*Sifarişçi:* **Avrasiya Beynəlxalq İnkişaf Assosiasiyası**

*Layihənin rəhbəri:* **Elçin Əsgərov**
*Avrasiya Beynəlxalq İnkişaf Assosiasiyası*
*İdarə Heyətinin sədri*

*İdeya müəllifi və məsləhətçi:* **Elşad İskəndərov**
*Azərbaycan Respublikası Xarici İşlər Nazirliyinin*
*Xüsusi tapşırıqlar üzrə səfiri*

*Rəyçi və girişin müəllifi:* **Kərim Şükürov**
*AMEA A.A.Bakıxanov ad. Tarix və Etnologiya İnstitutunun*
*baş direktoru, t.e.d., prof.*

*Müəlliflər:* **Tofiq Nəcəfli,** *t.e.d.*
**Ceyhun Bayramlı,** *t.ü.f.d.*
**Natiq Rəhimov**
**Araz Şəhrili**

*Kitabın redaktoru:* **Natiq Rəhimov**
*Dini Araşdırmalar Mərkəzinin direktoru*

*Korrektor:* **Kəmalə Cəfərova**

*Kitabı nəşrə hazırlayan:* **Dini Araşdırmalar Mərkəzi**

*Üz qabığı süni intellekt vasitəsilə yaradılmışdır.*

*Dəyərli məsləhətlərinə görə*
*Azərbaycan İlahiyyat İnstitutunun rektoru*
***Aqil Şirinova** təşəkkür edirik.*

İSBN

Qızılbaş Ensiklopediyası
Bakı, 2024, I cild, 504 səh.



*“Şah İsmayıl görkəmli dövlət xadimi,
siyasi şəxsiyyət,
Azərbaycanı birləşdirən insandır.
Azərbaycanın qədim dövlətçiliyi
Şah İsmayılın adı ilə bağlıdır”.*

***Ümummilli Lider Heydər Əliyev***



*Azərbaycan Respublikasının Prezidenti,*
*Müzəffər Ali Baş Komandan*
***İlham Əliyev***
*"Azərbaycan xalqının böyük oğlu,*
*sərkərdəsi və şairi" adlandırdığı*
***Şah İsmayıl Xətainin***
*heykəlinin önündə*



# Mündəricat



Birinci bölüm

## Şeyxlər və şahlar



İkinci bölüm

## Səfəvi xanədanının tanınmış üzvləri



Üçüncü bölüm

## Qızılbaşlıq





Dördüncü bölüm

## Qızılbaş tayfa və oymaqları

# Ön söz

Azərbaycanın tarixi torpaqlarını ilk dəfə vahid mərkəzdə birləşdirən, müasir Azərbaycan dövlətçiliyinin həm etnik, həm coğrafi, həm də mədəni təməllərini qoymuş, tariximizin şanlı səhifəsi olan Qızılbaş Hərəkatı və Dövləti-Qızılbaşdır. Qızılbaşlığın adı isə tariximizə, öncə hərəkatın şeyx-mürşidi, daha sonra isə qurduğu dövlətin hökmdarı I Şah İsmayılın adı ilə bərabər yazılmışdır.

Məşhur faktdır ki, Şah İsmayıl 14 illik hakimiyyəti ərzində 14 ölkə fəth etmişdir. Amma daha az bilinən odur ki, ondan əvvəl və sonra gəlib-getmiş bütün fatehlərdən fərqli olaraq, fəth etdiyi xalqların tarixi yaddaşında (həm yazılı ədəbiyyatında, həm də xalq folklorunda) ona münasibətdə mənfi təzahürə rast gəlinmir. Əksinə, Orta Asiyadan Anadoluya qədər bir çox ölkələrin titul xalqlarının dastanlarında İsmayılı epik qəhrəman və ədalətli hökmdar kimi tərənnüm edən çoxlu örnək görürük.

Tarixdə bənzəri olmayan bu hadisənin sirrini Qızılbaş imperiyasının xəritəsinə nəzər salanda anlayırsan. Bu xəritə bu gün Azərbaycan xalqının və ya ona yaxın xalqların təşəkkülündə rol oynamış etnosların tarixən yaşadıqları geniş coğrafiyanı əhatə edir. Şərti olaraq proto-azərbaycanlı adlandırıla bilən bu etno-tarixi toplumun varisləri – İraq və Suriya türkmanlarından tutmuş, Əfqanıstanın və Hindistan subkontinentinin qızılbaşlarına qədər – bu gün də bu torpaqlarda yaşayırlar. Qeyd etmək vacibdir ki, artıq həmin dövrdə müasir Azərbaycan ərazisində yaşayan talışların, kürdlərin, bir sıra digər Qafqaz və irandilli xalqların əcdadları da qızılbaşlarla ideoloji yaxınlıq və ortaq tarixi taleyi bölüşürdülər.

Yəni bu gün qardaş və etnik-mənəvi cəhətdən bizə yaxın xalqların məskunlaşdığı bu geniş coğrafiyada Şah İsmayıl faktiki olaraq azadlıq yürüşləri həyata keçirmiş, onların üzərində hökm sürən etnik və dini təqib buxovlarını dağıtmış, Qızılbaş superetnosunun, müasir dil ilə desək, Milli Evini qurmuşdur.

Məhz bu Milli Evdə Azərbaycan türklərinin müxtəlif tayfaları və onlarla ortaq tarixi taleyi bölüşən qardaş xalqlar qaynayıb-qarışaraq vahid Qızılbaş üstkimliyi altında dövlətin titul millətinə çevrildi. Məhz bu Milli Evdə demokratik qurultaylar ənənəsi əsasında qurulmuş tarixi Türk xaqanlıq modeli, əsrlər boyunca Qərbi Asiyada hökm sürmüş Sasani despotik modelinə qalib gəldi. Məhz bu Milli Evdə qızılbaşların, qaynağı Peyğəmbərin (s) Əhli-beytinə (ə) məhəbbətdən qaynaqlanan tarixi-mənəvi kimliyi öz dirçəlişini tapdı. O kimlik ki, qızılbaşların mənəvi və etnik sələflərinin tarix boyunca baş vermiş silsilə hərəkatlarında – Babəkin ərəb-fars Abbasi xilafətinin istilasına qarşı üsyanları, Nəsimi və hürufilərin mistik-ədəbi cərəyanı, türkman boylarının maarifçi “fütüvvə” təşkilatlanması, İmam Əli (ə) haqqında ilk Oğuz qəhrəmanlıq dastanları, nəhayət, tarixi Azərbaycan ərazilərində



xəlvətiyyə (şimalda) və səfəviyyə (cənubda) kimi geniş xalq dəstəyi qazanmış sufi təriqətlərin fəaliyyətinədək vüquf etmişdir.

Məhz bu Milli Evdə qızılbaşların ən çoxsaylı hissəsinin – Azərbaycan türklərinin ana dili tarixi zirvəyə ucaldı. Şah poeziyasında müstəqil ədəbi üslub kimi formalaşmış Azərbaycan dili təkcə saray, ordu və ədəbiyyat dili deyil, həm də Yaxın Asiyada millətlərarası ünsiyyətin "lingua franca"sı oldu.

Və nəhayət, məhz bu Milli Evdə **Azərbaycançılıq kimliyinin** təməl daşları qoyuldu. Öz dövləti və onun uğurları ilə fəxr edən, öz dili və xüsusi mənəvi ənənələri əsasında əlahiddə toplum olan qızılbaşların Vətən bağı gücləndi. Azərbaycan təkcə vacib coğrafi-inzibati mərkəz deyil, hər şeydən əvvəl qızılbaşlar üçün mənəvi və siyasi mərkəz roluna çevrildi. Təsadüfi deyil ki, Şah İsmayıl Şirvan yürüşündə öz mürid-əsgərlərinə müraciətini **"Sizə Gülüstan qalası, yoxsa Azərbaycan taxt-tacı lazımdır?"** şüarı ilə bitirmişdi ki, bu, Azərbaycan məfhumunu Qızılbaş Hərəkatının siyasi missiyasına və müqəddəs simvoluna çevirmişdir.

Beləliklə, Qızılbaşlar dövlətinin milli yurdunda qızılbaş etno-konfessional kimlik şüurunun etnik, mənəvi-etik və linqvistik ünsürləri "müqəddəs Vətən anlayışı" olan Azərbaycan məfhumu ilə yenidən vəhdətə gələrək, tamhüquqlu müasir Azərbaycan milli kimliyinin əsası sayıla biləcək bir kimlik formalaşdırmışdır.

Bu kimlik parçalanmış olsa da, xanlıqlar dövründə də qorunub-saxlanmışdır. ADR dövründə "siyasi millətin" formalaşması üçün zəmin yaradan da məhz bu kimliyin daşıyıcıları oldu. Və məhz bu kimlik Müstəqil Respublikada ehya edib möhkəmlənərək, 2020-ci ilin Müzəffər Vətən Müharibəsi ilə öz dirçəlişinin yeni mərhələsinə qədəm qoydu.

Buna görə, milli kimliyimizin formalaşmasında misilsiz tarixi rol oynamış Qızılbaş dövlətinin banisi I Şah İsmayıl Səfəvinin vəfatının 500-cü ilində **"Qızılbaş Ensiklopediyası"nın** işıq üzü görməsi çox rəmzi və vacib əhəmiyyət daşıyır. Əlinizdə tutduğunuz bu olduqca dəyərli və akademik səviyyəli Ensiklopediya bu sahədə bir ilk olması ilə yanaşı, həm də dərin, hərtərəfli, çoxşaxəli elmi araşdırmaların, fədakar zəhmətin nəticəsində ərsəyə gəlib.

**Süleyman şanlı Qızılbaş hökmdarı, Bahadur xan və Zillullah əs-Səfəvi Heydər oğlu Əbül-Müzəffər Şah İsmayılın** əziz xatirəsinə hörmətimi, əsər müəlliflərinə dəyərli zəhmətləri üçün dərin təşəkkürümü ifadə edərək, əsərdən yeni-yeni tarixi nailiyyətlər üçün ilham alacaq dəyərli millətimizə kitabla mənalı və təfəkkürə dəvət edən tanışlıqdan zövq almağı arzu edirəm.

**Elşad İskəndərov**
*Azərbaycan Respublikası XİN-nin*
*Xüsusi tapşırıqlar üzrə səfiri,*
*layihənin ideya müəllifi*

# Giriş

Səfəvilər dövləti (1501-1736) Azərbaycanın ona qədərki dövlətçilik tarixinə əsaslanmaqla eyni zamanda, özünəməxsus dövlətçilik modeli yaratmağa nail olmuş, Azərbaycanın sonrakı dövlətçilik tarixinə də mühüm stimul vermişdir. Azərbaycanın dövlətçilik tarixində ilk dəfə böyük önəmə malik olan xüsusi bir təlim – Qızılbaşlıq təlimi meydana gəlmişdir. Təsadüfi deyil ki, Səfəvilər dövləti, eyni zamanda Qızılbaş dövləti də adlandırılır. Dövrün mənbələri də bunu təsdiq edir. Belə ki, Səfəvilər dövləti dövrün tarixi mənbələrində çox zaman "Dövləti-Qızılbaşiyyə", "Ölkeyi-Qızılbaş" adları ilə xatırlanırdı.

Səfəvilər sülaləsinin kökləri yeddinci İmam Musa Kazimə bağlıdır, bu nəslin nümayəndələri həmişə xalq tərəfindən sevilmiş, cəmiyyət içində hörmət sahibi olmuşlar. Sülalənin ilk məşhur nümayəndəsi Firuz şah Zərrinkülah Ərdəbil ətrafında məskən salmış, onun xələfləri də öz həyatlarını bu şəhərlə bağlamışlar. Böyük sufi Şeyx Zahid Gilaninin müridi olan Şeyx Səfiəddin Ərdəbili XIV əsrin başlanğıcında səfəviyyə təriqətinin əsasını qoymuş, qısa müddət ərzində təriqət sürətlə ətrafa yayılmışdır. Səfəviyyə təriqəti şəbəkəsinin idarə edildiyi Ərdəbil xanəgahı müsəlman Şərqinin ən nüfuzlu mənəviyyat mərkəzlərindən biri sayılırdı. Şeyx Səfinin nəvəsi Xacə Əli Siyahpuşun səyləri ilə təriqət Anadolu torpaqlarında da özünə on minlərlə mürid qazandı. XV əsrin ortalarından etibarən Şeyx Cüneyd və Şeyx Heydər səfəviyyə təriqətini dini-mənəvi təlim səviyyəsindən və xanəgah miqyasından çıxararaq ona hərbi-siyasi güc bəxş etdilər. Səfəvi dövlətini yaratmaq missiyası isə gənc İsmayıla qismət oldu. O, bu dövlətin etno-coğrafi mənsubiyyətini də aydın şəkildə müəyyən etmişdir. Belə ki, Gülüstan qalasının mühasirəsi dövründə öz yaxın adamlarını toplayan İsmayıl onlara belə bir sual ilə müraciət etmişdir: "Sizin istəyiniz nədir? Azərbaycan, yoxsa Gülüstan qalası?" Onlar İsmayılın iradəsini ifadə edərək demişdilər: "İstədiyimiz Azərbaycandır".

Görkəmli salnaməçi Həsən bəy Rumlu "Əhsən ət-təvarix" adlı əsərində yazırdı ki, 1501-ci ildə I Şah İsmayıl Azərbaycanda siyasət meydanına qədəm basdığı zaman İraqi-Ərəb, İraqi-Əcəm, Xorasan, Diyarbəkir, Yəzd, Kaşan, Qəndəhar, Bəlx, Kirman, Əbərquh və Simnanda hər biri müstəqillik iddiası edən və "məndən başqası yoxdur", – deyən on bir hakim var idi. Digər salnaməçi Budaq Münşi Qəzvini isə həmin dövrü bu cür təsvir edirdi: "İraqi-Əcəm və Azərbaycanda hərc-mərclik hökm sürürdü, iki gündən-bir kimsə padşah olurdu".

Belə bir çətin şəraitdə həm səfəviyyə təriqətinin mürşidliyini, həm də qızılbaş tayfalarının hərbi liderliyini öz şəxsiyyətində uğurla birləşdirmiş I Şah İsmayıl



təkcə tarixi Azərbaycan torpaqlarını deyil, xeyli böyük ərazini vahid bayraq altında və möhkəm ideologiya ətrafında cəm etməyə nail oldu.

Şah İsmayıl Xətainin yaradıcılığında Azərbayacanın siyasi tarixinə dair çox nadir bir epizod öz əksini tapmışdır. Azərbaycan tarixindən məlumdur ki, monarxiya dövrlərində hakimiyyətə gəlməyin əsas yolu hakim siyasi elitaya məxsusluq idi. Çingiz xanın zamanında isə hökmdar qurultay vasitəsilə seçilmişdir. Yeri gəlmişkən, Nadir xan da Muğanda "şah seşkisi" keçirmişdir. Şah İsmayıl isə hakimiyyətə iddiasını daha çox şəxsi keyfiyyətləri ilə əsaslandırır. Bunun üçün onun iki siyasi qəzəlinin ("Əzəldən şah bizim sultanımızdır" və "Allah, Allah den, ğazilər") qarşılıqlı təhlilini nəzərdən keçirmək kifayətdir. Birinci qəzəldə, necə deyərlər, şaha verilən tələblərdən bəhs olunur, ikinci qəzəldə isə İsmayıl məhz onun belə keyfiyyətlərə malik olduğunu bəyan edərək yazır:

Xətaiyəm, al atluyam, sözü şəkərdən datluyam,
Murtəza Əli zatluyam, ğazilər deyən şah mənəm!

*(daha ətraflı bax: Kərim Şükürov. Şah İsmayıl Xətai: Ğazilər deyən şah mənəm (Azərbaycanın siyasi tarixinə dair nadir bir epizod)//Yazıçı. "Oğuz eli" qəzetinin ayrıca buraxılışı. Şah İsmayıl Xətai. 2018, noyabr. №2(171), s.27-28).*

Müsəlman Şərqinin ən qüdrətli imperiyalarından sayılan Səfəvilər dövləti müxtəlif dövrlərdə müasir Azərbaycan, İran, Gürcüstan, Ermənistan ərazilərini, eləcə də müasir İraq, Əfqanıstan, Pakistan, Türkmənistan torpaqlarının bir hissəsini, Türkiyənin şərqini və Dağıstanı əhatə edirdi. Azərbaycan türkcəsinin dominant mövqeyə malik olduğu bu dövlət öz dövrü üçün mütərəqqi daxili və xarici siyasət mexanizmlərini formalaşdırmış, həm yaxın qonşuları, həm də Avropanın aparıcı dövlətləri ilə səmərəli diplomatik əlaqələr qurmağa nail olmuş və bölgədə hər kəsin hesablaşmağa məcbur olduğu güc mərkəzlərindən birinə çevrilmişdir.

Səfəvilərin əsas hərbi-siyasi gücünü Azərbaycan və Anadolu torpaqlarında məskunlaşmış qızılbaş tayfaları təşkil edirdi. Qızılbaş inanc sistemi babaiyyə, bayramiyyə, yəsəviyyə, bektaşiyyə kimi türk mənşəli təsəvvüf təriqətlərinin təməlləri üzərində formalaşmış, batinilik və hürufilik kimi mistik cərəyanlarla çulğaşmış, xürrəmilikdən bəhrələnmiş, öz içində İslamaqədərki türk inancını da yaşatmış zəngin dünyagörüşü, həyat məktəbi idi. Sonralar ələvilik üçün baza rolunu oynamış qızılbaşlığı xalq şiəliyi da adlandırmaq olar. Bir əlində saz, o biri əlində qılınc tutmağa adət etmiş qızılbaş tayfalarının dini-mədəni düşüncəsində və hərbi-siyasi fəaliyyətində Əhli-beyt sevgisi ən yüksək yerdə dururdu. Sonrakı dövrlərdə Səfəvilər dövlətinin din siyasəti daha artıq dərəcədə ənənəvi şiəlik və məzhəbçilik çaları qazansa da, qızılbaş inancı yenə öz təsirini qorumaqda davam etmişdir.

Müxtəlif dövrlərdə Dərbənddən Hörmüzə, Diyarbəkirdən Qəndəhara kimi böyük ərazini əhatə etmiş Səfəvi qızılbaş məmləkətində dini və dünyəvi elmlərlə yanaşı, ədəbiyyat, musiqi, miniatür sənəti, xəttatlıq, xalçaçılıq, dekorativ-tətbiqi incəsənət növləri yüksək səviyyədə inkişaf etmişdi. Qasimi-Ənvar, Həbibi, Kişvəri, Füzuli, Aşıq Abbas Tufarqanlı, Qurbani, Miskin Abdal, Qövsi Təbrizi, Saib Təbrizi, Möhtəşəm Kaşani kimi şair və ozanların, Sultan Süleyman, Behzad, Ağa Mirək, Mir Müsəvvir, Sadıq bəy Əfşar, Rza Abbasi kimi rəssam və xəttatların, Həsən bəy Rumlu, İsgəndər bəy Münşi kimi tarixçilərin, Əllamə Kərəki, Şeyx Bəhai, Mir Damad, Müqəddəs Ərdəbili, Əllamə Məclisi, Feyz Kaşani, Hürr Amili, Molla Sədra kimi din alimlərinin adı bu və ya digər dərəcədə Səfəvilər tarixi ilə bağlıdır. Şərqin elm və mədəniyyət tarixinin şah əsərləri sayılan Xətai divanı, “Bəngü Badə” (Füzuli) poeması, Şeyx Səfi xalçası, Nəqşicahan meydanı, yellənən minarələr və bir şamla isidilən hamam (İsfahan), “Bihar əl-ənvar” (Əllamə Məclisi) və “Vəsail əş-şiə” (Hürr Amili) hədis topluları Səfəvilər zamanında yaradılmışdı, Təbriz miniatür məktəbi, ədəbiyyatda “hind üslubu” da bu dövrün yadigarıdır. Bütün bunlar Azərbaycan sivilizasiyasının tarixində də mühüm yeniliklər idi.

***

Diqqətinizə təqdim edilən ensiklopediya qızılbaşlıq və Səfəvilər dövləti barədə hazırlanmış ilk nəşrdir. İstər Azərbaycan, Türkiyə və İranda, istərsə də Qərb ölkələrində bu mövzu ətrafında kifayət qədər dərin araşdırmalar aparılmış, dəyərli kitab və məqalələr yazılmışdır. Buna baxmayaraq, indiyədək səfəvişünaslıqda ensiklopediya tipli layihə həyata keçirilməmişdir. Bu mənada “Qızılbaş ensiklopediyası” öz təyinatı üzrə ilk təcrübədir. Müasir dövrdə informasiya təminatının prioritet olması nəzərə alınsa, həm də olduqca aktualdır.

Ensiklopediya hazırlanarkən geniş mənbə bazasından (tarixi salnamələr, rəsmi sənədlər, Avropa səyyahlarının əsərləri və s.), həm də problemə dair mövcud tarixşünaslıqdan geniş surətdə istifadə edilmişdir. Tarixi faktlar fərqli mənbələrə əsasən dəqiqləşdirilmiş, əksəriyyət tərəfindən qəbul edilən və mübahisə doğurmayan məlumatlara üstünlük verilmişdir. Tarixi şəxslər və hadisələrə dair informasiyalar üçün obyektivlik əsas kriteriya olmuş, irəli sürülən bəzi qərəzli və yanlış iddialar tənqidi şəkildə nəzərdən keçirilmişdir. Səfəvilər dövlətinin tarixinin Azərbaycan dövlətçiliyi baxımından işıqlandırılması prioritet istiqamət təşkil etmişdir.

Mövzunu mümkün qədər tam əhatə edə bilmək üçün 8 əsas bölüm müəyyən edilmiş, onlar da hər biri dörd bölümdən ibarət olmaqla, iki cildə ayrılmışdır.

Birinci cildin **“Şeyxlər və şahlar”** adlanan birinci bölümündə Səfəvilər sülaləsinin hökmdarları haqqında məlumatlar xronoloji ardıcıllıqla verilmişdir. Səfəvilər dövlətinin adı səfəviyyə təriqətinin banisi Şeyx Səfiəddin Ərdəbilinin adından



qaynaqlandığı üçün birinci bölümün əvvəlində Şeyx Səfi və onu I Şah İsmayıla bağlayan daha 5 xələfi barədə də məqalələr təqdim olunmuşdur. Səfəvilər dövlətinin tarixi 1736-cı illə bitsə də, sonralar şahlıq iddiası etmiş daha bir neçə Səfəvi sülaləsi üzvünün həyatı da bu bölümdə işıqlandırılmışdır. Səfəvi şahlarından bəhs edilərkən onların dövründəki sosial-iqtisadi və mədəni həyata dair məlumatlar da diqqət mərkəzində olmuşdur. Müvafiq bölümlərdə isə uyğun məsələlər daha geniş təsvir edilmişdir.

İkinci bölüm – **"Səfəvi xanədanının tanınmış üzvləri"** – Səfəvilər sülaləsinin Şeyx Səfidən əvvəlki məlum nümayəndələrinin, eləcə də, Səfəvi şahzadələri və şahbanularının həyatı haqqında məlumatları əlifba sırası üzrə düzülmüş məqalələr şəklində əhatə edir.

**"Qızılbaşlıq"** adlanan üçüncü bölüm qızılbaşlığın ideoloji əsasları, kökləri, mühüm təsəvvüf terminləri və dini-məzhəbi məfhumlara həsr edilmişdir. Əlifba sırası ilə verilmiş məqalələrdə mövzunun daha yaxşı qavranması üçün Şeyx Səfiəddin Ərdəbilinin tövsiyələrinin toplandığı "Qara məcmuə" və "Şeyx Səfi təzkirəsi"ndən, eləcə də Xətai divanından nümunələr təqdim edilmişdir.

Dördüncü bölüm **"Qızılbaş tayfa və oymaqları"** adlanır. Bu bölümdə Azərbaycan və Anadolu ərazilərində məskunlaşmış əsas qızılbaş tayfaları, onların iri oymaqları barədə biliklər verilmiş, bunların görkəmli nümayəndələrinin adları sadalanmışdır. Ən məşhur qızılbaş əmirlərinin həyatı barədə isə ensiklopediyanın müvafiq bölümündə daha geniş məlumat verilmişdir.

Birinci cild **"Səfəvilərə qarşı irəli sürülmüş bir neçə yanlış iddiaya cavab"** məqaləsi ilə bitir. Burada Səfəvilər sülaləsinin görkəmli nümayəndələrinin fəaliyyətinə və ümumilikdə Səfəvilər dövlətinin tarixi roluna qarşı irəli sürülmüş əsassız və qərəzli iddialardan bir neçəsi faktlar əsasında təkzib edilmişdir.

Ensiklopediyanın digər dörd bölümdən ibarət ikinci cildi **"Səfəvilər dövrünün görkəmli şəxsiyyətləri"** bölümü ilə açılır. Burada Səfəvilər dövlətininin qurulmasında və çiçəklənməsində mühüm xidmətləri olmuş şəxsiyyətlər – qızılbaş əmirləri, eləcə də qeyri-türk mənşəli yüksək vəzifə sahibləri, Səfəvilərlə rəqabət halında olmuş qonşu dövlətlər haqqında qısa məlumatlar əldə etmək mümkündür.

Altıncı bölüm – **"Səfəvilər dövləti və qızılbaş ordusu"** – Səfəvilər dövlətinin quruluşu, idarəçilik aparatı, inzibati ərazi bölgüsü, sosial-iqtisadi vəziyyəti, mühüm dövlət vəzifələri haqqında məlumatları əhatə edir. Buraya, həmçinin, qızılbaş ordusunun tərkibi, silahları, qonşu dövlətlərlə aparılmış müharibələr, mühüm döyüşlər və sülh müqavilələri haqqında da məqalələr əlavə olunmuşdur.

Səfəvilər dövlətinin din siyasəti, görkəmli din alimlərinin həyatı, eləcə də bu dövlətin hüdudları daxilində yaşayıb-yaratmış məşhur şairlər, nəqqaş və xəttatlar,

mühüm memarlıq abidələri, musiqi və əyləncə növləri barədə məlumatlar **“Səfəvilər dövlətində din, ədəbiyyat və incəsənət”** adlı yeddinci bölümün əsasını təşkil edir.

Ensiklopediyanın sonuncu, **“Səfəvilər dövrünün tarixi mənbələri”** adlanan səkkizinci bölümündə o dövrün hərbi-siyasi, elmi-mədəni mənzərəsini əks etdirən mühüm tarixi mənbələr haqqında məlumatlar verilmişdir. Bu bölümdə həm Səfəvi tarixçiləri tərəfindən qələmə alınmış klassik salnamələr, həm Osmanlı müəlliflərinin əsərləri, həm də Səfəvilər dövlətinə səfər etmiş Qərb səyyah və diplomatlarının xatirələri işıqlandırılır. Əlifba sırası ilə təqdim edilmiş məqalələrdə hər mənbənin məzmunu, özəllikləri və müəllifi haqqında dolğun məlumat verilmişdir.

Səfəvilər dövləti Azərbaycan tarixinin ən şərəfli səhifələrindəndir, bu şanlı tarix haqqında hər bir azərbaycanlının kifayət qədər məlumata malik olması zəruridir. “Qızılbaş ensiklopediyası” məhz bir tələbatdan yaranmış və bu funksiyanı layiqincə yerinə yetirməyə qadirdir.

“Qızılbaş ensiklopediyası”nın həm həsr olunduğu mövzu, həm də Azərbaycan ensiklopediya yaradıcılığı tarixində yeni bir səhifə açacağı şübhəsizdir. Eyni zamanda qeyd etmək lazımdır ki, belə bir fundamental layihənin reallaşdırılması zamanı müəyyən çatışmazlıqların olması da təbiidir. Bütün bunlar növbəti nəşrlərdə aradan qaldırılacaq, daha da təkmilləşdiriləcəkdir.

Ümid edirik ki, “Qızılbaş ensiklopediyası” Azərbaycan ensiklopediyaları içərisində özünəməxsus yer tutacaq, geniş oxucu kütləsi üçün Azərbaycan tarixinin bu fundamental problemi üzrə ən mühüm informasiya bazasına çevriləcəkdir.

**Kərim Şükürov**
*AMEA A.A.Bakıxanov ad. Tarix və Etnologiya*
*İnstitutunun baş direktoru,*
*tarix elmləri doktoru, professor*



**ŞEYX SƏFİƏDDİN ƏRDƏBİLİ** (1252-1334) – *səfəviyyə* təriqətinin banisi, Səfəvilər sülaləsinin ən görkəmli nümayəndələrindən biri, I Şah İsmayılın altıncı nəsildən ulu babası. Bu nəslin ilk məlum nümayəndəsi *Firuz şah Zərrinkülah* sayılır. Firuz şahın kürd, fars və ya türk mənşəli olması elmi dairələrdə çox müzakirə edilmiş mübahisəli məsələlərdəndir. Bəzi tədqiqatçıların iddialarına rəğmən, Firuz şahın kürd və ya fars mənşəli olması barədə irəli sürülən sübutlar tutarlı deyil. Səfəvilər sülaləsinin yeddinci *imam Musa Kazimə (ə)* bağlanması da bəzi araşdırmaçılar tərəfindən düzgün sayılmır; onlar Səfəvilərin Əhli-beyt imamlarına gedib çıxan şəcərəsinin sonralar, hakim sülalə tərəfindən uydurulduğunu iddia edirlər. Amma Səfəvilərin İmam Kazimin (ə) nəslindən olması ehtimalı onların türk mənşəyini rədd etmir. *"Səfvət əs-səfa"* kitabında və digər klassik mənbələrdə Şeyx Səfiəddinin hələ öz müasirləri tərəfindən türk sayılması barədə məlumatlar mövcuddur (bax: *Səfəvilərin etnik mənsubiyyəti*). Eyni zamanda, Səfəvi sülaləsinin İmam Musa Kazimə (ə) bağlanmasını təsdiq edən sənədlər də əsassız hesab oluna bilməz.

Şeyx Səfiəddinin atası Şeyx *Əminəddin Cəbrail* Ərdəbilin Kəlxuran kəndində məskunlaşmışdı, əlinin zəhməti ilə dolanır, insanları əxlaq və mənəviyyat yoluna dəvət edirdi. O, Ərdəbilin Baruq kəndindən Baba Camal adlı şəxsin qızı *Dövləti* (və ya Dövlətlü) *xatunla* ailə qurmuş, bu izdivacdan 6 oğul və 1 qız doğulmuşdur. Əsl adı İshaq olan Şeyx Səfiəddin də bu övladlardan biridir. 6 yaşında ikən atasını itirmiş İshaq anasının himayəsi altında böyümüş, mükəmməl dini təhsil almışdır. Onun qardaşı Məhəmməd Şirazda ticarətlə məşğul idi, çoxlu sərvət toplamışdı. Məhəmməd vəfat etdikdən sonra digər qardaşı *Səlahəddin Rəşid* Şiraza gedib onun mülkünə yiyələnir və ticarət işlərini daha da genişləndirir. İki oğlundan ayrı düşmüş anası İshaqın təsəvvüf öyrənmək üçün uzaq səfərə çıxmasına icazə vermirdi. İshaq Şiraza gedib qardaşını tapmaq və geri qayıtmağa razı salmaq şərti ilə anasından rüsxət alıb yola çıxır. O zamanlar *sührəvərdiyyə* təriqətinin banisi Əbunnəcib Sührəvərdinin xəlifəsi (canişini) Nəcibəddin Büzğuş da Şirazda yaşayırdı. İshaq təsəvvüfün incəliklərini ondan öyrənmək niyyətində idi, amma Şiraza çatanda Büzğuşun vəfat etdiyini eşitdi.

Anasının tapşırığını yerinə yetirdikdən sonra İshaq *mürşid* axtarışına çıxdı, bir neçə ustadla görüşsə də, ürəyinə yatan mürşidi uzun müddət tapa bilmədi. Rəvayətə görə, o, hansısa ustadın əlini tutarkən öz daxilində heç bir mənəvi aramlıq hiss etmirdi. Nəhayət, təqribən 25 yaşında ikən (1276/77-ci illər) o, sufilərdən birinin məsləhəti ilə Azərbaycanın cənub bölgəsində (o zamanlar Gilan əyalətinə aid idi) məskunlaşmış *Şeyx Zahid Gilaninin* (vəf. 1301) müridlərinin cərgəsinə qoşuldu. 25 il öz mürşidindən təsəvvüfün sirlərini öyrənmiş İshaq onun ən sevimli və istedadlı

tələbəsi sayılırdı, hətta Şeyx Zahid öz qızı *Bibi Fatiməni* ona ərə vermişdi. Mürşidi tərəfindən Səfiəddin ləqəbinə layiq görülmüş İshaq bundan sonra həmin adla, yaxud onun qısaldılmış forması olan Şeyx Səfi ləqəbi ilə tanındı. Şeyx Zahid onu bir neçə dəfə ətraf bölgələrə, o cümlədən Marağaya təbliğat məqsədilə göndərmiş, o da vəzifəsinin öhdəsindən layiqincə gələrək mürşidin razılığını və tam etimadını qazanmışdı. Hələ Şeyx Zahidin sağlığında ondan sonra təriqətə Səfiəddinin rəhbərlik edəcəyi məlum idi, hətta Şeyx Zahidin böyük oğlu Cəmaləddin Əli buna qısqanclıqla yanaşırdı. 1301-ci ildə Şeyx Zahid Gilani Şeyx Səfini canişin *(xəlifə)* təyin edərək öz vətəni Siyavurd kəndində dünyadan köçdü. Şeyx Səfi ustadının cənazəsini həmin kənddə dəfn etdi, sonralar məzar su altında qaldığı üçün cənazəni çıxarıb Hiyəkəran kəndində torpağa tapşırdılar.

Ustadının vəfatından sonra Şeyx Səfiəddin ata yurdu olan Ərdəbildə məskunlaşaraq təsəvvüfdə özünəməxsus təlimləri yaymağa başladı. Bu təlimlər səfəviyyə təriqətinin əsasını təşkil edirdi. Onun Ərdəbildəki evi səfəviyyə təriqətinin ilk özəyinə çevrildi. Getdikcə Şeyx Səfinin şöhrəti ətrafa yayıldı, vəfat edərkən onun Ərdəbildə iri *xanəgahı* vardı, ətrafdakı 20 kənd bu xanəgaha *vəqf* edilmişdi. Xanəgahdan göndərilən xəlifələr səfəviyyə təriqətini bölgədə fəal surətdə yayırdılar, *müridlərin* sayı on minlərlə hesablanırdı. Elxani hökmdarları Olcaytu Xudabəndə və Əbu Səid Bahadur xan Şeyx Səfiəddin Ərdəbiliyə ehtiram bəsləyir, onun görüşünə gəlirdilər. Şeyxin müasiri olan görkəmli tarixçi Həmdullah Mustovfi "Tarixi-güzidə" kitabında yazırdı ki, moğollar (yəni Elxani hakimləri) ona dərin ehtiram və etimad göstərirlər, şeyx də onların camaata əziyyət verməsinin qarşısını alır. Rəvayətə görə, Elxanilərin qüdrətli sərkərdəsi Əmir Çoban Sulduz: "Mənim əsgərlərimin sayı çoxdur, ya sənin müridlərinin?" deyə şeyxdən soruşmuş, o da belə cavab vermişdi: "Başqa ölkələrlə işim yoxdur, təkcə bu diyarda sənin hər əsgərinin müqabilində bizim yüz müridimiz var" (Digər varianta görə, şeyxin sərkərdəyə cavabı bu şəkildə olmuşdur: "Elə sizin əsgərləriniz də mənim müridlərimdir").

Hələ Şeyx Səfiəddinin sağlığında Azərbaycandan əlavə Təbəristan, Türküstan, Xorasan, Orta Asiya, Qaraxitay, Mərkəzi İran, İraq, Suriya, Livan, Hicaz (Ərəbistan), Anadolu və Hindistanda, hətta Sərəndib (Seylon) adasında onun müridləri yaşayırdılar. Bu ölkələrdən dərvişlər Ərdəbilə axışıb gəlir və *mürşidi-kamillə* (təriqətin başçısı bu ləqəblə tanınırdı) görüşürdülər. Adıçəkilən bölgələrdə səfəviyyə xanəgahları fəaliyyət göstərirdi və bu şəbəkə Ərdəbildən idarə edilirdi. Şeyx Səfiəddin Ərdəbilinin sağlığında qazandığı hörmətin sayəsində onun vəfatından sonra da səfəviyyə durmadan inkişaf edərək yayılmış, XIV-XV əsrlərdə müsəlman Şərqinin ən nüfuzlu və sərvətli təriqətlərindən biri olmuşdur.



Şeyx Səfiəddin Ərdəbili *təsəvvüfün* bütün zahiri və batini qaydalarına ciddi şəkildə əməl edirdi, ibadətdə və əxlaqda yüksək məqama çatmışdı. Onun xariqüladə hərəkətləri *(kəramətləri)*, qeyb aləmindən verdiyi xəbərlər müridləri tərəfindən sevə-sevə nəql edilirdi. Şeyx Səfinin həyat tarixçəsi, kəramətləri *"Səfvət əs-səfa"* adlı irihəcmli kitabda toplanmışdır, səfəvi dərvişi İbn Bəzzaz Ərdəbili bu kitabı şeyxin vəfatından sonra oğlu Sədrəddinin sifarişi ilə qələmə almışdır. Şeyx Səfinin öyüd və nəsihətləri, hikmətli kəlamları, suallara verdiyi cavablar *"Qara məcmuə"* adlı kitabda öz əksini tapmışdır. "Qara məcmuə" səfəviyyə təriqətinin təlimatnaməsi sayılırdı, uzun müddət bu kitab yalnız Səfəvi sarayına bağlı olan xüsusi şəxslər tərəfindən qorunmuşdur. Səfəvi şahları sarayın *xəlvətxana* adlı məkanında bu kitabı oxutdurur və müzakirə edirdilər. Kitab I Şah Təhmasibin göstərişi ilə Məhəmməd ibn Hüseyn Katib Nişati tərəfindən Azərbaycan dilinə tərcümə edilmiş və *"Şeyx Səfi təzkirəsi"* adı ilə tanınmışdır.

Şeyx Səfiəddinin şairlik təbi də vardı, onun şeirlərindən qısa nümunələr mənbələrdə qeydə alınmışdır. Şeirlərinin bir qismi fars, bir qismi Azərbaycan türkcəsi, bir hissəsi də Gilan (gilək) dilindədir.

Şeyx Səfiəddin Ərdəbili ömrünün sonuna yaxın həcc ziyarətinə yollanmış, həcdən qayıtdıqdan sonra 12 gün xəstə yatmış, 1334-cü ilin sentyabrında Ərdəbildə vəfat etmişdir. Oğlu və xələfi Şeyx Sədrəddin onun xanəgahını genişləndirərək iri kompleksə çevirmişdir. Sonralar Səfəvi sülaləsinin bəzi məşhur nümayəndələri də bu kompleksin daxilində dəfn edilmişlər.

Şeyx Səfiəddin Ərdəbilinin iki həyat yoldaşı olmuşdur. Bunlardan birincisi öz ustadı *Şeyx Zahid Gilaninin* qızı *Bibi Fatimədir* (vəf. 1334). Bu izdivacdan onun 3 oğlu doğulmuşdur. Oğullarından biri *Şeyx Sədrəddindir*; o, atasından sonra təriqətə rəhbərlik etmişdir, Səfəvi şahları onun nəslindəndirlər. Digər oğullarının adı Şeyx Mühyiddin (1324-cü ildə atasının sağlığında vəfat etmişdir) və Əbu Səiddir.

Şeyx Səfiəddin Ərdəbilin Kəlxuran kəndinin əhalisindən Süleyman adlı şəxsin qızı ilə də evlənmiş, bu izdivacdan 2 oğul və 1 qız doğulmuşdur. Oğullarının adı Şeyx Əlaəddin və Şeyx Şərəfəddindir. Şeyx Səfiəddin qızını öz ustadı Şeyx Zahid Gilaninin kiçik oğlu Şəmsəddinə ərə vermişdir, *"Silsilət ən-nəsəbi-Səfəviyyə"* kitabının müəllifi Şeyx Hüseyn Pirzadə Zahidi onun nəticəsidir.

***Mənbələr:*** *İbn Bəzzaz Ərdəbili. Səfvət əs-səfa (nəşrə hazırlayan: Q.Təbatəbaiməcd); Qara məcmuə (nəşrə hazırlayan: H.M.Sədiq Düzgün); Şeyx Səfi təzkirəsi (tərtibçilər və nəşrə hazırlayanlar: M.Nağısoylu, S.Cabbarlı, R.Şeyxzamanlı); Ə.Kəsrəvi. Şeyx Səfi və nəsli; Mehman Süleymanov. Səfəvilər, I cild (Şeyx Səfiəddin Ərdəbili); Şeyx Hüseyn Pirzadə Zahidi. Silsilət ən-nəsəbi-Səfəviyyə, s.16-38; Türkiye Diyanet Vakfı İslam Ansiklopedisi, XXXV, 476-478; Həmdullah Mustovfi. Tarixi-güzidə, s.675; Qazı Nurullah Şüştəri. Məcalis əl-möminin, II, 43; Y.Baba-*

*yev. Azərbaycan ədəbiyyatı tarixi (XIII-XVIII əsrlər), s.11-12; Ə.Heydəri, N.B.Bidəhəndi. Səfiəddin Ərdəbilinin seyidliyi mövzusuna baxış, "Tarix dər ayineyi-pejuheş" dərgisi, 2011, №2, s.59-82; Z.Bayramlı. Səfəvi dövlətinin etnik mənsubiyyətinə dair ("Azərbaycan xalçaları", cild 5, №17, 2015), s.67-75; Ə.Xeyrəndiş. Səfəvilərin başlanğıcı və bu barədə araşdırmalar ("Kitabnameyi-tarix və coğrafiya", 1379 h.-ş., aban və azər ayları), s.82-85; Mirza Abbaslı. Safevilerin Kökenine Dair (Belleten, 40/158), s.287-330; Nihat Çetinkaya. Kızılbaş Türkler (Tarixi Oluşumu ve Gelişimi), s.359-362; O.Əfəndiyev. Azərbaycan Səfəvilər dövləti, s.37-39; İsgəndər bəy Münşi. Tarix-i aləmara-yi Abbasi (tərcümə və şərhlər: O.Əfəndiyev, N.Musalı), s.48-52; Əmini. Fütuhati-şahi (nəşrə hazırlayan: Məhəmməd Rza Nəsiri), s.9-31; Budaq Qəzvini. Cəvahir əl-əxbar (nəşrə hazırlayan: M.Bəhramnejad), s.103-108; Aləmarayi-Səfəvi (nəşrə hazırlayan: Yədullah Şükri), s.9-17; M.Tərbiyət. Danişməndani-Azərbaycan, s.112-116; The Cambridge History of Iran, vol. 6, pp.190-193; The Encyclopaedia of İslam (New Edition), VIII, 801.*

**SƏDRƏDDİN MUSA ƏRDƏBİLİ** (1305-91) – *səfəviyyə* təriqətinin *mürşidi,* təriqətin banisi *Şeyx Səfiəddin Ərdəbilinin* oğlu. Anası böyük sufi *Şeyx Zahid Gilaninin* qızı *Bibi Fatimə* idi. Həyatı haqqında konkret tarixi məlumat azdır, mənbələrdəki mövcud məlumatların əksəriyyəti mənqəbə (*kəramət* və əxlaqi keyfiyyətlərin təsviri) qismindədir.

Sədrəddin atasının sağlığında təriqət həyatında mühüm rol oynamış və onun gələcək canişini kimi tanınmışdı. Halal ruzi ilə qidalandığı üçün hələ uşaq yaşlarında ikən *kəşf və kəramət* sahibi olmuşdur. Rəvayətə görə, *xanəgahda* müridlərə xidmət etmək məqsədilə onların ayaqqabılarını cütləməklə məşğul olur, bu zaman ixlaslı müridləri sədaqətli olmayanlardan fərqləndirə bildiyinə görə ayaqqabıları iki hissəyə bölüb ayrı-ayrı yerlərə yığırdı. Şeyx Səfi məsələdən xəbər tutanda bunun qarşısını almaq üçün oğlunun yeməyinə bir qədər ərsəyə gəlməsində və bişirilməsində halala və paklığa tam riayət olunmayan, bazarda satılan çörək qatılmasına göstəriş vermiş, bunun sayəsində Sədrəddinin həmin bacarığı itmişdi.

Şeyx Səfiəddinin vəfatından (1334) sonra təriqət rəhbərliyində onu əvəz etmiş Şeyx Sədrəddin 57 il səfəvi müridlərinin başçısı olmuşdur. Onun zamanında səfəviyyə təriqəti daha da inkişaf edərək ətrafa yayılmış, təriqətin təşkilatlanma prosesi güclənmiş, müridlərin sayı xeyli artmışdı. O, Ərdəbildəki Şeyx Səfi xanəgahının təmir-tikinti və genişləndirmə işlərini həyata keçirmiş, xanəgahı təkcə səfəviyyə təriqətinin paytaxtına deyil, həm də Yaxın Şərqin mənəviyyat mərkəzlərindən birinə çevirmişdi. Şeyx Səfiəddinin həyat və fəaliyyətindən bəhs edən, səfəviyyə təriqəti barədə ən mühüm mənbələrdən sayılan *"Səfvət əs-səfa"* əsəri onun sifarişi ilə qələmə alınmışdır.

Şeyx Sədrəddinin təriqətə rəhbərliyi bölgədə siyasi sabitliyin pozulması dövrünə təsadüf etmişdir. Elxani, Çobani, Cəlayiri və Qaraqoyunlu hökmdarlarının çəkişmələri nəticəsində Azərbay-



canda tez-tez hakimiyyət dəyişikliyi baş verirdi. Elxani sərkərdəsi, Çobanilər sülaləsinin nümayəndəsi Məlik Əşrəf Şeyx Sədrəddini Təbrizə gətirdərək üç ay həbsdə saxlamış, amma gördüyü qorxulu bir yuxunun nəticəsində onu azad etmişdi. Şeyx Sədrəddin Ərdəbilə qayıtdıqdan sonra Əmir Əşrəf yenidən onu həbs etmək qərarına gəlmiş, bu dəfə şeyx Gilan istiqamətində qaçaraq həbsdən xilas olmuşdu. Çobanilərin təzyiqi nəticəsində Ərdəbil təkkəsinin sufiləri, eləcə də bölgədə yaşayan digər elm və mənəviyyat adamları ətraf ölkələrə dağıldılar. Nəhayət, Çingiz xanın nəslindən olan Qızıl Orda xanı Canı bəy 1357-ci ildə Azərbaycana qoşun çəkərək Şirvan ərazisindən keçməklə Təbrizə gəldi və Məlik Əşrəfi hakimiyyətdən salıb öldürdü. Canı bəy Şeyx Sədrəddinə tapşırmışdı ki, təriqətə məxsus olan bütün mülkiyyətin siyahısını ona təqdim etsin, Qızıl Orda xanı həmin mülkiyyəti *soyurqal* şəklində Şeyx Səfi xanəgahına vermək və bunu öz möhürü ilə təsdiqləmək fikrində idi. Lakin Canı bəy təcili qayıtdığına görə sənədləri imzalamaq mümkün olmadı. Bundan sonra bölgənin idarəçiliyi Cəlayirilər sülaləsinin əlinə keçdi. Cəlayirilərin zamanında Ərdəbil *təkkəsi* bərpa edilərək daha da çiçəkləndi. Sultan Əhməd Cəlayiri Şeyx Səfi xanəgahını və Ərdəbildə ona bağlı olan bütün məntəqələri vergilərdən azad etmişdi.

Şeyx Sədrəddinin xarici görünüşü barədə yazırlar ki, o, hündürboy, qarayanız idi. Dini elmlərdə və təriqət adabında dərin bilik sahibi olmuş, Quran təfsirini dərindən mənimsəmiş, şeir yazmışdır.

Mənbələrdə Ərdəbil camesinin gürcülər tərəfindən qarət edilib aparılmış qoşa qapı tayının geri qaytarılmasını da Şeyx Sədrəddinin adı ilə bağlayırlar. Rəvayətə görə, o, iki müridi ilə Gürcüstana gedib qapıları tələb etmiş və Ərdəbilə gətirmişdi. Qapı tayları o zamandan məscidin girişində yenidən öz yerini tutmuşdur.

Şeyx Sədrəddin Musanın 3 oğlu olmuşdur. Oğullarından *Xacə Əli Siyahpuş* ondan sonra təriqət rəhbərliyinə gəlmiş və 35 ildən çox səfəviyyə müridlərinə başçılıq etmişdir. İkinci oğlu Şihabəddin gənc yaşlarında, özündən sonra nəsil qoymadan dünyasını dəyişmişdir; öz vəsiyyətinə əsasən onun mirası Şeyx Səfi xanəgahında xidmət edən Quran hafizlərinə paylanmışdı ki, mərhumun ruhu üçün Quran oxuyub dua etsinlər. Şeyx Sədrəddinin üçüncü oğlu Şeyx Cəmaləddindən bir qız övladı yadigar qalmışdır, Xanzadə Paşa bəyim adlı həmin qızla *İbrahim Şeyxşah* (Xacə Əli Siyahpuşun oğlu) ailə qurmuşdur.

Şeyx Sədrəddin Musanın müridləri səfəviyyə təriqətini ətraf bölgələrdə uğurla yaymağa nail olmuşlar. Onun müridlərindən biri görkəmli Azərbaycan şairi *Qasimi-Ənvar* (1356-1433) idi. Qasimi-Ənvarın öz ləqəbini məhz Şeyx Sədrəddindən aldığını yazırlar. Şeyxin daha bir müridi, Somuncu Baba ləqəbli Şeyx Həmidəddin Aksarayi (vəf. 1412) səfəviyyə təriqətini Anadolu torpaqlarında təbliğ etmişdir (Bəzi mənbələrdə onu Xacə Əli Siyahpuşun müridi kimi qeyd

edirlər).

***Mənbələr:*** *Şeyx Hüseyn Pirzadə Zahidi. Silsilət ən-nəsəbi-Səfəviyyə, s.39-45; Z.Bayramlı. "Silsilət ən-nəsəbi-Səfəviyyə" əsəri Azərbaycan tarixinin mənbəyi kimi, s.43-47; Azərbaycan tarixi (7 cilddə), III, 27-28; İbn Bəzzaz Ərdəbili. Səfvət əs-səfa, s.1247; İsgəndər bəy Münşi. Tarix-i aləmara-yi Abbasi (tərcümə və şərhlər: O.Əfəndiyev, N.Musalı), s.54-55; Roger Savory. Səfəvilər dövrünün İranı (farsca tərcümə: Kambiz Əzizi), s.11-12; Türkiye Diyanet Vakfı İslam Ansiklopedisi, XXXVII, 377-378; N.Hanif. Biographical Encyclopaedia of Sufis (Central Asia & Middle East), pp.415-417.*



**XACƏ ƏLİ SİYAHPUŞ** (vəf. 1427 və ya 1429) – Səfəvilər sülaləsinin üzvü, *səfəviyyə* təriqətinin banisi Şeyx *Səfiəddin Ərdəbilinin* nəvəsi, *Şeyx Sədrəddinin* oğlu. Xacə Əlaəddin Əli adı ilə məşhurdur. Kərbəla müsibətinə matəm əlaməti olaraq qara libas geyindiyinə görə "Siyahpuş" (qaraya bürünmüş) ləqəbini qəbul etmişdir. Təriqət təlimini atasından almış, onun vəfatından (1391) sonra uzun illər səfəviyyə müridlərinə başçılıq etmişdir. Həyatı haqqında tarixi məlumat azdır, mənqəbə (kəramət və təriflər) xarakterli yazılar əsasında həyatını öyrənmək mümkündür. Səfəvi mənbələrində onun əxlaqi üstünlükləri, möcüzəyə bənzər hərəkətləri (buna *kəramət* deyilir) barədə məlumatlara rast gəlinir. Xacə Əlinin Əmir Teymurla üç dəfə görüşdüyü məlumdur, bu görüşlərin ikisi hərbi yürüşlər zamanı qısa və ayaqüstü olmuşdur. Hər görüş zamanı şeyx özünü hökmdara nişan vermiş və növbəti görüş yerini bildirmişdir. Xacə Əli ilə Əmir Teymurun üçüncü görüşü daha məşhurdur. Ankara qələbəsindən (1402) sonra xeyli əsirlə birlikdə geri qayıdan Əmir Teymur yolüstü Ərdəbil şəhərində Şeyx Səfi xanəgahını ziyarət etmiş, burada Xacə Əlinin kəramətlərini yoxlamaq üçün ürəyində üç niyyət tutmuşdur. Görüş zamanı Xacə Əli hökmdarın hər üç niyyətini söyləyərək qeyb aləmindən məlumatlı olduğunu ona sübut etdi. Şeyxdən ayrılarkən Əmir Teymur ondan nə istədiyini soruşdu və istənilən xahişini yerinə yetirəcəyini vəd verdi. Xacə Əli də hökmdarın özü ilə Osmanlı torpaqlarından gətirdiyi əsirləri ona bağışlamasını istədi. Onun xahişinə əməl edildi və on minlərlə Anadolu əsiri (saylarının 30 min və ya 40 min nəfər olduğunu yazırlar) Ərdəbil təkkəsinə bağışlandı. Bu əsirlərin hamısı Xacə Əli tərəfindən azad olundu və könüllü surətdə səfəviyyə təriqətini qəbul etdi. Onların əksəriyyəti öz vətəninə qayıtmış, beləliklə, Anadoluda *qızılbaş* icmasının özəyi yaranmışdır.

Bu hadisənin həqiqətən baş verib-vermədiyi və təfərrüatı barədə tədqiqatçılar arasında fikir ayrılığı mövcuddur. Xacə Əli ilə Əmir Teymurun görüşünü "Tarixi-aləmarayi-Abbasi" kitabında təsvir edən İsgəndər bəy Münşi yazır: "Xalq arasında belə yayılıb ki, Əmir Teymurun həzrət Sultan Sədrəddin Musa ilə görüşü olmuş və (yuxarıda) deyilənlər ona aiddir. Amma daha doğrusu odur ki, (bu), Sultan Xacə Əli idi. Tarix



kitablarında və bu sülalənin əhvalatına aid nəsr və nəzmlə yazılmış başqa əsərlərdə bu həqirin nəzərinə bu rəvayətin çatmadığına baxmayaraq, onun geniş yayıldığını və dillərə düşdüyünü nəzərə alaraq onu yazdım". Müəllif qeyd edir ki, bu hadisənin baş verdiyini sübut edən və üzərində Əmir Teymurun möhürü olan bir vəqfnamə sənədi I Şah Abbasın zamanında Bəlx şəhərindəki Əndixud qalasının fəthi zamanı qızılbaşların əlinə keçmişdi.

Xacə Əli ömrünün sonlarına yaxın oğlu və canişini *Şeyx İbrahimlə* birlikdə həcc ziyarətinə getmiş, geri qayıdarkən, özünün qabaqcadan xəbər verdiyi kimi, Qüds şəhərində dünyasını dəyişmiş və orada dəfn olunmuşdur. Vəfat tarixi mənbələrdə 1427-ci və ya 1429-cu il kimi qeyd edilmişdir.

Xacə Əlinin Şeyx İbrahim, Şeyx Cəfər və Şeyx Əbdürrəhman adlı üç oğlu olmuşdur. Xacə Əlinin vəfatından sonra səfəviyyə təriqətinə oğlu *Şeyx İbrahim* başçılıq etmişdir. Daha sonra təriqətdə fikir ayrılığı yaranmış, müridlərin bir hissəsi Xacə Əlinin o biri oğlu *Şeyx Cəfərə*, digər hissəsi isə Şeyx İbrahimin oğlu *Cüneydə* tabe olmuşlar.

Xacə Əlinin şairlik istedadı da olmuşdur, *"Silsilət ən-nəsəbi-Səfəviyyə"* kitabında onun divan sahibi olduğu və təriqət üzvləri arasında əsərlərinin çox oxunduğu qeyd edilmiş, şeirlərindən nümunələr verilmişdir.

***Mənbələr:*** *Abbasqulu Ğəffarifərd. Xacə Əli və Əmir Teymur Gürgan ("Xarici əlaqələr tarixi" dərgisi, 1387 h.-ş., №34), s.1-10; İsgəndər bəy Münşi. Tarix-i aləmara-yi Abbasi (tərcümə və şərhlər: O.Əfəndiyev, N.Musalı), s.56-60; Mirzə bəy Cünabədi. Rövzət əs-Səfəviyyə (nəşrə hazırlayan: Q.Təbatəbaiməcd), s.90-91; Cahangüşayi-xaqan (nəşrə hazırlayan: A.D.Müztər), s.24-33; Şeyx Hüseyn Pirzadə Zahidi. Silsilət ən-nəsəbi-Səfəviyyə, s.45-64; Əmir Sədrəddin İbrahim Əmini Hərəvi. Fütuhati-şahi (nəşrə hazırlayan: M.R.Nəsiri), s.32-34; Aləmarayi-Səfəvi (nəşrə hazırlayan: Y.Şükri), s.18-26.*

**İBRAHİM ŞEYXŞAH** (vəf. 1447) – Səfəvilər sülaləsinin nümayəndəsi və *səfəviyyə* təriqətinin *mürşidi*. *Xacə Əli Siyahpuşun* oğlu, *Şeyx Cüneydin* atası. Həyatı haqqında məlumat azdır. Atasının sağlığında təriqət həyatında fəal iştirak etməyə başlamışdır. Xacə Əli son həcc səfərinə yola düşərkən onu öz yerinə Ərdəbildə canişin qoydu. Amma Xacə Əli şəhəri tərk etdikdən bir müddət sonra İbrahim də onun ardınca səfərə çıxdı və yolda atasına yetişdi. Həcc ziyarətini oğlu ilə birlikdə yerinə yetirən Xacə Əli geri qayıdarkən Qüds şəhərində xəstələnib dünyasını dəyişmiş, İbrahim atasını orada dəfn etdikdən sonra təriqətin mürşidi olaraq Ərdəbilə qayıtmış və səfəviyyə müridlərinin başçısı olmuşdu. İsgəndər bəy Münşi "Tarixi-aləmarayi-Abbasi" kitabında onun haqqında yazırdı: "O, ətrafa xəlifələr və əyanlar göndərdi və tez bir zamanda onun uca dərgahı böyüklərin və kiçiklərin müraciət etdiyi yer oldu... Onun yüksək şan-şöhrəti gündən-günə artırdı. O vilayətin adamlarından bir nəfər belə (onun) itaəti vacib olan hökmündən bo-

yun qaçıra bilmirdi. Onun səxavət və kəramət nemətlərindən yoxsullar və möhtaclar, bəlkə də əhalinin hamısı faydalanırdı. Onun abad mətbəxi qızıl və gümüş qablarla dolu idi, o (özü) isə bağışlama və ehsanda ata-babalarından yüksəkdə dururdu. Onun şahanə gözəl xasiyyətləri vardı, bəyənilmiş görkəmi padşaha layiq idi". Şeyx İbrahim Xacə Əlidən (vəf. 1427 və ya 1429) sonra 18 və ya 20 il səfəviyyə təriqətinə rəhbərlik etmiş, ömrünün sonunda müxtəlif xəstəliklərə düçar olmuş, 1447-ci ildə dünyasını dəyişmişdir. Məzarı Ərdəbildəki Şeyx Səfiəddin *xanəgahında*, Səfəvilər sülaləsinin ailəvi məzarlığının qiblə səmtində yerləşir.

Əldə olan məlumatlar bunu söyləməyə əsas verir ki, səfəviyyə şeyxlərinin siyasət səhnəsinə qədəm qoymaları Şeyx İbrahim zamanından başlamışdır. Bundan əvvəl təriqətin başçıları yalnız dini maarifçilik və xeyriyyəçilik fəaliyyəti ilə məşğul olmuş, Ərdəbildə siyasi hakimiyyət sürməmişlər. Şeyx İbrahim Qaraqoyunlularla ittifaqa girərək 1440-cı ildə Cahanşahın tabeliyi altında gürcü qalası Samşvilde üzərinə yürüşə qatılmış və Ərdəbilin hakimi təyin edilmişdi.

Şeyx İbrahim bir neçə qadınla, o cümlədən *Şeyx Musa Sədrəddinin* oğlu Şeyx Cəmaləddinin qızı Xanzadə Paşa bəyimlə (öz əmisi qızı ilə) ailə qurmuş, 6 oğul sahibi olmuşdur. Oğullarından birinin adı Əbu Səid idi və o, Ərdəbil *təkkəsinin* kitabxanasına rəhbərlik edirdi. Şeyx Əbu Səidin də Şeyxican Mirzə və Təqi Mirzə adlı iki oğlu vardı. Şeyxican Mirzənin nəvəsi Qara xan 116 il yaşamış və gözəl Quran qiraətçisi kimi tanınmışdır. Şeyx İbrahimin digər oğullarının adı Seyid Əhməd, Şeyx Bayezid, Xacə Canmirzə və Xacəgidir. Bunların nəsil davamçıları barədə *"Silsilət ən-nəsəbi-Səfəviyyə"* kitabında məlumat verilmişdir. Səfəvi şahlarının şəcərəsi Şeyx İbrahimin digər oğlu *Şeyx Cüneyd* vasitəsilə davam etmişdir. Şeyx Cüneyd atasından sonra səfəvi təriqətinə rəhbərlik uğrunda öz əmisi *Şeyx Cəfərlə* (Şeyx İbrahimin qardaşı) rəqabət halında ömür sürmüşdür.

***Mənbələr:*** *Şeyx Hüseyn Pirzadə Zahidi. Silsilət ən-nəsəbi-Səfəviyyə, s.65-66; İsgəndər bəy Münşi. Tarix-i aləmara-yi Abbasi (tərcümə və şərhlər: O.Əfəndiyev, N.Musalı), s.60-61; Cahangüşayi-xaqan (nəşrə hazırlayan: Allah Dəta Müztər), s.34; İ.P.Petruşevski. XV əsrdə Azərbaycan dövlətləri (Tarix və Fəlsəfə İnstitutunun əsərləri, 1951), I, 100; Z.Bayramlı. "Silsilət ən-nəsəbi-Səfəviyyə" əsəri Azərbaycan tarixinin mənbəyi kimi, s.50; Məhəmməd Yusif Valeh İsfahani. Xüldi-bərin (nəşrə hazırlayan: Mirhaşim Mühəddis), s.47.*



**ŞEYX CÜNEYD** (vəf. 1460) – Səfəvilər sülaləsinin görkəmli nümayəndəsi, ilk Səfəvi hökmdarı *I Şah İsmayılın* babası. Səfəvi təriqətinin şeyxi *İbrahim Şeyxşahın* 6 oğlundan biridir. Təqribən 1429-cu ildə Ərdəbildə doğulmuş, mükəmməl dini və təriqət təhsili almışdır. Əksər mənbələrdə atası İbrahim Şeyxşah 1447-ci ildə vəfat etdikdən sonra səfəviyyə təriqətinə rəhbərlik uğrunda gənc Cüneydlə əmisi *Şeyx Cəfər* arasın-



da rəqabət başladığı bildirilir. Şeyx Cəfəri Qaraqoyunlu hökmdarı Cahan şah himayə edirdi, hətta şeyx öz oğlu Qasimi Cahan şahın qızlarından biri ilə evləndirmişdi. Səbəb olaraq Şeyx Cəfərin siyasətlə maraqlanmaması, lakin gənc, impulsiv xarakterli Cüneydin sərhəd bölgələrindəki xristianlara qarşı qəzavət (dini şüarlar altında yürüş) etməyə meyilli olması göstərilir ki, bu da Cahan şaha sərf etmirdi, o, daha təcrübəli və ehtiyatlı olan Cəfərin tərəfində dururdu və Cüneydi Ərdəbil təkkəsindən uzaqlaşdırmışdı.

Lakin bəzi digər mənbələr Şeyx Cəfərin əslində Şeyx Cüneydin naibi və himayəçisi olduğunu, Şeyx Cüneydə cavan yaşlarında təriqəti idarə etməkdə və Qaraqoyunlu Cahan şahla arası yaxşı olmayan Şeyx Cüneyd yürüş və təbliğat səfərlərində olduqda onu xanəgahda əvəz etməkdə kömək etdiyini bildirir (Həqiqətən, *Uzun Həsən* Qaraqoyunluları məğlub edib səhnədən çıxardıqdan və döyüşdə öldürülmüş Şeyx Cüneydin oğlu *Şeyx Heydər* Ərdəbilə qayıtdıqdan sonra da Şeyx Cəfər Ərdəbil təkkəsinin idarəetməsində qalmaqda davam etmiş, Şeyx Heydərin tərbiyəçisi vəzifəsinə təhkim edilmişdi). Hər bir halda əmisi Ərdəbil xanəgahına rəhbərlik etdiyi ilk dövrlərdə Cüneyd Ərdəbili tərk etmişdi və daha çox yürüşlərdə olurdu (1449).

Cüneyd hələ gənclik dövründən səfəviyyə təriqətini *xanəgah* çərçivəsindən çıxarıb aktiv siyasət meydanına daxil etmək, təriqətin hərbi-siyasi gücünü yaratmaq niyyətində idi. Onun atası İbrahim Şeyxşahın zamanında bu istiqamətdə ilk addımlar atılmışdı. Cüneyd səfəviyyə müridlərini silahlandıraraq hərbi dəstələr yaratdı. O, hökmdarların verdiyi *vəqf* torpaqları ilə kifayətlənmir, təriqətin ixtiyarında olan torpaqları hərbi yürüşlər vasitəsilə genişləndirmək istəyirdi. Məhz onun zamanında Səfəvilər dövlətinin qurulması uğrunda cəhdlər başlamış, bu fəaliyyət oğlu Şeyx Heydər vasitəsilə davam etdirilmiş, nəhayət, nəvəsi İsmayıl tərəfindən uğurla nəticələnmişdir. Şeyx Cüneyd səfəviyyəni təriqət səviyyəsindən yeni bir mərhələyə çıxarmış, bölgənin hərbi-siyasi güclərindən birinə çevirmişdir.

Hələ Cüneyddən də əvvəl Osmanlı sultanları Ərdəbil təkkəsinə nəzirlər və hədiyyələr göndərir, Səfəvi sülaləsinə ehtiramlarını bildirirdilər. Buna görə də Cüneyd Ərdəbili tərk etdikdən sonra əvvəlcə Osmanlı torpaqlarında möhkəmlənmək istədi. Osmanlı sultanı II Murad onun göndərdiyi hədiyyələri qəbul etsə də, hakimiyyəti altındakı torpaqlarda məskunlaşmasına icazə vermədi. Cüneyd Qaramanoğulları bəyliyinin ərazisinə keçib *Varsaq* tayfasının içində təbliğat aparmağa başladı. O, Qaramanoğulları bəyliyinin paytaxtı və mövləviyyə təriqətinin mərkəzi olan Konya şəhərini özünə məskən seçdi. Lakin tezliklə buradakı mövləviyyə şeyxləri ilə onun arasında dini-məzhəbi zəmində qarşıdurma yarandı, hətta mövləvilər səfəviləri kafir adlandırdılar. Qaraman bəylərinin təzyiqi ilə Cüneyd 1456-cı ildə Suriya bölgəsinə köçdü. Buradakı türk-

man tayfaları arasında uğur qazansa da, tezliklə məmlük sultanı Çaxmaq onu sıxışdırmağa başladı, toqquşma zamanı 70 nəfər səfəviyyə müridi həlak oldu. Bundan sonra Cüneyd Qara dənizin cənub sahillərindəki Canik bölgəsinə üz tutdu. Bir müddətdən sonra o öz ətrafına 12 min *mürid* toplamağa nail oldu. Qeyri-müsəlmanlara qarşı cihad etməyə meyilli olan Cüneyd Trabzon imperiyasını özünə hədəf seçərək dövlətin içərilərinə doğru irəlilədi, lakin öz hərbi uğurlarını möhkəmlətməyə fürsət tapmadan Osmanlı qoşununun Trabzon imperiyasına yardıma gəldiyini eşidib geri döndü. Onun budəfəki məskəni Ağqoyunlu *Uzun Həsənin* tabeliyində olan Diyarbəkrin Hisni-keyf şəhəri idi. Uzun Həsənlə Şeyx Cüneydi Qaraqoyunlularla rəqabət amili birləşdirirdi, buna görə Ağqoyunlu hökmdarı səfəviyyə müridlərinin başında duran Cüneydi öz torpaqlarında mehribanlıqla qarşıladı.

Şeyx Cüneyd Uzun Həsənin dövlətində üç il yaşamış (1456-59) və sərbəst şəkildə fəaliyyət göstərmişdir. Diyarbəkir məntəqəsində səfəviyyə xanəgahları quruldu, ətraf bölgələrə xəlifələr göndərildi. Uzun Həsən Cüneydi özünə yaxın müttəfiq hesab edərək bacısı Xədicə xatunu ona ərə verdi; I Şah İsmayılın atası Şeyx Heydər bu izdivacdan doğulmuşdur. Kifayət qədər gücləndiyini düşünən Cüneyd 1459-cu ildə Ərdəbilə qayıdaraq şəhər və xanəgah üzərindəki nəzarəti tam əlinə almaq istədi, lakin Qaraqoyunlu Cahan şahın təzyiqi ilə yenidən Ərdəbildən uzaqlaşdı (Digər mənbələrə görə, yenidən cihad üçün Ərdəbili tərk etdi).

Şeyx Cüneyd 1459-cu ildə öz məqsədini həyata keçirmək – qeyri-müsəlmanlara qarşı cihad etmək üçün Dağıstan istiqamətində hərbi yürüşə yollandı. Onun hədəfi müsəlman sərhədlərini hədələyən xristian çərkəzlər idi. Lakin İsgəndər bəy Münşi "Fütuhati-şahi" əsərinə istinadən yazır ki, Şeyx Cüneyd Şirvanşahla döyüşmək və Şirvan torpaqlarını təsiri altına almaq məqsədilə yürüşə çıxmışdı. Təbii ki, Şirvanşah I Xəlilullah Şeyx Cüneydin minlərlə döyüşçü ilə birlikdə (onun dəstəsində 10 min və ya 20 min nəfər olduğunu yazırlar) onun torpaqlarına girməsini razılıqla qarşılamadı. Çərkəzlərlə Şirvanşahın münasibətləri normal idi, bəzi məlumatlara görə, çərkəzlər ona vergi ödəyirdilər. Şeyx Cüneydlə Şirvanşahın dini əqidəsində fərqlərin olması da onların bir-birinə soyuq münasibətinə səbəb olmuşdu. I Xəlilullah Ərdəbildə Şeyx Cəfərlə Şeyx Cüneydin arasının soyuq olduğunu eşidib xanəgahın Cüneydə dəstək verməyəcəyini düşünərək Cüneydin Şirvan torpaqlarından çıxmasını tələb etdi. Şeyx Cüneyd bu tələbə əhəmiyyət vermədikdə Şirvanşahın hücumu ilə qarşılaşdı. 1460-cı ilin martında o zamanlar Tabasaran adlanan məntəqədə (indiki Dağıstan ərazisi), Samur çayı sahilində baş vermiş döyüşdə səfəvi dərvişləri məğlub oldular. Şeyx Cüneyd aldığı ox yarasından həlak oldu. A.A.Bakıxanov "Gülüstani-İrəm" əsə-



rində yazır: "Onun nəşini Samur çayının sol tərəfində, Qıpçah kəndinin yaxınlığında olan müharibə meydanından çıxarıb Quba və Gülhan nahiyəsinin Quryan (indiki Həzrə) kəndində basdırdılar. Öldürüldüyü yerdə indi də nişanə vardır". *I Şah Təhmasibin* hakimiyyəti dövründə Şeyx Cüneydin cənazəsinin qalıqları Ərdəbilə aparılaraq Səfəvilər sülaləsinə məxsus məqbərədə dəfn edilmiş, Həzrə kəndindəki məzarın üzərində isə xatirə türbəsi tikilmişdir.

Şeyx Cüneydin 2 oğlu olmuşdur. Oğullarından biri *Şeyx Heydərdir* ki, *Uzun Həsənin* bacısı Xədicə xatunla izdivacdan doğulmuşdur; o, I Şah İsmayılın atası, Səfəvi şahlarının ulu babasıdır. Şeyx Cüneydin çərkəz mənşəli (o zamanlar Dağıstanın qeyri-müsəlman xalqlarını ümumi şəkildə bu cür adlandırırdılar) qadından doğulmuş digər oğlunun adı *Xacə Məhəmməddir*. I Şah Təhmasibin zamanında sülalədaxili problemlərin həllində yaxından iştirak etmiş *Məsum bəy Səfəvi* Xacə Məhəmmədin nəvəsidir. Şeyx Cüneydin çərkəz qadından *Xacə Cəmşid* adlı daha bir oğlunun olduğu və onun Şeyx Heydərlə birlikdə Dağıstan iqtiqamətində yürüşə qatılaraq döyüşdə öldürüldüyü bəzi mənbələrdə qeyd edilmişdir (Xacə Cəmşidin məzarının Kubaçi ətrafında olması ehtimal edilir). Şeyx Cüneydin qızı Şahpaşa xatun Xalxaldan olan talış mənşəli Məhəmməd bəylə ailə qurmuş və I Şah İsmayılın uşaqlıq illərində onun təhlükələrdən qorunmasında mühüm rol ifa etmişdir.

***Mənbələr:*** *Bintülhüda Kardeşlik. Akkoyunlu Devleti'nde Tasavvuf ve Tarîkatlar (Yüksek Lisans Tezi), s.96-102; Əhməd Kamranifər. Səfəvilərin qüc qazanmaq yolunda hərbi çalışmaları: Cüneyd, Heydər, İsmayıl (Loristan Universitetinin "İran və İslam tarixi" elmi-ixtisas dərgisi, 1387 h.-ş., №4), s.41-62; Walther Hinz. Uzun Hasan ve Şeyh Cüneyd (çeviren: Tevfik Bıyıklıoğlu); Xurşah ibn Qubad Hüseyni. Tarixi-elçiyi-Nizamşah (nəşrə hazırlayan: M.R.Nəsiri), s.1-2; Tarix-i aləmara-yi Abbasi (tərcümə və şərhlər: O.Əfəndiyev, N.Musalı), s.61-65; Oqtay Əfəndiyev. Azərbaycan Səfəvilər dövləti, s.40; Həsən bəy Rumlu. Əhsən ət-təvarix (nəşrə hazırlayan: Əbdülhüseyn Nəvai), s.14; Həsən bəy Rumlu. Əhsənüt-təvarix (fars dilindən tərcümə və şərhlər: O.Əfəndiyev və N.Musalı), s.228-229; Şeyx Hüseyn Pirzadə Zahidi. Silsilət ən-nəsəbi-Səfəviyyə, s.66-67; M.Tərbiyət. Danişməndani-Azərbaycan, s.321-322; К.Рыжов. Все монархи мира. Мусульманский Восток, XV-XX вв., стр.408; The Cambridge History of Iran, vol. 6, pp.200-205; iranicaonline ("Haydar Safavi").*

**ŞEYX HEYDƏR** (1459/60-1488) – Səfəvilər sülaləsinin görkəmli nümayəndəsi, ilk Səfəvi hökmdarı *I Şah İsmayılın* atası. *Şeyx Cüneydin* Ağqoyunlu hökmdarı *Uzun Həsənin* bacısı Xədicə xatunla izdivacından doğulmuşdur. Atası Şeyx Cüneyd Dağıstan yürüşündə öldürüldüyü zaman (1460) Heydər bir neçə aylıq körpə idi, yaxud bundan bir ay sonra Diyarbəkirdə dünyaya gəlmişdi. Uşaqlıq illəri Uzun Həsənin himayəsi altında keçmiş, mükəmməl dini və dünyəvi təhsil, hərbi təlim almışdı. Bu müddət ərzində Ərdəbildə

səfəviyyə təriqətinə Şeyx Cüneydin əmisi, Qaraqoyunlu Cahan şah tərəfindən himayə olunan *Şeyx Cəfər* başçılıq etmişdir.

1467-ci ildə Ağqoyunlu və Qaraqoyunlu qoşunları arasında baş vermiş Muş döyüşündə birinci tərəf qalib gəldi, ardınca Cahan şah öldürüldü. 1469-cu ildə Uzun Həsən Mahmudabad savaşında Cahanşahın oğlu Həsənəli ilə Teymuri hökmdarı Əbu Səidin müttəfiq qüvvələrini məğlub etdi. Bunun ardınca Uzun Həsən Heydəri də özü ilə Ərdəbilə gətirdi, Şeyx Cəfəri təriqət rəhbərliyindən kənarlaşdıraraq Heydəri bu mənsəbdə təsdiq etdi. Şeyx Cəfər isə Heydərin tərbiyəsi ilə məşğul olmağa təhkim edildi. Heydər yeniyetməlik dövründə də təhsilini davam etdirmiş, hətta nücum elmini də öyrənmişdir. Onun fiziki cəhətdən çox güclü, cəsarətli, hərbi taktikada bacarıqlı olduğunu yazırlar. Silah hazırlamaqla da məşğul idi, düzəltdiyi ox ucluqları yüksək qiymətləndirilirdi.

Şeyx Heydərin ilk silahdaşlarını əsasən Anadolu, Talış və Qaracadağ bölgələrinin mənsubu olan səfəviyyə dərvişləri təşkil edirdi. Sonralar *Şamlu* tayfasından da xeyli adam onun tərəfinə keçdi.

Şeyx Heydər səfəviyyə təriqətinə başçılıq etdiyi dövrdə atası Şeyx Cüneydin diqqət yetirdiyi istiqamətləri daha da genişləndirmişdi. Belə ki, XV əsrin 70-80-ci illərində səfəviyyə təriqətinin ideoloji əsaslarında *şiəlik* xətti güclənmiş, bu xətt təriqətin əsas siması halına gəlmişdi. Səfəvi müridlərinin *"qızılbaş"* adlandırılması ənənəsi də Şeyx Heydərin zamanında və onun bilavasitə səyləri ilə yaranmışdır. Belə ki, Səfəvi mənbələri onun bir gecə yuxuda Həzrət Əlini (ə) gördüyünü, ondan *qızılbaş papağı* hazırlamaq qaydasını öyrəndiyini və bu papağı müridləri arasında tətbiq etmək əmrini aldığını xəbər verir. O vaxtdan Şeyx Heydər ənənəvi türkman börkünü çıxararaq "qızılbaş papağı" və ya "heydəri tac" adlandırılan 12 sarıqlı çalmanı başına qoymuş, tərəfdarlarına da bunu əmr etmişdir. Çalmadakı 12 zolaq *Əhli-beyt* imamlarının sayına və ya təsəvvüfdəki 12 mühüm əxlaqi göstərişə işarədir. Bəzi məlumatlara görə, hətta Uzun Həsən özü Şeyx Heydərin ona göndərdiyi qızılbaş tacını öpüb başına qoymuşdu.

Şeyx Heydər səfəviyyə müridlərinin silahlanmasına xüsusi diqqət yetirir, təriqəti xanəgah çərçivəsindən çıxararaq bölgənin mühüm hərbi-siyasi güclərindən birinə çevirməyə çalışırdı. Onun göndərdiyi *xəlifələrin* fəaliyyəti nəticəsində Anadolu türkmanları ilə əlaqələr inkişaf etdirilmiş və bu tayfalar qızılbaşlığın əsas dayağına çevrilmişdi.

Uzun Həsən Şeyx Heydərin liderlik bacarığını yüksək qiymətləndirir və onu himayə edirdi. Bundan əvvəl bacısı Xədicə xatunu Şeyx Cüneydlə evləndirmiş Ağqoyunlu hökmdarı ömrünün sonlarına yaxın öz qızını – Trabzon (Trapezund) imperatoru IV Böyük İohann Komninin qızı Teodora (*Dəspinə xatun*) ilə izdivacdan doğulmuş *Aləmşah bəyimi* gənc Heydərə ərə verdi. Bu evlilik



nəticəsində Şeyx Heydərin siyasi mövqeyi daha da möhkəmləndi və ətraf bölgələrin hakimləri onunla hesablaşmaq məcburiyyətində qaldılar. Lakin Uzun Həsənin vəfatından (1478) az sonra taxta çıxmış oğlu Sultan Yaqub qızılbaşlara münasibətdə fərqli mövqe tutmağa üstünlük verdi. O, Şeyx Heydərin möhkəmlənərək bölgədə söz sahiblərindən birinə çevrilməsindən narahat olsa da, onunla açıq düşmənçilikdən çəkinirdi. Buna görə Şeyx Heydər çərkəzlər üzərinə ilk yürüşə çıxarkən Şirvanşah Fərrux Yasarın ona öz ölkəsindən keçməyə icazə verməsi üçün Sultan Yaqubdan fərman almağı bacardı. Dağıstana birinci və ikinci yürüşlər uğurlu oldu, qızılbaşlar xeyli əsir və bol qənimətlə Ərdəbilə döndülər. Ağqoyunlu hökmdarı Şeyx Heydərin artmaqda olan nüfuzundan narahat olaraq şəxsən görüşmək üçün onu Təbrizə dəvət etdi. Görüş zamanı o, qızılbaş liderinə siyasi fəaliyyətlə məşğul olmaqdansa, təriqət işləri ilə kifayətlənməyi məsləhət gördü. Lakin üstündən bir müddət keçdikdən sonra Gürcüstan sərhədində yaranmış gərginliyi aradan qaldırmaq üçün Sultan Yaqub özü Şeyx Heydərdən xahiş etdi ki, başçılıq etdiyi silahlı qüvvə ilə bölgəyə gedib hadisələrə müdaxilə etsin. Şeyx Heydər Gürcüstan səfərinə çıxmazdan əvvəl gərginlik aradan qalxdı, o isə səfərbər etdiyi müridləri yenidən Dağıstan üzərinə istiqamətləndirməyi qərara aldı (1488). Bəzi mənbələr bu yürüş zamanı Şeyx Heydərin öz fikrini dəyişərək çərkəzlərlə deyil, Şirvanşahla döyüşmək və atasının intiqamını almaq fikrinə düşdüyünü xəbər verir. Bu yürüşü gözləməyən Fərrux Yasar qızılbaşlarla təkbaşına bacarmayacağını anlayıb əvvəlcə Gülüstan qalasına çəkildi. Qızılbaşlar Şamaxını ələ keçirib Gülüstan qalasını mühasirəyə aldılar. Şirvanşahın yardım çağırışına cavab olaraq müttəfiqi (o cümlədən kürəkəni) olan Sultan Yaqub Süleyman bəy Bicənoğlunun başçılığı altında Ağqoyunlu qüvvələrini Şirvana yolladı. Şeyx Heydər bunu eşidib Şamaxıdan çıxdı və şimal istiqamətində irəliləyərək Dərbənd qalasını mühasirəyə aldı. Bu arada Fərrux Yasarla Süleyman bəy Bicənoğlunun birləşmiş qüvvələrinin hücumu barədə Şeyx Heydərə xəbərdarlıq etdilər. O, Dərbəndin mühasirəsini yarımçıq buraxaraq döyüş mövqeyinə doğru irəlilədi. 1488-ci ilin iyulunda Şahdağın ətəklərində (mənbələrdə buralar Tabasaran adlandırılır) tərəflər qarşılaşdı. Qızılbaşlar şücaətlə döyüşərək sayca çox olan düşmənə layiqli müavimət göstərirdilər. Həsən bəy Rumlu "Əhcən ət-təvarix" kitabında yazır ki, döyüş meydanında Şeyx Heydər Ağqoyunlu sərkərdəsi Süleyman bəy Bicənoğlu ilə üz-üzə gəldi, nizə zərbəsi ilə onu atından yerə yıxdı, amma öldürməyib sağ buraxdı. Səbəbini soruşanlara isə dedi ki, Süleyman bəy onsuz da yaxın günlərdə döyüşdə öldürüləcək, mən özüm isə bugünkü döyüşdə həlak olacağam. Şiddətli döyüş zamanı Şeyx Heydər oxla öldürüldü (Bəzi məlumatlara görə, bu oxu atan düşmən tərəfdən deyil, qızılbaş qoşu-

nundan idi və o, başqa döyüşçünü nişan almış, amma ox Şeyx Heydərə dəymişdi).

Səfəvi liderinin başını kəsib Sultan Yaquba göndərdilər, başsız cənazəni isə tərəfdarları döyüş meydanından kənara çıxarıb gizli bir yerdə dəfn etdilər. Sultan Yaqub qızılbaşların ibrət alması üçün Şeyx Heydərin başını Təbriz meydanından asdırsa da, gecə səfəviyyə müridləri kəsik başı oğurladılar. I Şah İsmayıl Təbrizi ələ keçirəndə (1501) atasının kəsik başını ona gətirdilər. Bir neçə ildən sonra şahın əmri ilə Şeyx Heydərin gizli məzarının yeri öyrənildi və cənazənin qalıqları Ərdəbilə gətirilib *Şeyx Səfi kompleksindəki* türbədə torpağa tapşırıldı. Xızı rayonunun Tıxlı kəndindən 3 km məsafədə, Beşbarmaq dağının arxasında yerləşən əvvəlki məzarın üzərində ucaldılmış xatirə məqbərəsi isə hazırda dağılmış haldadır.

Şeyx Heydərə aid edilən daha bir məqbərə indiki Dağıstan ərazisində, Tabasaran mahalının Tinit kəndinin yaxınlığında yerləşmiş və uzun əsrlər boyunca insanların ziyarət yeri olmuşdur. A.A.Bakıxanov bu məzar haqqında yazırdı: "Onun qəbri Tabasaranın Ətək mahalında, Rubas çayının sol kənarındadır. Bu qəbir Tinit kəndinin bir ağaclığında olub, üzərindəki günbəz indi də yerli əhalinin ziyarətgahıdır".

Şeyx Heydərin indiki İran ərazisində, Ərdəbil yaxınlığındakı Mişkinşəhrdə dəfn edilməsi barədə də məlumatlar vardır, hazırda burada böyük türbə mövcuddur.

Şeyx Heydərin birinci həyat yoldaşı Uzun Həsənin qızı *Aləmşah bəyimdir* (Əsl adının Marta və ya Həlimə xatun olduğunu yazırlar). Bu izdivac Uzun Həsənin sağlığında, yəni 1478-ci ildən əvvəl baş tutmuşdur.

Şeyx Heydər Dağıstan yürüşlərindən əsir tutduğu çərkəz mənşəli bir neçə cariyə ilə də nikahda olmuşdur. İtalyan səyyahı Caterino Zenonun xatirələrində təsvir edilən, amma digər mötəbər mənbələrdə təsdiqini tapmayan bir məlumat I Şah İsmayıl barədə sonralar həqiqətdən uzaq iftiranın yayılmasına səbəb olmuşdur. Belə ki, Səfəvi hökmdarını gözdən salmaq istəyən bəzi sonrakı müəlliflər onun guya öz doğma anasını (yəni Aləmşah bəyimi) öldürtdüyünü yazmışlar. Halbuki C.Zenonun yazısından həmin qadının Şeyx Heydərin başqa xanımı olduğu, Şeyx Heydərin ölümündən sonra onun düşmənlərindən, yəni Sultan Yaqubun tərəfdarlarından birinə ərə getdiyi, buna görə şah tərəfindən öldürüldüyü iddia edilir.

Şeyx Heydərin Aləmşah bəyimlə izdivacdan 6 uşağı – 3 oğlu və 3 qızı olmuşdur. Böyük oğlu *Sultan Əli* atasından sonra səfəviyyə təriqətinə başçılıq etmişdir. Aləmşah bəyimlə Şeyx Heydərin ikinci oğlu *İbrahim Mirzə*, kiçik oğlu isə İsmayıl Mirzədir (gələcək I Şah İsmayıl). Bu izdivacdan doğulmuş qızlardan Fəxricahan xanım qızılbaş sərkərdəsi *Bayram bəy Qaramanlu* ilə, Fatimə sultan digər qızılbaş sərkərdəsi *Məhəmməd xan Ustaclu* ilə ailə qurmuşdur. Şeyx Heydərin kürəkənləri arasında *Əbdi bəy Şamlu*, *Hüseyn bəy Lələ*



*Şamlu* və Hisni-keyf hakimi Sultan Xəlilin də adları qeyd edilir.

Şeyx Heydərin Dağıstan yürüşlərindən əsir tutduğu çərkəz mənşəli cariyələrdən daha 9 övladının doğulduğunu yazırlar. Oğullarının ümumi sayının 7 olduğunu nəzərə aldıqda məlum olur ki, çərkəz cariyələrdən dünyaya gəlmiş övladların 4-ü oğlan, 5-i qız imiş. Bunlardan biri çərkəz mənşəli *Ana xatunun* (vəf. 1524-dən sonra) dünyaya gətirdiyi *Süleyman Mirzədir*. Digər 3 oğulun adları isə Həsən Mirzə, Davud Mirzə və Mahmud Mirzə olmuşdur. Həsən bəy Rumlu "Əhsən ət-təvarix" kitabında yazır ki, balaca İsmayıl Mirzə bir dəstə qızılbaş tərəfindən gizlədilmək üçün Rəştə aparıldıqda bu 4 qardaş da onu müşayiət etmiş, bəzi məlumatlara görə isə, Rəştdə ona qoşulmuşlar. Süleyman Mirzədən başqa digər 3 qardaşın taleyi barədə məlumat yox dərəcəsindədir. İsgəndər bəy Münşi onlar barədə məlumata malik olmadığını qeyd etməklə yanaşı bunu yazır: "Seyid Mahmud Mirzə Sultan Heydərin əzəmətli övladlarının Şirazın İstəxr qalasına aparıldıqları ildə vəfat etmiş və Şirazın Ovcan adlı yerində dəfn olunmuşdur". "Silsilət ən-nəsəbi-Səfəviyyə" kitabında isə İsmayıl Mirzənin Gilanda sığınacaq tapması ilə yanaşı bütün qardaşlarının "münafiqlərin əli ilə" öldürüldüyü qeyd edilir.

***Mənbələr:*** *Tarix-i aləmara-yi Abbasi (tərcümə və şərhlər: O.Əfəndiyev, N.Musalı), s.65-70; Həsən bəy Rumlu. Əhsənüt-təvarix (fars dilindən tərcümə və şərhlər: O.Əfəndiyev və N.Musalı), s.325-327; Şeyx Hüseyn Pirzadə Zahidi. Silsilət ən-nəsəbi-Səfəviyyə, s.67-68; Namiq Musalı. Şah İsmayıl Xətainin anası Aləmşah bəyim: əfsanələr və həqiqətlər (Alevilik-Bektaşilik Araştırmaları Dergisi/2016/13), s.35-59; Aləmarayi-Səfəvi (nəşrə hazırlayan: Yədullah Şükri), s.30-32; Seyid Həsən ibn Mürtəza Hüseyni Astarabadi. Tarixi-sultani (nəşrə hazırlayan: Ehsan İşraqi), s.26-28; Bintülhüda Kardeşlik. Akkoyunlu Devleti'nde Tasavvuf ve Tarîkatlar (Yüksek Lisans Tezi), s.102-105; Cahanbəxş Səvaqib. Səfəvi şeyxlərinin Şirvanşahlarla hərbi-siyasi əlaqələrinin təhlili (İsfahan Universiteti Ədəbiyyat və humanitar elmlər fakültəsinin elmi-araşdırma dərgisi, 1393 h.-ş., №17), s.1-34; Əhməd Kamranifər. Səfəvilərin qüc qazanmaq yolunda hərbi çalışmaları: Cüneyd, Heydər, İsmayıl (Loristan Universitetinin "İran və İslam tarixi" elmi-ixtisas dərgisi, 1387 h.-ş., №4), s.41-62; Əmini. Fütuhati-şahi (nəşrə hazırlayan: Məhəmməd Rza Nəsiri), s.43-59; Walther Hinz. Uzun Hasan ve Şeyx Cüneyd (türkcə tərcümə: Tevfik Bıyıklıoğlu), s.62-76; Namiq Musalı. Səfəvi səltənətində ilk taxt davası: Süleyman Mirzə üsyanı (XVIII. Türk Tarih Kongresi, 1-5 Ekim 2018, Kongreye Sunulan Bildiriler, VI. Cilt), s.685-708; A.A.Bakıxanov. Gülüstani-İrəm, s.107-108; К.Рыжов. Все монархи мира. Мусульманский Восток, XV-XX вв., стр. 408; The Cambridge History of Iran, vol. 6, pp.207-209; iranicaonline ("Haydar Safavi").*



**I ŞAH İSMAYIL** (27 iyul 1487 – 23 may 1524) – Səfəvilər dövlətinin banisi və ilk hökmdarı (hakim. 1501-1524). Səfəviyyə təriqətinin banisi *Şeyx Səfiəddin Ərdəbilinin* altıncı nəsildən xələfi, *Şeyx Heydərin* (1459/60-1488) oğludur. Anası Ağqoyunlu hökmdarı *Uzun Hə-*

*sənlə* Trabzon (Trapezund) imperatoru IV Böyük İohann Komninin qızı Teodoranın (*Dəspinə xatun*) izdivacından doğulmuş *Aləmşah bəyimdir* (1460-1522/23). Şeyx Heydərlə Aləmşah bəyimin üç oğlundan ən kiçiyi idi. Beləliklə, I Şah İsmayıl həm də Uzun Həsənin nəvəsi olmaqla Ağqoyunlular sülaləsinin varisi sayılır.

I Şah İsmayıl atasının Dağıstana hərbi yürüş zamanı öldürülməsindən bir il əvvəl Ərdəbildə doğulmuşdur (Görkəmli Səfəvi tarixçisi İsgəndər bəy Münşi "Tarixi-aləmarayi-Abbasi" əsərində qeyd edir ki, I Şah İsmayılın hicri təqvimlə doğum tarixinin (892) əbcəd hesabı ilə qarşılığı "bədvi-dövləti-qızılbaş" (Qızılbaş dövlətinin başlanğıcı) ifadəsinə uyğundur). Bundan sonra dayısı, Ağqoyunlu Sultan Yaqubun əmrinə əsasən anası və qardaşları ilə birlikdə Şirazın İstəxr qalasında həbsə atılmış, 5 il burada məhbus həyatı yaşamışdır (1488-93). Növbəti Ağqoyunlu hökmdarı Rüstəm padşah onları həbsdən azad edərək Təbrizə gətirdi. Rüstəm padşahın məqsədi Uzun Həsənin varislərinin taxt-tac uğrunda mübarizəsində Şeyx Heydərin böyük oğlu *Sultan Əli Mirzənin* siyasi nüfuzundan və hərbi bacarığından istifadə etmək idi. 1493-cü ildə Sultan Əli Mirzənin başçılıq etdiyi qızılbaş dəstələri ilə Rüstəm padşahın müttəfiq qüvvələri Ağqoyunlu şahzadəsi Baysunqur Mirzənin qoşununu məğlub etdi. Sultan Əli Mirzənin artmaqda olan nüfuzundan narahat olan Rüstəm padşah onu aradan götürməyi qərara aldı. Sultan Əli Mirzə bundan xəbər tutub qardaşlarını da özü ilə götürdü və 400 (və ya 700) nəfər qızılbaşın əhatəsində Təbrizdən çıxıb Ərdəbilə sarı hərəkət etdi. Ərdəbil yaxınlığındakı Şəmasi kəndində Rüstəm padşahın göndərdiyi qoşunla döyüşdə Sultan Əli Mirzə öldürüldü (1494). Amma o, bundan əvvəl səfəviyyə təriqətinə rəhbərliyi kiçik qardaşı İsmayıl Mirzəyə vəsiyyət etdi. Beləliklə, 1494-cü ildə 7 yaşlı İsmayıl Mirzə səfəviyyə şeyxlərinin varisi və qızılbaşların *mürşidi-kamili* (kamil rəhbəri) oldu.

Sadiq qızılbaş müridlərinin səyləri ilə İsmayıl Mirzə əvvəlcə bir müddət ata yurdu olan Ərdəbildə fərqli məkanlarda gizləndi. Onun mühafizəsi ilə bibisi Şahpaşa xatun, onun əri Məhəmməd bəy Türkman, Məhəmməd bəyin qardaşı Əhməd bəy, həmçinin *Hüseyn bəy Lələ Şamlu, Xadim bəy Xüləfa, Abdal bəy Dədə Zülqədər, Rüstəm bəy Qaramanlu,* Mənsur bəy Qıpçaq, Qırx Sidi Əli, Cülban bəy, Göyəli bəy və b. məşğul olurdular. Balaca İsmayılı Ağqoyunlu casuslarının təqibindən qorumaq üçün Qazı Əhməd Kakuli adlı qızılbaş müridinin, Xancan xatun və *Zülqədər tayfasından* Übeyi-cərrahə adlı qadınların evində, Ərdəbil cümə məscidindəki sərdabada gizlədirdilər. Bir müddətdən sonra İsmayıl Mirzənin təhlükəsizliyindən narahat olan qızılbaşlar onu Rəşt şəhərinə apardılar. Onun növbəti sığınacağı Gilanın Biyə-piş bölgəsinin hakimi Mirzə Əli Kərkiyanın Lahicandakı sarayı oldu. Burada Rüstəm padşahın əlaltılarından gizlənən İsmayıl



Mirzəyə görkəmli din alimi *Mövlana Şəmsəddin Lahici* Quranı və zəruri dini elmləri öyrətdi (O, sonralar Səfəvilər dövlətində ilk *sədr* vəzifəsini tutmuşdur). Bu müddət ərzində Şeyx Heydərin müridləri ona *səfəviyyə təriqətinin* və *qızılbaş* inancının incəliklərini də təlim etdilər. İsmayıl Mirzənin tərbiyəçiləri sırasında iki nəfər xüsusi seçilirdi. Bunlardan biri onun *lələsi* (dünyəvi məsələlərdə tərbiyəçi və məsləhətçisi) *Hüseyn bəy Lələ Şamlu*, digəri isə *dədəsi* (təriqət məsələlərində müəllimi) *Abdal bəy Dədə Zülqədər* idi. Lahicanda keçirdiyi illər ərzində gələcək şah fiziki cəhətdən möhkəmləndi, hərb sənətini öyrəndi, dini-əxlaqi elmləri mənimsədi. 12 yaşında o öz yaşıdlarını xeyli üstələyən geniş dünyagörüşünə, erudisiyaya, fiziki gücə və cəsarətə sahib idi. Ətraf bölgələrin qızılbaşları gizlicə Lahicana gəlib ona öz sədaqətlərini bildirirdilər.

1499-cu ilin avqustunda İsmayıl Mirzə dövlət quruculuğu sahəsində ilk ciddi addımlarını atmağa başladı. O, *"əhli-ixtisas"* adlandırılan yeddi qızılbaş əmirinin əhatəsində Lahicandan çıxaraq Ərdəbil istiqamətində hərəkətə keçdi (yeddi qızılbaş əmiri *Hüseyn bəy Lələ Şamlu, Abdal bəy Dədə Zülqədər, Xadim bəy Xüləfa Talış, Rüstəm bəy Qaramanlu, Bayram bəy Qaramanlu, İlyas bəy Ayqutoğlu Xınıslu* və *Qara Piri bəy Qacardan* ibarət idi). Yol boyunca İsmayıl Mirzənin ətrafındakı dəstənin sayı qızılbaş tayfalarının hesabına artırdı. Tarom və Xalxalda xeyli *Rumlu* və *Şamlu* tayfasının nümayəndəsi ona qoşuldu. Artıq onun ətrafında 1500 nəfərdən çox silahlı qüvvə var idi. Ərdəbil hakimi Əli bəy Cagirlü şəhərə girməyə icazə vermədiyi üçün qızılbaşlar Xəzər dənizinin cənub-qərb sahillərinə (Talış diyarına) çəkildilər. Buranın hakimi Mirzə Məhəmməd sultan Talış İsmayıl Mirzəni ehtiramla qarşılayıb qonaq saxladı. 1499/1500-ci illərin qış mövsümünü Astaranın Ərcüvan (indiki Ərçivan) kəndində keçirən İsmayıl Mirzə növbəti ilin yazında yenidən Ərdəbilə üz tutdu. Burada o, anası Aləmşah bəyimlə və bundan əvvəl bura gəlmiş qardaşı Sultan İbrahim Mirzə ilə görüşdü, *Şeyx Səfi xanəgahını* və əcdadlarının məzarını ziyarət etdi.

1500-cü ilin yazında İsmayıl Mirzə tərəfdarlarının məsləhəti ilə Ərzincan istiqamətində yola çıxdı. Bu yolu seçməkdə onun məqsədi Anadolu və Şamdakı qızılbaşların vəziyyətini daha yaxından öyrənmək və buradan özünə tərəfdar toplamaq idi. Qarabağ torpaqlarını keçdikdən sonra Göyçə gölünün yaxınlığında *Zülqədər* tayfasından və *Əfşar* tayfasının *Ərəşlü* oymağından xeyli döyüşçü onun dəstəsinə birləşdi. Beləliklə, İsmayıl Mirzə Anadolu torpaqlarına daxil olmazdan əvvəl onun ətrafında kifayət qədər böyük hərbi qüvvə var idi. Bu fakt qızılbaş qoşununun yalnız Anadolu sakinlərindən ibarət olması barədə bəzi tədqiqatçıların irəli sürdükləri iddianı rədd edir. Əlbəttə, ilk qızılbaş qoşununun böyük bir qismi Anadoludakı türkman tayfalarından toplanmışdı, daha sonralar da Səfəvi qoşununda Anadoludan köçüb gəlmiş tayfalar üstünlük

təşkil edirdi, lakin onlarla yanaşı Azərbaycan əhalisinin də bu qoşunda geniş surətdə təmsil olunduğu şübhəsizdir.
İsmayıl Mirzə Çuxursədi keçdikdən sonra Dokuz Ulam məntəqəsində *bayburtlu* Qaraca İlyasın başçılığı altında bir dəstə qızılbaş onun tərəfinə keçdi. Qaraca İlyasın düşməni Məntəşin qalası qızılbaşlar tərəfindən ələ keçirildi. Bingöl yaylasında *Ustaclu* tayfasının igidlərinin hesabına qızılbaş qoşunu daha da gücləndi. 1500-cü ilin ortalarında İsmayıl Mirzə Ərzincana çatdı. Sayı 7 minə çatan qızılbaş qoşununda *Şamlu, Rumlu, Zülqədər, Əfşar, Ustaclu, Təkəlü, Qacar, Varsaq* tayfaları, eləcə də *Qaradağ sufiləri* və *talışlar* təmsil olunmuşdu. Ərzincanda 13 yaşlı İsmayıl Mirzə öz fiziki gücünü və ovçuluq bacarığını nümayiş etdirərək bölgə camaatını qorxu içində saxlayan nəhəng ayını təkbaşına öldürdü.
Ərzincanda bir qədər dincəldikdən və təşkilatlanma işlərini tamamladıqdan sonra növbəti hədəfin təyin edilməsi üçün müşavirə keçirildi. Bəziləri burada qışlayıb növbəti ildə Ağqoyunlu Əlvənd Mirzənin üzərinə yürüməyi, bəziləri Gürcüstana basqın etməyi, bəziləri də Çuxursədə istiqamət götürüb orada qışın bitməsini gözləməyi təklif etdilər. Lakin sonda bu təkliflərin heç biri üstünlük qazanmadı və *Şirvanşahlar dövlətinin* üzərinə hücum etmək qərara alındı. Bununla İsmayıl Mirzə Ağqoyunlularla ciddi müharibəyə başlamazdan əvvəl onların şimal müttəfiqi olan Şirvanşahlar dövlətini zərərsizləşdirmək istəyirdi. Şirvan istiqamətində yola çıxmazdan əvvəl Xadim bəy Xüləfanın başçılığı altında qızılbaşlar Gürcüstan üzərinə yürüş edib çoxlu qənimətlə qayıtdılar.
Şirvanşah Şamaxını tərk edib əvvəlcə Qəbələyə, daha sonra Buğurt qalasına sığındı, axırda daha yaxşı müdafiə imkanı olan Gülüstan qalasına doğru geri çəkildi. Amma 1500-cü ilin son rübündə Cabanı çölündə qızılbaşlar Şirvan qoşununu haqladılar. İsmayıl Mirzənin başçılığı altında döyüşən 7 minlik qızılbaş birləşməsi Şirvanşahın 20 min süvaridən və 6 min piyadadan ibarət hərbi qüvvəsini darmadağın etdi. 13 yaşlı İsmayıl Mirzə *Cabanı döyüşündə* özünün ilk parlaq qələbəsini qazandı. Şirvanşah Fərrux Yasar döyüşdən qaçarkən öldürüldü, oğlu Şeyxşah ordunun qalıqlarını toplayıb savaş meydanından çıxartdı.
Cabanı zəfərindən sonra Mahmudabadda qışlamağı qərara alan İsmayıl Mirzə öz sərkərdələrini Şirvanşahlar dövlətinin ikinci şəhəri olan Bakını ələ keçirməyə göndərdi, amma fəthin yubandığını görüb şəhərin mühasirəsini öz öhdəsinə götürdü. Onun düzgün hərbi strategiyası nəticəsində şəhər tezliklə təslim oldu. Bundan sonra Şirvan döyüşçülərinin sığındığı Şamaxı ətrafındakı qalalar mühasirəyə alındı. Gülüstan qalasının mühasirəsi zamanı Ağqoyunlu Əlvənd Mirzənin qoşun toplayaraq Naxçıvan tərəfdən hücuma hazırlaşması barədə məlumat gəldi. Ötən illər ərzində Ağqoyunlu hakimiyyətində mü-



əyyən dəyişikliklər baş vermiş, hökmdarlar bir-birini əvəz etmişdi. Rüstəm padşahdan sonra Gödək Əhməd və Məhəmməd Mirzə qısa müddət ərzində dövləti idarə etdilər. Onlardan sonra hakimiyyətə iddialı olan iki şahzadə – Uzun Həsənin nəvələri Əlvənd Mirzə və Sultan Murad dövləti öz aralarında iki hissəyə böldülər. Qızılüzən çayından şimalda olan torpaqlar (indiki Şimali və Cənubi Azərbaycan) Əlvənd Mirzəyə, qalan ərazilər isə Sultan Murada verildi. Əlvənd Mirzənin hücum xəbərini eşitdikdən sonra İsmayıl Mirzə yuxuda imamlardan əmr aldığını bildirərək Gülüstan qalasını mühasirədə saxlayan qızılbaş əmirlərə: "Sizə Gülüstan qalası lazımdır, yoxsa *Azərbaycan taxtı*?" – deyə müraciət etdi. Qərara əsasən mühasirə dayandırıldı və qızılbaş qoşunu Naxçıvan istiqamətində yürüşə başladı. 1501-ci ilin ortalarında *Şərur* düzündə İsmayıl Mirzə Ağqoyunlu hökmdarı Əlvənd Mirzənin sayca dörd dəfə artıq olan qoşununu məğlubiyyətə uğratdı. Bununla da Azərbaycan torpaqlarının qızılbaşlar tərəfindən fəthi yekunlaşdı.

1501-ci ilin payızında İsmayıl Mirzə təntənə ilə *Təbrizə* daxil olub özünü şah elan etdi. Şəhərin Cümə məscidində 12 imamın adına xütbə oxundu, üzərində imamların adları həkk edilmiş sikkələrin zərb olunmasına göstəriş verildi. Əhli-beyt yolu yeni qurulan dövlətin əsas ideoloji xətti elan edildi. Təbriz camaatından bu əqidə üzərində hakimiyyətə beyət alındı. Ardınca Səfəvilər dövlətinin idarəçilik aparatı qurulmağa başladı, görkəmli qızılbaş əmirləri mühüm dövlət vəzifələrinə təyinat aldılar, bölgələrin idarəçiliyi onların arasında bölüşdürüldü. I Şah İsmayılın hakimiyyətə keçməsi klassik mənbələrdə "Azərbaycan taxtına oturmaq" kimi təqdim edilmişdir. Artıq ona "xaqani-sahibqiran Süleyman-şan İsmayıl Bahadur xan" və "İsgəndər-şan" ləqəbləri ilə müraciət edirdilər. Bu ləqəblərdə I Şah İsmayıl müsəlman dünyasında ən möhtəşəm hökmdarlar kimi tanınan Süleyman peyğəmbərə (ə) və İsgəndər Zülqərneynə bənzədilir, eləcə də "sahibqiran" ləqəbinin şəriksiz ünvanı olan Əmir Teymura tay tutulurdu (Bu ləqəb planetlərin bir xətt üzrə düzüldüyü gündə (buna nücum elmində "qiran" deyilir) doğulan hökmdarlara verilirdi. Bu sözün ədalətli hakim və ya uzun müddət (30 ildən artıq) hökm sürmüş padşah kimi digər mənaları da vardır). "Bahadur xan" ləqəbi isə onun *Ağqoyunlu dövlətinin* varisi olduğunu diqqətə çatdırırdı. I Şah İsmayıl öz məktublarını "Əbül-Müzəffər Şah İsmail Bahadur əs-Səfəvi" şəklində imzalayırdı. Düşmənləri ona "şeyx oğlu", "sufi şah", "sufi oğlu", "Ərdəbil oğlu" ləqəblərini verməklə aşağılamağa çalışırdılar.

1503-cü ildə I Şah İsmayıl Fars və İraqi-Əcəm torpaqlarını öz tabeliyində saxlayan Ağqoyunlu şahzadəsi Sultan Murada namə yollayıb onu itaətə çağırdı. Təklif rədd edildikdən sonra 1503-cü il iyun ayının 21-də Həmədan yaxınlığındakı *Almabulağı* (və ya Almaqulağı) adlı məkanda tərəflər qarşılaşdı.

Osmanlı dövlətindən aldığı canlı qüvvə və silah-sursat yardımı Sultan Muradı məğlubiyyətdən xilas edə bilmədi. Döyüş I Şah İsmayılın seçdiyi düzgün taktika və qızılbaşların şücaəti sayəsində qələbə ilə nəticələndi. 70 min nəfərlik Ağqoyunlu qoşunu böyük itki verdi, xeyli sərkərdə öldürüldü və əsir alındı, Sultan Murad savaş meydanından qaçdı. Almabulağı zəfərindən sonra Azərbaycanla yanaşı indiki İran torpaqlarının, demək olar ki, hamısı (Xorasan və bəzi müstəqil bölgələr istisna olmaqla) I Şah İsmayılın ixtiyarı altına keçdi, Səfəvilər dövləti bölgənin güc mərkəzlərindən birinə çevrilməyə başladı.

Növbəti illərdə mərkəzi hakimiyyətə qarşı çıxan və itaətsizlik göstərən yerli hakimlərin müqavimətinin qırılması istiqamətində hərbi əməliyyatlar həyata keçirildi. Mazandaran bölgəsində hökm sürən *Əmir Hüseyn Kiya Çəlavi* şiə (zeydi) məzhəbində olsa da, Sultan Muradın məğlub qoşununun qalıqlarına sığınacaq vermişdi. O, ətraf bölgələrə talançı yürüşlər edirdi, hətta qızılbaş sərkərdəsi *İlyas bəy Ayqut oğlu Xınıslunu* hiylə ilə ələ keçirib öldürmüşdü. 1504-cü ildə I Şah İsmayıl şəxsən qoşunun başında hərəkət edib bir-birinin ardınca Çəlavinin ixtiyarındakı qalaları fəth etdi. Üsyançıların son sığınacağı Usta qalası da süqut etdikdən sonra bölgədə sakitlik bərqərar oldu.

Bu arada Yəzd şəhərini bura hakim təyin edilmiş *Hüseyn bəy Lələ Şamlunun* adından idarə edən Şüeyb ağa şəhərin nüfuzlu şəxslərindən olan Xoca Sultan Əhməd Saruyi tərəfindən öldürüldü. Qarışıqlıqdan istifadə edən Əbərquh hakimi *Məhəmməd Rəis Kərrə* Yəzdə hücum edib şəhəri ələ keçirdi və şaha tabe olmadığını elan etdi. I Şah İsmayılın ümumi başçılığı və *Durmuş xan Şamlunun* sərkərdəliyi altında hərəkət edən qızılbaş qoşunu Yəzdi tutdu, şəhər qarnizonunu ciddi cəzalandırdı (1504).

Yəzd uğrunda döyüşlər getdiyi bir vaxtda xəbər gəldi ki, Teymurilərin hərbi dəstəsi Kirman şəhərində soyğunçuluq edib. İnsidenti nizamlamaq üçün Xorasanın Teymuri hakimi *Sultan Hüseyn Bayqara* öz elçilərini şahın hüzuruna göndərdi, lakin onun bir qədər etinasız məktubu və hədiyyələri şahı razı salmadı. Şah qoşunu Xorasan bölgəsinə yönləndirdi və Təbəs şəhərini qarət etdi. Teymuri hökmdarı üzrxahlıq edərək onun qəzəbini yumşalda bildi.

I Şah İsmayıl fütuhatla yanaşı ölkədəki asayişi qorumaqla da məşğul olur və öz nümayəndələrinin rəiyyətlə rəftarını izləyirdi. Həmin dövrdə Fars vilayətinin hakimi *Keçəl İlyas bəy Zülqədər* tabeliyində olanların şikayətləri əsasında mühakimə edilib edam olundu.

1504/05-ci ilin qış mövsümünü İsfahanda keçirən I Şah İsmayıl *Nəqşicahan meydanında* Osmanlı sultanı II Bayezidin elçilərini təntənəli şəkildə qəbul etdi. Sultan Səfəvi hökmdarının qələbə xəbərlərinə cavab olaraq onun hakimiyyətini tanıdığını bildirirdi.

1505-ci ilin yaz mövsümünü İsfahan ətrafındakı yaylaqda ov etməklə keçirən şah daha sonra Həmədana yola düşdü



və buradakı İmamzadə Səhl Əli türbəsini təmir etdirdi. Həmin il üsyançı bölgə əmirlərinə qarşı cəza tədbirləri davam etdirildi. Rəşt hakimi Hüsaməddin itaətsizlik göstərsə də, daha sonra təslim olub bağışlandı. 1506-cı ildə kürd tayfalarını başına toplayıb ətraf bölgələrə soyğunçu yürüşlər təşkil edən *Sarom xan Kürd* Urmiya qalasını ələ keçirib qızılbaş qarnizonunu xəyanətlə öldürdü. I Şah İsmayıl bir neçə qızılbaş sərkərdəsini qardaşı *İbrahim Mirzənin* ixtiyarına verərək Sarom xanın üzərinə yolladı. İlk toqquşmalar kürdlərin ikiqat say çoxluğu üzündən qızılbaşlar üçün o qədər də uğurlu olmadı, *Saru Əli bəy Təkəlü Möhürdar* döyüşdə öldürüldü. Sarom xan iki qardaşını və oğlunu itirsə də, müqavimət göstərməkdə davam edirdi. *Əbdi bəy Şamlunun* və oğlu Durmuş xanın başçılıq etdiyi yardımçı dəstələr də müharibənin gedişini dəyişə bilmədi, Əbdi bəy həlak oldu, Durmuş xan yaralandı. Bu zaman I Şah İsmayılın şəxsən hərbi əməliyyatlara müdaxilə etməsi nətcəsində kürdlər ağır itki verib məğlub oldular. Sarom xan qaçsa da, onun dayaq nöqtəsi olan Mokri qalası ələ keçirilib yandırıldı.

Məmləkət daxilində sabitliyə nail olmuş I Şah İsmayıl bundan sonra öz diqqətini Anadolunun cənubunda yerləşən və Səfəvilər dövləti ilə həmsərhəd olan *Zülqədəroğulları bəyliyinə* yönəltdi. Bəyliyin hakimi Əlaüddövlə bəy Zülqədər I Şah İsmayılın düşməni Ağqoyunlu Sultan Murada öz dövlətində sığınacaq vermişdi, onu təhvil vermək barədə şahın tələbi rədd edildi. I Şah İsmayıl Zülqədər bəyinin qızına elçi düşməklə iki dövlət arasında siyasi müttəfiqlik yaratmaq istədi. Lakin Əlaüddövlə qızını Sultan Murada ərə verməklə Səfəvi şahını təhqir etdi, Sultan Muradı isə osmanlıların yanına göndərdi. 1507-ci ildə I Şah İsmayıl böyük qoşunla Zülqədəroğulları bəyliyinin torpaqlarına daxil oldu. Üç gün davam edən şiddətli döyüşlər şahın rəşadəti sayəsində qələbə ilə nəticələndi. Əlaüddövlə bəy Durna dağındakı möhkəm qalaya çəkilsə də, daha sonra qızılbaşların mühasirəsinə dözməyəcəyini anlayaraq qalanı tərk edib qaçdı. Bu yürüşdə Diyarbəkir bəylərbəyi *Əmir xan Mosullu* qalanın açarlarını I Şah İsmayıla təslim etdi və əvəzində *möhürdar* vəzifəsini qazandı. Əlaüddövlə bəy sonralar Diyarbəkri geri almağa səy göstərdi, amma yeni təyin olunmuş bəylərbəyi *Məhəmməd xan Ustaclu* ilə döyüşlərdə iki oğlunu itirdi.

I Şah İsmayıl bu qələbədən sonra Bitlis, Ərciş və Əxlatda böyük ov mərasimi təşkil etdi, daha sonra 1507/08-ci illərin qış mövsümünü başa vurmaq üçün Xoy ətrafına üz tutdu.

Qızılbaş qoşununun Zülqədəroğulları bəyliyində səfərbər olmasından istifadə edən Portuqaliya admiralı Afonsu d'Albukerki 1507-ci ilin oktyabrında İran körfəzinin girişinə nəzarət edən Hörmüz məntəqəsini donanmanın yardımı ilə işğal etdi. Az sonra Hörmüz portuqalların nəzarətindən çıxdı, onlar buranı bir daha tutmağa cəhd etsələr də, uğursuzluqla qarşılaşdılar. Lakin admiral

d'Albukerki 1515-ci ildə Səfəvilərin yardımından məhrum qalmış Hörmüzü öz ixtiyarı altına almağı bacardı. Bundan sonrakı bir əsr müddətində Hind okeanına açılan "qapılar" portuqalların nəzarəti altında qaldı.

Bu arada İraq torpaqlarında mühüm hadisələr baş verirdi. Türkman tayfasının *Pörnak* oymağına mənsub olan *Barik bəy* Bağdad şəhərində möhkəmlənmiş, müqəddəs ziyarətgahların yerləşdiyi Nəcəf və Kərbəla şəhərləri üzərində də nəzarəti ələ keçirmişdi. O, əvvəlcə Səfəvilər dövlətinə tabe olduğunu bildirdi, hətta başına *qızılbaş tacı* qoymaqla itaətini göstərdi. Amma sonra mövqeyini dəyişərək İraq şiələrinin lideri *Seyid Məhəmməd Kəmunəni* quyuya salıb həbs etdi. Şah qoşunla İraq üzərinə yürüşə çıxarkən Barik bəy Pörnak qorxub əvvəlcə Hələbə qaçdı, sonra oradan Osmanlı dövlətinin ərazisinə keçdi. Bağdad şəhəri Hüseyn bəy Lələ Şamlunun başçılıq etdiyi *çərxçi* (avanqard) dəstəsi tərəfindən, demək olar ki, müqavimətsiz ələ keçirildi. *Xadim bəy Xüləfa* Bağdad valisi, Seyid Məhəmməd Kəmunə müqəddəs ziyarətgahların mütəvəllisi təyin edildi. 1508-ci ilin oktyabrında I Şah İsmayıl Bağdada daxil oldu, sonra digər müqəddəs şəhərləri ziyarət etməyə başladı. Salnamələrdə onun Nəcəf şəhərindəki İmam Əlinin (ə) məqbərəsini ziyarət etməsi bu şəkildə təsvir olunur: "Uzaqdan günbəz görünəndə şah bütün əmirlərlə birlikdə atdan yerə endi. Oradan "ya Əli" deyib zikr edəedə yola düşdülər... Həyətə daxil olanda şah başıaçıq və ayaqyalın halda, ağlayıb "ya Əli" deyərək mübarək hərəmə qədəm qoydu. Əmr etdi ki, onun icazəsi olmadan heç kimi içəri buraxmasınlar". İmam Əlinin (ə) məzarı üstündə şah nərə çəkib özündən gedir, bir neçə saatdan sonra hərəmdən çıxır və yanındakıların da ziyarət etməsinə izin verir. I Şah İsmayıl İraq ziyarətgahlarına bahalı hədiyyələr bağışlamış, türbələrin binalarında əsaslı təmir işlərinin görülməsini əmr etmişdi. Kərbəla şəhərinə Fərat çayından çəkilmiş və fəaliyyətdən qalmış su kanalları onun göstərişi ilə təmir olundu.

İraq səfərindən qayıdan şah iki bölgədən həyəcanlı xəbərlər aldı. Luristanda *Rüstəm Məlikşah* tabeliyindəki 40 min ailəlik qüvvəyə arxalanaraq ətraf bölgələrə basqınlar edir, karvanları soyurdu. Hüveyzə və Xuzistan bölgələrində isə *müşəşəi* adlı ifrat şiə cərəyanının nümayəndələri hakimiyyəti ələ keçirərək İmam Əlinin (ə) ilahiliyini təbliğ edirdilər. Bəzi mənbələr hər iki hədəf üzərinə yürüyən qızılbaş qoşununa I Şah İsmayılın şəxsən başçılıq etdiyini yazır, bəzi mənbələr isə onun yalnız müşəşəilər üzərinə yürüdüyünü, Luristana öz sərkərdələrini yolladığını bildirir. Luristanda aparılan hərbi əməliyyatlar əvvəlcə dağlıq ərazidə döyüşməyə öyrəşməmiş qızılbaşlar üçün çətinlik törətdi. Amma sonra onlar qədim türk döyüş taktikası olan "qurd oyunu"ndan istifadə etməklə düşməni düzənlik əraziyə çəkib məğlub etdilər. Məlikşah Rüstəmin özü daha bir müddət müqavimət



göstərməyə çalışsa da, axırda əsir düşdü, lakin şah onu bağışlayıb yenidən Luristan hakimi vəzifəsinə təsdiq etdi. Müşəşailərlə döyüş də qızılbaşların qələbəsi ilə bitdi. Şah şəxsən əvvəlcə düşmən lideri Sultan Fəyyazın kürəkənini, daha sonra özünü döyüş meydanında öldürdü. Hüveyzədə mərkəzi hakimiyyətə sadiq olan əmirlərdən biri bölgənin hakimliyinə gətirildi.

1508/09-cu illərin qış mövsümünü Şiraz ətrafında ov etməklə keçirən şah yaz mövsümündə İsfahana gələrək burada müxtəlif yarış tədbirləri təşkil etdi, Nəqşicahan meydanının genişləndirilməsi planının üzərində işlədi. Payız mövsümü Həmədan ətrafındakı Əlvənd dağlarının ətəyində keçdi, bundan sonra şah Təbrizə, oradan da Xoya gəldi. 1509-cu ildə şahdan sonra dövlətdə birinci şəxs sayılan vəkil *Əmir Nəcm Rəşti* vəfat etdi, Əmir Yar Əhməd Xuzani onun yerini tutaraq *"Nəcmi-sani"* (İkinci Nəcm) ləqəbini qazandı.

1509-cu ilin sonlarında I Şah İsmayıl bundan bir qədər əvvəl mərkəzi hakimiyyətə tabesizliyi barədə məlumat aldığı Şirvanşah Şeyxşahı (Fərrux Yasarın oğlu) cəzalandırmaq üçün Şirvan torpaqlarına daxil oldu. Şeyxşah Buğurt qalasına sığındı, qızılbaş qoşunu Şamaxı, Bakı, Şabran və Dərbənd qalalarını, demək olar ki, müqavimətsiz ələ keçirdi. Şah bu yerlərə yeni hakimlər təyin etdi, daha sonra atası Şeyx Heydərin Tabasarandakı məzarının yerini taparaq cənazənin qalıqlarının Ərdəbilə daşınması barədə göstəriş verdi. Qış mövsümünü Qarabağda keçirdikdən sonra 1510-cu ilin yazında şah Təbrizə qayıtdı. Beləliklə, 1510-cu ilin əvvəllərinədək Səfəvilər dövlətinin, demək olar ki, bütün ərazisində sabitlik və əmin-amanlıq bərqərar oldu, mərkəzi hakimiyyət gücləndi, itaətsiz hakimlərin müqaviməti qırıldı. Qərb istiqamətində Osmanlı imperiyası sarıdan ciddi təhlükə mövcud deyildi, Sultan II Bayezid Səfəvilər dövlətini rəsmi olaraq tanıyırdı və öz güclü qonşusu ilə qarşı-qarşıya gəlmək niyyətində deyildi. Lakin Səfəvilər dövlətinin şərq sərhədlərində qeyri-sabit vəziyyət hökm sürürdü. Şeybani sülaləsinin hökmdarı *Məhəmməd (Şeybək) xan* Sultan Hüseyn Bayqaranın vəfatından istifadə edərək Teymurilər dövlətinin torpaqlarını tutmuşdu. O, bir-birinin ardınca I Şah İsmayıla təhqiredici məktublar yollayır, onu şiə məzhəbini buraxıb əhli-sünnə əqidəsinə keçməyə və Şeybanilərə tabe olmağa çağırırdı. Səfəvi dövlətinin şərq sərhədləri ardıcıl olaraq özbəklərin hücumuna məruz qalırdı. Belə bir şəraitdə I Şah İsmayıl Şeybani təhlükəsini aradan qaldırmaq üçün həlledici addım atmağı qərara aldı. Bunun üçün o, əlverişli məqam gözlədi, Məhəmməd xanın qoşununun əsas hissəsi qışlamaq üçün Orta Asiyaya köç etdikdən sonra onun Heratda kiçik hərbi qüvvə ilə qaldığını öyrəndi. Düşməni hərbi manevrlə aldatmaq qərarına gələn şah özbək hökmdarına məktub göndərərək gələn ilin Novruz bayramından sonra Xorasan üzərinə yürüyəcəyini bildirdi, lakin özü təcili səfər tədarükünü

tamamlayıb qoşunun başında sürətlə şərq istiqamətində hərəkətə keçdi. Məhəmməd xan Şeybani bu qəfil hücumu gözləmirdi, qızılbaşların ildırım sürəti ilə Damğan, Bistam, Səbzəvar, Nişapur və Məşhəd şəhərlərini tutmaları onu ciddi təşvişə saldı. Şeybək xan Heratı tərk edib daha möhkəm saydığı Mərv qalasında sığınacaq tapdı. I Şah İsmayıl bu dəfə də sərkərdəlik məharətini göstərərək az itki ilə böyük qələbə qazandı. O, guya Osmanlı hücumu barədə xəbər aldığını və geri döndüyünü göstərərək Mərv qalasının ətrafından çəkildi. Şeybək xan müşavirlərinin sözünə əhəmiyyət vermədən düşməni təqib etmək üçün qaladan çıxdı. 1510-cu il dekabrın 2-də Mərv şəhərindən təxminən 15 km. məsafədə yerləşən Mahmudabad ərazisində özbək qoşunu qızılbaşların "qurd oyunu" taktikasına hədəf oldu. Həlledici döyüşdə özbək qüvvələri darmadağın edildi, qaçmağa çalışan Məhəmməd xan Şeybani pusquya düşüb öldürüldü.

I Şah İsmayıl Mavəraünnəhrdəki (Orta Asiya) özbək qoşununu tamamilə məhv etmək niyyətində idi, lakin Şeybək xanın ölümünü eşidən özbək sərkərdələri Übeydullah xan, Məhəmməd Timur sultan, Canıbəy sultan və b. tələsik şahla sülh bağlayıb hücumun qarşısını aldılar. Bu arada Teymurilər sülaləsindən Zəhirəddin Məhəmməd *Babur* I Şah İsmayılla əlaqələr qurmağa başladı. Özbəklər tərəfindən Kabilə sıxışdırılan Babur Əmir Teymurun imperiyasını bərpa etmək, Səmərqənd və Buxaranı Şeybanilərdən geri almaq arzusunda idi. Qızılbaşların yardımı ilə o, Səmərqəndi ələ keçirə bildi, amma bundan sonra vədini pozaraq Səfəvilərlə münasibətini soyutdu, nəticədə özbək xanları Səmərqəndi ondan geri aldılar. I Şah İsmayıl Babura öz gücünü göstərmək üçün vəkil Nəcmi-saninin başçılığı altında Xorasana böyük qoşun yolladı. Bu hərbi ekspedisiya zamanı Nəcmi-sani bir sərkərdə kimi öz bacarıqsızlığını nümayiş etdirdi. O, tabeliyindəki qızılbaş əmirlərinin və Baburun məsləhətlərinə məhəl qoymadan yanlış döyüş taktikası seçdi, nəticədə 1512-ci ilin noyabrında Qicduvan məntəqəsində baş vermiş döyüşdə qızılbaş qoşunu özbəklərə məğlub oldu. Bir neçə görkəmli Səfəvi sərkərdəsi, o cümlədən I Şah İsmayılın bacısının əri *Bayram bəy Qaramanlu* öldürüldü, *Nəcmi-sani* əsir düşüb edam edildi.

Bu məğlubiyyətin ardınca Xorasan bölgəsindəki şəhərlər bir-birinin ardınca qızılbaşların əlindən çıxdı, Mərv, Bəlx, Herat, Məşhəd şəhərləri özbəklərə təslim oldu. 1513-cü ilin yazında şah şəxsən qoşunun başında Xorasan səmtində hərəkətə keçdi, Übeydullah xan bu xəbəri eşidib tələsik geri çəkildi. Özbəklərin əlində olan bütün şəhərlər qızılbaş qoşunu tərəfindən fəth edildi. Qazax tayfalarının başçısı Qasım xan oğlu Əbülxeyr xanı böyük qoşunla Xorasana göndərsə də, I Şah İsmayıl qazax birləşməsini darmadağın edib geri oturtdu.

I Şah İsmayıl Xorasan yürüşündə ikən onun ögey qardaşı *Süleyman Mirzə* hakimiyyəti ələ keçirmək üçün öz tərəfdarları ilə Ərdəbildən Təbriz üzərinə



yola düşdü, lakin paytaxt sakinlərinin müqaviməti və *Məntəşa sultan Ustaclunun* (*Saru Piri bəyin* qardaşı) səyləri nəticəsində məqsədinə çata bilməyib öldürüldü (1513).

I Şah İsmayıl 1513/14-cü illərin qış mövsümünü İsfahanda keçirdikdən sonra 1514-cü ilin yaz fəslinin gəlişi ilə Həmədana köçdü. Həmin il Səfəvilər dövlətinin hərbi-siyasi tarixində yeni mərhələnin – *Səfəvi-Osmanlı müharibələrinin* ilk qığılcımı olan *Çaldıran savaşı* baş verdi. 1512-ci ildə atası II Sultan Bayezidi devirərək taxta çıxmış I Sultan Səlim Yavuz Səfəvilər dövlətini özünün əsas rəqibi hesab edirdi. Hakimiyyətə keçdiyi ilk zamanlardan etibarən işğalçı yürüşləri məqsəd seçmiş yeni sultan özünün şərq qonşusunu sərhəd toqquşmalarına təhrik etməyə başladı. İki dövlət arasındakı münasibətlər sürətlə gərginləşirdi, osmanlılarla birbaşa təmas xəttində yerləşən Diyarbəkrin hakimi Məhəmməd xan Ustaclunun Səfəvi şahından fərqli olan impulsiv xarakteri də gərginliyin artmasına şərait yaratdı.

I Sultan Səlim Səfəvilər dövlətinə hücum etməzdən əvvəl zəruri tədbirləri gördü, ölkə daxilindəki qızılbaş hərəkatını amansızlıqla yatırdı, minlərlə qızılbaşı məhv və ya sürgün etdirdi. O, dövlətin nüfuzlu müftilərindən şiə qızılbaşların dindən çıxması və onlarla müharibənin vacib dini vəzifə olması barədə fətvalar aldı. 1514-cü ildə Osmanlı sultanı 100 min nəfərlik qoşunun başında yürüşə çıxdı. Şah İsmayıl əvvəlcə bu hücum xəbərinə etina etməyib heç bir hazırlıq görməmişdi, ordunun əksər hissəsi Xorasan ekspedisiyasında idi və geri çağırılmamışdı, ona görə də Osmanlı əsgərləri sərhədi keçəndə şahın ətrafında hazır ordu yox idi. I Şah İsmayıl ordunun Xorasan yürüşündən kənarda qalmış hissələrini qısa vaxtda toplayaraq təxminən 40 min nəfərlik hərbi qüvvə ilə hərəkətə keçdi.

Tərəflər Səfəvilər dövlətinin ərazisində – Maku yaxınlığındakı Çaldıran düzündə qarşılaşdılar. Osmanlı ordusu say baxımından çox olmaqla yanaşı, Avropadan alınmış artilleriya və odlu silahla mükəmməl şəkildə təchiz olunmuşdu. Qızılbaşlar isə bu vasitələrdən istifadə etməyi özlərinə sığışdırmır, qılınc və oxla təkbətək savaşa üstünlük verir, klassik hərbi qaydalarla döyüşürdülər.

1514-cü il avqustun 23-də baş vermiş döyüşün taleyini Osmanlı ordusunun artilleriyası həll etdi. Qızılbaşlar öz taktikalarına uyğun olaraq ildırımsürətli hücumla düşməni geri oturtsalar da, Osmanlı mövqelərinə çox yaxınlaşdıqları üçün top atəşinə məruz qaldılar. Çaldıran savaşında I Şah İsmayılın ən sadiq tərəfdarlarının böyük bir qismi həlak oldu. Şah şəxsən döyüş meydanında şücaətlər göstərdi. Sonda cərgələri pozulmuş qızılbaşlar qoşunun qalan hissəsini qorumaq üçün döyüş meydanını tərk edib geri çəkildilər. I Sultan Səlim əsirləri edam etdirdi, öz qarşısında ciddi müqavimət görmədən Təbriz şəhərinə daxil oldu. Lakin şəhər camaatının narazılığı, azuqə qıtlığı, eləcə də qoşundakı *bektaşi* yeniçərilərin onlarla

yaxın əqidəyə malik qızılbaşlarla savaşmaqdan duyduqları peşmançılıq sultanın Təbrizdə çox qalmasını əngəllədi. Eyni zamanda başqa bölgələrdə olduğu üçün Çaldıran döyüşünə yetişə bilməyən qızılbaş qoşun birləşmələrinin Təbrizə yaxınlaşması haqda sultana xəbərlər yetişdi. Osmanlı qoşunu 8 gündən sonra Təbrizdən çıxıb sərhədə doğru geriləməyə başladı. I Sultan Səlim Təbrizi tərk edərkən şəhərdəki on minlərlə şair və ədibi, xəttat və rəssamı, memar və bənnanı, müxtəlif peşə sahiblərini özü ilə əsir qismində Osmanlı dövlətinə apardı. Həmin sənətkarlar öz vətənlərindən ayrılaraq Osmanlı elmi-mədəni irsinin çiçəklənməsinə xidmət etməli oldular.

Çaldıran savaşı itki baxımından o qədər böyük fəlakət olmasa, Təbriz və Azərbaycanın digər bölgələri geri qaytarılsa da, I Şah İsmayılın döyüş zamanı yeganə hərbi uğursuzluğu kimi onun nüfuzunun bir qədər zədələnməsinə səbəb oldu. Salnamələr şahın vəfatına kimi kədər içində olduğunu yazırlar. Hətta bəzi mənbələrə görə, Çaldıran savaşından sonra qızılbaş qoşununun bəzi bayraqlarına "Əl-qisas" kəlməsini həkk etmişdilər.

Növbəti illərdə osmanlılar Səfəvi dövlətinin qərb sərhədlərindəki bəzi bölgələri ələ keçirməklə öz hərbi üstünlüklərini möhkəmlətdilər. 1515-cı ildə Diyarbəkir, 1517-ci ildə Mardin qalası onların əlinə keçdi.

I Şah İsmayıl Çaldıran savaşından sonrakı 10 illik həyatı boyunca həm şərq istiqamətində özbəklərin hücumlarını uğurla dəf etmiş, həm də ölkənin şimal sərhədlərinin möhkəmləndirilməsi istiqamətində fəaliyyət göstərmişdir. Çuxursəd bəylərbəyi *Div sultan Rumlu* ardıcıl olaraq Gürcüstan üzərinə yürüşlər edir, bölgəni Səfəvi təsiri altında saxlamağa çalışırdı. Hərbi əməliyyatlar gedişində Tiflis şəhəri qızılbaşlar tərəfindən ələ keçirildi, üsyankar Kaxeti çarı I Levan əsir tutularaq şahın hüzuruna gətirildi. I Şah İsmayıl Kaxeti çarını bağışlayıb hakimiyyətdə saxlasa da, I Levan itaətsizlik göstərməkdə davam edirdi. I Şah İsmayılın həyatının sonunadək Gürcüstan yürüşlərinin arası kəsilmədi.

Səfəvilərin vassalı kimi öz varlığını qoruyan Şirvanşahlar üzərindəki nəzarət də zəifləmirdi. 1518-ci ildə Şirvanşah II İbrahimdən (Şeyxşah) böyük oğlu Sultan Xəlili girov olaraq Təbrizə göndərməsi tələb edildi, I Şah İsmayıl öz qızı *Pərixan xanımı* ona ərə verdi. 1523-cü ildə şah özü Şirvanşahın qızı ilə evləndi. Bu siyasi evliliklər nəticəsində Səfəvilərlə Şirvanşahlar arasındakı gərginlik xeyli yumşaldı, münasibətlər normal məcrada davam etməyə başladı.

I Şah İsmayıl 1523/24-cü illərin qış mövsümünü Naxçıvanda keçirdikdən sonra yaz aylarında Şirvanda ov təşkil etməyə əmr verdi. Böyük ov mərasimi gedişində xeyli ceyran (bunları bəzi mənbələrdə vəhşi at adlandırırlar) vuruldu. Şah öz məiyyəti ilə ov edə-edə Şəki bölgəsinə daxil olduqda Şəki hakimi *Həsən bəy* onun pişvazına gəldi. Burada Həsən bəy Kaxeti çarı I Levanın



hücum xəbərini eşidib onun üzərinə yürüdü, amma döyüşdə məğlub olub öldürüldü, yerinə oğlu *Dərviş Məhəmməd xan* təyin edildi.

Rəvayətə görə, ətrafındakılar I Şah İsmayıla bu torpaqlarda ov etməməyi məsləhət görmüş, amma o, məsləhətə əhəmiyyət vermədən ovu davam etdirmişdi. Şah yuxuda atası Şeyx Heydəri görüb tezliklə vəfat edəcəyini başa düşmüşdü. Şahın son günlərinin təsviri barədə mənbələrdəki məlumatlar fərqlidir. Onun Şəkidə ov zamanı özünü pis hiss etməsi və ovu yarımçıq kəsib Ərdəbilə doğru qayıtması məlumdur. Səhhətindəki problemin nə ilə bağlı olması barədə dəqiq məlumat isə yoxdur, bəzi müəlliflər bunu ov yorğunluğu, bəziləri soyuqdəymə, bəziləri qaraciyər xəstəliyi ilə əlaqələndirirlər. Şahın iştahası tamamilə kəsilmişdi, hətta xörək qoxusuna dözə bilmirdi. Ömrünün sona yaxınlaşdığını hiss edən I Şah İsmayıl *Ulamə sultan Təkəlüyə* tapşırdı ki, vəliəhd Təhmasib Mirzəni təcili Təbrizdən Ərdəbilə gətirsin. Şah Ərdəbilə gəlib burada *Şeyx Səfi kompleksində* dəfn edilmiş ata-babalarının məzarlarını ziyarət etdi. Bəzi müəlliflər onun Ərdəbildən çıxıb Təbrizə hərəkət edərkən Sərab yaxınlığındakı Sain kəndində, bəziləri isə Təbrizdə, öz sarayında dünyasını dəyişdiyini yazırlar.

I Şah İsmayıl ətrafındakılara ondan sonra 10 yaşlı Təhmasib Mirzəni taxta çıxarmağı vəsiyyət etdi və bunu yuxuda İmam Əlidən (ə) aldığı göstərişlə bağladı. Onun əmri ilə *vəkil Div sultan Rumlu* Təhmasib Mirzənin qəyyumu təyin edildi. Əslində şah əvvəlki vəkil *Mirzə Şah Hüseyn İsfahaniyə* hamıdan çox etibar edirdi və onu özündən sonra şahzadənin qəyyumu təyin etmək fikrində idi. Amma bundan bir neçə ay əvvəl Mirzə Şah Hüseyn *əmiraxurbaşı* Şahqulu bəy Türkman tərəfindən öldürüldüyü üçün şah öz ətrafındakı əmirlərin arasından Div sultanın üzərində seçim etməli oldu.

“Aləmarayi-Səfəvi”yə görə, I Şah İsmayıl ömrünün son dəqiqələrində yaxın əmirlərinə və oğlu Təhmasib Mirzəyə vəsiyyətlərini etmiş və söyləmişdi: “Mən on dörd yaşında ikən Gilandan çıxıb Xəta çölündən Hələbə və İraq sularına kimi hər yeri tutdum. Asilər qılıncımın zərbəsindən qorxub səhralara qaçdılar... Əgər sufilik yolunu tutmaq istəyirsinizsə, ocağı sönməyə qoymayın. Düşmən dörd tərəfdən baş qaldıracaq. Aranızda nifaq olmayınca, heç bir padşahın cəsarəti çatmaz ki, sizinlə döyüşməyə gəlsin”. Sonra şah kimi isə görürmüş kimi salam verərək yataqdan qalxmağa çalışmış, amma gücü olmadığı üçün əlini irəli uzadıb sonra dodaqlarına aparmış, bundan sonra canını tapşırmışdı. Bu rəvayət onun son nəfəsdə İslam müqəddəslərini görməsi barədə xəbərlərin meydana çıxmasına səbəb olmuşdur.

I Şah İsmayıl 1524-cü il may ayının 23-də dünyasını dəyişdi (Əbcəd hesabı ilə vəfat tarixi (hicri 930-cu il) “zill” (kölgə) sözünə uyğun gəlir). *Sədr* vəzifəsini tutan Əmir Cəmaləddin Məhəmməd

Astarabadi onun cənazəsinə qüsl verdi. Şahın nəşini Ərdəbildəki Şeyx Səfi kompleksində dəfn etdilər, sonralar məzarı üzərində yaraşıqlı türbə ucaldıldı. Şahın xanımı *Taclu bəyim* ondan ötrü kompleksin hüdudları daxilində Cənnətsəra adlı möhtəşəm türbə inşa etdirməyə başlamış, amma tikintini tamamlamağa və şahın cəsədini ora köçürməyə ömrü imkan verməmişdir.

I Şah İsmayıl Azərbaycan torpaqlarını (eləcə də indiki İran, İraq, Gürcüstan, Ermənistan, Əfqanıstan və digər əraziləri) vahid Səfəvi bayrağı altında və qızılbaş ideologiyası ətrafında birləşdirməyi bacarmış, güclü mərkəzləşdirilmiş hakimiyyət yaratmışdı. Onun zamanında Səfəvilər dövləti Yaxın və Orta Şərqin ən mühüm hərbi-siyasi güc mərkəzlərindən birinə çevrilmişdi. I Şah İsmayıl yaratdığı Qızılbaş dövlətində Azərbaycan dilinə və azərbaycanlılar da daxil olmaqla türkdilli tayfalara dominant mövqe bəxş etməyi bacarmışdı. O öz dövrü üçün mütərəqqi sayıla bilən xarici və daxili siyasət mexanizmlərini formalaşdırmış, Avropanın aparıcı dövlətləri (Papalıq, Venesiya, Genuya, Portuqaliya, Macarıstan, Müqəddəs Roma imperiyası) ilə kifayət qədər səmərəli diplomatik əlaqələr yaratmışdı. Özündən əvvəlki Azərbaycan dövlətlərinin (xüsusilə *Ağqoyunlu dövlətinin*) ənənələrini və müsbət təcrübəsini uğurla mənimsəməklə o, Azərbaycan dövlətçiliyinin sonrakı inkişaf tarixinə misilsiz töhfələr vermiş, müstəqil Azərbaycan Respublikasının yaradılması ilə nəticələnmiş dövlət quruculuğu prosesində mühüm rol oynamışdır.

I Şah İsmayılın zahiri görünüşü və şəxsi keyfiyyətləri barədə müasirlərinin verdiyi məlumatlar maraqlıdır. Ağbəniz, yaraşıqlı, ortaboylu, mütənasib bədən quruluşlu, enlikürək, şabalıdı saçlı, iti baxışlı və solaxay idi. Venesiyalı səyyah yeniyetmə İsmayıl Mirzəni bu şəkildə təsvir etmişdir: "Çox yaraşıqlı görünüşü və şahanə davranışı var idi. Gözlərində və alnında böyüklük nuru parlayırdı. Aydın görünürdü ki, bir gün gələcək və o, böyük hökmdar olacaq. Mənəvi kamillik və zahiri gözəllik onun şəxsiyyətində birləşmişdi. Yeniyetmə çağında elə iti zəkaya və dərin düşüncəyə sahib idi ki, bu yaşda həmin keyfiyyətlərin olması inanılmazdır". I Şah İsmayılın Florensiyada Uffitsi qalereyasında saxlanılan məşhur portreti (rəssamı Cristofano dell'Altissimodur (1525–1605) naturadan çəkilməsə də, söylənilən xüsusiyyətlərə uyğun gəlir və onun obrazını dolğun canlandırır.

I Şah İsmayılın zamanında Səfəvilər dövlətinin paytaxtı *Təbriz* şəhəri idi. Lakin yarımköçəri həyat tərzinə üstünlük verən şah vaxtının əksər hissəsini ya hərbi yürüşlərdə, ya da fərqli məkanlardakı yaylaq və qışlaqlarda keçirirdi. Bununla belə, o, istər Təbrizin, istərsə də *Ərdəbil*, *İsfahan*, Şiraz, Yəzd, Herat kimi şəhərlərin abadlaşdırılmasını daim diqqət mərkəzində saxlamışdır.

I Şah İsmayıl fövqəladə fiziki qüvvəyə, cəsarətə və sərkərdəlik məharətinə malik idi. Hərbi yürüşlərin bir çoxunda



şəxsən iştirak edir, böhranlı anlarda qoşunu öz ardınca qələbəyə doğru aparırdı. Çaldıran savaşında Osmanlı toplarını bir-birinə bağlayan zəncirləri və hətta topların lülələrini qılıncla doğraması barədə rəvayətlər məşhurdur. Deyilənə görə, döyüşdən sonra I Sultan Səlim həmin qılıncı ona göndərməsini şahdan xahiş etmişdi. Lakin bütün səylərinə baxmayaraq, sultan bu qılıncla zəncirləri kəsə bilməmiş, şaha məktub yazaraq başqa qılınc göndərdiyi üçün onu məzəmmət etmişdi. I Şah İsmayılın cavabı qısa olmuşdu: "Qılınc həmin qılıncdır, qol o qol deyil!" Çaldıran savaşında Osmanlı pəhləvanı *Malkoçoğlu Turəli bəy* ilə döyüş meydanında qarşılaşan şah ona qılıncla elə güclü zərbə vurmuşdu ki, bədəni sinəsinə və ya belinə kimi iki yerə bölünmüşdü.

I Şah İsmayıl öz sərkərdələri ilə birlikdə güləş, oxatma, *çövkən* və *qabaq yarışlarında* iştirak edir, yüksək nəticələr göstərirdi. Qabaq yarışmasında at belində 10 kiçik hədəfdən ən azı 6-sını vurur, süvari halda çaparaq torpağa basdırılmış qoçu buynuzlarından tutub qaldırır və üç dəfə başı üzərində fırlayıb qabağa tullayırdı. Ov etməyə hədsiz sevgisi vardı, hər il fərqli məkanlarda iri ov mərasimləri təşkil edirdi. Çox səxavətli idi, salnamələrdə yazıldığına görə, dövlət xəzinəsini doldurmağı xoşlamaz, ehtiyacı olanlara, ətrafındakı əmirlərə və şücaətli döyüşçülərə pul paylayardı.

Hökmdarlıq müddəti boyunca I Şah İsmayıl rəhbərlik etdiyi bütün döyüşləri qələbə ilə başa vurmuş, təkcə Çaldıran savaşında düşmənin artilleriyadan istifadə etməsi sayəsində uğur qazana bilməmişdi. O, döyüşlərdə top və tüfəngdən istifadə etməyi namərdlik sayır, düşmənlə üz-üzə mərdliklə döyüşməyi xoşlayırdı. Çaldıran döyüşündən əvvəl hələ döyüş mövqeyini almamış Osmanlı qoşununa gecəyarısı qəfil basqın etmək təklifini "Mən karvanbasan quldur deyiləm" sözləri ilə rədd etmişdi. I Şah İsmayıl öz qatı rəqibləri Məhəmməd xan Şeybani və I Sultan Səlimlə müharibə etməzdən əvvəl məktublaşmış, amma qarşı tərəfin bütün təhqir və təhriklərinə səbir və əxlaqla cavab vermişdi.

I Şah İsmayıl ədəbiyyat və incəsənətə böyük maraq göstərir, musiqi və rəsmlə maraqlanırdı. Gözəl xətti vardı, öz xətti ilə Quran köçürdüyü və bunu Nəcəfdəki İmam Əli (ə) hərəminə hədiyyə etdiyi rəvayət olunur. *"Xətai"* təxəllüsü ilə Azərbaycan türkcəsində son dərəcə gözəl şeirlər yazırdı. Onun yaradıcılığı XVI əsr Azərbaycan ədəbiyyatının şah əsərlərindən sayılır. *Xətai diva*nı 15 qəsidə, 371 qəzəl və 11 rübaidən, farsca bir qəzəl, bir təxmis (Hafiz Şirazidən) və kiçik şeir parçalarından ibarətdir (Rəqəmlər divanın 1966-cı ildə Bakıda nəşr edimiş elmi-tənqidi mətninə əsasən verilir). Daha bir neçə şeirin də ona aid olması mübahisəlidir. Bunlardan əlavə, I Şah İsmayılın *"Dəhnamə"* poeması və *"Nəsihətnamə"* məsnəvisi də məşhurdur. O, sadə xalq dilində, heca vəznində onlarla qoşma və gəraylı yaratmışdır. Xətainin şeirlərindən bəzi misralar bu

gün də xalq dilində zərbi-məsəl kimi işlədilir: "Keçmə namərd körpüsündən, qoy aparsın su səni", "Dişləmə çiy loxmanı, yerinə dişin düşər", "Əvvəl kəndi kəndin tanı, sonra elə nəzər eylə" və s. I Şah İsmayılın oğullarının dördü də şairlik təbinə sahib olmuş və dəyərli ədəbi nümunələr yaratmışlar (I Şah İsmayılın oğlu *Sam Mirzənin* tərtib etdiyi "Töhfeyi-Sami" təzkirəsi Səfəvilər dövrünün ən mühüm ədəbi qaynaqlarından sayılır). I Şah İsmayıl bütün həyatı boyunca öz ana dilində danışmış, Azərbaycan türkcəsini məmləkətin dövlət dili elan etmişdi.

I Şah İsmayıl Xətai sənət adamları üçün əlverişli mühit yaratmışdı. Təbrizdəki şah sarayı şair və aşıqların, xanəndə və ifaçıların, xəttat və nəqqaşların fəaliyyət mərkəzinə çevrilmişdi. Bu dövrdə *Təbriz miniatür məktəbinin* əsası qoyulmuş, *Sultan Məhəmməd* və *Kəmaləddin Behzad* kimi istedadlı rəssamların rəhbərliyi altında emalatxanalar yaradılmışdı. Çaldıran savaşından əvvəl I Şah İsmayılın rəssam Behzadı və xəttat *Şah Mahmud Nişapurini* qorumaq üçün mağarada gizlətməsi barədə rəvayət məşhurdur. Səfəvi sarayında *Həbibi, Sürurі, Tüfeyli, Şahi, Qurbani, Miskin Abdal* kimi şair-aşıqlar yaşayıb-yaradırdılar. Dahi Azərbaycan şairi *Füzuli* özünün "Bəngü Badə" poemasını I Şah İsmayıla ithaf etmişdi. Şah özü musiqi məclislərində həvəslə iştirak edirdi, hətta sarayda bəzi dövlət miqyaslı müşavirə məclisləri *ozanların* ifası ilə açılırdı. Səfəvi ordusunda xidmət edən ozan-aşıqlar döyüşdən qabaq Xətainin və digər qızılbaş şairlərin qoşmalarını oxuyaraq döyüşçülərə ruh yüksəkliyi gətirirdilər.

Bununla belə, I Şah İsmayıl eyş-işrəti və ifrat əyləncəni sevmirdi. Müasiri olduğu Şərq hökmdarlarından fərqli olaraq, hərəmxanası yox idi, sarayda rəqqasə saxlamırdı. Teymuri hökmdarı Sultan Hüseyn Bayqaranın göndərdiyi rəqqasə və çalğıçıları öz sənətlərini nümayiş etdirməyə imkan vermədən geri qaytarmış, cavab olaraq qızılbaş ozan-döyüşçülərindən ibarət heyəti Xorasana yollamışdı. "Aləmarayi-Səfəvi" kitabında yazıldığına görə, şah Zülqədəroğullarına qarşı savaşdan qabaqkı gecə Hüseyn bəy Lələ ilə düşərgəni gəzib dolaşmış, döyüşçülərin öz silahlarını itiləməklə məşğul olduqlarını və yarışdıqlarını görüb sevinmişdi. Lakin bir nəfərin şərab içməsi şahı məyus etmiş və Hüseyn bəydən: "Mənim qoşunumda şərabmı var?" – deyə soruşmuşdu.

Humanist və mülayim xarakterinə baxmayaraq, I Şah İsmayıl hökmdarlara xas vüqara və heybətə sahib idi. Təslim olmaq təklifini inadla rədd edən düşmənə qarşı amansızlıqla davranır, xəyanəti, yalanı, rəiyyətə qarşı zülmü və rüşvətxorluğu bağışlamırdı. Dini dəyərlərə münasibətdə son dərəcə həssaslıq göstərirdi. "Fəvaid əs-Səfəviyyə" müəllifinin təbiri ilə, "pələng təbiətli türklər onun qarşısında itaətlə baş əyirdilər". Şahın cəlladı Kor Süleyman Qorçu təkbaşına Təbrizdən Şiraza gəlmiş və tabeliyində üç-dörd min nəfər döyüşçü olan Fars



hakimi Sultan Xəlili edam edib başını şaha təhvil vermişdi; bu zaman nə müqəssir özü, nə də ətrafındakılar hökmə qarşı çıxmağa cəsarət etməmişdilər.

Bu xüsusiyyətlərinə görə I Şah İsmayıl qızılbaşlar tərəfindən hədsiz dərəcədə sevilirdi. Şahı *mürşidi-kamil* kimi qəbul edən *müridlər* onun hər sözünü qeyd-şərtsiz yerinə yetirirdilər. Şirvanın fəthi zamanı I Şah İsmayıl ələ keçirilən bütün qənimətin Kür çayına atılması barədə göstəriş verərkən bütün döyüşçülər əmri dəqiqliklə icra etmişdilər, hətta yüzbaşı Məhəmməd bəy Rumlu Şirvanşahın xəzinəsindən götürdüyü ləl-cavahiratla dolu kisəni açıb içinə baxmadan çaya tullamışdı. Qızılbaş müridlərin şaha sonsuz məhəbbəti avropalı səyyahları heyrətə salırdı. Onlar bu sevginin səbəbini anlaya bilmir, ona görə də qızılbaşların şahı ilahiləşdirdiyini, onu peyğəmbər və ya imam kimi qəbul etdiyini düşünürdülər. İtalyan səyyahı Mario Ancolello xatirələrində yazırdı: "Döyüşçülər şaha sitayiş edirlər. Əsgərlərin çoxu öz ağasının yolunda fəda olmaq üçün zirehsiz döyüşür. Onlar sinələrini açıb, "şeyx, şeyx" qışqıraraq döyüşə girirlər. Bəziləri düşünür ki, o, peyğəmbərdir. Şübhəsiz, hamı inanır ki, o, heç vaxt ölməyəcək".

Çaldıran savaşında I Şah İsmayılın atının ayağı bataqlığa düşəndə *Ustaclu* tayfasından Xızır ağa öz atını ona verib döyüş meydanından çıxmasına şərait yaratmışdı. Sultanəli bəy Əfşar isə şahla zahiri oxşarlığından istifadə edərək mühasirəyə düşən hökmdarı xilas etmək üçün "Şah İsmayıl mənəm" deyə düşməni özünə doğru cəlb edərək əsir düşmüş, həqiqət məlum olduqda öldürülmüşdü.

I Şah İsmayılın şəxsiyyəti həm müasirləri, həm də sonrakı dövrlərdə yaşamış tarixçi və mütəfəkkirlər tərəfindən yüksək dəyərləndirilmişdir. Səfəvi tarixçisi Əbdi bəy Şirazi *"Əhsən ət-təvarix"* əsərində yazırdı: "O həzrət rəiyyətlə və öz tabeliyində olanlarla ədalət və şəfqətlə davranırdı, onun qorxusundan heç kəs zülm və zorakılıq qapılarını xalqın üzünə açmırdı. O, döyüş meydanında xəncər vuran cəngavər (hərfən: "yırtıcı aslan"), əyləncə məclisində isə gövhər yağdıran bulud idi. Son dərəcə səxavətli olduğu üçün tam əyarlı qızıl və dəyərsiz daş onun gözündə eyni idi. O qədər alicənab idi ki, dənizin və mədənin hasilatı onun bir günlük bəxşişinə kifayət etməzdi. Əksər vaxtlarda xəzinəsi boş olurdu. Ova çıxmağı çox sevir, təkbaşına gedib aslanı və pələngi öldürürdü".

Şah öz ordusuna qayğı ilə yanaşır, döyüşçülərin ən kiçik problemlərini də həll etməyə çalışırdı. "Atı zəif olanlara öz şəxsi tövləsindən at bağışlayır, silah-əsləhəsi olmayanlara cəbbəxanadan silah-sursat verir, hər bir kəsə layiq olduğu qədər qayğı göstərirdi" (*"Aləmarayi-Səfəvi"dən*). Şəhid döyüşçülərin övladları ilə daha artıq dərəcədə şəfqətli davranırdı. Vəzifə və rütbələri əsil-nəsəbə görə deyil, şücaət və bacarığa əsasən verirdi. "Mərdliklə namərdliyin arasında bir addım qədər məsafə var" deyən şah döyüşdən qaçan, xidmətdə səhlən-

karlıq göstərən hərbi və dövlət qulluqçularını ağır cəzalandırırdı.
XIX əsrdə yaşamış görkəmli avstriyalı şərqşünas Jozef fon Hammer-Purqştal yazırdı: "XVI əsrin əvvəlində İsmayılın tarix səhnəsində görünməsi o qədər əlamətdar hadisələrə yol açdı ki, onun hakimiyyət dövrü Orta Asiyanın dini-siyasi tarixində mühüm mərhələlərdən birinə çevrildi".
Sovet şərqşünası İ.P.Petruşevski I Şah İsmayılın şəxsiyyətinə tarix boyunca verilmiş dəyəri ümumiləşdirərək bu qənaətə gəlmişdir: "I Şah İsmayıl Səfəvinin güclü şəxsiyyəti müasirlərində fərqli münasibət yaradırdı. Siyasi və dini mövqedən asılı olaraq bəziləri ona valeh olur, bəziləri ona nifrət bəsləyirdilər... Lakin bütün müasirləri onun hərbi istedadını etiraf edirdilər".
Fransalı şərqşünas Jan Pol Ru I Şah İsmayılın tarixi simasını bu ifadələrlə xarakterizə edirdi: "Hətta öz uğurlarına görə ətrafındakılara borclu olsa belə, inkar etmək olmaz ki, gənc şah fenomenal şəxsiyyətə malik idi".
Kommunizmin ideoloqu Karl Marks Səfəvi hökmdarının qarşısında heyrətini gizlətmədən yazırdı: "Şah İsmayıl fateh idi, 14 illik hakimiyyəti dövründə o, 14 əyalət fəth etmişdi".
I Şah İsmayıl özü də daşıdığı böyük missiyanı layiqincə dərk edir və uğrunda mübarizə apardığı ideyalara səmimiyyətlə inanırdı. O deyirdi: "Mən Allahın və məsum imamların tərəfindən rüsxət almışam ki, cahanı zülm və tüğyan əhlinin vücudundan təmizləyim, Əli Vəliyullahın doğru yoluna rəvac verim".
Səfəvi mənbələrində I Şah İsmayılın adı ilə bağlı bir neçə xariqüladə hadisədən də bəhs olunur və ona bir sıra *kəramətlər* aid edilir. Şah ən həssas anlarda atdığı bəzi addımları müqəddəs imamlardan aldığı göstərişlərlə bağlayırdı. Məsələn, rəvayətə görə, hələ Gilanda gizləndiyi zaman 12 yaşında ikən İmam Əlinin (ə) ruhu ilə görüşmüş və hərəkata başlamaq üçün ondan icazə istəmişdi. Amma imam o zaman yox, Ağqoyunlu Rüstəm padşahın ölümündən sonra, İsmayılın 14 yaşı olarkən bu icazəni ona vermişdi. Anonim "Aləmarayi-Səfəvi" kitabında İstanbulda yaşayan Dədə Məhəmməd adlı bektaşi dərvişin müridlərindən birinin ziyarətdən qayıdarkən İraqda möcüzəvi şəkildə *İmam Mehdi (ə)* ilə görüşməsi təsvir edilib. Bu zaman o, 14 yaşlı İsmayılın da ora gəldiyini, imamın ona tac, kəmər, qılınc verərək hərəkata başlamasına icazə verdiyini görmüşdü. Rəvayətə görə, I Şah İsmayıl Şirvan yürüşü gedişində Gülüstan qalasını mühasirədə saxladığı zaman imamlardan biri yuxusuna girib ona mühasirədən əl çəkməyi və Əlvənd Mirzənin üzərinə hərəkət etməyi tapşırmışdı. Həmçinin ömrünün sonlarına yaxın övladlarının arasından Təhmasib Mirzəni canişin təyin etməyi də ona İmam Əlinin (ə) tapşırdığını yazırlar.
Azərbaycanın aşıq havalarından və muğam guşələrindən biri *"Şah Xətai"* adlanır. Şah İsmayıl eyniadlı xalq dastanının baş qəhrəmanıdır. Görkəmli Azərbaycan bəstəkarı Müslüm Maqomayev



(1885-1937) həmin dastanın motivləri əsasında 1916-cı ildə *"Şah İsmayıl" operasını* bəstələmiş, operanın ilk tamaşası 1919-cu ildə baş tutmuşdur. Azərbaycan Respublikası Nazirlər Kabinetinin 7 may 2019-cu il tarixli 211 nömrəli Qərarı ilə Şah İsmayıl Xətai Azərbaycan Respublikasında əsərləri dövlət varidatı elan edilən müəlliflərin siyahısına daxil edilmişdir. Azərbaycan Respublikasının ali hərbi ordenlərindən biri *"Şah İsmayıl Xətai" ordenidir*; bu, yeganə ordendir ki, onunla heç kim təltif edilməyib (hazırkı məlumata əsasən).

***Həyat yoldaşları:***

I Şah İsmayılın aşağıda adları çəkilən 4 həyat yoldaşı barədə məlumatlar mövcuddur:

*Taclu bəyim* (əsl adı Şahbikə, vəf. 1540) – Bektaş bəy Mosullunun oğlu Həmzə bəyin oğlu Mihmad bəyin qızıdır (Bəziləri onu *I Şah Təhmasibin* anası hesab edir, bəziləri bunu inkar edirlər).

*Bəhruzə bəyim* – Bağdad hakimi *Xadim bəy Xüləfanın* qızı olduğunu yazırlar.

Xanbəyi (Xanbacı) xanım (vəf. 1547-ci ildən sonra) – Mosullu tayfasından Sufi Xəlil nəslindən idi (*Əlqas Mirzənin* anasıdır).

I Şah İsmayıl 1523-cü ildə siyasi səbəblər üzündən Şirvanşah II İbrahimin (Şeyxşahın) qızı ilə də evlənmişdir.

***Övladları:***

I Şah İsmayılın övladlarının sayı barədə məlumatlar fərqlidir. İlk övladı 1506/07-ci illərdə doğulmuş Xanış xanımdır. İlk oğul övladı 1514-cü və ya 1515-ci ildə doğulmuş Təhmasib Mirzədir (gələcək I Şah Təhmasib).

Dörd oğlunun olduğu dəqiq məlumdur. Bunlar Təhmasib Mirzə (gələcək *I Şah Təhmasib*, 1514/15-1576), *Əlqas Mirzə* (1516-1550), *Sam Mirzə* (1517-1567/68) və *Bəhram Mirzədir* (1517-1549). Vəfatından sonra Təhmasib Mirzə hakimiyyətə keçmiş, Bəhram Mirzə onun hakimiyyətini dəstəkləmişdir. Əlqas Mirzə və Sam Mirzə isə osmanlıların təhriki ilə öz qardaşına qarşı üsyan qaldırmış, amma məğlub olaraq həbsə atılmışlar. Bunlardan başqa, I Şah İsmayılın Rüstəm Mirzə və Sultan Hüseyn Mirzə adlı daha iki oğlunun da olduğu bəzi mənbələrdə öz əksini tapmışdır, lakin onların taleyi barədə məlumat olmadığı üçün kiçik yaşlarında vəfat etdikləri ehtimal olunur.

I Şah İsmayılın qızlarının da sayı mənbələrdə fərqli şəkildə yazılmışdır. Qız övladlarının yalnız bir neçəsinin adı və həyat tarixçəsi məlumdur.

*Xanış bəyim* (1506/07-1563/64) – Gilanın Biyə-piş mahalının hakimi Müzəffər sultana ərə getmiş, onun edamından (1535) sonra Şah Nemətullah Yəzdinin həyat yoldaşı olmuşdur.

*Pərixan xanım* (vəf. 1543) – Şirvanşah II İbrahimin oğlu Sultan Xəlillə (gələcək Şirvanşah II Xəlilullah) ailə qurmuş, onun ölümündən (1535) sonra Şəki hakimi *Dərviş Məhəmməd xana* ərə getmişdir.

*Məhin banu* (1519-1562) – ailə qurmamışdır.

I Şah İsmayılın qızı Şah Zeynəb xanımın *Məhəmməd xan Şərəfəddinoğlu Təkəlüyə* ərə getdiyi, başqa bir qızının *Abdullah xan Ustaclu* ilə ailə qurduğu barədə məlumatlar vardır (Abdullah xan Ustaclunun həyat yoldaşının adını Firəngiz (Fərəhəngiz) xanım şəklində yazırlar). I Şah İsmayılın kürəkənləri arasında bəzən vəkil Nəcmi-sanini də qeyd edirlər, lakin şahın hansı qızı ilə evləndiyi məlum deyildir. II Sultan Bayezidin nəvəsi (şahzadə Əhmədin oğlu) şahzadə Muradın (vəf. 1519) da Səfəvilər dövlətinə sığındıqdan sonra I Şah İsmayılın qızlarından biri ilə evləndiyi barədə ehtimallar mövcuddur.

I Şah İsmayılın övladları barədə ayrıca məqalələr şəklində məlumat verilmişdir.

***Mənbələr:*** *O.Əfəndiyev. Azərbaycan Səfəvilər dövləti, s.40-64; Namiq Musalı. I Şah İsmayılın hakimiyyəti ("Tarix-i aləmara-yi Şah İsmayıl" əsəri əsasında); Aləmarayi-Səfəvi (nəşrə hazırlayan: Yədullah Şükri); Fütuhati-şahi (nəşrə hazırlayan: Məhəmməd Rza Nəsiri); İsgəndər bəy Münşi. Tarix-i aləmara-yi Abbasi (tərcümə və şərhlər: O.Əfəndiyev, N.Musalı), s.77-120; Həsən bəy Rumlu. Əhsən ət-təvarix (nəşrə hazırlayan: Ə.Nəvai), s.13-240; Budaq Qəzvini. Cəvahir əl-əxbar (müqəddimə: M.Bəhramnejad), s.111-140; Əbülhəsən ibn İbrahim Qəzvini. Fəvaid əs-Səfəviyyə (nəşrə hazırlayan: Məryəm Mirəhmədi), s.6-17; Yəhya ibn Əbdülmüttəlib Qəzvini. Lübb ət-təvarix, s.240-260; Vəliqulu bəy Şamlu. Qisəs əl-xaqani (nəşrə hazırlayan: S.H.Sadat Nasiri), s.33-50; Mirzə bəy Cünabədi. Rövzət əs-Səfəviyyə (nəşrə hazırlayan: Qulamrza Təbatəbaiməcd), s.103-360; Mirzə Məhəmməd Məsum. Tarixi-səlatini-Səfəviyyə (nəşrə hazırlayan: Seyid Əmir Həsən Abidi), s.8-11; Seyid Həsən ibn Mürtəza Hüseyni Astarabadi. Tarixi-sultani (nəşrə hazırlayan: Ehsan İşraqi), s.31-52; Əhməd ibn Məhəmməd Ğəffari Kaşani (Qəzvini). Tarixi-cahanara (nəşrə hazırlayan: Əhməd Nəraqi), s.263-281; Əbdi bəy Şirazi. Təkmilət əl-əxbar (nəşrə hazırlayan: Ə.Nəvai), s.36-59; Sam Mirzə. Töhfeyi-Sami (nəşrə hazırlayan: Vəhid Dəstgirdi), s.7-9; Məhəmməd Möhsin Mustovfi. Zübdət ət-təvarix (nəşrə hazırlayan: Bəhruz Gudərzi), s.47-56; Venesiyalıların İran səfərnaməsi (farsca tərcümə), s.262; C.Bayramlı, V.Zifəroğlu. Azərbaycan hökmdarları: Səfəvilər, s.15-28; Mehman Süleymanov. Səfəvilər (Şah İsmayıl Səfəvi), II və III cildlər; M.K.Yusifcəmali. I Şah İsmayılın həyatı; Tufan Gündüz. Son Kızılbaş Şah İsmail; Azərbaycan tarixi (7 cilddə), III, 2-3-215; Süleyman Əliyarlı. Azərbaycan tarixi uzaq keçmişdən 1870-ci ilə qədər, s.364-381; Z.Bayramlı, B.Şabiyev. Azərbaycan Səfəvi dövləti (XVI-XVII əsrlər), s.59-82; Faruk Sümer. Safevi Devletinin Kuruluşu ve Gelişmesinde Anadolu Türklerinin Rolü, s.15-42; Joseph von Hammer. Büyük Osmanlı Tarihi (18 cilt), IV, 129; Namiq Musalı. I. Şah İsmail'in İdarî-Askerî ve İctimaî-İktisadî Politikaları Üzerine Bazı Notlar ve Değerlendirmeler (Akademik Tarih ve Düşünce Dergisi, İlkbahar 2018, 5/14), s.1-46; Ahmet Keven. Şah İsmail'in Mezhebi Eğilimlerinin Anadolu ve İran Coğrafyasına Etkileri (Uluslararası Sosyal ve Eğitim Bilimleri Dergisi, Cilt: 2, Sayı: 3, Hazıran 2015), s.9-26; Həmidrza Səfakiş. Səfəvilər tarix boyunca, s.57-64; Hacı Soltan Hüseynqulu oğlu. Şah İsmayıl Xətai (xronoloji-tarixi məlumatlar); Məhəmmədəli Tərbiyət. Danişməndani-Azərbaycan, s.365-366; Salman Mümtaz. Şah*



*Xətai ("Azərbaycan ədəbiyyatının qaynaqları" kitabından), s.309-322; A.A.Bakıxanov. Gülüstani-İrəm, s.109-113; M.H.Ghulam Sarwar. History of Shah Ismail Safawi; Roger Savory. Səfəvilər dövrü İran tarixinə dair araşdırmalar, s.79-106; Roger Savory. Səfəvilər dövrünün İranı (farsca tərcümə: Kambiz Əzizi), s.26-47; Əliəkbər Vilayəti. Şah İsmayıl Səfəvi dövründə İranın xarici əlaqələr tarixi; Yaqub Mahmudov. Azərbaycan diplomatiyası, s.170-221; P.Мехтиев. Шах Исмаил Сефеви: портрет правителя и воина; Р.Б.Рыбаков и др. История Востока: Восток на рубеже средневековья и нового времени XVI-XVIII вв. (в 6 томах), III, 100-104; Архив Маркса и Энгельса (под редакцией М.Б.Митина), VII, 206; Dairət əl-maarifi-təşəyyö, II, 169-170; E.Denison Ross. The Early Years of Shah Ismail, Founder of The Safavi Dynasty (Journal of The Royal Asiatic Society), pp.249-340; Cambridge History of Iran, vol.6, pp.634-640; The Encyclopaedia of Islam, IV, 186-188 ("Isma'il I"); Christopher Buyers. The Safawi Dynasty, Cenealogy.*

**I ŞAH TƏHMASİB** (1514/15-14 may, 1576) – Səfəvilər dövlətinin sayca ikinci hökmdarı (hakim. 1524-1576). Mənbələrdə adı Təhmasb və ya Təhmasp şəklində də qeyd edilir. Səfəvilər dövlətinin banisi I Şah İsmayılın böyük oğludur. Əksər tarixi mənbələrə görə, anası qızılbaş *Mosullu tayfasından* Mihmad bəyin qızı *Taclu bəyimdir*. Bəzi tədqiqatçılar Taclu bəyimin onun doğma anası olmadığını, buna baxmayaraq, I Şah İsmayıldan sonra onun hakimiyyətə gəlişini dəstəklədiyini yazır, *Bəhruzə bəyimi* onun doğma anası sayırlar. 1514-cü ilin fevralında (martında) İsfahanın Şahabad kəndində doğulmuşdur. *"Şah Təhmasib təzkirəsi"ndə* onun təvəllüd tarixi olaraq hicri 920-ci il zilhiccə ayının 26-sı, yəni miladi 1515-ci ilin fevralı qeyd edilmişdir.

Təhmasib Mirzə körpə yaşlarında atası tərəfindən Herata hakim kimi göndərilmiş, ana tərəfdən qohumu olan keçmiş Diyarbəkir valisi *Əmir xan Mosullu* onun *lələsi* və himayədarı təyin edilmişdir. Bir neçə ildən sonra Əmir xan Mosullu xidməti vəzifəsində yol verdiyi ciddi nöqsana görə geri çağırılmış və mühakimə olunmuşdu, həmtayfası Taclu xanım onu ölüm cəzasından xilas etsə də, Əmir xan həbsdə öldü. Onunla birlikdə paytaxta qayıtmış Təhmasib Mirzəni isə Herat hakimliyində kiçik qardaşı *Sam Mirzə* əvəz etdi (1522).

Təhmasib Mirzə atasının vəfatınadək sarayda yaşamış, mükəmməl təhsil almış, fiziki təlimləri mənimsəmişdi. Bu dövrdə onun lələsi *Div sultan Rumlu* idi. Div sultan I Şah İsmayılın ömrünün sonlarına yaxın dövlətdə çox yüksək nüfuza malik idi, qızılbaş qoşununun baş komandanlığı (*əmir əl-üməra* vəzifəsi) və bəzi məlumatlara görə, dövlətdə şahdan sonra ən yüksək mənsəb olan vəkillik ona həvalə edilmişdi. Öz yaxın silahdaşları arasında ondan daha üstün namizəd tapa bilməyən şah dünyasını dəyişərkən Təhmasib Mirzənin himayəsini ona vəsiyyət etmişdi.

1524-cü ilin mayında Səfəvilər dövlətinin qurucusu I Şah İsmayıl vəfat etdi və ənənə üzrə böyük oğul – 10 yaşlı Təh-

masib taxta çıxdı. O, Səfəvilər dövlətinin tarixi boyunca ən uzunmüddətli (52 il) hakimiyyət sürmüş şah sayılır. I Şah Təhmasibin hakimiyyətinin ilk illəri Səfəvilər dövləti üçün çox keşməkeşli olmuş, vətəndaş müharibəsi şəraitində keçmişdir. Yeniyetmə şah üzərində nüfuz qazanmaq və dövlət idarəçiliyində söz sahibi olmaq uğrunda ən güclü *qızılbaş tayfalarının* başçıları açıq rəqabətə girmişlər. Rumlu tayfasından *Div sultan*, Ustaclu tayfasından *Köpək sultan* (Mustafa xan), Təkəlü tayfasından *Çuxa sultan* rəqib dəstələrə başçılıq edirdilər. Əvvəlcə Köpək sultan və bir neçə Ustaclu əmiri Rumlu-Təkəlü ittifaqı ilə döyüşlərdə həlak oldu. Ustaclu tayfasını zəiflətdikdən sonra Çuxa sultan Təkəlü öz şəriki Div sultan Rumlunu şahın gözündən saldı və 1527-ci ilin iyulunda Div sultan şahın hüzuruna daxil olarkən hücuma məruz qalıb öldürüldü. Çuxa sultanın başçılığı altında üstünlüyü ələ almış təkəlülər az sonra digər qızılbaş tayfalarının sərt müqaviməti ilə qarşılaşdılar (bax: *afəti-Təkəlü*). 1531-ci ildə I Şah Təhmasibin bibisi oğlu *Hüseyn xan Şamlu* (*Əbdi bəy Şamlunun* oğlu və *Durmuş xanın* qardaşı) tayfa qarşıdurmasını yatırmağa nail oldu və *vəkil* olaraq gənc şahın adından dövləti idarə etməyə başladı.

1528-ci ildə Luristan hakimi, Mosullu tayfasından olan Zülfüqar sultan (Noxud sultan ləqəbi ilə tanınırdı) müstəqil şəkildə qərar verərək Bağdada hücum etdi və öz əmisi İbrahim xan Mosullunu (böyük şair *Füzulinin* himayədarı) öldürüb şəhərə yiyələndi. Bundan sonra o, Bağdadın açarlarını Osmanlı sultanına göndərərək onun himayəsinə sığındığını elan etdi. Səfəvi şahı ləngimədən bu hadisəyə reaksiya verərək Bağdadı mühasirəyə aldı, Noxud sultanı edam etdi və şəhərin idarəsini *Məhəmməd sultan Şərəfəddinoğlu Təkəlüyə* tapşırdı (1529). Bağdadda baş verənlər Osmanlı imperiyasının Səfəvilər dövlətinə qarşı yeni müharibə planı qurmasının ilk əlaməti idi.

Təkəlü tayfasının siyasi hegemonluğuna son qoyulduqdan sonra bu tayfanın yetirməsi olan Azərbaycan bəylərbəyi *Ulamə sultan* dövlət çevrilişinə cəhd etsə də, uğursuzluqla üzləşib Osmanlı dövlətinə sığındı. O, I Sultan Süleyman Qanunini Səfəvilər dövlətinə qarşı hərbi müdaxiləyə həvəsləndirdi, şahın başının həm ölkədaxili üsyanları yatırmağa, həm də özbəklərlə savaşmağa qarışdığını söyləyərək yeni cəbhə açmağı təklif etdi. Ulamə sultan qısa müddətdə qızılbaş ölkəsini ələ keçirməyin mümkünlüyünə sultanı inandırmağı bacardı. Osmanlı qüvvələri onun bələdçiliyi ilə bir neçə dəfə sərhədi pozub hücuma keçdilər. Diyarbəkir valisi Fil Yaqub paşanın köməyindən yararlanan Ulamə sultan Van gölünün yaxınlığında yerləşən və Səfəvi təsirində olan Bitlis qalasını tutdu. Qızılbaşlar növbəti ildə Bitlis qalasını geri alsalar da, şahın Xorasanda özbəklərlə savaşmasından istifadə edən Ulamə sultan 1533-cü ildə Bitlisi yenidən ələ keçirdi və buranın hakimi Şərəf xanı öldürdü (O, məşhur salnaməçi,



"Şərəfnamə" kitabının müəllifi *Şərəf xan Bitlisinin* babası, *Əmir xan Mosullunun* qudasıdır).

1534-cü ildə Osmanlı ordusu Səfəvilər dövləti üzərinə hücuma keçdi, bununla da 20 ildən çox davam etmiş Səfəvi-Osmanlı müharibəsinin növbəti mərhələsi başladı. Böyük ordu ilə hərəkət edən və əsas gücü sədri-əzəm (baş vəzir) İbrahim paşanın 90 min nəfərlik qoşunundan ibarət olan, Ulamə sultanın da 10 min nəfərlə qatıldığı Osmanlı ordusu çətinlik çəkmədən Təbrizə daxil oldu. Cəmi 7 min nəfərlik hərbi qüvvə toplaya bilmiş Səfəvi şahı düşmənlə açıq qarşıdurmadan çəkinirdi. Çaldıran savaşının acı nəticələrini unutmamış şah sərkərdələrin məşvərət məclisində belə söyləmişdi: "Məgər mən dedim ki, biz rumlularla üz-üzə vuruşmaq istəyirik? Mən atamın qaydası ilə gedə bilmərəm. Bu düşmən çox güclüdür".

Qış mövsümünün çox sərt keçməsi nəticəsində Osmanlı qoşunu çoxlu itki verdi, xeyli əsgər soyuqdan donaraq öldü, ordu təchizatında istifadə edilən minik heyvanlarının böyük hissəsi qırıldı. I Sultan Süleyman qışlamaq üçün İraq torpaqlarına üz tutdu, Bağdadı və İraqın müqəddəs şəhərlərini ələ keçirdi. Bununla da İraq torpaqları təqribən 90 ildən sonra I Şah Abbas tərəfindən geri qaytarılanadək Osmanlı işğalı altına düşdü.

I Şah Təhmasib Osmanlı istilasına qarşı müqavimət göstərməklə yanaşı ölkədaxili sabitliyi qorumaq istiqamətində də uğurlu fəaliyyət göstərirdi. 1534-cü ildə o, dövlətdə böyük nüfuz sahibi olan və şahı öz təsiri altında saxlayan *Hüseyn xan Şamlunu* osmanlılarla işbirliyində ittiham edərək aradan götürdü. Bununla da 20 yaşlı I Şah Təhmasib qızılbaş tayfalarının 10 illik özbaşınalığına son qoyaraq tam müstəqil şəkildə qərarlar verməyə başladı. Bununla yanaşı, hələ uzun müddət sarayda şahbanu Taclu xanımın nüfuzu güclü olaraq qalmaqda idi.

Öz hakimiyyətini möhkəmlədən gənc şah ilk sülalədaxili xəyanətlə üzləşdi, qardaşı *Sam Mirzə* Ulamə sultan Təkəlü ilə birləşərək osmanlıların tərəfinə keçdi. I Sultan Süleyman Sam Mirzəyə Səfəvilər dövlətinin şərq torpaqlarının hakimi olmağı təklif etməklə onu qardaşına qarşı üsyana sürüklədi. Lakin Osmanlı qüvvələrinin hərbi uğursuzluğu və tələsik geri çəkilməsi Sam Mirzənin planlarını puça çıxardı və o, qardaşına təslim olmaqdan başqa çıxış yolu görmədi.

1535-ci ilin yazında osmanlıların ikinci hücum dalğası başladı. Şah Təbriz əhalisini təhlükəsiz əraziyə köçürmüş, təmassız müharibə üçün lazım olan tədbirləri görmüşdü. Onun əmri ilə qızılbaşlar "yandırılmış torpaq" taktikasını seçərək osmanlıların keçdiyi yol boyunca bütün ərzaq ehtiyatını məhv edib əkin sahələrinə od vurdular, nəqliyyat və kommunikasiya yollarını dağıdıb su quyularını torpaqla doldurdular. Şah Təbriz yaxınlığındakı Sultaniyyə şəhərciyində qərargah qurdu və hərbi əməliyyatları buradan idarə etməyə başladı. Cəsur qızılbaş döyüşçülərinin qəfil bas-

qınları düşməni daim qorxuda saxlayaraq onlarda psixoloji gərginlik yaradırdı. Bu yürüşlərdə osmanlılar uzun yol, əlverişsiz hava şəraiti, ərzaq qıtlığı və taun xəstəliyi üzündən on minlərlə canlı qüvvə itirdilər. Şahın qardaşı *Bəhram Mirzənin* ümumi rəhbərliyi altında qızılbaş qoşunu Osmanlı qüvvələrinə sarsıdıcı zərbələr endirdi. Osmanlı sərkərdəsi Sinan paşa öldürüldü, sədri-əzəm İbrahim paşanın qoşunu darmadağın edildi, Ulamə sultan növbəti dəfə qaçmağa məcbur oldu. Strateji əhəmiyyətə malik Van və Ərciş qalaları yenidən Səfəvi torpaqlarının tərkibinə qaytarıldı. 1548-ci ilədək davam etmis nisbi sakitlik osmanlıların yeni hücum dalğası ilə pozuldu. Həmin il qardaşına qarşı üsyan qaldırmış *Əlqas Mirzə* qaçaraq əvvəlcə Krıma, oradan da İstanbula keçdi və sultanın himayəsinə sığındı. O, I Sultan Süleymanı yenidən Səfəvilər dövləti üzərinə hücuma keçməyə həvəsləndirdi və asanlıqla qələbə qazanacağını ona vəd etdi. Əlqas Mirzənin sözlərinə görə, qızılbaş əmirləri osmanlıların hücum xəbərini eşidən kimi şaha xəyanət edib qarşı tərəfə keçəcəkdilər. Lakin bunun əksinə olaraq qızılbaş sərkərdələri nəinki şaha xəyanət etmədilər, hətta əvvəllər osmanlıların tərəfinə keçmiş, Əlqas Mirzənin başçılığı altında yürüşə qatılmış əmirlərin çoxu peşman olub şahın hüzuruna döndü. Osmanlılara qarşı budəfəki müqavimət cəbhəsinə I Şah Təhmasibin gənc oğlu İsmayıl Mirzə (gələcək *II Şah İsmayıl*) başçılıq edirdi. Osmanlı sultanı Təbrizi ələ keçirə bilsə də, 1514-cü ildə I Sultan Səlimin yürüşündə olduğu kimi, şəhərdə bir neçə gündən artıq qala bilmədi. Tərəflər arasında baş vermiş bir neşə toqquşmada qızılbaşlar qalib gəldilər. Osmanlı qüvvələri qəfil basqınlardan xeyli tələfat verərək geri çəkildi. Əlqas Mirzə köməksiz qalaraq təslim olmaqdan başqa çıxış yolu görmədi. Bununla da osmanlıların Səfəvilər dövlətinə üçüncü hücum dalğası uğursuzluqla başa çatdı.

Osmanlıların qarətçi hücumlarına cavab olaraq I Şah Təhmasib 1552-ci ildə özü sərhəd bölgəsi üzərinə yürüşə çıxdı. Dörd istiqamətdə hərəkət edən Səfəvi qoşununa İsmayıl Mirzə, *Məsum bəy Səfəvi*, *Allahqulu sultan Eycəkoğlu Ustaclu*, Əli sultan Təkəlü, *Şahverdi sultan Ziyadoğlu-Qacar*, *İbrahim xan Zülqədər*, *Bədr xan Ustaclu*, Çıraq sultan Ustaclu, *Şahqulu sultan Ustaclu*, Ədhəm bəy Rumlu və başqa sərkərdələr başçılıq edirdilər. Səfəvi qoşunu Əxlat, Van, Muş, Bitlis, Ərciş və digər bölgələri qarət etdi, osmanlılara məxsus iri malqara sürüləri qənimət kimi ələ keçirildi. Ərzurum valisi İsgəndər paşa öz qüvvəsinə arxalanaraq döyüşə girsə də, məğlubiyyətlə üzləşib qalaya çəkilməyə məcbur oldu, amma Ərzurumu qoruya bilmədi. Minlərlə Osmanlı döyüşçüsü qarışıqlıqda xəndəyə yıxılaraq öldü, bir neçə görkəmli sərkərdə qızılbaşlara əsir düşdü. I Şah Təhmasibin şəxsən qatıldığı bu yürüşdə İsmayıl Mirzə xüsusi fərqlənmiş və böyük şöhrət qazanmışdı. I Sultan Süleyman Səfəvi şahının sülh təklifinə lazımi qədər etina göstərmə-



diyi üçün qızılbaş qoşunu bir daha Kürdüstana hücum edib bol qənimət ələ keçirdi (1553).
Osmanlı sultanı məğlubiyyətlə barışmayaraq növbəti yürüşə hazırlaşmağa başladı. Bunun üçün Avropada hərbi əməliyyatlar aparan baş vəzir Rüstəm paşa (həm də sultanın kürəkəni idi) geri çağırıldı və ona 50 min nəfərlik qoşunun başında hərəkətə keçmək əmri verildi, sultan özü də sonradan öz qüvvələri ilə onunla birləşməli idi. Lakin I Sultan Süleymanın səhhətinin pisləşməsi və Rüstəm paşanın saray intriqalarına aludəliyi yürüşü növbəti ilədək təxirə saldı. 1553-cü il avqustun sonlarında sultan nəhəng ordu ilə İstanbulu tərk etdi, amma Rüstəm paşadan narazı olan yeniçərilərin etirazı və digər səbəblər üzündən ordunun yürüşü ləngidi. Süleyman Qanuni qızılbaş qoşununun sərhəd bölgəsinə yürüşü barədə xəbərləri diqqətlə izləyirdi, bəzi mənbələr bu dəfə sülh danışıqlarının başlanmasında onun daha çox maraqlı olduğunu xəbər verir. Qışı Diyarbəkirdə keçirən Osmanlı ordusu 1554-cü ilin mayında hərəkətə başladı. Bu müddət ərzində I Şah Təhmasib "yandırılmış torpaq" taktikasını mükəmməl şəkildə həyata keçirməyə və üzücü qarşıdurmaya tam hazırlaşmağa imkan tapmışdı. Diyarbəkirdən Qarabağadək irəliləyən sultan yol boyunca İsmayıl Mirzənin sərkərdəlik məharəti barədə xəbərlər alırdı, qızılbaşların Ərzurumu ələ keçirib sərhəd bölgəsini nəzarət altına almaları onun gələcək yürüş barədə ümidlərini puça çıxardı. Sultan yürüşü davam etdirməyin mənasız olduğunu görərək geri dönməyə qərar verdi. Beləliklə, I Şah Təhmasibin qurduğu uğurlu döyüş taktikası nəticəsində osmanlıların Səfəvi torpaqlarına dörd yürüşü tam iflasa uğradı, sultan sonuncu yürüşdən geri dönərkən sülh danışıqlarına başlamaq xahişi ilə şaha müraciət etdi. 1555-ci il mayın 29-da Amasya şəhərində tərəflər arasında 20 illik müharibəyə son qoyan sülh sazişi imzalandı. *Amasya sülhünə* görə, Gürcüstan iki hissəyə bölündü, Qərbi Gürcüstan Osmanlıların, Şərqi Gürcüstan isə Səfəvilərin təsir dairəsi altına keçdi. İraq bölgəsi osmanlılara verildi, Azərbaycan torpaqları isə bütünlükdə Səfəvilər dövlətinin tərkibində qaldı.
Səfəvi-Osmanlı müharibəsinin nəticələri göstərdi ki, I Şah Təhmasib hərbi əməliyyatlar zamanı düzgün taktika qurmuş və sayca daha az orduya malik olsa da, manevrlərlə qarşı tərəfi yorub taqətdən salmağı bacarmışdı. Eyni zamanda, həm şərq (osmanlılara qarşı), həm də qərb cəbhəsində (özbəklərə qarşı) uğurla mübarizə apara bilmək, bununla yanaşı, ölkədaxili sabitliyi qorumaq böyük idarəçilik bacarığı və hərbi istedad tələb edirdi. Amasya sülhü dini mənada da mühüm əhəmiyyət kəsb etmişdir. Onun şərtlərinə görə, hər iki ölkədə dini radikallıq və məzhəb barışmazlığı tendensiyası müvəqqəti olsa da zəiflədi, Osmanlı dövləti *şiəliyi* İslam məzhəblərindən biri kimi qəbul etdi, Səfəvilər isə Osmanlı sultanının xəlifə titulunu tanıdılar. Osmanlı tərəfi şiə zəvvarların

Nəcəf və Kərbəla ziyarətlərinə getmələri, həcc ziyarətini yerinə yetirmələri üçün təhlükəsizliyi təmin edəcəyi barədə öhdəlik götürdü.

Amasya sülhündən dərhal sonra I Şah Təhmasib Səfəvilər dövlətinin paytaxtını Təbrizdən Qəzvinə köçürdü. 1555-ci ildən 1598-ci ilə, yəni I Şah Abbas tərəfindən İsfahan paytaxt seçilənədək *Qəzvin* dövlətin birinci şəhəri statusunu qoruyub saxladı.

I Şah Təhmasibin hakimiyyəti dövründə Səfəvilər dövlətinin Gürcüstana yönəlmiş siyasi maraqları fəallaşmış, bölgəyə ardıcıl hərbi yürüşlər həyata keçirilmişdir. Səfəvilər Kartli və Kaxeti çarlıqlarını öz nüfuz dairələri altına almağa bacardılar, Qarabağ və Gəncə bəylərbəyiləri (bu vəzifəyə əsasən Qacar tayfasının *Ziyadoğulları* sülaləsinin üzvləri təyin edilirdilər) Gürcüstan məsələlərində həlledici rol oynayır, bölgəyə nəzarət onlara tapşırılırdı. Kartli çarı I Luarsab Səfəvilərə qarşı müqavimət göstərməyə çalışsa da, *Şahverdi Sultan Ziyadoğlu-Qacarın* dəstəsi ilə döyüşdə öldürüldü (1556), onun yerini tutan oğlu I Simon bir neçə ildən sonra I Şah Təhmasib tərəfindən hakimiyyətdən salındı və Səfəvilər sarayında tərbiyə görüb Davud xan adını almış qardaşı XI David onun yerini tutdu. Lakin Davud xan osmanlılarla mübarizədə məğlub olub əsir götürüldü, I Simon yenidən taxta keçdi (1578). I Şah İsmayılın zamanından bəri Kaxeti çarı olan I Levan Səfəvi təsirindən qurtulmaq üçün Rusiyadan yardım istədi, hətta oğlu Qorgini qızılbaşlarla döyüşən Kartli çarı I Simona yardıma göndərdi. Lakin Rusiyadan gözlədiyi yardımı ala bilməyən, oğlunu da döyüşdə itirən I Levan sonda Səfəvilərə itaətlə barışmalı oldu. I Şah Təhmasib dövründə əsası qoyulmuş ənənəyə görə, Gürcüstan taxtına şahın məsləhət bildiyi şəxslər gətirilirdi, gələcək Kartli və Kaxeti çarları Səfəvilər dövlətində hazırlıq keçdikdən sonra Gürcüstana qayıdaraq taxta çıxırdılar, bəzi çarlar və şahzadələr isə İslamı qəbul etmişdilər və onlara müsəlman ləqəbləri verilmişdi.

I Şah Təhmasib zamanında Səfəvilər dövlətinin şərq sərhədlərini hədələyən özbək təhlükəsi daha da fəallaşmışdı. I Şah İsmayılın zamanında Xorasana olan iddialarından müvəqqəti əl çəkmiş özbəklər onun vəfatından sonra dövlətin daxili çəkişmələrdən zəiflədiyini düşünərək hərəkətə keçdilər. Heratın təcrübəli hakimi *Durmuş xan Şamlunun* düzgün müqavimət planı qurması nəticəsində qızılbaşlar öz mövqelərini qoruyub saxlaya bildilər. 1528-ci ildə Buxara hakimi, Şeybani hökmdarı Übeydullah xan 100 min nəfərdən artıq qoşunla Xorasan üzərinə yürüşə çıxdı. I Şah Təhmasibin ixtiyarında olan hərbi qüvvə bundan dəfələrlə az olsa da, o, qarşıdurmadan çəkinmədi. Döyüşün ilk mərhələsi qızılbaşların məğlubiyyəti ilə nəticələndi, qızılbaş qoşununun cinahları düşmənin hücumu qarşısında tab gətirməyib geri çəkildi. Qələbədən arxayınlaşan özbəklər döyüş meydanına səpələnib qənimətləri toplamağa başladılar. Übeydullah xan öz qələbəsi-



ni bayram etdiyi zaman 14 yaşlı I Şah Təhmasib qəfil əks-hücumla özbəklərin mövqeyini sarsıtdı. Öz şəxsi qvardiyasının başında həmləyə keçən şahın qətiyyəti döyüşün taleyini həll etdi, Cam savaşı Səfəvilərin parlaq qələbəsi ilə başa çatdı.

Sonrakı illər ərzində Übeydullah xan Xorasan üzərində nəzarəti ələ keçirmək üçün bir neçə dəfə ardıcıl cəhdlər etdi, Herat şəhəri dəfələrlə əldən-ələ keçdi. Bir qayda olaraq, özbəklər şəhəri mühasirədən sonra tutur, qətl və qarət törətdikdən sonra qızılbaş qoşununun gəliş xəbərini eşidib tələsik geri çəkilirdilər. 1540-cı ildə Übeydullah xan öldükdən sonra özbəklərin hücumları səngiməyə başladı və Xorasan nahiyəsində müvəqqəti sabitlik yarandı. Lakin Şeybanilər sülaləsindən Buxara, Bəlx və Xarəzmdə hakimiyyət sürən xanlar bir neçə ildən sonra hücumları bərpa etdilər. Səfəvi qoşunu bu hücumların qarşısını alır və özbəkləri geri oturdurdu. Astarabad bölgəsini təhlükə altında saxlayan Yaka türkmanlarının da hücumlarına layiqli cavablar verilirdi.

I Şah Təhmasibin hakimiyyəti dövründə Səfəvilər dövləti ilə onun cənub-şərq qonşusu olan *Böyük Moğol imperiyası* arasında kifayət qədər sıx diplomatik əlaqələr qurulmuşdu. Lakin mühüm strateji əhəmiyyətə malik olan Qəndəhar şəhəri uğrunda aparılan mübarizələr qonşuluq əlaqələrinə müəyyən kölgələr salırdı. 1537-ci ildə qızılbaşlar Qəndəharı ələ keçirdilər, amma növbəti ildə şəhərin hakimi Budaq xan Qacar moğol hücumunun qarşısında geri çəkildi. Səfəvi-Moğol münasibətlərinin ən maraqlı səhifəsini moğol hökmdarı Humayun şahın Səfəvilər dövlətində yaşadığı müddət təşkil edir. 1540-cı ildə siyasi rəqibi Şirşah tərəfindən sıxışdırılan və qardaşlarından da yardım görməyən Humayun şah Səfəvilər dövlətinə pənah gətirib I Şah Təhmasibin himayəsinə sığındı. Səfəvi himayəsi altında yaşadığı 15 il ərzində o, şah tərəfindən böyük hörmətlə əhatə olunmuş və hər cür hərbi-siyasi yardımdan faydalanmışdı. Məhz I Şah Təhmasibin yaxından köməkliyi sayəsində Humayun şah öz rəqiblərini məğlub edərək taxt-tacını geri qaytara bildi, Qəndəhar şəhəri də minnətdarlıq əlaməti olaraq Səfəvilərə qaytarıldı. Lakin moğollar az sonra şəhəri yenidən zəbt edərək öz dövlətlərinə qatdılar.

I Şah Təhmasib bundan sonra da Moğol dövlətinin çiçəklənməsi üçün əlindən gələni əsirgəməmiş, onlarla istedadlı rəssam və şairi, xəttat və memarı, həmçinin bacarıqlı sərkərdə və dövlət adamlarını Hindistana ezam etmişdi. Bunun sayəsində Böyük Moğol imperiyasında Səfəvi ənənələri güclü şəkildə yayılmış, rəssamlıqda moğol miniatür məktəbi, ədəbiyyatda *"səbki-hindi"* üslubu formalaşmışdı.

1538-ci ildə I Şah Təhmasib osmanlılarla müharibədə fasilələrdən yararlanaraq *Şirvanşahlar dövlətini* ləğv etməyə nail oldu. I Şah Təhmasibin bacısı *Pərixan xanım* Şirvanşah II Xəlilullahın həyat yoldaşı idi. 1535-ci ildə II Xəlilullahın ölümündən sonra hakimiyyət

taxtı boş qalmış, daxili çəkişmələr başlamışdı. Pərixan xanım qardaşının təlimatlarına uyğun hərəkət edərək Şirvanşahlar dövlətinin idarəçiliyini öz əlinə aldı. Daha sonra Təbrizə gələrək şahla görüşdü və ona xaos içində olan Şirvanın şahlıq kimi ləğv edilmə vaxtının çatdığını bildirdi. Öz dəstəsi ilə Təbrizə gəlmiş qorçubaşı Padarın ifadələri də bununla üst-üstə düşürdü. 1538-ci ilin yayında şahın göstərişi ilə Əlqas Mirzə 20 minlik qoşunun başında Şirvan üzərinə yürüdü, müqavimət göstərən Şirvan qoşun dəstələri Gülüstan və Buğurt qalalarında möhkəmlənməyə çalışsa da, qızılbaş ordusu yeni əldə edilmiş döyüş toplarını işə saldıqdan sonra qaladakılar təslim oldular. Şirvanşahların xəzinəsi hesab olunan Buğurt qalasındakı saysız-hesabsız pul və qiymətli daş-qaş müsadirə edildi. Şirvanşahlar dövləti bəylərbəylik statusu ilə Səfəvi dövlətinə ilhaq olundu, Əlqas Mirzə Şirvan bəylərbəyi vəzifəsinə təyinat aldı.

1554-cü ildə Osmanlı qoşununun dördüncü yürüşü fonunda Şirvanşahlar nəslindən olan Qasım osmanlılardan yardım alaraq Şirvan torpaqlarında Səfəvilər əleyhinə qiyam qaldırdı. Şirvanın ozamankı bəylərbəyi *Abdullah xan Ustaclu* ixtiyarındakı qüvvələrin azlığına baxmayaraq, bu üsyanı müvəffəqiyyətlə yatıra bildi. 1551-ci ildə I Şah Təhmasib Şəki hakimliyinin formal müstəqilliyinə son qoyaraq onu Səfəvilər dövlətinin tərkibinə qatdı. Şəki hakimi, şahın yeznəsi *Dərviş Məhəmməd xan* (o, Şirvanşah II Xəlilullahın dul arvadı Pərixan xanımla evlənmişdi) müqavimət göstərməyə çalışarkən öldürüldü və Toygün bəy Qacar onun yerinə təyin edildi.

I Şah Təhmasibin hakimiyyət müddətini Səfəvilər dövlətinin tarixi üçün uğurlu saymaq olar. O, qızılbaş əmirlərinin çəkişmələrinə son qoyaraq mərkəzi hakimiyyəti gücləndirmiş, ölkənin şərq sərhədlərində özbək hücumuna qarşı kifayət qədər uğurla müqavimət göstərmiş, seçdiyi düzgün taktika ilə nəhəng Osmanlı ordusunun dörd böyük yürüşünü Səfəvilər dövləti üçün əlverişli sayıla biləcək sülh müqaviləsi ilə nəticələndirmiş, Şirvanşahlar dövlətini və Şəki hakimliyini öz mülklərinə birləşdirmiş, Gürcüstana dəfələrlə yürüşlər həyata keçirməklə Kartli və Kaxeti çarlıqlarını asılı vəziyyətə salmışdı. Gilan, Təbriz, Şirvan bölgələrində qopmuş xalq üsyanları şahın qətiyyəti nəticəsində yatırılmışdı.

1559-cu ilin sonunda atasına (I Sultan Süleyman Qanuniyə) qarşı üsyan etmiş Osmanlı şahzadəsi Bayezid təqibdən qurtulmaq üçün Səfəvi dövlətinin ərazisinə gəlib burada qonaqpərvərliklə qarşılanaraq 3 il qaldı. Bəzi mənbələrə görə, sultanın öz oğlunu təslim etmək tələblərinə qarşı şah ondan Bağdadı geri qaytarmaq, həmçinin Kərbəladakı şiə türbələrinə qızılbaş xadimlərini nəzarətçi təyin etmək tələbini qoydu. Sultanın bu tələbləri rədd etməsi danışıqların uzanmasına səbəb oldu, amma sonda şahzadə Bayezid 4 oğlu ilə birlikdə İstanbuldan gələn elçi heyətinin sərən-



camına verildi (1562). Eyni zamanda, qarşı tərəfə siyasi sığınacaq xahişi ilə müraciət edən sülalə mənsublarının geri qaytarılması barədə Səfəvi və Osmanlı dövlətləri arasında qarşılıqlı müqavilə imzalandı. Qeyd edək ki, bir çox Səfəvi mənbələrində şahzadə Bayezidin Osmanlı tərəfinə təhvil verilməsinin səbəbi kimi onun təxribat planları qurması və hətta "Şah Təhmasib təzkirəsi"ndə yazıldığına görə, şahı zəhərləməyə cəhd göstərməsi qeyd edilir.

I Şah Təhmasib dövründə Səfəvilər dövlətinin Avropa ölkələri ilə münasibətləri də genişlənmişdi. Məlumatlara görə, Portuqaliya Səfəvilər dövlətinə həm odlu silah, həm də pul ilə yardım göstərmişdi. Təkcə 1549-cu ildə şah portuqallardan 20 ədəd döyüş topu aldı. Venesiya hökuməti öz diplomatları vasitəsilə Səfəvilər dövlətini osmanlıların əleyhinə qızışdırmağa çalışırdı. 1553, 1561, 1563-cü illərdə Səfəvi nümayəndə heyəti Moskvaya səfər etmiş, 1569-cu ildə Çar IV İvan öz nümayəndələrini 100 top və 500 tüfənglə Qəzvinə yollamışdı. Roma papası V Piy 1572-ci ildə şaha göndərdiyi məktubda onu osmanlılara qarşı çıxmağa təhrik etsə də, şah Amasya müqaviləsinin tələblərinə sadiq qalaraq bu təklifə sükutla cavab vermişdi.

Tarixi mənbələrdə qeyd edildiyi kimi, I Şah Təhmasib xüsusi idarəetmə qabiliyyətinə malik idi, xalqın güzəranına diqqət yetirir, rəiyyətin qayğısına qalır, sarayda bütün sənədləşmə işlərinə, rəsmi məktublara şəxsən nəzarət edirdi. Mənbələrdə yazıldığı kimi, onun icazəsi olmadan dövlət adamları heç kəsə bir qara pul da ödəmirdilər. Şah 20 illik vergiləri əhaliyə bağışlamış, yerli hakimlərin öz səlahiyyətlərindən sui-istifadə hallarına qarşı cərimələr tətbiq etmiş, faydalı iqtisadi islahatlar aparmışdı. Onun əmri ilə sənətkarlardan alınan mali-möhtərifə, kəndlilərdən alınan mal-qara (məvaşi) və otlaq (mərai) vergiləri hesab dəftərlərindən silinmiş, rəiyyətdən qeyri-qanuni olaraq bir dinar artıq vergi alan məmurun 50 tümən məbləğində cərimə olunacağı barədə car çəkilmişdi. Şah özü həftənin üç günü divanda oturub verilən hökmlərə nəzarət edir, şikayətləri şəxsən dinləyirdi. I Şah Təhmasibin ən mühüm islahatı şəhər həyatının və ticarətin inkişafına əngəl olan yol tamğası vergisini ləğv etməsi idi (30 min tümən məbləğində olan bu vergini ləğv etmək barədə tapşırığın ona yuxuda ikən *İmam Mehdi (ə)* tərəfindən verildiyi iddia edilir). Vergilərin azaldılması və ya ləğv edilməsi ilə bağlı I Şah Təhmasibin verdiyi fərmanların daş kitabələr üzərindəki mətnləri Azərbaycan ərazisində bir neçə yerdə qalmışdır. Bu fərmanlardan birində rəiyyətdən alınan malcəhət və vücuhat vergilərinin azaldıldığı elan edilir. Həmin fərmanın həkk edildiyi daş kitabə İçəri şəhər Cümə məscidinin minarəsinin divarına bərkidilmişdir.

Şah ölkə ərazisindəki pul kapitalını xəzinəyə toplamışdı, xəzinələr pul və cavahiratla dolmuşdu, qiymətli mallar 7 min baş dəvə yükündən artıq idi. Qərb

səyyahları şahın şəxsi illik gəlirinin 3 milyon, hətta bəzi məlumatlara görə, 8 milyon qızıl sikkə həcmində olduğunu yazmışlar. Bitlisi "Şərəfnamə" kitabında I Şah Təhmasibin Qəhqəhə qalasında mühafizə edilən xəzinəsində 380 min tümən qızıl və gümüş pulun, hər biri 3 min misqal çəkisində 600 ədəd qızıl və gümüş külçənin olduğunu yazmışdır. Bürokratik aparatda çalışan 200 min nəfərdən artıq qulluqçu dövlətdən məvacib alırdı.

I Şah Təhmasibin şəxsi keyfiyyətlərindən bəhs edən tarixçilər onun fenomenal yaddaşa malik olduğunu xüsusi vurğulamışlar. O, 52 illik hakimiyyəti dövründə hər il harada yaylaq və qışlaq etdiyini, bu zaman hansı mühüm hadisələrin baş verdiyini dəqiq xatırlayırdı. Şah dövlət vəzifələrində bütün çalışanların adını bilir, hamını üzdən tanıyırdı. Ən təəccüblüsü bu idi ki, şah ona xidmət edən 3 min nəfər *qorçu* və 3 mindək *yasavul*, bukavul vəzifəli şəxs və daxili mühafizəçilərin (qalaçı) hamısı haqqında, "hansının nə vaxt mülazimliyə başladığını, yürüşlərdə hansı şücaət və igidlik göstərdiyini və əvvəllər hansı xanın və sultanın yanında qulluq etdiyini" bilirdi.

Zahiri görünüş baxımından I Şah Təhmasibin boyu hündür (bəzi məlumatlara görə isə orta), siması sarışın və gərgin, qolları uzun, saqqalı ağarmışdı. Vasvasılıq dərəcəsində təmizkar olan şah hər şeydən şübhələnirdi. Mistik və metafizik elmlərə, yuxuyozmalara meyilli idi. Müasirləri onun bir qədər bədbin xasiyyətli olduğunu yazırlar. Onun ehtiyatkarlığı osmanlılara qarşı aparılan mübarizənin xarakterində də özünü göstərmişdi. Ömrünün son bir neçə ili ərzində şah saraydan kənara çıxmamış, hətta ata minməmişdi.

I Şah Təhmasibin həyatı ilə bağlı mühüm məqamlardan biri onun tövbəsi ilə bağlıdır. Hakimiyyətinin ilk dövrlərində ədəbiyyata, musiqiyə və rəssamlığa xüsusi maraq göstərən şah öz dövrünün böyük sənət adamlarından dərs almışdı. Səfəvi sarayında xidmət edən ən məşhur xəttat və rəssamlar onun istedadını inkişaf etdirməyə çalışırdılar. Şah "Adil" təxəllüsü ilə türk və fars dillərində şeirlər yazırdı. *Sadiq bəy Əfşar "Məcmə əl-xəvas"* təzkirəsində qeyd etmişdir: "Ruh oxşayan sözləri başdan-başa lətif və zərif idi. İstəsəydi, bütün ömrü boyu gözəl şeirlər deyərdi. Şeir deməkdə ardıcıllıq göstərməsə də, təbinin dəryasından çıxan hər bir gövhər dünya əhlinin qulağında sırğa olub qalırdı". I Şah Təhmasibin Sultan Süleyman Qanuni ilə türkcə müşairəsi (şeirləşməsi, deyişməsi) də mənbələrdə öz əksini tapmışdır.

Lakin sonralar I Şah Təhmasib, görünür, şiə üləmasının təkidi ilə incəsənətə olan münasibətini dəyişmiş, ədəbiyyat, musiqi və rəssamlıqla məşğul olmaqdan tövbə etmiş, ölkə ərazisində dünyəvi məzmunlu incəsənəti qadağan edən fərman imzalamışdı. Sarayda fəaliyyət göstərən bəzi sənət adamları bu fərmandan sonra vəzifədən kənarlaşdırılmış, bəziləri isə öz sənətini tərk etmədiyi üçün



cəzalandırılmışdı. Rəssam və musiqiçilərin əksəriyyəti Məşhədə köçərək Bəhram Mirzənin oğlu *Sultan İbrahim Mirzənin* himayəsinə sığındı. Şah yalnız incəsənətin dinlə bağlı növlərinə maraq göstərirdi. Görkəmli xalçaçı rəssam Lətif Kərimov "Azərbaycan xalçası" kitabında yazırdı ki, I Şah Təhmasib Səfəvi həm də mahir rəssam olmuş, xalça eskizləri hazırlamışdır. O öz eskizləri əsasında toxunmuş xalça və pərdələri İmam Hüseynin (ə) və İmam Rzanın (ə) hərəmlərinə hədiyyə etmişdi. Şah Sultan Süleymana yazmışdı ki, memar Sinanın tikdiyi böyük məscid üçün (Süleymaniyyə məscidi) xalçanı özü toxutdurub hədiyyə etmək istəyir. O, sultandan xahiş etmişdi ki, məscidin iç ölçülərini ona yazsın. I Şah Təhmasibin əmri ilə həmin xalça qısa müddət ərzində toxundu və İstanbula göndərildi.

Bir neçə ildən sonra incəsənətə tətbiq edilən məhdudiyyətlər aradan qaldırıldı, vəziyyət nisbətən yüngülləşdi.

I Şah Təhmasib dini dəyərlərə, xüsusilə şiə məzhəbinə son dərəcə bağlı olmuş, özünə "Bəndeyi-şahi-vəlayət" (yəni "vilayət şahının (İmam Əlinin) bəndəsi") ləqəbini götürmüşdü. Möhürünün qaşına "Bəndeyi-şahi-vəlayət Təhmasb" kəlmələrini həkk etdirmiş şahın cülus (taxta çıxma) tarixinin əbcəd hesabı da bu ifadəyə müvafiq idi. Onun fərmanı ilə ölkə ərazisində şərabxana və qumarxana binaları dağıdılmış, külli miqdarda tiryək suya axıdılaraq məhv edilmişdi. Şah müqəddəs ziyarətgahları təmir etdirir, şəxsi vəsaiti hesabına onlarla kasıb adamın dolanışıq xərcini ödəyir, pulsuz yemək süfrələri təşkil edirdi.

I Şah Təhmasib atası I Şah İsmayıl kimi *səfəviyyə təriqətinin* rəhbəri və müridlərin *mürşidi-kamili* sayılırdı. Təkcə Qəzvin şəhərində *xəlifət əl-xüləfanın* nəzarəti altında 10 min nəfər səfəviyyə müridi onun əmrini gözləyirdi. Bununla belə, şah öz tərəfdarlarının ona ifrat sevgi ilə yanaşmasını bəyənmir, *ğülüvvə* (məzhəbi mövzuda ifrat düşüncəyə) qarşı çıxırdı. Qələndər məsləkli sufilərdən bir dəstə şahı İmam Mehdi adlandırdıqda o, qəti şəkildə buna etiraz edərək həmin dəstəni tövbə etməyə çağırmış, etirazla qarşılaşdıqda edam olunmalarını əmr etmişdi. I Şah Təhmasib Anadoludakı qızılbaş tayfalarını da öz *xəlifələri* (təriqət üzrə nümayəndələri) vasitəsilə idarə edirdi.

I Şah Təhmasibin hakimiyyəti illərində Səfəvilər dövlətində türk dili hakim mövqedə olmuş, türk qızılbaş tayfalarının nümayəndələri yüksək dövlət vəzifələri tutmuşlar. Anadoludakı qızılbaş tayfalarının Səfəvi torpaqlarına I Şah İsmayıl zamanında başlamış köçü onun hakimiyyət illərində də davam etmişdir. Anadoludan köçüb gələn tayfalar ölkənin müxtəlif bölgələrində kompakt şəkildə yerləşdirilir və yarımköçəri həyat tərzi sürürdülər. I Şah Təhmasibin zamanında vəzifə başında olmuş dövlət adamlarının "Tarixi-aləmarayi-Abbasi" kitabında verilmiş siyahısında türk mənşəli *əmirlər* üstünlük təşkil edir. Əmirlərin bəziləri "ələm (bayraq) sahibi" statusuna malik idi, öz ixtiyarında

bir neçə minlik hərbi dəstə saxlayırdı.
Şahın sağlığında böyük oğlu Məhəmməd Mirzə (gələcək *Şah Məhəmməd Xudabəndə*) hakimiyyət məsələlərinə meyil göstərmədiyinə və gözləri korluq dərəcəsində zəif olduğuna, ikinci oğlu İsmayıl Mirzə (gələcək II Şah İsmayıl) özbaşınalığı və mərkəzi hakimiyyəti təhlükə altına qoyan hərəkətləri üzündən Qəhqəhə qalasında həbsdə yatdığına görə üçüncü oğul *Heydər Mirzə* vəliəhdliyə namizəd sayılırdı. I Şah Təhmasib sağlığında övladlarından heç birini açıq şəkildə öz vəliəhdi elan etməsə də, saray əyanlarının bir qismi atasının sevimlisi olan xarizmatik xasiyyətli Heydər Mirzəni, bir qismi isə həbsdə olan İsmayıl Mirzəni gələcək şah kimi görürdü. 1575-ci ildə şah ağır xəstələndiyi zaman qızılbaş əmirləri arasında açıq cəbhələşmə baş verdi. Lakin I Şah Təhmasibin xəstəlikdən sağalması nəticəsində mübahisələr səngidi. 1576-cı ilin may ayında şahın səhhəti yenidən pisləşdi. İki həftəlik xəstəlikdən sonra may ayının 14-də I Şah Təhmasib Qəzvindəki sarayında dünyasını dəyişdi. Şahın vəfat səbəblərindən biri kimi zəhərlənmə ehtimalı da irəli sürüldü. Xəstəlik müddəti boyunca şahı müalicə etmiş və qulluğunda durmuş həkim Əbu Nəsr Gilani saray intriqasının qurbanı oldu. Rəqibləri onu şahı zəhərləməkdə təqsirləndirdilər və həkim *qorçuların* əli ilə qətlə yetirildi.
Şahın cənazəsi dəfn edilməzdən əvvəl Heydər Mirzə ilə İsmayıl Mirzənin tərəfdarları arasındakı rəqabət qızışdı. Heydər Mirzə hakimiyyətə olan hüququnu təsdiq etmək üçün guya atasının imzaladığı vəsiyyətnaməni ortaya çıxardı. (Tədqiqatçılar bu sənədin saxta olduğunu ehtimal edirlər). Lakin əks cəbhənin nümayəndələri onu saray dustağına çevirərək ətraf mühitdən təcrid etməyi bacardılar. I Şah Təhmasibin qızı Pərixan xanımın köməyi ilə çərkəzlərdən ibarət dəstə Heydər Mirzəni öldürdü. Bundan sonra İsmayıl Mirzə Qəhqəhə qalasından azad olub Qəzvinə gəldi.
I Şah Təhmasibin cənazəsinə *Mühəqqiq Kərəkinin* nəvəsi Mir Seyid Hüseyn Kərəki qüsl verdi, cənazə Qəzvində hərəm bağçası ilə divanxana arasında yerləşən "Şirvani yurdu" adlı məkanda əmanət kimi dəfn edildi. II Şah İsmayılın hakimiyyəti dövründə cənazənin qalıqlarını təntənə ilə Məşhəd şəhərində İmam Rza (ə) hərəmində torpağa tapşırdılar.
I Şah Təhmasib təqribən 62 il yaşamış, 52 il hakimiyyət sürmüşdür.
I Şah Təhmasibin həyatından və hakimiyyətindən bəhs edən *"Şah Təhmasib təzkirəsi"* adlı kiçikhəcmli əsərin onun qələmindən çıxdığı ehtimal edilir. *"Aləmarayi-Şah Təhmasib"* adlı anonim klassik mənbədə də hökmdarın hakimiyyət müddəti boyunca baş vermiş hadisələrdən geniş şəkildə bəhs edilmişdir.

***Həyat yoldaşları:***
Mosullu tayfasından İsa sultanın qızı, *Musa sultanın* bacısı *Sultanım xanım* (vəf. 1593, Məhəmməd Mirzənin və İsmayıl Mirzənin anası);
Dağıstanın feodal hakimləri sülaləsindən (Şamxal nəslindən) *Şamxal sultanın*



bacısı Sultanağa xanım (vəf. 1578, *Pərixan xanımın* və *Süleyman Mirzənin* anası);
Əli xan Gürcinin qızı Sultanzadə xanım (*Heydər Mirzənin* anası);
Gürcü əsilli Zal bəyin bacısı Xanpərvər xanım (*İmamqulu Mirzənin* və *Xanış bəyimin* anası);
Gürcü əsilli şahzadə Otar Şalikaşvilinin qızı Zəhrabacı bəyim (vəf. 1577-ci ildən sonra, *Mustafa Mirzənin* və *Əli Mirzənin* anası);
Hurixan xanım (*Zeynəb bəyimin* və *Məryəm sultan bəyimin* anası);
Qardaşı *Bəhram Mirzənin* dul arvadı, şirvanlı İmadəddin xanın bacısı Zeynəb sultan xanım (vəf. 1570);
Xivə xanı Sufiyan xanın qızı Aişə bəyim.
Bunlardan əlavə gürcü və çərkəz (Dağıstan) əsilli daha bir neçə qadınla (kənizlə) da evlənmişdir.

***Övladları:***

İsgəndər bəy Münşinin "Tarixi-aləmarayi-Abbasi" əsərində I Şah Təhmasibin 9 oğlu və 8 qızının olduğu qeyd edilmişdir.

***Oğulları:***

Məhəmməd Mirzə (gələcək *Şah Məhəmməd Xudabəndə*, 1531/32-1595/96);
İsmayıl Mirzə (gələcək *II Şah İsmayıl*, vəf. 1577);
*Heydər Mirzə* (vəf. 1576) atasının vəfatından sonra hakimiyyətə keçməyə cəhd göstərmiş, amma məğlub olaraq öldürülmüşdür;
*Süleyman Mirzə, Mustafa Mirzə, Mahmud Mirzə, İmamqulu Mirzə, Əli Mirzə* və *Əhməd Mirzə*. (Bu şahzadələrin 5-i II Şah İsmayılın hakimiyyəti dövründə (1576-77) onun göstərişi ilə öldürülmüş, təkcə Əli Mirzə kor edilərək sağ buraxılmışdır).
I Şah Təhmasibin Əliqulu, Zeynalabidin və Musa adlı oğullarının körpə ikən öldükləri, Murad Mirzə adlı oğlunun isə moğol hökmdarı Humayunla birlikdə Hindistana getməsi və 1545-ci ildə orada vəfat etməsi barədə məlumatlar vardır.

***Qızları:***

*Gövhər sultan bəyim* (vəf. 1577);
*Pərixan xanım* (1548-1578);
*Xədicə sultan bəyim*;
*Zeynəb bəyim* (vəf. 1641);
*Məryəm sultan bəyim*;
*Fatimə sultan bəyim* (vəf. 1581);
*Şəhrəbanu bəyim* (vəf. 1583);
*Xanış bəyim*.
(Övladlarının hər biri haqqında müstəqil məqalə şəklində məlumat verilmişdir).

***Mənbələr:*** *O.Əfəndiyev. Azərbaycan Səfəvilər dövləti, s.65-118; C.Bayramlı, V.Zifəroğlu. Azərbaycan hökmdarları: Səfəvilər, s.43-62; Faruk Sümer. Safevi Devletinin Kuruluşu ve Gelişmesinde Anadolu Türklerinin Rolü, s.57-84; İsgəndər bəy Münşi. Tarix-i aləmara-yi Abbasi (tərcümə və şərhlər: O.Əfəndiyev, N.Musalı), s.121-280; N.Süleymanov. Azərbaycan Səfəvi dövləti: təsərrüfatı, ticarət əlaqələri, maliyyə sistemi, s.133-134, 147-148; Mehmet Nuri Çinarcı. Sefevi sarayında türkçe şiir yazan bir şehzade (Türkiye Sosyal Araştırmalar dergisi, yıl: 19, sayı: 3), s.168-169; Məhəmməd*

*Möhsin Mustovfi. Zübdət ət-təvarix (nəşrə hazırlayan: Bəhruz Gudərzi), s.57-81; Əbülhəsən Qəzvini. Fəvaid əs-Səfəviyyə (nəşrə hazırlayan: Məryəm Mirəhmədi), s.18-33; Лятиф Керимов. Азербайджанский ковер, стр.36; Sadiq bəy Əfşar. Məcmə əl-xəvas (tərcümə edən və nəşrə hazırlayan: Ə.Bağırov), s.19-20; Türkiye Diyanet Vakfı İslam Ansiklopedisi, XXXIX, 414-415; Nəsrullah Fəlsəfi. I Şah Abbasın həyatı (3 clddə), I, 10-13; Roger Savory. Səfəvilər dövrünün İranı (farsca tərcümə: Kambiz Əzizi), s.48-66; The Cambridge History of Iran, vol. 6, pp.233-250; The Encyclopaedia of Islam, X, 108-110 ("Tahmasp"); Aləmarayi-Şah Təhmasib (nəşrə hazırlayan: İrəc Əfşar); Mehmet Dağlar. Şah Tahmasb'ın Dini Siyaseti (1524-1576) (doktora tezi); Şah Təhmasib təzkirəsi; Н.В.Пигулевская и др. История Ирана с древнейших времен до конца XVIII века, стр.257-264; М.С.Неймат. Корпус эпиграфических памятников Азербайджана, I, 66; Christopher Buyers. The Safawi Dynasty, Cenealogy.*



**II ŞAH İSMAYIL** (1533 və ya 1537-24.11.1577) – Səfəvilər dövlətinin üçüncü hökmdarı. Təqribən il yarım hakimiyyətdə olmuşdur, Səfəvilər dövlətinin tarixində ən qısa hakimiyyət müddəti ona məxsusdur. *I Şah Təhmasibin* yaşca ikinci oğludur. Anası türkman tayfa ittifaqına daxil olan *Mosullu tayfasından* İsa sultanın qızı, *Musa sultanın* bacısı *Sultanım xanımdır*. II Şah İsmayıl özündən sonrakı Şah *Məhəmməd Xudabəndənin* doğma qardaşıdır.

Uşaqlıq illərini sarayda, atasının yanında keçirən İsmayıl Mirzə 14 yaşında ikən mərkəzi hakimiyyətə qarşı çıxmış əmisi *Əlqas Mirzənin* əvəzinə Şirvan hakimi təyin edilmiş, *lələsi Gökçə sultan Qacarın* himayəsi altında burada hərb və idarəçilik sənətinin sirlərinə yiyələnmişdir. Hələ gənc yaşlarında Şirvanşahlara qarşı aparılan döyüşlərdə İsmayıl Mirzə öz sərkərdəlik bacarığını nümayiş etdirmişdir. 1548-ci ildə I Şah Təhmasibin başçılıq etdiyi qoşunun sərkərdələrindən olan İsmayıl Mirzə Qars uğrunda aparılan döyüşlərdə xüsusi fərqlənmiş, 1553-cü ildə müstəqil şəkildə ordunun başında yürüş edərək Ərzurum qalasını Osmanlı sərkərdəsi İsgəndər paşadan almağa nail olmuşdur. Qəfil həmlələri ilə osmanlıları dəhşətə saldığı üçün onu "Dəli İsmayıl" adlandırırdılar. Nəhayət, İsmayıl Mirzənin də böyük payı olan qələbələr nəticəsində 1555-ci ildə iki dövlət arasında *Amasya sülh müqaviləsi* imzalandı. *Səfəvi–Osmanlı müharibələrində* qazandığı uğurlar İsmayıl Mirzəni xalqın sevimlisinə və atasından sonra taxt-tacın real namizədinə çevirmişdi. 1555-ci ildə nüfuzlu seyidlərdən olan Şah Nemətullah Yəzdi ilə I Şah Təhmasibin bacısı *Xanış bəyimin* izdivacından doğulmuş Pəripeykər xanımla İsmayıl Mirzənin dəbdəbəli toy mərasimi təşkil edildi. Təbrizin Şimalabad bağında keçirilmiş bu toy şənliyinin sorağı hər tərəfə yayılmışdı. Mənbələrin verdiyi məlumata görə, hətta I Şah Təhmasib şəxsən oğlunun toyunda rəqs edərək öz sevincini bildirmişdi.

Lakin sonra İsmayıl Mirzənin artmaqda olan nüfuzundan sui-istifadə etməsini, əyanlara özbaşına göstərişlər verməsini



öz hakimiyyətinin sabitliyi üçün təhlükə hesab edən I Şah Təhmasib onu bir müddət mərkəzdən uzaqlaşdırmaq qərarına gəldi və digər oğlu Məhəmməd Mirzəni (gələcək Şah Məhəmməd Xudabəndə) Herat hakimliyindən azad edərək, İsmayıl Mirzəni onun yerinə göndərdi. Lakin Herat hakimiyyətində möhkəmləndikdən sonra şahzadənin *əmir əl-üməra* vəzifəsini daşıyan, eyni zamanda lələsi (tərbiyəçisi və himayədarı) olan *Məhəmməd bəy Şərəfəddinoğlu* ilə münasibətləri gərginləşdi. Üstəlik, Qəzvinə xəbərlər gəlirdi ki, o, Amasya sülh müqaviləsinə baxmayaraq, özbaşına olaraq Osmanlı dövlətinə yeni hərbi yürüş planlaşdırır, hətta bununla əlaqədar bölgələrdəki qızılbaş əmirlərinə də şaha demədən hazırlıq əmri göndərib, ordu toplamağı tapşırıb. Oğlunun davranışından narahat olan I Şah Təhmasib cəmi bir ildən sonra İsmayıl Mirzənin vəzifədən azad edilmə əmrini imzalayır, Məhəmməd Mirzə yenidən öz xidmət yerinə qayıdır.

1557-ci ildə *qorçubaşı Sevindik bəy Əfşarın* müşayiəti ilə İsmayıl Mirzə Heratı tərk edib paytaxt istiqamətində yola çıxır. Lakin Savə şəhərində şahın göndərdiyi *Məsum bəy Səfəvi* (Səfəvilər soyundan olduğuna görə sülalə daxilindəki problemli məsələlərin icrası adətən ona tapşırılırdı) onları qarşılayır. İsmayıl Mirzə Qəzvinə gətirilmək əvəzinə Ərdəbil ətrafında, Mişkinşəhrdən 85 km məsafədə dağlıq ərazidə yerləşən Qəhqəhə qalasına aparılır və orada həbsə alınır. Ən möhkəm istehkamlardan hesab edilən Qəhqəhə qalasının müdiriyyəti iki ildən-bir dəyişilirdi. İlk zamanlarda İsmayıl Mirzə qalada çox ağır şəraitdə, zəncirlənmiş halda saxlanılırdı, zaman keçdikcə onun həbs şəraiti xeyli yüngülləşdirildi. Hətta şahzadəyə icazə verilmişdi ki, qalanın üstüaçıq bürclərinin damına qalxıb təmiz hava alsın. Buradan o, qala divarlarının yanına gələn tərəfdarları ilə əlaqə saxlayır, onlara xəbər ötürür və hədiyyələr tullayırdı. Bu yolla İsmayıl Mirzə Qəhqəhə qalasında qaldığı 19 ildən artıq müddət ərzində dövlət ərazisində və sarayda baş verən bütün hadisələrdən dərhal xəbər tuta bilirdi.

Görkəmli Səfəvi tarixçisi İsgəndər bəy Münşi "Tarixi-aləmarayi-Abbasi" kitabında şahzadənin həbsi barədə bunları yazmışdır: "İsmayıl Mirzənin Xorasandakı davranışı da şahın xoşuna gəlmirdi. Bəzi məmləkət mənafeləri və dövlətin maraqlarının qorunması üçün qısa bir müddət sonra şahzadə cənabları o vilayətin hakimliyindən də azad edildi və hökmdarın əmrinə müvafiq olaraq qorçubaşı Sevindik bəy Əfşar Herata gedib onu Təbəs və Yəzd yolu ilə gətirib gəldi. Elə ki onlar gəlib Savəyə çatdılar, vəkil əs-səltənə Məsum bəy Səfəvi gedib onu (İsmayıl Mirzəni) Savədən Qəhqəhə qalasına apardı... İsmayıl Mirzə on doqquz il altı ay iyirmi bir gün ərzində o qalada qalmalı oldu. Atasının ölümü vaxtı o, qalada məhbus idi və qırx yaşı vardı. O zaman onun Şah Nemətullah Yəzdinin qızından doğulmuş bir qızdan savayı övladı yox idi".

1576-cı il may ayının sonlarında I Şah Təhmasibin özündən sonra vəliəhd təyin etmədən dünyadan köçməsi ilə taxt-tac uğrunda rəqabət başladı. Şahın böyük oğlu Məhəmməd Mirzə təbiətcə intriqadan uzaq, sağlamlıq baxımından problemli olduğu üçün (gözləri korluğa yaxın dərəcədə zəif görürdü) hakimiyyətə iddialı deyildi. Saray əyanlarının bir qismi I Şah Təhmasibin üçüncü oğlu *Heydər Mirzənin* hakimiyyətə gətirilməsini istəyirdi. Daha bir dəstə isə həbsdə olan İsmayıl Mirzəni taxta çıxarmağa çalışırdı. İsmayıl Mirzənin tərəfdarlarının çoxalmasına o, həbsdə olarkən baş vermiş bir hadisə də təkan vermişdi. Belə ki, şahzadənin saxlanıldığı Qəhqəhə qalasından bir ədəd iri qızıl və bir ədəd də gümüş külçə yoxa çıxmışdı. Qalanın ozamankı gözətçisi Həbib bəy Ustaclu bu işdə İsmayıl Mirzəni, o isə öz növbəsində qala gözətçisinin qızını təqsirləndirdi. Məsələni aydınlaşdırmaq üçün şahın göndərdiyi komissiyaya daxil olan Şamlu və Rumlu tayfasının əmirləri şahzadəni, Ustaclu tayfası, *Ənsar xəlifə Qaradağlu* (növbəti qala gözətçisi) isə Həbib bəyi dəstəklədilər. I Şah Təhmasibin vəfatından bir neçə il əvvəl baş vermiş bu hadisə qızılbaş əmirləri arasında gizli düşmənçiliyin yaranmasına səbəb oldu və növbəti hökmdar seçimində qızılbaş tayfalarının hansı mövqeyi tutmalarına zəmin yaratdı.

İsmayıl Mirzənin Qəhqəhə qalasında uzunmüddətli həbsi iki mühüm məsələ ilə nəticələndi. Birincisi, qalada yaşadığı əziyyətli illər, doğma atası da daxil olmaqla, hamı tərəfindən laqeydliklə əhatə olunması şahzadənin psixologiyasına mənfi təsir göstərdi. İsmayıl Mirzə hər kəsə qarşı etimadsız və qəddar davranmağa adət etdi, ona hörmətsizlik göstərmiş qızılbaş tayfalarına və əmirlərinə (xüsusilə ustaclulara) nifrət etməyə başladı. Bu davranış onun qısamüddətli hakimiyyət dövründə də özünü bariz şəkildə göstərdi. İkincisi, İsmayıl Mirzə həbs müddəti boyunca tiryək və şərab kimi zərərli vərdişlərə qurşandı.

Qəzvində özünü atasının varisi elan etmiş və hakimiyyətə yiyələnmiş şahzadə Heydər Mirzə lazımi iradə göstərmədiyindən təşəbbüsü əldən verdi. İsmayıl Mirzənin tərəfdarları sarayın giriş-çıxış qapılarını ələ keçirərək, şahzadə ilə tərəfdarları arasında maneə yaratdılar. Heydər Mirzə, faktiki olaraq, saray dustağı vəziyyətinə düşdü. I Şah Təhmasibin qızı *Pərixan xanım* Heydər Mirzənin etibarını qazanaraq şah seçiləcəyi barədə onu arxayın etdi. Lakin daha sonra Pərixan xanım öz dayısı *Şamxal sultanı* bir dəstə döyüşçü ilə arxa qapıdan saraya daxil edib şahzadənin öldürülməsinə şərait yaratdı. Heydər Mirzənin qətlindən sonra hakimiyyətə yeganə real namizəd İsmayıl Mirzə oldu. Atasının vəfatı və qardaşının qətli barədə xəbər ona gəlib çatanda Qəhqəhə qalasının gözətçisi *Ənsar xəlifə Qaradağlu* ovda idi. Vəziyyətdən istifadə edən İsmayıl Mirzə qalaya nəzarəti ələ keçirdi, belə ki, hətta Ənsar xəlifə ovdan qayıdanda qala qapıları onun üzünə bağlandı. Bir neçə gündən sonra İsmayıl



Mirzə təntənə ilə Qəhqəhə qalasından çıxıb Qəzvin istiqamətində yola düşdü. Bəzi məlumatlara görə, artıq bu günlərdə paytaxt məscidində İsmayıl Mirzənin adına xütbə oxunmuşdu. Beləliklə, II Şah İsmayılın hakimiyyət müddəti rəsmi tacqoyma mərasimi keçirilməsindən xeyli əvvəl, atasının vəfatından cəmi bir həftə sonra başlamış sayıla bilər.

İsmayıl Mirzə yolüstü Ərdəbil şəhərindəki Şeyx Səfiəddin xanəgahına baş çəkib ulu əcdadlarının məzarını ziyarət etdi. O, atasının zamanında uzun müddət verilməmiş və üst-üstə yığılmış ordu məvacibini tam şəkildə ödəmək barədə göstəriş verdi. Avqust ayının sonlarında Qəzvinin məşhur *Çehelsütun sarayında* II Şah İsmayılın təntənəli tacqoyma mərasimi keçirildi.

Taxta çıxdıqdan dərhal sonra yeni şah yaxın ətrafındakılara münasibətdə öz qəddar simasını aşkara çıxardı. Onun hakimiyyətə gəlişində mühüm rolu olmuş *xəlifət əl-xüləfa Hüseynqulu xəlifə Rumlu* hiyləgər plan nəticəsində vəzifəsindən uzaqlaşdırılıb Qəzvindən sürgün olundu, daha sonra gözləri çıxarılaraq kor edildi. Onun tabeliyində olan sufilərin paytaxtda qaldırdığı qiyam 500 nəfərin amansızcasına qətli ilə yatırıldı. Qısa müddətdə mühüm dövlət vəzifələrində ciddi kadr dəyişiklikləri həyata keçirildi. Şahın qəzəbinə tuş gəlmiş Ustaclu tayfasının bəzi böyükləri aradan götürüldü, sağ qalanlar bir neçə gün yalvarışdan sonra əfv edildilər.

II Şah İsmayıl yaxın qohumlarını öz hakimiyyəti üçün təhlükə hesab edərək taxta çıxdıqdan sonra tezliklə onları öldürmək barədə fərman verdi. I Şah Təhmasibin oğulları *Əhməd Mirzə, İmamqulu Mirzə, Mustafa Mirzə, Süleyman Mirzə* və *Mahmud Mirzə* (körpə oğlu Məhəmməd Baqir Mirzə ilə birlikdə), *Bəhram Mirzənin* oğulları *İbrahim Mirzə*, *Bədiüzzaman Mirzə* (körpə oğlu ilə birlikdə) və *Hüseyn Mirzə*, sonuncunun oğlu Məhəmməd Hüseyn Mirzə və b. II Şah İsmayılın əmri ilə edam edildilər, şahın digər qardaşı *Əli Mirzənin* isə gözləri çıxarıldı. Beləliklə, II Şah İsmayıl Səfəvilər tarixinə ən amansız hökmdar kimi daxil oldu.

II Şah İsmayılın Səfəvi mənbələrində mənfi şəkildə xatırlanmasının səbəblərindən biri də onun yürütdüyü din siyasəti ilə bağlıdır. Hakimiyyətə keçdikdən qısa müddət sonra şah şiə məzhəbindəki bəzi əqidəvi məsələlərə etiraz bildirməyə başladı. Onunla razılaşmayan müctəhid və alimlərin kitabları müsadirə edildi, əks mövqedə olan din alimlərinə ehtiram göstərilib mükafatlar verildi. Pul sikkələrinin üzərində "Əliyyən vəliyullah" cümləsinin zərb olunması ənənəsi ləğv edildi, məscid və ziyarətgahların divarlarından imamların adlarını və şiə məzmunlu şeirləri yığışdırdılar. Qızılbaşlar bundan ciddi şəkildə narahat olaraq şaha etiraz etməyi qərara aldılar. Qəzvinin Sədabad bağında, sarayın qarşısında toplaşmış etirazçılar şahın öz əqidəsini açıq şəkildə bildirməsini tələb edərək, Təkəlü tayfasından *Ərdoğdu xəlifəni* və Türkman tayfasından *Əmir xanı* hökmdarın yanı-

na danışığa göndərdilər. II Şah İsmayıla sadiq olan əmirlər ona xəbər verdilər ki, guya narazı qızılbaşlar Məhəmməd Mirzənin (gələcək Şah Məhəmməd Xudabəndənin) oğlu Sultan *Həsən Mirzəni* hakimiyyətə gətirmək istəyirlər. Heratdan çıxıb paytaxta sarı istiqamət götürmüş Həsən Mirzə bu zaman Tehranda dayanmışdı və yoluna davam etmək üçün icazə gözləyirdi. Şah qızılbaş əmirlərinin nümayəndələrini qəbul etdi, amma görüşün sonunda Ərdoğdu xəlifənin həbsinə göstəriş verdi, Əmir xanı isə bu şərtlə azad buraxdı ki, Həsən Mirzəni aradan götürsün. Bundan sonra şahın yaxın qohumlarından yalnız doğma qardaşı Məhəmməd Mirzə sağ qaldı; bəzi məlumatlara görə, şah onu da aradan götürmək istəmiş, bir müddət anasının etirazından çəkinərək buna cəsarət etməmişdi. Sonralar o, qardaşını öldürmək üçün Herata adam göndərmək qərarına gəlmiş, amma bu məqsədi həyata keçirmədən ölmüşdü.

II Şah İsmayıl öz psixoloji sarsıntısını və sui-qəsd qorxularını aradan qaldırmaq üçün tiryəkdən ardıcıl olaraq istifadə edirdi. 1577-ci il noyabrın 24-də o, libasını dəyişərək sərxoş halda sirdaşı *Halvaçıoğlu* Həsən bəyin və bir dəstə gözətçinin müşayiəti ilə saraydan çıxdı. Qəzvinin küçələrini və meyxanalarını gəzib dolaşan şah gecə dincəlmək üçün Həsən bəyin evində qonaq qalacağını bildirdi. Ertəsi gün sübh tezdən onu həmin evdə ölmüş halda tapdılar. Otağın qapısı arxadan bağlı olduğu üçün saray adamları qapını sındırmağa məcbur oldular, yarıayıq vəziyyətdə olan Həsən bəy Halvaçıoğlu şahın nədən öldüyünün səbəbini izah edə bilmədi. Mənbələrdə onun kəskin mədə ağrısından, yaxud həddən artıq tiryək qəbul etməkdən öldüyünü yazırlar. Bəzi fərziyyələrə görə, narazı qüvvələr şahı zəhərləmiş və ya boğub öldürmüşdülər. İsgəndər bəy Münşi bu barədə yazırdı: "Camaat arasında belə bir söhbət yayıldı ki, o, Pərixan xanımı əhəmiyyətsiz və etibarsız bir vəziyyətə saldığından xanım hərəmxana kənizləri ilə əlbir olmuş, onun tiryəkinin tərkibinə zəhər qatmışlar. Bəziləri deyirdilər ki, onun hərdənbir özünü büruzə verən sancısı vardı. Həmin sancı bundan öncə bir dəfə də baş qaldırmış və hətta ölüm həddinədək gəlib çatmışdı. Lakin o zaman təbiblər onu müalicə etmiş və o, xilas olmuşdu. Bu dəfə isə sancı daha şiddətli olmuş və yanında həkim olmadığı üçün bu, onun ölümü ilə nəticələnmişdi. Bəziləri isə deyirdilər ki, o, dalbadal çoxlu tiryək atmış, çoxlu yemək yemiş və nəticədə mədəsində ağırlıq yığılıb nəfəs yolunu tutmuşdur. Xülasə, hadisənin necə baş verməsinin mahiyyəti aydın olmadı".

II Şah İsmayılın ölümündən sonra Vəli sultan Qalxançıoğlu Zülqədər onun körpə oğlu *Şah Şücanın* taxta çıxarılmasını, yetkinlik yaşına çatanadək Pərixan xanımın naibə olaraq dövləti idarə etməsini təklif etdi. Lakin bu təklif hamı tərəfindən rədd olundu. I Şah Təhmasibin oğullarından yalnız Məhəmməd Mirzə sağ qaldığı üçün hakimiyyətə namizəd məsələsində fikir ayrılığı ya-



ranmadı, hamı yekdilliklə onun şah seçilməsini dəstəklədi.

II Şah İsmayılın cənazəsini, ehtimala görə, əvvəlcə Qəzvindəki İmamzadə Hüseyn ziyarətgahında dəfn etmiş, daha sonra Məşhədə aparmışlar.

Bütün ziddiyyətləri ilə yanaşı, II Şah İsmayılın qısa hakimiyyət dövrü daxili sabitlik və əmin-amanlıq şəraitində keçmişdir. O, ədliyyə sistemində islahatlar aparmış, xalqın vəziyyətini yaxşılaşdırmağa, zülm və haqsızlıqları azaltmağa yönəlmiş tədbirlər həyata keçirmişdir. Sonralar Səfəvilər dövlətində mühüm rol ifa etmiş vəzir *Mirzə Salman Cabiri*, Herat hakimi *Əliqulu xan Şamlu*, Məşhəd hakimi *Mürtəzaqulu xan Pörnak*, Qarabağ bəylərbəyi *İmamqulu xan Yıva Qacar*, Çuxursəd bəylərbəyi *Məhəmmədi bəy Toxmaq Ustaclu*, qorçubaşı Qulu bəy Əfşar və başqaları II Şah İsmayılın zamanında bu vəzifələrə təyinat almışlar. Onun zamanında Osmanlı dövləti ilə ciddi qarşıdurma baş verməmiş, *Amasya sülh müqaviləsinin* şərtləri qorunmuş, özbəklərlə sərhəd bölgəsində də nisbi sakitlik hökm sürmüşdür.

Onun qəfil vəfatından sonra Səfəvilər dövləti ərazisində və Anadoluda bir neçə nəfər ölən şəxsin əslində şah deyil, başqa adam (nökərlərdən biri) olduğunu iddia etdi və özünü II İsmayıl adlandırdı.

Bəzi məlumatlara görə, Səfəvilər dövlətinin bayrağındakı Günəş və aslan (*şirü xurşid*) təsviri II Şah İsmayılın zamanında qəbul edilmişdir. Səfəvilər dövrünün mühüm tarixi mənbələrindən sayılan *"Əhsən ət-təvarix"* əsərini müəllif Həsən bəy Rumlu II Şah İsmayıla ithaf etmişdi.

II Şah İsmayıl "Adili" təxəllüsü ilə şeirlər yazmışdır. Şahın fərmanlarının əvvəlində "Huvəl-adil" sözləri qeyd edilirdi (O, ədalətlidir; burada həm Allahın ədalətinə, həm də şaha işarə edilir).

Ömrü 40 və ya 44 il, hakimiyyət müddəti bir il yarıma yaxın davam etmişdir.

***Həyat yoldaşları:***

II Şah İsmayıl hələ şahzadəlik dövründə öz bibisi *Xanış bəyimin* nüfuzlu seyid ailəsinə mənsub Şah Nemətullah Yəzdi ilə izdivacından doğulmuş qızı Pəripeykər xanımla evlənmişdi. Hakimiyyətə çatdıqdan sonra o, *Ustaclu tayfasının* ağsaqqalı *Pirə Məhəmməd xanın*, *Şamxal sultanın* (öz ögey dayısının) və Hüseyn sultan Xınıslunun qızları ilə də ailə qurmuşdur.

***Övladları:***

Pəripeykər xanımla evlilikdən doğulmuş *Şah Şüca* adlı körpə oğlu *Şah Məhəmməd Xudabəndənin* hakimiyyətinin əvvəllərində öldürülmüşdür (1577).

Qızlarından Fəxricahan bəyim I Şah Abbasın oğlu *Məhəmməd Baqir Mirzənin* həyat yoldaşı idi.

Digər qızı Səfiyyə sultan bəyim (Şahzadə xanım kimi tanınırdı) öz dayısı oğlu Şah Xəlilullah Yəzdiyə ərə getmişdir.

Üçüncü qızı Gövhər sultan haqqında mənbələrdə məlumat yox dərəcəsindədir.

***Mənbələr:*** *İsgəndər bəy Münşi. Tarix-i aləmara-yi Abbasi (tərcümə və şərhlər: O.Əfəndiyev, N.Musalı), s.295-296, 395-446;*

*Həsən bəy Rumlu. Əhsən ət-təvarix (təshih: Əbdülhüseyn Nəvayi), s.598-638; Mirzə Məhəmməd Məsum. Tarixi-səlatini-Səfəviyyə (nəşrə hazırlayan: Seyid Əmir Həsən Abidi), s.15-16; C.Bayramlı, V.Zifəroğlu. Azərbaycan hökmdarları: Səfəvilər, s.85-93; Faruk Sümer. Safevi Devletinin Kuruluşu ve Gelişmesinde Anadolu Türklerinin Rolü, s.110-142; Oqtay Əfəndiyev. Azərbaycan Səfəvilər dövləti, s.114-138; Məhəmməd Möhsin Mustovfi. Zübdət ət-təvarix (nəşrə hazırlayan: Bəhruz Gudərzi), s.83-85; Seyid Həsən ibn Mürtəza Hüseyni Astarabadi. Tarixi-sultani (nəşrə hazırlayan: Ehsan İşraqi), s.94-101; Nəsrullah Fəlsəfi. I Şah Abbasın həyatı, I, 36; Walther Hinz. İkinci Şah İsmayıl Səfəvi (farsca tərcümə: K.Cahandari); Mehmet Dağlar. Safevi Devleti'nde Şah II. İsmail ve Muhammed Hudabende Dönemlerinde Kızılbaş Hakimiyeti (1574-1587) (Türk Tarihi Araştırmaları Dergisi, Yıl. 3, Sayı. 1, Bahar 2018), s.50-65.*



**ŞAH MƏHƏMMƏD XUDABƏNDƏ** (1531/32-1595/96) – Səfəvilər dövlətinin dördüncü hökmdarı (hakim. 1578-87). Atası Səfəvi hökmdarı *I Şah Təhmasib*, anası türkman tayfa ittifaqına daxil olan Mosullu tayfasından İsa sultanın qızı, *Musa sultanın* bacısı *Sultanım xanımdır*. Hicri 938-ci ildə (miladi 1531/32-ci illər) doğulmuşdur. Atasının böyük oğlu və vəliəhdi idi. I Şah Təhmasibin zamanında, 6 yaşında ikən Xorasan hakimi təyin edilmiş və *lələsi*, *Təkəlü tayfasından* olan *Məhəmməd bəy Şərəfəddinoğlunun* himayəsi altında Herata göndərilmişdi. Məhəmməd Mirzənin uşaqlıq və yeniyetməlik dövrü Təkəlü tayfası əmirlərinin əhatəsində keçmişdi, buna görə o, həmin tayfaya etimad bəsləyirdi. Bəzi məlumatlara görə, Şah Məhəmmədə əvvəldən "Xudabəndə" (Allahın bəndəsi) ləqəbi verilmiş, bəzi məlumatlara görə isə, o, gözləri zəiflədikdən və ibadətə meyil göstərdikdən sonra bu ləqəbi qazanmışdı.

Sonralar Məhəmməd Mirzə paytaxta çağırıldı və doğma qardaşı İsmayıl Mirzə (gələcək *II Şah İsmayıl*) onun əvəzinə Herata vali göndərildi. Lakin bir müddətdən sonra İsmayıl Mirzə vəzifədən kənarlaşdırılıb Qəhqəhə qalasında həbs edildi, Məhəmməd Mirzə yenidən Xorasan hakimliyinə qaytarıldı. Bu dəfə *Ustaclu tayfasından Şahqulu sultan* onun lələsi təyin edildi. Məhəmməd Mirzə ilə Şahqulu sultan Ustaclunun münasibətləri yaxşı deyildi. I Şah Təhmasib bundan xəbər tutduqda Məhəmməd Mirzəyə Fars vilayətinin hakimliyini verdi, onun Xorasandakı yerinə isə oğlu Abbas Mirzəni (gələcək *I Şah Abbas*) keçirdi. Bundan sonra Məhəmməd Mirzə oğlu Abbas Mirzəni Heratda qoyub digər ailə üzvləri ilə birlikdə Şiraza köçdü və burada məskunlaşdı. Hakimiyyətə gəlişinədək o, mərkəzi Şiraz olan Fars vilayətini idarə etmişdir. I Şah Təhmasibin vəfatı zamanı Məhəmməd Mirzənin təqribən 45 yaşı vardı.

I Şah Təhmasibdən sonra böyük oğlu Məhəmməd Mirzə taxta çıxmalı idi. Lakin həbsdə olan İsmayıl Mirzənin tərəfdarları (I Şah Təhmasibin qızı *Pərixan xanımın* başçılığı altında) üstünlüyü ələ alaraq hakimiyyətə iddialı olan digər şahzadəni – *Heydər Mirzəni* aradan gö-



türdülər, İsmayıl Mirzə Qəhqəhə qalasından azad edilib dövlətin başına keçdi. Məhəmməd Mirzə vəliəhdlik dövründə hakimiyyət məsələlərinə laqeyd yanaşır, digər şahzadələr kimi saraydaxili intriqalara qoşulmurdu. Bu xasiyyət sonralar – hakimiyyət müddəti boyunca da onu müşayiət etmişdi. Məhəmməd Mirzənin gənclik yaşlarından etibarən gözlərində xəstəlik yaranmış, müalicədən imtina etdiyinə, yaxud müalicə düzgün aparılmadığına görə görmə qabiliyyəti sürətlə zəifləmişdi. Onun korluq həddinə çatacaq dərəcədə zəif gördüyünü yazırlar. Hakimiyyət uğrunda mübarizəyə qoşulmamasının bir səbəbi də fiziki qüsuruna görə özünü şahlığa layiq bilməməsi olmuşdur. Buna görə qızılbaş əmirləri tərəfindən hakimiyyətə layiq olmayan, zəif iradəli bir şəxs kimi tanınırdı və tərəfdarları az idi.

II Şah İsmayıl hakimiyyətə keçdikdən sonra Səfəvi sülaləsinin üzvləri olan şahzadələri qətlə yetirmək barədə göstəriş vermiş və bu proses Məhəmməd Mirzənin oğlu Sultan *Həsən Mirzənin* qətli ilə başlamışdı. Sultan Həsən Mirzə, atasından fərqli olaraq, idarəçilik işlərinə həvəs göstərirdi, buna görə hələ I Şah Təhmasibin zamanında Mazandaran vilayətinin yarısının hakimiyyəti ona verilmişdi. Babasının vəfatından sonra Mazandaranda mövqeyi zəifləmiş Həsən Mirzə nənəsi Sultanım xanımın himayəsinə arxalanaraq paytaxta sarı yola düşdü, lakin Tehrana çatarkən orada qalıb gözləməsi əmr edildi. Əmisi II Şah İsmayıl tərəfindən göndərilmiş Kosa Əliqulu Türkman bir dəstə qızılbaşla şahzadəni orada boğub öldürdü. Bunun ardınca II Şah İsmayıl *qorçu* Qazı bəy Zülqədərə tapşırdı ki, Məhəmməd Mirzəni və digər oğullarını da Şirazda nəzarət altına alıb növbəti əmri gözləsin. Lakin şahın qəfil ölümü onları edamdan xilas etdi.

1577-ci ildə II Şah İsmayılın müəmmalı və gözlənilməz ölümündən sonra Qəzvin sarayında şah seçkiləri barədə müzakirələr şiddətləndi. Səfəvilər sülaləsinin xeyli üzvü öldürüldüyü üçün sağ qalanlar arasında hakimiyyətə real namizəd Məhəmməd Mirzə idi. Onun iradəsiz xarakteri və göz xəstəliyi də qızılbaş əmirlərinə sərf edirdi; bu yolla onlar şah tərəfindən müqavimət görmədən dövlət işlərində öz nüfuzlarını artırmağa ümid edirdilər. Vəli sultan Qalxançıoğlu Zülqədər II Şah İsmayılın körpə oğlu *Şah Şücanın* hakimiyyətə gətirilməsini və o, yetkinlik yaşına çatanadək Pərixan xanımın naibə (himayədar) olaraq dövləti idarə etməsini təklif etsə də, qızılbaş əmirləri bununla razılaşmadılar. Məşvərət iclasında dövlət adamları yekdilliklə Məhəmməd Mirzənin hakimiyyətə gətirilməsini dəstəklədilər və onu Şirazdan Qəzvinə dəvət etməyi qərara aldılar. II Şah İsmayılın ölüm xəbərini və Məhəmməd Mirzənin hakimiyyəti qazanma müjdəsini Şiraza gətirən elçi İsgəndər xan Zülqədər "Xoşxəbər xan" ləqəbini qazandı. Bunun ardınca gələn digər qızılbaş əmirləri də xəbəri təsdiq etdilər.

II Şah İsmayılın vəfatından (24 noyabr

1577-ci il) dərhal sonra Qəzvində hakimiyyət I Şah Təhmasibin qızı Pərixan xanımın əlində cəmləşdi. Bir neçə ay boyunca o, dövlətin faktiki başçısı olmuş, mühüm dövlət vəzifələrinə öz istəyi əsasında əmirləri təyin etmişdir. Pərixan xanımın əmri ilə II Şah İsmayılın həbsə atdırdığı qızılbaş əmirləri və saray əyanları zindandan azad edildilər. Onun yanında qızılbaş tayfa başçılarından ibarət ağsaqqallar şurası yaradıldı, bu şuraya Türkman tayfasından Əmir xan, Ustaclu tayfasından Pirə Məhəmməd xan, Şamlu tayfasından Sultan Hüseyn xan, Təkəlü tayfasından Müseyyib xan Şərəfəddinoğlu, Əfşar tayfasından Qulu bəy Qorçubaşı daxil idilər. Pərixan xanım öz dayısı Şamxal sultana arxalanırdı, onun ixtiyarı altında yüzlərlə çərkəzdən ibarət dəstə vardı.

Lakin Məhəmməd Mirzə paytaxta gəlib hakimiyyəti qəbul etməyə tələsmirdi. Sarayda xidmət edən qeyri-türk mənşəli *Salman xan Cabiri* Şiraza gələrək yeni seçilmiş şahı Qəzvinə getməyə həvəsləndirdi. Şah Məhəmməd Xudabəndə öz məiyyəti ilə birlikdə Şiraz-İsfahan-Kaşan-Qum-Savə-Qəzvin yolu ilə hərəkətə keçdi. Pərixan xanımın göstərişi ilə Şamxal sultan saray əmirlərini öz tərəfinə çəkib müqavimət cəbhəsi təşkil etməyə çalışsa da, səyləri nəticə vermədi. Fevralın 13-də Məhəmməd Xudabəndənin Qəzvində tacqoyma mərasimi keçirildi. Hələ qarşılanma mərasimi zamanı şahın həyat yoldaşı Xeyrənnisa bəyim *Məhdi-ülya* Pərixan xanımın ona lazımi hörməti göstərmədiyini bəhanə edərək onu aradan götürmək üçün saraydan uzaqlaşdırıb lələsi Xəlil xan Əfşarın evində həbs etdirdi. Bir neçə gündən sonra Pərixan xanım boğularaq öldürüldü, Şamxal sultan isə saraydan kənarlaşdırılıb yolda qətlə yetirildi.

Şah Məhəmməd Xudabəndə hakimiyyətinin əvvəllərində həyat yoldaşı Xeyrənnisa bəyim Məhdi-ülyanın güclü təsiri altında olmuşdur. Dövlət idarəçiliyinə həvəs göstərməyən və bu sahədə bacarığı da olmayan şah əslində bütün işləri öz xanımının öhdəsinə buraxmışdı. Məhdi-ülya yüksək vəzifə təyinatlarına nəzarət edir, hətta hərbi yürüşlərə də qatılırdı. O, şahın dərin etimadını qazanmış baş vəzir, "etimad əd-dövlə" (dövlətin etimad etdiyi şəxs) ləqəbli Mirzə Salman Cabirini himayə edirdi. Qızılbaş əyanları ilə onların mənafeləri tez-tez kəsişirdi. Məhdi-ülya və Cabiri aradan götürüldükdən sonra qızılbaş əmirləri *Əliqulu xan Qıçoğlu Ustaclu* (vəf. 1587) və *İsmayılqulu xan Şamlu* (vəf. 1587) şahın etibarından istifadə edərək dövlət idarəçiliyini tam nəzarətə aldılar. Şah Məhəmməd onların birinə "qardaş", digərinə isə "yoldaş" fəxri ləqəbini vermişdi.

Şah Məhəmməd Xudabəndənin daxili siyasətinin zəifliyi nəticəsində ölkə ərazisi özbaşına formada idarəçiliyi həyata keçirən və mərkəzi hakimiyyətlə az hesablaşan qızılbaş tayfa başçıları arasında bölüşdürülmüşdü. İri vilayətlərdə qızılbaş tayfalarından olanlar hakimlik edir, qeyri-türklər ("*tacik*" adlandırılan farslar) isə bürokratik aparatda çalışırdı-



lar. I Şah Təhmasibin 14 il ərzində ödəmədiyi məvacibin hamısı dərhal orduya ödənilmiş, dövlət xəzinəsi boşalmışdı.

Hakim sülalənin bir çox mənsubu bundan əvvəl aradan götürüldüyü üçün dövlətin təməllərinə böyük zərbə dəymiş, yerlərdə mərkəzdənqaçma meylləri və böyük tayfalara mənsub qrupların öz ərazilərinə sahibolma cəhdləri güclənmişdi. Böhranlı durumun yaranmasına səbəb olan daha bir amil rüşvətin genişlənməsi idi. Belə bir vəziyyətdə ölkəni hədələyən həm daxili, həm də xarici təhlükələr tezliklə özünü göstərdi.

1577-ci ildə Van məntəqəsinin Osmanlı hakimi Xosrov paşanın təhriki ilə Səlmasda və Təsuqda qiyam qaldıran kürdlər Osmanlı qüvvələri ilə birləşərək əvvəlcə Xoy, daha sonra Urmiya şəhərini ələ keçirdilər, I Şah Təhmasibin Marağada olan 10 min seçmə ərəb atından ibarət ilxısını sürüb apardılar. Bundan bir qədər sonra Şirvanda Əbubəkr Mirzə Bürhanoğlu dəstə toplayaraq üsyan qaldırdı və "Şirvanın sünni əhalisini qızılbaş zülmündən qorumaq" üçün Osmanlı sultanından yardım istəyib onun vassallığını qəbul etdi. Üsyanın əsl səbəblərindən biri xalqın ağır həyat şəraitinə görə hələ I Şah Təhmasib tərəfindən yığılması dayandırılmış və 9 ilə yaxın toplanmamış 200 min tümən xərac vergisinin boşalmış dövlət xəzinəsinə ödənməsi məsələsinin gündəmə gəlməsi idi.

1578-ci ildə Səfəvilər dövlətinin zəifləməsindən istifadə edən Osmanlı sultanı III Murad 1555-ci ildə bağlanmış *Amasya sülhünü* pozaraq Mustafa Lələ paşaya Ərzurumda topladığı 100 minlik qoşunla hərəkətə keçmək əmrini verdi, eyni zamanda, Krım xanından və Dağıstanın feodal hakimlərindən bu yürüşə dəstək vermələrini tələb etdi. Mustafa Lələ paşa Qarsa qoşun yeritdi və oradan Gürcüstana doğru hərəkət etdi. Çuxursəd bəylərbəyi *Məhəmmədi xan Toxmaq Ustaclu* və Qarabağ bəylərbəyi *İmamqulu xan Qacar* öz qüvvələrini birləşdirərək 15 minlik qoşunla Qarsın şimal-şərqindəki *Çıldır* gölü sahilində Osmanlı ordusunun ön dəstələri ilə üz-üzə gəldilər. Lakin düşmənin qüvvəsini düzgün qiymətləndirməyən və pusquya düşən qızılbaş ordusu döyüşdə məğlubiyyətə uğradı. Digər vilayətlərin hakimləri Məhəmmədi xanın çağırışına biganəlik göstərərək ona dəstək vermədilər, 1578-ci il avqustun 24-də osmanlılar Tiflisi və Qorini tutdular. Şəki hakimi İsa xan bu xəbəri eşitdikdə öz mülkünü tərk edərək Qəzvinə gəldi. Həmin ilin payızında Azərbaycan (Təbriz) bəylərbəyi *Əmir xan Türkman* 10 minlik qoşunla Təbrizdən çıxıb Qarabağda İmamqulu xanın qüvvələri ilə birləşərək Alazan çayı sahilində Osmanlı ordusuna hücum etdi. Döyüş qızılbaşların qələbəsiylə nəticələnsə də, Əmir xanın oğlunun özbaşına hücumu və məğlubiyyəti vəziyyəti dəyişdi. Əmir xan qoşunlarının qalıqları ilə Təbrizə qayıtmağa məcbur oldu, Osmanlı ordusu isə 8 min nəfər itki bahasına da olsa Alazan çayının digər sahilinə keçərək

Ərəşə daxil oldu, daha sonra Şamaxı, Qəbələ, Bakı, Şabran, Mahmudabad və Salyanı ələ keçirdi. Dərbənd hakimi Çıraq xəlifə 300 nəfərlik dəstəsi ilə sonadək müqavimət göstərərək həlak oldu, şəhər Osmanlı qoşunlarının əlinə keçdi. Qış mövsümündə geriyə dönən Mustafa paşanın qoşunu yol boyunca gah soyuqdan, gah aclıqdan, gah da qəfil hücumlardan çoxlu sayda itki verdi. Təkcə Tiflis yolunda İmamqulu xan Qacarın qurduğu pusquda 20 minədək Osmanlı əsgəri məhv oldu. İmamqulu xan Ərəşə qəfil hücum edərək şəhəri Osmanlı qarnizonundan təmizlədi.

Qəzvindəki şah sarayında hərbi əməliyyatlarla bağlı keçirilən müşavirədə uğurları möhkəmləndirmək əvəzinə sultana yumşaq tərzdə məktub yazılması və sərhədin pozulmasına etiraz bildirilməsi qərara alındı. Lakin göndərilən məktub ünvana çatmadığından Osmanlı işğalının qarşısını almaq üçün səfərbərlik elan edildi. Şahzadə *Həmzə Mirzənin* başçılıq etdiyi 30 min nəfərlik qoşun sentyabrın 27-də Qəzvindən çıxaraq Miyanəyə gəldi, Ərdəbildən keçərək Qarabağa doğru hərəkət etdi. Krım xanının, ləzgilərin və Şirvandakı Əbubəkr Mirzənin qüvvələri şimaldan Şirvan torpaqlarına daxil olaraq Osmanlı ordusu ilə birlikdə Şamaxıda toplandılar. 1578-ci il noyabrın 28-də Ağsu çayı sahilindəki *Mollahəsən* məntəqəsində baş vermiş döyüşdə qızılbaş ordusu 12 min nəfərlik tatar-ləzgi qoşununu darmadağın etdi, Krım xanının qardaşı Adil Gəray əsir alındı. Şamaxıdakı Osmanlı qoşununun sərkərdəsi şəhəri buraxıb Dərbəndə doğru geri çəkildi. Qızılbaş ordusu Şamaxını tutaraq düşməni təqib etməyə başladı. Osmanlılar böyük çətinlik və itkilər hesabına Dərbənd sakinlərinin müqavimətini qırıb şəhəri ələ keçirdilər. Qarağacda toplanmış qızılbaş ordusuna təqibi davam etdirmək və Osmanlı qüvvələrini bütünlüklə Şirvan ərazisindən çıxarmaq barədə Qəzvindən əmr gəlməsinə baxmayaraq, yürüşdə iştirak edən Məhdi-ülya hərbi əməliyyatları dayandırmaq və geri qayıtmaq göstərişini verdi. Onun səriştəsizliyi üzündən Şirvan məsələsi həll olunmamış qaldı və Səfəvi ordusu burada möhkəmlənə bilmədi.

Paytaxt Qəzvində daxili siyasi vəziyyət mürəkkəb olaraq qalırdı. Şahbanu Məhdi-ülyanın özbaşına verdiyi qərarlardan qızılbaş əmirlərinin narazılığı son həddə çatmışdı. Onlar şahbanunu hakimiyyəti öz inhisarına almaqda, özünə yaxın tacikləri və mazandaranlıları yüksək vəzifələrə gətirməkdə, qızılbaş əmirlərini isə dövlət işlərindən kənarlaşdırmaqda, həmçinin hərəmxana xəzinəsini Mazandarana köçürməkdə təqsirli bilirdilər. Şaha edilmiş şikayətlərin də təsiri olmadı, şah əmirləri inandırıcı görünməyən vədlərlə yola saldı, Məhdi-ülya isə onlara təhqirli cavabla əvəz verdi. Başqa çıxış yolu görməyən müxalif qızılbaş əmirləri şahbanunu aradan götürməyi qərara aldılar. Bu dəstəyə möhürdar Şahrux xan Zülqədər, Pirə Məhəmməd xan Ustaclu, Qorxmaz xan Şamlu, Məhəmməd xan Türkman, qorçubaşı Qulu



bəy Əfşar və b. daxil idilər. 1579-cu il iyulun 26-da aralarında şahın bəzi qohumları da olan bir neçə qızılbaş əyanı hərəmxanaya daxil olaraq Məhdi-ülyanı boğub öldürdü. Ardınca onun anasını, bəzi qohumlarını və Mazandaran əsilli əyanları da aradan götürdülər. Bir neçə gündən sonra qızılbaş əmirləri şahın hüzurunda Qurana and içdilər ki, şaha sadiqdirlər və onların bu addımı şaha qarşı yönəlməyib. Günahlarını yumaq üçün əmirlər şahbanunun böyük oğlu Həmzə Mirzənin vəliəhd elan olunmasını təklif etdilər.

Həmin ilin oktyabrında Krım xanı Məhəmməd Gəray 100 minlik ordu ilə Səfəvi torpaqlarına soxulub Osmanlı qüvvələri ilə birləşdi. Onlar Şamaxı, Bakı, Gəncə, Qarabağ və Muğanı ələ keçirdilər. Şah Məhəmməd Xudabəndə vəliəhd Həmzə Mirzə ilə birlikdə qoşunun başında hərbi yürüşə çıxdı. Səfəvi qoşununun yaxınlaşdığını eşidən Məhəmməd Gəray Krıma qayıtdı. Şamaxı azad edilsə də, tatarların bu qəfil hücumu Azərbaycanda böyük aclıq və səfalət yaratdı, çörək və ərzaq hədsiz dərəcədə bahalaşdı, minlərlə insan acından tələf oldu. 1580-ci ilin yayında Osmanlı tərəfinə sülh müqaviləsi bağlamaq və əsir mübadiləsi aparmaq barədə təklif göndərildi, çətinliklə də olsa, tərəflər arasında Şirvan məsələsini aydınlaşdırmaq üçün danışıqlara başlamaq barədə qərar qəbul edildi. Bu arada Krım tatarları Şirvana növbəti dəfə basqın etdilər, onların hücumunun qarşısı uğurla alındı. Səfəvi elçisi Qum hakimi İbrahim xan Türkman danışıqlar üçün İstanbula göndərildi, amma sultanın sülh bağlamağa tələsmədiyi aydın oldu, elçi isə Osmanlı sarayında 7 il saxlanıldı. Krım tatarlarının 1581-ci ildə Şirvana dördüncü basqını da uğursuzluqla nəticələndi və onlar Şamaxı ilə Şabran arasında qızılbaş ordusu tərəfindən darmadağın edildilər. Növbəti ildə Dərbənddə möhkəmlənmiş Osmanlı sərkərdəsi Osman paşa yenidən Şamaxını ələ keçirdi, bir ildən sonra İmamqulu xan Qacar şəhəri ondan geri aldı. 1583-cü ildə qızılbaş əmirləri arasında təfriqə və ədavət yaratdığına görə baş vəzir Mirzə Salman Heratda qızılbaşlar tərəfindən öldürüldü. 1584-cü ildə Osmanlı sərkərdəsi Fərhad paşa 80 minlik qoşunla İrəvanı tutdu, ardınca bütün Şirvan torpaqları da osmanlıların əlinə keçdi. Azərbaycan (Təbriz) bəylərbəyi Əmir xan Türkman şahzadə Həmzə Mirzənin gözündən düşdüyünə görə Qəhqəhə qalasında həbs edildi, onun vəzifəsinə Əliqulu bəy Qıçoğlu Ustaclu gətirildi. Əmir xanın 1585-ci ilin mayında həbsxanada öldürülməsindən sonra Türkman və Təkəlü tayfaları qisas məqsədilə birləşdilər. İğtişaşdan istifadə edən Osmanlı qoşunu Təbrizi tutmaq üçün Ərzurumdan hərəkətə keçdi. Təbrizdə təcili toplanmaq barədə şah tərəfindən göndərilmiş çağırışa qızılbaş tayfa başçılarının əksəriyyəti tabe olmadı. Həmzə Mirzənin başçılıq etdiyi 20 minlik qoşun 18 sentyabr 1585-ci ildə Ordubaddan keçib *Sufiyan* ərazisində osmanlıların ön qüvvələri ilə üzüzə gəldi, amma düşmənin say çoxluğu




onları geri çəkilməyə məcbur etdi. Sentyabrın 20-də təbrizlilərin müqavimətinə baxmayaraq, Osmanlı qoşunu şəhəri ələ keçirdi. Şəhər dağıdılıb yandırıldı, əhali amansız şəkildə qarət olundu. Müqaviməti dayandırmayan Təbriz camaatı gündüzlər təqiblərdən gizlənir, gecələr Osmanlı düşərgəsinə basqınlar təşkil edirdi. Qızılbaş dəstələri isə şəhər kənarındakı Osmanlı qoşun hissələrinə həmlələr etməklə onlara ağır tələfat verirdi. Osman paşa şəhərdə bir aydan çox qaldı. Həmzə Mirzənin qəfil hücumu nəticəsində Təbrizdəki Osmanlı qarnizonu xeyli itki verdi. Bundan sonra Osmanlı ordusundan 6 min nəfər Təbrizdə saxlanılaraq, qalan qoşun hissələri şəhərdən çıxarıldı, onlar yol boyunca ağır itkilər verərək geri çəkildilər. 1585-ci ilin sonunda Həmzə Mirzənin qoşunu xarabalığa çevrilmiş Təbrizə daxil oldu, lakin iç qalada möhkəmlənmiş Osmanlı qarnizonunu məhv etmək mümkün olmadı.

Bu arada Əmir xanın intiqamını almaq üçün Həmzə Mirzəyə qarşı birləşmiş Türkman və Təkəlü tayfa birliyinin qüvvələri Təbrizə yaxınlaşdı. Onlar sülh təklifi ilə razılaşmadılar, Həmzə Mirzənin ətrafındakı bəzi narazı qüvvələr də qiyamçılara qoşuldu. Qiyamçılar Şah Məhəmməd Xudabəndənin azyaşlı oğlu *Təhmasib Mirzəni* oğurlayıb gizli yolla Qəzvinə gətirdilər və burada onu vəliəhd elan etdilər. Qəzvin yaxınlığında Həmzə Mirzənin sərkərdəliyi altında dövlət ordusu ilə qiyamçılar arasında döyüş baş verdi. Türkman-Təkəlü alyansı sayca çox olmasına baxmayaraq məğlub oldu, qiyam başçıları əsir alındı, Təhmasib Mirzə az sonra Ələmut qalasına göndərildi.

Bundan sonra Həmzə Mirzə yenidən Təbrizə qayıdaraq Osmanlı qarnizonuna qarşı mübarizə etməyə cəhd göstərdi, lakin Fərhad paşanın 1586-cı ilin sentyabrında təkrarən Təbriz üzərinə yürüşü Həmzə Mirzəni geri çəkilməyə məcbur etdi. Şəhəri ələ keçirən Fərhad paşa alınmış bütün ərazilərin Osmanlı mülkü hesab edilməsi şərti ilə sülh təklifi göndərdi. Həmzə Mirzə tabeliyindəki qoşunun azlığını və bu qüvvə ilə itirilmiş əraziləri qaytarmağın qeyri-mümkünlüyünü anlayaraq Təbrizin Səfəvilərdə qalmasını şərt kəsərək sülhə razı olduğunu bildirdi. Fərhad paşa sülhə zəmanət olaraq ondan öz övladlarından birini Osmanlı paytaxtına girov göndərməyi tələb etdi. Həmzə Mirzə kiçik oğlu Heydər Mirzəni İstanbul sarayına göndərməyə boyun oldu. Şah Məhəmməd Xudabəndə Həmzə Mirzə ilə birlikdə İmamqulu xan Qacarın hakimiyyəti altında qalan Qarabağa yollandılar.

Həmzə Mirzə fasilədən istifadə etməklə ölkə daxilindəki işləri nizama salmaq, tənəzzülə uğramış mərkəzi hakimiyyəti gücləndirmək niyyətində idi. Lakin o, 10 dekabr 1586-cı ildə Gəncə yaxınlığında narazı qızılbaş əmirlərinin təşkil etdiyi sui-qəsd nəticəsində öldürüldü. Bunun ardınca ölkədə vətəndaş müharibəsi və feodal özbaşınalığı şiddətləndi. Şah Məhəmməd Xudabəndənin dövlət işlərini öz əlində cəmləmək və ölkəni



xaosdan xilas etmək cəhdi uğursuzluqla nəticələndi. Qızılbaş əmirləri bu dəfə şahı məcbur etdilər ki, şahzadə *Əbu Talib Mirzəni* vəliəhd kimi tanısın. Əmirlərin bir hissəsi, xüsusilə Xorasanda olan əyanlar isə digər şahzadənin – 13 yaşlı Abbas Mirzənin (gələcək I Şah Abbas) varisliyini dəstəkləyirdilər. Qarışıqlıqdan istifadə edən Osmanlı ordusu hərbi əməliyyatları bərpa edərək Təbriz, Mərənd, Ordubad və ətraf əraziləri ələ keçirdi, hətta Həmədana qədər irəlilədi. Daha sonra Qarabağ, Gəncə, Bərdə Osmanlı ordusunun ixtiyarına keçdi. Beləliklə, 1587-88-ci illərdə, demək olar ki, bütün Azərbaycan torpaqları tədricən Osmanlı ordusu tərəfindən tutuldu, şərq istiqamətində özbəklərin Xorasana hücumları da intensiv xarakter aldı.

Səfəvilər dövləti üçün son dərəcə böhranlı bir şəraitdə 1587-ci ilin oktyabrında Şah Məhəmməd Xudabəndə hakimiyyətdən salındı, oğlu Abbas Mirzə I Şah Abbas adı ilə taxta çıxdı. Bundan sonra bir müddət Qəzvində sakit həyat tərzi sürən Məhəmməd Xudabəndə ömrünün sonlarını Ələmut qalasında keçirdi. İsgəndər bəy Münşi "Tarixi-aləmarayi-Abbasi" əsərində Şah Məhəmməd Xudabəndənin hicri 1004-cü ildə (miladi 1595/96-cı illər) Qəzvində ishal xəstəliyindən vəfat etdiyini yazır. Mənbələrdə onun vəfat tarixini 21 iyul 1595-ci və ya 10 iyul 1596-cı il şəklində qeyd etmişlər. Cənazəsi əvvəlcə Qəzvindəki İmamzadə Hüseyn ziyarətgahında müvəqqəti olaraq dəfn edilmiş, sonralar İraqa aparılaraq müqəddəs ziyarətgahların birində torpağa tapşırılmışdır.

Şah Məhəmməd Xudabəndə "Fəhmi" ləqəbi ilə şeir yazırdı, zarafatı xoşlayırdı. İsgəndər bəy Münşi onun şəxsi keyfiyyətləri haqqında yazır: "Xasiyyətcə fəhmli, fərasətli, səxavətli idi. Elə böyük alicənablığa malik idi ki, onun alicənablığının qarşısında dünyanın bütün zənginliklərinin qədr-qiyməti yoldakı toz-torpaqla eyni idi".

Şah Məhəmməd Xudabəndənin ömrü 63-65 il arası, hakimiyyət müddəti 10 ilə yaxın davam etmişdir.

***Həyat yoldaşı:***

Mazandaran hakimi Mir Abdullah xanın qızı Xeyrənnisa bəyim *Məhdi-ülya* (vəf. 1579).

***Övladları:***

*Həsən Mirzə* (vəf. 1577),
*Həmzə Mirzə* (vəf. 1586),
*I Şah Abbas* (1571-1629),
*Əbu Talib Mirzə* (vəf. 1620),
*Təhmasib Mirzə* (vəf. 1629-cu ildən sonra),
Şahbəyim sultan,
Seyyidə bəyim (Kürdüstan hakimi Xan Əhməd xanın həyat yoldaşı).

***Mənbələr:*** *İsgəndər bəy Münşi. Tarix-i aləmara-yi Abbasi (tərcümə və şərhlər: O.Əfəndiyev, N.Musalı), s.280-284, 448-706; Mirzə Məhəmməd Məsum. Tarixi-səlatini-Səfəviyyə (nəşrə hazırlayan: Seyid Əmir Həsən Abidi), s.17-18; C.Bayramlı, V.Zifəroğlu. Azərbaycan hökmdarları: Səfəvilər, s.105-123; Faruk Sümer. Safevi Devletinin Kuruluşu ve Gelişmesinde Anadolu Türklerinin Rolü, s.110-142; Oqtay Əfəndiyev.*

*Azərbaycan Səfəvilər dövləti, s.138-196; Məhəmməd Möhsin Mustovfi. Zübdət ət-təvarix (nəşrə hazırlayan: Bəhruz Gudərzi), s.87-88; Nəsrullah Fəlsəfi. I Şah Abbasın həyatı, I, 38-133; Seyid Həsən ibn Mürtəza Hüseyni Astarabadi. Tarixi-sultani (nəşrə hazırlayan: Ehsan İşraqi), s.101-133.*



**I ŞAH ABBAS** (27 yanvar 1571 – 29 yanvar 1629) – Səfəvilər dövlətinin sayca beşinci şahı (hakim. 1587-1629). Özündən əvvəlki Səfəvi şahı *Məhəmməd Xudabəndənin* yaşca üçüncü oğludur. Anası Mazandaran hakimi Mir Abdullah xanın qızı *"Məhdi-ülya"* ləqəbli Xeyrənnisa bəyimdir. Babası I Şah Təhmasibin hakimiyyəti zamanı, atası Məhəmməd Mirzə (gələcək Şah Məhəmməd Xudabəndə) Herat valisi kimi xidmət edərkən bu şəhərdə doğulmuşdur. Abbasın 2 yaşı tamam olmazdan əvvəl I Şah Təhmasib Məhəmməd Mirzəni Herat valiliyindən azad edib Şirazın hakimi təyin etdi. Məhəmməd Mirzənin yerini ikinci oğlu, 7 yaşlı *Həmzə Mirzə* tutmalı idi. Lakin Məhəmməd Mirzə Həmzənin ağlıkəsən yaşa çatdığını və valideynlərindən ayrı yaşamağın ona çətin olacağını bildirdi, xahiş etdi ki, onun əvəzinə körpə Abbasın Heratda qalmasına icazə verilsin. Beləliklə, Abbas Mirzə o vaxtdan Xorasanın nominal valisi hesab edilməyə başladı. İdarəçilk işlərini *lələsi* – Ustaclu tayfasından *Şahqulu sultan Yegan* icra edirdi.

Abbas Mirzə uşaqlıq və yeniyetməlik illərində mükəmməl təhsil almış, fiziki hazırlıq və hərbi təlimlərlə ardıcıl məşğul olmuşdur. I Şah Təhmasibin vəfatından (1576) sonra hakimiyyətə keçmiş *II Şah İsmayıl* vaxtilə *Heydər Mirzəni* müdafiə etmiş *Ustaclu tayfasına* qarşı təzyiqlərə başladı, Ustaclu əmirlərindən bir neçəsi öldürüldü, qalanları öz siyasi nüfuzlarını və sərvətlərini itirdilər. Cəza tədbirləri gedişində Abbas Mirzənin lələsi Şahqulu sultan Yegan da aradan götürüldü. Sülalədaxili rəqiblərini bir-bir zərərsizləşdirən II Şah İsmayıl Şamlu tayfasından Əliqulu xanı Herata göndərdi ki, Abbas Mirzəni öldürsün. Lakin Əliqulu xan müqəddəs ramazan ayında seyid övladının və şah nəslinin qanını tökməyin günah olduğunu bəhanə gətirərək əmrin icrasını yubatdı. Bu müddətdə II Şah İsmayıl müəmmalı şəkildə öldü, bununla da Abbas Mirzənin həyatı üzərindən təhlükə götürüldü. Yeni şah Məhəmməd Xudabəndə "xanlar xanı" *Əliqulu xan Şamlunu* Heratın *əmir əl-ümərası* təyin edərək oğlunun himayəsini ona tapşırdı. Abbas Mirzə Əliqulu xanı atası kimi sevir, onun xanımına ana kimi baxırdı. Əliqulu xan Şamlu ömrünün sonunadək şahzadəyə himayə göstərməkdə davam etmiş, onu qorumağa çalışmışdır.

Valideynləri Abbas Mirzəni Qəzvinə gətirtməyə çalışsalar da, Əliqulu xan şahzadənin paytaxta getməsini təhlükəli sayaraq onu Heratda saxladı. O, öz hərəkətini bununla əsaslandırdı ki, özbəklərin hücumu qarşısında şahzadənin Xorasanda qalması və hakim sülalə adından hərbi əməliyyatlara başçılıq etməsi zəruridir.



1578-ci ildən başlayaraq osmanlıların şiddətli hücumları qarşısında Səfəvilər dövləti çətin vəziyyətə düşdü, ölkə ərazisinin xeyli hissəsi bir-birinin ardınca nəzarətdən çıxaraq onların əlinə keçdi. Qətiyyətsiz şah və bir-biri ilə çəkişən ordu başçıları Osmanlı işğalının qarşısını almaqda aciz idilər. Şahın vəliəhd təyin etdiyi Həmzə Mirzə hərbi əməliyyatlara şəxsən başçılıq edir, bununla yanaşı, ölkədaxili problemləri də nizamlamağa çalışırdı. Abbas Mirzə bu müddət ərzində Heratda qaldığı üçün osmanlılara qarşı aparılan döyüşlərdə və saray intriqalarında iştirak etmədi.

1579-cu ildə Şah Məhəmməd Xudabəndənin zəif təbiətindən istifadə edərək dövlət idarəçiliyini ələ keçirmiş şahbanu Məhdi-ülya Xeyrənnisa (Abbas Mirzənin anası) ilə qızılbaş əmirləri arasında qarşıdurma şiddətləndi. Narazı əmirlər şahbanu Məhdi-ülya Xeyrənnisanı sarayda şahın gözləri qarşısında boğub öldürdülər. Bunun ardınca Abbas Mirzənin lələsi Əliqulu xanın tərəfdarlarına qarşı ciddi təzyiqlər başladı, onun anası şahbanunun tərəfdarı olmaq bəhanəsi ilə öldürüldü, atası *Sultan Hüseyn xan* vəzifəsini itirib Ərdəbilə qaçdı, amma orada xəyanətlə ələ keçirilib aradan götürüldü. Əliqulu xan çıxış yolunu mərkəzi hakimiyyətə qarşı çıxmaqda və Abbas Mirzəni vəliəhd elan etməkdə gördü. Şah Məhəmməd Xudabəndə ilə Həmzə Mirzə qoşunla Xorasan üzərinə yeridilər, amma yeni Osmanlı hücumunun xəbəri gəlib çatdığı üçün tələsik barışıq əldə edildi və şah geri qayıtdı. Bu yürüş zamanı Əliqulu xanın əsas düşmənlərindən biri olan fars mənşəli baş vəzir *Mirzə Salman Cabiri* qızılbaş əmirləri tərəfindən öldürüldü (1583).

Bundan sonra Xorasana hakimlik uğrunda *Mürşidqulu xan Ustaclu*, Məşhəd valisi *Mürtəzaqulu xan Pörnak* və Herat əmir əl-ümərası *Əliqulu xan Şamlu* arasında rəqabət başladı. Mürşidqulu xan əvvəlcə Əliqulu xanla müttəfiq idi, onlar hətta Məşhəd hakimini vəzifədən uzaqlaşdırmağa nail oldular. Lakin az sonra iki sərkərdənin maraqları toqquşdu. Mürşidqulu xan Abbas Mirzə üzərində təsir qazanmaq uğrunda Əliqulu xanla mübarizəyə girişdi. Tərəflər arasında baş vermiş döyüşdə Mürşidqulu xan qalib gəldi, o zamandan Abbas Mirzə onun iqamətgahında yaşamağa başladı.

1586-cı ildə vəliəhd şahzadə *Həmzə Mirzə* sui-qəsd nəticəsində öldürüldü, şahın sonbeşiyi *Təhmasib Mirzə* bundan əvvəl dövlət çevrilişində təqsirli bilinərək həbsə salınmışdı. Qızılbaş əmirləri şahı öz dördüncü oğlu *Əbu Talib Mirzənin* vəliəhdliyini elan etməyə razı saldılar. Növbəti il Şah Məhəmməd Xudabəndə Qum şəhərindəki üsyanı yatırmaq məqsədilə Qəzvindən çıxdı. Mürşidqulu xan Ustaclu çoxdan gözlədiyi əlverişli fürsətin gəlib çatdığını anladı; o, Abbas Mirzəni də özü ilə götürüb kiçik dəstənin başında paytaxta doğru irəlilədi. Mürşidqulu xanın niyyəti qarışıqlıqdan və şahın sarayda olmamasından istifadə edərək Abbas Mirzəni hakimiyyətə gətirmək idi. Yol boyunca şahdan narazı qüvvələr onlara qoşulmağa

başladı. Şah vəziyyətdən xəbər tutanda artıq gec idi, təşəbbüs əldən verilmişdi. 1587-ci ilin sentyabrında Abbas Mirzə Qəzvinə daxil olub, faktiki olaraq, paytaxtı özünə tabe etdi. Şahın ətrafında olanlar da tədricən dağılıb şahzadəyə qoşuldular. Şah Məhəmməd Xudabəndənin vəzyyətlə barışmaqdan savayı çıxış yolu qalmadı. Beləliklə, Mürşidqulu xan Ustaclunun səyləri ilə 17 yaşlı Abbas Mirzə Səfəvilər dövlətinin başına keçdi. 1588-ci il oktyabrın 1-də Qəzvin sarayında təşkil olunmuş təntənəli tacqoyma mərasimində Şah Məhəmməd Xudabəndə hakimiyyətdən getdiyini və şahlığı öz oğluna ötürdüyünü elan etdi.

I Şah Abbas hakimiyyətə keçdikdən sonra anasının qatillərindən intiqam aldı. *Oruc bəy Bayat* yazırdı ki, şah taxta çıxmasının ertəsi günü nüfuzlu qızılbaş əmirlərini məşvərət bəhanəsi ilə saraya toplayıb öldürdü. Həmzə Mirzənin qətlində şübhəli bilinən *İsmayılqulu xan Şamlu*, Abbas Mirzənin hakimiyyətə gəlməsinə mane olmağa və müqavimət cəbhəsi təşkil etməyə çalışmış *Əliqulu xan Qıçoğlu Ustaclu* öz əlaltıları ilə birlikdə edam olundular. Mürşidqulu xan Ustaclu şahın vəkili vəzifəsinə təyinat aldı və dövlətdə birinci söz sahibi oldu. O, getdikcə nüfuzunu artırmaqda davam edir, mühüm vəzifələrə öz adamlarını yerləşdirir, dövlət işlərinə şahın müdaxiləsini məhdudlaşdırmağa çalışırdı. Bu vəziyyət I Şah Abbasa qətiyyən sərf etmirdi. Bu arada özbəklərin Xorasana növbəti dəfə hücum etmələri və Herat hakimi, şahın keçmiş *lələsi* Əliqulu xan Şamlunun onlara təslim olduqdan sonra xəyanətlə öldürülməsi xəbəri yayıldı. Bundan əvvəl Əliqulu xan yardım üçün Mürşidqulu xana dəfələrlə müraciət etsə də, o öz rəqibini xilas etməyi lazım bilməmişdi. Çünki şahın doğma ata qədər sevdiyi Əliqulu xan özbək mühasirəsindən xilas olsaydı, idarəçilik işlərini ələ keçirə və Mürşidqulu xan üçün problem yarada bilərdi. I Şah Abbas himayədarının təsirindən qurtulmaq üçün onu Əliqulu xanın məhvində və özbəklərlə işbirliyi qurmaqda ittiham edərək aradan götürmək qərarına gəldi. 1589-cu ildə sui-qəsdçilər qrupu Bəstam şəhərində Mürşidqulu xanı öldürdülər. Bundan sonra şah tam müstəqil şəkildə öz hakimiyyətini davam etdirməyə imkan qazandı.

I Şah Abbas hakimiyyəti  çox çətin bir dövrdə təhvil almışdı. Osmanlı imperiyası Səfəvilər dövlətinin ərazi bütövlüyünü pozmuş, indiki Şimali və Cənubi Azərbaycanı, İraq torpaqlarını işğal etmişdi. Şərq istiqamətində özbəklərin Xorasana hücumları güclənmiş, bölgənin, demək olar ki, yarısı onların nəzarəti altına keçmişdi. Yerlərdə hökm sürən əmirlərin bir hissəsi Osmanlı üsuli-idarəsinə tabe olmuş, onlarla əməkdaşlığa başlamışdı. Şah Məhəmməd Xudabəndə zamanında zəifləmiş mərkəzi hakimiyyətin nüfuzu hələ bərpa olmamışdı. Belə şəraitdə I Şah Abbas soyuqqanlılıqla hərəkət edərək problemləri bir-birinin ardınca mərhələlər üzrə çözmək qərarına gəldi. Hər şeydən əvvəl ona qərb cəbhəsində osmanlıların irəli-



ləməsini dayandırmaq və atəşkəsə nail olmaq lazım idi. Bu məqsədlə o, 1590-cı ildə əlverişsiz şərtlərlə də olsa, *İstanbul sülh müqaviləsini* imzaladı. 12 illik hərbi əməliyyatlara son qoymuş barışığa əsasən Azərbaycan torpaqları tərəflərin arasında bölündü, Şirvan, Qarabağ, Təbriz və ətraf nahiyələr osmanlıların ixtiyarına verildi, Qaradağ, Ərdəbil və Talış bölgələri isə Səfəvilərdə qaldı. Osmanlı hökuməti işğal edilmiş ərazilərdə yeni inzibati və sosial-iqtisadi islahatlar həyata keçirmək imkanı qazandı, Azərbaycanın iri şəhərlərində Osmanlı hərbi qarnizonları yerləşdirildi. Əhli-sünnənin müqəddəs dəyərlərinə qarşı hər hansı hörmətsizlik qadağan edildi. İlk baxışdan Səfəvilər dövləti üçün faydasız görünən bu müqavilə əslində I Şah Abbasa öz qüvvələrini səfərbər etmək, mövcud vəziyyəti düzgün dəyərləndirmək, müharibənin ağır nəticələrini aradan qaldırmaq və növbəti addımları atmağa hazırlaşmaq imkanı yaratdı.

Osmanlılar sarıdan arxayın olduqdan sonra I Şah Abbas dəqiq proqram üzrə hərbi-siyasi və iqtisadi islahatları həyata keçirməyə başladı. O vaxtadək, demək olar ki, bütövlükdə qızılbaş türk tayfalarının hərbi gücündən ibarət olan Səfəvi ordusunda alternativ qoşun növü – qullar (*qulamlar*) korpusu yaradıldı. Qeyri-müsəlmanlardan səfərbər edilmiş yeniyetmələr mükəmməl hərbi təlim keçirdilər. Qulamların bir hissəsi lazımi təlimlərdən sonra saray xidmətinə qəbul edilirdi. Orduya və keşikçi qüvvələrə qulamların qəbul edilməsi öz faydasını verirdi; onlar tayfa təəssübündən uzaq, bitərəf mövqe sərgiləyir, istənilən cəza tədbirinin icrasında maraqsız tərəf kimi çıxış edirdilər. Qulamlar dövlət idarəçiliyində və orduda qızılbaşların qarşısında müvazinət tərəzisinin ikinci gözü funksiyasını ifa edirdilər. I Şah Abbas dövründən etibarən qızılbaş əmirlərinin cəzalandırılması, tayfa konfliktlərinin həlli istiqamətində qulamların köməyindən istifadə edilməyə başlandı. Xidmətdə fərqlənən qulamlar hətta iri bölgələrin hakimi (*bəylərbəyi*), ordu komandanı (*sipəhsalar*) kimi yüksək mənsəblərə də təyinat alırdılar. Qulam korpusunun komandanı olan *qullarağası* Səfəvilər dövlətinin üç əsas güc strukturundan birinin başçısı (*qorçubaşı* və *tüfəngçiağası* ilə birlikdə) sayılırdı. Gürcü mənşəli qullarağası *Allahverdi xan Undiladze* və oğulları, Fars vilayətinin hakimi *İmamqulu xan*, Qarabağ bəylərbəyi *Davud xan*, Şirvan bəylərbəyiləri *Yusif xa*n və *Qazaq xan Çərkəz*, Dərbənd və Şabran hakimi Fərrux sultan, sipəhsalar *Qərəçəqay xan*, qullarağası Xosrov xan (*Rüstəm xan*) və b. I Şah Abbas zamanındakı qulam korpusunun yetirməsi idilər.

Lakin qeyd etmək lazımdır ki, orduda qulam təbəqəsindən olan hərbi qulluqçuların sayının artmasına baxmayaraq, Səfəvi ordusunun böyük hissəsini yenə qızılbaş tayfalarının yetirmələri təşkil edirdi. İsgəndər bəy Münşi “Tarixi-aləmarayi-Abbasi” əsərində I Şah Abbasın vəfatı ərəfəsində Səfəvilər dövlətində vəzifə başında olmuş 73 nəfər türk və

qeyri-türk əmir haqqında məlumat vermişdir ki, bunlara *qızılbaş tayfalarının, kürd və lurların* nümayəndələri, eləcə də qızılbaş sayılmayan sərkərdələr aid idi. Bunlarla yanaşı, müəllif 21 nəfər qulamın da yüksək vəzifələrdə xidmət göstərdiyini qeyd etmişdir. Bu say nisbəti guya I Şah Abbasın dövlət idarəçiliyində qızılbaş təsirini aradan qaldırması, idarəçilik aparatında qeyri-türkləri yerləşdirməsi barədə iddiaları əsassız saymağa imkan verir.

I Şah Abbasın ordu quruculuğu ilə bağlı mühüm islahatlarından biri də Səfəvi ordusunda odlu silah və artilleriya bölmələrini artırmaq idi. Orduda bundan əvvəl də odlu silahdan (muşket və tapançalardan), müxtəlif ölçülü artilleriya qurğularından istifadə edilirdi. I Şah Abbasın Avropadan dəvət etdiyi mütəxəssislərin (ingilis Şerli qardaşları da bunlara aid idi) yardımı ilə döyüşçülər təlim keçərək odlu silahdan istifadənin incəliklərinə yiyələnirdilər. Xüsusi emalatxanalarda hazırlanan toplar döyüşlərdə fəal şəkildə istifadə edilirdi; belə ki, iri toqquşmalar zamanı döyüş meydanına 500-dək top çıxarmaq imkanı vardı. Qərb səyyahlarından birinin verdiyi məlumata əsasən, bu dövrdə Səfəvi ordusunun süvari bölmələrində 70 min nəfər döyüşçü xidmət edirdi, bunların 50 mini dövlətdən məvacib alır, qalan 20 mini isə əkinçilik və ticarətlə öz yaşayışını təmin edirdi. Bəzi məlumatlara görə, I Şah Abbas zamanında Səfəvi ordusu 110-120 min nəfərdən ibarət idi; bunların 60 minini əyalətlərdə yerləşən hərbi qüvvələr (*çərik*), 20 minini *qorçular* təşkil edirdi, *qulam, tüfəngçi* və *topçu* bölümlərinin hər birində xidmət edənlərin sayı isə 12 mini ötürdü. İngilis səyyahı T.Herbert isə Səfəvi ordusunun 300 min süvari və 70 min tüfəngçidən ibarət olduğunu yazmaqla yanaşı, qeyd edirdi ki, nizami ordunun sayı nadir hallarda 50 mini ötür.

I Şah Abbas Səfəvilər dövlətinin siyasi-inzibati strukturunda da dəyişikliklər aparmış, yerli hakimlər tərəfindən idarə edilən bəzi iri əraziləri səltənət (*divan*) və ya xassə (şah mülkiyyəti) siyahısına daxil etmişdir. Bu yolla həm bölgələrdən xəzinəyə daxil olan gəlirlər artdı, həm də yerlərdəki valilərin hakimiyyəti məhdudlaşdı.

I Şah Abbasın daxili siyasəti mərkəzi hakimiyyətin möhkəmləndirilməsinə yönəlmişdi. Onun əmri ilə bürokratik aparatda nizam-intizam həyata keçirildi, dəqiq vəzifə və səlahiyyət bölgüləri aparıldı. Rəiyyətdən toplanan vergilər sistemləşdirildi, vergilərin bir hissəsi ləğv edildi. "Tarixi-aləmarayi-Abbasi" kitabında yazılıb: "O, rəiyyətə divan vergilərindən külli miqdarda yüngülləşdirmələr bəxş etdi. Əvvəla, İraqi-Əcəmin on beş min İraq tüməninə yaxın olan sərkəllə vergisi o vilayətin əhalisinə bağışlandı. Bundan başqa, o, ramazan ayında əhalini divan mükəlləfiyyətlərindən azad etdi, divan işçilərinin əməlləri ucbatından iyirmi min tümənə yaxınlaşan ehdas və mali-yekmahə vergilərini rəiyyətə bağışladı". Şahın fərmanı ilə ayrı-ayrı bölgələrin əhalisi də dövlət



qarşısında xüsusi xidmətin əvəzi olaraq vergidən azad edilirdi. Məsələn, osmanlılara qarşı müharibədə müstəsna şücaət göstərdiyinə görə 1606-cı ildə Ordubad, 1607-ci ildə Dərbənd və Bakı əhalisi bütün vergilərdən azad olundu. İraqi-Əcəm əhalisinin 100 min İraq tüməni məbləğində vergi yükü, 20 min tümən məbləğində çobanbəyi vergisi, darğalar üçün alınan beşdəbir dinar vergisi hesab dəftərlərindən silindi. Müharibə zamanı dağıntılara məruz qalmış bölgələrdə əhaliyə pul və mal yardımı göstərildi. Yuxarıda göstərilən rəqəmlər I Şah Abbas zamanında ölkə iqtisadiyyatının böhrandan çıxdığını, tərəqqi yoluna qədəm qoyduğunu göstərir, artıq dövlət maliyyə gəlirlərinin bir hissəsindən rəiyyətin xeyrinə imtina etmək gücündə idi. Rəiyyətin güzəranına qayğı ilə yanaşdığına görə I Şah Abbas xalq yaddaşında ədalətli hökmdar kimi qalmış, "Şah Abbas cənnətməkan" ləqəbi ilə xatırlanmışdır. Xalq arasında onun ədaləti haqqında rəvayətlər dolaşır, Şah Abbas dastanların müsbət qəhrəmanına çevrilirdi. Bu dastanlarda şah öz vəzirləri (xüsusilə Allahverdi xan) ilə birlikdə təğyiri-libas olub şəhərləri və kəndləri dolaşır, özünü tanıtmadan problemləri həll edir, zalımları cəzalandırırdı.

I Şah Abbasın hərbi fəaliyyəti hakimiyyətə gəlişindən az sonra özbəklərə qarşı yürüşlə başladı. 1588-ci ildə özbək sərkərdəsi Abdullah xanın Heratı tutub Məşhədi mühasirəyə aldığını eşidən şah Xorasan istiqamətində yürüşə çıxdı. Abdullah xan qızılbaş ordusunun gəlişini eşidib tələsik geri çəkildi, qızılbaşlar Məşhədi işğaldan xilas edə bilsələr də, Heratı geri almağı bacarmadılar. Lakin şah Xorasandan geri qayıdan kimi özbəklər yenidən Məşhəd şəhərini mühasirəyə aldılar. I Şah Abbasın Tehranda xəstələnməsi Məşhəd qarnizonunun ümidlərini qırdı və qızılbaş sərkərdəsi Əmət xan Ustaclu qalanı özbəklərə təslim etdi. Özbəklərin lideri Abdullah xan öldükdən sonra I Şah Abbas şərqdən gələn təhlükəni birdəfəlik aradan qaldırmaq üçün 1598-ci ildə böyük qoşunla Xorasana üz tutdu. Şiddətli döyüşdə özbəklərin yeni başçısı Din Məhəmməd xan yaralandı və geri çəkilərkən öz silahdaşları tərəfindən öldürüldü. Səfəvi ordusunun komandanı sipəhsalar *Fərhad xan Qaramanlu* yol verdiyi nöqsanlara görə vəzifəsindən götürüldü, amma şah sərkərdəni bağışlamağı qərara aldı və hətta Herat hakimliyini ona təklif etdi. Fərhad xan isə *sipəhsalar* vəzifəsindən sonra bu təklifi əskiklik sayaraq rədd cavabı verdi. Qəzəblənmiş şahın gizli göstərişi ilə Allahverdi xan Undiladzenin başçılıq etdiyi qrup Fərhad xan Qaramanlunu aradan götürdü (1598/99).

Xorasan yürüşünü uğurla başa vuran şah Gilan və Mazandaranı xassə (səltənət) torpaqlarına qatdı, on minlərlə kürdü Xorasanın şimalına köçürərək özbəklərlə sərhəddə bufer zonası yaratdı. Sonrakı illərdə I Şah Abbas Bəlx şəhərini tutmağa çalışdı, amma qazandığı üstünlük müvəqqəti oldu. Xorasan yürüşünün çox uzandığını, ordunun yorulduğunu və xəstəlikdən əziyyət çəkdiyini

görən şah geri qayıtdı. Buna baxmayaraq, Xorasan yürüşünün nəticələri Səfəvilər üçün ümumilikdə uğurlu olmuş, dövlətin şimal-şərq sərhədlərinin təhlükəsizliyi təmin edilmişdi.

1611-ci ildə özbək sərkərdəsi Vəli Məhəmməd xan öz qohumları tərəfindən hakimiyyətdən salınaraq Səfəvilər dövlətinə pənah gətirdi. Bir ay I Şah Abbasın qonağı olmuş Vəli Məhəmməd xan daha sonra geri dönərək rəqiblərinə qalib gəldi, amma az sonra Səmərqənd yaxınlığında yenidən məğlub olaraq öldürüldü. Onun yerini tutan xanlar Osmanlı imperiyası ilə əlaqəli şəkildə Səfəvilərə qarşı döyüşməyə cəhd etdilər, lakin ciddi nəticə qazanmadılar. 1623-cü ildə özbəklərlə Səfəvi dövləti arasında sülh müqaviləsi bağlandı və I Şah Abbasın vəfatınadək bölgədə ciddi toqquşma baş vermədi.

1598-ci ildə I Şah Abbas Səfəvilər dövlətinin paytaxtını *Qəzvindən İsfahana* köçürdü. Bununla o, paytaxtı Osmanlı sərhədlərindən bacardıqca uzağa çəkməyə çalışırdı. Zəruri hazırlıq işlərini həyata keçirdikdən sonra şahın bütün diqqəti osmanlılar üzərinə yönəltməsinə artıq heç nə mane olmurdu. O, 1590-cı ildə bağlanmış müqavilənin nəticələrini ləğv etmək, Səfəvi–Osmanlı sərhədlərini heç olmazsa 1555-ci il *Amasya sazişinə* uyğun vəziyyətə qaytarmaq məqsədilə hərbi əməliyyatları yenidən başlatdı. Keçən müddət ərzində Səfəvilər dövləti iqtisadi və hərbi baxımdan güclәndiyi halda Osmanlı imperiyası böhran həddində idi. Cəlali üsyanları imperiyanı zəiflətmişdi, Avropa istiqamətindəki fəthlər də əvvəlki kimi uğurlu deyildi. Bəzi məlumatlara görə, Osmanlı tərəfi təhrikedici addımlarla qarşılıqlı münasibətləri korlamış və sülhün pozulmasına şərait yaratmışdı. Belə ki, Van və Şirvan bölgələrində Səfəvi tacirlərinə qarşı həyata keçirilmiş təzyiq və qətl hadisələri I Şah Abbası qəti cavab tədbirləri görməyə vadar etmişdi.

1603-cü ildə başlamış hərbi əməliyyatlar gedişində əvvəlcə Təbrizdəki Osmanlı qarnizonu təslim oldu (21 oktyabr), bunun ardınca Naxçıvan, Culfa, Ordubad və Qars geri qaytarıldı. 1604-cü ilin mayında altı aylıq mühasirədən sonra *İrəvan* qalası osmanlılardan təmizləndi. Gürcüstan feodalları Osmanlı qüvvələrini qovub Səfəvilər dövlətinin himayəsini qəbul etdiklərini bildirdilər. I Şah Abbas nüfuzlu qızılbaş sərkərdələrindən *Əmirgünə xan Ağcaqoyunlu-Qacarı* Çuxursədə, Maqsud sultan Kəngərlü-Ustaclunu isə Naxçıvana hakim təyin etdi.

Növbəti ildə Səfəvi torpaqlarının Osmanlı işğalından azad olunması prosesi davam etdirildi. Təcrübəli Osmanlı sərkərdəsi Sinan paşa böyük qoşunla Səfəvi torpaqlarına soxulsa da, "yandırılmış torpaq" taktikası ilə üzləşdi. Qızılbaşlar Osmanlı ordusunun yolu üzərindəki bütün əkin sahələrini yandırmaqla, malqaranı sürüb aparmaqla, əhalini təhlükəsiz əraziyə köçürməklə düşməni yorub əldən salmağı və psixoloji basqı altına almağı bacardılar. 1605-ci il noyabrın 5-də Təbriz ətrafındakı *Sufiyan* mən-



təqəsində baş vermiş həlledici savaşda 60 min nəfərlik qızılbaş qoşunu sayı 100 mini aşan osmanlılar üzərində parlaq qələbə qazandı. Osmanlıların bütün artilleriyası qənimət kimi ələ keçirildi, xeyli döyüşçüsü həlak oldu, Sinan paşanın ürəyi partlayıb öldü.

Osmanlı sultanı I Əhməd dərhal sülh bağlamaq üçün yollar axtarmağa başladı, bu məqsədlə hətta İstanbulda əsir olaraq saxlanılan gürcü kraliçası Gülsarəni I Şah Abbasın bibisi *Zeynəb xanıma* məktub yazmağa məcbur etdi. Lakin Səfəvi hökmdarı cavab verdi ki, I Şah İsmayılın atının nalı dəyən bütün torpaqları geri qaytarmayınca barışığa getməyəcək. 1606-cı ildə uzun sürən mühasirədən sonra Gəncə şəhəri, ardınca Tiflis Səfəvilərə tabe oldu. Həmin ilin qışında isə Şirvan torpaqları artıq qızılbaşların əlində idi, Şamaxı qalası top atəşləri altında təslim olmuş, Dərbənd və Bakıdakı Osmanlı qarnizonu əhali tərəfindən qovulmuşdu. İsgəndər bəy Münşinin yazdığı kimi, Əmir Teymurun zamanından keçən 250 il ərzində I Şah Abbasdan başqa heç bir hökmdar öz ordusunu 5 il ərzində fasiləsiz olaraq döyüş meydanında saxlayıb qələbələr qazanmamışdı. 1610-cu ildə Osmanlı sədri-əzəmi, 90 yaşlı Kuyucu Murad paşa üstünlüyü geri qaytarmağa bir daha cəhd etdi, amma ciddi nəticə əldə etmədən öldü. Bundan sonra Osmanlı tərəfi I Şah Abbasın şərtləri əsasında sülh sazişi imzalamağa məcbur oldu. 1612-ci ildə bağlanmış *İstanbul müqaviləsi* cüzi fərqlərlə Amasya sazişinin şərtlərini təkrar etdi.

Növbəti illərdə Səfəvi qoşununun Gürcüstanda sabitlik yaratmaq cəhdləri, eləcə də müqavilədə nəzərdə tutulmuş 200 tay ipək parça xəracının şah tərəfindən verilməməsi hərbi əməliyyatların yenidən qızışmasına səbəb oldu. Sədri-əzəm Qara Mehmed paşanın uğursuz hücumundan sonra yeni təyin edilmiş sədriəzəm Xəlil paşa nəhəng qoşunla sərhədi keçdi. I Şah Abbas bu dəfə də "yandırılmış torpaq" taktikasına müraciət edərək üzücü qarşıdurma yolunu seçdi. Osmanlı sərkərdəsinin alçaldıcı sülh təklifləri (fəth edilmiş bütün torpaqlardan imtina etmək, öz oğullarından birini girov kimi İstanbula göndərmək) şah tərəfindən qəti şəkildə rədd edildi. 1618-ci ildə baş vermiş Sınıq körpü döyüşündə qızılbaşlar Osmanlı ordusunu və köməyə gəlmiş Krım tatarlarını darmadağın etdilər. Osmanlı qüvvələri 15 min nəfərdən artıq döyüşçünü, o cümlədən Ərzurum, Rumeli və Diyarbəkir bəylərbəyilərini itirdi, Van bəylərbəyi əsir alındı. Həmin il bağlanmış *Sərab sülh müqaviləsi* 1612-ci il İstanbul müqaviləsinin şərtlərini təsdiq etdi (Gürcüstan istiqamətindəki sərhəd xətlərində Səfəvilərin xeyrinə dəyişikliyi nəzərə almaqla), illik xərac kimi nəzərdə tutulmuş 200 tay ipəyin miqdarı azaldılıb 100 tay oldu.

Sərab sülh müqaviləsi bağlandıqdan sonra Osmanlı imperiyasında siyasi böhran kəskinləşdi. 1618-ci ildə hakimiyyətə keçmiş Sultan II Osman 1622-ci ildə üsyançı yeniçərilər tərəfindən öldürül-

dü, ondan əvvəl qısa müddət sultanlıq edib taxtdan salınmış əmisi I Mustafa yenidən hakimiyyət başına gətirildi. Lakin bu dəfə də iradəsiz (və ya əqli cəhətdən zəif) sultanın hökuməti uzun sürmədi. 1623-cü ildə onu taxtdan endirib 11 yaşlı qardaşı oğlunu IV Sultan Murad adı ilə hakimiyyətə gətirdilər. Sultan azyaşlı olduğu üçüb dövləti, faktiki olaraq, anası Mahpeykər (Kösem) sultan idarə edirdi. Bu vəziyyətdən istifadə edən Bağdad hakimi Bəkir bəy mərkəzi hakimiyyətə tabe olmaqdan boyun qaçırdı, amma Diyarbəkir valisi Hafiz Əhməd paşanın onu cəzalandırmaq üçün gəldiyini eşidib yardım üçün Səfəvilər dövlətinə müraciət etdi. Çoxdan bəri İraq torpaqlarını geri qaytarmaq və şiə imamlarının müqəddəs məzarları üzərində nəzarəti bərpa etmək istəyən I Şah Abbas bu imkandan yararlanmaya bilməzdi. Amma Bağdad üzərinə hərəkətə keçən Səfəvilər bölgəyə çatdıqda fərqli vəziyyətlə qarşılaşdılar. Diyarbəkir valisi ilə anlaşmaya gəlmiş Bəkir bəy şəhəri Səfəvilərə təslim etmək istəmədi, hətta onların düşərgəsinə basqın etdi. I Şah Abbas Bağdad valisinə təslim olmaq üçün 3 gün vaxt verdikdən sonra şəhəri mühasirəyə aldı. 1624-cü ilin yanvarında Bağdad qızılbaş qoşununa təslim oldu, bunun ardınca İraqın digər şəhərləri də ələ keçirildi. 1625-ci ildə Diyarbəkir valisi Hafiz Əhməd paşa yenidən Bağdad üzərinə hücuma keçdi, amma özü ilə artilleriya qurğuları gətirmədiyi üçün şəhərin mühasirəsində uğur qazanmadı. *Zeynal bəy Şamlunun* basqınçı dəstələri də Bağdadı əhatəyə almış Osmanlı qoşununa ağır itkilər verirdi. I Şah Abbasın tətbiq etdiyi taktika nəticəsində ərzaq təminatından məhrum qalan, aclıq və xəstəlikdən əziyyət çəkən Osmanlı qoşununda narazılıq başladı. Hafiz Əhməd paşa Bağdadın mühasirəsi zamanı qoşunun yarısını itirərək tələsik geri çəkildi (1626).

I Şah Abbasın hakimiyyətinin əvvəllərində Səfəvilər dövlətinin *Böyük Moğol imperiyası* ilə münasibətləri sabit idi, moğol hökmdarı Əkbər şah Səfəvilərlə qarşıdurmadan çəkinirdi. Ondan sonra hakimiyyətə gəlmiş Cahangir şah 1618-ci ildə Səfəvilər dövlətinə təmtəraqlı diplomatik heyət göndərdi. Qəzvində I Şah Abbas tərəfindən qəbul edilmiş bu heyətin 800 nəfərdən artıq üzvü vardı. Elçilər özləri ilə bahalı hədiyyələr, hətta ekzotik heyvanlar da gətirmişdilər. I Şah Abbas buna cavab olaraq Zeynal bəy Şamlunu böyük heyətlə birlikdə moğol hökmdarının hüzuruna yolladı. Həm Qəzvində, həm də Aqrada aparılan danışıqlar zamanı hər iki dövlət üçün strateji əhəmiyyət daşıyan Qəndəhar mövzusu müzakirə edildi. I Şah Təhmasibin zamanında əldən-ələ keçmiş Qəndəhar XVI əsrin sonlarında moğollar tərəfindən tutulmuş, 1605-ci ildə şəhəri geri qaytarmaq üçün göndərilmiş qızılbaş qoşunu nəticəsiz geri dönmüşdü.

1622-ci ildə I Şah Abbas böhran halını yaşayan Osmanlı dövlətinin hücumundan arxayın olduğu üçün diqqətini İraqla yanaşı Qəndəhar üzərinə də yönəltdi. Şəhəri geri qaytarmaq üçün edilmiş



müraciətlərə müsbət cavab almayan şah 1622-ci ildə Qəndəhar üzərinə yürüşə çıxdı. Cahangir şah digər daha mühüm məsələlərlə məşğul olduğu üçün vəziyyətə müdaxilə etməməyi qərara aldı. Həmin ilin iyununda Qəndəhar şəhəri mühasirədən sonra Səfəvi ordusuna təslim oldu, *Gəncəli xan Zig* şəhərin hakimi təyin edildi.

I Şah Abbasın zamanında aparılmış hərbi əməliyyatların bir hissəsi də Gürcüstanın payına düşürdü. Osmanlılarla müharibə gedişində Səfəvi dövlətinin təsiri altına düşmüş Gürcüstan feodalları daha sonralar öz mövqelərini dəyişdilər. Osmanlıların təhriki ilə Böyük Mouravi ləqəbli Georgi Saakadze (1570-1629) üsyan qaldırdı. I Şah Abbas ordunun baş komandanı (*sipəhsalar*) *Qərəçəqay xanı* Şirvan bəylərbəyi *Yusif xanla* birlikdə bölgəyə yolladı. Qızılbaş qoşunu döyüşdə çətinliklə də olsa qalib gəldi, amma Qərəçəqay xanla Yusif xan Böyük Mouravi tərəfindən xəyanətlə öldürüldülər (1625). Az sonra *qorçubaşı İsa xan Şeyxavənd* üsyançılar üzərində qələbə qazansa da, gürcü feodallarının müqavimətini tam qırmaq mümkün olmadı. Döyüşlərdə Çuxursəd bəylərbəyi *Əmirgünə xan Ağcaqoyunlu-Qacar* ağır yaralanıb həlak oldu, Şirvan bəylərbəyi *Qazaq xan Çərkəz* əsir düşdü. Gürcülərin kömək üçün müraciət etdikləri Rusiya dövlətinin xahişi ilə I Teymuraz Kartli-Kaxeti çarı seçildi, bundan sonrakı Gürcüstan valilərinin həmin nəsildən seçiləcəyi, həmçinin İsfahan dargasının da bu sülalə nümayəndələrindən olacağı qərara alındı. 1627-ci ildə I Şah Abbas Qarabağ bəylərbəyi *Məhəmmədqulu xan Ziyadoğlu-Qacarı* yarıtmaz xidmətinə görə vəzifəsindən çıxarıb yerinə qullarağası Allahverdi xan Undiladzenin oğlu *Davud xanı* təyin etdi. Beləliklə, I Şah Abbasın hakimiyyətinin sonlarına yaxın Gürcüstanda nisbi sabitlik yarandı.

I Şah Abbasın zamanında Səfəvilər dövləti İran körfəzi hövzəsindəki limanları ələ keçirməklə dəniz ticarətinin üzərində ciddi nəzarət qazandı. Bölgəyə çoxdan bəri Portuqaliya nəzarət edirdi (Hərbi əməliyyatların qızışdığı dövrdə Portuqaliya İspaniya krallığı ilə uniya halında mövcudluğunu davam etdirirdi və əslində İspaniya kralının hakimiyyəti altında idi. XVII əsrin birinci rübündə baş vermiş Səfəvi-Portuqaliya müharibəsi mahiyyətcə Səfəvi-İspaniya müharibəsi sayılır). 1602-ci ildə *Allahverdi xan* öz təşəbbüsü ilə Bəhreyni Səfəvilər dövlətinin tərkibinə qatdı, 1622-ci ildə şah ingilis donanmasının köməyi ilə Hörmüz və Kiş adalarını avropalılardan azad etdi.

I Şah Abbas öz varisi olan nəvəsi *I Şah Səfiyə* həm hərbi-siyasi, həm də iqtisadi cəhətdən güclü bir dövlət qoyub getdi. Səfəvilər dövləti Şərqin ən güclü imperiyalarından biri kimi Avropa ölkələri tərəfindən də qəbul edilirdi, Avropa hökmdarları Şərqlə bağlı siyasətdə Səfəvilər dövləti ilə hesablaşmağa məcbur idilər. Ölkədə mərkəzləşdirilmiş hakimiyyət güclənmiş, üsyançı qüvvələrin müqaviməti qırılmışdı. Həm şimalda

Gürcüstan və Rusiya ilə, həm şərq istiqamətində özbəklər və moğollarla, həm də qərbdə Osmanlı imperiyası ilə sərhədlərdə sabitlik hökm sürürdü. İran körfəzində Portuqaliya ağalığına son qoyulmuş, əcnəbi tacirlər üçün sərfəli şərtlərlə ticarət imkanları yaradılmışdı. Səfəvilər dövlətinin I Şah İsmayıl zamanındakı sərhədləri bərpa edilməklə bitməmiş, yeni ərazilər fəth olunmuşdu, artıq 3 milyon kv.km-dən artıq torpaqlarda qızılbaş ideologiyası hakim idi.

I Şah Abbas dini dəyərlərə bağlı bir hökmdar idi. Onun zamanında din alimləri, xüsusilə *Şeyx Bəhai* və *Mir Damad* böyük nüfuz qazanmışdılar. Şah İran və İraq ərazisindəki müqəddəs ziyarətgahlara ehtiramını ardıcıl şəkildə nümayiş etdirirdi. O, hicri 1010-cu (miladi 1601-ci) ildə özbəklər üzərində qələbənin şərəfinə etdiyi nəzirə uyğun olaraq piyada Məşhəd ziyarətinə yollandı və 1.200 km-dən artıq məsafəni 28 günə qət etdi. Onun əmrinə əsasən İsfahandan Məşhədədək yol boyunca ölçü ipləri vasitəsilə məsafə dəqiq şəkildə hesablanmışdı (Ziyarət səfərinin dəqiq marşurutu I Şah Abbasın saray münəccimi Molla Cəlaləddin Məhəmməd Münəccim Yəzdinin *"Ruznameyi-Molla Cəlal"* ("Tarixi-Abbasi") əsərində ətraflı təsvir edilmişdir). Şah sonralar da Məşhəd ziyarətini təkrar etmişdir. Bu ziyarət səfərlərində o, İmam Rzanın (ə) məqbərəsində fəxri xidmətlə məşğul olur, şamları və çıraqları yandırırdı. Onu səfərdə müşayiət edən Şeyx Bəhai ilə bu mövzuda şeirləşməsi də məlumdur. I Şah Abbas İmam Əliyə (ə) duyduğu dərin məhəbbətə görə özünə "Kəlbi-asitani-Əli" (İmam Əlinin (ə) kandarının iti; Əshabi-kəhf rəvayətinə işarədir) ləqəbini götürmüşdü, hətta bəzi məktublara da bu cür imza qoyurdu. Bununla yanaşı, o, oyun və əyləncəni, xüsusilə ov etməyi və çövkən oyununa baxmağı çox sevirdi.

Səfəvilər sülaləsinin əksər nümayəndələri kimi, I Şah Abbas da fiziki cəhətdən güclü və dözümlü idi. Hərbi yürüşlərə sıravi döyüşçülərlə yanaşı qatılırdı. Sufiyan döyüşündən sonra əsir kimi hüzuruna gətirilmiş iricüssəli Osmanlı sərkərdəsi xəncərlə şaha hücum etdikdə şah əlbəyaxa savaşa girərək onu zərərsizləşdirmişdi.

I Şah Abbas ədəbiyyat və incəsənəti sevir, sənət adamlarını himayə edirdi. "Abbas" təxəllüsü ilə şeirlər yazırdı. Görkəmli ədiblər *İsgəndər bəy Münşi* və *Sadiq bəy Əfşar*, istedadlı rəssam və xəttatlar *Rza Abbasi*, *Əlirza Abbasi* (Şahnəvaz xan), *Mir İmad Qəzvini*, Əbdülbaqi Təbrizi və b. onun himayəsi altında fəaliyyət göstərirdilər. I Şah Abbasın dövründə İsfahan şəhəri Şərqin ən məşhur elm və sənət mərkəzlərindən birinə çevrilmişdi. İsfahan şəhərində ayrı-ayrı məhəllələrin salınması, *Nəqşicahan meydanının* layihəsi, *Ali qapu, Şah məscidi, Şeyx Lütfullah məscidi* kimi möhtəşəm memarlıq abidələrinin tikintisi onun təşəbbüsü və rəhbərliyi altında aparılmışdır.

I Şah Abbasın şəxsi keyfiyyətləri və xarakteri barədə məlumatlar geniş və ziddiyyətlidir. Əksər hökmdarlar kimi, o



da bəzən həddən artıq mərhəmətli və mülayim olur, bəzən isə qəddarlıq nümayiş etdirirdi. Tütün və tənbəkini sevmir, hətta hüzurunda xarici ölkə səfirlərinin tütündən istifadə etməsindən narahat olurdu. Zarafatı xoşlayırdı. Mistik elmlərə marağı vardı, mövhumata inanır, hadisələrin nəhs (uğursuz) olmasından qorxduğu üçün münəccimlərlə teztez məsləhətləşirdi. Hətta onların məsləhəti ilə təhlükədən xilas olmaq üçün 3 gün ərzində hakimiyyətdən kənara çəkilmiş, Yusif Tərkeşduzu taxta çıxarmışdı (Bu hadisə M.F.Axundov tərəfindən "Aldanmış kəvakib" povestində təsvir edilmişdir).

I Şah Abbas qızılbaş tayfalarının bir bölgədə kompakt şəkildə məskunlaşmasını hakimiyyət üçün təhlükə sayır, eyni zamanda Osmanlı işğalı ilə barışan, hətta düşmənlə əməkdaşlıq edən tayfaları cəzalandırmağı zəruri bilirdi. Buna görə o, on minlərlə insanı tayfalar şəklində ölkənin bir bölgəsindən digərinə sürgün etdirmişdi, bu proses tarix kitablarında "Şah Abbasın köçləri" kimi məşhurdur.

I Şah Abbas həmişə ehtiyat edirdi ki, bəzi saray əmirləri onun yaxın qohumlarını, xüsusilə oğullarını hakimiyyət əleyhinə intriqalara cəlb edə bilərlər. Buna görə şahzadələrin hərəmxanada qapadılmasını tapşırmış, əmirlərin onlarla ünsiyyət qurmasını qadağan etmişdi.

I Şah Abbas ortaboylu, mütənasib bədən quruluşuna malik idi, saçlarını və saqqalını tam qırxdırırdı, qızılbaş ənənəsinə uyğun uzun və ucları yuxarı burulmuş bığları vardı. Adi vaxtlarda təmtəraqlı geyinməyi xoşlamazdı. Həmsöhbətləri ilə müharibə və silah-sursat mövzusunda həvəslə danışırdı, xüsusilə odlu silahlarla maraqlanırdı. Şah üçün ən gözəl hədiyyə silah idi, bunu nəzərə alan səfirlər ona adətən odlu silah hədiyyə edirdilər.

I Şah Abbas 1628/29-cu illərin qış mövsümünü Mazandaran bölgəsində inşa etdirdiyi Əşrəf şəhərciyində keçirmək üçün İsfahandan yola çıxmış, burada istirahət etmiş və ovla məşğul olmuşdu. Ovdan qayıtdıqdan sonra müvazinətini itirib yıxılan şah bir neçə gün qızdırmalı halda xəstə yatdıqdan sonra 1629-cu il yanvarın 19-da sübh vaxtı dünyasını dəyişmişdi. Onun cənazəsini Kaşan şəhərinə gətirib İmamzadə Həbib ibn Musanın məzarının yanında torpağa tapşırdılar.

Görkəmli maarifpərvər ədib A.A.Bakıxanov "Gülüstani-İrəm" əsərində I Şah Abbasın şəxsiyyətinə bu cür qiymət vermişdir: "Şah Abbas məmləkəti abad etmək və rəiyyətin asayişinə baxmaq işlərində bütün dünyada məşhurdur... Sultanların ləyaqətini onların xüsusi məziyyətlərinə görə təyin edən Avropa tarixçiləri belə bu elmsevər padşaha "Böyük" ləqəbi vermişdilər. O, xalq arasında indi də adil sifəti ilə tanınmaqdadır".

I Şah Abbasın həyatı müasiri olduğu müəlliflər tərəfindən müfəssəl şəkildə qələmə alınmışdır; bu kitablardan ən məşhuru İsgəndər bəy Münşinin *"Tarixi-aləmarayi-Abbasi"* əsəridir.

I Şah Abbas 58 il ömür sürmüş, 40 ildən artıq hakimiyyətdə olmuşdur.

***Həyat yoldaşları:***

I Şah Təhmasibin oğlu *Mustafa Mirzənin* qızı Məhdi-aliyə;

I Şah İsmayılın oğlu *Bəhram Mirzənin* oğlu *Hüseyn Mirzənin* qızı Oğlanpaşa bəyim (bundan əvvəl *Həmzə Mirzənin* xanımı olmuş, onun ölümündən sonra I Şah Abbasa ərə getmişdir);

Luristan hakimi Məhəmməd xan Abbasinin qızı;

Gilan hakimi Xanəhməd xanın qızı, I Şah Təhmasibin qız nəvəsi Yaxşan bəyim;

Marağa hakimi Şeyx Heydər Mokrinin qızı;

Rüstəm xan Dağıstaninin qızı;

Kartli çatı VII Baqratın qızı Fəxri-cahan xanım;

Kartli çarı X Georginin qızı Fatimə sultan bəyim (əsl adı Tinatina);

Kaxeti çatı II Davidin qızı Marta;

Bunlardan əlavə daha bir neçə qeyri-müsəlman (gürcü, çərkəz və s.) kənizi olmuşdur.

Bəzi mənbələrdə şahın böyük şiə alimi *Şeyx Lütfullah Meysinin* qızı ilə evləndiyi yazılsa da, bu məlumat əsassızdır.

***Övladları:***

I Şah Abbasın oğullarının sayı mənbələrdə 5, 6 və ya 7 qeyd edilmişdir. Qızlarının sayı isə 6-dır.

*Məhəmməd Baqir Mirzə* (1615-ci ildə atası tərəfindən edam edilib);

*Həsən Mirzə* (1591-ci ildə iki yaşında ölmüşdür);

*Məhəmməd Mirzə* və *İmamqulu Mirzə* (1629-cu ildə öldürülmüşlər);

*İsmayıl Mirzə* (vəf. 1613).

Bunlardan əlavə, I Şah Abbasın Hüseyn Mirzə və Təhmasib Mirzə adlı oğullarının olması, hər ikisinin kiçik yaşlarında ikən dünyalarını dəyişməsi bəzi mənbələrdə qeyd edilmişdir.

*Şahzadə bəyim* (möhtərəm seyidlərdən Mirzə Möhsün Rezəvi ilə ailə qurmuşdur);

*Zibeydə bəyim* (*qorçubaşı İsa xan Şeyxavəndə* ərə getmişdir);

*Xanağa bəyim* (*"Sultan əl-üləma"* və *"Xəlifə sultan"* ləqəbli Seyid Hüseyn Mərəşi Amulinin həyat yoldaşı idi);

*Həvva bəyim* (*sədr* vəzifəsini daşıyan Mirzə Rəzi Şəhristani ilə ailə qurmuş, birinci ərinin vəfatından sonra onun qardaşı oğlu Mirzə Rəfiəddinə ərə getmişdir);

*Şəhrəbanu bəyim* (anası tərəfdən qohumu olan Mir Hüseyn xan Mazandaraninin oğlu Mir Əbdüləzimlə ailə qurmuşdur);

*Mələknisa (Şahbanu) bəyim* (nüfuzlu seyid ailəsindən olan Mirzə Cəlal Şəhristaninin xanımı idi).

(Övladlarının hər biri haqqında müstəqil məqalə şəklində məlumat verilmişdir).

I Şah Abbasın bəzi oğulları və demək olar ki, bütün nəvələri I Şah Səfinin hakimiyyət müddəti boyunca edam edilmişlər.

***Mənbələr:*** *İsgəndər bəy Münşi. Dünyanı bəzəyən Abbasın tarixi (II kitab, fars dilindən tərcümə edən: Ş.Fərzəliyev); C.Bayramlı, V.Ziifəroğlu. Azərbaycan hökmdarları: Səfəvilər, s.141-152; Cihat Aydoğmuşoğlu. Şah Abbas ve Zamanı (doktora tezi); Səid*



*Qanei. Şah Abbas Səfəvi; Nəsrullah Fəlsəfi. I Şah Abbasın həyatı (3 cilddə); T.Nəcəfli. I Şah Abbasın islahatları (Akademik Tarih ve Düşünce Dergisi, 2022, №9-4), s.1938-1969; Thomas Herbert, Travels in Persia 1627-1629, pp.242-243; A.A.Bakıxanov. Gülüstani-İrəm, s.143-144; Tarixi-Abbasi ya ruzna-meyi-Molla Cəlal (nəşrə hazırlayan: Seyful-lah Vəhidniya), s.206-208; Məhəmməd Möh-sin Mustovfi. Zübdət ət-təvarix (nəşrə hazır-layan: Bəhruz Gudərzi), s.89-103; Roger Savory. Səfəvilər dövrünün İranı (farsca tərcümə: Kambiz Əzizi), s.74-99; Əbülhəsən Qəzvini. Fəvaid əs-Səfəviyyə (nəşrə hazırla-yan: Məryəm Mirəhmədi), s.38-48; Ə.Niku-himmət. Şah Abbasın Məşhədə piyada ziya-rəti ("Vəhid", il: 2, sayı: 9), s.60-65; Türkiye Diyanet Vakfi İslam Ansiklopedisi, I, 17-19; Blow. Shah Abbas, The Ruthless King Who Became an Iranian Legend; Sheila R. Canby. Shah Abbas: The Remaking of Iran; pp.114-138; Н.В.Пигулевская и др. История Ирана с древнейших времен до конца XVIII века, стр.270-278; Р.Б.Рыбаков и др. История Востока: Восток на рубеже средневе-ковья и нового времени XVI-XVIII вв. (в 6 томах), III, 107-115; The Cambridge History of Iran, vol. 6, pp.262-278; The Encyc-lopaedia of Islam, I, 7-8 ("Abbas I"); Christopher Buyers. The Safawi Dynasty, Cenealogy.*

**I ŞAH SƏFİ** (1611-11/12.05.1642) – Səfəvilər dövlətinin sayca altıncı hökmdarı (hakim. 1629-1642). Özündən əvvəl hakimiyyət sürmüş I Şah Abbasın oğul nəvəsi, yəni *I Şah Abbasın* böyük oğlu *Məhəmməd Baqir Mirzənin* (1587-1615) böyük övladıdır. Anası gürcü əsilli *Dilaram sultandır*. 1611-ci ildə Gilanda anadan olmuşdur. Hakimiyyətə gəlməzdən əvvəl Sam Mirzə adını daşımış, taxta şıxarkən Səfəvilər sülaləsinin banisi *Şeyx Səfiəddin Ərdəbilinin*, yaxud daha çox Səfi Mirzə adı ilə tanınan atasının şərəfinə Şah Səfi adını qəbul etmişdir. I Şah Abbas hakimiyyətdə ikən çevriliş edəcəyini düşündüyü oğlu Məhəmməd Baqir Mirzəni edam etmiş, amma sonra çox peşman olmuş, buna görə onun yadigarı Sam Mirzəni vəliəhd elan etmişdi. Lakin Sam Mirzə atasının qətlini bağışlamamış və həmişə ürəyində babasına qarşı kin bəsləmişdi.

I Şah Abbas övladlarının qızılbaş əmirləri ilə ünsiyyət qurmasına maneçilik törətdiyinə görə şahzadələr adətən günlərini hərəmxanada keçirirdilər. I Şah Səfinin də uşaqlıq və gənclik illəri hərəmxanada, qadınların arasında keçmiş, buna görə xasiyyətində müəyyən dəyişikliklər yaranmışdır. Onun qəddar, intriqaçı, oturaq həyata meyilli xarakterini və bəzi pis vərdişlərə alışqanlığını bəzən bununla bağlayırlar.

I Şah Səfi 1629-cu ildə 18 yaşında taxta çıxdı, İsfahanın *Ali qapu* sarayında onun təntənəli tacqoyma mərasimi keçirildi. Onun hakimiyyətə gəlişində *qullarağası Xosrov xanla eşikağasıbaşı Əbülqasim bəy Evoğlunun* xüsusi xidmətləri olmuşdur.

I Şah Səfi tarixə qəddar və daşürəkli şah kimi düşmüşdür. O öz yaxın qohumlarını aradan götürməklə hakimiyyətdə möhkəmlənməyə çalışırdı. 1632-ci ildə guya hərəmxanada şaha qarşı sui-qəsd hazırlandığı və bu planda Səfəvilər soyunun xeyli üzvünün də əli ol-

duğu barədə şayiələr yayıldı. Bu şayiələrə cavab olaraq şahın 40 nəfərə yaxın hərəmi və yaxın qadın qohumu öldürüldü. I Şah Səfi eyni zamanda yeganə qardaşını, iki əmisini və bibisi oğullarını da edam etdirdi. Qəddarlığı və daşürəkliliyi sərhəd tanımayan Şah Səfinin bu addımları Səfəvilər sülaləsinin adına böyük ləkə vurmuşdur.

I Şah Səfi babasının zamanında dövlətdə böyük nüfuz sahibi olmuş baş vəzir və görkəmli din alimi *Sultan əl-üləmanı (Xəlifə sultan)* vəzifədən uzaqlaşdırıb, onun yerinə *Hatəm bəy Ordubadinin* oğlu *Əbu Talib xanı* gətirdi. Lakin Əbu Talib xan 3 ildən sonra edam edildi (I Şah Səfinin şəxsən baş vəziri öldürdüyünü yazırlar). Bundan sonra ölkənin bütün idarəçilik işləri *Saru Tağı* ləqəbli baş vəzirin əlində cəmləşdi. Şah eyş-işrətə aludə olduğu üçün dövlət işlərini Saru Tağıya, hərbi məsələləri isə gürcü mənşəli sipəhsalar *Rüstəm xan Saakadzeyə* həvalə etmişdi. I Şah Səfinin zamanında xeyli nüfuzlu dövlət adamı müxtəlif bəhanələrlə öldürüldü (Fars bölgəsinin hakimi *İmamqulu xan Undiladze*, oğlu Səfiqulu xan və yaxın qohumları, sipəhsalar Zeynal xan Şamlu, qorçubaşılar İsa xan Şeyxavənd və Çıraq xan Zahidi, saraydakı çərkəz qruplaşmasının başçısı qapıqulu Yusif ağa və b).

Şahın qəddarlığı nəticəsində onun hakimiyyət dövrü daha çox yerlərdə şaha qarşı çoxsaylı üsyanların qalxmasıyla yadda qalmışdır. I Şah Səfinin hakimiyyətinin əvvəllərində Gilan bölgəsində bir nəfər özünü Qərib şah və ya Adil şah adlandırıb ətraf bölgələrə yürüşlər etməyə başladı. Bir müddətdən sonra məğlub olan Qərib şah İsfahanın Nəqşicahan meydanında nümayişkaranə şəkildə edam edildi. Qəndəharda moğolların təhriki ilə Şirxanın başladığı üsyan da hakimiyyət qüvvələrinin səyi ilə yatırıldı.

I Şah Abbasın zamanından özünə tərəfdar toplamağa başlamış Rza adlı dərviş getdikcə öz nüfuzunu artırdı. Araz çayını keçərkən boğulduğu deyilən dərviş üç gündən sonra yenidən peyda oldu. O, mistik elmlərlə məşğul olurdu, əvvəlcə özünü İmam Mehdinin (ə) naibi elan etmiş, daha sonra imamlıq iddiasına düşmüşdü. Nöqtəviyyə təriqətinin bəzi ardıcılları da ona qoşuldular. Axırda Dərviş Rzanın tərəfdarları o qədər gücləndilər ki, hətta Qəzvin şəhərini ələ keçirdilər. Burada Dərviş Rza bir ölünü dirildəcəyini iddia etdi. Lakin hökumət qüvvələrinin hücumu nəticəsində onun tərəfdarları dağıdıldı, özü isə öldürüldü (1632).

I Şah Abbasın vəfatından sonra Səfəvilər dövlətinin zəiflədiyini güman edən özbəklər Xorasanı ələ keçirmək üçün fəallıq göstərməyə başladılar. Xivə xanının qardaşı Əbülqazi Xorasanın bəzi şəhərlərini ələ keçirməyə nail oldu. I Şah Səfi *naziri-büyutat* və *tüfəngçiağası* vəzifələrində xidmət edən Zaman bəyi qoşunla Xorasana göndərdi, orada daha artıq sayda döyüşçünü səfərbər etmək üçün ona iri məbləğdə pul da verdi. Ətraf məntəqələrin hakimləri öz tabe-



liklərində olan qüvvələrlə Xorasanda toplaşdılar. Nəsa yaxınlığında baş vermiş döyüşdə qızılbaşlar qalib gəldilər, Əbülqazi xan tələsik Xarəzmə doğru geri çəkildi. Sonralar da ciddi uğur qazana bilməyən özbəklər bütün günahı Əbülqazi xanın üzərinə atıb onu Xorasan hakiminə təslim etdilər (1630). Beləliklə, Xorasan uğrunda özbəklərlə aparılmış müharibənin ilk mərhələsi Səfəvilər üçün uğurla başa çatdı. Sonrakı illərdə Buxara xanlarının da Xorasana hücumlarının qarşısı uğurla alındı, onlar böyük itki verərək geri çəkilməyə məcbur oldular. Özbək qüvvələrinin başçısı Əbdüləziz xanın xəzinəsi qızılbaşların əlinə keçdi və paytaxta göndərildi. Özbəklərlə müharibədə qızılbaşlar keçmiş dövrlərdə olduğu kimi, "boşaldılmış ərazi" və "yandırılmış torpaq" taktikasından uğurla istifadə etmişdilər.

Xorasan probleminin həlli I Şah Səfiyə imkan yaratdı ki, diqqətini osmanlılara qarşı aparılan hərbi əməliyyatlara yönəltsin. I Şah Abbasın vəfatından sonra Osmanlı dövləti də Səfəvilərlə bağlanmış sülh müqaviləsini pozaraq hücuma keçmişdi. IV Sultan Muradın baş vəziri Xosrov paşanın başçılığı altında hərəkət edən qoşun İraq və Kürdüstan ərazisindəki bəzi qalaları ələ keçirdi, amma Bağdadın ay yarımlıq mühasirəsi nəticə vermədi. Osmanlılar Bağdadı ələ keçirə bilmədikləri üçün Hillə şəhərinin yaxınlığında öz mövqelərini möhkəmləndirmək məqsədilə istehkam tikdilər, lakin Səfəvi qoşunu az sonra oranı da tutdu.

İraq torpaqlarını əlində saxlamağa müvəffəq olmuş I Şah Səfi bir müddət müqəddəs Nəcəf və Kərbəla şəhərlərindəki ziyarətgahlarda fəxri xidmətçiliklə məşğul oldu. Nəcəf qalasının möhkəmləndirilməsi yönündə bəzi addımlar atıldı.

Xosrov paşa İraq səfərindən geri qayıdarkən Təbrizi tutmağa səy göstərsə də, qızılbaşların güclü müqaviməti ilə üzləşdi. Osmanlı qoşunu Həmədanı ələ keçirib burada dəhşətli qırğın törətdi. Şəhər əhalisinin böyük hissəsi öldürüldü, hətta ev heyvanlarına da rəhm edilmədi, bir həftə ərzində Həmədanın böyük tikililəri dağıdılıb yerlə yeksan edildi. I Şah Səfi bu məğlubiyyətdə qoşun başçısı Zeynal xan Bəgdilü Şamlunu təqsirkar bilərək edam etdirdi (1630).

Hələ I Şah Abbasın zamanından Ərdəlanda kürd mənşəli Xan Əhməd xan hökm sürürdü, şah hətta öz bacısı, Zərrinkülah ləqəbli Seyyidə bəyimi ona ərə vermişdi. I Şah Səfinin hakimiyyətinin əvvəllərində Xan Əhməd xanla münasibəti yaxşı idi, Xan Əhməd xan xəstələnəndə şah onu müalicə etmək üçün bacarıqlı bir həkim də göndərmişdi. Osmanlı hücumunun əvvəlində kürdlər qızılbaşlarla müttəfiq halda hərbi əməliyyatlarda iştirak edirdilər. Lakin Xan Əhməd xanın osmanlılarla əlbir olması onun Səfəvilərlə münasibətini pozdu. I Şah Səfi *qullarağası Siyavuş bəyi* və Luristan hakimi Şahverdi xan Lurfiylini böyük qoşunla kürdlərin üzərinə yolladı. Xan Əhməd xan müttəfiqlərinin köməyi ilə bir neçə dəfə müqavimət göstərmək istəsə də, hər dəfə

məğlubiyyətə uğradı, axırda xəstələnib öldü (1636/37).
Osmanlı sultanı IV Murad Səfəvilər üzərinə yürüşlərin uğursuzluğu ilə barışmaq istəmir, yeni hücumlar planlayırdı. 1632-33-cü illərdə Van gölü istiqamətində tərəflər yenə qarşı-qarşıya gəldi, döyüşlərdən sonra Osmanlı qoşunu geri çəkildi. 1635-ci ilin martında nəhəng ordu ilə Çuxursəd üzərinə hücum edən sultan *İrəvan* qalasını mühasirəyə aldı. Günlərlə top atəşinə tutulduqdan sonra qala təslim oldu. Çuxursəd bəylərbəyi, Əmirgünə xan Ağcaqoyunlu-Qacarın oğlu *Təhmasibqulu xan* şəhəri osmanlılara təslim etdi.
IV Sultan Murad 1635-ci il sentyabr ayının əvvəllərində Təbrizi də ələ keçirməyə nail oldu. Bundan əvvəl şəhər əhalisi dövlətin nəzarəti altında kənara köçürülmüş, Təbriz tamamilə boşaldılmışdı. Osmanlılar Təbrizi viran etdilər, şəhər kənarındakı qədim Şənbi-Qazan şəhərciyi yerlə yeksan edildi. Lakin qızılbaşlar tərəfindən həyata keçirilmiş "boşaldılmış ərazi" və "yandırılmış torpaq" taktikaları osmanlılara Təbrizdə 3 gündən artıq qalmağa imkan vermədi.
IV Sultan Murad İstanbula qayıtdıqdan sonra İrəvan fəthinin şərəfinə 7 gün şadlıq tədbirləri keçirdi. Lakin cəmi bir ildən sonra qızılbaş qoşunu şəhəri geri aldı. 1636-cı ilin martında İrəvandakı Osmanlı qarnizonunun başçısı Mürtəza paşa öldürüldü və şəhər təslim oldu. Şah əsir düşmüş iki mindən artıq Osmanlı əsgərini birtərəfli qaydada azad etdi.
Səfəvilər dövlətinin özbəklər və osmanlılarla müharibəyə məşğul olduğunu görən moğollar da sərhəd bölgəsində fəallaşmağa başladılar. Mühüm strateji əhəmiyyətə malik Qəndəhar üzərinə təzyiqlər gücləndi. Şahın öz əyanlarına qəddar münasibətini müşahidə edən Qəndəhar hakimi *Əlimərdan xan Zig* növbəti qurbana çevriləcəyindən çəkinərək 1637/38-ci illərdə şəhəri moğollara təslim etdi. Bundan sonra Qəndəharın geri qaytarılması uğrunda 10 ildən artıq davam etmiş çəkişmələr başladı. I Şah Səfi özü də Qəndəharı geri almaq üçün başladığı yürüşün əvvəlində, məntəqəyə çatmadan vəfat etmişdir.
1638-ci ilin sonlarında Sultan IV Muradın başçılıq etdiyi Osmanlı ordusu uzun mühasirədən sonra Bağdadı ələ keçirdi. Şəhər xeyli müqavimət göstərsə də, axırda ərzaq çatışmazlığı öz sözünü dedi və Səfəvi qarnizonu Bağdadı təslim etməyə məcbur oldu. Şəhərin şiə əhalisinin bir hissəsi digər məntəqələrə köçürüldü, onların əvəzinə şəhərə kənardan əhli-sünnə camaatı gətirildi.
1639-cu il may ayının 17-də Səfəvi və Osmanlı dövlətləri arasında müharibənin növbəti mərhələsinə son qoyan *Qəsri-Şirin sülh müqaviləsi* imzalandı. Müqavilənin şərtlərinə görə, Bağdad da daxil olmaqla, İraq torpaqlarının bir hissəsi, Mesxeti bölgəsi Osmanlı dövlətinə, İraqın bir hissəsi, eləcə də İrəvan Səfəvilərə verildi. Son araşdırmalara görə, Azərbaycan dilində tərtib edilmiş Qəsri-Şirin müqaviləsi iki dövlət arasında bağlanmış ən uzunmüddətli saziş sayılır.
Şah I Səfi öz hakimiyyəti dövründə Av-



ropa dövlətlərinin hökmdarları ilə stabil diplomatik münasibətlər saxlamağa çalışmışdır. O, Müqəddəs Roma imperiyasının imperatoru və Macarıstan kralı II Ferdinand, İngiltərə kralı I Karl və digər Avropa monarxları ilə məktublaşır, müxtəlif ixtisaslar üzrə təlimçiləri Səfəvilər dövlətinə göndərmələrini onlardan xahiş edirdi. 1635-ci ildə Avropanın nüfuzlu siyasət və dövlət xadimlərindən olan Holşteyn-Hottorn hersoqu III Fridrix Moskva dövləti və Səfəvilərlə iqtisadi əlaqələr qurmaq məqsədilə nümayəndə heyəti göndərdi. Alman diplomatik korpusu 1637-ci ilin bir neçə ayını Səfəvilər dövlətinin ərazisində keçirdi. Bu heyətə daxil olan Adam Olearinin öz səyahətnaməsində Səfəvilər dövləti, o cümlədən Azərbaycan torpaqları barədə verdiyi məlumatlar böyük əhəmiyyət kəsb edir. I Şah Səfi zamanında Səfəvilər dövlətində olmuş Qərb səyyahı J.B.Tavernyenin xatirələri də diqqətəlayiqdir.

I Şah Səfinin zamanında Səfəvilər dövlətinin inzibati quruluşunda islahatlar həyata keçirildi. Əvvəllər *bəylərbəyliklərin* tərkibində olmuş bəzi ərazilər Saru Tağının məsləhəti ilə xassə mülkə (şahın ixtiyarında olan dövlət torpaqlarına) qatıldı. Bu siyasət mərkəzi hakimiyyətin gücləndirilməsinə yönəlsə də, qızılbaş əmirlərinin yerlərdəki nüfuzuna və hakimiyyətinə güclü zərbə vurdu, onların hökumətdən narazılığını artırdı.

I Şah Səfi dinə o qədər də meyilli deyildi, onun zamanında din alimlərinin səlahiyyəti də çox olmamışdır. Bəzi mənbələrdə şahın hakimiyyətə gəlişindən dərhal sonra şərabxanaların dağıdılması barədə əmr verdiyi qeyd edilsə də, özünün sarayda içki məclisləri təşkil etməsi barədə məlumatlar vardır. I Şah Səfinin zamanında Mirzə Qazı Ərdəkani adlı görkəmli din alimi İsfahan *şeyxülislamı*, Mirzə Rəfiəddin Məhəmməd (Mirzə Rəfia) isə *sədr* vəzifələrini daşımışlar (Mirzə Rəfiadan sonra sədr vəzifəsinə *Mühəqqiq Kərəkinin* nəslindən olan Mirzə Həbibullah Kərəki təyin edildi).

1642-ci ilin Novruz günlərində I Şah Səfi Qəndəharı geri almaq və Xorasanda sabitlik yaratmaq məqsədilə hərbi yürüşə çıxdı. Həmin ilin aprelində o, Kaşan şəhərinə çatdı. Burada düşərgə qurub bir neçə gün qaldıqdan sonra birdən-birə şahın halı pozuldu. Getdikcə hərarəti yüksələn I Şah Səfi may ayının 11-də və ya 12-də dünyasını dəyişdi. Bəzi məlumatlara görə, onun dəqiq dəfn yeri məlum deyildir. Qərb səyyahı Şardenin də təsdiq etdiyi kimi, Səfəvi hökmdarları vəfat etdikdən sonra ənənə üzrə bir neçə tabut hazırlanıb eyni təntənə ilə müxtəlif istiqamətlərdə göndərilir və fərqli məkanlarda torpağa tapşırılırdı. *"Qisəsi-xaqani"* kitabının müəllifi Vəliqulu xan Şamlu da I Şah Səfiyə aid edilən 3 tabutun Nəcəf, Məşhəd və Qum istiqamətlərində göndərildiyini, həqiqi məzarın, böyük ehtimalla, Qumda yerləşdiyini yazmışdır. I Şah Səfinin Qumda dəfn edilməsi dəqiqdirsə, bu müqəddəs şəhərdə torpağa tapşırılmış ilk Səfəvi şahı hesab edilir.

I Şah Səfi təqribən 31 il yaşamış, 13 il 4

aya yaxın hakimiyyətdə olmuşdur.

***Həyat yoldaşları:***
*Ana xanım* – çərkəz əsillidir, II Şah Abbasın anasıdır,
Gürcü şahzadəsi Mənuçöhr xan Dadiyaninin qızı,
Şahzadə Tinatin – Kaxeti çarı I Teymurazın qızı.
Digər həyat yoldaşları haqqında məlumat yox dərəcəsindədir.

***Övladları:***
Abbas Mirzə (1632-ci ilin avqustunda doğulmaq etibarilə böyük oğul olmuş, lakin atasının sağlığında vəfat etmişdir),
Məhəmməd Mirzə (gələcək *II Şah Abbas*),
Təhmasib Mirzə, Bəhram Mirzə, Heydər Mirzə və İsmayıl Mirzə.
*Məryəm bəyim* (1640-1720, II Şah Abbasın doğma bacısı, Şah Sultan Hüseynin zamanında sarayda böyük nüfuz sahibi olmuşdur),
Fəxrünnisa və ya Şahzadə bəyim (Xorasanın nüfuzlu seyidlərindən olan Mirzə Əbu Taliblə ailə qurmuşdur).

***Mənbələr:*** *C.Bayramlı, V.Zifəroğlu. Azərbaycan hökmdarları: Səfəvilər, s.163-170; Həmidrza Səfakiş. Səfəvilər tarix boyunca, s.104-111; Seyid Həsən ibn Mürtəza Hüseyni Astarabadi. Tarixi-sultani, s.235-261; Əbülhəsən Qəzvini. Fəvaid əs-Səfəviyyə (nəşrə hazırlayan: Məryəm Mirəhmədi), s.48-61; Məhəmməd Möhsin Mustovfi. Zübdət əttəvarix (nəşrə hazırlayan: Bəhruz Gudərzi), s.105-110; Mirzə Məhəmməd Məsum. Tarixisəlatini-Səfəviyyə (nəşrə hazırlayan: Seyid Əmir Həsən Abidi), s.25-27; Vəliqulu bəy Şamlu. Qisəs əl-xaqani (nəşrə hazırlayan: S.H.Sadat Nasiri), s.207-266; İsgəndər bəy Münşi. Zeyli-Tarixi-aləmarayi-Abbasi (nəşrə hazırlayan: Süheyli Xansari); Christopher Buyers. The Safawi Dynasty, Cenealogy.*



**II ŞAH ABBAS** (31.08.1632-26.10.1666) – Səfəvilər dövlətinin sayca yeddinci hökmdarı (hakim. 1642-66). Atası *I Şah Səfi*, anası çərkəz əsilli *Ana xanımdır*. Əsl adı Məhəmməd Mirzədir. I Şah Səfinin böyük oğlu Abbas Mirzə hələ atasının sağlığında vəfat etdiyi üçün ondan cəmi bir neçə ay kiçik olan Məhəmməd Mirzə vəliəhd kimi tanınmışdır. Uşaqlıq dövrü hərəmxanada keçmiş, ilk təlim-tərbiyəsini böyük filosof *Rəcəbəli Təbrizidən* almışdır.
10 yaşına çatmadan II Şah Abbas adı ilə taxta çıxmış Məhəmməd Mirzənin tacqoyma mərasimi Kaşan şəhərində keçirilmişdir, cülus (taxta çıxma) tarixini (hicri təqvimlə 1052-ci il) "zilli-məbud" (Allahın kölgəsi) kəlməsi ilə ifadə etmişlər. Dövlət idarəçiliyi, faktiki olaraq, baş vəzir *Saru Tağının* əlində cəmləşmiş, şah bir müddət onun güclü təsiri altında olmuşdur. Taxta çıxdıqdan sonra şah Qəzvində qalmağa üstünlük vermişdi, burada o, təhsillə və fiziki çalışmalarla məşğul idi.
1643-cü ildə özbəklərə qarşı növbəti yürüşdən qayıdan sipəhsalar *Rüstəm xan Saakadzenin* hakimiyyət əleyhinə çıxması və dövlət çevrilişi hazırlaması barədə şayiələr yayıldı. Saru Tağının təhriki ilə Rüstəm xan paytaxta çatmadan Məşhəddə öldürüldü. Növbəti il Bəxtiyari tayfaları şaha qarşı üsyan qaldırsa-



lar da, Saru Tağı üsyanı yatırmağa nail oldu.

Şahbanu Ana xanımla ortaq maliyyə maraqları olan Saru Tağı 1645-ci ildə sui-qəsd nəticəsində öldürüldükdən sonra baş vəzirlik mənsəbi bundan əvvəl də I Şah Abbas və I Şah Səfi zamanlarında həmin vəzifəni icra etmiş *Xəlifə sultana (Sultan əl-üləma)* verildi (vəf. 1654).

II Şah Abbas ölkəni iqtisadi böhrandan qurtarmaq üçün bəzi maliyyə islahatları həyata keçirməyə səy göstərmişdir. Bu məqsədlə sarayda böyük nüfuzu sahibi olan qeyri-türk mənşəli *əmirşikarbaşı* (sonralar *qullarağası)* Allahverdi xanın zəmanəti ilə qulam təbəqəsinə mənsub Məhəmməd bəy əvvəlcə *naziri-büyutat* və *müəyyir əl-məmalik*, daha sonra isə (1654-cü ildə Xəlifə sultanın vəfatından sonra) baş vəzir vəzifəsinə gətirildi. Lakin Məhəmməd bəy ölkədəki iqtisadi böhranı həll edə bilmədi. Gümüş defisiti, əsasən erməni tacirlərindən ibarət olan Yeni Culfa şəhərciyinin əvvəlki iqtisadi gücünün zəifləməsi islahatların uğurla nəticələnməsinə mane oldu. Yerli hakimlərin ixtiyarında olan Həmədan, Ərdəbil, Simnan, Kirman kimi mülklərin ləğv edilərək xassə (dövlət) torpaqlarına qatılması da problemi həll edə bilmədi. 1661-ci ildə məşhur Kərəkilər nəslindən *sədr* vəzifəsində xidmət edən Mirzə Həbibullah Kərəkinin oğlu Mirzə Məhəmməd Mehdi Kərəki baş vəzir təyin edildi. O, *I Şah Süleymanın* hakimiyyəti dövründə də bir müddət bu vəzifəni daşımışdır.

Atasından fərqli olaraq, II Şah Abbas dövlət işlərinə daha çox maraq göstərir, ciddi və mülayim davranmağa, ölkəni ədalət və ağılla idarə etməyə çalışırdı. Onun şərab içməyi qadağan edən fərman imzaladığı salnamələrdə öz əksini tapmışdır. II Şah Abbas saray əyanları və əmirlərə münasibətdə sərt, əhaliyə münasibətdə isə mülayim mövqe sərgiləmişdir. Hakimiyyətə keçdikdən sonra verdiyi bir fərmanla xəzinəyə ödənməli olan 500 min tümən məbləğində vergiləri bağışlamışdır. Həmin dövr üçün hədsiz dərəcədə böyük məbləğ olduğuna görə tədqiqatçılar bunu şişirdilmiş rəqəm hesab edirlər.

II Şah Abbasın zamanında xalqın şikayətlərinə baxılan məhkəmə məclisləri təşkil edilir, həftənin müəyyən günlərində şah şəxsən bu məclislərə qatılırdı. Mənbələrdə yazılır ki, sadə insanlar at belində şəhəri gəzən şaha yaxınlaşıb öz xahiş məktublarını ona təqdim etmək ixtiyarına sahib idilər.

II Şah Abbasın zamanında Səfəvi–Osmanlı münasibətlərində nisbi sabitlik yaranmışdı. Eyni zamanda, Osmanlı dövlətinin Cənubi Qafqaz bölgəsinə 130 ildən artıq davam edən yürüşlərinin dayandırılmasına nail olmaq üçün II Şah Abbas Səfəvi dövlətinin qərb hüdudları boyunca Osmanlı qoşunlarına qarşı silahlı üsyan qaldıran əhaliyə yardım etmiş, Osmanlı qoşunlarının başını qatan və ciddi çətinliklər yaşadan partizan hərəkatına hərbi-siyasi və maddi-mənəvi dəstək vermişdir.

II Şah Abbas zamanında Gürcüstanda irimiqyaslı hərbi əməliyyatlar həyata

keçirilmiş, bölgədə Səfəvi nüfuzu bərpa edilmişdir. 1648-ci ildə Kartli çarı, Səfəvilərin vassalı Rüstəm xan Baqrationi Kaxeti çarı I Teymurazı qovaraq onun yerini tutdu, Kartli və Kaxeti çarlıqları birləşdirildi. Onun ölümündən (1658) sonra Şahnəvaz xan ləqəbli V Vaxtanq hakimiyyətə keçdi. 1660-cı ildə gürcü feodalları öz qüvvələrini birləşdirərək Baxtrion və Allahverdi qalalarını ələ keçirib müsəlmanlara divan tutdular. Bundan xəbər tutan II Şah Abbas Şahnəvaz xandan cinayətkarları cəzalandırmasını tələb etdi. 1662-ci ilin sentyabrında II Şah Abbasdan aman diləməyə gedən bəzi üsyançı gürcü feodalları Şahnəvaz xan tərəfindən ələ keçirilərək edam olundular. Lakin az sonra Şahnəvaz xan 1639-cu il Səfəvi-Osmanlı sülh müqaviləsinin şərtlərini pozaraq, osmanlıların təsir dairəsində olan Meqreliyaya öz oğlu II Arçili hakim təyin etdi. Osmanlı sultanı şahdan öz canişininin müqaviləyə zidd hərəkətlərinə son qoymasını tələb etdi. Nəticədə II Arçil Meqreliyadan geri çağırıldı, II Şah Abbasın təkidi ilə o, İslamı qəbul edib Şahnəzər ismi ilə Kaxetiyə hakim göndərildi.

II Şah Abbasın zamanında özbəklərlə sərhəd bölgəsində çəkişmələr baş versə də, bunlar dövlətin sabitliyini poza biləcək həddə olmamışdır. Şah özbəklərlə, o cümlədən dövlətin şimal sərhədlərini hədələyən Dağıstan xalqları ilə sülh və barışıq dilində danışmağa üstünlük verir, hətta onlara iri məbləğdə pul və bahalı hədiyyələr göndərməklə hücumların qarşısını almağa nail olurdu.

II Şah Abbasın zamanında Səfəvilər dövlətinin şimal-qərb sərhədlərində Rusiya ilə toqquşmalar baş vermiş və Rusiyanın bu bölgədə öz nüfuzunu artırmaq cəhdlərinin qarşısı alınmışdır. Belə ki, 1650-ci illərin əvvəllərində Rusiya Şimali Qafqazda strateji əhəmiyyət daşıyan istehkam qalaları tikməyə başladı, amma Şirvan bəylərbəyi Xosrov xanın təşəbbüsü ilə təşkil edilən Səfəvi qoşun birləşmələri rusların əsas istinad nöqtələrindən olan Sunja qalasını ələ keçirib dağıtdı (1653). Az sonra Qəndəhar ətrafında *Böyük Moğol imperiyası* ilə gərginlik başladığı üçün II Şah Abbas Qafqazdakı hərbi əməliyyatları tam möhkəmlədə bilmədi və 1654-cü ildə Fərəhabadda Rusiya ilə saziş bağlamaqla kifayətləndi.

II Şah Abbasın ən böyük xidmətlərindən biri Səfəvi-Moğol sərhəd bölgəsində yerləşən strateji əhəmiyyətli Qəndəhar qalasını geri alması olmuşdur. Qəndəhar hələ I Şah Səfinin zamanında *Əlimərdan bəy Zig* tərəfindən moğollara təhvil verilmişdi. II Şah Abbas 1648-ci ildə 40 min nəfərlik qoşunla bölgəyə hücum edib mühasirədən sonra 1649-cu ilin fevralında qalanı ələ keçirdi. Gürcü mənşəli Mehrab xan Qəndəharın yeni valisi təyin edildi. Bir müddətdən sonra moğol hökmdarı Şah Cahan öz oğlu Övrəngzibi 50 min nəfərlik qoşunla Qəndəhar üzərinə yolladı. Moğollar şəhəri mühasirəyə aldılar, lakin bu arada qızılbaşların və özbəklərin müttəfiq qoşunu onları geri oturtdu. Beləliklə, Qən-



dəhar şəhəri Səfəvilər dövlətinin süqutunadək bu dövlətin tərkibində qaldı.

II Şah Abbas Avropa ölkələri ilə dostluq münasibətləri saxlamağa çalışır, onların ticari və hərbi əməkdaşlıq təkliflərini diqqətlə araşdıraraq dəyərləndirirdi. XVII əsrin ortalarında Səfəvilər dövləti Rusiya, Fransa, Hollandiya və digər ölkələrlə diplomatik əlaqələr saxlayırdı. Səfəvi dövlətinin şimal sərhədləri yaxınlığında, Terek çayı sahilində Rusiyanın istehkamlar tikdirməsi iki ölkənin münasibətlərində bir müddət gərginlik yaratsa da, 1653-cü ildə çar Aleksey Mixayloviçin göndərdiyi 800 nəfərlik elçi heyəti ticarət əlaqələrini qurmağa başladı. Danışıqlar çətinliklə də olsa irəlilədi, Səfəvilər dövləti ərazisində rus tacirləri üçün yer icarəsi haqqı ləğv edildi, Şamaxıda onlardan ötrü daimi nümayəndəlik açıldı.

II Şah Abbasın zamanında Səfəvilər dövlətinə səfər etmiş J.Şarden, J.B.Tavernye və b. ölkədəki siyasi-iqtisadi, elmi-mədəni vəziyyət barədə dəyərli məlumatlar vermişlər.

II Şah Abbas həm də tarixdə ən tolerant Səfəvi hökmdarlarından biri kimi qalmışdır. Onun zamanında dövlətin qeyri-müsəlman tacirlərdən asılılığı xeyli azaldılsa da, dini zəmində azadlıqlar yüksək şəkildə təmin edilmişdir. Ölkə ərazisində hətta Avropa dövlətlərinin dini missiyaları azad halda fəaliyyət göstərirdi. Katolik dininə mənsub olan karmelitlər ordeni təkcə xristian təbəələrin dini ehtiyaclarını ödəməklə məşğul olmur, həm də xristian təbliğatı aparırdı. Bəzi məlumatlara görə, onlar xalq arasında hökm sürən xurafat və mövhumatdan istifadə edərək müalicə adı altında yüzlərlə müsəlman uşağı xaç suyuna çəkməyə nail olmuşdular.

Bəzi mənbələrdə II Şah Abbasın xariqüladə dərəcədə fiziki gücə malik olması və təhlükədən qorxmaması barədə rəvayətlər mövcuddur. Moğol elçisi Tərbiyət xan şahın qəbulunda olarkən otağa gətirilmiş bir aslan zəncirdən çıxaraq şaha hücum etmiş, lakin II Şah Abbas yalın əllə aslanı öldürmüşdü.

II Şah Abbas tikinti və abadlıq işlərinə meyilli idi, onun hakimiyyəti illərində Səfəvilər dövləti ərazisində bəzi mühüm tikintilər həyata keçirilmişdir. İsfahandakı məşhur *Çehelsütun sarayının* inşasına I Şah Abbasın zamanında başlanılsa da, bu gözəl memarlıq abidəsindəki əsas işlər II Şah Abbasın dövründə həyata keçirilmiş və tikinti 1647-ci ildə tamamlanmışdır. İsfahanın girişlərindən hesab olunan Zayəndərud çayı üzərindəki Xacu körpüsü də II Şah Abbas dövrünün yadigarıdır.

Qızılbaş ordusunun hərbi gücünü artırmağa yönəlmiş bəzi islahatlar da onun adı ilə bağlıdır. II Şah Abbasın qızılbaş qoşunu üçün xüsusi geyim (çəpkən) tətbiq etməsi tarix kitablarında qeyd olunmuşdur.

A.A.Bakıxanov "Gülüstani-İrəm" kitabında II Şah Abbası bu cür xarakterizə etmişdir: "Cəlallı və sərvətli bir padişah olub səltənət işlərini qurmağı da yaxşı bacarırdı. Onun şairlik təbi də var idi". Şah "Sani" təxəllüsü ilə şeir yazırdı,

"Təzkireyi-Nəsrabadi" onun türk və fars dillərində mənalı şeirlər yazmaqda qüdrət sahibi olduğunu xəbər verir.
II Şah Abbas elm və sənətə yüksək dəyər verir, alimlərlə ünsiyyəti xoşlayırdı. Məşhur xəttat Mirzə Şəfia (şahın şərəfinə "Abbasi" təxəllüsünü qəbul etmişdi), *Məhəmməd Zaman, Müin Müsəvvir* və digər nəqqaşlar onun himayəsi altında sarayda fəaliyyət göstərmişlər. Şah öz ana dili olan Azərbaycan dilinə böyük ehtiram bəsləyirdi. Dərviş Mustafa adlı şəxs Osmanlı Türkiyəsinə qayıtdığı zaman onun təhlükəsizliyi üçün Şirvan bəylərbəyi Mənuçöhr xana ünvanlanmış amannaməni şah Azərbaycan dilində yazdırmışdı.
II Şah Abbas 1666-cı il oktyabrın 26-da 34 yaşında ikən Mazandaranda I Şah Abbasın inşa etdirdiyi Əşrəf şəhərciyində dincələrkən vəfat etmişdir. Onu sağlığında Qum şəhərində özü üçün tikdirdiyi məqbərədə dəfn etmişlər. Bəzi şayiələrə görə, məzarı Məşhəd şəhərindədir.

***Həyat yoldaşları:***
Çərkəz əsilli *Nəkihət xanım* (vəf. 1680, I Şah Süleymanın anası),
Gürcü əsilli Kaxeti şahzadəsi Nurənnisa xanım (Həmzə Mirzənin anası),
Kartli çarı V Vaxtanqın (Şahnəvaz xan) qızı Anna (Anuka).

***Övladları:***
II Şah Abbasın 3 oğlu və 2 qızı olduğu məlumdur. Böyük oğlu Sam Mirzə atasından sonra *I Şah Süleyman* və ya II Şah Səfi adı ilə hakimiyyət sürmüşdür. Həmzə Mirzə və İsmayıl Mirzə adlı oğullarının, eləcə də iki qızının taleyi haqqında məlumat yox dərəcəsindədir.

***Mənbələr:*** *C.Bayramlı, V.Zifəroğlu. Azərbaycan hökmdarları: Səfəvilər, s.177-182; Həmidrza Səfakiş. Səfəvilər tarix boyunca, s.111-113; Əbülhəsən Qəzvini. Fəvaid əs-Səfəviyyə (nəşrə hazırlayan: Məryəm Mirəhmədi), s.61-75; Məhəmməd Möhsin Mustovfi. Zübdət ət-təvarix (nəşrə hazırlayan: Bəhruz Gudərzi), s.111-112; Mirzə Məhəmməd Məsum. Tarixi-səlatini-Səfəviyyə (nəşrə hazırlayan: Seyid Əmir Həsən Abidi), s.28-30; S.Ə.R.Xizri və Ə.Fuladipənah. Səfəvilər dövründə İranda karmelitlər ordeninin fəaliyyəti ("Mütaliati-tarixi-İslam" dərgisi, 1390 h.-ş., №11), s.7-27; A.A.Bakıxanov. Gülüstani-İrəm, s.145; Vəliqulu bət Şamlu. Qisəs əl-xaqani (nəşrə hazırlayan: S.H.Sadat Nasiri), s.266-524; Təzkireyi-Nəsrabadi, s.9-10; Sussan Babaie and etc. Slaves of The Shah: New Elites of Safavid Iran, pp.71-72; П.Х.Гребельский и С.В.Думин. Дворянские роды Российской империи, III, 42; Paul Luft. II Şah Abbas dövründə İran (farsca tərcümə: K.Cahandari); Christopher Buyers. The Safawi Dynasty, Cenealogy.*

**I ŞAH SÜLEYMAN** (1648-29.07.1694) – Səfəvilər dövlətinin səkkizinci hökmdarı (hakim. 1666-94). Atası Səfəvi hökmdarı *II Şah Abbas*, anası çərkəz əsilli şahbanu *Nəkihət xatundur*. Uşaqlıq və yeniyetməlik dövründə Sam Mirzə adını daşımışdır. Atası II Şah Abbas ölərkən öz yerinə heç kimi təyin etməmiş, yalnız hər il şəxsi əmlakından on iki gümüş şamdan və iki qızıl qab miqdarında (təqribən min tümən dəyərində) ayrılaraq Məşhəddəki İmam Rza (ə)



ziyarətgahına hədiyyə olunmasını vəsiyyət etmişdi.

II Şah Abbasın Sam Mirzədən əlavə Həmzə Mirzə, İsmayıl Mirzə və Fərrux Mirzə adlı digər oğullarının da olduğu məlumdur. Şahın vəfatından sonra oğullarından ikisinin – yaşca ən böyük olan 18 yaşlı Sam Mirzənin və 7 yaşlı Həmzə Mirzənin hakimiyyətə gətirilməsi uğrunda rəqabət başladı. Damğanda saray əyanlarının iştirakı ilə toplanmış şurada əvvəlcə II Şah Abbasın gürcü əsilli Nurənnisa bəyimdən doğulmuş oğlu Həmzə Mirzəni taxta çıxarmağa təşəbbüs olundu. Lakin Nəkihət xatunun səyləri ilə baş vəzir etimad əd-dövlə Mirzə Mehdi şurada bildirdi ki, şahlıq böyük oğulun haqqıdır. Sam Mirzə uzun illər sarayda böyüsə də, II Şah Abbasın hakimiyyətinin sonuna yaxın atasının gözündən düşmüşdü.

1666-cı il noyabrın əvvəlində Sam Mirzə II Şah Səfi adı ilə taxta çıxdı. Lakin az sonra o, bir ildən çox davam edən ağır xəstəliyə tutuldu. Üstəlik Səfəvilər dövlətində siyasi-iqtisadi vəziyyət pisləşdi, bəzi şəhərlərdə taun epidemiyası yayıldı. Azərbaycanın bəzi bölgələrində 80 min nəfərin həyatına son qoymuş zəlzələ baş verdi. Rus kazaklarının soyğunçu dəstələri Xəzər dənizinin sahilboyu məntəqələrini qarət etdi. Belə bir şəraitdə sarayın baş münəccimi və bəzi əmirlər şahın birinci tacqoyma mərasiminin uğursuz (nəhs) zamanda baş verdiyini bildirərək ikinci dəfə tacqoyma mərasimi keçirməyin zəruri olduğunu söylədilər. 1668-ci ilin Novruz bayramı günündə İsfahanın *Çehelsütun sarayında* yenidən tacqoyma mərasimi keçirildi, bu dəfə hökmdar özünə Süleyman adını götürərək Şah Süleyman kimi taxta çıxdı. Pul sikkələrinin və möhürlərin üzərindəki adlar qısa müddətdə təcili surətdə dəyişdirildi. Bundan sonra həm şahın səhhəti, həm də ölkədəki vəziyyət yaxşılaşmağa doğru üz tutdu.

Təəssüf ki, I Şah Süleyman Səfəvinin hakimiyyət dövrü barədə mənbələrdəki məlumatlar digər şahlar haqqındakı xəbərlərlə müqayisədə xeyli azdır. I Şah Süleymanın 28 illik hakimiyyət dövrü hətta II Şah Abbasın hökmdarlıq müddətindən də sakit keçmişdir. Bu dövrdə Səfəvi-Osmanlı sərhədlərində sülh bərqərar olmuş, tərəflər arasında hələ I Şah Səfi zamanında imzalanmış müqavilə öz qüvvəsində qalmışdır. Avropa səfirlərinin Səfəvi dövlətini osmanlıların əleyhinə qaldırmaq cəhdləri baş vəzir *Şeyxəli xan Zəngənənin* uzaqgörən siyasəti nəticəsində iflasa uğramışdır. İki dövlət arasında kiçikmiqyaslı bəzi münaqişələr baş versə də, Osmanlı dövləti Avropadakı hərbi əməliyyatlarla məşğul olduğu, I Şah Süleyman da döyüşə meyilli olmadığı üçün bu toqquşmalar müharibə həddinə çatmamışdır.

1678-ci ildə Süleymaniyyə şəhərinin qurucusu Süleyman Baban Osmanlı qoşunu ilə Kürdüstan vilayətinə yürüş etdikdə I Şah Süleyman sərkərdə Rüstəm xanın başçılığı altında həmin bölgəyə qoşun yeritdi. Qızılbaş ordusu kürdlərlə döyüşə girib onları darmadağın etdi, savaşda Baban öldürüldü. Lakin bu hadisə

Səfəvi-Osmanlı münasibətlərinə ciddi mənfi təsir göstərmədi.

1690-cı ildə Osmanlı sultanı II Əhmədin taxta çıxması münasibətilə Şah Süleyman İstanbula qiymətli hədiyyələrlə nümayəndə heyəti göndərdi. Xorasan və Mavəraünnəhr bölgələrində də bu dövrdə nisbi sakitlik hökm sürürdü. I Şah Süleyman Səfəvinin hakimiyyət müddətində diqqət çəkən hadisələrdən biri Stepan Razinin başçılığı altında rus kazaklarının Səfəvilər dövlətinin şimal ərazilərinə talançı hücumları oldu. Bu yürüşlər II Şah Abbasın hakimiyyətinin son illərindən başlamışdı. Kazaklar Xəzərsahili bölgələrdə qarət törətdikdən sonra Səfəvi qoşunundan güclü zərbə alaraq şimala doğru geri çəkildilər, bununla belə, 1669-cu ildə baş vermiş dəniz döyüşündə şahın göndərdiyi gəmiləri məhv etməyi bacardılar. Lakin Stepan Razin eyni zamanda Rusiya dövlətçiliyinə qarşı da üsyankar mövqedə olduğuna görə hakimiyyət qüvvələri ilə döyüşdə məğlub olaraq əsir alındı və 1671-ci ildə Moskvada edam edildi.

Səfəvi sarayının daha bir çətinliyi bu dövrdə Astarabad və ətraf bölgələrə hücumlar təşkil edən türkmənlərlə bağlı idi. 1676-cı ildə qızılbaş ordusu onları ölkə sərhədlərindən qovub çıxara bildi. I Şah Süleyman Səfəvinin dövründə Avropa ölkələri ilə ticarət əlaqələri genişlənmiş, bəzi Avropa ölkələri Səfəvilər dövlətindən ticarət sahəsində imtiyazlar əldə etməyə səy göstərmişdir. Hollandlar və ingilislər bu sahədə digərlərindən daha irəlidə idilər, onlardan sonra almanlar və fransızlar gəlirdi. Roma papası XI İnnokenti I Şah Süleyman Səfəviyə yazdığı məktubda ona Avropa ölkələri ilə bir cəbhədə osmanlılara qarşı birləşməyi təklif etmişdi. Amma şah Roma papasının bu təklifindən boyun qaçıraraq cavab məktubunda belə yazmışdı: "Bizim sülaləmiz uzun müddətdir həmin diyarın hökmdarları ilə sülh içində yaşayır və bu müddət ərzində onlar tərəfindən razılaşmaya zidd bir addım atılmamışdır, siz deyən addımı atmaq isə Allahın və peyğəmbərimizin buyurduqlarına ziddir".

Ümumilikdə I Şah Süleymanın xarakteri və şəxsi davranışları barədə məlumatlar onun ikili təbiətə malik olduğu qənaətini yaradır. Bəzi tarixi mənbələr onu içkiyə, əyləncəyə və ova, gecə məclislərinə və qadınlara meyil göstərən, vaxtını və xəzinəni bunlara sərf edən bir şəxs kimi xarakterizə edir. Onların yazdığına görə, şah vaxtının çox hissəsini Yeni Culfadan bir qədər aralıda yerləşən, özünün tikdirdiyi Təxti-Süleyman adlı məkanda keçirirdi. Şahın hərəmxanasına ardıcıl olaraq yeni kənizlər gətirilirdi. Xəzinə boşaldıqdan sonra şah tədricən xəsisləşmiş, maaşları kəsərək büdcəyə qənaət etmək üçün *şeyxülislam, mehtər* və *eşikağasıbaşı* kimi vəzifələrə bir müddət heç kimi təyin etməmişdi. Tarixi mənbələrdə I Şah Süleymanın qəddarlığa meyilli olması barədə də məlumatlar var.

Bununla belə, I Şah Süleyman Səfəvi din alimlərinə, *vəqf* idarələri və məscidlərə, əzadarlıq mərasimlərinə, dini ki-



tablara böyük diqqət yetirirdi. Din xadimlərinə hörmətlə yanaşan şahın zamanında mədrəsələr tam ciddiyyətlə fəaliyyət göstərmişdir. Alimlərin bir çoxu öz yazdığı əsəri şaha təqdim edirdi, bəzən şah özü hansısa əsərin yazılmasına, yaxud tərcümə edilməsinə göstəriş verirdi. I Şah Süleyman dini bayramlara diqqətlə yanaşır, təmtəraqla qeyd olunan Qurban bayramını əhali ilə birlikdə keçirməyə üstünlük verirdi. Ramazan ayında oruc tutmaqdan, ibadət etməkdən qalmır, bəzən geyimini dəyişərək tanınmaz halda gün çıxmazdan əvvəl məscidə gedirdi.

Səfəvilər dövlətində xristianlığın təbliği rəvac tapmasa da, İsfahandakı missionerlərin fəaliyyəti şiə üləmasına xristianlıq barədə daha çox məlumat əldə etmək imkanı verdi. Rafael Duman adlı fransız rahib Azərbaycanda 40 ildən artıq yaşayaraq, kapusin təriqətinin başçısı kimi xristianlığın təbliği ilə məşğul olmuşdur. O, eyni zamanda riyaziyyat və astronomik cihazlarla da maraqlanırdı. I Şah Süleymanın hakimiyyəti dövründə Səfəvilər dövlətinə səfər etmiş Avropa səyyahları Jan Şarden, Engelbert Kempfer, Sanson və başqalarının xatirələrində çox mühüm tarixi qeydlərə rast gəlmək mümkündür.

I Şah Səfinin və II Şah Abbasın dövrlərində geniş vüsət almış tikinti işləri I Şah Süleymanın zamanında da davam etdirilmişdir. Bu dövrdə məmləkətdə xeyli imarət, saray, məscid, mədrəsə və karvansara binası, o cümlədən tanınmış filosof və alimlərin qəbirləri üzərində məqbərələr tikilmişdir. 1673-cü ildə Xorasan bölgəsində baş vermiş zəlzələ zamanı İmam Rza (ə) hərəminin günbəzi zədələnmiş və I Şah Süleymanın göstərişi ilə burada əsaslı bərpa işləri aparılmışdı.

I Şah Süleymanın bibisi *Məryəm xanım* onun üzərində güclü nüfuza sahib idi.

*"Bihar əl-ənvar"* adlı irihəcmli hədis toplusunun müəllifi *Əllamə Məclisinin* (vəf. 1699/1700), eləcə də *Mühəqqiq Səbzəvari* və *Ağa Hüseyn Xansari* kimi böyük cəfəri fəqihlərinin elmi və dini-siyasi (*şeyxülislam* vəzifəsində) fəaliyyətinin bir hissəsi I Şah Süleymanın hakimiyyəti dövrünə təsadüf etmişdir.

I Şah Süleyman Səfəvi ömrünün son 7 ilində ağır podaqra xəstəliyi üzündən hərəmxanaya çəkilərək dövlət işlərində fəal iştirakdan imtina etmişdir. Hamı şahın qəzəbindən qorxduğuna görə o öldükdən sonra 3 gün ərzində heç kim cəsədinə yaxınlaşmağa cəsarət etmirdi. Şah 1694-cü il iyul ayının 29-da İsfahanda dünyasını dəyişmiş, müqəddəs Qum şəhərində həzrət Məsumə xanımın (ə) hərəmində dəfn edilmişdir.

Görkəmli maarifçi A.A.Bakıxanov "Gülüstani-İrəm" əsərində I Şah Süleyman barədə yazırdı: "Bütün tarixçilərin yazdığına görə, Şah Süleyman ədalətli və ciddi, hökmdarlıq işlərində mahir, elmi sevən, şəriətə meyilli və qonşu sultanlar ilə dostluq mərasimini gözləyən bir padşah idi. Ömrünün axırlarında şiddətli ayaq ağrısından yeddi il yataqda yatıb, hicri 1105-ci (miladi 1694) ildə vəfat etdi".

Şah Süleyman 46 il yaşamış, təqribən 28 il hakimiyyət sürmüşdür.

***Həyat yoldaşı:***
Gürcüstanın Yuxarı Kartli bölgəsində hökm sürmüş Samtsxe atabəyliyinin hakiminin qızı *Yelena xanım* (*Şah Sultan Hüseynin* anası).

***Övladları:***
Sultan Hüseyn Mirzə (gələcək *Şah Sultan Hüseyn*, 1668-1726).
Səfi Mirzə. Gənc yaşlarında ox atmaqla məşğul olmuş, bir gün öz bacarığını atasına göstərmək qərarına gəlmişdi. Bu məqsədlə qəfildən atasının ayağındakı başmağı nişan alaraq ox atmış və ox düz hədəfə dəymişdi. Şah Süleyman ayağındakı başmağın oxla vurulmasını özünə qarşı sui-qəsd cəhdi kimi qəbul edərək Səfi Mirzənin edamını əmr etmişdi.
Şah Süleymanın Abbas Mirzə, Mürtəza Mirzə, Mustafa Mirzə, Həmzə Mirzə, İbrahim Mirzə və Əhməd Mirzə adlı oğulları İsfahanın əfqanlar tərəfindən işğalından sonra 1725-ci ildə qətlə yetirilmişlər.
Qızı Şəhrəbanu bəyim (vəf. 1742) Mərəşi seyidlərindən olan Mirzə Məhəmməd Davudla ailə qurmuş və bu izdivacdan gələcəkdə özünü Səfəvilər taxtının varisi elan etmiş *Əhməd şahın* (vəf. 1728) atası Əbülqasim Mirzə və *II Şah Süleyman* adı altında eyni iddia ilə çıxış etmiş Seyid Məhəmməd Mirzə (1714-63) doğulmuşlar.
Digər qızı Zibeydə bəyim I Şah Abbasın baş vəziri *Sultan əl-üləma (Xəlifə sultan)* ilə I Şah Abbasın qızı *Xanağa bəyimin* izdivacından doğulmuş Mirzə Seyid Həsənlə ailə qurmuşdur.

***Mənbələr:*** *C.Bayramlı, V.Zifəroğlu. Azərbaycan hökmdarları: Səfəvilər, s.189-197; Məhəmməd Möhsin Mustovfi. Zübdət ət-təvarix (nəşrə hazırlayan: Bəhruz Gudərzi), s.113-114 və 170; Əbülhəsən Qəzvini. Fəvaid əs-Səfəviyyə (nəşrə hazırlayan: Məryəm Mirəhmədi), s.75-77; Mirzə Məhəmməd Məsum. Tarixi-səlatini-Səfəviyyə (nəşrə hazırlayan: Seyid Əmir Həsən Abidi), s.31; A.A.Bakıxanov. Gülüstani-İrəm, s.146; Rudi Matthee. Persia in Crisis: Safavid Decline and the Fall of Isfahan, pp.55-75; The Encyclopaedia of Islam, IX, 820-821 ("Sulayman Shah").*



**II ŞAH SƏFİ** – *bax:* **I ŞAH SÜLEYMAN.**



**ŞAH SULTAN HÜSEYN** (1668 – noyabr, 1726) – Səfəvilər dövlətinin sayca doqquzuncu hökmdarı (hakim. 1694-1722). *I Şah Süleymanın* böyük oğludur. Anası Gürcüstanın Yuxarı Kartli bölgəsində hökm sürmüş Samtsxe atabəyliyinin hakiminin qızı, çərkəz əsilli *Yelena (Fəthiyyə) xanımdır*. XVII əsr Səfəvi saray ənənəsinə uyğun olaraq uşaqlıq və gənclik illərini hərəmxanada qapalı şəkildə keçirmiş, ətraf aləmlə ünsiyyət qurmamışdır. I Şah Süleyman vəfat edərkən oğullarından yaşca daha böyük olan ikisinin – Hüseyn Mirzə (gələcək Şah Sultan Hüseyn) ilə ondan 3 yaş kiçik olan Abbas Mirzənin şah seçilməsi məsələsi gündəmə gəldi. I



Şah Süleyman ölüm ayağında ikən öz yaxın ətrafına növbəti şah seçkisi ilə bağlı belə bir tövsiyə etmişdi: "Əgər asayiş və sakitlik istəyirsinizsə, Hüseyn Mirzəni, əgər güc və iqtidar istəyirsinizsə, Abbas Mirzəni seçin". Dövlət adamlarının əksəriyyəti öz vəzifələrində qalıb rahat ömür sürmək naminə Hüseyn Mirzənin taxta çıxmasına razılıq verdi.

I Şah Süleymanın vəfatından təqribən bir həftə sonra 26 yaşlı Şah Sultan Hüseynin tacqoyma mərasimi təşkil edildi. Bu münasibətlə İsfahanın bütün yoxsullarına yemək paylanıldı, Şah meydanı çıraqban edilib bəzədildi. Lakin təhlükəsizlik baxımından tacqoyma mərasimi Ayinəxana sarayında keçirildi. Gənclik illərində dindarlığı ilə seçilən, *şeyxülislam* Mir Məhəmməd Baqir *Xatunabadidən* (Səfəvilər dövlətinin gələcək ilk *mollabaşısı*) Quran öyrənmiş şah ənənəni pozaraq, mərasim zamanı onun belinə hakimiyyət qılıncını sufilərin başçısı olan *xəlifət əl-xüləfanın* deyil, görkəmli din alimi *Əllamə Məclisinin* bağlamasını istədi. Tacqoyma ayininin sonunda Əllamə Məclisidən xeyir-dua aldıqdan sonra şah ondan nə istədiyini soruşdu. Əllamə Məclisi ölkə ərazisində şəriətə zidd olan bütün əməllərin qadağan edilməsi barədə fərman verilməsini xahiş etdi. Şahın fərmanı ilə ölkədə şərab istehsalı, satışı və istifadəsi, göyərçinbazlıq, gənclərin qəhvəxanalarda toplaşması və s. qadağan olundu. Şah meydanında 6 min şərab şüşəsini nümayişkaranə şəkildə sındırıb məhv etdilər.

Şah Sultan Hüseyn hakimiyyətinin birinci yarısında dinə meyilli davranmış, dini dəyərlərə ehtiram göstərmiş, şəxsən şəriətə zidd olan əməllərdən uzaq duraraq bunların sarayda yayılmasına da imkan verməmişdir. Hələ şahzadəlik dövründə şəriətə ciddi şəkildə əməl etdiyi üçün yaxın ətrafı tərəfindən "Molla Hüseyn" adlandırılan şah bir dəfə saray bağçasında tüfəngdən atəş açarkən bir sərçəni vurduğuna görə o qədər peşman olmuşdu ki, "qanlı (qatil) oldum" deyərək, günahını yumaq məqsədilə fəqirlərə 200 tümən sədəqə verilməsini əmr etmişdi. Lakin Əllamə Məclisinin vəfatından sonra, bəzi məlumatlara görə, atasının bibisi *Məryəm xatunun* təhriki ilə o, eyş-işrətə aludə oldu. Məryəm xatunun bunu şah üzərində öz təsirini artırmaq üçün etdiyi bildirilir.

Şah Sultan Hüseyn təbiətcə oturaq həyata meyilli olmuş, atası kimi xüsusi olaraq dövlət idarə etmək üçün tərbiyə olunmamış, hətta at minməyi bacarmamışdır. Digər əksər Səfəvi şahları kimi, o da Azərbaycan dilində danışmağa üstünlük verir, farsca az danışırdı. Dövlət işlərində laqeydlik dərəcəsində yumşaqlıq göstərir, onun fikri tələb edilən hər suala ana dilində "yaxşıdur" cavabını verirdi. Şah Sultan Hüseyn edam əmrləri verməyi xoşlamırdı, özündən əvvəlki Səfəvi şahlarının qəzəb əlaməti olaraq geyindikləri qırmızı libasdan imtina etmişdi. Hakimiyyətə keçdikdən sonra kişi cinsindən olan yaxın qohumlarını öldürtməmişdi, hətta hakimiyyətə gələrkən rəqibi olan qardaşı Abbas Mirzəni

də sağ buraxmışdı. Onun zamanında dövlətin təhlükəsizliyi üçün qorxu yaradan üsyankar və günahkar şəxslərin cəzalandırılmaması mərkəzi hakimiyyətin zəifləməsinə, ölkədə özbaşınalığın artmasına, tabesizlik, əmrlərə itaətsizlik, rüşvət və korrupsiya hallarının çoxalmasına səbəb olmuşdu.

Şah Sultan Hüseynin bəxti qismən onda gətirmişdi ki, hakimiyyətinin ilk illərində yanında bacarıqlı vəzirlər var idi və tənəzzülə gedən dövləti tam dağılmaqdan qismən qoruya bilirdilər, lakin sonradan vəziyyət bu barədə də dəyişdi. Hakimiyyətinin ilk dövrlərində dövlət idarəçiliyi baş vəzir, görkəmli tarixçi, "Vəhid" təxəllüslü şair *Məhəmməd Tahir Qəzvininin* əlində cəmləşmişdi. 1699-cu ildə onu həmin vəzifədə əvvəlcə Məhəmməd Mömin xan Şamlu, 1707-ci ildən kürd mənşəli *Şahqulu xan Zəngənə* (*Şeyxəli xan Zəngənənin* oğlu) əvəz etdilər. Şahqulu xan 1716-cı ildə vəfat etdikdən sonra baş vəzirliyə onun kürəkəni *Fəthəli xan Dağıstani* gətirildi. 1720-ci ildə o, dövlətə xəyanət və çevriliş ittihamı ilə öldürüldü, Məhəmmədqulu xan Şamlu Səfəvilər dövlətinin son baş vəziri oldu.

Şah Sultan Hüseynin hakimiyyəti dövründə ruhanilərlə saray əyanları (əsasən *xacəbaşı* və *eşikağasıbaşıları*) arasında güclü rəqabət mövcud olmuş, tərəflərdən hər biri üstünlüyü və şah üzərində nəzarəti ələ keçirməyə çalışmışdır. Hakimiyyətinin ilk illərində şah üzərində ruhanilərin təsiri daha güclü idi, sonralar şahın əyləncəyə, eyş-işrətə meylindən istifadə edən qarşı tərəf üstünlüyü ələ keçirdi.

Şah Sultan Hüseynin zamanında Səfəvilər dövlətinin iqtisadiyyatı dəhşətli tənəzzül dövrünü yaşamışdır. Dövlət xəzinəsi boşalmışdı, xidmətçilərin məvacibi ödənilmirdi. Şah məcburiyyət qarşısında qalaraq xəzinədə olan 25 min tümənlik cavahiratı girov qoymuş və holland tacirlərindən aldığı pulla dövlət qulluqçularının məvacibini ödəmişdi.

1698-ci ildə ölkə ərazisində kütləvi siyahıyaalma həyata keçirildi, əhali və əmlak qeydə alındı. XVIII əsrin əvvəllərində iqtisadi tənəzzülün və dövlət xəzinəsindəki boşluğun qarşısını almaq üçün çıxış yolunu vergilərin iki-üç dəfə artırılmasında və yeni vergi növlərinin tətbiqində gördülər, bu isə öz növbəsində ölkəni daha ağır iqtisadi çətinliyə sürüklədi. Köçəri əhalidən alınan vergilərin yüksəldilərək oturaq əhalinin vergilərinin həddinə çatdırılması xalq kütlələrinin narazılığını artırdı. 1710-cu ildə şahın verdiyi fərmanla rəiyyət öz yaşadığı əraziyə təhkim edildi, daimi yaşayış yerini tərk edən kəndlilər geri qaytarılmalı idilər. 12 il ərzində qayıtmayan kəndli yeni yaşayış yerinin sakini hesab edilirdi.

Şah Sultan Hüseynin hakimiyyəti dövrü Səfəvilər dövlətinin, demək olar ki, bütün ərazisində üsyanların qalxması ilə əlamətdar olmuşdur. Bəluçlar Kirman və Bəm şəhərlərini, Tun şəhərinin hakimi, özünü Səffarilərin varisi elan etmiş Məlik Mahmud Sistani Məşhəd şəhərini və Xorasanın bir hissəsini, kürdlər



Həmədanı ələ keçirdilər. Ölkənin şimal sərhədləri öz çıxışlarını məzhəb pərdəsi altında həyata keçirən narazı qüvvələrin ardıcıl hücumları altında qərar tutmuşdu. Onların əsas himayədarı baş vəzir, qumuq mənşəli *Fəthəli xan Dağıstani* idi. O öz qohumlarını bütün mühüm dövlət vəzifələrində yerləşdirərək ölkənin faktiki hakiminə çevrilmişdi. Cənubda, Ərəbistanla sərhəddə məskunlaşmış xəvaric (ibaziyyə) əqidəli Oman sultanı İran körfəzindəki strateji əhəmiyyətli adalara yiyələnməklə dəniz ticarətini nəzarətə almışdı. Şah qoşun başçısı, baş vəzirin kürəkəni və həm də qardaşı oğlu Lütfəli xanı Oman istiqamətində hərbi yürüşə göndərsə də, o, hollandlarla müttəfiqlik qurmasına və Hollandiya gəmilərində hərbi əməliyyatlar həyata keçirməsinə baxmayaraq, təhlükəni aradan qaldıra bilmədi və nəticəsiz halda paytaxta qayıtdı.

Səfəvilər dövlətinin həm yaxın qonşuları, həm də uzaq dövlətlər baş verənləri diqqətlə izləyir, imperiyanın zəifləməsindən öz xeyirlərinə bacardıqca çox istifadə etməyə çalışırdılar. Vaxtilə Osmanlı dövlətinin qarşısında layiqincə rəqabət apara bilmiş Səfəvi imperiyası artıq öz sərhədlərini qorumaq gücündə deyildi. Mühüm vəzifələrə gətirilmiş qeyri-türk mənşəli əmirlər, xüsusilə kürd, ərəb mənşəli ordu sərkərdələri dövlətin hərbi gücünü qəsdən zəiflədir, dövlətin çökməsi üçün zəmin hazırlayırdılar.

Şah Sultan Hüseynin ən mühüm səhvi əfqanlarla bağlı yürütdüyü siyasət olmuş və bu səhv onun özünün, övladlarının, bütünlükdə Səfəvilər dövlətinin taleyini həll etmişdir. Ğilzayi, abdali, dürrani kimi əfqan tayfaları ölkənin şimal-şərq sərhədlərində, Qəndəhar bölgəsində və Xorasanda məskunlaşmışdılar. Şah Sultan Hüseynin Qəndəhar valisi təyin etdiyi gürcü mənşəli Gorgin xan (Şahnəvaz xan ləqəbli XI Georgi) əfqanlarla yola getmir, bölgədə narazılıq yaranmasına səbəb olurdu. Ğilzayi lideri Mir Üveys xanın israrlı xahişlərinə baxmayaraq, Gorgin xanın özbaşınalıqlarına qarşı Səfəvi sarayı heç bir tədbir görmədi. Həbs edilərək İsfahana göndərilən Mir Üveys xan şah tərəfindən əfv olundu və həcc ziyarətinə getmək üçün icazə aldı, lakin həcdən qayıtdıqdan sonra, 1709-cu ildə Qəndəhar valisini öldürdü. Beləliklə, Qəndəhar bölgəsi əfqanların əlinə keçdi, bundan sonra Gorgin xanın qardaşı oğlu Keyxosrov xan bölgəyə hərbi yürüş təşkil etsə də, nəticəsiz qaldı.

Mir Üveys xan vəfat etdikdən sonra əvvəlcə qardaşı, daha sonra (1717) qardaşı oğlu *Mir Mahmud Hutəki* Qəndəhar üzərində hakimiyyəti ələ keçirdi. O, Səfəvilər dövlətinin daxildən tam zəiflədiyini görərək 1720-ci ildə ölkənin içərilərinə doğru ilk yürüşə çıxdı. Kəşfiyyat xarakteri daşıyan bu hücumdan 2 il sonra əfqan tayfa birliyinin daha çox sayda hərbi qüvvəsi İsfahan üzərinə yürüdü.

1722-ci il mart ayının 8-də İsfahan yaxınlığındakı Gülnabad kəndində böyük Səfəvi qoşunu əfqanları qarşıladı (Fərqli mənbələrdə Səfəvi ordusunun 30-80 min

nəfərdən ibarət olduğu yazılır). Qızılbaş qoşunu sayca bir neçə qat çox, daha yaxşı təşkilatlanmış və hərbi artilleriyaya sahib idi. Lakin bu üstünlüklərin heç biri həlledici rol oynamadı. Şahın müşavirləri öz yarıtmaz məsləhətləri ilə döyüşün taleyini qabaqcadan həll etdilər. Səfəvi sərkərdələri arasında hökm sürən rəqabət və hərbi təcrübəsizlik nəticəsində savaş əfqanların qələbəsi ilə bitdi. Xuzistan (o zamanlar Ərəbistan adlanırdı) valisi Abdullah xəyanət edib öz ixtiyarındakı qoşunu döyüş meydanından kənara çıxardı. Yerdə qalan ordu tələsik İsfahana qayıtdı, qala qapıları düşmənin üzünə bağlandı. Mir Mahmud Hutəki daha çox itki verməmək naminə şəhəri mühasirəyə alıb isfahanlıların iradəsini aclıqla qırmaq qərarına gəldi. 6 ay davam etmiş mühasirə nəticəsində İsfahanda 80 mindən artıq insan aclıqdan və xəstəlikdən həlak oldu.

Şah Sultan Hüseyn bu 6 ay ərzində mühasirəni yarıb düşməni məğlub etmək və ya şəhərdən çıxıb kənarda özünə tərəfdar toplamaq, yeni qüvvə ilə İsfahana qayıtmaq imkanından da istifadə etmədi. Lur hakimi Əlimərdan xan öz qoşunu ilə İsfahan yaxınlığına gəlib köməyini təklif etdi, lakin bu şərti qoydu ki, şah hakimyyətdən kənara çəkilib qardaşı Abbas Mirzənin taxta çıxmasına razılıq versin. Şah Sultan Hüseyn bu imkanı dəyərləndirmək əvəzinə çıxış yolunu oğlu, şahzadə Təhmasib Mirzəni şəhərdən çıxarmaqda gördü. Lakin Təhmasib Mirzə gözlənildiyinin əksinə olaraq, ölkənin şimal bölgələrində qoşun toplayıb qayıtmaq əvəzinə Mazandaranda *Fəthəli xan Qacarla* birləşib özünü şah elan etdi.

1722-ci ilin oktyabrında Şah Sultan Hüseyn kənardan yardım gözləməyin və müqavimət göstərməyin mənasız olduğunu görərək İsfahanı təslim etmək qərarına gəldi. Şəhər kənarındakı düşərgədə Mir Mahmud xanla görüşən şah öz tacını onun başına qoymaqla Səfəvilər dövlətinin süqutuna imza atdı. Özünü şah elan etmiş Mir Mahmud xan əvvəlcə şah və ailə üzvləri ilə mehriban davranır, şəhər əhalisinə qarşı qəddar tədbirlər görməkdən çəkinirdi. Lakin bir müddətdən sonra Təhmasib Mirzəyə qarşı göndərilmiş bir neçə min əfqan döyüşçüsü Qəzvində məhv edildi. Bu xəbəri eşidən Mir Mahmud şah 300 nəfər Səfəvi əyanını ziyafətə çağırıb hamısını qılıncdan keçirdi, İsfahan əhalisinə divan tutuldu. Bir qədər sonra şahzadə *Səfi Mirzənin* guya şəhərdən qaçması barədə yayılmış şayiəyə cavab olaraq Şah Sultan Hüseynin həbsdə olan oğulları edam edildi. Şah özünü qılıncların altına ataraq yalnız iki körpəsini xilas edə bildi (8 fevral 1725).

Şah Sultan Hüseyn öz nüfuz və gücünü o qədər itirmişdi ki, qızlarının birini *Mir Mahmud şah Hutəkiyə*, digərini onun varisi *Mir Əşrəf şaha*, daha ikisini isə o biri əfqan əyanlarına ərə verməyə məcbur olmuşdu.

Qarışıqlıqdan istifadə edən Rusiya dövləti Səfəvi imperiyasının şimal ərazilərini – Dərbənd, Bakı və Şirvanı, o cümlədən Mazandaran, Gilan və Rəşti ələ



keçirdi, osmanlılar isə Tiflis və İrəvanı, mərkəzi Təbriz şəhəri olmaqla indiki Cənubi Azərbaycan torpaqlarını və Luristanı tutdular. 1725-ci ilin aprelində ölmüş Mir Mahmud şahın yerinə əmisi oğlu Mir Əşrəf Hutəki keçdi. Səfəvilər dövlətinin ərazisinə təcavüz etmək üçün fürsət yarandığını görən Osmanlı sultanı III Əhməd Bağdad valisi Əhməd paşaya böyük qoşunla hücum etmək əmrini verdi. Əhməd paşa guya Şah Sultan Hüseyni əfqan əsirliyindən azad etmək və taxt-tacı ona qaytarmaq tələbində olduğunu bildirdi. Mir Əşrəf şah bu bəhanənin qarşısını almaq üçün şahın başını kəsib paşaya göndərdi (noyabr, 1726).

Şah Sultan Hüseynin cənazəsi Qum şəhərində, başı isə Həmədanda torpağa tapşırılmışdır.

Şah müqəddəs məkanlarda, o cümlədən Kazimeyn, Kərbəla və Məşhəd hərəmlərində irimiqyaslı təmir işləri həyata keçirmiş, ziyarətgahlara bahalı hədiyyələr göndərmişdir. Onun zamanında sxolastik ruhanilərin təsiri altında sufilərə qarşı təzyiqlər başlamış, sufilik əlaməti olan yun libas geyinmək qadağan edilmiş, məşhur dərvişlər iri şəhərlərdən qovulmuş, İsfahanda *Ali qapu* sarayına bitişik yerləşən, qızılbaş sufilərin toplaşdığı *xəlvətxana* otağı bağlanmışdır.

A.A.Bakıxanov "Gülüstani-İrəm" kitabında Şah Sultan Hüseynin şəxsi keyfiyyətlərini və onun zamanında Səfəvilər dövlətinin vəziyyətini belə təsvir etmişdir: "Dindar və insaflı bir şəxs idi, həmişə üləma ilə görüşərdi. O, gecələr nafilə (müstəhəb) namazı qılardı, gündüzlər isə əlaltıları soyğunçuluq edərdilər. Get-gedə ölkə xarabalığa çevrildi, səltənət binası hər tərəfdən çatlamağa başladı. Bu tədbirsiz padşahın hökmranlıq dövrünün axırlarında fəsad əhlinin istədiyi kimi, dövlət işləri nizamdan düşdü. Şirvan və Dağıstan vilayətləri də iğtişaş və qarışıqlıq məskəninə döndü".

Şah Sultan Hüseyn 58 il yaşamış, hakimiyyət dövrü təqribən 28 il davam etmişdir.

***Həyat yoldaşları:***

Səfiqulu xanın qızı Varəstə xanım (1694),
Kartli çarı Şahnəvaz xanın (V Vaxtanq) qızı Nazənin xanım (1698),
Kaxeti çarı Keyxosrov xanın qızı Fəridə (Fərda) bəyim (1710),
Hüseynqulu xan Qacarın qızı Aminə (Xeyrənnisa) bəyim (1713).

***Övladları:***

Ümumilikdə Şah Sultan Hüseynin 14 oğlu, 11 qızı olduğunu yazırlar:
Təhmasib Mirzə (gələcək *II Şah Təhmasib*),
*Səfi Mirzə* (taleyi barədə məlumatlar fərqlidir),
İsmayıl Mirzə (1732-ci ildə II Şah Təhmasibin zamanında öldürülmüşdür),
Mahmud Mirzə, Mehr Mirzə, Heydər Mirzə, Səlim Mirzə, Süleyman Mirzə, Məhəmməd Mirzə, Xəlil Mirzə, Məhəmməd Baqir Mirzə, Cəfər Mirzə (hamısı 1725-ci il fevralın 8-də Mir Mahmud şah Hutəkinin əmri ilə qətlə yetirilmişdir),

Daha iki körpə oğlu 1726-cı ilin noyabrında şahla birlikdə öldürülmüşdür. Şah Sultan Hüseynin qızları Mir Mahmud şah Hutəki, Mir Əşrəf şah Hutəki və digər əfqan böyükləri ilə ailə qurmuşlar.

Şah qızlarından *Raziyyə bəyimi Nadir şaha* (ikinci evlilik), Fatimə bəyimi Nadir şahın oğlu Rzaqulu Mirzəyə, Zeynəb bəyimi Nadir şahın qardaşı İbrahim xana ərə vermişdir. Şahın bəzi qızları da Səfəvilər dövlətində böyük nüfuz sahibi olan seyidlərlə ailə qurmuşlar.

***Mənbələr:*** *C.Bayramlı, V.Zifəroğlu. Azərbaycan hökmdarları: Səfəvilər, s.205-211; Məhəmməd Möhsin Mustovfi. Zübdət ət-təvarix (nəşrə hazırlayan: Bəhruz Gudərzi), s.115-138; Əbülhəsən Qəzvini. Fəvaid əs-Səfəviyyə (nəşrə hazırlayan: Məryəm Mirəhmədi), s.78-82; A.A.Bakıxanov. Gülüstani-İrəm, s.147; Məhəmməd Haşim İsfahani. Rüstəm ət-təvarix (nəşrə hazırlayan: Məhəmməd Müşiri), s.69-188; Rudi Matthee. Persia in Crisis: Safavid Decline and the Fall of Isfahan, pp.197-241; Z.Ə.Məhəmmədi. Şah Sultan Hüseynin vəsfləri ("Kitabi-mah: tarix və coğrafiya", 1388 h.-ş., №137), s.82-85; Ehsan İşraqi. Şah Sultan Hüseyn ("Nəşriyyeyi-güruhi-tarix", il: 1, sayı: 1), s.14-102; Sara Şuhani. Şah Sultan Hüseynin din siyasətinin təhlili ("Tarixi-nov" dərgisi, 1386 h.-ş., №7), s.159-177; Ramin Yulfani. Şah Sultan Hüseyn Səfəvinin hakimiyyəti dövründəki iqtisadi vəziyyət ("Fiqh və mədəniyyət tarixi" ixtisas dərgisi, 1387 h.-ş., №16), s.149-166; İbrahim Bərzgər. Şah Sultan Hüseynin siyasi psixologiyası və Səfəvilər dövlətinin süqutunda bunun rolu ("Afaqi-əmniyyət" dərgisi, 1394 h.-ş., №27), s.107-121; M.N.Haşimi. İsfahanın süqutu faciəsinə daha bir baxış (İsfahan Universiteti Ədəbiyyat və humanitar elmlər fakültəsinin elmi araşdırma dərgisi, 1377 h.-ş., №15), s.35-46; Roger Savory. Səfəvilər dövründə İran (farsca tərcümə: K.Əzizi), s.240-253; Rəsul Cəfəriyan. Səfəviyyə din, mədəniyyət və siyasət meydanında, I, 394-409; Səfərnameyi-Krusinski (farsca tərcümə: Əbdürrəzzaq Dünbüli Məftun); Н.В.Пигулевская и др. История Ирана с древнейших времен до конца XVIII века, стр.306-316; К.Рыжов. Все монархи мира. Мусульманский Восток, XV-XX вв., стр. 411; The Cambridge History of Iran, vol. 6, pp.310-324; The Encyclopaedia of Islam, IX, 854 ("Sultan Husayn").*



**II ŞAH TƏHMASİB** (1704-1739/40) – Səfəvilər dövlətinin sayca onuncu hökmdarı (hakim. 1722-1732). Atası *Şah Sultan Hüseyn*, anası gürcü əsilli idi. Təhmasib Mirzə atasının yaşca üçüncü oğludur. İsfahan əfqanlar tərəfindən mühasirəyə alındıqdan (mart, 1722) sonra şəhərə kənardan kömək gəlməyəcəyi məlum oldu. Saray əhli Şah Sultan Hüseynin oğullarından birini vəliəhd elan edib şəhərdən çıxarmağı qərara aldı ki, o, kənarda qoşun toplayıb özü ilə gətirsin. Şahzadələrin yaşca ən böyüyü olan Sultan Məhəmməd Mirzə vəliəhd elan edildi, amma o zamana kimi hərəmxanadan kənara çıxmamış şahzadə ilk müşavirə məclisində vəziyyətdən qorxuya düşüb istefa verdi. Bundan sonra yaşca ikinci şahzadə olan *Səfi Mirzəni* vəliəhd seçdilər. O, kənardan yardım gətirmək əvəzinə problemin həllini daxildə axtarmağı, günahkarları cəzalandırmağı və şəhər daxilində tədbir-



lər görərək düşmənlə mübarizə aparmağı təklif etdi. Bütün bunlar Şah Sultan Hüseynin tutduğu istiqamətə uyğun olmadığı üçün 15 gündən sonra Səfi Mirzəni vəliəhdlikdən kənarlaşdırıb yerinə Təhmasib Mirzəni gətirdilər. 1722-ci il iyun ayının əvvəllərində Təhmasib Mirzə 200 nəfər təbrizli süvari ilə mühasirəni yarıb İsfahandan çıxdı və ölkənin şimalına tərəf üz tutdu. O, Qəzvində bir müddət, demək olar, fəaliyyətsiz qaldı və İsfahana yardım göndərmədi. Paytaxt əfqanlara təslim olub şahlıq tacı *Mir Mahmud Hutəkinin* başına qoyulduqdan sonra 1722-ci ilin noyabrında 18 yaşlı Təhmasib Mirzə Qəzvində özünü Səfəvilər dövlətinin şahı elan etdi. Mir Mahmud Hutəki bunu eşitdikdə Qəzvinə qoşun göndərdi, amma II Şah Təhmasib şəhərdən qaçmağı bacardı, əfqan dəstəsi isə Qəzvin əhalisinin inadlı müqaviməti ilə üzləşdi və ağır tələfat verdi.

İsfahanın süqutunu eşidən qonşu ölkələr Səfəvilər dövlətinin torpaqlarını hissə-hissə mənimsəməyə başladılar. 1723-cü ildə Rusiya imperatoru I Pyotr Xəzəryanı vilayətləri ələ keçirdi, Bakı, Dərbənd, Şamaxı şəhərləri tutuldu. II Şah Təhmasibin Peterburqa göndərdiyi diplomatik heyətin başçısı İsmayıl bəy itirilmiş torpaqların Rusiyaya verilməsini təsdiq edən sülh sazişini imzaladı (sentyabr, 1723). I Pyotr bununla kifayətlənməyib Xəzər dənizinin cənub sahillərinədək irəlilədi, Rəşt və ətrafını ələ keçirdi. 1724-cü ilin iyununda Rusiya və Osmanlı dövlətləri arasında İstanbul müqaviləsi imzalandı. Bu müqavilə əslində Səfəvilər dövlətinin torpaqlarını bölüşdürmək məqsədi güdürdü. Rusiya və Osmanlı imperiyaları II Şah Təhmasibi Səfəvi hökmdarı kimi tanımaq barədə razılığa gəldilər. Osmanlı qüvvələri Gürcüstanı və İrəvan qalasını ələ keçirib, ardınca Şimali və Cənubi Azərbaycan torpaqlarının böyük hissəsini işğal etdi. II Şah Təhmasib Rəşt yaxınlığında rus qoşunlarına məğlub oldu. Mir Mahmud Hutəki Tehrana çəkilən II Şah Təhmasibə qarşı qoşun yolladı, şah yenə də məğlubiyyətə uğrayıb Mazandarana üz tutdu.

XVIII əsrin ilk rübünün sonlarında Səfəvilər dövlətinin ərazisi əfqan, rus və Osmanlı qüvvələri arasında bölünmüşdü, Xorasan bölgəsi özünü "Şahnamə"nin qəhrəmanı Keyxosrovun nəslindən hesab edən Məlik Mahmud Sistaninin əlində idi, ölkənin cənub-qərb torpaqlarını Bəxtiyari tayfaları idarə edirdi. Belə bir şəraitdə II Şah Təhmasibin Mazandaranda hökm sürən Qacar tayfasının mənsubu *Fəthəli xan Qovanlı-Qacarla* birləşməkdən başqa yolu qalmamışdı. O, Astarabadda qərarlaşıb öz dövlət aparatını qurmağa başladı, ilk təyinat olaraq Fəthəli xanı baş vəzir təyin etdi.

II Şah Təhmasib Fəthəli xan Qacarla müttəfiq olduqdan sonra Xorasan bölgəsini Məlik Mahmudun əlindən almaq qərarına gəldi. Lakin onların qoşunu qarşı tərəfi əzmək üçün kifayət edəcək gücə sahib deyildi. Bu zaman Əfşar tayfasına mənsub, hakimiyyətə iddialı

və xarizmatik şəxsiyyətə malik Nadirqulu xan onların köməyinə gəldi. Nadirqulu xan çoxdan bəri Xorasanı ələ keçirmək uğrunda çalışırdı, Əbivərd, Kəlat və Dəstcirdi fəth etmişdi, amma Məlik Mahmudun hərbi üstünlüyü onun qarşısında maneə kimi dururdu. II Şah Təhmasiblə Nadirqulu xanın ittifaqı onların hər ikisinə sərf edirdi. Müttəfiq qüvvələr Məlik Mahmud Sistaninin əsas qərargahı olan Məşhəd şəhərini mühasirəyə aldı. Burada Fəthəli xan Qacarla Nadirqulu xan Əfşarın şah üzərində nüfuzu ələ keçirmək uğrunda amansız rəqabəti başladı. Bu mübarizədə Nadirqulu xan qalib gəldi, Fəthəli xanın adından Məlik Mahmuda yazılmış saxta məktub düşünülmüş şəkildə şahın əlinə keçdi. II Şah Təhmasib Fəthəli xanı xəyanətdə təqsirləndirib edam etdirdi (oktyabr, 1726). Uğurla başa çatmış Xorasan yürüşündən sonra şahın yanında xüsusi etibar qazanmış Nadirqulu xan özünə Təhmasibqulu ləqəbini götürdü. Bundan sonra o, Səfəvi qoşununun baş sərkərdəsi kimi bütün hərbi əməliyyatlara rəhbərlik etməyə başladı.

Məlik Mahmud Sistani üzərindəki qələbədən sonra II Şah Təhmasibin qarşısında əfqan, rus və Osmanlı işğallarına son qoymaq, bölgələrdəki üsyanları yatırmaq vəzifəsi dururdu. Bu məqsədi həyata keçirməkdə Təhmasibqulu xan (bundan sonra məqalədə Nadir xan adlandırılacaq) ona ən yaxın köməyi göstərdi. İlk hədəf olaraq əfqanlar seçildi. *Mir Əşrəf şah* Osmanlı və rus qoşunlarına qarşı bəzi uğurlu hərbi əməliyyatlar aparsa da, onları işğal olunmuş torpaqlardan geri oturda bilməmişdi. Əfqanlar əsasən paytaxt İsfahanda möhkəmlənmişdilər, onların hərbi-siyasi gücü ətraf bölgələrə yayılmamışdı. Paytaxt İsfahanı əfqanlardan azad etmək Səfəvilər üçün həm də simvolik məna daşımaq baxımından mühüm idi. Mir Əşrəf şahın qüvvələri ilə Nadirin qoşunu üç dəfə qarşı-qarşıya gəldi. Əvvəlcə Damğan yaxınlığındakı Mehmandust kəndində, daha sonra Vəramində, axırda isə İsfahan yaxınlığındakı Murçəxurtda döyüşlər baş verdi, hər üç döyüş Nadirin qələbəsi ilə başa çatdı. Əfqanlar Osmanlı dövlətindən canlı qüvvə və artilleriya sarıdan yardım alsalar da, məğlub oldular. Mir Əşrəf şah İsfahanda böyük qətl törətdikdən sonra şəhəri tərk edib Şiraza sığındı.

1729-cu ilin dekabrında II Şah Təhmasib böyük təntənə ilə İsfahana daxil oldu. Göstərdiyi xidmətin əvəzi olaraq o, Xorasan vilayətini Nadir xanın ixtiyarına vermək barədə fərman imzaladı. Nadir xan qızılbaş qoşununu toplayıb Şiraz yaxınlığında əfqanları darmadağın etdi. Mir Əşrəf Luristana, oradan Bəlucistana qaçdı, burada qohumu Hüseyn sultan tərəfindən öldürüldü (1730). Bununla 8 illik əfqan işğalına son qoyuldu və əfqan təhlükəsi aradan qalxdı.

Bundan sonra diqqət Osmanlı işğalının üzərinə yönəldildi. Qısa müddət ərzində Həmədan və Kirmanşah, ardınca Ərdəbil və Təbriz onlardan geri alındı. Bu arada Nadir xana xəbər çatdırıldı ki, əfqanların Abdal tayfası Xorasanda qi-



yam qaldırıb. Nadirin Xorasana getməsindən istifadə edən II Şah Təhmasib osmanlılarla məsələni özü təkbaşına həll etmək fikrinə düşüb İrəvan üzərinə yeridi. İrəvan ətrafında Zəngiçay sahilində baş vermiş döyüşdə qızılbaş ordusu qalib gəldi, Osmanlı tərəfi 9 min nəfərdən artıq itki verdi. Lakin İrəvan qalasına sığınmış Osmanlı qarnizonu Əli paşanın başçılığı altında uzun müddət müqavimət göstərə bildi. Qızılbaş qoşunu azuqə qıtlığı hiss etdikdə şah mühasirəni kəsib Təbrizə qayıtmağa məcbur oldu. Geri qayıdarkən Səfəvi qoşunu pusquya düşüb ağır məğlubiyyətə uğradı, vaxtilə Şah Sultan Hüseynin baş vəziri olmuş bacarıqlı sərkərdə Səfiqulu xan əsir düşdü və İstanbula aparılıb edam edildi.

Bundan sonra Osmanlı sərkərdələri Əli paşa İrəvandan, Əhməd paşa isə Bağdad istiqamətindən hücuma keçib Nadir xanın geri almış olduğu Kirmanşah və Həmədanı yenidən tutdular. Təbriz və Həmədan arasında Osmanlı və Səfəvi qoşunları qarşılaşdı. Osmanlı ordusunun başçıları şahı aldadıb guya sülh bağlamaq istədiklərini bildirdilər, Səfəvi qoşununu arxayın saldıqdan sonra onlar qəfildən hücum edib bütün artilleriyanı ələ keçirdilər. Xeyli qızılbaş döyüşçüsü öldürüldü, bir hissəsi əsir alındı. Osmanlılar Təbrizi və Marağanı da tutdular. II Şah Təhmasib onu təqib edən Osmanlı qoşununun İsfahana girməsinə və əfqan işğalına bənzər faciənin təkrarlanmasına yol verməmək üçün şimala doğru üz tutdu. O, Mazandarandakı tərəfdarlarını toplamaq, zərurət halında isə Xorasana – Nadirin yanına sığınmaq fikrində idi. Bağdad valisi Əhməd paşa İraqa qayıtdıqdan sonra şah İsfahana gəldi. Hərbi əməliyyatların sonunda II Şah Təhmasib Osmanlı dövləti və Rusiya imperiyası ilə sülh sazişləri imzaladı (1732). Bu sazişlərə görə, osmanlılar ələ keçirdikləri Səfəvi torpaqlarının bir hissəsini geri qaytardılar, amma Araz çayından şimaldakı ərazilər osmanlıların işğalı altında qaldı. Ruslar isə Xəzər dənizinin cənub sahilində tutduqları ərazilərdən geri çəkilib Kür çayından şimalda yerləşən şəhərləri əldə saxlamaqla kifayətləndilər. Beləliklə, II Şah Təhmasibin Nadir xandan xəbərsiz halda apardığı hərbi əməliyyatlar uğursuzluqla nəticələndi, o, Azərbaycanın şimal torpaqlarının Osmanlı və Rusiya tərəfindən işğalı ilə barışmalı oldu.

Şahın bu özbaşına addımlarının uğursuzluğundan çox qəzəblənmiş Nadir xan Xorasanda sakitlik yaratdıqdan sonra İsfahana sarı geri döndü. O, Bağdad valisi Əhməd paşaya məktub göndərərək şahın imzaladığı müqavilə ilə razı olmadığını bildirdi və Osmanlı dövlətinin ələ keçirdiyi bütün torpaqları geri qaytarmasını tələb etdi. II Şah Təhmasib Nadirin qəzəbindən qorxaraq İsfahan yaxınlığındakı bağların birində düşərgə qurdu, lakin sərkərdə onu arxayın etdi ki, heç bir pislik etmək fikrində deyil. Nadir xan şahı öz malikanəsinə qonaq dəvət etdi. Burada II Şah Təhmasib bir neçə gün ərzində eyş-işrətlə vaxt keçirdi, bəzi məlumatlara görə,




ona Nadir xanın əmri ilə bihuşedici maddələr verilmişdi. Şah bihuş halda yatdığı zaman Nadir xan dövlət adamlarını toplayıb ölkə üçün bu cür ağır vəziyyətdə eyş-işrətlə başını qatan bir şəxsin hökmdarlıq taxtına layiq olmadığını söylədi. Qərara alındı ki, II Şah Təhmasib taxtdan salınıb yerinə ikiaylıq körpə oğlu Abbas şah seçilsin. Beləliklə, 1732-ci ilin avqustunda II Şah Təhmasibin şahlıq müddəti sona çatdı, onu özünə sadiq əyanlarla və 1.500 nəfər gözətçi ilə birlikdə Məşhəd şəhərinə yola saldılar. Bir neçə gündən sonra yeni şahın – körpə *III Abbasın* tacqoyma mərasimi keçirildi. Bu münasibətlə körpəni *Çehelsütun sarayında* tavandan asılmış beşikdə yatırtdılar, şahlıq tacını və qılıncını da beşiyin yanında qoydular. Beyət mərasimindən sonra Nadir xan əyanların və qoşun başçılarının iştirakı ilə namaz qıldı.

Bundan sonra Nadir xan özünə "naib əs-səltənə" (səltənətin canişini) ləqəbini götürdü və faktiki olaraq dövlətin başçısı kimi ölkəni idarə etməyə başladı. O, körpə şahı Qəzvinə göndərdi, dövlət vəzifələrinə öz adamlarını təyin etdi. Sonrakı 3 il ərzində o, Rusiya ilə danışıqlar apararaq Dərbəndə kimi Azərbaycan torpaqlarının geri qaytarılmasını təmin etdi, bu danışıqların nəticəsi olaraq Gəncə müqaviləsi imzalandı (1735). İraq uğrunda osmanlılarla aparılmış müharibə Nadir xanın qələbəsi ilə başa çatdı, Bağdad da daxil olmaqla, İraq torpaqları Səfəvilər dövlətinə qaytarıldı. Osmanlı qoşunu son illər ərzində işğal etdiyi bütün məntəqələri, o cümlədən Gəncə, Şamaxı, İrəvan, Ərdəbil, Təbriz şəhərlərini boşaldıb geri çəkildi. Beləliklə, Səfəvilər dövlətinin əfqan işğalından əvvəlki ərazi bütövlüyü bərpa edildi. 1736-cı ilin martında Suqovuşanda təşkil edilmiş Muğan qurultayında Nadir xan artıq III Şah Abbasın da hakimiyyətinə ehtiyac qalmadığını bildirərək özünü şah elan etdi. Bununla da Səfəvilər dövlətinin 235 illik hakimiyyətinə son qoyuldu.

Muğan qurultayından sonra II Şah Təhmasib oğulları ilə birlikdə saxlandığı Məşhəd şəhərindən Səbzəvara köçürüldü. Nadir şah Əfşar 1738-ci ildə Hindistan səfərinə yollanarkən oğlu Rzaqulu Mirzəni də özü ilə aparmışdı. Bir sıra mühüm qələbələrdən sonra Nadir şah oğlunu geri göndərərək öz canişini təyin etdi. 10 aydan sonra Nadir şahın Hindistanda ölməsi barədə şayiələr yayıldı. Rzaqulu Mirzənin müşavirləri ona məsləhət gördülər ki, Səfəvi əyanlarının qarışıqlıqdan istifadə edərək II Təhmasibi və ya oğullarını hakimiyyətə gətirmək imkanının qarşısını almaq üçün onları aradan götürsün. Rzaqulu Mirzə Məhəmməd Hüseyn xan Dəvəlü-Qacarı (zalımlığına görə Şimr ləqəbi ilə tanınırdı) bir dəstə ilə Səbzəvara yolladı. O, II Təhmasibə Rzaqulu xandan xəbər gətirdiyini söyləyib onun hərəmxanadan çıxmasını tələb etdi. Hərəmxanadakı qadınlar məsələni anlayıb ah-fəryad etməyə başladılar. Səbzəvar camaatının məsələdən duyuq düşəcəyindən qorxan Mirzə Məhəmməd Hüseyn xan yanındakı dəstə



ilə birlikdə hərəmxanaya girərək II Təhmasibi yay kirişi ilə boğub öldürdü. Özünü atasının cənazəsi üstünə atan 8 yaşlı şahzadə Abbas Mirzəni də qılıncla doğradılar. Şahın kiçik oğlu, 7 yaşlı İsmayıl Mirzəni gizlədildiyi quyudan tapıb çıxardılar və hərəmxanadakı qadınların yalvarışlarına baxmayaraq, onu da qətlə yetirdilər. II Təhmasibin hərəmxanadakı hamilə qadınlarına da aman verilmədi. Bu faciənin 1740-cı ilin fevralında, yaxud 1739-cu ilin mayında baş verdiyini yazırlar.

II Şah Təhmasibin və oğullarının cənazəsi Məşhəddəki İmam Rza (ə) hərəmində dəfn edilmişdir.

***Həyat yoldaşları:***

II Şah Təhmasibin bir neçə həyat yoldaşı olmuşdur. Onlardan biri *I Şah Süleymanın* nəvəsi Şahpuri bəyimdir.

***Övladları:***

II Şah Təhmasibin övladlarının sayı və adları barədə mənbələrdəki məlumatlar fərqlidir. Oğullarından birinin Abbas adını daşıdığı şübhəsizdir (Bu, sonuncu Səfəvi hökmdarı *III Şah Abbasdır*). Bundan başqa, şahın daha bir oğlu olduğunu da yazırlar, onun adı İsmayıl, Süleyman və ya Əlqas olmuşdur. Əksər mənbələr hər iki oğulun şahla birlikdə Səbzəvarda qətlə yetirildiyini xəbər verir (Onların bundan əvvəl öldüklərini yazanlar da vardır).

II Şah Təhmasibin bir neçə aylıq körpə oğlu Hüseyn Mirzənin (vəf. 1775) faciədən sağ çıxması, Dağıstanda və Gürcüstanda gizli şəraitdə böyüməsi (anası gürcü əsilli idi), daha sonra *II Şah Hüseyn* adı ilə özünü hökmdar elan etməsi barədə məlumatlar vardır.

II Şah Təhmasibin qızı İsmət ən-nisa bəyim sonralar III Şah İsmayıl adı altında hakimiyyət iddiası etmiş Əbu Türab Mirzənin (anası Şah Sultan Hüseynin qızı Məryəm xanım idi) qardaşı Seyid Əhməd Mirzə ilə ailə qurmuş, bir oğul sahibi olmuşdur.

II Şah Təhmasibin anası əfqan işğalı zamanı özünü kəniz kimi təqdim edərək sağ qalmışdı. O, çox sonralar (1766/67-ci illərdə) dünyasını dəyişmiş, Kərim xan Zənd tərəfindən ehtiramla Qum şəhərində dəfn olunmuşdur.

***Mənbələr:*** *C.Bayramlı, V.Zifəroğlu. Azərbaycan hökmdarları: Səfəvilər, s.205-211; Əbülhəsən Qəzvini. Fəvaid əs-Səfəviyyə (nəşrə hazırlayan: Məryəm Mirəhmədi), s.82-92; Məhəmməd Möhsin Mustovfi. Zübdət ət-təvarix (nəşrə hazırlayan: Bəhruz Gudərzi), s.139-166; Məhəmməd Haşim İsfahani. Rüstəm ət-təvarix (nəşrə hazırlayan: Məhəmməd Müşiri), s.174-204; Məhəmməd Kazim Mərvi. Aləmarayi-Nadiri (nəşrə hazırlayan: M.Ə.Riyahi), II, 765-771; Roger Savory. Səfəvilər dövründə İran (farsca tərcümə: K.Əzizi), s.251-253; К.Рыжов. Все монархи мира. Мусульманский Восток, XV-XX вв., стр. 411-412; The Encyclopaedia of Islam, X, 110 ("Tahmasp II"); The Cambridge History of Iran, vol. 6, pp.326-328; Clements R.Markham. A General Sketch of The History of Persia, pp.295-296; Christopher Buyers. The Safawi Dynasty, Cenealogy.*

**III ŞAH ABBAS** (1732-1739/40) – sonuncu (sayca on birinci) Səfəvi hökmdarı, *II Şah Təhmasibin* oğlu. Körpə ikən Nadir xan tərəfindən atasının yerinə formal olaraq şah elan edilmiş, 1736-cı ildə hakimiyyətdən salınmış, 1739-cu və ya 1740-cı ildə atası II Şah Təhmasiblə birlikdə öldürülmüşdür. Tarixşünaslıqda III Şah Abbasla Səfəvi dövlətinin mövcudluğu başa çatmış hesab olunur. Daha sonra özünü şah elan edən Səfəvi nəslinin nümayəndələri real dövlət və hakimiyyətə malik olmamış, müxtəlif siyasi qüvvələr tərəfindən hakimiyyəti ələ keçirmək üçün istifadə olunmuşdular.

*bax:* **II ŞAH TƏHMASİB.**



**ƏHMƏD ŞAH SƏFƏVİ** (vəf. 1728) – Səfəvi sülaləsinin nümayəndəsi, Səfəvilər dövlətinin süqutundan az sonra özünü şah və Səfəvi sülaləsinin hüquqi varisi elan etmiş şəxs. Anası *I Şah Abbasın* qızı *Xanağa bəyimlə* Səfəvilər sülaləsindən olan baş vəzir *Sultan əl-üləmanın* izdivacından doğulmuş İbrahim Mirzənin qızıdır. Atası isə Səfəvilər sülaləsi ilə qohum olan Məşhəd mütəvəllisi Mirzə Məhəmməd Davud Mərəşinin (vəf. 1721) oğlu Əbülqasim Mirzədir. Beləliklə, Əhməd Mirzə həm ata, həm də ana tərəfdən Səfəvi qanını daşıyırdı. Əmisi Seyid Məhəmməd Mirzə (vəf. 1763) də *II Süleyman* adı ilə özünü şah elan etmişdir.

İsfahanın süqutundan sonra Əhməd Mirzə *II Şah Təhmasibə* qoşulmuş, lakin sonralar onun eyş-işrətə aludə olduğunu və hakimiyyətə ləyaqəti çatmadığını sübut gətirərək özünü Fars vilayətinin (Səfəvilər dövlətinin mərkəzi əyaləti) hərbi qüvvələrinin komandanı (*əmir əl-üməra*) elan etmişdir (II Şah Təhmasibin möhürünü saxtalaşdıraraq öz adına hökm imzalatdırdığını yazırlar). Beləliklə, ilk dövrlərdə Əhməd Mirzə müstəqillik iddiasında olmamış, özünü II Şah Təhmasibin bölgədəki nümayəndəsi kimi təqdim etmişdir. 1725-ci ildə Fars bölgəsində üstünlüyü ələ keçirmiş Əhməd Mirzə hətta burada əfqan qüvvələrini sıxışdırmağa da nail oldu. Lakin tezliklə II Şah Təhmasib bu uğurlardan xəbər tutdu, Fars bölgəsinin əmirlərinə məktub yazaraq Əhməd Mirzənin təqdim etdiyi fərmanın saxta olduğunu bildirdi və onu təslim etmələrini istədi. Əhməd Mirzə iki ay həbsdə qaldıqdan sonra qaçmağa nail oldu, qoşun toplayaraq II Şah Təhmasibin göndərdiyi sərkərdələri məğlub etdi. 1726-cı ildə o, Kirmanda özünü şah elan edərək öz adına xütbə oxutdurdu və pul zərb etdirdi. Əhməd şah Səfəvilər dövlətinin idarəçilik aparatının modelinə uyğun olaraq vəzifələr təsis etmiş və bu vəzifələrə təyinatlar həyata keçirmişdir.

Bundan sonra İsfahanda hakimiyyət sürən *Əşrəf şah Hutəki* onun üzərinə əfqan qoşununu göndərdi. Döyüşdə Əhməd şah məğlub olub bütün hərbi qüvvəsini itirdi və Xorasana sarı üz tutub II Şah Təhmasibdən üzr istəməyi və onun himayəsinə sığınmağı qərara aldı. Lakin



II Şah Təhmasibin onu cəzalandırmaq istəyindən xəbər tutduqda istiqaməti dəyişib Bəndər-Abbas limanına getdi. Burada o, limandan istifadəyə görə holland və ingilis gəmilərindən gömrük haqqı almağa başladı.

Əşrəf şah Hutəki bu dəfə də Əhməd şahın üzərinə qoşun yolladı. Əhməd şah Darab qalasına sığınsa da, 8 aylıq mühasirədən sonra təslim oldu. Onu İsfahana gətirdilər. Əşrəf şah əvvəlcə onunla ehtiramla davranırdı, lakin tədricən onların münasibətləri pisləşdi. 1728-ci ildə Əhməd şah qardaşı Əbdül-əimmə Mirzə ilə birlikdə qətlə yetirildi və İsfahandakı Siti Fatimə ziyarətgahında torpağa tapşırıldı.

***Mənbələr:*** *Ə.Cəfəri. Seyid Əhməd xan Mərəşi Səfəvinin şahlığı və Səfəvilərin legitimlik böhranı (İsfahan Universiteti Ədəbiyyat və humanitar elmlər fakültəsinin elmi araşdırma dərgisi, 1390 h.-ş., №1), s.1-18; Əbülhəsən Qəzvini. Fəvaid əs-Səfəviyyə (nəşrə hazırlayan: Məryəm Mirəhmədi), s.89; Əbülhəsən Gülüstanə. Mücməl ət-təvarix (nəşrə hazırlayan: Müdərris Rezəvi), s.397, 480-483; J.R.Perry. The Last Safavids, 1722-73 (British Institute of Persian Studies, Vol. 9, 1971), p.61.*

**SAM MİRZƏ** (vəf. 1748) – Səfəvilər dövlətinin süqutundan sonra özünü *Şah Sultan Hüseynin* oğlu Sam Mirzə kimi təqdim etmiş şəxs. Əslində Şah Sultan Hüseynin Sam Mirzə adlı oğlunun olması mötəbər mənbələrdə öz əksini tapmamışdır. Özünü Sam Mirzə adlandıran şəxs təqribən 1740-cı ildə Ərdəbildə hakimiyyət iddiasına qalxmış, amma *Nadir şahın* qardaşı İbrahim xan tərəfindən ələ keçirilmişdi. İbrahim xan onun burnunu kəsərək azad buraxdı. 3 ildən sonra o, yenidən fəaliyyətə başladı, Dağıstan əyanları ilə birləşərək Şirvan hakimi Heydər xanı məğlubiyyətə uğratdı və Ağsunu ələ keçirdi. Bunun ardınca Quba əhalisi qiyam qaldırıb şəhəri ona təslim etdi. İraq ərazisində hərbi əməliyyat keçirən Nadir şah bundan xəbər tutan kimi oğlu Nəsrullah Mirzəyə və kürəkəni Fəthəli xana problemi həll etməyi tapşırdı. 1743-cü ilin sonlarında Şamaxı ətrafında baş vermiş döyüşdə Sam Mirzə əfşarlara məğlub olub Gürcüstana qaçdı. Az sonra o, Kartli çarı II Teymuraz və onun oğlu, Kaxeti çarı II İrakli tərəfindən ələ keçirildi. Nadir şah bu dəfə Sam Mirzənin bir gözünün çıxarılmasını əmr etdi.

Lakin Səfəvi taxtının iddiaçısı bununla siyasət səhnəsindən çəkilmədi. Nadir şahın qətlindən (1747) sonra qardaşı oğlu Əliqulu xan Əfşar Adil şah adı ilə taxta çıxdığı zaman Sam Mirzə Təbrizə gəlib özünü Səfəvilər dövlətinin hüquqi varisi kimi təqdim etdi. Tezliklə ətrafına 20 min nəfər tərəfdar toplamağı bacarmış Sam Mirzə Təbrizin əhalisi tərəfindən sevilirdi. Lakin o, Adil şahın qüvvələri ilə mübarizədə məğlub olub öldürüldü (1748).

***Mənbələr:*** *J.R.Perry. The Last Safavids, 1722-73 (British Institute of Persian Studies, Vol. 9, 1971), p.62-63; Əbülhəsən Qəzvini. Fəvaid əs-Səfəviyyə (nəşrə hazırlayan: Məryəm Mirəhmədi), s.155.*

**II SÜLEYMAN** (1714-63) – Səfəvi sülaləsinin nümayəndəsi, Səfəvilər dövlətinin süqutundan bir müddət sonra özünü şah və Səfəvi sülaləsinin hüquqi varisi elan etmiş şəxs. Əsl adı Seyid Məhəmməd Mirzədir. Anası *Şah Süleymanın qızı*, *Şah Sultan Hüseynin* bacısı *Şəhrəbanu bəyim* (vəf. 1742), atası məşhur seyid nəslindən olan Mirzə Məhəmməd Davud Mərəşi (vəf. 1721) idi. Mirzə Məhəmməd Davudun da anası *I Şah Abbasın* qızı *Zibeydə bəyimin* qızı Cahanbanu bəyimin qızı İzzşəraf bəyim, atası Mərəşi seyidlərindən Mirzə Abdullah olmuşdur. Beləliklə, II Süleyman həm ana, həm də ata tərəfdən Səfəvilər sülaləsinin qanını daşıyırdı. O, anadan olarkən valideynləri onun da digər Səfəvi şahzadələri kimi öldürüləcəyini və ya kor ediləcəyini gözləmiş, amma Şah Sultan Hüseyn belə bir qəddar hərəkətə razı olmayıb bacısı oğlunu salamat buraxmış, hətta adını da özü qoymuşdu.

İsfahanın mühasirəsi zamanı Şah Sultan Hüseynin göstərişi ilə Seyid Məhəmməd öz anası və iki xalası (şahın digər iki bacısı) ilə birlikdə şəhərdən qaçmış və dayısı Təhmasib Mirzəyə (gələcək *II Şah Təhmasib*) qoşulmuşdu. Tədricən öz nüfuzunu artıran Seyid Məhəmməd dayısı tərəfindən qısqanclıqla qarşılansa da, öz həyatını qoruya bildi. İsfahan azad edildikdən sonra şəhərə qayıdan II Təhmasib onu da yanına çağırdı. Daha sonralar Nadir xan Əfşar (gələcək *Nadir şah*) II Şah Təhmasibi Xorasana yolladığı zaman Seyid Məhəmməd Mirzənin anası Şəhrəbanu bəyim də əvvəlcə qardaşının ardınca getdi, onun ölümündən sonra yenidən İsfahana, oğlunun yanına qayıtdı. Nadir şahın zamanında Seyid Məhəmməd Mirzə Xorasana çağırıldı, ona bütün ölkənin *sədrliyi* (ali ruhani mənsəb) və Məşhəd ziyarətgahının müdirliyi vəd edildi. Lakin Şəhrəbanu bəyim bu dəvətin sətiraltı mənasını anlayaraq oğlunu getməyə qoymadı və Nadir şaha xəbər göndərərək bu fikirdən daşınmasını, oğlunu rahat buraxmasını istədi. Yalnız anasının vəfatından (1742) sonra Seyid Məhəmməd Mirzə Nadir şahın əmri ilə Məşhədə yola düşdü və İmam Rza (ə) hərəminin mütəvəllisi (müdiri) vəzifəsinə təyin edildi.

Nadir şahın vəfatından (1747) sonra qardaşı oğlu Adil şah Seyid Məhəmməd Mirzənin Məşhəddə qalmasını öz hakimiyyəti üçün təhlükə hesab edərək onu nəzarət altında, göz qabağında saxlamaq qərarına gəldi. Bu məqsədlə Seyid Məhəmməd sədr vəzifəsinə təyin edildi və şahın məiyyətində bütün yürüşlərə qatılmasına əmr verildi. Adil şah öz qardaşı İbrahim şah tərəfindən məğlub edildikdən sonra Seyid Məhəmməd Mirzə sədr vəzifəsini qoruyub saxladı, üstəlik Qum şəhərindəki həzrət Məsumə (ə) ziyarətgahının təmiri də ona həvalə olundu.

1748-ci ildə Nadir şahın nəvəsi Şahrux hakimiyyətə keçdi. Eyni zamanda Şah Sultan Hüseynin də qız nəvəsi olan Şahrux öz əmiləri Adil şahla İbrahim şah üzərində qələbə çalıb onları öldürdü. Şahrux Seyid Məhəmməd Mirzəni də aradan götürməyə cəhd etdi, amma



buna nail ola bilmədi. Əksinə, ətrafındakılar onu taxtdan salıb kor etdilər, Seyid Məhəmməd Mirzə Məşhəddə şah elan edildi. 1750-ci ilin əvvəllərində taxta çıxmış Seyid Məhəmməd Mirzə özünə II Şah Süleyman adını götürdü. Onun hakimiyyəti cəmi 2 ay (bəzi məlumatlara görə, 40 gün) davam etmişdir. II Şah Süleyman hakimiyyətə keçən kimi əhalinin 3 illik vergisini ləğv etdi. Onsuz da boş olan xəzinəyə bu yolla külli miqdarda ziyan dəydiyini iddia edən dövlət adamları çevriliş edərək onu taxtdan saldılar, kor Şahrux xanı yenidən hakimiyyətə qaytardılar.

II Şah Süleyman dayısı qızı (Şah Sultan Hüseynin qızı) Xanağa bəyimlə ailə qurmuşdur, ikisi bu izdivacdan olmaqla beş oğlu vardı. O, hakimiyyətdən salındıqdan sonra yaşca böyük olan iki oğlunu İraqa göndərmiş, üç oğlunu yanında saxlamışdı. İraqa yola düşmüş oğullarından Sultan Davud Mirzə sonralar Benqal ölkəsinə (Hindistanın şərqi) hicrət etmiş, o biri oğlu Sultan Əli Mirzə əvvəlcə hakimiyyət iddiasına qalxan *II Şah Hüseynə* qoşulmuş, döyüşdə yaralandıqdan sonra o da Benqala köçmüşdü. Oğlu Sultan Haşim Mirzə öz nəslinin tarixindən bəhs edən "Zəburi-ali-Davud" əsərini qələmə almışdır.

II Şah Süleyman 1763-cü ildə vəfat etmişdir. O, Səfəvi taxtının daha bir iddiaçısı olan Seyid Əhməd şahın əmisidir.

***Mənbələr:*** *Mirzə Məhəmməd Xəlil Mərəşi Səfəvi. Məcmə ət-təvarix (nəşrə hazırlayan: A.İqbal), s.90-97, 138-144; Lüğətnameyi-Dehxuda, IX, 13743; Sultan Haşim Mirzə. Zəburi-Ali-Davud (nəşrə hazırlayan: Ə.Nəvai).*

**III İSMAYIL** (1733-73) – Səfəvi sülaləsinin nümayəndəsi, Səfəvilər dövlətinin süqutundan bir müddət sonra özünü şah və Səfəvi sülaləsinin hüquqi varisi elan etmiş şəxs. Əsl adı Əbu Turab Mirzədir. Anası *Şah Sultan Hüseynin qızı Məryəm bəyim*, atası *Sultan əl-üləma* Seyid Hüseyn Mərəşi Amulinin (vəf. 1654) nəvəsi, *sədr* vəzifəsində xidmət edən Mirzə Mürtəza Xəlifə Sultani idi. Onların izdivacı 1731-ci ildə baş tutmuş, bu evlilikdən Əhməd Mirzə və Əbu Turab Mirzə adlı iki oğul doğulmuşdur. Əhməd Mirzə *II Şah Təhmasibin* qızı İsmət bəyimlə ailə qurmuşdu və "Niyazi" təxəllüsü ilə şeirlər yazırdı.

*Nadir şahın* vəfatından sonra başlamış qarışıqlıqdan istifadə edən Səfəvilər sülaləsinin mənsubu Seyid Məhəmməd Mirzə (*III Şah İsmayılın* xalası oğlu) 1750-ci ildə Xorasanda özünü *II Süleyman* adı ilə şah elan etdi. O, qısamüddətli hakimiyyətdən sonra taxtdan salındı və Nadir şahın nəvəsi Şahrux, kor olmasına baxmayaraq, yenidən dövlət başına qaytarıldı.

Bundan sonra Zəndilər sülaləsindən Kərim xan və Bəxtiyari tayfasından Əlimərdan xan İsfahanda Əbu Turab Mirzəni taxta çıxardılar. 17 yaşlı yeni şah özünə III İsmayıl adını götürdü. Əslində onun dövlət idarəçiliyində heç bir rolu yox idi, ölkəni onun vəkili qismində əvvəlcə Əlimərdan xan Bəxtiyari, daha sonra Kərim xan Zənd idarə edirdilər. Şah Sultan Hüseynin qızı, Nadir şahın dul xanımı *Raziyyə bəyim* də dövlətdə yüksək mövqeyə malik idi.

O zamanın hakimləri III Şah İsmayıldan öz hakimiyyətlərinə legitimlik qazandırmaq üçün istifadə edirdilər. Onun formal şəkildə hakimiyyətə gətirilməsi etirazçı qüvvələri sakitləşdirmək məqsədi daşıyırdı. Ağa Məhəmməd xan Qacar Kərim xan Zəndlə mübarizədə qalib gəldikdən sonra III Şah İsmayıl Qacar tayfasına qoşuldu, üstünlük yenidən Zəndilərə qayıtdıqda o da mövqeyini dəyişərək əvvəlki himayədarının yanına qayıtdı. Bu dəfə Kərim xan Zənd onu taxtdan endirməsə də, soyuq qarşıladı və İsfahanla Şiraz arasındakı Abadə məntəqəsində ondan ötrü imarət tikdirdi. Burada, faktiki olaraq, məhbus həyatı yaşayan III Şah İsmayıl 1773-cü ildə dünyasını dəyişdi.

III Şah İsmayılın oğlu Heydər Mirzə Zəndilər sülaləsinin himayəsi altında olmuş, qızı Ziynət ən-nisa bəyim Qacarlar sülaləsindən Ağa Məhəmməd şahın qardaşı Rzaqulu xan Qacara ərə getmişdi.

***Mənbələr:*** *Mirzə Məhəmməd Xəlil Mərəşi Səfəvi. Məcmə ət-təvarix (nəşrə hazırlayan: Abbas İqbal), s.144-145; L.D.Neyyiri, Ə.M.Əl-Qaim və Ə.Cəfəri. Səfəvilərin legitimlik böhranı və III İsmayılın hakimiyyət məsələsi (İsfahan Universiteti Ədəbiyyat və humanitar elmlər fakültəsinin elmi araşdırma dərgisi, 1386 h.-ş., №50), s.1-16; Lüğətnameyi-Dehxuda, II, 2537; J.R.Perry. The Last Safavids, 1722-73 (British Institute of Persian Studies, Vol. 9, 1971), pp.59-69.*

**II HÜSEYN** (vəf. 1775) – Səfəvi sülaləsinin nümayəndəsi, Səfəvilər dövlətinin süqutundan bir müddət sonra özünü şah və Səfəvi sülaləsinin hüquqi varisi elan etmiş şəxs. *II Şah Təhmasibin* oğlu, *Şah Sultan Hüseynin* nəvəsidir. Anası gürcü mənşəli idi. II Şah Təhmasiblə böyük oğlu *III Şah Abbas Nadir şahın* oğlu Rzaqulu xanln əmri ilə öldürüldükdən (1740) sonra 6 aylıq şahzadə Hüseyni dayısı Mənuçöhr bəy gizlicə Səbzəvardan qaçıraraq Azərbaycana gətirdi. Hüseynin uşaqlıq illəri Dağıstan və Gürcüstanda qaçqınlıq şəraitində keçdi.

Nadir şahın qətlindən (1747) sonra şahzadə Hüseyn anası və dayısı ilə birlikdə İraqa mühacirət etdi. Burada Nadir şahın Osmanlı dövlətindəki səfiri Mustafa xan Şamlu onunla görüşüb əsil-nəsəbinin düzgün olub-olmadığını yoxladı və Hüseynin Səfəvi soyundan gəldiyinə əmin olduqdan sonra onu Kərbəladakı *Raziyyə bəyimin* yanına apardı (II Şah Təhmasibin bibisi və Nadir şahın dul xanımı Raziyyə bəyim o zamanlar İraqda məskunlaşmışdı).

Bu arada Kərim xan Zəndə məğlub olduqdan sonra İraqa sığınmış Əlimərdan xan Bəxtiyari onun haqqında məlumat aldı. Şahzadə Hüseynin mövcudluğu Əlimərdan xana imkan verdi ki, Səfəvilər dövlətinin irsi uğrunda mübarizəyə qalxmış Zəndi və Qacarlara, onların himayəsi altında yaşayan III Şah İsmayıla qarşı rəqabət səhnəsinə yenidən daxil olsun. Bəxtiyarilər və digər lur tayfaları hər tərəfdən İraqa axışıb onun ətrafında birləşdilər. Əlimərdan xan Bəxtiyari və Mustafa xan Şamlu şahzadə Hüseyni hakimiyyətə gəlməyə çətinliklə də olsa razı saldılar. 1752-ci ildə o, II Şah Hüseyn adı ilə taxta çıxdı və hər iki sərkər-



dənin müşayiəti ilə Kirmanşaha gədi. Hutəki tayfasından olan əfqan sərkərdəsi Azad xan, Xorasanda qısa hakimiyyətdən sonra taxtdan salınmış II Şah Süleymanın oğlu Sultan Əli Mirzə də ona qoşuldular. Lakin Kərim xan Zəndin böyük qoşunla Kirmanşah üzərinə yeridiyini eşidən şəhər müdafiəçiləri təslim olmağa qərar verdilər. Kirmanşahın süqutundan sonra Əlimərdan xan Bəxtiyari şəhər hakimi təyin olunsa da, məğlubiyyətlə razılaşmayıb müqavimət göstərməyə cəhd etdi. Döyüşdə Kərim xan Zənd qalib gəldi, Əlimərdan xan qaçıb canını qurtardı, Mustafa xan Şamlu isə yaralı halda əsir düşdü.

Məğlubiyyətdən ümidsizliyə düçar olmuş Əlimərdan xan II Şah Hüseynin gözlərini çıxardı, bundan sonra kor şah qalan ömrünü Kərbəlada ibadətlə başa vurdu. Kərim xan Zənd onun üçün təqaüd ayırmaq istəsə də, II Şah Hüseyn buna razı olmamışdı. Onun oğullarından biri körpə ikən vəfat etmişdir, digər oğlu Əbülfəth Məhəmməd Mirzə (gələcək *II Şah Məhəmməd*) atasının vəfatı zamanı təqribən 2 yaşında idi. O, böyüdükdən sonra Səfəvilər sülaləsinin hakimiyyətə iddialı olan son nümayəndəsi kimi tarixə düşmüşdür.

II Şah Hüseyn 1775-ci ildə dünyasını dəyişmiş və Kərbəlada dəfn olunmuşdur.

***Mənbələr:*** *J.R.Perry. The Last Safavids, 1722-73 (British Institute of Persian Studies, Vol. 9, 1971), p.63; Fəvaid əs-Səfəviyyə (nəşrə hazırlayan: M.Mirəhmədi), s.92-94; Əbülhəsən Gülüstanə. Mücməl ət-təvarix (nəşrə hazırlayan: M.Rezəvi), s.474-477.*

**II MƏHƏMMƏD** (1773-1816) – Səfəvi sülaləsinin nümayəndəsi, Səfəvilər dövlətinin süqutundan bir müddət sonra şah və Səfəvi sülaləsinin hüquqi varisi elan edilmiş şəxs. *II Şah Təhmasibin nəvəsi*, bundan əvvəl özünü şah elan etmiş *II Hüseynin* oğlu. Anası da Səfəvi sülaləsindən idi. Əbülfəth künyəli Məhəmməd Mirzə atasının vəfatı zamanı təqribən 2 yaşında idi. Kərbəlada dünyaya gəlmiş, orada mükəmməl dini təhsil almışdı. Gənc yaşlarında İmam Rzanın (ə) məzarını ziyarət etmək məqsədilə Məşhədə gəlmiş, burada *Nadir şahın* nəvəsi (həm də ana tərəfdən Səfəvilər sülaləsinə mənsub olan) Şahrux xan onunla görüşmüşdü. Şahrux xan hakimiyyətini möhkəmlətmək üçün öz oğlunu Məhəmməd Mirzənin bacısı ilə evləndirmək istəmiş, amma bu izdivac baş tutmamışdı.

Kərim xan Zəndin ölümündən sonra başlamış qarışıqlıq şəraitində Qacar tayfasından Məhəmməd xan (gələcək Ağa Məhəmməd şah Qacar) hakimiyyətə keçmək üçün onu öz tərəfinə cəlb etmək qərarına gəldi. Bundan əvvəl Məhəmməd xanın atası Məhəmməd Həsən xan Qacar da öz hakimiyyətinə legitimlik qazandırmaq üçün *III Şah İsmayıldan* istifadə etmişdi. Məhəmməd xan Qacar o zamanlar Xorasanda olan Məhəmməd Mirzəni şah kimi qəbul etdiyini bildirərək onun adından Tehranda pul zərb etdirdi. Lakin Xorasan hakimlərinin səyi nəticəsində onların danışıqları nəticəsiz qaldı və Məhəmməd Mirzə Şiraza getdi. O, burada da siyasi oyunlara çəkildiyini hiss etdiyi üçün 1791-ci ildə həcc ziya-

rəti bəhanəsi ilə yola çıxdı, Omandan keçərək Sind vilayətində (Qərbi Hindistan) bir müddət qaldı. Burada Məhəmməd Mirzəni Səfəvi sülaləsinin tərəfdarı olan kürd tayfaları mehribanlıqla qarşıladılar. Daha sonra o, həcc ziyarətinə hazırlaşmaq üçün Hindistan ərazisinə keçdi, lakin iqlim dəyişikliyi səhhətinə mənfi təsir göstərdiyinə görə həcc niyyətindən daşınmalı oldu. Lahurda bir müddət qaldıqdan sonra Məhəmməd Mirzə Pişavərə getməyi qərara aldı, amma yolda ikən fikrini dəyişib Dehliyə sarı üz tutdu. O, Böyük Moğol imperatoru II Şah Aləmin himayəsinə keçmək fikrində idi, bu arada imperatorun saray çevrilişi nəticəsində taxtdan endirilməsi xəbəri yayıldı. Məhəmməd Mirzə Lakhnauya gedib İngiltərinin Şərqi Hindistan kompaniyasının qərargahında məskunlaşdı. O, ömrünün sonunadək Lakhnauda yaşamış, 1816-cı ildə burada dünyasını dəyişmişdir.

Əbülfəth Məhəmməd Mirzə ədəbi fəaliyyətlə də məşğul olurdu, "Əxlaqi-Mühəmmədi", "Töhfət əs-səlatini-Səfəviyyə", "Töhfət əş-şüəra", "Töhfət əl-əhbab" və digər kitablar onun qələmindən çıxmışdır. 5 min beyt həcmində divanının olduğunu yazırlar. Səfəvilər dövlətinin süqutundan sonra taxt-taca iddialı olanların fəaliyyətindən bəhs edən "Fəvaid əs-Səfəviyyə" kitabı ona ithaf olunmuşdur.

***Mənbələr:*** *Ə.H.Mehdəvi. Hökmdarlıq iddiası etmiş sonuncu Səfəvi şahzadəsi ("Siyasi-iqtisadi xəbərlər" dərgisi, 1387 h.-ş., №258), s.160-167; Əbülhəsən Qəzvini. Fəvaid əs-Səfəviyyə (nəşrə hazırlayan: Məryəm Mirəhmədi), s.96-115; Əbülhəsən Gülüstanə. Mücməl ət-təvarix (nəşrə hazırlayan: Müdərris Rezəvi), s.477.*





**SƏFƏVİLƏR SÜLALƏSİ** – müsəlman Şərq torpaqlarının böyük bir hissəsində təqribən iki əsr yarım müddətində (1501-1736) hökm sürmüş sülalə. Sülalənin adı XIII-XIV əsrlərdə yaşamış görkəmli təsəvvüf xadimi *Şeyx Səfiəddin Ərdəbilinin* adından götürülmüş, onun yaratdığı sufi təriqəti səfəviyyə, nəsli isə Səfəvilər adlandırılmışdır. Bu sülalənin mənşəyi və etnik mənsubiyyəti barədə elmi dairələrdə mübahisəli fikir ayrılığı vardır. Bəzi tədqiqatçılar onları kürd, bəziləri fars mənşəli hesab etmişlər. Səfəvilər sülaləsinin *seyid* olması və yeddinci *imam Musa Kazimin (ə)* imamzadə Həmzə adlı övladından törəməsi barədə fikir də geniş yayılmışdır; lakin bəzi tədqiqatçılar bu şəcərənin Səfəvilər dövründə hakimiyyəti legitimləşdirmək məqsədilə uydurulduğunu iddia edirlər. Əksər ciddi araşdırmalar Səfəvilər sülaləsinin türk (Azərbaycan) mənşəli olduğunu təsdiq edir, Səfəvi şahlarının Azərbaycan dilini öz ana dili hesab etmələri, dövlətin türk mənşəli *qızılbaş tayfalarına* dayaqlanması, hakim vəzifələrə türk qızılbaş mənşəli əyanların irəli çəkilməsi, Azərbaycan türkcəsinin saray, ordu və məişət səviyyəsində hegemon mövqeyə malik olması da bunu sübut edir.

Səfəvilər sülaləsinin tarixini şərti olaraq iki mərhələyə bölür, 1501-ci ilə kimi olan dövrü şeyxlik, 1501-1736-cı illər arasındakı dövrü isə şahlıq mərhələləri adlandırırlar.

Səfəvi şəcərəsinin zamanca daha qədim nümayəndələrinin həyatı barədə məlumatlar az, bəzən isə yox dərəcəsindədir. Bu nəslin nisbətən daha çox tanınmış ilk nümayəndəsi *Firuz şah Zərrinkülah* sayılır. XIV əsrin ortalarında Şeyx Səfiəddin Ərdəbili öz sufi təlimlərini (*səfəviyyə təriqətini*) müstəqil şəkildə yaymış, onun xələfləri də bu təriqəti təbliğ etmişlər. Təqribən 200 il ərzində Səfəvilər fəal təriqət həyatı yaşamış, Ərdəbil *xanəgahının* bölgədə nüfuzunu artırmaqla və bu xanəgahdan idarə olunan təriqət şəbəkəsini inkişaf etdirməklə məşğul olmuşlar. *Şeyx Sədrəddin Musa, Xacə Əli Siyahpuş* və *İbrahim Şeyxşah* on minlərlə səfəviyyə müridinin mənəvi rəhbəri (*mürşidi-kamili*) idilər. *Şeyx Cüneyd* və *Şeyx Heydər* səfəviyyəni sufi təriqəti çərçivəsindən və xanəgah miqyasından çıxararaq hərbi-siyasi gücə çevirmiş, onun möhkəm silahlı bazasını qurmuşlar. XV əsrin sonlarında Səfəvi şeyxləri Anadolu, Azərbaycan, Mərkəzi İran, İraq, Suriya, Xorasan, Orta Asiya və digər bölgələrdə yaşayan böyük *qızılbaş* kütləsinin dini lideri və sərkərdəsi idilər, bu məntəqələrdəki tərəfdarlarını öz canişinləri (*xəlifələr*) vasitəsilə idarə edirdilər. *Vəqf* torpaqlarından gələn gəlirlər, *müridlərdən* toplanan nəzirlər, hərbi yürüşlərdən əldə edilən qənimətlər hesabına təriqət iqtisadi baxımdan da xeyli güclənmişdi.

1501-ci ildə *I Şah İsmayılın* Təbrizdə taxta çıxaraq özünü şah elan etməsi ilə Səfəvilər sülaləsi müsəlman Şərqinin ən güclü imperiyalarından birinin hökmdarı olaraq siyasət meydanına daxil oldu. 1736-cı ildə Səfəvilər dövləti süqut edənə kimi bu sülalənin 11 hökmdarı haki-

miyyətdə bir-birini əvəz etdi: *I Şah İsmayıl* (1501-1524), *I Şah Təhmasib* (1524-1576), *II Şah İsmayıl* (1576-1577), *Şah Məhəmməd Xudabəndə* (1578-1587), *I Şah Abbas* (1587-1629), *I Şah Səfi* (1629-1642), *II Şah Abbas* (1642-1667), *I Şah Süleyman* (1667-1694), *Şah Sultan H*üseyn (1694-1722), *II Şah Təhmasib* (1722-1732) və *III Şah Abbas* (1732-1736). Öz hərbi və siyasi karyerasına Səfəvi ordusunun sərkərdəsi kimi başlamış *Nadir xan Əfşar* 1736-cı ildə bu sülalənin sonuncu hökmdarı azyaşlı III Abbası hakimiyyətdən salaraq özünü şah elan etmişdir. Rəsmi tarixşünaslıqda Səfəvilər dövlətinin süqutu 1736-cı il qəbul edilsə də, həmin tarixdən sonra bu sülalənin bir neçə nümayəndəsi özünü taxt-tacın varisi elan edərək hakimiyyət iddiasına qalxmış, amma müstəqil hökm sürmək gücündə olmadıqları üçün ya Əfşar, Zənd və Qacar hakimləri tərəfindən aradan götürülmüş, ya da onların əlində oyuncağa çevrilmişlər (*Əhməd şah Səfəvi, Sam Mirzə, II Şah Süleyman, III Şah İsmayıl, II Şah Hüseyn, II Şah Məhəmməd*).

Səfəvilər sülaləsinin hakimiyyətdə olan nümayəndələri (xüsusilə ilk Səfəvi şahları), bir qayda olaraq, fiziki cəhətdən güclü olmuşlar. I Şah İsmayıl, I Şah Təhmasib, II Şah İsmayıl, I Şah Abbas hərb sənətini gözəl bilmiş, güclü strategiya hazırlığı sayəsində əksər döyüşləri qələbə ilə başa vurmuş, çətin vəziyyətlərdən minimal itki ilə çıxmağı bacarmışlar.

İlk Səfəvi şahları türk mənşəli qadınlardan doğulmuş, I Şah Abbasdan sonra hakimiyyətə gəlmiş şahlar isə İslamı qəbul etmiş qeyri-müsəlman (gürcü və çərkəz) əsilli qadınlardan dünyaya gəlmişlər. I Şah Abbas tərəfindən əsası qoyulmuş saraydaxili ənənəyə əsasən şahzadələr (xüsusilə vəliəhdlər) uşaqlıq və yeniyetməlik dövrünü hərəmxanada, qadınların və *xacələrin* əhatəsində keçirdikləri üçün ətraf mühitlə ünsiyyət, idarəçilik təcrübəsi, fiziki hazırlıq kimi bacarıqlardan məhrum idilər. Taxta çıxdıqdan sonra bu xüsusiyyətlər onların şəxsi xarakterində və hökmdarlıq siyasətində özünü göstərmişdir.

Ənənəyə uyğun olaraq, şahın yaşca böyük oğlu onun əsas varisi və canişini sayılır, vəliəhdliyi şah tərəfindən elan və təbliğ edilirdi. Böyük oğul şahın sağlığında vəfat etdikdə və ya hakimiyyətə yararlı sayılmadıqda növbə ondan sonrakı oğula keçirdi (I Şah Təhmasibin vəfatından sonra dövlət adamlarının əksəriyyəti onun yaşca böyük oğlu Məhəmməd Mirzəni sakit, intriqadan uzaq həyat tərzi sürdüyünə və gözlərinin zəifliyinə görə şahlığa layiq bilməmiş, üçüncü oğul *Heydər Mirzə* hakimiyyət iddiası ilə çıxış etdiyi zaman onu dəstəkləməmiş, ikinci oğul İsmayıl Mirzəni həbsdən azad edərək *II Şah İsmayıl* adı ilə taxta çıxarmışdı). Əgər şahın vəfatı zamanı oğul övladlarından heç biri sağ deyildisə, böyük nəvə hakimiyyətə gətirilirdi (I Şah Abbasdan sonra nəvəsi Sam Mirzə (gələcək I Şah Səfi) vəliəhd elan edilmişdi). Bəzən hakim sülaləyə mənsub şahzadələr dövlətə qarşı üsyan



qaldırmış əmirlərin əlində alətə çevrilir, əmirlər öz siyasi iddialarına legitimlik qazandırmaq üçün onlardan istifadə edirdilər (Şah Məhəmməd Xudabəndənin zamanında vəliəhd Həmzə Mirzəyə qarşı müxalifət cəbhəsinə keçmiş qüvvələr azyaşlı şahzadə *Təhmasib Mirzəni* saraydan oğurlayıb Qəzvində vəliəhd elan etmişdilər).

Şahbanular (şah xanımları) sarayda kifayət qədər böyük nüfuza malik olduqları üçün vəliəhd seçkisinə, yüksək dövlət vəzifələrinə edilən təyinatlara təsir göstərə bilirdilər. Xüsusilə I Şah Abbasdan sonrakı Səfəvi hökmdarları üzərində hərəmxananın təsiri çox güclü olmuşdur.

Səfəvi sülaləsindən olan oğul şahzadələr, bir qayda olaraq, ya sülalədaxili nikahla evlənir, ya da şahın məsləhəti ilə nüfuzlu qızılbaş ailələrindən biri ilə qohum olurdular. Bəzi hallarda onlar qonşu dövlətlərin yüksək rütbəli əyanlarının, xüsusilə gürcü feodallarının qızları ilə evləndirilirdilər. Sülalənin qız övladları da dövlətdə xüsusi yeri olan qızılbaş əmirlərinə və ya nüfuzlu seyid nəsillərinin nümayəndələrinə ərə verilirdi.

Orta əsrdə əksər saraylarda olduğu kimi, Səfəvilər dövlətinin ilk onilliklərindən etibarən sülalədaxili çəkişmələr müşahidə edilmiş, şahın yaxın qohumları (qardaş və ya oğulları) hakimiyyəti ələ keçirməyə çalışmışlar. I Şah İsmayılın zamanında qardaşı *Süleyman Mirzənin*, I Şah Təhmasib zamanında qardaşları *Sam Mirzə* və *Əlqas Mirzənin* çevriliş cəhdləri buna misaldır. I Şah Abbasdan başlayaraq Səfəvi şahları hakimiyyətdə möhkəmlənmək, çevrilişlərin qarşısını almaq məqsədilə öz yaxın qohumlarını zərərsizləşdirmişlər. Hakimiyyətdə olmuş 11 Səfəvi şahından üçünün qətlə yetirilərək öldürülməsi dəqiq məlumdur (Şah Sultan Hüseyn 1726-cı ildə *Əşrəf şah Hutəki* tərəfindən edam edilmişdir, II Şah Təhmasib və oğlu III Şah Abbas isə 1739/40-cı illərdə Nadir şah Əfşarın oğlu Rzaqulu Mirzənin göstərişi ilə öldürülmüşlər). Bəzi Səfəvi şahlarının ölümü müəmmalı tərzdə baş verdiyindən zəhərlənmə və sui-qəsd ehtimalları yaranmışdır (II Şah İsmayıl).

Səfəvi şahlarından bəziləri şairlik təbinə malik olmuş və şeir yazmışlar (I Şah İsmayıl, I Şah Təhmasib, Şah Məhəmməd Xudabəndə, II Şah İsmayıl, I Şah Abbas). Onlar ədəbiyyat və incəsənəti himayə edir, xəttat və nəqqaşların, memar və musiqiçilərin fəaliyyətinə yardım göstərirdilər.

***Mənbələr:*** *C.Bayramlı, V.Zifəroğlu. Azərbaycan hökmdarları: Səfəvilər; Christopher Buyers. The Safawi Dynasty, Cenealogy; Oqtay Əfəndiyev. Azərbaycan Səfəvilər dövləti; Nizami Süleymanov. Azərbaycan Səfəvi dövləti (1501-1736-cı illər); Şeyx Hüseyn Pirzadə Zahidi. Silsilət ən-nəsəbi-Səfəviyyə; Məhəmməd Möhsin Mustovfi. Zübdət ət-təvarix (nəşrə hazırlayan: Bəhruz Gudərzi); Z.Rizayi, N.Cədidi və M.K.Yusifcəmali. Səfəvilər dövründə vəliəhd seçimində sarayın nüfuzlu şəxslərinin rolu barədə araşdırma (Tarix elmi araşdırma dərgisi, 1401 h.-ş., № 64), s.188-215; К.Рыжов. Все монархи*

*мира. Мусульманский Восток, XV-XX вв., стр.407-412; Р.Мехтиев. Шах Исмаил Сефеви: портрет правителя и воина (ч. I), стр.63-142; Z.Bayramlı. "Silsilət ən-nəsəbi-Səfəviyyə" əsəri Azərbaycan tarixinin mənbəyi kimi, s.57-80; The Cambridge History of İran, vol. 6, pp.189-350; The Encyclopaedia of Islam, VIII, 765-766; Türkiye Diyanet Vakfı İslam Ansiklopedisi, XXXV, 451-455.*



**ALƏMŞAH BƏYİM** (1460-1522/23) – *I Şah İsmayılın* anası. Əsl adı Həlimə xatun olmuş, orta əsrlər Şərq ənənəsinə görə mənbələrdə adətən öz adı ilə deyil, ləqəbi ilə tanınmışdır. Bəzi Avropa mənbələrində adı Marta kimi qeyd edilir. Ağqoyunlu hökmdarı *Uzun Həsənlə* Trabzon (Trapezund) imperatoru IV Böyük İohann Komninin (ləqəbi Kalo-İoannes – "gözəl İohann") qızı Teodoranın (*Dəspinə xatun*) izdivacından təqribən 1460-cı ildə doğulmuşdur. Siyasi izdivaclardan sayılan bu evlilik osmanlılara qarşı müttəfiqliyin göstəricisi idi.

Uzun Həsən həyatının sonlarlına yaxın Aləmşah bəyimi *Şeyx Cüneydin* oğlu *Şeyx Heydərə* ərə vermişdi. Şeyx Heydər Aləmşah bəyimin bibisi oğlu sayılırdı, çünki Uzun Həsənin bacısı Xədicə bəyim Şeyx Cüneydin xanımı idi və o zamanlar atasını itirmiş Şeyx Heydər Uzun Həsənin himayəsi altında yaşayırdı. Uzun Həsənin 1478-ci ilin əvvəllərində vəfat etdiyini nəzərə alaraq bu izdivac zamanı Aləmşah bəyimin təqribən 17 yaşında olduğu ehtimal edilir. Aləmşah bəyimlə Şeyx Heydər altı övlad sahibi olmuşlar, bu övladların üçü oğlan, üçü isə qızdır. Oğulları *Sultan Əli, İbrahim Mirzə* və İsmayıl Mirzədir (gələcək I Şah İsmayıl). Qızları Fəxri-cahan xanım qızılbaş sərkərdəsi *Bayram bəy Qaramanlu* ilə, Fatimə sultan digər qızılbaş sərkərdəsi *Məhəmməd xan Ustaclu* ilə, daha bir qızı isə Hisni-keyf hakimi Sultan Xəlillə ailə qurmuşdur.

Aləmşah bəyim keşməkeşli həyat yaşamış, evlilikdən az sonra ərini itirmişdir (1488). Bundan sonrakı bir neçə il ərzində o, Şeyx Heydərin yadigarlarının yanında olmuş, həbsxanada da öz övladlarını tərk etməmişdir. Ağqoyunlu Sultan Yaqubun əmrinə əsasən övladları ilə birlikdə İstəxr qalasında dörd ildən artıq məhbus həyatı yaşamış Aləmşah bəyim I Şah İsmayılın təlim-tərbiyəsində mühüm rol oynamışdır. Ağqoyunlu Rüstəm padşahın hakimiyyətə gəlişindən sonra Aləmşah bəyim övladları ilə birlikdə həbsdən azad edilmiş və Təbrizə, oradan Ərdəbilə göndərilmişdir. Bunun səbəbi Rüstəm padşahın öz rəqiblərinə qarşı mübarizədə Aləmşah bəyimin böyük oğlu Sultan Əli Mirzənin nüfuzundan və hərbi bacarığından faydalanmaq istəyi idi.

1494-cü ildə Sultan Əli Rüstəm padşahın əli ilə aradan götürülür, İbrahim Mirzə ilə İsmayıl Mirzə sadiq qızılbaş əmirləri tərəfindən Ərdəbildə gizlədilir. Bu zaman Şeyx Heydərin Ərdəbildəki evində məskunlaşan Aləmşah bəyim təzyiq altında yaşamış, evi daim axtarış və talanlara məruz qalmışdır. Lakin şəhərdəki qızılbaşlar ona dayaq olmuş və maddi sıxıntı çəkməsinə imkan vermə-



mişlər.
Aləmşah bəyim övladlarının Ərdəbildə qalmasının təhlükəli olduğunu anlayaraq qızılbaş əmirlərinə məsləhət görür ki, onları Gilana aparıb orada gizli saxlasınlar. Bir müddətdən sonra İbrahim Mirzə yenidən anasının yanına Ərdəbilə qayıdır, səfəviyyə təriqətinin *mürşidi* olan İsmayıl Mirzə isə Gilanda qalır. 1499-cu ildə I Şah İsmayıl siyasi və hərbi fəaliyyətə başladığı zaman Aləmşah bəyim bütün mümkün yollarla ona yardım etmişdir. Mənbələrin verdiyi məlumata görə, o, Ərdəbildəki vəziyyət, Ağqoyunluların planları barədə mütəmadi olaraq oğlunu məlumatlandırmış, bir neçə dəfə onu pusqudan xilas etmişdir.

I Şah İsmayılın hakimiyyətə gəlişindən sonra Aləmşah bəyimin həyatı barədə mənbələrdə məlumat yox dərəcəsindədir. Bunun əsas səbəbi onun, bəzi digər Səfəvi şahbanularından fərqli olaraq, siyasi hakimiyyətə və intriqalara meyil göstərməməsi, saray həyatından uzaq durması və Ərdəbildə adi həyat tərzi sürməyə üstünlük verməsi olmuşdur. Məlum olduğu kimi, Səfəvi salnamələrində şah ailəsinə məxsus qadınların adı, demək olar ki, yalnız onların siyasi hadisələrdəki rolu ilə bağlı çəkilir. Aləmşah bəyim siyasi proseslərdən uzaq durduğu və ibadətə bağlandığı üçün adı klassik mənbələrdə az çəkilmişdir.

I Şah İsmayılın 1501-ci ildə hakimiyyətə gəldikdən sonra guya öz anasını öldürməsi barədə yazılanlar həqiqətə uyğun deyil. Əvvəla, bu şayiələr üçün əsas rolunu oynamış italyan səyyahları Katerino Zeno, Giovan Maria Angiolello və bir venesiyalı tacirin yazdıqları etibarlı sayıla bilməz. Katerino Zeno öz xatirələrində bu məsələ ilə bağlı məlumat verərkən birmənalı olaraq “analıq” (ögey ana) ifadəsini işlətmişdir, həmin səyahətnamənin italyan dilindəki orijinal mətnlərində, eləcə də digər dillərə tərcümələrdə bu, açıq şəkildə görünür. Giovan Maria Angiolello və venesiyalı tacirin isə bu məsələ ilə bağlı verdikləri məlumatda mövcud olan qeyri-dəqiqliklər və ziddiyyətlər onların həqiqəti əks etdirmədiyini və digər qərəzli mənbələrdən götürüldüyünü göstərir. İkincisi, Ərdəbildəki Şeyx Səfi türbəsinin həyətində, “Allah-Allah” günbəzinin yanında Aləmşah bəyimə aid olan məzar daşının üzərində onun hicri 929-cu ildə (miladi 1522/23-cü illər) vəfat etdiyi göstərilmişdir.

Aləmşah bəyimin daha iki doğma bacısı və Maqsud adlı bir doğma qardaşı olmuşdur. Maqsud atasının ölümündən sonrakı hakimiyyət davasında qardaşları tərəfindən aradan götürülmüşdür. Bacılarından Məryəm bəyim 1503-cü ildə İsfahanda yaşayırdı. Ağqoyunlu Sultan Murad üzərində qələbədən sonra İsfahanı fəth etmiş I Şah İsmayıl orada xalası Məryəm bəyimlə görüşmüşdü. Həmin görüş zamanı Məryəm bəyim öz bacısının vəziyyəti ilə maraqlanmış və I Şah İsmayıl anası Aləmşah bəyimin sağsalamat olduğunu ona xəbər vermişdi. Bu məlumat da Aləmşah bəyimin guya 1501-ci ildə I Şah İsmayıl tərəfindən

öldürüldüyü şayiəsinin yalan olduğunu göstərir.

***Mənbələr:*** *Namiq Musalı. Şah İsmayıl Xətainin anası Aləmşah bəyim: əfsanələr və həqiqətlər (Alevilik-Bektaşilik Araştırmaları Dergisi/2016/13), s.35-59; M.K.Yusifcəmali. I Şah İsmayılın həyatı, s.47 və 192; Namiq Musalı. I Şah İsmayılın hakimiyyəti ("Tarix-i aləmara-yi Şah İsmayıl" əsəri əsasında), s.102 və 111; Walther Hinz. Uzun Hasan ve Şeyh Cüneyd (türkcə tərcümə: Tevfik Bıyıklıoğlu), s.63; Mehman Süleymanov. Səfəvilər, II, 116-117.*

**ANA XANIM** – I Şah Təhmasibin qızı Zeynəb bəyimin ləqəbi.
bax: **ZEYNƏB BƏYİM**.

**ANA XANIM** (vəf. 1647) – Səfəvi şahbanusu, *I Şah Səfinin* xanımı, *II Şah Abbasın* anası. Çərkəz mənşəlidir. Əsl adı Anna olmuş, Səfəvi mənbələrində Ana xanım kimi xatırlanmışdır. II Şah Abbasın hakimiyyəti zamanı idarəçilik yüksək rütbəli məmurlardan üçünün əlində cəmlənmişdi: baş vəzir *Saru Tağı*, *qorçubaşı* Canı xan Şamlu və *naziri-büyutat* Məhəmməd Əli xan. Saru Tağı hərəmxanaya sərbəst giriş imkanına malik olduğu üçün Ana xanımla bütün məsələləri rahat şəkildə müzakirə edə bilirdi. Nüfuz və maliyyə gəliri məsələsində maraqları birləşən bu qruplaşma özünün əsas rəqibi olan *sipəhsalar Rüstəm xanı* ortadan götürməyə nail oldu. Lakin bu qruplaşmanın daxilində qopan rəqabət düşmənçiliyə çevrildi, əvvəlcə Saru Tağı Canı xanın təşkil etdiyi sui-qəsd nəticəsində öldürüldü, bir neçə gündən sonra Canı xan özü də sui-qəsdin qurbanı oldu. Bəzi tədqiqatçılar onun aradan götürülməsində Ana xanımın əli olduğunu yazırlar. Öz müttəfiqi olan Saru Tağının qətlindən sonra Ana xanım Canı xanın yanına adam göndərib ona narazılığını bildirdi. Canı xan nəinki öz əməlinə görə peşmançılığını bildirmədi, əksinə, şahbanuya göndərdiyi cavabda Saru Tağının ünvanına ağır təhqiramiz ifadələr işlətdi və baş vəzirin bütün maliyyə fırıldaqlarının üstünü açacağı ilə şahbanunu hədələdi. Böyük ehtimalla, Ana xanım Canı xanın bu hədələri qarşısında onu aradan götürməklə baş vəzirin cinayətlərindəki öz rolunu gizlətmək istəmişdir. Bəzi məlumatlara görə, Canı xan Şamlu Ana xanıma qarşı sui-qəsd planlaşdırmış, amma şahbanu onu qabaqlayaraq qətlə yetirmişdi. Saru Tağının qətlindən sonra Səfəvilər soyundan olan *Xəlifə sultanın* baş vəzir təyin edilməsi nəticəsində (1645) şahın dövlət idarəçiliyində yeri möhkəmləndi, korrupsiya şəbəkələri ifşa edildi. Ana xanım saray daxilində *Dilaram xanımla* rəqabətdə qalib gəlsə də, az sonra özü də vəfat etdi. O, bir neçə tikinti-abadlıq layihəsini maliyyələşdirmişdir. İsfahanın Abbasabad məhəlləsindəki bir məscid və bir mədrəsə şahbanunun xeyriyyə fəaliyyətinin yadigarıdır.

Səfəvilər dövlətində uzun müddət yaşamış fransız səyyahı Jan Şarden şahların uşaqlıq illərində onların analarının dövlətdə böyük nüfuz qazanmalarının ənənəvi hal olduğunu qeyd edərək yazırdı:



“II Şah Abbasın anası da güclü məlikə-analardan biri olmaqla böyük nüfuz və mütləq güc sahibi idi. O, baş vəzirə çox inanırdı və onlar köməkləşib bütün işləri birlikdə həll edirdilər”.

***Mənbələr:*** *Rudi Matthee. Persia in Crisis: Safavid Decline and the Fall of Isfahan, pp.42-45; Sussan Babaie and etc. Slaves of The Shah: New Elites of Safavid Iran, pp.44-46, 161-162; Əbdülməcid Şüca. Səfəvilər dövründə qadın, siyasət və hərəmxana, s.156-158; Şardenin səyahətnaməsi (tərcümə: M.Abbasi), VII, 81-90; M.Mehmannəvaz. II Şah Abbas dövründəki saray rəqabətlərində Saru Tağının rolunun və yerinin təhlili (“İran və İslam tarixi araşdırmaları” dərgisi, 1399 h.-ş., № 27), s.247-270; Nəsrullah Fəlsəfi. Saru Tağının sərgüzəşti (“Səkkiz tarixi və ədəbi məqalə” kitabından), s.129-156.*

**ANA XATUN** – *I Şah İsmayılın* ögey anası, *Şeyx Heydərin* xanımı. Çərkəz əsilli Ana xatun Şeyx Heydərin Dağıstan səfərində əsir düşmüş, Şeyx Heydər cariyə qismində onunla evlənmişdir. Dağıstan səfərlərinin 1483-88-ci illər arasında baş verdiyini nəzərə alaraq bu evliliyin həmin zaman aralığında həyata keçdiyi ehtimal edilir. Ana xatunun həyat və fəaliyyəti, övladlarının sayı barədə dəqiq məlumat yoxdur. Məlum olan budur ki, o, I Şah İsmayılın zamanında (1513) üsyan qaldırıb öldürülmüş *Süleyman Mirzənin* anasıdır. Ana xatun *I Şah Təhmasibin* hakimiyyətinin əvvəllərinədək sağ idi. Süleyman Mirzə mərkəzi hakimiyyət əleyhinə qiyam qaldırmış olsa da, I Şah İsmayılın Ana xatuna münasibəti mənfi olmamışdır. Süleyman Mirzə qiyamdan əvvəl Təbriz hakimi təyin edildiyi üçün Ana xatun onun varisi olaraq vəfat edənədək Təbrizin gəlirindən təqaüd almışdır.

***Mənbələr:*** *Namiq Musalı. Səfəvi səltənətində ilk taxt davası: Süleyman Mirzə üsyanı (XVIII. Türk Tarih Kongresi, 1-5 Ekim 2018, Kongreye Sunulan Bildiriler, VI. Cilt), s.686; Namiq Musalı. Şah İsmayıl Xətainin anası Aləmşah bəyim: əfsanələr və həqiqətlər (Alevilik-Bektaşilik Araştırmaları Dergisi/2016/13), s.49; Namiq Musalı. I Şah İsmayılın hakimiyyəti (“Tarix-i aləmara-yi Şah İsmayıl” əsəri əsasında), s.316.*



**BƏDİÜZZAMAN MİRZƏ** (vəf. 1576) – Səfəvi şahzadəsi, *Bəhram Mirzənin* kiçik oğlu, I Şah İsmayılın nəvəsi. *Təkəlü* tayfasından *Şərəfəddinoğlu Məhəmməd xanın* oğlu Qazaq xan 1565-ci ildə Heratı ələ keçirib mərkəzi hakimiyyətə qarşı çıxdığı zaman I Şah Təhmasib *Məsum bəy Səfəvi, Araz xan Rumlu*, Heydər bəy Türkman, *Əmir Aslan xan Əfşar, İbrahim Mirzə* və qardaşı Bədiüzzaman Mirzəni böyük qoşunla üsyanı yatırtmağa göndərmiş, onlar tapşırığın öhdəsindən uğurla gəlmişdilər.

Bədiüzzaman Mirzə I Şah Təhmasibin zamanında Sistan bölgəsinin Nimruz məntəqəsinə (hazırda Əfqanıstan ərazisindədir) hakim təyin edilmiş və oranı idarə etmişdir. Ustaclu tayfasının *Şeyxlər* (və ya Şeyxlü) oymağından görkəmli sərkərdə *Məntəşa sultanın* oğlu Teymur xan onun lələsi idi.

Bədiüzzaman Mirzə I Şah Təhmasibin qızı *Pərixan xanımla* nişanlı idi, amma

toyları olmamışdı. Onun digər qadından Bəhram adlı (babasının adı verilmişdi) körpə oğlu və iki qızı vardı. *II Şah İsmayılın* əmri ilə Teymur xan Bədiüzzaman Mirzəni körpə oğlu ilə birlikdə qətlə yetirdi.

***Mənbələr:*** *İsgəndər bəy Münşi. Tarix-i aləmara-yi Abbasi (tərcümə və şərhlər: O.Əfəndiyev, N.Musalı), s.303; Həsən bəy Rumlu. Əhsən ət-təvarix (nəşrə hazırlayan: Ə.Nəvai), s.544.*

**BƏHRAM MİRZƏ** (1517-1549) – Səfəvi şahzadəsi, *I Şah İsmayılın* dördüncü (ən kiçik) oğlu, *I Şah Təhmasibin* doğma qardaşı. Anası türkman ittifaqına daxil olan *Mosullu* tayfasına mənsub *Taclu bəyim* idi. I Şah Təhmasibin hakimiyyətə keçməsindən bir neçə il sonra Bəhram Mirzə Xorasan hakimi təyin edildi, qızılbaş sərkərdəsi Çirkin Həsən oğlu Qazı xan Təkəlü də onun lələsi oldu (1529/30). Şahzadə Xorasanın mərkəzi sayılan Herat şəhərində məskunlaşmışdı. Həmin dövrdə Xorasan vilayəti özbəklərin ardıcıl hücumlarına məruz qalırdı. 1531/32-ci illərdə özbək tayfalarının lideri Übeydullah xan Heratı mühasirəyə aldı. Şəhərdə vəziyyət elə pisləşdi ki, əhali aclıqdan it-pişik əti yeməyə başladı. Bununla belə, qızılbaşlar şəhəri düşmənə təslim etmədilər. İl yarım davam etmiş mühasirə vaxtı I Şah Təhmasib osmanlılara qoşulmuş *Ulamə sultanın* hücumlarını dəf etməklə məşğul olduğu üçün qardaşına yardım edə bilmirdi. 1533-cü ilin əvvəlində şah qoşunla Herata yaxınlaşdı və özbəklər mühasirəni dayandırıb öz mövqelərini tərk etdilər. Qazı xan Təkəlü şəhərin müdafiəsini yaxşı təşkil etmədiyinə və əhali ilə ədalətsiz davrandığına görə vəzifəsindən uzaqlaşdırıldı (sonralar o, osmanlıların tərəfinə keçdi), Xorasanın idarəçiliyi şahzadə *Sam Mirzəyə* və onun lələsi *Ağzıvar xan Şamluya* həvalə edildi.

Bundan sonra Bəhram Mirzə Osmanlı qoşunu ilə müharibələrə cəlb olunmuş, bir müddət Lahican hakimi kimi xidmət etmişdir. Daha sonralar Həmədan hakimi təyin olunmuş Bəhram Mirzə burada da çətinliklərlə üzləşdi. Qardaşı *Əlqas Mirzə* osmanlıların tərəfinə keçərək böyük ordu ilə oradan Səfəvilər dövlətinin ərazisinə soxuldu, Həmədanda Bəhram Mirzənin oğullarını əsir tutub xəzinəsini qarət etdi. Bəhram Mirzə ordunun başında Əlqas Mirzənin üzərinə yürüdü, uğursuzluqlarına görə Osmanlı himayəsindən məhrum olmuş Əlqas Mirzə təslim oldu, Bəhram Mirzənin ailə üzvləri azadlığa buraxıldı.

Bəhram Mirzə digər iki qardaşından (*Sam Mirzə* və *Əlqas Mirzə*) fərqli olaraq, mərkəzləşdirilmiş hakimiyyətə qarşı çıxmamış, böhranlı anlarda I Şah Təhmasibin tərəfində olmuşdur.

Bəhram Mirzə ədəbiyyat və incəsənətə meyilli olmuş, sənət adamlarını himayə etmişdir. O, zərif şairlik təbinə malik idi, dərin musiqi duyumu vardı, gözəl rəsmlər çəkir, nəstəliq xətti ilə məharətlə yazırdı. *Sadiq bəy Əfşar "Məcmə əl-xəvas"* təzkirəsində onu bu şəkildə təsvir etmişdir: "Tayı-bərabəri olmayan, hər sözü ürəyə xoş gələn, sözü şirin, şe-



iri rəngarəng, dediyinin yerini bilən, hər mənada məna güdən, şeiri sevən, şairə qiymət verən bir mirzə (şahzadə) idi. Sanki mirzəlik o şahzadənin adına yazılmış ayə və ya şahzadəlik o mirzənin isminə sancılmış bir bayraq idi. Bir çox bilik və hünər sahibini himayə edib onları öz yaxınları və həmtayları yanında fərqli və başıuca etdi. Şeir təbi çox incədir".

Bəhram Mirzə 1549-cu ildə təqribən 32 yaşında vəfat etmiş, Məşhəddə İmam Rzanın (ə) hərəmində torpağa tapşırılmışdır. İmadəddin xanın bacısı Zeynəb sultan xanımla ailə qurmuş, *Sultan Hüseyn Mirzə, İbrahim Mirzə və Bədiüzzaman Mirzə* adlı üç oğlu olmuşdur. Onun vəfatından sonra dul arvadı I Şah Təhmasibə ərə getmişdir.

***Mənbələr:*** *M.K.Yusifcəmali. I Şah İsmayılın həyatı, s.205-206; Sadiq bəy Əfşar. Məcməül-xəvas, s.33; İsgəndər bəy Münşi. Tarix-i aləmara-yi Abbasi (tərcümə və şərhlər: O.Əfəndiyev, N.Musalı), s.120, 301-303; Məhəmmədəli Kərimzadə Təbrizi. Əhval və asari-nəqqaşani-qədimi-İran, I, 106; Qazı Mir Əhməd Münşi Qumi. Gülüstani-hünər, s.138-139; Həsən bəy Rumlu. Əhsən ət-təvarix (nəşrə hazırlayan: Ə.Nəvai), s.442-443.*



**BƏHRUZƏ BƏYİM** – Səfəvi şahbanusu, *I Şah İsmayıl* Səfəvinin xanımı. Bəzi məlumatlarda *Xadim bəy Xüləfanın* qızı olduğu qeyd edilir. Həyatı haqqında dəqiq məlumat azdır. Klassik Səfəvi mənbələrində I Şah İsmayılın bu adda xanımının olması barədə məlumata rast gəlinmir. Bəhruzə bəyimlə bağlı məlumatların mütləq əksəriyyəti onun *Çaldıran savaşından* sonrakı taleyi ilə bağlıdır və azsaylı osmanlı mənbələrinə əsaslanır. Bu mövzuda aparılmış araşdırmalarda *Taclu bəyim* və Bəhruzə bəyimlə bağlı məlumatlar qarışdırılır.

Bəhruzə bəyimlə bağlı məlumatın rast gəlindiyi ən mühüm mənbələrdən biri XVII əsr Osmanlı tarixçisi Münəccimbaşı Əhməd Dədənin tarix kitabıdır. Burada qısa şəkildə I Şah İsmayılın xanımı Bəhruzənin əsir alındığı, amma bəzilərinin təsəvvür etdiyi kimi, Məsih Paşazadəyə əsir düşüb bahalı sırğalarını verməklə xilas olan xanımın o deyil, Taclu bəyim olduğu yazılır. Daha sonra qeyd edilir ki, Bəhruzə bəyim əsirlikdə qalmış, sultan onu qazıəsgər Tacızadə Cəfər Çələbiyə əmanət olaraq tapşırmış, amma ona toxunmağı qadağan etmişdi.

Bəhruzə bəyimin bundan sonrakı taleyi barədə geniş yayılmış məlumatlar da yalnız Osmanlı mənbələrində öz əksini tapmışdır. Guya qazıəsgərə əmanət verildikdən bir müddət sonra Bəhruzə bəyimin hamilə olduğu bilinmiş və sultan bu xəyanətin cəzası olaraq Cəfər Çələbinin edamına fərman vermişdi. Əsir düşdükdən bir il sonra Bəhruzə bəyim bahalı faytonda, 9 nəfər xacənin, bir dəstə nökərin müşayiəti ilə Ədirnəyə göndərilir. Sultanın əmri ilə bütün xidmətçilər və 5 min ağça məbləğində pul ona hədiyyə edildi. Bəhruzə bəyimin bundan sonrakı taleyi barədə heç bir məlumat yoxdur. Bu informasiyanın yalnız məhdud sayda Osmanlı mənbələrində öz əksini tapması onun düzgün-

lüyünü şübhə altına salır. Bəzi mənbələrdə sultanın məhz I Şah İsmayılı təhqir etmək məqsədilə bu addımı atdığı yazılır, bu da Səfəvi şahını sonrakı nəsillərin gözündə alçaltmaq üçün informasiya müharibəsinin bir elementi ola bilərdi. Hadisənin təsvirinin davamında guya şahın Bəhruzə bəyimi azad etmək xahişi ilə dəfələrlə İstanbula elçilər göndərdiyi, amma sultanın bu xahişlərə məhəl qoymadığı iddia olunur. Lakin I Şah İsmayılla I Sultan Səlim arasında mövcud olmuş və tarixi mənbələrdə əks edilmiş məktublaşmanın heç bir yerində əsirlikdə olan xanımın azad edilməsi ilə bağlı məlumata rast gəlmirik. Bəzi məktublarda və diplomatik səfərlərdə bu məqsədlə bağlı işarələr axtarmaq cəhdi isə əsassız iddiadan başqa bir şey deyildir.

***Mənbələr:*** *M.K.Yusifcəmali. I Şah İsmayılın həyatı, s.225-227; Tufan Gündüz. Şah İsmail'in Eşi Taçlu Begüm (Turk Kulturu ve Hacı Bektaş Veli Araştırma Dergisi, Sayı 51) s. 223-233; Azərbaycan Səfəvi dövlətində Birinci Xanım titulu ("Türküstan", 26 fevral-6 mart 2017), s.8-9; Müneccimbaşı Ahmet Dede. Müneccimbaşı Tarihi, II, 465-466; Mehman Süleymanov. Səfəvilər (Şah İsmayıl Səfəvi), III, 547-549; Nəsrullah Fəlsəfi. Bir neçə tarixi və ədəbi məqalə, s.76-80.*

**BİBİ FATİMƏ** (vəf. 1334) – *səfəviyyə təriqətinin* banisi *Şeyx Səfiəddin Ərdəbilinin* xanımı, *zahidiyyə təriqətinin* banisi *Şeyx Zahid Gilaninin* qızı. *"Səfvət əs-səfa"da* yazılana əsasən, Şeyx Zahid 72 yaşında ikən Əxi Süleyman adlı bir sufinin qızı ilə evlənmiş, bu izdivacdan Bibi Fatimə və Hacı Şəmsəddin doğulmuşdur. Şeyx Səfiəddin Ərdəbili təqribən 25 il ərzində Şeyx Zahidin müridi olmuş, onun etibarını qazanaraq qızı Bibi Fatimə ilə ailə qurmuşdur.

Bibi Fatimə də kəramət sahibi olmuşdur. Hələ uşaq yaşlarında çoxlu nar dənəsinin içindən turş ilə şirin olanları dəqiqliklə ayıra bilirmiş. Şeyx Səfiəddin bunu necə etdiyini soruşanda Şeyx Zahid qızının yerinə cavab vermişdi: "Səfiəddin, ol məşayixün (şeyxin) fərzəndidür və onun başında dövlətlər var. Gərək onu yaxşıca saxlayasan kim, beqayət (hədsiz) dövlətlüdür". Dövrün ədəbiyyatında iddia olunduğuna görə, Bibi Fatimə cin vurmuş qadınları da sağaldırmış.

Şeyx Səfiəddin Ərdəbili ilə Bibi Fatimənin izdivacından üç oğul dünyaya gəlmişdir: Mühyiddin (1324-cü ildə valideynlərinin sağlığında vəfat etmişdir), *Sədrəddin Musa* və Əbu Səid. Şeyx Səfinin digər iki oğlu və bir qızı başqa xanımla izdivacdan doğulmuşdur.

Şeyx Səfiəddin Ərdəbilinin vəfatından 18 gün sonra Bibi Fatimə də dünyasını dəyişir; bunu şeyxin ölüm ayağında ikən ona xəbər verdiyi rəvayət olunur (bu müddət mənbələrdə fərqli şəkillərdə qeyd edilmişdir).

***Mənbələr:*** *İbn Bəzzaz Ərdəbili. Səfvət əs-səfa, s.759; Şeyx Səfi təzkirəsi ("Səfvətüs-səfa"nın XVI əsr türk tərcüməsi), s.126-127; Şeyx Hüseyn Pirzadə Zahidi. Silsilət ən-nəsəbi-Səfəviyyə, s.11; İbn Bəzzaz Ərdəbili. Səfvət əs-səfa, s.36.*



**DƏSPİNƏ XATUN** – *I Şah İsmayılın* ana tərəfdən nənəsi. Atası Trabzon (Trapezund) imperatoru IV Böyük İohann Komnin (ləqəbi Kalo-İoannes – "gözəl İohann"), anası onun türk mənşəli (Krım tatarlarından olması mümkündür) xanımı və ya cariyəsi idi. Xristian mənbələrində Böyük Teodora Komnin, bəzən isə Katerina adı ilə, Şərq mənbələrində isə Dəspinə xatun kimi qeyd edilmişdir. Yunan dilində "despina" xanım mənasını verir və türk dilindəki "bəyim", "xatun" ifadələrinə uyğun gəlir. Müsəlman hakimlərinə ərə verilmiş xristian şahzadələrini adətən "despina" adlandırırdılar. 1459-cu ildə Trabzon imperatorluğu ilə Ağqoyunlu dövlətinin Osmanlı imperiyasına qarşı müttəfiqliyini möhkəmləndirmək məqsədilə Dəspinə xatun *Uzun Həsənə* ərə verilir. Onu Ağqoyunlu dövlətinə əmisi, gələcək (və sonuncu) Trabzon imperatoru David gətirir. Lakin Dəspinə xatunun Uzun Həsənlə evliliyi Trabzonu Osmanlı işğalından qoruya bilmədi; Sultan Mehmet Fateh 1461-ci ildə Trabzonu öz torpaqlarına qatdı. Dəspinə xatun bundan sonra da öz vətənini azad etmək ümidini itirmədi və Osmanlı əsarətində olan əmisi Davidlə əlaqə yaratmağa çalışdı. Lakin onun göndərdiyi məktub sultanın əlinə keçdi, Davidin Ağqoyunlularla danışığa getdiyinin üstü açıldı, nəticədə o və yaxınları edam edildi (1463).

Dəspinə xatun Uzun Həsənin təşəbbüsü ilə Avropa ölkələri ilə aparılan danışıqların təşkilində mühüm rol oynamışdır. O öz nüfuzundan və təcrübəsindən, eləcə də Venesiyaya bağlı Arxipelaq hersoqluğunun xanımı olan bacısı Valensanın köməyindən istifadə edərək Venesiya Respublikasına odlu silah alınması ilə bağlı müraciət etmiş, lakin bu danışıqların nəticəsi gecikdiyi üçün Uzun Həsən Otluqbeli savaşında (1473) osmanlılara məğlub olmuşdu.

Dəspinə xatunun vəfat tarixi məlum deyildir, həyatının sonlarında onun ibadətə bağlandığı yazılır. Əldə olan məlumatlara əsasən, Dəspinə xatun İslam dinini qəbul etməmiş və xristian əqidəsində qalmışdır (qızı *Aləmşah bəyimdən* fərqli olaraq). O, Diyarbəkirdəki Müqəddəs Georgi kilsəsində dəfn edilmişdir.

Uzun Həsənlə Dəspinə xatunun üç qızı və bir oğlu olmuşdur. Oğlu Maqsud bəy atasının ölümündən sonrakı hakimiyyət davasında dərhal qardaşı Sultan Xəlil tərəfindən öldürülmüşdür. Qızlarından *Aləmşah bəyim* Uzun Həsənin sağlığında *Şeyx Heydərə* ərə verilmiş, bu izdivacdan *I Şah İsmayıl* doğulmuşdur. Digər iki qızı Uzun Həsənin vəfatından sonra əvvəlcə Hələbə, oradan da Dəməşqə qaçmışdır. İtalyan səyyahı Katerino Zenonun nəvəsi 1512-ci ildə onlardan biri ilə Dəməşqdə rastlaşdığını yazır. (Katerino Zeno özü də Komninlər ailəsi ilə qohum olmuş, bunun sayəsində *Ağqoyunlular dövlətində* səfərdə olduğu müddətdə Uzun Həsənlə maneəsiz görüşmək imkanı qazanmışdır). Bu qızlardan birinin adının Məryəm olduğu məlumdur; 1503-cü ildə o, Şirazda yaşamış və I Şah İsmayılla görüşmüşdür.

Dəspinə xatun hədsiz dərəcədə yaraşıqlı

görünüşə sahib olmuş, bu gözəllik Avropada və Səfəvilər dövlətində dillər əzbərinə çevrilmişdir. XV əsrdə yaşamış italyan rəssamı Pizanellonun çəkdiyi və Verona kilsələrindən birinin divarını bəzəyən "Müqəddəs Georgi və Trapezund kraliçası" freskasındakı obrazın Dəspinə xatun olduğu ehtimal edilir.

***Mənbələr:*** *Р.М.Шукуров. Великие Комнины и Восток (1204-1461), стр.317-321; Yaqub Mahmudov. Azərbaycan diplomatiyası, s.82 və 127; Walther Hinz. Uzun Hasan ve Şeyh Cüneyd (türkcə tərcümə: Tevfik Bıyıklıoğlu), s.29-30; The Encyclopaedia of Islam, X, 963-967 ("Uzun Hasan").*



**DİLARAM SULTAN** (vəf. 1647) – Səfəvi şahbanusu, *I Şah Səfinin* anası. Gürcü əsilzadə ailəsinə mənsub idi. Ailəsi *I Şah Abbasın* əmri ilə Gürcüstandan Səfəvilər dövlətinin içərilərinə köçürülmüş, bu səfər zamanı Dilaram sultanın valideynləri vəfat etmiş, qardaşı ondan ayrı düşmüşdür. Dilaram sultan özü I Şah Abbasın hərəmxanasına qəbul edilmiş, şah onu öz oğlu *Məhəmməd Baqir Mirzəyə* bağışlamışdı. Məhəmməd Baqir Mirzə ilə Dilaram sultanın izdivacından 1611-ci ildə şahzadə Sam Mirzə (gələcək I Şah Səfi) doğulmuşdur.
Dilaram sultan iti zəkası və vəziyyəti düzgün qiymətləndirmə bacarığı sayəsində getdikcə sarayda öz nüfuzunu artırmış və hərəmxanada ondan əvvəl I Şah Abbasın qızı *Zibeydə bəyimin* malik olduğu mövqeyi ələ keçirmişdi. Tədqiqatçılar 1632-ci ildə I Şah Səfinin öz hərəmxanasındakı qadınlara və Səfəvi şahzadələrinə qarşı həyata keçirdiyi soyqırımında Dilaram sultanın da əli olduğunu yazırlar. Həmin il şaha suiqəsddə ittiham edilən qırx nəfərdən artıq hərəmxana sakini (şahın hərəmləri və yaxın qadın qohumları) amansızlıqla öldürülmüş, Səfəvilər nəslindən olan bir neçə şahzadə, o cümlədən I Şah Abbasın nəvələri və bir neçə qızılbaş sərkərdəsi edam edilmişdi. Bu hadisədən sonra Dilaram sultan hərəmxanada üstün mövqeyə sahib olmuşdu.
Dilaram sultan təkcə hərəmxanaya deyil, bəzi mühüm dövlət işlərinə də nəzarət edirdi. Vəzifə təyinatları, vəzifədən azadedilmələr bəzən onun diktəsi ilə həyata keçirilirdi. Bu kimi məsələlərdə Dilaram sultan baş vəzir *Saru Tağı* ilə əməkdaşlıq edirdi. Saru Tağının xədimliyi onun rahat şəkildə hərəmxanaya daxil olmasına və Dilaram sultanla məşvərət aparmasına imkan verirdi. Onları bəzi maliyyə maraqları da birləşdirirdi.
1645-ci ildə Saru Tağının öldürülməsi nəticəsində Dilaram sultanın saraydakı mövqeyi zəifləməyə başladı. *II Şah Abbasın* yeni təyin etdiyi baş vəzir *Xəlifə sultan* saraydakı maliyyə maxinasiyalarının üstünü açdığı zaman bəzi məsələlərdə Dilaram sultanın da adı hallandı. Getdikcə öz nüfuzunu itirən Dilaram sultan 1647-ci ildə dünyasını dəyişmiş və Məşhəddə, İmam Rzanın (ə) hərəmində dəfn olunmuşdur.
Dilaram sultan xeyriyyəçilik işləri ilə məşğul olmuş, İsfahanda iki mədrəsə və Cəddə (nənə) karvansarasını tikdirmişdir. Onun sifarişi ilə köçürülmüş iki



nəfis Quran nüsxəsi Qum şəhərindəki Məsumə xanım (ə) hərəminə vəqf edilmişdir və hazırda hərəmin muzeyində qorunur.

***Mənbələr:*** *Əbdülməcid Şüca. Səfəvilər dövründə qadın, siyasət və hərəmxana, s.151-153; Sussan Babaie and etc. Slaves of The Shah: New Elites of Safavid Iran, p.104; David Blow. Shah Abbas, The Ruthless King Who Became an Iranian Legend, p.232; Nəsrullah Fəlsəfi. I Şah Abbasın həyatı, II, 184; M.H.Riyahi. Səfəvilər dövrü İsfahanının qadınlarından yadigar qalmış vəqflər ("Vəqfi-mirasi-cavidan" dərgisi, 1389 h.-ş., № 71), s.143-168.*

**DÖVLƏTİ XATUN** – *səfəviyyə təriqətinin* banisi *Şeyx Səfiəddin Ərdəbilinin* anası, *Şeyx Əminəddin Cəbrayılın* xanımı. Həyatı haqqında məlumat azdır. Ərdəbilin Baruq kəndindən Baba Camal adlı şəxsin qızıdır. Mənbələrdə adı Dövlətlü və ya Dövlət xatun şəklində də qeyd edilmişdir. *"Səfvət əs-səfa"da* onun örtülü (yəni iffətli), ibadətə həvəsli, zahidliyə meyilli, təqvalı qadın olduğu, gündüzlər oruc tutub, gecələr ibadət etdiyi yazılıb. Həmin kitabda Dövləti xatunun Şeyx Səfiyə hamilə olduğu dövrün təsviri barədə bəzi qeydlər verilmişdir. Bu rəvayətlərdə Dövləti xatun digər övladlarından heç birinə hamilə olduğu zaman rast gəlmədiyi halların baş verdiyini, hamiləlik dövrünün əziyyətsiz keçdiyini, hər zaman rahatlıq və əminlik içində olduğunu bildirir. Dövləti xanım hamiləlik dövründə həmişə yuxudan oyanarkən bətnindəki körpənin səsini (zikrini) eşidirmiş. Səfiəddin İshaq onun beşinci övladı idi, bundan əvvəl Məhəmməd, Səlahəddin, İsmayıl adlı üç oğlu və bir qızı, daha sonra Yəqub və Fəxrəddin adlı iki oğlu doğulmuşdur.

***Mənbələr:*** *İbn Bəzzaz Ərdəbili. Səfvət əs-səfa, s.76-80; Şeyx Səfi təzkirəsi ("Səfvətüs-səfa"nın XVI əsr türk tərcüməsi), s.50-52; Şeyx Hüseyn Pirzadə Zahidi. Silsilət ən-nəsəbi-Səfəviyyə, s.15; İsgəndər bəy Münşi. Tarix-i aləmara-yi Abbasi (tərcümə və şərhlər: O.Əfəndiyev, N.Musalı), s.48.*

**ƏBU TALİB MİRZƏ** (1574-1620) – Səfəvi şahzadəsi, *Şah Məhəmməd Xudabəndənin* dördüncü oğlu. Babası *I Şah Təhmasib* vəfat edərkən (1576) onun iki yaşında olduğu yazılır; bu hesabla 1574-cü ildə doğulduğu məlum olur. Anası *Məhdi-ülya* ləqəbli Xeyrənnisa xanımdır. 1586-cı ildə vəliəhd şahzadə *Həmzə Mirzə* öldürüldükdən sonra Şah Məhəmməd Xudabəndə heç bir oğlunu vəliəhd elan etmək fikrində deyildi. Lakin nüfuzlu qızılbaş əmirləri *Əliqulu xan Qıçoğlu Ustaclu* və *tavaşıbaşı İsmayılqulu xan Şamlu* onun fikrinə qarşı çıxdılar (Bu iki qızılbaş əmiri sarayda çox böyük nüfuz sahibi idi, Şah Məhəmməd Xudabəndə onlara "yoldaş" və "qardaş" fəxri ləqəblərini vermişdi). Onlar şahın gözlərinin zəif olduğunu və bu üzdən dövləti idarə etməkdə çətinlik çəkdiyini, hazırda böyük oğul (əslində öldürülmüş *Həsən Mirzə* və Həmzə Mirzədən sonra üçüncü oğul) Abbas Mirzənin (gələcək *I Şah Abbas*) paytaxtdan uzaqda,

Xorasanda *Mürşidqulu xan Ustaclunun* əlində olduğunu əsas gətirib yaşca ondan sonra gələn Əbu Talib Mirzənin vəliəhd seçilməsinin zəruriliyini vurğuladılar. Əmirlərin təklifi qarşısında Şah Məhəmməd Xudabəndə Əbu Talib Mirzəni öz vəkili və vəliəhdi elan etdi.

Növbəti il I Şah Abbas taxta çıxdıqda Əbu Talib Mirzə Şah Məhəmməd Xudabəndə ilə birlikdə tutulub bundan əvvəl (Həmzə Mirzə tərəfindən) həbs olunmuş qardaşı *Təhmasib Mirzənin* yanına Ələmut qalasına göndərildi. Sonra onları Həmzə Mirzənin övladları ilə birlikdə Qəzvinə, daha sonra Vəraminə apardılar. Paytaxt İsfahan şəhərinə köçürüldükdən sonra şahzadələri də bura gətirdilər. Daha sonra Əbu Talib Mirzə ilə Təhmasib Mirzənin hər ikisi Ələmut qalasına göndərildi. Əbu Talib Mirzə 1620-ci ildə burada dünyasını dəyişmişdir.

***Mənbələr:*** *İsgəndər bəy Münşi. Tarix-i aləmara-yi Abbasi (tərcümə və şərhlər: O.Əfəndiyev, N.Musalı), s.294; Nəsrullah Fəlsəfi. I Şah Abbasın həyatı, I, 114-115 və II, 167-169.*

**ƏHMƏD MİRZƏ** (vəf. 1576) – Səfəvi şahzadəsi, *I Şah Təhmasibin* doqquzuncu oğlu. Atasının vəfatı zamanı sağ olan şahzadələrin yaşca ən kiçiyi (13 yaşında) idi. Kənizdən doğulmuş, *Əfşar* tayfasının *Ərəşlü* oymağından *Əmir Aslan sultan* onun *lələsi* təyin edilmişdi. Əhməd Mirzə onun himayəsi altında İsfahanda yaşayırdı. Sonralar I Şah Təhmasib şahzadəni paytaxta gətirtmiş, nəvazişlə "Sultan Əhməd Bağdadi" adlandırmışdı. Əfşar tayfası, o cümlədən Əmir Aslan sultan *II Şah İsmayılın* tərəfdarı olduğu üçün Əhməd Mirzə də eyni mövqeyi bölüşürdü. Buna baxmayaraq, II Şah İsmayıl hakimiyyətə keçdikdən sonra Əhməd Mirzənin qətlinə əmr verdi. Onu qardaşı *İmamqulu Mirzə* ilə birlikdə Qəzvində, sarayın qarşısındakı At meydanı adlı yerdə öldürdülər.

***Mənbələr:*** *İsgəndər bəy Münşi. Tarix-i aləmara-yi Abbasi (tərcümə və şərhlər: O.Əfəndiyev, N.Musalı), s.300 və 428; Həsən bəy Rumlu. Əhsən ət-təvarix (nəşrə hazırlayan: Ə.Nəvai), s.637.*

**ƏLİ MİRZƏ** – Səfəvi şahzadəsi, *I Şah Təhmasibin* səkkizinci oğlu, *Sultan Mustafa Mirzənin* kiçik qardaşı. Anası gürcü əsilli Zəhrabacı xanım adlı kəniz idi. Qarabağ bəylərbəyi *İbrahim sultan Ziyadoğlu-Qacar* onun *lələsi* təyin olunmuşdu, Əli Mirzə də onun himayəsi altında bəylərbəyliyin mərkəzi olan Gəncədə yaşayırdı. *II Şah İsmayıl* hakimiyyətə keçdikdən sonra xəbər göndərib Əli Mirzəni yanına gətirmələrini əmr etdi. Qacar bəyləri şahzadəni Qəzvinə, qardaşının hüzuruna gətirdilər. II Şah İsmayıl göstəriş verdi ki, onun gözlərini çıxartsınlar. "Tarixi-aləmarayi-Abbasi"-nin müəllifi İsgəndər bəy Münşinin zamanında (1616) Əli Mirzə hələ sağ idi.

***Mənbələr:*** *İsgəndər bəy Münşi. Tarix-i aləmara-yi Abbasi (tərcümə və şərhlər: O.Əfəndiyev, N.Musalı), s.299-300 və 428; Həsən bəy Rumlu. Əhsən ət-təvarix (nəşrə hazırlayan: Ə.Nəvai), s.637.*



**ƏLQAS MİRZƏ** (1516-1550) – Səfəvi şahzadəsi, *I Şah İsmayılın* ikinci oğlu. Adını bəzən Əlqasb şəklində də qeyd edirlər. Bəzi məlumatlara görə, anası Xanbacı xanım, *"Təkmilət əl-əxbar"a* görə, Sufi Xəliliyyə tayfasından Xanbəyi xanım Mosullu idi. 1516-cı ilin mart ayında, Novruz bayramından üç gün sonra Təbrizdə doğulmuşdur. Yeniyetməliyindən qardaşı *I Şah Təhmasibin* göstərişi ilə hərbi əməliyyatlarda iştirak etmişdir. 1530-cu ildə *lələsi* (tərbiyəçisi) *Bədr xan Ustaclu* ilə birlikdə Astarabad hakimi qismində özbəklərə qarşı döyüşə qatılmışdır. Həmin dövrdə osmanlıların hücumuna qarşı müdafiədə iştirak etmiş, qardaşı *Sam Mirzənin* qiyamının yatırılmasına şahid olmuşdur. 1538-ci ildə Şirvanşahların torpaqları Səfəvilər dövlətinə ilhaq edildikdən sonra burada hərbi əməliyyatlarda fərqlənmiş Əlqas Mirzə Şirvanın ilk bəylərbəyi təyin edilmişdir. I Şah Təhmasibin qardaşları arasında Əlqas Mirzəni hamıdan çox sevdiyi yazılır. "Şah Təhmasib təzkirəsi"ndə qeyd edilir ki, şah Əlqas Mirzənin sağ-salamat olması üçün dua etmələrindən ötrü Məşhəd seyidlərinə 250 tümən məbləğində bəxşişlər etmişdi (daha doğrusu, onların həmin məbləğdə olan borclarını bağışlamışdı).

Əlqas Mirzə Osmanlı dövlətinə pənah aparmış *Ulamə sultan Təkəlünün* və ətrafındakı bəzi Şirvan əmirlərinin təhriki ilə 1546-cı ildə qardaşına qarşı üsyan qaldırdı. Lakin tezliklə əməlindən peşman oldu, hətta anasının və nüfuzlu qızılbaş əmirlərinin hüzurunda tövbə edib bir daha itaətsizlik göstərməyəcəinə and içdi. Şahdan Dağıstana yürüş etmək əmri alan Əlqas Mirzə uğur qazana bilmədi və geri çəkildi. Azərbaycanın şimalında (Dərbənddə) möhkəmlənərək yenidən mərkəzi hakimiyyətə qarşı çıxdı, öz adına xütbə oxutdurdu və pul zərb etdirdi. I Şah Təhmasibin hücum xəbərini eşidəndə isə Krım yolu ilə Osmanlı torpaqlarına keçib I Sultan Süleyman Qanunidən yardım istədi. Sultan Süleyman Əlqas Mirzəni mehribanlıqla qarşılayıb ona 90 min ağça məbləğində məvacib ayırdı. Şahzadə sultanı inandıra bildi ki, Səfəvi əmirlərinin xeyli hissəsi onun tərəfdarıdır və əgər osmanlılar hücum etsələr, Səfəvi qoşununun böyük hissəsi təslim olub onların tərəfinə keçəcək. Lakin Osmanlı qüvvələrinin Səfəvi ərazisinə soxulması uğursuzluqla nəticələndi, Təbriz alınsa da, burada möhkəmlənmək planı baş tutmadı. Qızılbaş əmirlərindən heç kim osmanlılara qoşulmadı, əksinə, Əlqas Mirzə ilə gələnlərin bir hissəsi peşman olub I Şah Təhmasibin cəbhəsinə qayıtdı. Üstəlik, soyuq iqlim də qoşuna ciddi ziyan vurdu.

Osmanlı qüvvələri geri çəkildikdən sonra Əlqas Mirzə Bağdada sığındı, amma bir müddətdən sonra yenidən hərəkətə keçib Həmədan, Qum, Kaşan, İsfahan şəhərlərinə talançı yürüşlər etdi, qardaşı *Bəhram Mirzənin* ailə üzvlərini də özü ilə apardı. Səfəvi torpaqlarının qərbinə doğru çəkildikcə qüvvələrini itirən Əlqas Mirzənin osmanlılarla münasibəti də pisləşdi. Həm Osmanlı qüvvələri, həm də qızılbaş qoşunu tərəfindən sıxışdırılan Əl-

qas Mirzə kürdlərin məskunlaşdığı Ərdalan məntəqəsinə çəkildi və I Şah Təhmasiblə danışıqlara başlamaq üçün yollar axtardı. Qardaşının ailə üzvlərini geri qaytardıqdan sonra (qarət etdiyi əmlakı osmanlılara təhvil vermişdi) 1549-cu ildə o, Bəhram Mirzənin vasitəçiliyi və zəmanəti ilə təslim oldu. Əlqas Mirzə saraya gətirildi, burada I Şah Təhmasib onunla görüşdü. Şah öz üsyankar qardaşını sarayda bir neçə gün saxladı. Bu arada Bəhram Mirzənin vəfat xəbəri yayıldı və şahın əmri ilə Əlqas Mirzə Qəhqəhə qalasında həbs edildi. Yeniyetmə oğulları Əhməd Mirzə ilə Fərrux Mirzə də onunla birlikdə həbsə alındılar. Hakimiyyət iddiasına düşdükdən sonra təslim olmuş Sam Mirzə də bundan əvvəl Qəhqəhə qalasında məhbus həyatı yaşayırdı. Üstündən bir neçə ay keçdikdən sonra Əlqas Mirzə öldürüldü. O dövrün salnamələri onun həbsxana nəzarətçilərindən biri tərəfindən aradan götürüldüyünü yazır; yaxınları Əlqas Mirzə tərəfindən öldürülmüş həmin gözətçi intiqam məqsədilə şahzadəni qala divarlarından aşağı ataraq həlak etmişdi (1550). Onun nəşi Məşhədə aparılaraq İmam Rzanın (ə) hərəmində torpağa tapşırıldı. Əlqas Mirzənin oğulları bir neçə ildən sonra Qəhqəhə qalasında Sam Mirzə və övladları ilə birlikdə ölmüşlər; onların zəlzələ zamanı qala divarlarının altında qaldıqları barədə xəbər yayılmışdı.

Əlqas Mirzənin şairlik təbinə malik idi, şair və sənətkarlara himayədarlıq edirdi. Onunla birlikdə Osmanlı dövlətinə sığınmış şairlər Fəthullah Arif Çələbi (gülşəniyyə təriqətinin şeyxi İbrahim Gülşəninin nəvəsi, "Şahnameyi-ali-Osman"ın müəllifi) və Əflatun Şirvani (Xəzani, Əsiri və Əflatun təxəllüsləri ilə yazmışdır) sultanın hərbi zəfərlərini nəzmə çəkmək ənənəsinin əsasını qoymuşlar. "Şahnaməçilik" (şahnaməguyi) adlandırılan bu ənənənin ilk nümayəndələri Azərbaycandan köçmüş və Osmanlı sarayında mühacir həyatı yaşamış şairlər olmuşlar.

***Mənbələr:*** *M.K.Yusifcəmali. I Şah İsmayılın həyatı, s.199-202; The Encyclopaedia of Islam (New Edition), Volume 1, p.406; Türkiye Diyanet Vakfi İslam Ansiklopedisi, XI, 55; Təzkireyi-Şah Təhmasib, s.42-47; O.Əfəndiyev. Azərbaycan Səfəvilər dövləti, s.78-81; Lüğətnameyi-Dehxuda, III, 3231-3232; Sadiq bəy Əfşar. Məcməül-xəvas (hazırlayan: Əkrəm Bağırov), s.33-34; İsgəndər bəy Münşi. Tarix-i aləmara-yi Abbasi (tərcümə və şərhlər: O.Əfəndiyev, N.Musalı), s.166-175.*



**ƏMİNƏDDİN CƏBRAYIL** (1210/11-1258) – *səfəviyyə təriqətinin* banisi *Şeyx Səfiəddin Ərdəbilinin* atası, *Qütbəddin Əbu Baqinin* və ya onun oğlu *Seyid Salehin* övladı. Gürcülərin Ərdəbilə hücumu zamanı Qütbəddin Əbu Baqinin bir aylıq oğlunun Cəbrayıl olduğunu qəbul etsək, onun XIII əsrin əvvəllərində (1210/11-ci illər) doğulduğu aydın olur. Əminəddin Cəbrayıl atasından sonra sülalənin başçılığına keçmiş, Ərdəbilin Kəlxuran kəndində öz halal zəhməti ilə dolanmış, əkinçiliklə məşğul olmuşdur.

Təriqətdə Xacə Kəmaləddin Ərəbşah Ərdəbilinin müridi olmuş, yaxınlarına təsəvvüfün sirlərini öyrətmişdir. Şeyx Əminəddin camaatdan kənar gəzib boş vaxtını ibadətlə keçirir, susmağa üstünlük verirdi, səxavətli idi. O, Ərdəbilin Baruq kəndindən Baba Camal adlı şəxsin qızı *Dövləti* (və ya Dövlətlü) *xatunla* ailə qurmuş, bu izdivacdan altı oğul və bir qız doğulmuşdur. Oğulları Məhəmməd, Səlahəddin, İsmayıl, İshaq (Şeyx Səfiəddin), Yəqub və Fəxrəddindir. “Aləmarayi-Səfəvi” kitabında onun əvvəlcə Şiraza səfər edib orada on il qaldığı, evləndiyi və Saleh adlı oğlunun doğulduğu, daha sonra anasının təkidi ilə Ərdəbilə qayıdıb burada Dövləti xatunla ailə qurduğu qeyd edilir.
Səfiəddinin 6 yaşı olarkən (1258) Şeyx Əminəddin Cəbrayıl dünyasını dəyişmiş, yaşadığı Kəlxuran kəndində atası Seyid Salehin məzarının yanında torpağa tapşırılmışdır. Sonralar məzarının üzərində böyük məqbərə ucaldılmışdır.

***Mənbələr:*** *Şeyx Hüseyn Pirzadə Zahidi. Silsilət ən-nəsəbi-Səfəviyyə, s.14-16; İsgəndər bəy Münşi. Tarix-i aləmara-yi Abbasi (tərcümə və şərhlər: O.Əfəndiyev, N.Musalı), s.47-48; İbn Bəzzaz Ərdəbili. Səfvət əs-səfa, s.75-76; Şeyx Səfi təzkirəsi (“Səfvətüs-səfa”-nın XVI əsr türk tərcüməsi), s.50; Aləmarayi-Səfəvi (nəşrə hazırlayan: Y.Şükri), s.8-9.*

**ƏVƏZ əl-XƏVASS** – Səfəvilər sülaləsinin əcdadlarından biri, *Firuzşah Zərrinkülahın* oğlu, *Məhəmməd Hafizin* atası. Həyatı haqqında məlumat azdır. Bəzi mənbələrdə adını Əvaz şəklində də qeyd etmişlər, künyəsi Əbu Rafedir. Atasından sonra sülalənin lideri olmuş, qohumları və müridləri ilə birlikdə Gilan bölgəsindən Ərdəbil məntəqəsinə köçmüş, Ərdəbilin İsfərəncan kəndində yaşamışdır. Səfəvilər nəslinin Ərdəbildə məskunlaşması Əvəz əl-Xəvassın adı ilə bağlıdır. Zəngin olmuş, səxavət və xeyirxahlıq sarıdan məşhurlaşmışdır, kəşf və kəramət əhli idi. Məzarı Ərdəbilin Kəlxuran kəndində, *Şeyx Əminəddin Cəbrayılın* məqbərəsinin yanındadır.

***Mənbələr:*** *Şeyx Hüseyn Pirzadə Zahidi. Silsilət ən-nəsəbi-Səfəviyyə, s.11; İbn Bəzzaz Ərdəbili. Səfvət əs-səfa, s.73; Şeyx Səfi təzkirəsi (“Səfvətüs-səfa”nın XVI əsr türk tərcüməsi), s.47; İsgəndər bəy Münşi. Tarix-i aləmara-yi Abbasi (tərcümə və şərhlər: O.Əfəndiyev, N.Musalı), s.45; Aləmarayi-Səfəvi (nəşrə hazırlayan: Y.Şükri), s.5; Əmir Sədrəddin İbrahim Əmini Hərəvi. Fütuhati-Şahi (nəşrə hazırlayan: M.R.Nəsiri), s.4; Qazı Əhməd Ğəffari Qəzvini. Tarixi-cahanara, s.258; M.A.Ghulam Sarwar. History of Shah Ismail Safawi, p.18.*



**FATİMƏ SULTAN BƏYİM** (vəf. 1581) – Səfəvi şahzadəsi, *I Şah Təhmasibin* qızı, şahzadə *Mahmud Mirzənin* doğma bacısı. Həyatı haqqında məlumat azdır. Şah Məhəmməd Xudabəndənin hakimiyyəti dövründə Fatimə sultan bəyim Azərbaycan bəylərbəyi *Əmir xan Mosullu-Türkmana* (vəf. 1586) ərə getmişdir. Mənbələrə görə, qızılbaş əmirlərindən Müseyyib xan Təkəlü bundan əvvəl Fatimə sultan bəyimlə evlənmək istəmiş, amma razılıq almamışdı. Əmir xan

Mosullu qızılbaş tayfaları ilə münasibəti yaxşılaşdırmaq üçün öz toyunda *Pirə Məhəmməd xan Ustaclunun* sağdış, Müseyyib xan Təkəlünün soldış olmasını xahiş etmişdi. O dövrün ənənəsinə görə bu qızılbaş əmirləri də təntənəli şəkildə “sağdış toyu” və “soldış toyu” təşkil etmişdilər.

Toydan qısa müddət sonra Fatimə sultan bəyim dünyasını dəyişmiş və Ərdəbildə dəfn olunmuşdur (1581).

***Mənbələr:*** *İsgəndər bəy Münşi. Tarix-i aləm-ara-yi Abbasi (tərcümə və şərhlər: O.Əfəndiyev, N.Musalı), s.301 və 520; Həsən bəy Rumlu. Əhsən ət-təvarix (nəşrə hazırlayan: Ə.Nəvai), s.638; Nəsrullah Fəlsəfi. I Şah Abbasın həyatı, I, 48.*

**FATİMƏ SULTAN BƏYİM** (1717-1739/40) – Səfəvi şahzadəsi, *Şah Sultan Hüseynin* beşinci qızı. Şah Sultan Hüseynin 12 qızından yalnız bir neçəsinin həyatı haqqında nisbətən geniş məlumat vardır. Onun əksər qızlarının yalnız kiminlə ailə qurduqları məlumdur, bəzilərinin adı da mənbələrdə qeyd edilməmişdir. Fatimə sultan bəyim 1717-ci ildə İsfahanda doğulmuşdur. Səfəvi şahı *II Təhmasibin* doğma bacısı olduğu yazılır. 1730-cu ildə Nadir xanın (gələcək *Nadir şah Əfşar*) böyük oğlu Rzaqulu Mirzəyə ərə getmişdir. Qısa müddətdə Əfşarlar dövlətini, 45 il ərzində Xorasan vilayətini idarə etmiş Şahrux Mirzə bu izdivacdan doğulmuşdur (1734).

1739-cu ildə Hindistanı fəth etməyə yola düşmüş Nadir şahın döyüşdə öldürülməsi barədə şayiə yayılır. Şahın canişini kimi ölkəni idarə edən Rzaqulu Mirzə Səfəvi sülaləsinin hakimiyyət uğrunda mübarizəyə qalxacağından qorxaraq II Şah Təhmasibi və oğullarını qətlə yetirmək barədə əmr verir. Qardaşının və qardaşı uşaqlarının amansızlıqla öldürülməsi xəbəri Fatimə sultan bəyimə çatanda o, özünü ağacdan asaraq intihar edir (1739/40).

***Mənbələr:*** *Məhəmməd Kazim Mərvi. Aləmarayi-Nadiri (3 clddə, nəşrə hazırlayan: M.Ə.Riyahi), I, 121 və II, 773-774; Hacı Mirzə Həsən Hüseyni Fəsai. Farsnameyi-Nasiri, s.529; Qulamrza Gülizəvarə. Qacarların qüdrət sahibi olmalarına qədər Əfşarların siyasi izdivacları (“Pəyami-zən” dərgisi, 1385h.-ş., № 174).*

**FİRUZ ŞAH ZƏRRİNKÜLAH** – Səfəvilər sülaləsinin nümayəndəsi; bu sülalənin əcdadları arasında haqqında mənbələrdə məlumat verilmiş ilk tarixi şəxsiyyət sayılır. Bununla belə, Firuz şah barəsində konkret tarixi məlumat azdır, onun hansı dövrdə yaşadığı dəqiq məlum deyildir. “Zərrinkülah” ləqəbinin fars dilindən tərcüməsi “qızıl (qırmızı) papaqlı” deməkdir (Bu sözlə “*qızılbaş*” kəlməsinin məna oxşarlığı diqqətçəkicidir). Səfəvi mənbələrində yazılır ki, keçmiş zamanlarda böyük sufi İbrahim Ədhəmin nəslindən bir hökmdar qoşun çəkib Azərbaycan vilayətini, o cümlədən Muğan və Aran torpaqlarını fəth etmiş, burada İslam dinini yaymışdı. O, fəth etdiyi torpaqlara hakimlər təyin edərkən Ərdəbil ətrafının idarəçiliyini də öz ətrafından olan Firuza tapşırmış-



dı. Firuz Gilan yaxınlığındakı Rəngin adlı meşəlik ərazidə məskunlaşmışdı, bol sərvəti, çoxlu mal-qara sürüsü vardı. Sonralar onun oğlu *Əvəz əl-Xəvass* Rəngin ətrafından köç edib ata mirası olan Ərdəbilin İsfərəncan kəndində yaşayır. Səfəvi mənbələrinə əsasən, Firuz şah Zərrinkülah *Şeyx Səfiəddin Ərdəbilinin* (1252-1334) yeddinci nəsildən ulu babası sayılır; buna əsasən onun XI əsrdə yaşadığı ehtimal edilir.

Firuz şah haqqında məlumata rast gəldiyimiz ilk mənbə *"Səfvət əs-səfa"* kitabıdır (Şeyx Səfiəddin Ərdəbilinin oğlu *Şeyx Sədrəddin Musanın* sifarişi ilə qələmə alınmışdır). Bu əsərin bəzi nüsxələrində İbrahim Ədhəmin övladının başçılığı altında Azərbaycan torpaqlarına yürüş etmiş qoşunun kürd ləşkəri olduğu və Səncan ətrafından gəldiyi yazılıb. Əlavə olaraq əsərin müasir nəşrlərində Firuzun kürd mənşəli olduğu da qeyd edilib. Lakin Səfəvilərin mənşəyi barədə araşdırmalar göstərir ki, Firuz şah Zərrinkülahın kürd əslli olması nəzəriyyəsi həqiqətə uyğun deyildir. "Səfvət əs-səfa" kitabı Səfəvilər zamanında ciddi redaktəyə məruz qalmış və onun mətnində bəzi düzəlişlər edilmişdir. Əsərin bir çox qədim nüsxələrində Firuz şah Zərrinkülahın kürd olması barədə qeyd yoxdur (həmin nüsxələrdə "kürd" yox, "zikr" yazılmışdır). "Səfvət əs-səfa"nın XVI əsrdə türk dilinə tərcümə edilmiş nüsxəsində nə qoşunun, nə də Firuz şahın kürd mənşəli olmasına aid heç bir qeydə rast gəlinmir. Bəzi nüsxələrdə yanlış olaraq Səncar şəklində yazılmış, əslində isə Səncan adlanan şəhər barədə orta əsr müsəlman səyyahlarının əsərlərindən məlumat almaq mümkündür. Məşhur coğrafiyaçı Yaqut əl-Həməvi Səncan şəhərinin Mərv yaxınlığında yerləşdiyini bildirir, bundan əlavə, Nişapur və hətta Dərbənd yaxınlığında da Səncan qəsəbələrinin olduğu məlumdur. Beləliklə, Azərbaycana yürüş etmiş qoşunun Diyarbəkir ətrafındakı kürdlər yaşayan Səncardan gəldiyini düşünməyə əsas yoxdur. Burada Şeyx Səfiəddin Ərdəbilinin *mürşidi Şeyx Zahid Gilaninin* mənşəyi ilə bağlı eyni iddiaların olduğunu da unutmamalıyıq. Mənbələr onun da kökünün Səncandan olduğunu xəbər verir, bu əsasla bəzi tədqiqatçılar onu da kürd əsilli hesab etmişlər. Lakin qədim türk şəhəri olan Mərvin yaxınlığındakı Səncan məntəqəsinə mənsub şəxsləri kürd saymağın heç bir əsası yoxdur.

***Mənbələr:*** *İbn Bəzzaz Ərdəbili. Səfvət əs-səfa, s.72; Şeyx Səfi təzkirəsi ("Səfvətüs-səfa"nın XVI əsr türk tərcüməsi), s.47; Nihat Çetinkaya. Kızılbaş Türkler (Tarixi Oluşumu ve Gelişimi), s.359-362; Mirza Abbaslı. Safevilerin Kökenine Dair (Belleten, 40/158), s.287-330; İsgəndər bəy Münşi. Tarix-i aləmara-yi Abbasi (tərcümə və şərhlər: O.Əfəndiyev, N.Musalı), s.44-45; Şeyx Hüseyn Pirzadə Zahidi. Silsilət ən-nəsəbi-Səfəviyyə, s.11; O.Əfəndiyev. Azərbaycan Səfəvilər dövləti, s.38.*



**GÖVHƏR SULTAN BƏYİM** (vəf. 1577) – Səfəvi şahzadəsi, *I Şah Təhmasibin* böyük qızı. 1539/40-cı illərdə anadan olmuşdur. Təqribən 15 yaşında ikən

əmisi oğluna – *Bəhram Mirzənin* oğlu *Sultan İbrahim Mirzəyə* ərə verilmişdir. Gövhər sultan bəyim atasının ölümündən sonra qardaşı İsmayıl Mirzənin (*II Şah İsmayılın*) hakimiyyətə gəlişini dəstəkləmişdir. Əri Sultan İbrahim Mirzə II Şah İsmayılın əmri ilə öldürüldükdən sonra Gövhər sultan bəyim də buna dözməyib xəstələnmiş və üç ay ərzində dünyasını dəyişmişdir. Məşhəddə İmam Rzanın (ə) hərəmində dəfn olunmuşdur.

Gövhərşad bəyim adlı yeganə qız övladı mükəmməl dini təhsil almış, I Şah Abbasın zamanında Məkkəyə köçmüş, orada Dəştəki nəslindən Seyid İbrahim Şirazinin oğlu Əmir Nəsirəddin Hüseyn Şirazi ilə ailə qurmuşdur.

***Mənbələr:*** *İsgəndər bəy Münşi. Tarix-i aləmara-yi Abbasi (tərcümə və şərhlər: O.Əfəndiyev, N.Musalı), s.300 və 302; Həsən bəy Rumlu. Əhsən ət-təvarix (nəşrə hazırlayan: Ə.Nəvai), s.637.*

**HEYDƏR MİRZƏ** (1554/55-1576) – Səfəvi şahzadəsi, *I Şah Təhmasibin* üçüncü oğlu. 22 yaşında öldürüldüyünü nəzərə alsaq, 1554/55-ci illər doğum tarixi kimi qəbul edilir. Anası gürcü əsilli Əli xanın qızı Sultanzadə xanımdır. Səfəvilər nəslindən olan *Məsum bəy Səfəvi* şahzadənin *lələsi* (tərbiyəçisi) təyin edilmişdi. Heydər Mirzə atasının sağlığında onun sevgi və etibarını qazanmış, dövlət idarəçiliyində iştirak etmişdir. I Şah Təhmasib ömrünün son illərində səhhəti ilə əlaqədar dövlət işlərinə çox nüfuz edə bilmədiyi üçün oğlunun yardımına arxalanırdı. Heydər Mirzə atasından sonra özünün hakimiyyətə keçəcəyinə inanırdı, şahın rəğbətinə cavab olaraq qızılbaş əmirlərinin də ona böyük ehtiram göstərməsi bu arxayınlığın yaranmasına səbəb olmuşdu. Qoşun başçılarının bir hissəsi, *Ustaclu* və *Şeyxavənd* əmirləri, eləcə də şahzadənin ana tərəfdən qohumu olan gürcü əyanları onun tərəfində idilər. I Şah Təhmasibin ölümündən az əvvəl xəstələndiyi dövrdə *Heydər Mirzənin* tərəfdarları hətta onun ölümünü gözləmədən şahzadəni taxta çıxarmağa cəhd göstərmişdilər. I Şah Təhmasib sağaldıqdan sonra baş verənlərdən xəbər tutsa da, oğluna münasibətində heç bir dəyişiklik büruzə verməmişdi.

I Şah Təhmasib vəfat edəndə sarayda kimin hakimiyyətə gətirilməsi mövzusunda qızılbaş əmirləri arasında ciddi qarşıdurma yarandı. Əsasən Ustaclu və Şeyxavənd tayfalarının əmirləri Heydər Mirzəni dəstəkləyir, digər qızılbaş tayfalarının əksəriyyəti (o cümlədən, *Əfşar, Təkəlü, Türkman, Şamlu, Rumlu* və s. tayfaların liderləri) isə həbsdə olan İsmayıl Mirzəni (gələcək *II Şah İsmayıl*) taxta çıxarmağa çalışırdılar. Heydər Mirzə öz gücünə arxayın olaraq şahlıq tacını başına qoyub özünü şah elan etdi, I Şah Təhmasib tərəfindən yazıldığı iddia edilən vəsiyyətnaməni də sübut gətirdi. Lakin daha yaxşı silahlanmış İsmayıl Mirzə tərəfdarları sarayın qapısını bağlayaraq şahzadənin çöldəki adamlarının saraya girişinə imkan vermədilər. Hadisələrdə həlledici rolu I Şah Təhmasibin qızı *Pərixan xanım* oynadı. O, Heydər Mirzəyə yalandan beyət edə-



rək (hətta Qurana and içərək) onu arxayın etdi, özü isə hərəmxana qapısının açarlarını dayısı, çərkəz *Şamxal sultana* ötürdü. Şamxal sultan 300 nəfər çərkəz əsilli döyüşçü ilə saraya daxil oldu. Heydər Mirzə məğlub olduğunu görərək hərəmxanada, anası, gürcü məlikəsinin yanında gizlənməyə çalışdı, lakin ələ keçirilərək öldürüldü. Tərəfdarları onun kəsik başını gördükdən sonra müqavimətdən əl çəkdilər. Tezliklə İsmayıl Mirzə də Qəhqəhə qalasından azad edilib Qəzvinə gətirildi və II Şah İsmayıl adı ilə taxta oturdu.

İsgəndər bəy Münşi Heydər Mirzənin şəxsi keyfiyyətlərindən söz açarkən onu "çox əməlisaleh, pəhrizkar, rəhmdil, insanlara münasibətdə şəfqətli, mehriban və ədalətpərvər" bir şəxs kimi xarakterizə etmişdir.

Heydər Mirzənin oğlu olmamışdır, yeganə qızı I Şah Abbas zamanında 25 il Həmədanda hakimlik etmiş Həsən xan Ustaclunun xanımı idi. Onların dörd övladı *I Şah Səfinin* zamanında edam edilmişdir.

***Mənbələr:*** *İsgəndər bəy Münşi. Tarix-i aləmara-yi Abbasi (tərcümə və şərhlər: O.Əfəndiyev, N.Musalı), s.296-297 və 395-402; Həsən bəy Rumlu. Əhsən ət-təvarix (nəşrə hazırlayan: Ə.Nəvai), s.600-611.*

**HƏMZƏ MİRZƏ** (1568-1586) – Səfəvi şahzadəsi, *Şah Məhəmməd Xudabəndənin* yaşca ikinci oğlu, *I Şah Abbasın* doğma qardaşı. Anası Mazandaran hakimi Mir Abdullah xanın qızı *Məhdi-ülya* xanım idi. Həmzə Mirzə mükəmməl təhsil almış, dövlət idarəçiliyi qaydalarını gözəl mənimsəmişdi. I Şah Təhmasib Herat hakimi olan oğlu Məhəmməd Mirzəni (gələcək Şah Məhəmməd Xudabəndə, Heydər Mirzənin atası) Şiraza hakim təyin etdiyi zaman onun yerinə 7 yaşlı Həmzə Mirzəni keçirmək istəyirdi. Lakin Məhəmməd Mirzə atasından xahiş edir ki, Həmzə Mirzə ağlıkəsən yaşda olduğu üçün ata-anasından ayrı qalmaq ona çətin olacaq, daha yaxşı olar ki, o, valideynləri ilə birlikdə Şiraza getsin, südəmər körpə olan Abbas Mirzə (gələcək I Şah Abbas) isə hələ dayənin öhdəsində olduğu üçün Heratda qalsın. Beləliklə, Abbas Mirzə formal olaraq Heratın hakimi oldu (*lələsi Əliqulu xan Şamlunun* himayəsində), Həmzə Mirzə isə ailəsi ilə birlikdə Şiraza köçdü.

Şah Məhəmməd Xudabəndənin hakimiyyətinin əvvəlində Həmzə Mirzə İsfahan şəhərinin hakimi vəzifəsinə təyinat aldı. 1578-ci ildə Azərbaycana soxulmuş Osmanlı qüvvələrinə qarşı göndərilən qızılbaş qoşununun sərkərdəsi Həmzə Mirzə idi. O, anası Məhdi-ülyanın və baş vəzir *Mirzə Salmanın* müşayiəti ilə ordunun başında Şirvana gəldi və osmanlıların əlində olan Şamaxı şəhərini mühasirəyə aldı. Bu arada Krım xanının qardaşı Adil Gərayın tatar qüvvələri ilə köməyə gəldiyini eşidən Həmzə Mirzə onları Şamaxıdakı Osmanlı qarnizonu ilə birləşməyə imkan vermədən qarşılamaq qərarına gəldi. 1578-ci ilin noyabrında baş vermiş *Mollahəsən döyüşündə* qızılbaşlar tatar qoşununu darmadağın

edib Adil Gərayı əsir tutdular. Lakin qızılbaş əmirləri arasında başlamış fikir ayrılığı nəticəsində qələbəni gücləndirmək mümkün olmadı, hərbi yürüş yalnız boşalmış Şamaxı şəhərini geri almaqla bitdi.

1579-cu ildə qızılbaş əmirləri Həmzə Mirzənin anası Məhdi-ülyanı qətlə yetirdilər. Az sonra şahzadənin dayəsi olan Əliqulu xan Şamlunun anası da öldürüldü. Əmirlər baş verən özbaşınalıqdan sonra guya günahlarını yumaq üçün Həmzə Mirzənin vəliəhd elan olunmasını təklif edib hamılıqla razılıqlarını bildirdilər.

Getdikcə nüfuzunu artıran Həmzə Mirzə atasının zəif təbiətini və dövlət işlərinə meyil göstərmədiyini görərək idarəçiliyi öz əlində cəmləşdirdi. O, ətrafındakı əmirlərlə və rəiyyətlə mehriban rəftar etdiyinə, ədaləti qoruduğuna görə sevilirdi.

Həmzə Mirzə osmanlılara və kürdlərə qarşı döyüşlərdə fərqlənmiş, Abbas Mirzənin tərəfdarlarına qarşı təşkil edilmiş Xorasan yürüşündə atasının yanında yer tutmuşdu. Savaşlarda o, özünü bacarıqlı sərkərdə və şücaətli döyüşçü kimi göstərirdi.

1586-cı ildə Həmzə Mirzənin Azərbaycan (Təbriz) bəylərbəyi *Əmir xan Mosullunu* vəzifəsindən azad edib həbsə salması Türkman və Təkəlü tayfalarının ciddi narazılığına səbəb oldu. Onlar Həmzə Mirzənin vəliəhdliyi ilə razılaşmayıb kiçik qardaşı *Təhmasib Mirzəni* özləri ilə Qəzvinə apardılar. Təhmasib Mirzə Türkman-Təkəlü alyansı tərəfindən vəliəhd elan edildi. Bu zaman Həmzə Mirzə osmanlıların əlində olan Təbriz şəhərinin mühasirəsi ilə məşğul idi. Xeyli cəhddən sonra şəhər geri alındı, amma şəhər qalası hələ də Osmanlı qarnizonunun əlində idi. Bu arada Həmzə Mirzə Türkman və Təkəlü tayfalarının üsyanından xəbər tutub onların çıxışını yatırtmaq üçün Təbriz ətrafından hərəkətə keçdi. Qarşıdurmada Təkəlü və Türkman tayfalarından və digər tayfaların bəzi əmirlərindən başqa əksər qızılbaşlar Həmzə Mirzənin tərəfini tutdular. 1586-cı ildə baş vermiş döyüş Həmzə Mirzənin qələbəsi ilə başa çatdı, qarşı tərəfin başçıları öldürüldü, Təhmasib Mirzə Ələmut qalasına göndərildi.

Məğlub olan qüvvələr vəliəhddən intiqam almaq üçün ona qarşı sui-qəsd hazırladılar. Bu məqsədlə Həmzə Mirzənin erməni mənşəli bərbəri dəllək Xudaverdidən istifadə edildi. O, 1586-cı ilin sonlarında Gəncə ətrafında şahzadəni qətlə yetirdi.

Həmzə Mirzə atasının əmisi oğlu *Sultan Hüseyn Mirzənin* qızı ilə (*Bəhram Mirzənin* nəvəsi) ailə qurmuş, lakin həyat yoldaşı bir neçə ildən sonra dünyasını dəyişmişdi. Sonralar o, baş vəzir Mirzə Salman Cabirinin qızı ilə evlənmişdir. Həmzə Mirzənin daha bir siyasi izdivacı Kaxeti çarı II İraklinin qızı ilə baş tutmuşdur.

***Mənbələr:*** *İsgəndər bəy Münşi. Tarix-i aləmara-yi Abbasi (tərcümə və şərhlər: O.Əfəndiyev, N.Musalı), s.285, 293, 663-669; Lüğətnameyi-Dehxuda, VI, 9201-9202; The Encyclopaedia of Islam (New Edition), Volume 3, p.157.*



**HƏSƏN MİRZƏ** (vəf. 1525) – *I Şah İsmayılın* atabir, ana ayrı qardaşı, *Şeyx Heydərin* oğlu. Anası *Şeyx Cüneydin* əmisi *Şeyx Cəfərin* oğlu Şeyx Qasimin qızıdır. Həsən Mirzə I Şah İsmayıldan yaşca bir qədər böyük olmuşdur. Çünki şahzadələr 1494-99-cu illər arasında Gilanda yaşadıqları zaman Həsən Mirzə artıq hərbi əməliyyatlarda iştirak edirdi. Lahican hakimi Mirzə Əli Kərkiya (o, I Şah İsmayılı himayə etmiş və sarayında gizlətmişdi) Rüstəmdar hakimi Məlik Kavusla qardaşı Məlik Bisütun arasındakı hakimiyyət çəkişməsində birincini dəstəkləmiş, ona hərbi yardım yollamışdı. Məlik Kavusun köməyinə göndərilmiş üç hərbi dəstədən birinin sərkərdəsi Həsən Mirzə idi.

I Şah İsmayıl Qızılbaş dövlətini qurmaq uğrunda mücadiləyə başladıqda Həsən Mirzə onun yanında olmuş, Şirvanşah Fərrux Yasara və Ağqoyunlu Əlvənd Mirzəyə qarşı döyüşlərdə fəal iştirak etmişdir. Sonralar o, təriqət həyatına, ibadət və inzivaya üstünlük vermiş, I Şah İsmayılın zamanında iki dəfə Ərdəbildəki Şeyx Səfi təkkəsinə mütəvəlli vəzifəsinə təyinat almışdır. Ərdəbildə təriqət həyatı yaşadığı müddətdə o, təkkənin genişləndirilməsi ilə məşğul olmuş, təkkə binasına eyvan artırmış və yaxınlıqda xəstəxana ilə hədis evi (mədrəsə) tikdirmişdir. Onun evi də Ərdəbildə Şeyx Səfi xanəgahının *vəqfi* olan Vəzir hamamının yaxınlığında yerləşirdi. Həsən Mirzə 1525-ci ildə dünyasını dəyişmişdir.

***Mənbələr:*** *Namiq Musalı. Şah İsmayılın böyük qardaşı İbrahim Mirzə və qızılbaş hərəkatındakı rolu* (*IV. Uluslararasi Alevilik ve Bektaşilik Sempozyumu (18-20 Ekim 2018, Ankara) Bildiriler Kitabi), s.207.*

**HƏSƏN MİRZƏ** (1558/59-1577) – Səfəvi şahzadəsi, *Şah Məhəmməd Xudabəndənin* böyük oğlu. Anası Gilanın möhtərəm seyidlərindən olan Mir Əbdüləzim Seyfi Hüseyninin qızı Fərxəndə xanım idi. Babası I Şah Təhmasibin vəfatı zamanı 18 yaşında olduğunu yazırlar; bu məlumata əsasən 1558/59-cu illərdə anadan olmuşdur. Babasının himayəsi altında böyüyüb tərbiyə almış və onun tərəfindən Mazandaran vilayətinin yarısına hakim təyin edilmişdi. Mazandaran əmirlərindən olan Mirək Div şahzadənin *lələsi* olaraq hakimiyyət məsələlərində ona yardım edirdi. Lələsinin idarəçilik işlərini öz əlində toplaması Həsən Mirzənin xoşuna gəlmədiyindən dayısı oğlu Mir Əziz xanın təhriki ilə, şahdan icazə almadan onu qətlə yetirdi. I Şah Təhmasib hadisədən xəbər tutanda Mir Əziz xanı İstəxr qalasında həbs etdirdi, Həsən Mirzəni yaxın ətrafındakı əmirlərin təsirindən qurtarmaq üçün onları Mazandaran sarayından uzaqlaşdırdı. Bunun nəticəsində şahzadə ona düşmən münasibət bəsləyən əmirlərin əhatəsində qaldı və nüfuzunu itirməyə başladı. I Şah Təhmasibin vəfatından sonra Mazandaran əmirləri Mirək Divin intiqamını almaq bəhanəsi ilə şahzadəyə qarşı üsyan qaldırdılar. Həsən Mirzə əlacsız halda Mazandarandan çıxıb Qəzvin isti-

qamətində yola düşdü. O, doğma nənəsi *Sultanım xanımın* himayəsinə arxalanaraq sarayda nüfuz qazanmağa və varissiz əmisi *II Şah İsmayıldan* sonra taxta çıxmağa ümid edirdi. Lakin II Şah İsmayıl onun paytaxt Qəzvinə daxil olmasına icazə verməyib bir müddət Tehranda qalmasını əmr etdi. Tezliklə Sultan Həsən Mirzənin öz əmisini hakimiyyətdən salıb yerinə keçmək niyyətində olduğu barədə şayiələr yayıldı. Şah qardaşı oğlunu aradan götürməyi əvvəlcə Müseyyib xan Şərəfəddinoğlu Təkəlüyə tapşırdı, lakin onun əmrdən narazı qaldığını öyrənib Kosa Əliqulu Türkmanı bu işə təhkim etdi. Hər qızılbaş oymağından iki *qorçu* olmaqla 40-50 nəfərlik dəstə toplanıb onun ixtiyarına verildi ki, şahzadəni öldürsünlər. Sultan Həsən Mirzə sarayın damına qalxaraq müqavimət göstərmək istədi, amma Kosa Əliqulu yalandan and içdi ki, onu şahın hüzuruna aparmaq məqsədilə gəlib. Şahzadə təslim olan kimi onu kəndirlə boğub öldürdülər. Bunun ardınca Şirazda olan Məhəmməd Mirzənin (gələcək Şah Məhəmməd Xudabəndənin) və oğullarının həbs edilməsi barədə əmr verildi. Lakin II Şah İsmayıl qardaşını aradan götürməyə imkan tapmadan öldü. Sultan Həsən Mirzə ədəbiyyat sahəsində də qələmini sınamış və şeir yazmışdır.

***Mənbələr:*** *İsgəndər bəy Münşi. Tarix-i aləmara-yi Abbasi (tərcümə və şərhlər: O.Əfəndiyev, N.Musalı), s.284-285, 428-431; Qazı Əhməd Qumi. Xülasət ət-təvarix (nəşrə hazırlayan: Ehsan İşraqi), II, 650.*

**HƏSƏN MİRZƏ** (1589-1591) – Səfəvi şahzadəsi, *I Şah Abbasın* ikinci oğlu. 1589-cu ildə, I Şah Abbas Larican yaylağında dincələrkən dünyaya gəlmişdir. *Çigini* (Çəkəni) tayfasından *Budaq xan* onun *ləләsi* (tərbiyəçisi) idi. Budaq xan körpə şahzadənin adından Məşhədi idarə edirdi. Lakin az sonra I Şah Abbas onu hakimiyyətə gətirmiş *Mürşidqulu xan Ustaclunu* aradan qaldırdı. Budaq xan Mürşidqulu xanın yaxın ətrafından sayıldığı üçün şahın qəzəbinə düçar olacağından qorxub körpə şahzadəni də özü ilə götürərək Məşhəddən çıxdı, Quçan şəhərinin ətrafındakı qalalardan birinə sığınıb müdafiəyə hazırlaşdı. I Şah Abbas əvvəlcə Həsən Mirzəni Mürşidqulu xanın əvəzinə Məşhəd hakimi təyin edib Xorasan vilayətinin idarəçiliyini ona tapşırmaq istəyirdi. Bu zaman özbəklər Xorasana hücum edib Quçan ətrafına gəlib çıxdılar. Budaq xan özbəklərlə döyüşdə məğlub oldu, şaha təslim olmaqdan başqa çarə görməyib şahzadəni öz böyük oğlu ildə birlikdə Qəzvinə yolladı (1590). Bir ildən sonra Budaq xanın sarayda girov olan oğlu şahın əmri ilə öldürüldü, o özü də digər övladları ilə birlikdə həbs edildi (sonralar azad edilib xidmətə qaytarıldılar). Bu hadisələr baş verəndə körpə şahzadə Həsən Mirzə də təbii ölümlə dünyasını dəyişdi.

Bəzi mənbələrdə I Şah Abbasın körpə yaşlarında dünyasını dəyişmiş Təhmasib Mirzə adlı oğlundan söz açılır ki, onun Həsən Mirzə ilə eyni olduğu ehtimal edilir.



***Mənbələr:*** *Nəsrullah Fəlsəfi. I Şah Abbasın həyatı, II, 185-186; İsgəndər bəy Münşi. Dünyanı bəzəyən Abbasın tarixi (fars dilindən çevirən: Ş.Fərzəliyev), s.696, 713-715; Roger Savory. Səfəvilər dövrünün İranı (fars dilinə tərcümə: Kambiz Əzizi), s.91-92.*

**HƏVVA BƏYİM** – Səfəvi şahzadəsi, *I Şah Abbasın* dördüncü qızı. Həyatı haqqında məlumat azdır. Əvvəlcə I Şah Abbasın zamanında *sədr* vəzifəsini daşıyan Mirzə Rəzi Şəhristaniyə ərə getmiş, bu izdivacdan Mirzə Məhəmməd Tahir adlı bir oğlu doğulmuşdur; Mirzə Məhəmməd Tahir şeirlər də yazırdı. Mirzə Rəzi 1617-ci ildə vəfat etdikdən sonra sədrlik məqamı onun körpə oğlu Sədrəddinə verilmiş, əmisi oğlu Mirzə Rəfiəddin Şəhristani də onun naibi olaraq vəzifəni icra etməyə başlamışdı. Bundan sonra Həvva bəyim Mirzə Rəfiəddin (birinci həyat yoldaşının qardaşı oğlu) ilə ailə qurmuş və bu evlilikdən daha iki oğlu dünyaya gəlmişdir. Övladlarından birinin adı Məhəmməd Sadiq idi, I Şah Abbas onun adını dəyişdirib Əlaəddin Məhəmməd qoymuşdu. Mirzə Əlaəddin Məhəmməd mükəmməl təhsil almış, xüsusilə fiqh, kəlam və nücum elmlərini dərindən mənimsəmişdi. Bundan əlavə, gözəl təbə malik idi, "Faiz" təxəllüsü ilə şeir yazırdı, bu təxəllüsü də onun üçün Saib Təbrizi bəyənmişdi.

Həvva bəyimin dəqiq vəfat tarixi bilinmir, amma atasının sağlığında dünyasını dəyişdiyi məlumdur.

*I Şah Səfi* taxta çıxdıqdan bir müddət sonra Səfəvi qanını daşıyan digər bir neçə şahzadə kimi, Həvva bəyimin üç oğlunun da gözləri çıxarıldı (1632). Həvva bəyimin əri Mirzə Rəfi Şəhristani də vəzifəsindən uzaqlaşdırıldı.

*"Təzkireyi-Nəsrabadi"də* Mirzə Əlaəddinin Mirzə Abdullah adlı kiçik oğlu olduğu, onun da atası kimi gözlərinin çıxarıldığı, amma buna rəğmən təhsil alıb yüksək elmi dərəcəyə çatdığı qeyd edilir.

***Mənbələr:*** *Nəsrullah Fəlsəfi. I Şah Abbasın həyatı, II, 201; M.H.Riyahi. İsfahanın məşhur qadınları, s.151-152; İsgəndər bəy Münşi. Zeyli-Tarixi-aləmarayi-Abbasi, s.90; Şeyx Səfidən Şah Səfiyə kimi ("Tarixi-sultani"dən, nəşrə hazırlayan: E.İşraqi), s.244; Təzkireyi-Nəsrabadi, s.12-16.*

**HÜSEYN MİRZƏ** (vəf. 1576) – Səfəvi şahzadəsi, *Bəhram Mirzənin* böyük oğlu, *I Şah İsmayılın* nəvəsi. I Şah Təhmasibin zamanında osmanlılara qarşı müxtəlif hərbi əməliyyatlarda iştirak etmişdir. 1556-cı ildə özbəklər Bayram xan Türkmanın köməkçisi tərəfindən idarə olunan Qəndəhara hücum çəkəndə şəhər hakimi I Şah Təhmasibə məktub yazıb kömək istədi. Şahın əmri ilə Hüseyn Mirzənin sərkərdəliyi altında Əliyar sultan Əfşar, Vəli xəlifə Şamlu, Vəli xəlifənin oğlu Şahverdi xəlifə və digər qızılbaş əmirlərinin qatıldığı ordu yola düşdü. Lakin qızılbaşlar özbəkləri qovduqdan sonra Qəndəhar hakimi qala qapılarını onların üzünə bağladı. I Şah Təhmasib bu dəfə Əli sultan Tatıoğlu Zülqədərin başçılığı altında başqa bir qı-

zılbaş qoşununu Hüseyn Mirzənin köməyinə yolladı. 1558-ci ildə Qəndəhar şəhəri və ətraf bölgələr Səfəvi dövlətinə birləşdirildi, Hüseyn Mirzə bu torpaqların hakimi təyin olundu. O, 20 ilə yaxın müddətdə Qəndəhar və Zəmindavər bölgələrini idarə etmiş, *II Şah İsmayılın* hakimiyyəti dövründə (1576) dünyasını dəyişmişdir. Mənbələrdə öz əcəli ilə ölməsi barədə məlumatlar üstünlük təşkil edir.

Hüseyn Mirzənin beş oğlu və bir qızı olmuşdur. Böyük oğlu Məhəmməd Hüseyn Mirzə Qəzvində sarayda yaşayırdı, 18 yaşında ikən II Şah İsmayılın əmri ilə öldürüldü. Digər dörd oğlu Müzəffər Hüseyn Mirzə, Rüstəm Mirzə ("Fədai" təxəllüsü ilə şeirlər yazırdı), Səncər Mirzə və Əbu Səid Mirzə bir müddət Qəndəhar, Zəmindavər və digər bölgələrdə hakimlik etmişlər. Digər qonşu vilayət əmirləri və bir-biri ilə uzunmüddətli hakimiyyət davasından sonra qardaşlar çoxalan özbək hücumunun qarşısında zəiflədiklərini görüb Hindistana köçdülər. Hüseyn Mirzənin qızı Oğlanpaşa xanım şahzadə *Həmzə Mirzə* (I Şah Abbasın qardaşı) ilə ailə qurdu, onun vəfatından sonra I Şah Abbasa ərə getdi.

*__Mənbələr:__ İsgəndər bəy Münşi. Tarix-i aləmara-yi Abbasi (tərcümə və şərhlər: O.Əfəndiyev, N.Musalı), s.301-302; Dünyanı bəzəyən Abbasın tarixi (fars dilindən çevirən: Ş.Fərzəliyev, II kitab), s.808-822; Nətənzi. Nəqavət əl-asar fi zikr əl-əxyar dər tarixi-Səfəviyyə (nəşrə hazırlayan: Ehsan İşraqi), s.46.*

**XACƏ CƏMŞİD** – Səfəvilər sülaləsinin üzvü, *Şeyx Cüneydin* oğlu və *Şeyx Heydərin* qardaşı olduğu ehtimal edilir. Həyatı haqqında məlumat yox dərəcəsindədir. Məlum olan budur ki, qardaşı Şeyx Heydərlə birlikdə Dağıstan yürüşündə iştirak etmiş və ehtimala görə, həmin yürüşdə öldürülmüşdür. Son illərdə Dağıstan alimləri tərəfindən Kubaçı şəhərinin ətrafında ona mənsubluğu ehtimal edilən qəbir daşı aşkar olunmuşdur. 50x60 sm ölçüyə malik qəbir daşında süls xətti ilə "Şəhid Xacə Cəmşid ibn Sultan Şeyx Cüneyd ibn Şeyx İbrahim ibn Sultan Xacə Əli ibn Sultan Şeyx Musa ibn Sultan Şeyx Səfi" yazılmışdır. Başdaşının tarix həkk olunmuş axırıncı sətri oxunmaz vəziyyətdədir. Eyni zamanda Dağıstanın Tinit kəndində vaxtilə Şeyx Heydərin qəbri üzərində mövcud olmuş məqbərədən qalan məzar daşı da aşkar edilmişdir.

Şeyx Cüneydin Şeyx Heydərdən əlavə *Xacə Məhəmməd* və Seyid Cəmşid adlı oğullarının olması Səfəvilər tarixinə aid mühüm mənbələrdən sayılan *"Səfvət əs-səfa"nın* bəzi nüsxələrində də qeyd edilmiş, lakin onun haqqında heç bir əlavə məlumat verilməmişdir.

*__Mənbələr:__ Timur Aytberov. Şeyx Heydər Səfəvinin Dağıstanda yeni tapılmış məzar daşı ("Pəyami-bəharistan" dərgisi, 1389 h.-ş., № 9), s.407-408; İbn Bəzzaz Ərdəbili. Səfvət əs-səfa, s.1239.*

**XACƏ MƏHƏMMƏD** – Səfəvilər sülaləsinin üzvü, *Şeyx Cüneydin* çərkəz əsilli kənizlə izdivacından doğulmuş oğlu,



*Şeyx Heydərin* ögey qardaşı. Şeyx Cüneyd Dağıstan yürüşü zamanı həmin qadınla evlənmiş və bu izdivacdan Xacə Məhəmməd doğulmuşdu. Ümumiyyətlə, Şeyx Cüneydin Şeyx Heydərdən başqa digər övladları barədə mənbələrdəki məlumatlar fərqlidir. Bəzi mənbələrdə onun Şeyx Heydərdən başqa yalnız Xacə Məhəmməd adlı oğlunun, digərlərində isə bundan başqa *Xacə Cəmşid* adlı daha bir oğlunun olduğu qeyd edilmişdir.

Xacə Məhəmmədin fərqli qadınlardan iki oğlu vardı. Səfəvilər soyundan olan bir qadınla evlilikdən Xacə Nemət adlı oğlu doğulmuş, onun da Ağa Yusif Mirzə, Rəzixan Mirzə və Abbas Mirzə adlı oğulları olmuşdur. Xacə Məhəmmədin digər oğlunun adı Xacə Xanəhməd idi. O, I Şah Təhmasibin ən yaxın ətrafından sayılan *Məsum bəy Səfəvinin* (vəf. 1568/69) atasıdır. Məsum bəyin Mahmudxan Mirzə adlı qardaşı da olmuşdur; onun övladları İshaq Mirzə, Musa xan, Mir Hüseyn Mirzə, Müzəffər xan Məczub, Məhəmməd Hüseyn bəy həcc zəfəri zamanı Məsum bəylə birlikdə müəmmalı şəkildə qətlə yetirilmişlər. Mahmudxan Mirzənin daha bir oğlunun adı Cahanbəxş Mirzə idi.

Şeyx Cüneydin həmin çərkəz qadından olan qızı (Xacə Məhəmmədin bacısı) Şahpaşa xatun Xalxal ətrafından olan Məhəmməd bəy Talışla ailə qurmuşdur. Məhəmməd bəy Talış I Şah İsmayılın körpəlik dövründə onun yanında olmuş və onu qorumuşdur.

***Mənbələr:*** *Şeyx Hüseyn Pirzadə Zahidi. Silsilət ən-nəsəbi-Səfəviyyə, s.67; Kioumars Ghereghlou. Haydar Safavi (Encyclopaedia Iranica, online edition,* 2016*).*



**XANAĞA BƏYİM** – Səfəvi şahzadəsi, *I Şah Abbasın* üçüncü qızı. Həyatı haqqında məlumat azdır. *Sultan əl-üləma* və Xəlifə sultan ləqəbli Seyid Hüseyn Mərəşi Amulinin (vəf. 1654) xanımı idi. Onların izdivacı 1600-cü ilin əvvəllərində (və ya 1608-ci ilin sonlarında) baş tutmuşdur. Sultan əl-üləma I Şah Abbasın anası tərəfdən qohumu olduğu üçün sarayda uca məqama sahib idi, baş vəzir mənsəbində xidmət edirdi. O həm də öz dövrünün görkəmli din alimi kimi tanınmışdı. Xanağa bəyimin Sultan əl-üləma ilə izdivacdan dörd oğlu doğulmuş, amma onların hamısı *I Şah Səfinin* hakimiyyəti zamanı Səfəvi qanını daşıdıqları üçün taxt-taca təhlükə sayılaraq kor edilmişdir (1632). Bu iş *sipəhsalar Rüstəm bəyə* və *Şeyx Zahid Gilaninin* nəslindən olan Çıraq xana həvalə olunmuşdu. Bu hadisədən sonra Sultan əl-üləma vəzirlikdən kənarlaşdırılmış, *Əbu Talib xan Ordubadi* onun yerinə keçmişdir.

***Mənbələr:*** *Nəsrullah Fəlsəfi. I Şah Abbasın həyatı, II, 200-201; M.H.Riyahi. İsfahanın məşhur qadınları, s.155; İsgəndər bəy Münşi. Zeyli-Tarixi-aləmarayi-Abbasi, s.90; Şeyx Səfidən Şah Səfiyə kimi ("Tarixi-sultani"-dən, nəşrə hazırlayan: E.İşraqi), s.244.*



**XANIŞ BƏYİM** (vəf. 1563/64) – Səfəvi şahzadəsi, *I Şah İsmayılın* yaşca ən böyük övladı. 1506/07-ci illərdə doğulmuşdur. 1522-ci ildə Gilanın Biyə-pəs

mahalının hakimi Sultan Hüsaməddin Əmirə Dubac Fuməni Səfəvilər dövlətinə tabe olmaqdan imtina etmiş, amma qızılbaş qoşununun hücumu qarşısında təslim olub şahın hüzuruna gəlmişdi. I Şah İsmayıl onu bağışlamaqla yanaşı ölkənin şimal sərhədlərində əmin-amanlıq yaratmaq məqsədilə öz qızı Xanış bəyimi ona ərə vermişdi. Bu izdivacdan sonra Sultan Hüsaməddin Müzəffər sultan fəxri ləqəbini qazandı. I Şah Təhmasibin zamanında Osmanlı qoşununun hücumundan ümidlənən Müzəffər sultan Səfəvilər dövlətinə sədaqət andını pozaraq öz dəstəsi ilə əks tərəfə keçdi. I Şah Təhmasib "yandırılmış torpaq" taktikası sayəsində Osmanlı ordusunu yorub nəticəsiz halda geri qayıtmağa məcbur etdikdən sonra Müzəffər sultan Şirvana sığındı. Lakin Şirvanşah II Xəlilullahın qəfil ölümü (1535) nəticəsində o, əsir tutularaq Təbrizə göndərildi və burada edam edildi.

Bu hadisədən sonra I Şah Təhmasib dul qalmış bacısını atasının zamanında ən yüksək dövlət vəzifəsi olan *vəkillik* mənsəbini tutmuş və *Çaldıran savaşında* öldürülmüş Əmir Nizaməddin Əbdülbaqi Yəzdinin oğlu Şah Nemətullah Yəzdiyə ərə verdi. Yəzdilər böyük sufi Şah Nemətullah Vəlinin övladları idilər. Xanış bəyimin bu izdivacdan Pəripeykər adlı qızı və Mirmiran ləqəbli Əmir Qiyasəddin adlı oğlu doğulmuşdur. Pəripeykər xanım sonralar şahzadə İsmayıl Mirzənin (gələcək *II Şah İsmayıl*) həyat yoldaşı oldu; I Şah Təhmasib onlar üçün misli görünməmiş təmtəraqlı toy təşkil etmişdi. Mirmiranın iki oğlu da şah nəsli ilə qohumluq əlaqəsini davam etdirmişdir. Babasının adını daşıyan Şah Nemətullah I Şah Təhmasibin qızı *Xanış bəyimlə* ailə qurmuşdur. Digər oğlu Şah Xəlilullah isə II Şah İsmayılın qızı Səfiyyə sultan bəyimlə evlənmişdir.

I Şah İsmayılın qızı Xanış bəyim mənbələrdə dindar və xeyriyyəçi qadın kimi xarakterizə olunur. O, 1556-cı ildə öz ixtiyarında olan xeyli daşınmaz əmlakı (Yəzd şəhərindəki mülkləri və şəhər ətrafındakı bütöv kəndləri) Kərbəladakı İmam Hüseyn (ə) hərəminə *vəqf* etmiş, öz var-dövlətini hərəmin xərclərinə və zəvvarların xidmətinə bağışlamışdı.

Xanış bəyim 1563-cü və ya 1564-cü ildə vəfat etmişdir. Əri Şah Nemətullah Yəzdi onun vəsiyyətinə uyğun olaraq cənazəsini Kərbəlada basdırmaq, həm də həcc ziyarətini yerinə yetirmək məqsədilə yola çıxmış, İraq ziyarətlərini başa vurduqdan sonra yolda maneə yarandığı üçün həccə gedə bilməyib geri qayıtmış və Həmədanda dünyasını dəyişmişdir.

Bəzi mənbələrdə Xanış bəyimin Xeyrənnisa ləqəbini daşıdığı qeyd edilmişdir. Bəzi mənbələrə görə isə, I Şah İsmayılın Müzəffər sultana ərə getmiş qızının adı Xeyrənnisa olmuş və o, 1532-ci ildə dünyasını dəyişmişdir.

***Mənbələr:*** *İsgəndər bəy Münşi. Tarix-i aləmara-yi Abbasi (tərcümə və şərhlər: O.Əfəndiyev, N.Musalı), s.301, 315-316 və 459; Həsən bəy Rumlu. Əhsən ət-təvarix (nəşrə hazırlayan: Ə.Nəvai), s.524 və 700-701; M.K.Yusifcəmali. I Şah İsmayılın həyatı, s.209; Qazı Əhməd Ğəffari Qəzvini. Tarixi-*



*cahanara, s.309; Əbdi bəy Şirazi. Təkmilət əl-əxbar (nəşrə hazırlayan: Ə.Nəvai), s.198.*

**XANIŞ BƏYİM** – Səfəvi şahzadəsi, *I Şah Təhmasibin* qızı. Şahzadə *İmamqulu Mirzənin* doğma bacısı. Bibisi *Xanış bəyimin* şərəfinə adlandırılmışdır. O, Yəzdin nüfuzlu seyidlərindən olan Mirmiran Yəzdinin oğlu Şah Nemətullah ilə ailə qurmuşdu. Böyük sufi Şah Nemətullah Vəlinin soyundan olduğu iddia edilən Mirmiranlar nəsli hələ bundan əvvəl də Səfəvilər dövlətində yüksək məqam sahibi idi. Əbdülbaqi Yəzdi (vəf. 1514) I Şah İsmayıl zamanında *vəkil* mənsəbinə yüksəlmişdi. I Şah Təhmasibin bacısı *Xanış bəyim* Əbdülbaqi Yəzdinin oğlu Şah Nemətullah Yəzdi ilə ailə qurmuşdu. Həmçinin şah öz qızı Xanış bəyimi də Şah Nemətullah Yəzdinin eyniadlı nəvəsinə ərə vermiş, bu izdivacdan onların Səncər adlı oğlu doğulmuşdu. Səncər sultan yaşlı olmasına baxmayaraq, *I Şah Səfinin* zamanında kor edildi.

***Mənbələr:*** *İsgəndər bəy Münşi. Tarix-i aləmara-yi Abbasi (tərcümə və şərhlər: O.Əfəndiyev, N.Musalı), s.301, 315-316 və 459; Həsən bəy Rumlu. Əhsən ət-təvarix (nəşrə hazırlayan: Ə.Nəvai), s.542 və 700-701; Səfəvilər tarixi ("Xülasət ət-təvarix" və "Tarixi-Molla Kamal"; nəşrə hazırlayan: İbrahim Dehgan), s.84.*

**XEYRƏNNİSA BƏYİM** – *bax:* **ŞAHZADƏ BƏYİM.**

**XƏDİCƏ SULTAN BƏYİM** – Səfəvi şahzadəsi, *I Şah Təhmasibin* qızı. Anası Dağıstan hakiminin qızı idi. Gilan hakimi Cəmşid xana ərə getmiş, bu izdivacdan iki oğlu doğulmuş, lakin hər ikisi gənc yaşında dünyasını dəyişmişdir. I Şah Abbasın zamanında Cəmşid xan vəfat etdikdən sonra Xədicə sultan bəyim Yəzdin nüfuzlu seyidlərindən Mirmiran Yəzdinin oğlu Şah Nemətullah ilə ailə qurmuşdur. (Bundan xeyli əvvəl I Şah Təhmasibin digər qızı *Xanış bəyim* Şah Nemətullaha ərə getmiş, amma qısa müddətdən sonra dünyasını dəyişmişdi). *İsgəndər bəy Münşi "Tarixi-aləmarayi-Abbasi"* kitabının ilk variantını bitirən zaman (1616) Xədicə sultan bəyim hələ sağ idi.

***Mənbələr:*** *İsgəndər bəy Münşi. Tarix-i aləmara-yi Abbasi (tərcümə və şərhlər: O.Əfəndiyev, N.Musalı), s.300; Həsən bəy Rumlu. Əhsən ət-təvarix (nəşrə hazırlayan: Ə.Nəvai), s.637.*

**İBRAHİM MİRZƏ** – Səfəvilər sülaləsinin nümayəndəsi, *Şeyx Heydərin* oğlu, *I Şah İsmayılın* doğma qardaşı. Anası Ağqoyunlu hökmdarı *Uzun Həsənlə* Trabzon (Trapezund) imperatoru IV Böyük İohann Komninin (ləqəbi Kaloİoannes – "gözəl İohann") qızı Teodoranın (*Dəspinə xatun*) izdivacından doğulmuş *Aləmşah bəyimdir*. Yaşca I Şah İsmayıldan bir və ya üç yaş böyük, *Sultan Əli Mirzədən* kiçik idi. Uşaq ikən anası və qardaşları ilə birlikdə Ağqoyunlu Sultan Yaqubun göstərişinə əsasən həbsdə olmuşdur. Böyük qardaşı Sultan Əlinin qətlindən sonra İbrahim Mirzə kiçik qardaşı İsmayılla birlikdə

bir müddət Ərdəbildə və Gilanda qızılbaş əmirləri tərəfindən gizlədilmişdir. Sonralar anası ilə görüşmək üçün Gilandan Ərdəbilə qayıtmışdır. Bu qayıdışın səbəbini səfəviyyə təriqətinin rəhbərliyi tərəfindən düşünülmüş planla əlaqələndirirlər. Belə ki, bəzi məlumatlara görə, atasından sonra təriqətin başçısı olan Sultan Əli Mirzə ölümündən qabaq iki qardaşı arasında vəzifə bölgüsü aparmışdı. O, təriqətin mənəvi rəhbərliyini İbrahim Mirzəyə, siyasi və hərbi rəhbərliyini isə İsmayıl Mirzəyə həvalə etmişdi. Məhz buna görə İbrahim Mirzə Ərdəbilə qayıtmışdı ki, buradakı sufilərə başçılığı və təriqətin mənəvi rəhbərliyini üzərinə alsın; həm də Ağqoyunlular İsmayılı tapıb aradan götürəcəkləri təqdirdə İbrahim Mirzə onun yerini tutsun.

Bu nəzəriyyənin qarşısında bəzi tədqiqatçılar İbrahim Mirzənin Ağqoyunlularla razılıq əsasında aşkar şəkildə Ərdəbilə qayıtdığını yazır və bunu Ağqoyunlu Rüstəm padşahın Şeyx Heydər ailəsinə münasibətdə daha mülayim mövqeyə keçməsi ilə izah edirlər. Şərqşünas M.Mazzaoui isə İbrahim Mirzənin Ərdəbilə girov qismində qayıtdığını göstərir.

İbrahim Mirzənin Ərdəbilə qayıtdıqdan sonrakı həyatı barədə xəbərlər ziddiyyətlidir. Bəzi məlumatlara görə, o, Ərdəbilə qayıtdıqdan sonra öz əcəli ilə dünyasını dəyişmiş, yaxud Gilanda yeniyetmə yaşında ikən vəfat etmişdir. *"Silsilət ən-nəsəbi-Səfəviyyə"də* I Şah İsmayılın digər qardaşlarının düşmənlər tərəfindən öldürüldüyü və Şeyx Heydər nəslinin yalnız onun vasitəsilə davam etdiyi yazılıb. *"Fəvaid əs-Səfəviyyə"* kitabında da Ərdəbilə qayıtdıqdan sonra İbrahim Mirzənin öldürüldüyü qeyd edilib.

Tədqiqatçılar arasında İbrahim Mirzənin Səfəvi dövləti qurulmazdan əvvəl vəfat etməsi, yaxud dövlət quruculuğu prosesində I Şah İsmayılın yanında yer alması məsələsində fikir ayrılığı vardır. I Şah İsmayılın 1500-cü ildə Ərdəbilə gələrək anası və qardaşı ilə görüşməsi faktı mənbələrdə öz əksini tapmışdır; böyük ehtimalla, burada məhz şahın Aləmşah bəyimlə yanaşı Ərdəbildə yaşamağa daha çox haqqı çatan anabir qardaşı İbrahim Mirzə nəzərdə tutulur.

Səfəvilər dövrünün tarixinə aid mühüm mənbələrdən sayılan, *"Aləmarayi-Səfəvi"* və ya "Aləmarayi-Şah İsmayıl" adları ilə tanınan anonim əsərdə İbrahim sultanın sonrakı həyatı barədə bəzi biliklərə rast gəlirik. Bu əsərdən məlum olur ki, I Şah İsmayılın hakimiyyətinin əvvəllərində İbrahim Mirzə *lələsi* möhürdar Saru Əli bəy Təkəlü ilə birlikdə Təbrizdə yaşayırmış. O, 1503-cü ildə Ağqoyunlu Sultan Muradın qoşununa qarşı *Almabulağı savaşında*, eləcə də bu savaşdan əvvəl baş vermiş *çərxçi* (avanqard) qüvvələrin toqquşmasında sərkərdə qismində iştirak etmişdir.

1506-cı ildə *Sarom xan Kürdlə* savaşda İbrahim Mirzə yaralanmış, lələsi Saru Əli bəy öldürülmüşdü. İbrahim Mirzə 1507-ci ildə *Zülqədəroğulları bəyliyinə* qarşı həyata keçirilmiş yürüşə də qatılmışdı. Bəzi məlumatlara görə, o, Osmanlı sərhədlərində şahzadə Səlim Yavu-



zun qüvvələrinə qarşı aparılan hərbi əməliyyatlarda əsir düşərək Trabzonda bir müddət əsarətdə qalmış, daha sonra II Sultan Bayezidin əmrinə əsasən azadlığa buraxılmışdı (1508-10-cu illər). Onun osmanlılara əsir düşməsi faktı tam sübuta yetməsə də, sərhəd toqquşmalarında iştirak etməsi dəqiqdir. Mənbələr İbrahim Mirzənin 1508-09-cu illərdə hərbi yürüşlərə qatıldığını, I Şah İsmayılın 1510-cu il Herat yürüşü zamanı canişin qismində onu Təbrizdə əvəz etdiyini xəbər verir. Nəhayət, onun *Çaldıran savaşı* gedişində qızılbaş sərkərdələrinin arasında yer tutduğunu göstərən məlumatlar da mənbələrdə mövcuddur. 1514-cü ildən sonra İbrahim Mirzənin həyat yolunu izləmək mümkün deyildir.

Klassik Səfəvi mənbələrində İbrahim Mirzə haqqında bu qədər az məlumat verilməsi şah nəslinin digər nümayəndələrinə qarşı salnaməçilərin qısqanc münasibətilə izah edilə bilər. Şeyx Heydərin digər oğullarının da I Şah İsmayıl zamanındakı hadisələrin təsvirində adları nadir hallarda çəkilir. Tarixçilər Səfəvilər soyunun yeganə lideri kimi I Şah İsmayılın rolunu qabartmaq üçün onun yaxın qohumlarının hərbi və siyasi fəaliyyətinin üzərindən çox zaman sükutla keçməyə üstünlük verirdilər.

***Mənbələr:*** *Namiq Musalı. Şah İsmayılın böyük qardaşı İbrahim Mirzə və qızılbaş hərəkatındakı rolu (IV. Uluslararasi Alevilik ve Bektaşilik Sempozyumu (18-20 Ekim 2018, Ankara) Bildiriler Kitabi), s.205-231; Namiq Musalı. I Şah İsmayılın hakimiyyəti ("Tarix-i aləmara-yi Şah İsmayıl" əsəri əsasında), s.115; M.Tərbiyət. Danişməndani-Azərbaycan, s.321; Şeyx Hüseyn Pirzadə Zahidi. Silsilət ən-nəsəbi-Səfəviyyə, s.68; Fəvaid əs-Səfəviyyə (nəşrə hazırlayan: Məryəm Mirəhmədi), s.6; Michel M.Mazzaoui. The Origins of The Safawids: Shiism, Sufism and The Gulat, p.80.*



**İBRAHİM MİRZƏ** (vəf. 1576) – Səfəvi şahzadəsi, *Bəhram Mirzənin* ikinci oğlu, *I Şah İsmayılın* nəvəsi. Anası Şirvanşahlar nəslindən İmadəddin xanın bacısı Zeynəb sultan xanım idi. I Şah Təhmasibin qızı *Gövhər sultan bəyimlə* ailə qurmuşdu. İbrahim Mirzə I Şah Təhmasibin zamanında Məşhəd hakimi təyin edilmişdi. Şeir və sənətə bağlı olmuş, müasirləri tərəfindən sevilmişdir. İsgəndər bəy Münşi *"Tarixi-aləmarayi-Abbasi"* kitabında onu bu şəkildə xarakterizə etmişdir: "O, yüksək qabiliyyətə, istedada, ağla və idraka malik idi və ali dərəcəli əmisinin hüzurunda əziz, möhtərəm, sözükeçən, əhəmiyyətli, rəyi dinlənən və məşvərətçi bir şəxs idi". Sadiq bəy Əfşar isə *"Məcmə əl-xəvas"* təzkirəsində onun haqqında yazmışdır: "Bəhram Mirzənin övladlarının başıdır. Söhbətcil, istedadlı, dərrakəli, lətifəsevər bir şəxs idi. Haqqında qeyri-adi rəvayətlər yayılıb. Az hünər və sənət sahəsi olar ki, onun elmi və ya əməli tərəfindən faydalanmamış olsun. Lətifə deməyə elə meyilli idi ki, o səbəbdən xalq arasında məsələ çevrilmişdi. Dilini saxlaya bilmədiyindən II Şah İsmayıl dövründə qətlə yetirildi. Təxəllüsü "Cahi" idi. Yaxşı beytləri çoxdur". İbrahim Mirzə sazda məharətlə ifa etməyi bacarır, özü

musiqi alətləri hazırlayır, dülgərlik və mozaika sənətləri ilə məşğul olurdu. Nəstəliq xətti ilə yazmaqda və rəsm çəkməkdə məharət sahibi idi, fəlsəfə, məntiq, tibb, hesab, nücum, ədəbiyyat elmlərini mükəmməl şəkildə mənimsəmişdi. Onun Məşhəddəki sarayı şeir və sənət adamlarının yaradıcılıq mərkəzinə çevrilmişdi. I Şah Təhmasibin rəssamlıq və musiqiyə himayəsi azaldıqdan sonra ölkənin ən məşhur sənətkarları İbrahim Mirzənin himayəsinə sığınmışdılar.

Lakin sonralar İbrahim Mirzə əmisinin gözündən düşmüş və o, Məşhəd hakimliyindən uzaqlaşdırılmışdı. Bir müddət Səbzəvarda qaldıqdan sonra I Şah Təhmasibin diqqəti yenidən ona yönəlmiş və *Qəzvinə* dəvət edilmişdir. Bu dəfə İbrahim Mirzəyə sarayda ən yüksək vəzifələrdən olan *eşikağasıbaşı* mənsəbi verilmişdi. I Şah Təhmasibin vəfatından sonra baş vermiş parçalanma zamanı İbrahim Mirzə şahzadə *Həmzə Mirzənin* tərəfdarlarına qoşulmuş və onların toplandığı məkana (Hüseyn bəy Yüzbaşının evinə) gəlmişdi. Amma sonra radikal addım atmaqdan çəkinib evinə getmişdi. *II Şah İsmayıl* hakimiyyətə gəldikdən sonra əvvəlcə İbrahim Mirzə ilə mehriban davrandı, onu "qardaş" adlandırdı, eşikağasıbaşı vəzifəsini şahzadəyə layiq görməyib onu *möhürdar* təyin etdi. Qardaşı *Hüseyn Mirzənin* Qəndəharda vəfat etməsi xəbəri paytaxta çatanda şah İbrahim Mirzənin evinə gəlib ona başsağlığı verdi. Lakin tezliklə İbrahim Mirzəyə münasibət dəyişdi. Hüseyn Mirzə vəfat etdikdən sonra Qəndəhar tərəfdən hər hansı etiraz təhlükəsi aradan qalxdı və şah İbrahim Mirzəni öldürməyə cəsarət tapdı. Şahzadə öldürüləcəyini duyub evinə çəkildi, şahın göndərdiyi çərkəz qulamlar onun evini mühasirəyə aldılar. Bir neçə gündən sonra qızılbaş sufilərlə dövlət məmurları arasında 500 qızılbaşın öldürülməsi ilə nəticələnmiş qarşıdurma baş verdi. Bundan istifadə edən II Şah İsmayıl nəzarət altında saxlanılan bir neçə Səfəvi şahzadəsinin, o cümlədən İbrahim Mirzənin öldürülməsinə əmr verdi. Şahzadəni öz evində kəndirlə boğub öldürdülər.

İbrahim Mirzənin qətlindən az sonra həyat yoldaşı Gövhər sultan bəyim də qəm-qüssədən öldü. Ölümündən bir qədər əvvəl o, İbrahim Mirzənin çini qablardan ibarət zəngin kolleksiyasını şahın əlinə keçməməsi üçün məhv etdi. Şahzadənin Gövhərşad bəyim adlı yeganə qız övladı mükəmməl dini təhsil almış, I Şah Abbasın zamanında Məkkəyə köçüb orada Dəştəkilər nəslindən Əmir Nəsirəddin Hüseyn Şiraziyə ərə getmişdir.

***Mənbələr:*** *İsgəndər bəy Münşi. Tarix-i aləm-ara-yi Abbasi (tərcümə və şərhlər: O.Əfəndiyev, N.Musalı), s.302, 425-426; Həsən bəy Rumlu. Əhsən ət-təvarix (nəşrə hazırlayan: Ə.Nəvai), s.630, 632-633, 637; Sadiq bəy Əfşar. Məcməül-xəvas (nəşrə hazırlayan: Əkrəm Bağırov), s.34-35; Nətənzi. Nəqavət əl-asar fi zikr əl-əxyar dər tarixi-Səfəviyyə (nəşrə hazırlayan: Ehsan İşraqi), s.46-51; Ə.Şəbani. Şahzadə Əbülfəth Sultan İbrahim*



*Mirzənin həyatı və onun kitabxanasının tarixi barədə araşdırma (İsfahan Universiteti ədəbiyyat və humanitar elmlər fakültəsinin dərgisi, 1382 h.-ş., № 34-35), s.237-248; M.H.Şahi və M.S.Gəndümani. Səfəvilər dövrünün sənətkarlıq proseslərində Sultan İbrahim Mirzənin rolu (Tarixi araşdırmalar dərgisi, İsfahan, 1395 h.-ş., № 31), s.41-58.*

**İMAMQULU MİRZƏ** (1562-1576) – Səfəvi şahzadəsi, *I Şah Təhmasibin* yeddinci oğlu. Anası gürcü əsilli əmir Zal bəyin bacısı Xanpərvər xanım idi. İmamqulu Mirzə uşaq yaşlarında ikən atası onu Gilan hakimi təyin etmişdi. O, Gilanın mərkəzi olan Lahicanda *ləlləsi Pirə Məhəmməd xan Ustaclunun* nəzarəti altında ömür sürürdü. *II Şah İsmayıl* hakimiyyətə keçən kimi Pirə Məhəmməd xana məktub yazıb İmamqulu Mirzəni də özü ilə götürərək onun hüzuruna gəlməsini əmr etdi. Pirə Məhəmməd xan şahın taxta çıxmasını təbrik etmək bəhanəsi ilə şahzadəni götürüb Gilanı tərk etdi. Qəzvin yolunda Zəncanrud çayının yaxınlığındakı Qarabağ yaylağında onlar Qəhqəhə qalasından çıxmış II Şah İsmayılla görüşdülər. Şah öz qardaşı ilə üzdə mehriban görüşdü, lakin Qəzvinə çatdıqdan sonra onun qətlinə əmr verdi. 14 yaşlı İmamqulu Mirzəni qardaşı Əli Mirzə ilə birlikdə sarayın qarşısındakı At meydanı adlı yerdə öldürdülər.

İmamqulu Mirzənin *Xanış xanım* adlı doğma bacısı da vardı.

***Mənbələr:*** *İsgəndər bəy Münşi. Tarix-i aləm-ara-yi Abbasi (tərcümə və şərhlər: O.Əfəndiyev, N.Musalı), s.299, 411 və 427; Həsən bəy Rumlu. Əhsən ət-təvarix (nəşrə hazırlayan: Ə.Nəvai), s.637.*

**İMAMQULU MİRZƏ** (1602-1629) – Səfəvi şahzadəsi, *I Şah Abbasın* yaşca ən kiçik (beşinci) oğlu. 1620-ci ildə I Şah Abbas ağır xəstələndiyi zaman övladlarından ikisi sağ idi. Şah yaşca daha böyük olan *Məhəmməd Mirzəyə* qarşı nifrət duyduğu, nəvəsi Sam Mirzəni isə (gələcək *I Şah Səfi*) yaşının azlığına görə şahlığa layiq bilmədiyi üçün İmamqulu Mirzəni vəliəhd elan etmişdi. Müasirləri İmamqulu Mirzəni yaraşıqlı, ağıllı və mehriban bir gənc kimi xarakterizə etmişlər. I Şah Abbas Məhəmməd Mirzəni kor etdikdən sonra bir daha xəstələndi, İmamqulu Mirzə bundan əvvəlki xəstəlik zamanı sevindiyinə görə qəzəbə düçar olmuş qardaşının aqibətindən ibrət götürərək atasının yanından ayrılmadı və onun sağalması üçün əlindən gələni etdi. Bu davranış I Şah Abbasın daha ciddi şəkildə onu öz vəliəhdi kimi tanıtmasına səbəb oldu.

Lakin 1626/27-ci illərdə I Şah Abbas Zəncan yaxınlığındakı Sultaniyyə şəhərində dincəldiyi zaman qəflətən İmamqulu Mirzənin kor edilməsinə əmr verdi. Mənbələrdə bu davranışın konkret səbəbi göstərilmir. Bir məlumata görə, şahzadə Osmanlı sultanına məktub yazaraq atasından şikayət etmiş, amma məktub şahın əlinə keçdiyi üçün şahzadə ağır şəkildə cəzalandırılmışdır.

Görmə qabiliyyətinin xeyli hissəsini itirən İmamqulu Mirzə atasının vəfatından

sonra övladlıq haqqından istifadə edərək Səfəvi taxtına iddia irəli sürdü. Onun tərəfdarları bu iddianı dəstəkləyərək deyirdilər ki, şahzadənin gözləri çox zəif görsə də, 5 yaşlı oğlu Nəcəfqulu Mirzə böyüyənədək hakimiyyət sürə bilər; oğlu yetkinlik yaşına çatdıqdan sonra hakimiyyəti ona təhvil verər. Lakin dövlət adamlarının əksəriyyəti I Şah Abbasın vəsiyyətinə sadiq qalaraq onun nəvəsi Sam Mirzəni I Şah Səfi adı ilə taxta çıxartdılar. İmamqulu Mirzə Qəzvindəki Ələmut qalasına – qardaşı Məhəmməd Mirzənin yanına göndərildi. Tezliklə I Şah Səfinin əmrinə əsasən hər iki qardaşı, o cümlədən İmamqulu Mirzənin azyaşlı oğlu Nəcəfqulu Mirzəni də qətlə yetirdilər. Bəzi məlumatlara görə, İmamqulu Mirzə hakimiyyət iddiası etdiyi zaman özünü onun tərəfdarı kimi göstərən şəxslər müalicə adı ilə onun gözlərini tamamilə kor etmişdilər.

***Mənbələr:*** *Nəsrullah Fəlsəfi. I Şah Abbasın həyatı, II, 192-197; İsgəndər bəy Münşi. Dünyanı bəzəyən Abbasın tarixi (fars dilindən çevirən: Ş.Fərzəliyev, II kitab), s.1884-1885; İsgəndər bəy Münşi. Zeyli-Tarixi-aləmarayi-Abbasi, s.8-9, 87 və 98; Don Qarsia de Silva Fiqueronun səfərnaməsi (farsca tərcümə: Ğ.Səmii), s.343; Məhəmməd Möhsin Mustovfi. Zübdət ət-təvarix, s.109.*

**İSMAYIL MİRZƏ** (1601-1613) – Səfəvi şahzadəsi, *I Şah Abbasın* dördüncü oğlu. 1601-ci ildə doğulmuş, cəmi 12 il yaşamışdır. 1613-cü ilin avqustunda İsfahanda dünyasını dəyişmişdir. O zaman I Şah Abbas paytaxtda deyildi. Şahın əmri ilə İsmayıl Mirzənin cənazəsini İsfahan yaxınlığındakı İmamzadə İsmail ziyarətgahında əmanət olaraq dəfn etdilər. Az sonra cənazə Məşhəd şəhərinə aparılıb İmam Rzanın (ə) hərəmində torpağa tapşırıldı.

***Mənbələr:*** *Nəsrullah Fəlsəfi. I Şah Abbasın həyatı, II, 192; İsgəndər bəy Münşi. Dünyanı bəzəyən Abbasın tarixi (fars dilindən çevirən: Ş.Fərzəliyev, II kitab), s.1113.*

**QÜTBƏDDİN ƏBU BAQİ** – Səfəvilər sülaləsinin əcdadlarından biri, *Səlahəddin Rəşidın* oğlu. Atasının zamanında Səfəvilərin əcdadları Ərdəbilin İsfərəncan kəndindən Kəlxuran kəndinə köçüb burada məskunlaşmışdı. Şeyx Qütbəddinin adı *"Silsilət ən-nəsəbi-Səfəviyyə"* kitabında Əbu Baqi, *"Səfvət əs-səfa"da* isə Əbu Bəkr (digər nüsxədə Əhməd) şəklində qeyd edilmişdir. O, atası Səlahəddin Rəşiddən sonra sülaləyə rəhbərlik etmiş, Ərdəbilin Kəlxuran kəndində əkinçiliklə məşğul olmuşdur. Şəriətə bağlı, təqvalı bir şəxs kimi tanınır, xeyriyyəçiliklə məşğul olur, fəqir dərvişlərə yardım göstərirdi. Ətrafında xeyli mürid birləşərək təsəvvüf həyatını yaşayırdı. Onun zamanında gürcü qoşunu Ərdəbilə hücum edib burada dəhşətli qətl-qarət törətdi (1210/11-ci illər). Minlərlə müsəlmanın şəhid olduğu həmin faciəli günlərdə Şeyx Qütbəddin ailəsini götürüb Ərdəbil şəhərinə gəldi və bir aylıq körpəsi də daxil olmaqla ailə üzvlərini evlərdən birinin zirzəmisində gizlətdi. Gürcülər onu boynundan ağır



yaralamış halda ölü bilib əl çəkmişdilər, sonra Şeyx Qütbəddin sağaldı və öz mənəvi rəhbərlik vəzifəsinə davam etdi. Şeyx Qütbəddindən sonra sülalənin davamçısının şəxsiyyəti barədə mənbələrdə iki fərqli məlumat vardır. *"Tarixi-aləmarayi-Abbasi"də* yazılıb ki, Şeyx Qütbəddindən sonra oğlu *Şeyx Saleh*, sonra da onun oğlu *Əminəddin Cəbrayıl* sülaləyə başçılıq etmişlər. *"Aləmarayi-Səfəvi"* kitabında gürcü basqınının Şeyx Saleh zamanında baş verdiyi qeyd edilir, guya onun xristian gürcüləri müsəlman dininə dəvət etməsindən qəzəblənən Baqrat(ioni) nəslindən Kartli çarı Şeyx Salehi öldürmək üçün Ərdəbilə hücum edibmiş. Həmin kitabda gürcülər tərəfindən yaralanmış şəxsin Şeyx Saleh olduğu yazılmaqla bərabər hadisə fərqli şəkildə verilmişdir. "Silsilət ən-nəsəbi-Səfəviyyə"də isə Şeyx Qütbəddin Şeyx Əminəddin Cəbrayılın atası kimi təqdim edilir və gürcülərin əlindən zirzəmidə gizlədilmiş bir aylıq körpənin Əminəddin Cəbrayıl olduğu bildirilir. Beləliklə, məlumatlardan birinə görə, Şeyx Qütbəddin səfəviyyə təriqətinin banisi *Şeyx Səfiəddin Ərdəbilinin* babası, digər məlumata görə, atasının babasıdır. Hər bir halda o, Şeyx Səfiəddinin zamanında sağ idi, Şeyx Səfiəddin onun boynundakı qılınc yarasının izini gördüyünü rəvayət etmişdir.

***Mənbələr:*** *İsgəndər bəy Münşi. Tarix-i aləmara-yi Abbasi (tərcümə və şərhlər: O.Əfəndiyev, N.Musalı), s.46-47; İbn Bəzzaz Ərdəbili. Səfvət əs-səfa, s.70-75; Şeyx Səfi təzkirəsi ("Səfvətüs-səfa"nın XVI əsr türk tərcüməsi), s.48-50; Şeyx Hüseyn Pirzadə Zahidi. Silsilət ən-nəsəbi-Səfəviyyə, s.12-14; Z.Bayramlı. "Silsilət ən-nəsəbi-Səfəviyyə" əsəri Azərbaycan tarixinin mənbəyi kimi, s.25-26.*



**MAHMUD MİRZƏ** (1558-1576) – Səfəvi şahzadəsi, *I Şah Təhmasibin* altıncı oğlu. Anası kəniz idi. Mahmud Mirzə atasının sağlığında Gilan vilayətinə hakim təyin edilmiş, Lahicanda yaşamış, orada üsyan qalxdığı zaman atasının əmri ilə saraya qayıtmışdı. I Şah Təhmasib hakimiyyətinin sonlarında Mahmud Mirzəyə Şirvan bəylərbəyi vəzifəsini verdi. *Rumlu* tayfasından *Araz xan* onun *lələsi* seçildi. Lakin şahzadə xidmət yerinə getməmiş, sarayda qalmışdı, Şirvan vilayətini Araz xan onun adından idarə edirdi. *Heydər Mirzə* ilə İsmayıl Mirzənin hakimiyyət davasında Rumlu tayfası ikincini dəstəklədiyi üçün Mahmud Mirzə də eyni mövqeyi bölüşmüşdü. Buna baxmayaraq, *II Şah İsmayıl* digər qardaşları kimi, onu da öz hakimiyyəti üçün təhlükə hesab edərək aradan götürmək qərarına gəldi. 18 yaşlı şahzadə körpə oğlu Məhəmməd Baqir Mirzə ilə birlikdə öldürüldü. Deyilənə görə, Mahmud Mirzəni kəndirlə boğan zaman o, huşunu itirmiş, cəllad onun öldüyünü güman etmişdi. Şahzadəyə cənazə qüslü verilən zaman qəfildən özünə gəlib gözlərini açmışdı. II Şah İsmayıl bunu eşidəndə şahzadənin işini bitirməyi əmr etmişdi.
Mahmud Mirzənin *Fatimə sultan xanım* adlı doğma bacısı da var idi.

***Mənbələr:*** *İsgəndər bəy Münşi. Tarix-i aləm-*

*ara-yi Abbasi (tərcümə və şərhlər: O.Əfəndiyev, N.Musalı), s.298-299 və 427; Həsən bəy Rumlu. Əhsən ət-təvarix (nəşrə hazırlayan: Ə.Nəvai), s.637.*



**MƏHDİ-ÜLYA XEYRƏNNİSA BƏYİM** (vəf. 1579) – Səfəvi şahbanusu, *Şah Məhəmməd Xudabəndənin* xanımı, *I Şah Abbasın* anası. Əsl adı Xeyrənnisa bəyimdir. Mazandaran hakimi Mir Abdullah xanın qızı idi. Mir Abdullah xan *I Şah Təhmasibin* zamanından bəri (1532/33-cü illər) irsi olaraq Mazandaranda hakimiyyət sürmüşdü. O, məşhur seyidlərdən olan "Miri-büzürg" (Böyük mir, Böyük seyid) ləqəbli Seyid Qivaməddin Mərəşinin nəslindən idi. Mir Abdullah xanın əmisi oğlu Mir Sultan Murad Mirşahi onunla hakimiyyət davasına qalxmış, I Şah Təhmasib qarşıdurmanı aradan qaldırmaq üçün Mazandaran vilayətini onların arasında bölmüşdü. Az sonra Mir Sultan Murad şahın gizli razılığı ilə Mir Abdullah xanı öldürərək vilayətin tam sahibi oldu. Amma I Şah Təhmasib öz öğlu şahzadə Həsən Mirzəni Mir Abdullah xanın əvəzinə Mazandaranın yarısının hakimi etdi. Mir Abdullah xanın qızı Xeyrənnisa bəyim isə şahın böyük oğlu Məhəmməd Mirzəyə (gələcək Şah Məhəmməd Xudabəndə) ərə verildi və Herata, onun yanına göndərildi (1566/67-ci illər).

Şah Məhəmməd Xudabəndə hakimiyyətə keçdikdən (1577) sonra dövlət idarəçiliyində Məhdi-ülyanın rolu artdı. Şahın zəif xasiyyətindən istifadə edən şahbanu bütün hakimiyyət işlərini öz əlində cəmləşdirdi. Təbii olaraq bu hərəkət hakim dairələrdəki bəzi qızılbaş əmirlərinin ciddi narazılığına səbəb oldu. Məhdi-ülya vaxtilə onun atasını öldürmüş Mir Sultan Muradın oğlu Mirzə xanın Mazandaran hakimliyindən uzaqlaşdırılmasını və cəzalandırılmasını tələb edirdi. Mirzə xan xilas olmaq üçün qalalardan birinə sığınıb müqavimət göstərməyə hazırlaşdı. Məlikənin təhriki ilə Mazandarana qızılbaş qoşunu göndərildi. Qoşun başçıları qalanı almaqda çətinlik çəkdikləri üçün Mirzə xanla danışığa girdilər, ona aman vəd edib təslim olmağa razı saldılar. Mirzə xan təslim olub Qəzvinə gətirildi. Məhdi-ülya onu öldürməyəcəyinə söz verib qızılbaş əmirlərindən təhvil aldı, amma dərhal qətlinə göstəriş verdi. Bu hadisədən sonra qızılbaş əmirlərinin Məhdi-ülyaya münasibəti daha da pisləşdi. *Möhürdar Şahrux xan Zülqədər*, qorçubaşı Qulu bəy Əfşar, vəzifəsindən azad edilmiş Kaşan hakimi Məhəmməd xan Türkman və b. Məhdi-ülyaya qarşı müxalifət cəbhəsi təşkil etdilər. Şahbanunu dövlət işlərindən uzaqlaşdırmaq barədə şaha ultimatum göndərildi. Lakin Məhdi-ülya öz mövqeyini asanlıqla əldən vermək fikrində deyildi. Onun vəziri xəzinədəki pulların bir hissəsini narazı əmirlər arasında bölüşdürməklə onları öz tərəfinə çəkməyi təklif etdisə də, məlikə bu addımı zəiflik əlaməti sayaraq qəbul etmədi. Məhdi-ülyanın əleyhdarları onu gözdən salmaq üçün Səfəvi dövlətində əsir saxlanılan Krım xanzadəsi Adil Gəray xanın məşuqəsi olmaqda ittiham etdilər.



Məhdi-ülyaya qarşı aparılan qaralama kampaniyası öz bəhrəsini verdi, hətta Səfəvilər soyundan Şeyxavənd tayfasının başçısı *Məsum bəy* də onun qarşısında mövqe tutdu. Nəhayət, qızılbaş əmirləri hərəmxanaya hücum edib ərinə sığınmış Məhdi-ülyanı şahın gözünün qabağında boğub öldürdülər (1579). Onun qoca anası da eyni aqibəti bölüşdü. Bunun ardınca Qəzvindəki Mazandaran əmirlərinin mülkləri talan olundu, xeyli insan qətlə yetirildi. Məhdi-ülyanın cənazəsini şəhərdəki İmamzadə Hüseyn ziyarətgahında dəfn etdilər.

Mənbələrdəki məlumatlara əsasən, I Şah Təhmasibin qızı *Pərixan xanımın* və dayısı *Şamxal sultanın*, II Şah İsmayılın körpə oğlu *Şah Şücanın* və bəzi qızılbaş əmirlərinin öldürülməsində Məhdi-ülyanın birbaşa rolu olmuşdur. O, Səfəvi ordusunun indiki Cənubi Azərbaycan torpaqlarını osmanlıların işğalından xilas yürüşündə iştirak etmiş (1578), amma bu yürüş zamanı qızılbaş sərkərdələri ilə onun arasında fikir ayrılıqları yaranmışdı.

Məhdi-ülya I Şah Abbasdan əlavə daha üç şahzadənin da anası idi (*Həmzə Mirzə, Əbu Talib Mirzə* və *Təhmasib Mirzə*).

***Mənbələr:*** *Nəsrullah Fəlsəfi. I Şah Abbasın həyatı, I, 3-5, 53-57; H.C.Kəlkinari. Məhdi-ülya ləqəbli Xeyrənnisa bəyim (“Miskəveyh” Rey Azad Universitetinin nəşri, 1387 h.-ş., № 9), s.81-98; G.K.Çinar. Safevî Devleti'nin Güçlü Melikesi Hayrünnisa Begüm (Türkiyat Mecmuası, c.21/Güz, 2011), s.87-103; İsgəndər bəy Münşi. Tarix-i aləmara-yi Abbasi (tərcümə və şərhlər: O.Əfəndiyev, N.Musalı), s.486-490.*

**MƏHƏMMƏD BAQİR MİRZƏ** (1587-1615) – Səfəvi şahzadəsi, *I Şah Abbasın* böyük oğlu. Tarixi mənbələrdə daha çox Səfi Mirzə adı ilə xatırlanır. Anası, bəzi mənbələrə görə, gürcü mənşəli Baqrat(ioni) nəslindən Kartli çarı VII Baqratın (vəf. 1619) qızı Fəxricahan bəyim idi. Bəzi mənbələrdə isə anasının çərkəz əsilzadələrinin nəslindən olduğu xəbər verilir. Bir yaşında ikən formal olaraq Xorasan hakimi təyin edilmiş, *Mürşidqulu xan Ustaclunun* qardaşı İbrahim xan onun *lələsi* (tərbiyəçisi və hamisi) seçilmişdi. Beş yaşında ikən Həmədan hakimi və Səfəvilər dövlətinin Bağdada kimi uzanan qərb torpaqlarının *əmir əl-üməras*ı vəzifəsinə gətirilmişdi. Bayat tayfasından Uğurlu sultan onun *vəkili* təyin edilmiş və öz obası ilə birlikdə Həmədana köçməsi əmr olunmuşdu.

Təxminən həmin vaxtlarda I Şah Abbas Gilan hakimi Xan Əhmədin azyaşlı qızı ilə Məhəmməd Baqir Mirzəni nişanladı. Onlar uşaqlıq dövrünü birlikdə keçirdilər. Məhəmməd Baqir Mirzə 15 yaşına çatdıqda I Şah Abbas bu nikahı rəsmiləşdirmək qərarına gəldi, amma şahzadə buna razılıq vermədi. Nəticədə Məhəmməd Baqir Mirzəni *II Şah İsmayılın* qızı Fəxricahan bəyimlə evləndirdilər, Xan Əhmədin qızını isə I Şah Abbas özü aldı (1600-02-ci illər). Sonralar Məhəmməd Baqir Mirzə gürcü əsilli *Dilaram sultanla* (gələcək *I Şah Süleymanın* anası) da ailə qurmuşdur.

I Şah Abbas çevriliş cəhdlərinin qarşısını almaq üçün əmirlərdən heç birinə

şahzadələrlə ünsiyyət qurmaq icazəsi vermirdi. Şahzadələr vaxtlarının çox hissəsini hərəmxanada keçirir, yalnız *xacələrlə* və müəllimlərlə ünsiyyətdə olurdular. Şahın qorxusundan əmirlər onlarla salamlaşmağa belə cəsarət etmirdilər. Şahzadələrlə ünsiyyət saxladığına görə bir neçə qızılbaş əmiri şahın qəzəbinə düçar olub kor edilmişdi.

Məhəmməd Baqir Mirzə şahın böyük oğlu olduğu üçün vəliəhd sayılırdı. 1614-cü ildə I Şah Abbasa xəbər çatdırdılar ki, guya Məhəmməd Baqir Mirzə çərkəz mənşəli *əmirşikarbaşı* Fərhad bəy Quşçi və iki çərkəz qulamla danışığa girərək atasına qarşı sui-qəsd hazırlayıb. Bu arada münəccimlər də şaha demişdilər ki, yaxın zamanlarda onu təhlükə gözləyir. Ov zamanı şahzadənin şahdan əvvəl ova başlaması və heyvanı təkbaşına öldürməsi onun əmirşikarbaşı ilə əlbir olması barədə şahın şübhələrini daha da artırdı. I Şah Abbas əvvəlcə Məhəmməd Baqir Mirzəyə əmr verdi ki, onunla ünsiyyətə girdiyi üçün Fərhad bəyi öldürsün. Şahzadə şübhəni öz üzərindən götürmək üçün Fərhad bəyi öldürməyi öz adamlarına tapşırdı, bunun ardınca həmin iki çərkəz qulamı da aradan götürdülər.

I Şah Abbasın qəlbində oğluna qarşı ciddi şübhə yaranmışdı, o, hətta sui-qəsdin qarşısını almaq üçün bir neçə gecə yatdığı yeri də dəyişdi. Sarayda xidmət edən çərkəzlər şahın cəza tədbirlərindən qorxuya düşüb gizlicə Məhəmməd Baqir Mirzəyə xəbər göndərdilər ki, əgər atasını öldürüb yerinə keçmək istəsə, ona yardım edəcəklər. Şahzadə dəhşət içində bu xəbəri atasına çatdırdı, bundan sonra I Şah Abbasın öz oğlunu aradan götürmək niyyəti daha da qətiləşdi.

Nəhayət, şahın gizli əmri ilə çərkəz mənşəli Behbud bəy Rəşt şəhərində (I Şah Abbasın Gilan səfəri zamanı) şahzadə Məhəmməd Baqir Mirzəni qətlə yetirdi. Şahzadəni Ərdəbildə Səfəvi sülaləsinin ailəvi məqbərəsində dəfn etdilər. Behbud bəy bu cinayətdən sonra müxtəlif vəzifələrə təyinat aldı, axırda öz adamları tərəfindən öldürüldü.

Şah Məhəmməd Baqir Mirzənin günahsızlığına tam yəqinlik əldə etdikdən sonra çox peşman olmuş, hətta uzun müddət ona yas saxlamış, bəzəkli libasdan və təmtəraqlı yeməklərdən imtina etmişdi. Rəşt şəhərində şahzadənin öldürüldüyü yerdə Şəhidiyyə adlı xatirə binası tikildi və bura bəst elan edildi (bəst elə yerlərə deyilirdi ki, günahkar şəxs ora pənah aparsaydı, binanın içində olduğu müddət boyunca amanda qalırdı və onu cəzalandırmağa icazə verilmirdi).

Məhəmməd Baqir Mirzənin iki oğlu olmuşdur. Bunlardan biri gürcü əsilli Dilaram sultanla izdivacdan doğulmuş Sam Mirzə (gələcək I Şah Səfi), digəri isə II Şah İsmayılın qızı Fəxricahan bəyimlə izdivacdan doğulmuş Süleyman Mirzə idi. Süleyman Mirzə I Şah Abbasın əmri ilə kor edilib həbsə atılmış, I Şah Səfi zamanında isə öldürülmüşdür (1632).

***Mənbələr:*** *Nəsrullah Fəlsəfi. I Şah Abbasın həyatı, II, 170-185; Dünyanı bəzəyən Abbasın tarixi (fars dilindən çevirən: Ş.Fərzəli-*



yev, II kitab), s.1579-1580; П.Х.Гребельский и С.В.Думин. Дворянские роды Российской империи, III, 41; David Blow. Shah Abbas, The Ruthless King Who Became an Iranian Legend, pp.31, 105; Roger Savory. Səfəvilər dövrünün İranı (farsca tərcümə: Kambiz Əzizi), s.92.*



**MƏHƏMMƏD HAFİZ** – Səfəvilər sülaləsinin əcdadlarından biri, *Əvəz əl-Xəvassın* (və ya Seyid Əvaz) oğlu, *Səlahəddin Rəşidin* atası. Həyatı haqqında məlumat azdır, mənbələrdəki məlumatlar da mistik xarakter daşıyır. Məhəmməd Hafiz 7 yaşında ikən qəfildən yoxa çıxmış, 7 idən sonra səliqəli və gözəl libas geyinmiş, boynundan Quran asılmış halda ailəsinə qayıtmışdır. Soruşanlara cavab vermişdir ki, onu guya mömin cinlər oğurlamış, bu müddətdə ona Quranı və şəriəti öyrətmişlər. Ləqəbindən də göründüyü kimi, Məhəmməd Hafiz Qurani-Kərimi əzbər bilmişdir. Onun vəfatından sonra sülalənin başçılığı oğlu Səlahəddin Rəşidə keçmişdir.

***Mənbələr:*** *İsgəndər bəy Münşi. Tarix-i aləmara-yi Abbasi (tərcümə və şərhlər: O.Əfəndiyev, N.Musalı), s.45-46; İbn Bəzzaz Ərdəbili. Səfvət əs-səfa, s.73; Şeyx Səfi təzkirəsi ("Səfvətüs-səfa"nın XVI əsr türk tərcüməsi), s.47-48; Şeyx Hüseyn Pirzadə Zahidi. Silsilət ən-nəsəbi-Səfəviyyə, s.11-12; Aləmarayi-Səfəvi (nəşrə hazırlayan: Y.Şükri), s.5-7; Əmir Sədrəddin İbrahim Əmini Hərəvi. Fütuhati-Şahi (nəşrə hazırlayan: M.R.Nəsiri), s.4-5.*



**MƏHƏMMƏD MİRZƏ** (1597/98-1629) – Səfəvi şahzadəsi, *I Şah Abbasın* üçüncü oğlu. Babası *Şah Məhəmməd Xudabəndənin* şərəfinə adlandırılmışdır. Ruzək Mirzə ləqəbi ilə də tanınır. Anası gürcü əsilli kəniz idi. Məhəmməd Mirzə də, digər şahzadələr kimi, cəmiyyət içinə çıxmadan, qızılbaş əmirləri ilə ünsiyyətdən uzaq şəkildə hərəmxanada böyümüşdür. Məhəmməd Mirzə fiziki cəhətdən güclü olmaqla yanaşı, tədbirli və bacarıqlı bir gənc idi, böyük qardaşının acı taleyini yaşamamaq üçün atası ilə münasibətləri normal şəkildə saxlamağa xüsusi diqqət yetirirdi. Bununla belə, şahzadənin nüfuzunun getdikcə artması şahı narahat etməyə başladı və onun gələcəkdə Səfəvi taxtına iddiasını aradan qaldırmaq üçün tədbir görməyə məcbur etdi. 1619-cu ildə Mazandaran səfərində olan I Şah Abbas belə bir xəbər yaydı ki, guya Məhəmməd Mirzə onun oğlu deyil; şahzadənin anası olan gürcü qadın kəniz qismində hərəmxanaya daxil olanda artıq başqasından hamilə imiş. Şah öz iddiasının düzgünlüyünü sübuta yetirmək üçün hərəmxanadakı qadınlardan (o cümlədən bibisi *Zeynəb bəyimdən*) yazılı ifadə aldı. Bundan sonra Məhəmməd Mirzə atasının gözündən düşərək təhqirlərə məruz qalmağa başladı.

Növbəti ildə I Şah Abbas ağır xəstələndi, hətta ölümünün çatdığını düşünərək kiçik oğlu *İmamqulu Mirzəni* özünə vəliəhd elan etdi. Məhəmməd Mirzə atasının haqsızlığından çox incidiyi üçün onun xəstəliyini sevinclə qarşıladı, hətta şadlıq məclisi quraraq tezliklə hakimiyyətə keçəcəyini gözləməyə başladı. Lakin I Şah Abbas 1621-ci ilin ortalarında sa-

ğalaraq paytaxta qayıtdı və dərhal Məhəmməd Mirzənin gözlərinin çıxarılmasını əmr etdi. Gözlərinə mil çəkilən şahzadə tamamilə kor olmadı. Bir müddətdən sonra şaha xəbər çatdırdılar ki, Məhəmməd Mirzə Hindistana qaçıb Böyük Moğol hökmdarının yardımı ilə atasından intiqam almağı düşünür. Şah bu dəfə onu Qəzvindəki Ələmut qalasında həbs etdi, onunla əlbir olanları öldürdü. Məhəmməd Mirzə atasının vəfatına kimi həbsdə qaldı, *I Şah Səfi* hakimiyyətə keçəndən sonra onu qardaşı İmamqulu Mirzə ilə birlikdə qalanın bürcündən yerə atıb öldürdülər.

***Mənbələr:*** *Nəsrullah Fəlsəfi. I Şah Abbasın həyatı, II, 186-192; İsgəndər bəy Münşi. Dünyanı bəzəyən Abbasın tarixi (fars dilindən çevirən: Ş.Fərzəliyev, II kitab), s.1714-1716; Roger Savory. Səfəvilər dövrünün İranı (farsca tərcümə: Kambiz Əzizi), s.92; Don Qarsia de Silva Fiqueronun səfərnaməsi (farsca tərcümə: Ğ.Səmii), s.343.*

**MƏHİN BANU** (1519-1562) – Səfəvi şahzadəsi, *I Şah İsmayılın* ən kiçik qızı, *I Şah Təhmasibin* doğma bacısı. Anası *Taclu bəyimdir*. 1519-cu ildə Təbrizdə anadan olmuşdur. Dövlət idarəçiliyi və siyasətə böyük maraq göstərmiş, bu barədə lazımi bilik və vərdişləri anası Taclu bəyimdən öyrənmişdir. 1540-cı ildə anası vəfat etdikdən sonra Məhin banu qardaşı I Şah Təhmasibin mühüm müşavirlərindən birinə çevrilmişdir. Öz yaxınları arasında Sultanım ləqəbi ilə tanınmışdır.

Məhin banu Səfəvilər dövlətinin xarici siyasətində fəal rol oynayırdı. Bəzi məlumatlara görə, Osmanlı məlikəsi, I Sultan Süleymanın xanımı Xürrəm sultanla və onun qızı Mehrmah sultanla, eləcə də Böyük Moğollar imperiyasının hökmdarı Humayun şahın həyat yoldaşı, Əkbər şahın anası Həmidə banu bəyimlə məktublaşırdı. Humayun şah taxtdan salınaraq Səfəvilər dövlətinə pənah gətirəndə I Şah Təhmasib əvvəlcə ona şiə məzhəbinə keçməyi təklif etmiş, amma moğol hökmdarı mənfi cavab vermişdi. I Şah Təhmasib bu cavabı təhqir kimi qəbul edərək hətta Humayun şahı aradan götürmək fikrinə də düşmüşdü. Lakin Məhin banu onu bu fikirdən daşındırmağı bacarmış, nəticədə Humayun şah Səfəvilər dövlətində uzun müddət əmin-amanlıqda yaşamış, sonda qızılbaş ordusunun yardımı ilə öz taxt-tacını geri qaytarmışdı.

I Şah Təhmasib Məhin Banuya böyük hörmətlə yanaşırdı. Müasirlərinin verdiyi məlumata görə, heç kim şahın hüzurunda at belində gəzə bilmədiyi halda yalnız Məhin banuya süvari olmaq icazəsi verilmişdi.

Məhin banu tarix kitablarında möhkəm imanlı, ibadətə meyilli, səxavətli və xeyirxah insan kimi vəsf edilir. Mükəmməl dini təhsil almış, xüsusilə Quran qiraətində uğur qazanmışdı. Xeyli əmlakı müqəddəs ziyarətgahlara vəqf etmiş, sağlığında özü üçün Kərbəlada məqbərə tikdirmişdi. Məhin banu 1562-ci ildə 43 yaşında ikən Qəzvində dünyasını dəyişmiş və şah İmamzadə Hüseyn ziyarətgahına kimi onun cənazə mərasimində



şəxsən iştirak etmişdir. Oradan cənazə Qum şəhərinə aparılmış və Fatimeyi-Məsumənin (ə) hərəmində əmanət olaraq dəfn olunmuşdur. Şah Məhəmməd Xudabəndənin zamanında cənazəni Kərbəlaya apararaq öz tikdirdiyi məqbərədə torpağa tapşırmışlar. Ailə qurmamışdır. Şairlik təbi vardı, qardaşı I Şah Təhmasibə həsr etdiyi rübai məşhurdur.

***Mənbələr:*** *M.K.Yusifcəmali. I Şah İsmayılın həyatı, s.207-208; Həsən bəy Rumlu. Əhsən ət-təvarix (nəşrə hazırlayan: Ə.Nəvai), s.536; Əbdi bəy Şirazi. Təkmilət əl-əxbar (nəşrə hazırlayan: Ə.Nəvai), s.199, 224-226; Məcmueyi-münşəati-Firudin bəy, II, 63-66; Hüseyn Müdərrisi Təbatəbai. Qəzvin tarixindən bir vərəq, s.25.*

**MƏLƏKNİSA BƏYİM** – Səfəvi şahzadəsi, *I Şah Abbasın* ən kiçik (altıncı) qızı. Həyatı haqqında məlumat azdır. Bəzi mənbələrdə adı Şahbanu bəyim kimi qeyd edilmişdir. Məşhəd şəhərindəki İmam Rza (ə) hərəminin mütəvəllisi (müdiri) Mirzə Cəlal Şəhristani ilə ailə qurmuşdur. İsfahan əsilli Mirzə Mömin Şəhristaninin oğlu olan Mirzə Cəlal gözəl şair idi, "Əsir" təxəllüsü ilə 20 min beyt həcmində divan yaratmışdır. *"Təzkireyi-Nəsrabadi"də* onun gənc yaşlarında dünyasını dəyişdiyi qeyd olunmuşdur. Mələknisa bəyimin bu izdivacdan övladları olub-olmaması barədə məlumata rast gəlinmir. O da, əksər bacıları kimi, atası I Şah Abbasın sağlığında vəfat etmişdir.

***Mənbələr:*** *Nəsrullah Fəlsəfi. I Şah Abbasın həyatı, II, 202; Təzkireyi-Nəsrabadi, s.95-96.*

**MƏRYƏM BƏYİM** (1640-1720) – Səfəvi şahzadəsi, *I Şah Səfinin* üçüncü qızı. İsfahanın *Çehelsütun sarayında* doğulmuşdur. Anası gürcü əsilli *Ana xanım* idi; beləliklə, Məryəm bəyim *II Şah Abbasın* doğma bacısı sayılırdı. Mükəmməl təhsil almış Məryəm bəyim dövlətdə yüksək dini vəzifənin daşıyıcısı olan *sədrlə* ailə qurmuşdu. II Şah Abbasın vəfatından sonra Məryəm bəyimin həyat yoldaşı da dünyasını dəyişdi. *Şah Süleymanın* hakimiyyəti zamanında Məryəm bəyimin *qorçubaşı* Saru xan Səhəndlüyə aşiq olması barədə şayiələr yayıldı. Şah bu şayiələrin kökünü kəsmək üçün qorçubaşını öldürüb bibisinə ciddi şəkildə xəbərdarlıq etdi (1691).

Məryəm bəyim iti zəkasına və intriqalara meyilli xasiyyətinə görə sarayda böyük nüfuz qazanmışdı. Məhz onun səyləri nəticəsində Şah Süleymanın vəfatından sonra şahzadələr arasından Sultan Hüseyn taxta çıxarıldı. *Şah Sultan Hüseynin* zəif xarakteri Məryəm bəyimin idarəçilik işlərini öz əlində daha çox cəmləməsinə şərait yaratdı.

Şah Sultan Hüseyn zamanında Məryəm bəyimin sarayda oynadığı rol birmənalı qiymətləndirilmir. Mənbələrdə şahın eyş-işrətə aludə olmasının günahkarı kimi onun adı çəkilir; bu addımı Əllamə Məclisinin şah üzərində nüfuzunu azaltmaq və öz gücünü təsdiq etmək məqsədilə atdığı yazılır. Sonralar Məryəm bəyim öz hərəkətinin nə qədər fəlakətli olduğunu anlayaraq Şah Sultan Hüseyni sağlam həyat tərzinə qaytarmağa çalışsa da, faydası olmadı. O, şahı *əfqan istila-*

*sına* və Bəhreyndəki üsyançılara qarşı tədbir görməyə həvəsləndirmək və boşalmış dövlət xəzinəsinə yardım etmək üçün ordunun təchizatını da öz öhdəsinə götürdü. Lakin hərbi sahədə heç bir uğur əldə edilmədi və Səfəvilər dövlətinin süqutu daha da tezləşdi.
Məryəm bəyim xeyriyyəçilik fəaliyyəti ilə məşğul olmuş, İsfahanda məscid və mədrəsə tikdirmiş, öz əmlakının böyük bir hissəsini şəhərin abadlaşdırılmasına və din tələbələrinin təhsilinə *vəqf* etmişdir. O, 1720-ci ildə vəfat etmiş və Məşhəddə dəfn olunmuşdur. Özündən sonra zinət əşyaları, daş-qaş və torpaq sahələrindən əlavə 200 min tümən nağd pul miras qoymuşdur.

***Mənbələr:*** *Q.Gülizəvarə. Qadınlar və Səfəvi hökmdarları ("Pəyami-zən" dərgisi, 1384 h.-ş., № 161), s.38-46; Rudi Matthee. Persia in Crisis: Safavid Decline and the Fall of Isfahan, pp.203-204; M.H.Riyahi. İsfahanın məşhur qadınları, s.252-253; Z.Rizayi. Səfəvilər dövründə hökmdarın canişininin təyini məsələsində hərəmxananın rolu (Tarix elmi araşdırmalar dərgisi, 1399 h.-ş., №58), s.27-30; Əbdülməcid Şüca. Səfəvilər dövründə qadın, siyasət və hərəmxana, s.177-178.*

**MƏRYƏM BƏYİM** – Səfəvi şahzadəsi, *Şah Sultan Hüseynin* qızı. Həyatı haqqında məlumat azdır. Səfəvilər dövründə mühüm dövlət vəzifələri tutmuş *Sultan əl-üləma* Seyid Hüseyn Mərəşi Amulinin (vəf. 1654) nəvəsi, *sədr* vəzifəsində xidmət edən Mirzə Mürtəza Xəlifə Sultani ilə ailə qurmuşdur (1731). Bu izdivacdan Əhməd Mirzə və Əbu Türab Mirzə adlı iki oğlu olmuşdur. Əhməd Mirzə *II Şah Təhmasibin* qızı ilə evlənmişdir. Əbu Türab Mirzə sonralar Bəxtiyari və Zəndi sülalələri tərəfindən Səfəvilər dövlətinin varisi kimi hakimiyyətə gətirilmiş və *III Şah İsmayıl* adını qəbul etmişdir (vəf. 1773).

***Mənbələr:*** *Mirzə Məhəmməd Xəlil Mərəşi Səfəvi. Məcmə ət-təvarix (nəşrə hazırlayan: Abbas İqbal), s.144-145.*

**MƏRYƏM SULTAN BƏYİM** – Səfəvi şahzadəsi, *I Şah Təhmasibin* qızı. Anası gürcü əsilzadələrindən Hurixan xanımdır. Məryəm sultan bəyim *Zeynəb xanımın* doğma bacısıdır. O, Gilan hakimi Xan Əhməd sultana ərə getmişdi. Xan Əhməd sultan Gilanın Biyə-pəs mahalı hakimlərinin nəslindən idi, I Şah Təhmasibin zamanında böyük hörmətə layiq görülmüş, amma mərkəzi hakimiyyətə qarşı üsyan etmişdi. Şahın əmri ilə Xan Əhməd sultan əvvəlcə Qəhqəhə, daha sonra İstəxr qalasında 10 il həbsdə qaldı. *Şah Məhəmməd Xudabəndə* hakimiyyətə keçəndə həyat yoldaşı *Məhdi-ülyanın* xahişi ilə (Xan Əhməd sultan onun qohumu idi) onu azad edib yenidən Gilan hakimliyinə gətirdi. Üstəlik, Xan Əhməd sultan şahın bacısı Məryəm sultan bəyimlə evlənmək şərəfinə də nail oldu. Lakin 1592-ci ildə o, ailəsini də özü ilə götürüb osmanlıların tərəfinə keçdi. Məryəm sultan bəyim öz övladını aparmaqdan imtina edib Səfəvi sarayına yolladı. Bu nəslin qız övladı İsgəndər bəy Münşinin zamanında (1616-cı il) Səfəvilər dövlətinin ərazisində yaşayırdı.



***Mənbələr:*** *İsgəndər bəy Münşi. Tarix-i aləm-ara-yi Abbasi (tərcümə və şərhlər: O.Əfəndiyev, N.Musalı), s.301; Həsən bəy Rumlu. Əhsən ət-təvarix (nəşrə hazırlayan: Ə.Nəvai), s.638; Nəsrullah Fəlsəfi. I Şah Abbasın həyatı, I, 213.*



**MUSTAFA MİRZƏ** (1556-1576) – Səfəvi şahzadəsi, *I Şah Təhmasibin* beşinci oğlu. Anası, Zəhrabacı xanım gürcü əsilli kəniz idi. Atası ona *Ustaclu* tayfasından Nəzər sultanı *lələ* (tərbiyəçi) təyin etmiş, şahzadə bu tayfanın arasında böyümüşdü. Nəzər sultanın vəfatından sonra Hüseyn bəy yüzbaşı şahzadənin lələsi oldu. Mustafa Mirzə Gilan vilayətində qopmuş üsyanın yatırılmasında fərqlənmiş, mülk sahibi olmuş və orduda yüksək vəzifə qazanmışdı. O, qardaşları arasında *Heydər Mirzə* ilə daha çox yaxın idi. I Şah Təhmasibin ömrünün sonlarında güclənən saray intriqalarında Mustafa Mirzə qardaşı Heydər Mirzənin tərəfində durmuş və onun şahlığa namizədliyini dəstəkləmişdi. Bu planın boşa çıxmasından və Heydər Mirzənin qətlindən sonra Mustafa Mirzə sarayı tərk edib *Bayat* tayfasına pənah apardı. Bu tayfada onun tərəfdarları çox idi. Lakin Hacı Üveys sultan Bayat şahın gözündə ucalmaq və cəzadan xilas olmaq üçün şahzadəni tutub Qəzvinə gətirdi. *II Şah İsmayıl* öz qardaşının edamını *Pirə Məhəmməd xan Ustacluya* tapşırdı. Ustaclu tayfası məlum hadisələr zamanı Heydər Mirzənin tərəfini tutmuşdu, buna görə öz vəziyyətini düzəltməyə çalışırdı. Şahzadə bir neçə gün Pirə Məhəmməd xanın evində qaldı. Bu müddətdə Ustaclu əmirləri xeyli müzakirələr apardılar. Onlar şahzadənin qanına əllərini bulamaq istəməsələr də, şahın cəzasından qorxduqları üçün axırda əmri yerinə yetirməyə razılıq verdilər. Mustafa Mirzə qardaşı *Süleyman Mirzə* ilə eyni gündə öldürüldü. Hər iki şahzadənin cənazəsini Qəzvindəki İmamzadə Hüseyn ziyarətgahında dəfn etdilər. Bu hadisədən sonra II Şah İsmayıl Pirə Məhəmməd xan Ustaclunun qızı ilə evləndi.

Mustafa Mirzə incə təbli şair idi, Sadiq bəy Əfşar *"Məcmə əl-xəvas"* təzkirəsində onun ədəbi istedadını təriflәmişdir.

Mustafa Mirzənin oğul övladı yox idi, iki qızı vardı. Doğma qardaşı Sultan Əli Mirzə II Şah İsmayılın əmri ilə kor edilmişdir.

***Mənbələr:*** *İsgəndər bəy Münşi. Tarix-i aləm-ara-yi Abbasi (tərcümə və şərhlər: O.Əfəndiyev, N.Musalı), s.298 və 420-421; Həsən bəy Rumlu. Əhsən ət-təvarix (nəşrə hazırlayan: Ə.Nəvai), s.626, 715-716; Sadiq bəy Əfşar. Məcməül-xəvas, s.37.*



**NƏKİHƏT XANIM** (vəf. 1680) – Səfəvi şahbanusu, *II Şah Abbasın* xanımı, *Şah Süleymanın* anası. Çərkəz əsillidir. Adını Nəqiyət xanım şəklində də qeyd etmişlər. II Şah Abbasın diqqətini özünə çəkərək hərəmxanada rəhbərliyi ələ almağa nail olmuşdur. Ərinin vəfatından sonra şahzadə Sam Mirzə (gələcək Şah Süleyman) ilə ondan yaşca kiçik olan Həmzə Mirzə arasında seçim etmək qarşısında qalan saray əyanlarının fikrini öz oğluna tərəf yönəltmiş və Sam Mir-

zənin hakimiyyətə gəlişini təşkil etmişdir. Bəzi məlumatlara görə, Şah Süleymanın hakimiyyətinin əvvəllərində baş vermiş uğursuzluqlar üzündən bu adın şaha "düşmədiyini" və başqa bir adla yenidən tacqoyma mərasimi keçirməyin zəruriliyini iddia edən də Nəkihət xanım olmuşdur. O, saray münəccimlərini bu barədə fikir bildirməyə məcbur etmiş, nəticədə şah bu dəfə Süleyman adını qəbul edərək bu adla tacqoyma mərasimi keçirmişdi. Tacqoymadan sonra Nəkihət xanım hamıdan əvvəl oğlunu şah olaraq salamlamış və öz beyətini bildirmişdi.

Nəkihət xanım sonrakı illərdə də dövlət idarəçiliyində üstün mövqeyini qoruyub saxlamış və bəzi mühüm qərarların verilməsində həlledici rol oynamışdır. Mühüm dövlət sənədlərinə vurulan möhür onun ixtiyarında idi. Şahbanu öz oğlunun israfçı davranışının qarşısını almağa çalışır, yüksək dövlət vəzifələrinə təyinatları təsdiq edirdi. II Şah Abbas hətta öz anasından, bəzi sevimli həyat yoldaşlarından və *xacəbaşılardan* ibarət bir müşavirə heyəti təşkil etmişdi; əsas məsələlər bu heyət tərəfindən müzakirə olunur və qərar qəbul edilirdi. II Şah Abbasın şəxsi həyatı da tamamilə anasının nəzarəti altında idi.

Səfəvilər tarixində İsfahan şəhərində ilk muzeyin təşkilini Nəkihət xanımın adı ilə bağlayırlar. O, şah xəzinəsində mövcud olan qiymətli əşyaların, digər ölkələrdən göndərilmiş hədiyyələrin nümayişi üçün "qoruq" adlı məkan ayırmışdı və tez-tez buranı ziyarət edirdi.

Nəkihət xanım dinə bağlı olmuş, mülkünün böyük bir hissəsini İraqdakı müqəddəs ziyarətgahlara vəqf etmişdir.

***Mənbələr:*** *Z.Rizayi. Səfəvilər dövründə hökmdarın canişininin təyini məsələsində hərəmxananın rolu (Tarix elmi araşdırmalar dərgisi, 1399 h.-ş., № 58), s.210; Əbdülməcid Şüca. Səfəvilər dövründə qadın, siyasət və hərəmxana, s.160-169; Q.Güllizəvarə. Qadınlar və Səfəvi hökmdarları ("Pəyami-zən" dərgisi, 1384 h.-ş., № 161), s.38-46; M.H.Riyahi. İsfahanın məşhur qadınları, s.246.*



**PƏRİXAN XANIM** (vəf. 1543) – Səfəvi şahzadəsi, *I Şah İsmayılın* qızı. 1519-cu və ya 1520-ci ildə Marağa yaxınlığındakı Bunab kəndində Şirvanşah II İbrahimin (Şeyxşahin) oğlu Sultan Xəlillə (gələcək Şirvanşah II Xəlilullah) kəbinləri kəsilmişdir. Bundan sonra Pərixan xanım Şirvanda yaşamış, Sultan Xəlilin vəfatından (1535) sonra da bir müddət orada qalmışdır. Bu dövrdə Şirvanşahlar dövlətində hərc-mərclik hökm sürürdü, hətta camaat *qələndər* kimi tanınan, özünü Sultan Xəlilin qardaşı elan edən şəxsi taxta çıxarmışdı. Növbəti şirvanşah Şahrux üsyanın öhdəsindən çətinliklə gəldi. Pərixan xanım qardaşının təlimatlarını yerinə yetirərək Şirvanşahlar dövlətinin Səfəvilər tərəfindən tam və qəti şəkildə ilhaq edilməsinə şərait yaratmaq üçün əlindən gələni edirdi. O, üsyançı qələndərlə əlaqə yaradaraq onu Şahruxun əleyhinə təhrik etməyə çalışırdı. Salnaməçi Budaq Münşi Qəzvini *"Cəvahir əl-əxbar"* kitabında yazırdı ki, hətta camaat formal olaraq qələndərlə



Pərixan xanımın kəbinini kəsmişdi. Qələndər öldükdən sonra Şirvanda hakimiyyət Pərixan xanımın əlinə keçdi. Baş verən hadisələrin sonunda I Şah Təhmasib Şirvanı Səfəvilər dövlətinə ilhaq etdi.

Dul qalmış Pərixan xanım 1539-cu ildə qardaşının təşəbbüsü ilə ölkənin şimal sərhədlərində əmin-amanlıq yaranması naminə Şəki hakimi *Dərviş Məhəmməd xana* (vəf. 1551) ərə getmişdir.

Məşhur şair *Möhtəşəm Kaşani* Pərixan xanıma mədhiyyə yazıb saraya göndərmiş, amma bu hərəkət şah tərəfindən xoş qarşılanmamışdı.

Pərixan xanım 1543-cü ildə dünyasını dəyişmiş, vəfatından sonra mülkləri Ərdəbildəki Şeyx Səfi xanəgahına *vəqf* olunmuşdur. I Şah Təhmasib öz bacısının xatirəsini əbədiləşdirmək üçün 1548-ci ildə doğulmuş qızına onun adını vermişdir.

***Mənbələr:*** *M.K.Yusifcəmali. I Şah İsmayılın həyatı, s.207-208; O.Əfəndiyev. Azərbaycan Səfəvilər dövləti, s.75-77; Budaq Münşi Qəzvini. Cəvahir əl-əxbar (nəşrə hazırlayan: M.Bəhramnejad), s.183; Əbdi bəy Şirazi. Təkmilət əl-əxbar (nəşrə hazırlayan: Ə.Nəvai), s.91; Şahin Fazil. İki Pərixan xanım ("Hikmət" dərgisi, № 21-22, 2022), s.39-43.*

**PƏRİXAN XANIM** (1548-1578) – Səfəvi şahzadəsi, *I Şah Təhmasibin* qızı. Anası Dağıstanın yerli feodal sülaləsindən (Şamxal nəslindən) çərkəz əsilli *Şamxal sultanın* bacısı *Sultanağa xanım* idi. I Şah Təhmasibin siyasi izdivaclarından olan bu evlilik 1547-ci ildə baş tutmuşdur. Pərixan xanıma bir müddət əvvəl vəfat etmiş bibisinin şərəfinə bu ad verilmişdi. Pərixan xanım 1548-ci ildə Əhər yaxınlığında doğulmuş, mükəmməl təhsil almışdır. Öz əmisi oğlu *Bədiüzzaman Mirzə* (*Bəhram Mirzənin* kiçik oğlu) ilə nişanlanmış, lakin toy baş tutmamışdı. Bunun dəqiq səbəbi bilinmir, bəzi ehtimallara görə, toyun baş tutmamasının səbəbi çox böyük məbləğdə mehriyyə təyin edilməsi idi.

Pərixan xanımın iti zəkası, vəziyyəti düzgün qiymətləndirmə bacarığı onu atasının gözündə ucaltmışdı, I Şah Təhmasib mühüm məsələlərdə qızının rəyini soruşmaqdan çəkinmirdi. Atasının ömrünün sonlarına yaxın hakim dairələrdə növbəti şahın kim olacağı mövzusundakı intriqalarda Pərixan xanım da fəal iştirak edirdi. O, *II Şah İsmayılın* hakimiyyətə gətirilməsinin tərəfdarı idi, dayısı Şamxal sultan da eyni mövqeyi bölüşürdü. Lakin şahın sevimli hərəmi olan gürcü mənşəli Sultanzadə xanım öz oğlu *Heydər Mirzəni* hakimiyyətə hazırlayırdı. I Şah Təhmasibin vəfatından sonrakı böhranlı günlərdə Heydər Mirzə Pərixan xanımı və onun doğma qardaşı *Süleyman Mirzəni* öz tərəfinə çəkməyə ümid edirdi. Pərixan xanım qardaşının etibarını qazanmaq üçün hətta Qurana and içməkdən də çəkinmədi. Lakin Heydər Mirzəni arxayın saldıqdan sonra o, sarayın arxa qapılarının açarını dayısı Şamxal sultana ötürdü və Şamxal sultan çərkəz döyüşçülərlə birlikdə saraya daxil olub şahzadəni qətlə yetirdi (1576).

II Şah İsmayıl həbsdə olduğu Qəhqəhə

qalasından Qəzvinə gəlib çatana kimi ölkənin faktiki hakimi Pərixan xanım olmuşdur. Dövlət adamları bütün məsələlərdə onunla məsləhətləşirdilər, əmirlərin taleyi və vəzifəsi onun istəyi əsasında təyin olunurdu. Heydər Mirzənin qətlindən sonrakı bir neçə gün ərzində onun yüzlərlə müdafiəçisi Pərixan xanımın icazəsi ilə öldürülmüş və onların əmlakı qarət olunmuşdu.

Lakin II Şah İsmayıl taxta çıxdıqdan sonra onun öz bacısına müsbət yanaşmadığı aşkara çıxdı. Təbiətcə narahat və ətrafdakılardan həmişə şübhəli olan II Şah İsmayıl Pərixan xanım kimi güclü şəxsiyyəti öz hakimiyyətinə ciddi rəqib kimi görürdü. Buna görə şahzadə xanım dövlət işlərindən tam kənarlaşdırıldı, əmlakının böyük hissəsi müsadirə edildi. Onun doğma qardaşı Süleyman Mirzə digər Səfəvi şahzadələri ilə birlikdə qətlə yetirildi.

II Şah İsmayılın vəfatından (1577) sonra Vəli sultan Qalxançıoğlu Zülqədər onun körpə oğlu *Şah Şücanın* taxta çıxarılma məsələsini gündəmə gətirdi. Onun təklifinə görə, şahzadə yetkinlik yaşına çatanadək Pərixan xanım onun naibəsi (himayədarı) qismində dövləti idarə edəcəkdi. Lakin qızılbaş əmirləri yekdilliklə bir qadının dövlət başına gətirilməsinə qarşı çıxdılar. Şirazda olan *Şah Məhəmməd Xudabəndə* hökmdar seçildi və Qəzvinə dəvət olundu. Onun paytaxta gəlişinədək keçən iki ay ərzində yenidən Pərixan xanım üstünlüyü öz əlinə aldı.

Bu arada Şah Məhəmməd Xudabəndəyə və onun xanımı *Məhdi-ülyaya* Pərixan xanımın qeyri-məhdud ixtiyar sahibi olduğu və hakimiyyəti ələ keçirmək fikrinə düşdüyü barədə xəbər çatdırıldı. Mənbələrdə bu xəbərin *Salman xan Cabiri* tərəfindən ötürüldüyü yazılır. Məhdi-ülya artıq təhlükəli qüvvəyə çevrilmiş Pərixan xanımın aradan götürülməsinin vaxtının çatdığını anladı. Qəzvinin girişində şahı qarşılamağa gəlmiş Pərixan xanım görüş zamanı şahbanu Məhdi-ülyaya lazımi ehtiram göstərməməklə aradakı gərginliyi son həddə çatdırmış oldu. Şah Məhəmməd Xudabəndə öz məiyyəti ilə birlikdə Qəzvinə daxil olarkən Məhdi-ülyanın əmri ilə Pərixan xanımın oturduğu kəcavəni saraya deyil, uşaqlıqda onun lələsi olmuş Xəlil xan Əfşarın evinə apardılar. Bir müddətdən sonra onu Xəlil xanın evində boğaraq öldürdülər (1578). Pərixan xanımın dayısı Şamxal sultanı da Şəki hakimliyinə təyin etmək bəhanəsi ilə saraydan kənara çıxarıb yolda edam etdilər. Pərixan xanımın cənazəsi Qəzvindəki İmamzadə Hüseyn ziyarətgahında torpağa tapşırılmışdır.

Pərixan xanım irimiqyaslı xeyriyyəçilik fəaliyyəti ilə məşğul olur, mühüm tikinti işlərini maliyyələşdirirdi. İsfahandakı Pərixan xanım mədrəsəsi onun xeyriyyə işlərinin nümunəsidir. O, şeir və sənətə himayədarlıq edir, özü də "Həqiqi" təxəllüsü ilə şeirlər yazırdı. Zamanının böyük şairi *Möhtəşəm Kaşani* Pərixan xanıma qəsidələr ithaf etmiş, onu ən uca ifadələrlə tərifləmişdir. Səfəvilər dövrünün görkəmli tarixçisi Əbdi bəy Şirazi



də *"Təkmilət əl-əxbar"* əsərini ona həsr etmişdir.

***Mənbələr:*** *Şahin Fazil. İki Pərixan xanım ("Hikmət" elmi araşdırmalar toplusu, № 21-22, 2022), s.38-64; İ.Mirabidini. Şah Təhmasibin qızı Pərixan xanım ("Rüşdi-amuzeşi-tarix" dərgisi, üçüncü il, № 8), s.37-41; S.M.Şahmuradi. Səfəvilər dövrünün proseslərində Pərixan xanımın yaradıcı rolu ("İran və İslam tarix araşdırmaları" dərgisi, 1399 h.-ş., № 26), s.115-139; Ş.Gülsürxi. Pərixan xanım ("Rüşdi-amuzeşi-tarix" dərgisi, dördüncü il, № 12), s.13-21; Sugra Caferova. Azerbaycan Tarihinde Kadın (Sakarya Üniversitesi Sosyal Bilimler Enstitüsü, Yüksek Lisans Tezi), s.15-24; İsgəndər bəy Münşi. Tarix-i aləmara-yi Abbasi (tərcümə və şərhlər: O.Əfəndiyev, N.Musalı), s.451-456.*

**RAZİYYƏ BƏYİM** (1700-1776) – Səfəvi şahzadəsi, *Şah Sultan Hüseynin* qızı, *II Şah Təhmasibin* bacısı, *Nadir şah Əfşarın* xanımı. Mükəmməl təhsil almış, Kaxeti çarı David (İmamqulu xan, 1678-1722) ilə ailə qurmuşdur. İsfahan şəhəri əfqanların hücumuna məruz qaldığı dövrdə Gürcüstanda olan Raziyyə bəyimin əri vəfat etmiş (1722) və o, vətəninə, qardaşı II Şah Təhmasibin yanına qayıtmışdır. Sonralar Səfəvilər dövlətini əfqan işğalından azad etdiyinə görə II Şah Təhmasib öz dul bacısının Nadir xanla (gələcək Nadir şah Əfşar) izdivacına razı olmuş (1729), bu izdivacdan Raziyyə bəyimin bir qızı doğulmuşdur. Nadir xan özünü şah elan etdikdən sonra Raziyyə bəyim məlikə statusu qazanmışdır. Nadir şahın Səfəvilərin varisi kimi öz hakimiyyətinə legitimlik qazandırmasında onun Raziyyə bəyimlə evliliyinin böyük rolu olmuşdur. Sonralar Nadir şah Hindistan səfərində olarkən oğlu şahzadə Rzaqulu Mirzə II Şah Təhmasibi azyaşlı oğlu *III Abbasla* birlikdə qətlə yetirdi. Bundan sonra Raziyyə bəyimlə Rzaqulu Mirzənin arasında ciddi narazılıq yarandı. Bəzi məlumatlara görə, Rzaqulu Mirzənin qəzəbə tuş gəlib kor edilməsində onun da rolu olmuşdur.

Raziyyə bəyim dinə bağlı olmuş, hələ Nadir şahın sağlığında Kərbəladakı İmam Hüseyn (ə) hərəminin təmirinə 20 min nadiri (o zamanın pul vahidi) məbləğində ianə etmişdi. Onun göstərişi əsasında müqəddəs məzarın üzərində təzə, nəfis sənduqə quraşdırılmış, məqbərənin içi xalçalarla döşənmiş, divarlara bahalı pərdələr asılmışdı.

Nadir şahın qətlindən (1747) sonra Raziyyə bəyim bir müddət dövlət idarəçiliyində iştirak etmiş, sonra İraqa köçmüşdür. O, 1776-cı ildə Kərbəlada dünyasını dəyişmiş və İmam Hüseyn (ə) hərəmində torpağa tapşırılmışdır. Mülkünün böyük hissəsini İmam Hüseyn (ə) hərəminə *vəqf* edən Raziyyə bəyim genişmiqyaslı xeyriyyəçilik fəaliyyəti ilə məşğul olmuşdur.

***Mənbələr:*** *L.Lockhart. Nadir Shah: a Critical Study Based Mainly Upon Contemporary Sources, pp.42, 169 and 232; Mehman Süleymanov. Nadir şah, s.601-603; Dairət əl-məarifi-təşəyyö, I, 76; П.Х.Гребельский и С.В.Думин. Дворянские роды Российской империи, III, 67; Cəfər əl-Xəlili. Movsuət əl-ətəbat əl-müqəddəsə (qism Kərbəla), VIII, 268.*

**RUZƏK MİRZƏ** – Səfəvi şahzadəsi, *I Şah Abbasın* üçüncü oğlu *Sultan Məhəmməd Mirzənin* ləqəbi. O, bir və ya iki il əvvəl dünyasını dəyişmiş babası *Şah Məhəmməd Xudabəndənin* şərəfinə adlandırılmışdı. Uşaq yaşlarında ona Ruzək Mirzə deyə müraciət edirdilər. "Ruzək" fars dilində "gün" sözünün kiçildilmiş forması olsa da, ləqəbin verilmə səbəbi aydın deyildir.

***Mənbələr:*** *Nəsrullah Fəlsəfi. I Şah Abbasın həyatı, II, 186-192; Ruznameyi-Molla Cəlal, s.155.*

**RÜSTƏM MİRZƏ** (1517-?) – bəzi mənbələrdə *I Şah İsmayılın* Rüstəm Mirzə adlı oğlu olduğu qeyd edilmişdir. İlkin Səfəvi mənbələrindən "Həbib əs-siyər"-də xəbər verilir ki, hicri 923-cü il şəban ayının 26-da (miladi 1517-ci il) şahzadə *Sam Mirzənin* təvəllüdündən cəmi 5 gün sonra Marağada doğulmuş, bu hadisə I Şah İsmayılın böyük sevincinə səbəb olmuşdur. I Şah İsmayılın Rüstəm Mirzə adlı oğlunun olması yalnız bəzi mənbələrdə öz əksini tapmışdır; bu mənbələr də əsasən "Həbib əs-siyər"ə əsaslanır. Ehtimala görə, Rüstəm Mirzə kiçik yaşlarında, atasının sağlığında vəfat etdiyi üçün sonrakı hadisələrin gedişində onun adına rast gəlinmir. Buna görə də mənbələrdə onun həyatı haqqında məlumat yoxdur.

***Mənbələr:*** *Şeyx Səfidən Şah Səfiyə kimi ("Tarixi-sultani"dən, nəşrə hazırlayan: E.İşraqi), s.33; M.K.Yusifcəmali. I Şah İsmayılın həyatı, s.204; Əbdi bəy Şirazi. Təkmilət əl-əxbar (müqəddimə: Ə.Nəvayi), s.188.*

**SAM MİRZƏ** (1517-1567/68) – Səfəvi şahzadəsi, *I Şah İsmayılın* üçüncü oğlu. Bəzi mənbələrdə I Şah İsmayılın *Taclu bəyimlə* izdivacından doğulduğu qeyd edilsə də, daha üstün nəzəriyyəyə görə, anası şahın digər xanımı idi. Bəzən *Əlqas Mirzə* ilə doğma qardaş olduğu yazılır, *"Tarixi-aləmarayi-Abbasi"yə* görə, bu iki şahzadənin anaları ayrı-ayrı xanımlar idi. Sam Mirzə Marağa yaxınlığındakı Surluq yaylağında doğulmuş, kiçik yaşlarında atası tərəfindən formal Xorasan hakimi qismində Herata göndərilmişdir (bundan əvvəl şahın böyük oğlu Təhmasib Mirzə *lələsi Əmir xan Mosullu* ilə Xorasan hakimi olmuş, sonra Əmir xan Mosullu təqsirinə görə saraya çağırılmışdır). I Şah İsmayılın bacısı oğlu *Durmuş xan Şamlu* onun lələsi təyin edilmişdir (1521).

I Şah İsmayılın vəfatından sonra da vəzifəsində qalan Sam Mirzə Durmuş xanın köməyi ilə özbəklərin bir neçə hücumunun qarşısını uğurla alaraq Heratı qoruya bilmişdi. 1525-ci ildə Durmuş xanın vəfatından sonra qardaşı *Hüseyn xan Şamlu* şahzadənin lələsi seçilmişdir. Onun zamanında da Herat uzun müddət özbəklərin hücumları qarşısında davam gətirmiş, lakin axırda Hüseyn xanın məsləhəti ilə Sam Mirzə şəhəri boşaldıb Səfəvilər dövlətinin içərilərinə çəkilmişdi. 1533-cü ildə I Şah Təhmasib şəxsən qızılbaş qoşunu ilə Xorasana yeriyib özbəkləri oradan uzaqlaşdırdı, Sam Mirzəni Herat hakimi vəzifəsində təsdiq etdi. Hüseyn xan Şamlu *vəkil* mənsəbinə təyinat aldığı üçün həmin il



şahzadənin lələsi vəzifəsi *Ağzıvar xan Şamluya* verildi.

Az sonra Hüseyn xan Şamlunun aradan götürülməsi nəticəsində yaranmış qarışıqlıqdan istifadə edən *Ulamə sultan Təkəlü* osmanlılar tərəfə keçərək I Sultan Süleymanı Səfəvilər dövlətinin üzərinə hücuma keçməyə həvəsləndirdi. I Süleyman Sam Mirzəni şərq torpaqlarının hakimi elan etməklə onu qardaşının əleyhinə üsyan qaldırmağa sövq etdi. Lakin Osmanlı qoşununun uğursuzluğu və vətəndaş müharibəsinin aradan qaldırılması ilə Sam Mirzə çətin vəziyyətə düşdü. Ağzıvar xanın məsləhəti ilə o, I Şah Təhmasibin qəzəbini yumşaltmaq üçün Qəndəhar şəhərini Böyük Moğollar imperiyasından almağa cəhd etdi. Moğollarla döyüşdə Ağzıvar xan ələ keçirilib öldürüldü (1534), Sam Mirzə qoşunun qalıqlarını buraxıb qardaşının hüzuruna gəldi və təslim olduğunu bildirdi, bundan sonra uzun müddət ciddi nəzarət altında yaşadı. 1549-cu ildə şahdan xahiş etdi ki, ibadət və yaradıcılıqla məşğul ola bilməsi üçün onu saraydan uzaq, sakit bir məkana köçürsün. Şahzadə Səfəvilər dövlətində ən yüksək mənəvi mənsəblərdən olan Ərdəbil təkkəsini idarə etmək şərəfini qazandı.

1562-ci ildə Sam Mirzə müqəddəs Məşhəd şəhərində məskunlaşmaq üçün qardaşından icazə istədi. I Şah Təhmasib əvvəlcə bu xahişə müsbət cavab versə də, daha sonra ətrafındakılardan şahzadənin üsyan qaldırmaq niyyətində olması haqda xəbər aldığı üçün Sam Mirzəni iki azyaşlı oğlu ilə birlikdə Ərdəbildəki Qəhqəhə qalasında həbs etdirdi. 1567-ci ilin sonu, 1568-ci ilin əvvəllərində Sam Mirzə, iki oğlu və Əlqas Mirzənin orada həbsdə olan iki oğlu (Əhməd Mirzə və Fərrux Mirzə) dünyalarını dəyişdilər. Onların ölüm hadisəsinin təsviri barədə məlumatlar fərqlidir. Bəzi rəsmi Səfəvi mənbələri xəbər verir ki, zəlzələ nəticəsində Qəhqəhə qalasında uçqun baş vermiş və şahzadələr də uçqunda həlak olmuşlar. Qazı Əhməd Quminin *"Xülasət ət-təvarix"* əsərində isə onların Məhəmməd bəy Qoyunçuoğlu Ustaclunun başçılıq etdiyi 30 nəfərlik *qorçu* dəstəsi tərəfindən öldürüldüyü bildirilir. Onların cənazələri Ərdəbilin Kəlxuran kəndinə gətirilərək Səfəvilərin ailəvi məqbərəsində torpağa tapşırıldı.

Sam Mirzə Hüseyn xan Şamlunun qızı ilə evlənmiş, üç oğlu və bir qızı doğulmuşdur. Böyük oğlu Rüstəm Mirzə 16 yaşında ikən *Şeyxavənd* ailəsindən bir qızla evlənmiş, amma az sonra qəfildən dünyasını dəyişmişdir. Onu öz vəsiyyətinə əsasən Məşhəd şəhərində dəfn etmişlər. Sam Mirzənin iki azyaşlı oğlu onunla birlikdə Qəhqəhə qalasında dünyalarını dəyişmişlər. *Şah Məhəmməd Xudabəndənin* zamanında Sam Mirzənin qızı Kaxeti çarı I Levanın (Səfəvi mənbələrində Ləvənd xan adı ilə xatırlanır) oğlu İsa xana ərə verilmişdir.

Sam Mirzənin də, atası və qardaşları kimi, şairlik təbi vardı, "Sami" təxəllüsü ilə şeir yazır, ədəbi araşdırmalarla məşğul olurdu. Bu araşdırmaların nəticəsi olaraq Ərdəbildə yaşadığı müddət

ərzində o, müasiri olduğu yüzlərlə şairin yaradıcılığından bəhs edən *"Töhfeyi-Sami"* təzkirəsini tərtib etmişdir.
*bax:* **"TÖHFEYİ-SAMİ".**

***Mənbələr:*** *M.K.Yusifcəmali. I Şah İsmayılın həyatı, s.202-204; Əbdi bəy Şirazi. Təkmilət əl-əxbar (müqəddimə: Əbdülhüseyn Nəvayi), s.232-237; Türkiye Diyanet Vakfi İslam Ansiklopedisi, XXXVI, 61; İsgəndər bəy Münşi. Tarix-i aləmara-yi Abbasi (tərcümə və şərhlər: O.Əfəndiyev, N.Musalı), s.119-120; Şeyx Səfidən Şah Səfiyə kimi ("Tarixi-sultani"-dən, nəşrə hazırlayan: E.İşraqi), s.11-12; M.Tərbiyət. Danişməndani-Azərbaycan, s.297-298; Sam Mirzə. Töhfeyi-Sami (nəşrə hazırlayan: Vəhid Dəstgirdi), müqəddimə bölümü; Sadiq bəy Əfşar. Məcməül-xəvas (hazırlayan: Əkrəm Bağırov), s.34.*

**SEYYİD SALEH** – Səfəvilər sülaləsinin əcdadlarından biri. Bəzi məlumatlara görə, *Qütbəddin Əbu Baqinin* oğlu və *Şeyx Əminəddin Cəbrayılın* atası, səfəviyyə təriqətinin banisi *Şeyx Səfiəddin Ərdəbilinin* babası.
*bax:* **QÜTBƏDDİN ƏBU BAQİ.**

**SƏFİ MİRZƏ** (vəf. 1728) – Səfəvi şahzadəsi, *Şah Sultan Hüseynin* ikinci oğlu. İsfahanın əfqanlar tərəfindən işğalından və Səfəvilər dövlətinin süqutundan sonra bir neçə nəfər özünü Səfi Mirzə adlandıraraq hakimiyyət iddiasına qalxmışdır. Buna şərait yaradan səbəblərdən biri 1725-ci ildə Şah Sultan Hüseynin Səfi Mirzə adlı oğlunun əfqan əsarətindən qaçması barədə yayılmış şayiə idi. *Mahmud şah Hutəki* bu xəbərdən qəzəblənərək İsfahanda həbsdə saxladığı bütün Səfəvi şahzadələrini (şahın özü və İsfahanın ələ keçirilməsindən əvvəl şəhəri tərk etmiş Təhmasib Mirzə istisna olmaqla) qətlə yetirdi. Tədqiqatçıların fikrincə, Səfi Mirzənin qaçış xəbəri Mahmud şahın özü tərəfindən uydurulmuşdu ki, bu yolla Səfəvi sülaləsinin kişi üzvlərinin hamısını qılıncdan keçirməyə bəhanə yaransın.
Bəzi məlumatlara görə, əsl Səfi Mirzə İsfahanın əfqanlar tərəfindən mühasirəsi zamanı ordu toplamaq üçün şəhərdən çıxmağa cəhd etsə də, qardaşı Təhmasib Mirzədən fərqli olaraq, uğursuzluqla üzləşmiş və İsfahanda qalmışdı. Mənbələrin bir qismində onun 1725-ci ildə qardaşları ilə birlikdə İsfahanda edam edildiyi yazılır. Lakin bəzi mənbələr onun baş vəzir Məhəmmədqulu xanın yardımı ilə İsfahandan qaçdığını və Kirmanşah ətrafında özünə tərəfdar topladığını xəbər verir. Səfi Mirzə əsasən lurlardan ibarət 10-12 min nəfərlik qoşun topladıqdan sonra Səfəvilər dövlətinin ərazisinə soxulmuş Osmanlı qüvvələri ilə müharibəyə başlamış, hətta Həmədan şəhərini azad etmişdi. Səfəvi mirasının sahibi kimi öz hakimiyyətini elan etmiş, öz adına xütbə oxutdurub pul zərb etdirmiş Səfi Mirzə az sonra yerli hakimlərlə anlaşılmazlıq üzündən sui-qəsd nəticəsində öldürülmüşdür.
Səfi Mirzə olduğunu iddia edənlərin ən məşhuru Bəxtiyari tayfasının yaşadığı dağlıq ərazidə üzə çıxmış şəxsdir. Onun iddiasına görə, əsl adı Əbulməsum Mirzə idi, Səfi Mirzə adını özü qəbul etmişdi. Səfi Mirzə İsfahandan bacısı ilə



birlikdə qaçdığını iddia edirdi. Səfəvilər sülaləsinə rəğbətlə yanaşan və əfqan işğalından narazı olan xalq kütlələri, eləcə də bölgənin hakim təbəqəsi onun ətrafında birləşdi. Xəlilabad məntəqəsinə gələn Səfi Mirzə elan etdi ki, hakimiyyəti öz sülaləsinə qaytarmaq üçün hərəkata başlayacaq və lazım gəlsə, osmanlılardan yardım istəyəcək. Bəxtiyari elinin böyüklərindən olan Fəthəli xan öz tayfası ilə birlikdə ona qoşuldu. Səfi Mirzə ilk dövrlərdə hakimiyyətə təkbaşına iddia etmir, o zamanlar Xorasanda olan qardaşı Təhmasib Mirzəni Səfəvi taxtının hüquqi varisi kimi qəbul edir və ona yardımçı olduğunu deyirdi. Bu fakt onun həqiqi Səfi Mirzə olmasını şübhə altına alır. Çünki Şah Sultan Hüseynin ikinci oğlu olan Səfi Mirzə hakimiyyətə üçüncü oğul Təhmasib Mirzədən daha artıq dərəcədə layiq idi və öz haqqını legitimləşdirmək üçün kiçik qardaşının adından istifadə etməsi qeyri-məntiqi hərəkət olardı. Daha sonralar Səfi Mirzə Bəxtiyari elindən gözlədiyi dəstəyi görməyərək Xuzistan bölgəsinə köçdü, əvvəlcə Şüştərdə məskunlaşdı. Burada Kuhgiluyə və Xuzistan əyanları, xüsusilə yerli ərəb qəbilələri ona qoşuldu. Səfi Mirzə əvvəlcə Bəhbəhan, daha sonra Dehdəşt şəhərini özünə mərkəz seçdi, öz adına xütbə oxutdurub sikkələr zərb etdirdi. O, Səfəvi ənənəsinə uyğun olaraq öz dövlətinin özəyini qurmağa çalışır, hətta Kuhgiluyə *bəylərbəyi,* Şüştər hakimi, baş vəzir, *sədr*, *eşikağasıbaşı*, *naziri-büyutat*, *vəkil*, *miraxurbaşı* və digər vəzifələrə yerli əyanları təyin edirdi.

Tezliklə Səfi Mirzənin tərəfdarları arasında qarşıdurma və narazılıqlar yarandı. Təhmasib Mirzə də Xorasandan Bəxtiyari və Kuhgiluyə əmirlərinə məktub göndərərək Səfi Mirzəni yalançı adlandırdı. Səfi Mirzə ilk zamanlarda ona qarşı çıxanları sakitləşdirə bilsə də, artmaqda olan narazılığın qarşısını almaq gücündə deyildi. 1728-ci ildə üsyançıların əlindən qaçmağa çalışan Səfi Mirzə ələ keçirildi, rüsvayçı şəkildə Dehdəştə gətirilib edam edildi. Bu zaman onun cəmi 20 yaşında olduğunu yazırlar.

***Mənbələr:*** *S.Əzimi, M.L.Şatiri. Qüdrətə nail olmaqda şəriətə uyğunluq və məqbulluq şərti (İsfahanın süqutundan Muğan qurultayına kimi Səfəvi hakimiyyətinin iddiaçıları, "Pəyami-nov" dərgisi, 1398 h.-ş., № 29), s.21-48; K.Siyahpur, N.Zəkipur. İsfahanın süqutundan sonra Səfəvi hakimiyyətinə daxili iddiaçılar: Səfi Mirzə üsyanı ("Tarixi-İran" dərgisi, 1397 h.-ş., № 15), s.103-121; Mirzə Mehdi xan Astarabadi. Cahangüşayi-Nadiri (nəşrə hazırlayan: S.A.Ənvar), s.21-22; Məhəmməd Möhsün Mustovfi. Zübdət ət-təvarix (nəşrə hazırlayan: B.Gudərzi), s.173-174; J.R.Perry. The Last Safavids, 1722-73 (British Institute of Persian Studies, Vol. 9, 1971), p.60.*

**SƏFİ MİRZƏ** – Səfəvi şahzadəsi, *I Şah Abbasın* böyük oğlu, *I Şah Səfinin* atası *Məhəmməd Baqir Mirzənin* ikinci adı. Şahzadənin əsl adı Məhəmməd Baqir olsa da, sülalənin ulu əcdadı, səfəviyyə təriqətinin banisi *Şeyx Səfiəddin Ərdəbilinin* şərəfinə onu Səfi deyə çağırır-

dılar. Oğlu Sam Mirzə hakimiyyətə gəldikdən sonra atasının şərəfinə "Şah Səfi" ləqəbini qəbul etmişdir.
*bax:* **MƏHƏMMƏD BAQİR MİRZƏ.**

**SƏLAHƏDDİN RƏŞİD** – Səfəvilər sülaləsinin əcdadlarından biri, *Məhəmməd Hafizin* oğlu, *Şeyx Qütbəddinin* atası. Həyatı haqqında məlumat azdır. Adının Məhəmməd olduğunu yazırlar. Atası Məhəmməd Hafizdən sonra sülaləyə başçılıq etmiş, Ərdəbilin İsfərəncan kəndindən Kəlxuran kəndinə köçmüşdür. Bundan sonra Səfəvilər nəsli həmin kənddə məskunlaşmış, səfəviyyə təriqətinin banisi *Şeyx Səfiəddin Ərdəbili* də Kəlxuran kəndində doğulmuşdur.

Səlahəddin Rəşid əkinçiliklə məşğul olur, ətrafındakıları da buna həvəsləndirirdi. Əlinin halal zəhməti ilə dolanır, müridlərindən nəzir və hədiyyə qəbul etmirdi. Mənəvi paklıqdan əlavə zahiri görünüş cəhətdən də çox yaraşıqlı olduğunu yazırlar. Zahidanə həyat tərzi sürmüş, irşad (təbliğat) işində böyük uğur qazanmışdı, insanları inandırmaq bacarığına malik idi. Səlahəddin Rəşid 70 il yaşamışdır.

***Mənbələr:*** *İsgəndər bəy Münşi. Tarix-i aləmara-yi Abbasi (tərcümə və şərhlər: O.Əfəndiyev, N.Musalı), s.46; İbn Bəzzaz Ərdəbili. Səfvət əs-səfa, s.73; Şeyx Səfi təzkirəsi ("Səfvətüs-səfa"nın XVI əsr türk tərcüməsi), s.48; Şeyx Hüseyn Pirzadə Zahidi. Silsilət ən-nəsəbi-Səfəviyyə, s.12; Ələmarayi-Səfəvi (nəşrə hazırlayan: Y.Şükri), s.7-8.*

**SƏLAHƏDDİN RƏŞİD** – Səfəvilər nəslinin nümayəndəsi, *Şeyx Səfi Ərdəbilinin* doğma qardaşı. Ulu babasının şərəfinə adlandırılmışdır. Onun Məhəmməd adlı qardaşı ticarət məqsədilə Şiraza getmiş və orada çoxlu var-dövlət qazanmışdı. Amma sonra Şiraz və Hörmüz arasında ticarət səfərində ikən isti səhra küləyinə tuş gəlib dünyasını dəyişmişdi. Ərdəbildə yaşayan Səlahəddin Rəşid qardaşının təsərrüfatını idarə etmək üçün Şiraza gedib orada qalır. O, ticarətdə uğur qazanmış, şəhərin nüfuzlu adamlarından biri olmuşdu. Anbardar Xacə Əminəddinin qızı ilə evlənməsi sayəsində hətta kəndxuda (şəhər müdiriyyətinin başçısı) vəzifəsinə yüksəlmişdi. Bazara çıxan zaman önündə və arxasında 70 nəfərdən artıq xidmətçi irəliləyir, 18 nəfər zurna və kəranay çalaraq onun gəlişini elan edirdi. Şeyx Səfinin anası oğlunun ayrılığına dözə bilmir və onu hər vasitə ilə Ərdəbilə qaytarmağa çalışırdı. Hətta özü üçün mənəvi ustad axtarışında Şiraza səfər edən Şeyx Səfiyə də tapşırmışdı ki, qardaşını qaytarıb gətirsin. Şeyx Səfi Şirazda qardaşı ilə görüşüb anasının xahişini çatdırmış, amma onun verdiyi hədiyyələri qəbul etməmişdi (zahidanə həyat sürdüyü və dünya malına meyil etmədiyi üçün). Səlahəddin Rəşid ticarət işlərini və təsərrüfatını atıb Ərdəbilə qayıda bilməyəcəyini söyləyərək nökər vasitəsilə anası və digər qohumları üçün hədiyyələr göndərmişdi.

*"Səfvət əs-səfa"* kitabında Səlahəddin Rəşidin Livan dağlarının ətəyində dəfn edildiyi yazılmışdır.



*Mənbələr: Şeyx Hüseyn Pirzadə Zahidi. Silsilət ən-nəsəbi-Səfəviyyə, s.17-21; Z.Bayramlı. "Silsilət ən-nəsəbi-Səfəviyyə" əsəri Azərbaycan tarixinin mənbəyi kimi, s.31-32; Şeyx Səfi təzkirəsi ("Səfvətüs-səfa"nın XVI əsr türk tərcüməsi), s.61-63; İbn Bəzzaz Ərdəbili. Səfvət əs-səfa, s.95-97.*

**SULTAN ƏLİ MİRZƏ** (vəf. 1494) – Səfəvilər sülaləsinin nümayəndəsi, *Şeyx Heydərin* böyük oğlu, *I Şah İsmayılın* doğma qardaşı. Anası Ağqoyunlu hökmdarı *Uzun Həsənlə* Trabzon (Trapezund) imperatoru IV Böyük İohann Komninin (ləqəbi Kalo-İoannes – "gözəl İohann") qızı Teodoranın (*Dəspinə xatun*) izdivacından doğulmuş *Aləmşah bəyimdir*. Qardaşları *İbrahim Mirzədən* və I Şah İsmayıldan yaşca daha böyük olmuşdur. Atası Şeyx Heydərin ölümündən (1488) sonra səfəviyyə təriqətinin *mürşidi-kamili* seçilmişdir. Ağqoyunlu hökmdarı Sultan Yaqubun əmrinə əsasən anası və qardaşları ilə birlikdə Şirazın İstəxr qalasında dörd ildən artıq həbsdə qalmış, sonralar Ağqoyunlu Rüstəm padşah tərəfindən azadlığa buraxılmışdır.

Rüstəm padşah sülalədaxili mübarizədə Sultan Əli Mirzədən öz rəqibi və əmisi oğlu Baysunqur Mirzəyə qarşı istifadə etməyi qərara almışdı. Onun planına əsasən, Sultan Əli sərkərdə qismində orduya cəlb ediləcək və Baysunqura qarşı döyüşə göndəriləcəkdi. Bu döyüşdə tərəflərdən hər hansı birinin məğlub olması Rüstəm padşah üçün fərq etmirdi, çünki həm əmisi Sultan Yaqubun oğlu Baysunquru, həm də dayısı Şeyx Heydərin oğlu Sultan Əli Mirzəni özünə siyasi rəqib sayırdı; onların hər ikisinin aradan götürülməsi Rüstəm padşahın maraqlarına uyğun idi.

Rüstəm padşahın əmri ilə Şeyx Heydərin ailəsi həbsdən azad edilib Təbrizə gətirildi. Sultan Əli Mirzə qızılbaşları öz ətrafına toplayıb 12 min nəfərlik qızılbaş qoşunu və 20 min nəfərlik Ağqoyunlu ordusu ilə Baysunqurla Şirvanşahların birləşmiş qüvvələrinin üzərinə yürüdü (Baysunqur Şeyx Heydərin qatili sayılan Şirvanşah Fərrux Yasara – öz babasına sığınmış və ondan hərbi yardım istəmişdi). Sultan Əli Mirzənin başçılığı altında qızılbaşların göstərdikləri şücaət sayəsində döyüş qələbə ilə nəticələndi.

Rəqiblərindən birinə qalib gəlmiş Rüstəm padşah az sonra planının ikinci hissəsinin icrasına başladı. O, qızılbaş əmirlərinin şərəfinə ziyafət təşkil edərək onların hamısını orada öldürməyi qərara aldı. Bundan xəbər tutan Sultan Əli Mirzə qardaşlarını da götürüb *Hüseyn bəy Lələ Şamlu, Abdal bəy Dədə Zülqədər, İlyas bəy Halvaçıoğlu, Qara Piri bəy Qacar* və digər qızılbaş əmirləri ilə birlikdə Təbrizi tərk etdi və Ərdəbil istiqamətində yola çıxdı. Ağqoyunlu dəstəsi onları Ərdəbilin yaxınlığındakı Şəmasi kəndində haqladı. Ətrafında cəmi 400 (və ya 700) nəfər tərəfdarı olan Sultan Əli Mirzə qeyri-bərabər döyüşə girməli oldu. O, *səfəviyyə təriqətinin* başçılığını qardaşı İsmayıl Mirzəyə vəsiyyət etdi (Bəzi məlumatlara görə, təriqətin mənəvi rəhbərliyi İbrahim Mirzəyə, siyasi və hərbi lider-

liyi İsmayıl Mirzəyə ötürüldü). Ağqoyunlu qüvvələri ilə toqquşmada Sultan Əli Mirzə və qızılbaşların bir hissəsi həlak oldu, sadiq müridlər İsmayıl Mirzə ilə İbrahim Mirzəni xilas edib Ərdəbilə çatdırdılar (1494). Sultan Əli Mirzənin cənazəsi də şəhərə gətirilib Səfəvilərin ailəvi məzarlığında – Şeyx Səfi xanəgahında torpağa tapşırıldı.

***Mənbələr:*** *Namiq Musalı. I Şah İsmayılın hakimiyyəti ("Tarix-i aləmara-yi Şah İsmayıl" əsəri əsasında), s.106-110; İsgəndər bəy Münşi. Tarix-i aləmara-yi Abbasi (tərcümə və şərhlər: O.Əfəndiyev, N.Musalı), s.71-76; M.K.Yusifcəmali. I Şah İsmayılın həyatı, s.49-50; Həsən bəy Rumlu. Əhsən ət-təvarix (təshih: Əbdülhüseyn Nəvayi), s.11-12; Aləmarayi-Səfəvi (nəşrə hazırlayan: Y.Şükri), s.33-38; Seyid Həsən ibn Mürtəza Hüseyni Astarabadi. Tarixi-sultani (nəşrə hazırlayan: Ehsan İşraqi), s.28-30; M.A.Ghulam Sarwar. History of Shah Ismail Safawi, pp.26-29; Walther Hinz. Uzun Hasan ve Şeyh Cüneyd (türkcə tərcümə: Tevfik Bıyıklıoğlu), s.80-82.*

**SULTANIM** – *bax:* **MƏHİN BANU.**

**SULTANIM XANIM** (vəf. 1593/94) – Səfəvi şahbanusu, *I Şah Təhmasibin* xanımı. Səfəvi şahlarından ikisinin – *II Şah İsmayılın* və *Şah Məhəmməd Xudabəndənin* anasıdır. Sultanım xanım türkman tayfa ittifaqına daxil olan *Mosullu* tayfasından İsa sultanın qızı, *Musa sultanın* bacısı idi (Bəzi mənbələrdə, o cümlədən *"Tarixi-aləmarayi-Abbasi"* kitabında o, Musa sultanın qızı kimi təqdim edilmişdir). Bu nəslin başçısının adı Bektaş bəydir, onun oğlu Bəkr bəy Ağqoyunlular zamanında Astarabadda hakimlik etmiş, sonralar Ağqoyunlu şahzadələri arasında baş vermiş döyüşlərdə həlak olmuşdu. Sultanım xanımın atası İsa bəy Bəkr bəyin oğlu idi. Mosullu tayfası bundan əvvəl də Səfəvi sülaləsi ilə qohum olmuşdu. I Şah İsmayıl Bəkr bəyin qardaşı Həmzə bəy Mosullunun oğlu Mihmad bəyin qızı *Taclu bəyimlə* evlənmiş, bu izdivacdan I Şah Təhmasib doğulmuşdur. Beləliklə, Taclu bəyimin atası Mihmad bəylə Sultanım xanımın atası İsa bəy əmioğlu idilər.

Sultanım xanım Səfəvi sarayında böyük nüfuz sahibi idi. Hətta II Şah İsmayılın qısamüddətli hakimiyyət dövründə əksər Səfəvi şahzadələrini qətlə yetirməsinə rəğmən qardaşı Məhəmməd Mirzəni (gələcək Şah Məhəmməd Xudabəndə) öldürməməsini Sultanım xanımın nüfuzu ilə bağlayırlar. Bəzi məlumatlara görə, II Şah İsmayıl anasından çəkinərək qardaşını aradan götürməyə cəsarət etməmişdir.

Sultanım xanımın həyatı haqqında mənbələrdə məlumat azdır. O, nəvəsi *I Şah Abbasın* hakimiyyətə gəlişi zamanı (1587) həyatda olmuş, onu təbrik etmişdir. Sultanım xanım 1593/94-cü illərdə 80 yaşında ikən Qəzvin şəhərində dünyasını dəyişmişdir. Dindar qadın olan Sultanım xanım əmlakının böyük bir hissəsini *vəqf* olaraq xeyriyyəçiliyə sərf etmişdir. Molla Cəlaləddin Münəccim *"Tarixi-Abbasi"* kitabında yazır ki, Sultanım xanımın vəfatı zamanı Xürrəmabadda olan I Şah Abbas Qəzvinə qa-



yıtdıqdan sonra nənəsinə məxsus sandıqları açdırmış və oradan cəmi iki min dinar pul çıxmışdı (şahbanu üçün bu, çox xırda məbləğ sayılırdı).

***Mənbələr:*** *İsgəndər bəy Münşi. Tarix-i aləm-ara-yi Abbasi (tərcümə və şərhlər: O.Əfəndiyev, N.Musalı), s.280 və 295; Zabil Bayramlı. Azərbaycan Səfəvi dövlətinin quruluşu və idarə olunmasında türk qızılbaş əyanlarının rolu, s.60; Şeyx Səfidən Şah Səfiyə kimi ("Tarixi-sultani"dən, nəşrə hazırlayan: E.İşraqi), s.160; Molla Cəlaləddin Münəccim. Tarixi-Abbasi (nəşrə hazırlayan: S.Vəhidniya), s.123.*



**SÜLEYMAN MİRZƏ** (vəf. 1513) – Səfəvilər sülaləsinin nümayəndəsi, *Şeyx Heydərin* oğlu, *I Şah İsmayılın* ögey qardaşı. Anası çərkəz əsilli *Ana xatundur.* Şeyx Heydərin Dağıstan yürüşlərinin tarixini nəzərə alsaq, onun 1483-88-ci illər arasında doğulduğu ehtimal edilir. Şeyx Heydərin ölümündən sonra Süleyman Mirzə də qardaşları ilə birlikdə Ağqoyunlu Sultan Yaqubun əmri ilə Şirazdakı İstəxr qalasında həbsdə olmuş, sonra Rəştdə və Lahicanda gizlənmişdi. Onun uşaqlıq illəri I Şah İsmayılla birlikdə keçmişdir. Sonralar o, qardaşı İbrahim Mirzə ilə birlikdə Ərdəbilə qayıtdı.

I Şah İsmayılın hakimiyyətə gəlişi ərəfəsində və bundan sonrakı ilk dövrlərdə Süleyman Mirzənin həyat və fəaliyyəti haqqında məlumat azdır. Mənbələrə əsasən, I Şah İsmayıl 1507-ci ildə *Zülqədəroğulları bəyliyi* üzərinə yürüşdən əvvəl onu paytaxt Təbrizin hakimi təyin etmişdi. 1508-ci ildə yürüşdən qayıdan şah Təbrizdə onun əmrlərinə qardaşı tərəfindən riayət edilmədiyini öyrənərək qəzəblənmişdi. Bundan sonra Süleyman Mirzə ata-baba yurdu olan Ərdəbilə göndərilmiş və Şeyx Səfi xanəgahında məskunlaşmışdı. Ərdəbili tərk etməsinə qadağan qoyulmuş şahzadənin *lələsi* Əhməd sultan Şamlu onun əvəzinə Təbrizi idarə edirdi. Ərdəbil xanəgahı Səfəvilər dövlətinin mənəvi paytaxtı sayılsa da, bura həm də yüksəkrütbəlu məmurların sürgün yeri hesab edilirdi. I Şah İsmayılın qəzəbinə düçar olmuş *Abdal bəy Dədə Zülqədər*, I Şah Təhmasibin üsyankar qardaşı *Sam Mirzə* və b. cəza olaraq Ərdəbil xanəgahının mütəvəllisi (müdiri) vəzifəsinə təyinat almışdılar. Süleyman Mirzə də 1513-cü ilədək Ərdəbildə qalmışdır. Bu müddətdə onun mülkləri yenə öz ixtiyarında olmuş, həmin mülklərdən gələn gəlir ona çatmışdır.

1512-ci ildə Qicduvan savaşında *vəkil Nəcmi-saninin* qətli ilə nəticələnmiş məğlubiyyətə cavab olaraq I Şah İsmayıl növbəti ildə Xorasan istiqamətində yürüşə çıxdı və özbək-qazax qüvvələri üzərində uğur qazandı. Xorasan səfərindən geri qayıdan şah yolda ikən qardaşı Süleyman Mirzənin üsyan qaldırması barədə məlumat əldə etdi. Süleyman Mirzənin üsyan üçün bu zamanı seçməsinin iki başlıca səbəbi vardı. Birinci səbəb şahın paytaxtdan çox uzaqda olması və üsyana müqavimət göstərə biləcək Səfəvi qoşununun əsas zərbə gücünün də onu müşayiət etməsi idi. İkinci səbəb Xorasandan gələn yanlış xəbər-

lərlə əlaqəlidir. Belə ki, özbəklər üzərində qələbəsini qeyd etmək üçün ova çıxmış şah atdan yıxılmış və üç gün huşsuz halda qalmışdı. Süleyman Mirzənin casusları şahın öldüyünü güman edərək xəbəri dərhal Ərdəbilə çatdırmışdılar. Beləliklə, Süleyman Mirzə qardaşının ölü və ya ölümcül yaralı olduğuna inanaraq hakimiyyəti əlinə keçirmək üçün hərəkətə keçdi. Hakimiyyətdən incik olan bəzi qızılbaş əmirləri və ehtimala görə, Ərdəbildə güclü dini-siyasi nüfuza malik olan *Şeyxavənd* soyunun bəzi nümayəndələri ona dəstək verdilər. Şahzadəni qardaşına qarşı təhrik edən əsas şəxslərdən biri *Türkman* tayfa ittifaqına mənsub olan qızılbaş əmiri Qızıl Məhəmməd bəy idi. Süleyman Mirzə Şeyx Səfiəddin Ərdəbili xanəgahının xəzinəsində olan bütün qiymətli əşyaları və qızılları toplayaraq əritmiş, öz adına sikkə vurdurmuşdu. Üç günlük hazırlıqdan sonra 1513-cü ilin sonlarında şahzadə 18 min tərəfdarı ilə birlikdə Ərdəbildən çıxıb paytaxt Təbriz üzərinə yürüdü.

Şahzadənin lələsi Əhməd sultan Şamlu tərəfindən idarə edilən Təbriz müqavimətə hazırlaşdı. Əhməd sultan özü şəhər kənarında Süleyman Mirzə ilə görüşərək onu şaha qarşı çıxmamağa və üsyan fikrindən əl çəkməyə çağırdı, amma şahzadə tərəfindən öldürüldü. *Halvaçıoğlu* Hüseyn bəyin başçılığı altında və *əxi* dərnəyi üzvlərinin fəal iştirakı ilə təbrizlilər şəhəri qorumağa qalxdılar. Qış mövsümündə küçələrin buz bağlaması hücumçuların işini çətinləşdirdi. Təbriz əhalisi evlərin damından və barrikadalardan onların üzərinə daş, ox və güllə yağdırırdı. Geri çəkilən Süleyman Mirzə Təbriz ətrafında pusquya düşdü. Döyüşdə onun tərəfdarlarının əksəriyyəti qılıncdan keçirildi, özü isə *qorçubaşı Saru Pirə bəy Ustaclunun* kiçik qardaşı *Məntəşa sultan* tərəfindən öldürüldü. I Şah İsmayıl qardaşının ölümündən kədərlənmiş, hətta onu əsir tutub gətirmədiyi üçün Məntəşa sultanı həbsə atdırmışdı.

***Mənbələr:*** *Namiq Musalı. Səfəvi səltənətində ilk taxt davası: Süleyman Mirzə üsyanı (XVIII. Türk Tarih Kongresi, 1-5 Ekim 2018, Kongreye Sunulan Bildiriler, VI. Cilt), s.685-708; Aləmarayi-Səfəvi (nəşrə hazırlayan: Y.Şükri), s.426-428; Namiq Musalı. I Şah İsmayılın hakimiyyəti ("Tarix-i aləmarayi Şah İsmayıl" əsəri əsasında), s.315-316; M.K.Yusifcəmali. I Şah İsmayılın həyatı, s.193-195; Cahangüşayi-xaqani (nəşrə hazırlayan: Allah Dəta Müztər), s.469-471.*



**SÜLEYMAN MİRZƏ** (1555-1576) – Səfəvi şahzadəsi, *I Şah Təhmasibin* dördüncü oğlu. Anası Dağıstanın yerli feodal sülaləsindən (Şamxal nəslindən) çərkəz əsilli *Sultanağa xanımdır*. I Şah Təhmasib Səfəvilər dövlətinin şimal sərhədlərindən arxayın olmaq üçün 1547-ci ildə çərkəz *Şamxal sultanın* bacısı ilə evlənmiş, bu izdivacdan *Pərixan xanım* və Süleyman Mirzə doğulmuşdular. Süleyman Mirzənin 21 il yaşadığını nəzərə alsaq, təqribən 1555-ci ildə doğulduğu aydın olur.

Süleyman Mirzə atası tərəfindən Şahvə-



li sultan Tatıoğlu Zülqədərin *lələliyi* şərti ilə Məşhəd hakimi təyin edilmiş, İmam Rza (ə) hərəminin fəxri mütəvəllisi vəzifəsi də ona həvalə olunmuşdu. 1570/71-ci illərdə şahzadənin lələsi vəzifədən azad edilmiş, özü də paytaxta çağırılmışdı. O zamandan Süleyman Mirzə sarayda atasının nəzarəti və himayəsi altında tərbiyə alırdı. I Şah Təhmasibin vəfatı ərəfəsində sarayda yaranmış intriqalar gedişində Süleyman Mirzə ana tərəfdən qohumlarının mövqeyinə qoşularaq İsmayıl Mirzənin (gələcək *II Şah İsmayıl*) hakimiyyətini dəstəkləyirdi. Qardaşı *Heydər Mirzə* onun dəstəyini qazanmağa çox ümid edirdi, bacısı Pərixan xanımdan da xahiş etmişdi ki, şahzadənin ona qoşulmasına köməklik göstərsin. Lakin Süleyman Mirzə nəinki ona köməklik etməmiş, öz nökərlərini Heydər Mirzəni tapıb öldürmək üçün göndərmiş, onun qətlindən sonra tərəfdarlarını amansızlıqla edam etdirmişdi.

II Şah İsmayıl hakimiyyətə keçdikdən sonra bəzi qızılbaş əmirlərinin guya Süleyman Mirzəni hakimiyyətə gətirmək istəmələri barədə şayiələr yayıldı. Yaxın qohumlarını bir-bir aradan götürən şah Süleyman Mirzəni öldürməyi onun doğma dayısı Şamxal sultana tapşırdı. Şamxal sultan şahın etimadını qazanmaq naminə bu tapşırığı dərhal yerinə yetirdi, əvəzində şah onun (Şamxal sultanın) qızı ilə evləndi. Süleyman Mirzəni həmin gün öldürülmüş qardaşı *Mustafa Mirzə* ilə birlikdə Qəzvindəki İmamzadə Hüseyn ziyarətgahında dəfn etdilər.

***Mənbələr:*** *İsgəndər bəy Münşi. Tarix-i aləm-ara-yi Abbasi (tərcümə və şərhlər: O.Əfəndiyev, N.Musalı), s.297-298 və 420-421; Həsən bəy Rumlu. Əhsən ət-təvarix (nəşrə hazırlayan: Ə.Nəvai), s.636-638, 712.*



**SÜLEYMAN MİRZƏ** (vəf. 1632) – Səfəvi şahzadəsi, *I Şah Abbasın nəvəsi*. Şahzadə *Məhəmməd Baqir Mirzə* ilə *II Şah İsmayılın* qızı Fəxricahan bəyimin izdivacından doğulmuşdur. I Şah Abbas onun atası Məhəmməd Baqir Mirzənin qətlinə əmr verdikdən sonra peşman olmuş və günahını yumşaltmaq üçün onun oğlu Süleyman Mirzəni öz canişini elan etmək qərarına gəlmişdi. Şahın ətrafında olan hər kəs ondan sonra Süleyman Mirzənin taxta çıxacağını gözləyirdi. Lakin Süleyman Mirzə atasının qatili olan babasına nifrət edir və ondan intiqam almağı səbirsizliklə gözləyirdi. Buna görə I Şah Abbas Qəndəharı fəth etmək üçün Xorasan istiqamətində yürüşə çıxmazdan əvvəl Süleyman Mirzənin gözlərinə mil çəkdirmək barədə əmr verdi. Bundan sonra I Şah Abbas öz oğlu *İmamqulu Mirzəni* vəliəhd elan etdi, amma az sonra qəzəblənib onun da gözlərini çıxartdırdı. Ən sonda I Şah Abbasdan sonra Məhəmməd Baqir Mirzənin digər oğlu Sam Mirzə (gələcək *I Şah Səfi*) taxta çıxdı.

Süleyman Mirzə I Şah Abbasın ömrünün sonunadək kor halda yaşamış, 1632-ci ildə I Şah Səfinin (öz qardaşının) əmri ilə digər Səfəvi şahzadələri ilə birlikdə öldürülmüşdür.

***Mənbələr:*** *Nəsrullah Fəlsəfi. I Şah Abbasın*

*həyatı, II, 194-195; Viaggi di Pietro della Valle, il pellegrino: descritti da lui medesimo in lettere familiari all'erudito suo amico Mario Schipano, divisi in tre parti cioè: La Truchia, La Persia, e l'India, colla vita dell'autore, Lettera XVI, 300.*

**ŞAH ŞÜCA** (1577-78) – Səfəvi şahzadəsi, *II Şah İsmayılın* oğlu. Anası Pəripeykər xanım *I Şah İsmayılın* qızı *Xanış bəyimlə* Şah Nemətullah Yəzdinin izdivacından doğulmuşdu. Şah Şüca II Şah İsmayılın bir illik hakimiyyət müddətinin sonlarında Qəzvində doğulmuşdur. Onun adını Hafiz Şirazinin müasiri olan Müzəffəri hökmdarı Şah Şücaəddin Məhəmmədin şərəfinə qoymuşdular. Zülqədər tayfasından Vəli sultan Qalxançıoğlu onun *lələsi* (tərbiyəçisi) təyin edilmişdi. Vəli sultan Şiraz hakimi idi və şahzadə də həmin şəhərdə onun yanında qalırdı. II Şah İsmayılın ölümündən sonra əksəriyyət Məhəmməd Mirzənin (gələcək *Şah Məhəmməd Xudabəndə*) hakimiyyətə gəlməsini müdafiə etdiyi halda Vəli sultan Qalxançıoğlu körpə Şah Şücanı taxta çıxarmağı təklif etdi. Onun fikrincə, şahın oğlu var ikən qardaşının hökmdar olmasına ehtiyac yoxdur. Vəli sultan hətta sarayda böyük nüfuzu olan *Pərixan xanımı* öz tərəfinə çəkmək üçün təklif etdi ki, Şah Şüca taxta çıxsa, bir neçə il Pərixan xanım onun naibəsi (himayədarı və canişini) olaraq dövləti idarə etsin və şahzadə yetkinlik yaşına çatdıqdan sonra hakimiyyəti ona təhvil versin. Lakin bu təklif ciddiyyətlə qarşılanmadı, Şah Məhəmməd Xudabəndə hakimiyyətə gətirildi. Yeni şahın xanımı *Məhdi-ülya* Şah Şücanı öz ərinin hakimiyyəti üçün təhlükə hesab edirdi. Buna görə Şah Məhəmməd Xudabəndənin taxta çıxmasının ertəsi günü Məhdi-ülya onu Şah Şücanı öldürməyə razı saldı; bununla da körpə şahzadənin həyatına son qoyuldu.

***Mənbələr:*** *H.C.Kəlkinari. Məhdi-ülya ləqəbli Xeyrənnisa bəyim ("Miskəveyh" Rey Azad Universitetinin nəşri, 1387 h.-ş., № 9), s.87-88; İsgəndər bəy Münşi. Tarix-i aləmara-yi Abbasi (tərcümə və şərhlər: O.Əfəndiyev, N.Musalı), s.446; Şeyx Səfidən Şah Səfiyə kimi ("Tarixi-sultani"dən, nəşrə hazırlayan: E.İşraqi), s.103; Sugra Caferova. Azerbaycan Tarihinde Kadın (Sakarya Üniversitesi Sosyal Bilimler Enstitüsü, Yüksek Lisans Tezi), s.24-30.*

**ŞAHZADƏ BƏYİM** – Səfəvi şahzadəsi, *I Şah Abbasın* qızı. Bəzi mənbələrdə adı Xeyrənnisa bəyim kimi qeyd edilmişdir. Həyatı haqqında məlumat azdır. 1617-22-ci illər arasında Məşhəd şəhərindəki İmam Rza (ə) hərəminin mütəvəllisi (müdiri) vəzifəsində xidmət etmiş möhtərəm seyidlərdən olan Mirzə Möhsün Rezəvi (vəf. 1645/46) ilə ailə qurmuş və ondan iki oğlu olmuşdur. Oğullarından biri Əbülqasim Mirzə Səfəvilər nəslindən olan, həm yüksək dövlət vəzifəsi tutmuş, həm də din alimi kimi tanınmış *Sultan əl-üləma* və Xəlifə sultan ləqəbli Seyid Hüseyn Mərəşi Amulinin (vəf. 1654) qızı ilə evlənmişdir. 1632-ci ildə *I Şah Səfinin* əmri ilə hakimiyyətə iddia ehtimalının qarşısını almaq üçün Əbülqasim Mirzənin gözlərini kor etdilər. Əbülqasim Mirzə istedadlı şair idi,

*“Təzkireyi-Nəsrabadi”nin* müəllifi onun öz korluğu barədə divarda cızdığı rübaini kitabında qeyd etmişdir. Əbülqasim Mirzə bu faciədən sonra gənc yaşlarında ölmüşdür. Şahzadə bəyimin digər oğlu Zeynülabidin Mirzə atası ilə birlikdə Məşhəddə yaşayırdı, şahın əmri ilə Məşhəd hakimi Mənuçöhr xan onun da gözlərini çıxartdı. Şahzadə bəyim bu müsibətləri görmədən, I Şah Abbasın zamanında dünyasını dəyişmişdir.

***Mənbələr:*** *Nəsrullah Fəlsəfi. I Şah Abbasın həyatı, II, 198; Şeyx Səfidən Şah Səfiyə kimi (“Tarixi-sultani”dən, nəşrə hazırlayan: E.İşraqi), s.244; Əbülfəzl Həsənabadi. Səfəvilər dövründə Məşhəddə Rezəvi seyidlərinin mövqeyinə bir baxış (Astani-qüdsi-Rezəvinin “Miras” dərgisi, 1388 h.-ş., № 3), s.1-14; Mehdi Seyidi. Məşhədin Rezəvi seyidlərinin övlad vəqflərinə bir baxış (“Vəqfi-mirasi-cavidan” dərgisi, 1380 h.-ş., № 35-36), s.85-98; Təzkireyi-Nəsrabadi, s.11-12.*

**ŞEYX CƏFƏR** – Səfəvi sülaləsinin nümayəndəsi, *Xacə Əli Siyahpuşun* böyük oğlu, *Şeyx Cüneydin* əmisi. 1447-ci ildə qardaşı *Şeyxşah İbrahim* (Şeyx Cüneydin atası) vəfat etdikdən sonra səfəviyyə təriqətinin başına keçmiş, Ərdəbildə məskunlaşaraq dərvişlərə rəhbərlik etmişdir. Daha təcrübəli olduğu və Qaraqoyunlular tərəfindən dəstəkləndiyi üçün təriqətə rəhbərlik uğrunda rəqabətdə Şeyx Cüneydi üstələmiş və onun Ərdəbili tərk etməsinə səbəb olmuşdu (1449). Şeyx Cəfər siyasi ambisiyalarla çıxış etmədiyi, təriqət rəhbərliyi ilə kifayətləndiyi üçün Qaraqoyunlu Cahan şah tərəfindən himayə olunurdu. Hətta Cahan şah qızlarından birini onun oğlu Şeyx Qasimə ərə vermişdi. Şeyx Cüneyd bir müddət *Uzun Həsənin* başçılıq etdiyi Ağqoyunlu dövlətində yaşadıqdan və onun bacısı ilə evləndikdən sonra yenidən Ərdəbilə gəlmiş, amma bu dəfə də 11 il əvvəl olduğu kimi, Şeyx Cəfərin ciddi müqaviməti ilə rastlaşıb ata-baba mülkünü tərk etməli və Dağıstan yürüşünə yollanmalı olmuşdu (1459). Şeyx Cəfər 1470-ci ilədək Ərdəbildə səfəviyyə təriqətinin *mürşidi* kimi fəaliyyət göstərmişdir. Tədqiqatçı alim O.Əfəndiyev “Azərbaycan Səfəvilər dövləti” kitabında yazır: “Cüneyd Ərdəbildən getdikdən sonra şəhərdə hakimiyyəti əslində onun əmisi Şeyx Cəfər ələ keçirdi. Bəzi məlumatlara görə, o, cavan qardaşı oğlunun qəyyumu olmuş, digər məlumatlara görə isə, təriqətin mənəvi rəhbəri (mürşidi) rütbəsinə sahib olmaq iddiasına düşmüşdü. J.Obenin ehtimalına görə, Cüneydlə Cəfər arasında ixtilaf ona görə baş vermişdi ki, onlardan birincisi aşkar şiə idisə, sonuncu sünniliyə tərəfdar çıxırdı... 1470-ci ilin əvvəlində Uzun Həsən Ərdəbilə gəlmiş və Şeyx Heydəri təntənəli surətdə təriqətin irsi başçısı vəzifəsinə təyin etmiş, Şeyx Cəfəri onun qəyyumu kimi saxlamışdı. Beləliklə, Şeyx Cəfər 1449-cu ildən 1470-ci ilədək Ərdəbilin faktiki hakimi olmuşdu”.

Uzun Həsən 1469-cu ildə Mahmudabad yaxınlığında baş vermiş həlledici döyüşdə Qaraqoyunlu Cahan şahın oğlu Həsənəliyə və Teymuri hökmdarı Əbu

Səidə qalib gəldi, bunun ardınca Şeyx Cüneydin oğlu *Şeyx Heydər* səfəviyyə təriqətinin başına gətirildi. Şeyx Cəfər öz hakim mövqeyini itirsə də, qardaşı nəvəsinin təlim-tərbiyəsi ilə məşğul olmağa təhkim edildi. Şeyx Heydər ondan bəzi elmləri, o cümlədən nücum elmini öyrəndi.

*Şeyx Zahid Gilaninin* nəslindən olan Şeyx Hüseyn Pirzadə Zahidi *"Silsilət ən-nəsəbi-Səfəviyyə"* kitabında Şeyx Cəfər haqqında yazır: "Zahiri elmlərdə kamil dərəcəyə çatmışdı, səfəviyyə *silsiləsinin* şeyxlərindən heç biri onun qədər fəzilət və bilik sahibi deyildi". Bununla belə, klassik Səfəvi mənbələrində Şeyx Cüneyd və Şeyx Heydərə qarşı düşmən münasibətinə görə Şeyx Cəfər adətən tənqid edilir və mənfi şəkildə xatırlanır.

Şeyx Cəfərin Hacı Kəlb xan, Qasim xan, Baqir xan, İbrahim xan, Süleyman xan, Murad xan və Bayram xan adlı oğulları vardı, onlara Şeyx Cəfəri nəsli deyirdilər.

Şeyx Cəfərin ölüm tarixi dəqiq məlum deyildir, 1470-ci ildən sonra vəfat etmişdir.

I Şah İsmayılın atası Şeyx Heydər Şeyx Cəfərin oğlu Şeyx Qasimin qızı ilə (atasının əmisi nəvəsi) evlənmiş, bu izdivacdan *Həsən Mirzə* doğulmuşdur (vəf. 1525).

***Mənbələr:*** *Walther Hinz. Uzun Hasan ve Şeyh Cüneyd (türkcə tərcümə: Tevfik Bıyıklıoğlu), s.15-16 və 62; O.Əfəndiyev. Azərbaycan Səfəvilər dövləti, s.297-298; Türkiye Diyanet Vakfı İslam Ansiklopedisi, VIII, 123; Şeyx Hüseyn Pirzadə Zahidi. Silsilət ən-nəsəbi-Səfəviyyə, s.49-50; Həsən bəy Rumlu. Əhsən ət-təvarix (tərcümə və şərhlər: O.Əfəndiyev və N.Musalı), h. 889-cu ilin hadisələri.*



**ŞƏHRƏBANU BƏYİM** (vəf. 1583) – Səfəvi şahzadəsi, *I Şah Təhmasibin* qızı. Anası Dağıstan hakiminin qızı idi. Şəhrəbanu bəyim *Xədicə sultan bəyimlə* doğma bacı idi. *Şah Məhəmməd Xudabəndənin* zamanında onu *Ustaclu* tayfasından *Salman xana* ərə verdilər. Salman xan I Şah İsmayılın bacısının əri *Qara xan Ustaclunun* nəticəsi, I Şah Təhmasibin bacısının əri *Abdullah xan Ustaclunun* nəvəsi idi. Onların toyu 1580-cı ildə Ustaclu tayfasının ağsaqqalı *Pirə Məhəmməd xanın* təşkilatçılığı ilə keçirildi. Toydan sonra Salman xan Şirvan *bəylərbəyi* təyin edildi və böyük qoşunun başında osmanlılarla döyüşə yollandı, amma məğlub olaraq vəzifəsindən uzaqlaşdırıldı. Bir müddətdən sonra o, Məşhəd hakimliyinə təyinat aldı, amma *Mürşidqulu xan Ustaclunun* təzyiqləri qarşısında davam gətirməyib geri qayıtdı. Qəzvinə çatdığı zaman Salman xan xəstə olan həyat yoldaşı Şəhrəbanu bəyimin vəfatı xəbərini aldı (1583).

***Mənbələr:*** *İsgəndər bəy Münşi. Tarix-i aləm-ara-yi Abbasi (tərcümə və şərhlər: O.Əfəndiyev, N.Musalı), s.301 və 578; Həsən bəy Rumlu. Əhsən ət-təvarix (nəşrə hazırlayan: Ə.Nəvai), s.638.*



**ŞƏHRƏBANU BƏYİM** – Səfəvi şahzadəsi, *I Şah Abbasın* qızı. Həyatı haqqında məlumat azdır. 1614-cü ildə anası



tərəfdən qohumu olan Mir Hüseyn xan Mazandaraninin oğlu Mir Əbdüləzimlə ailə qurmuşdur. Əri Mir Əbdüləzim İsfahan şəhərinin darğası vəzifəsində xidmət edirdi. 1620-ci ildə onunla şəhər kələntəri arasında mübahisə yarandı. Kələntər Mir Əbdüləzimi və tabeliyində olanları camaatdan artıq vergi almaqda təqsirləndirdi. Mir Əbdüləzim kələntəri döydürüb həbsə atdırdı. Hadisədən xəbər tutan baş vəzir *Əbu Talib xan Ordubadi* vəziyyət barədə şaha məruzə etdi və *divanbəyinin* sədrliyi ilə komissiya təşkil olunub məsələ araşdırıldı. Şikayətin düzgün olduğu aşkara çıxdıqda şah öz kürəkənini vəzifədən azad etdi, hətta onu ağır şəkildə cəzalandırmaq da istədi, lakin saray əyanları onu dilə tutub bu fikirdən daşındırdılar. Şəhrəbanu bəyimin bu izdivacdan övladı olub-olmadığı, eləcə də nə zaman dünyasını dəyişdiyi məlum deyildir, amma 1662/63-cü illərdə həyatda idi.

***Mənbələr:*** *Nəsrullah Fəlsəfi. I Şah Abbasın həyatı, II, 201-202.*



**ŞƏHRƏBANU BƏYİM** (vəf. 1742) – Səfəvi şahzadəsi, *Şah Süleymanın qızı*, *Şah Sultan Hüseynin* bacısı, *II Şah Süleymanın* anası. O, Mərəşi seyidlərindən olan Mirzə Məhəmməd Davudla ailə qurmuş və bu izdivacdan gələcəkdə özünü Səfəvilər taxtının varisi elan etmiş *Əhməd şahın* (vəf. 1728) atası Əbülqasim Mirzə və II Şah Süleyman adı altında eyni iddia ilə çıxış etmiş Seyid Məhəmməd Mirzə (1714-63) doğulmuşlar. Mirzə Məhəmməd Davud Mərəşi də ana tərəfdən I Şah Abbasın nəslindən idi. I Şah Abbasın qızı *Zibeydə bəyim* Səfəvi sülaləsindən *İsa xan Qorçubaşı* ilə ailə qurmuş, onların qızı Cahanbanu bəyim Kartli çarı II Simona (Səfəvi mənbələrində Simayun xan adı ilə verilir, İslamı qəbul etmişdi) ərə getmişdir. Onların qızı İzzşərəf bəyim Mərəşilər nəslindən Mirzə Abdullahla evlənmiş və Mirzə Məhəmməd Davud Mərəşi doğulmuşdur. Mirzə Məhəmməd Davud Mərəşi 1721-ci ildə vəfat etdi. İsfahanın əfqanlar tərəfindən mühasirəsi zamanı şəhərdən qaçıb canını qurtaran Seyid Məhəmməd Mirzə şəhər azad edildikdən sonra geri qayıtdı. Sonralar Nadir xan (gələcək *Nadir şah Əfşar*) Seyid Məhəmməd Mirzəni İsfahana, Səfəvi taxtının varisi *II Şah Təhmasiblə* oğlu şahzadə Abbası Xorasana göndərdi. Şəhrəbanu bəyim qardaşı oğlu ilə öz oğlu arasında seçim qarşısında qalaraq qardaşı oğlu II Şah Təhmasibə qoşuldu və Xorasana yola düşdü, onun qətlindən sonra yenidən oğlunun yanına qayıtdı. Nadir şah Hindistan yürüşündən qayıtdıqdan sonra Seyid Məhəmməd Mirzəni nəzarət altında saxlamaq üçün Xorasana çağırdı, ona bütün ölkənin *sədrliyini* və Məşhəd hərəminin müdirliyini verəcəyini vəd etdi. Ağıllı qadın olan Şəhrəbanu bəyim anladı ki, Nadir şah onun oğlunu aradan götürmək istəyir; o, şaha xəbər göndərib bu fikirdən daşınmasını xahiş etdi. Nadir şahın icazəsi ilə Şəhrəbanu bəyim və oğlu İsfahanda qaldılar.

Şəhrəbanu bəyim 1742-ci ildə dünyasını dəyişmiş və Məşhəd şəhərində torpağa tapşırılmışdır. Onun vəfatından son-

ra oğlu Seyid Məhəmməd Mirzə Nadir şahın əmri ilə İmam Rza (ə) hərəminin mütəvəllisi (müdiri) təyin edilmişdir.

***Mənbələr:*** *Mirzə Məhəmməd Xəlil Mərəşi Səfəvi. Məcmə ət-təvarix (nəşrə hazırlayan: A. İqbal), s.63, 90-92; Sultan Haşim Mirzə. Zəburi-Ali-Davud (nəşrə hazırlayan: Ə.Nəvai).*

**TACLU BƏYİM** (vəf. 1540) – Səfəvi şahbanusu, *I Şah İsmayılın* həyat yoldaşı. Əsl adı Şahbikə bəyimdir və o, Bektaş bəy Mosullunun oğlu Həmzə bəyin oğlu Mihmad bəyin qızı idi. Bu nəslin böyükləri vaxtilə Ağqoyunluların xidmətində olmuşlar. Şahbikə bəyimə Taclu adını I Şah İsmayıl vermiş və bundan sonra bu adla tanınmışdır. *"Aləmarayi-Səfəvi"* əsərində verilmiş məlumata görə isə, Taclu bəyim I Şah İsmayılın ilk və sadiq tərəfdarlarından olan *təvaçıbaşı Əbdi (Abidin) bəy Şamlunun* qızı, *Durmuş xanın* bacısıdır. Lakin bu məlumatın düzgünlüyü şübhə altındadır. Çünki Əbdi bəy *Şeyx Heydərin* qızı ilə evlənmiş, Durmuş xan və *Hüseyn xan* bu izdivacdan dünyaya gəlmişlər. Əgər Taclu bəyim Əbdi bəy Şamlunun qızıdırsa, deməli, I Şah İsmayılın bacısı qızı sayılır. Buna görə də onunla I Şah İsmayıl arasında nikah bağlanması mümkün deyildir. Bu faktı nəzərə alaraq, guya Taclu bəyimin öz qardaşı Durmuş xanla güləşərək onu yıxması, bunu eşidən şahın onunla evlənmək istəməsi, Taclu bəyimin yalnız təkbətək savaşda onu yıxan bir şəxsə ərə gedəcəyini bildirməsi, daha sonra şərtini dəyişərək gələcəkdə döyüşlərdə iştirak etmək icazəsi müqabilində evliliyə razı olması barədə "Aləmarayi-Səfəvi"də verilmiş rəvayətlər də öz qüvvəsini itirmiş sayılır.

Alman şərqşünası Walther Hinz isə "Uzun Həsən və Şeyx Cüneyd" əsərində Taclu bəyimin ailəsi barədə fərqli fikir irəli sürmüşdür. Bu məlumata görə, Taclu bəyim Ağqoyunlu hökmdarı *Uzun Həsənin* oğlu Sultan Yaqubun qızı (yəni I Şah İsmayılın dayısı qızı) idi. Walther Hinz bunu yazarkən əsasən venesiyalı səyyah Angiolellonun xatirələrinə əsaslanır; lakin bu informasiyanın doğruluğu şübhə altındadır.

Budaq Qəzvini *"Cəvahir əl-əxbar"* əsərində I Şah İsmayılın Taclu bəyimlə hicri 909-cu (miladi 1504-cü) ildə *Əmir Hüseyn Kiya Çəlaviyə* qarşı yürüşdən sonra ailə qurduğunu yazmışdır. Çəlavinin son sığınacağı olan Usta qalası süqut etdikdən sonra Taclu bəyim bacısı ilə birlikdə I Şah İsmayılın hüzuruna gətirilmişdir. O, türkman əsilzadəsi Murad bəy Cahanşahi ilə birlikdə Çəlavinin himayəsinə sığınmışdı. Budaq Qəzvini onu Mosullu bəyim kimi təqdim edərək, bundan sonra şah tərəfindən Taclu bəyim adlandırıldığını xəbər verir. O yazır ki, Taclu bəyim I Şah İsmayılla ailə qurduqdan sonra sarayda böyük nüfuz sahibi olmuşdur, əyanlar vəzifəyə təyin edilərkən və vəzifədən götürülərkən onun rəyi nəzərə alınırdı. Müəllif daha sonra qeyd edir ki, 1507-ci ildə I Şah İsmayıl *Zülqədəroğulları bəyliyi* üzərinə yürüş etdiyi zaman Taclu bəyimin həmtayfası və qohumu, Diyarbəkir valisi *Əmir xan Mosullu* şahın hüzuruna



gəlmiş, ona "ləli-böbrək və ləli-dəvəgözü" adlı çox bahalı cəvahirat hədiyyə etmişdi. Bu qiymətli daşların ovuc ölçüsündə olduğunu yazırlar, I Şah İsmayılın əmri ilə onları kiçik parçalara bölmüş və bir neçə zinət əşyasının hazırlanmasında istifadə etmişdilər. Şah bu zinət əşyalarından bəzilərini, o cümlədən bir cüt sırğanı Taclu bəyimə bağışlamışdı (bunların adı *Çaldıran savaşından* sonra Taclu bəyimin əsirliyi ilə bağlı rəvayətlərdə hallanır).

Xurşah ibn Qubad Hüseyni *"Tarixi-elçiyi-Nizamşah"* əsərində Taclu bəyimlə I Şah İsmayılın izdivacına müstəqil fəsil ayırmışdır. O yazır ki, əyanlardan hər kimin çətinliyi olurdusa və ya şahın qəzəbinə tuş gəlirdisə, Taclu bəyimə müraciət edir və məsələ həllini tapırdı.

1522-ci ildə *Əmir xan Mosullunun* adı bir qalmaqallı hadisədə hallanmış, I Şah İsmayıl hadisədən xəbər tutduqda onun edam edilməsinə fərman vermişdi. Lakin Taclu bəyimin işə müdaxiləsi və xahişi nəticəsində edam cəzası həbslə əvəzləndi, bununla belə, Əmir xan az sonra həbsdə öldü. Taclu bəyimin öz həmtayfasını edamdan xilas etməsi onun hələ I Şah İsmayıl zamanında kifayət qədər nüfuza malik olduğunu göstərir. I Şah Təhmasibin hakimiyyətinin əvvəllərində (1526) qızılbaş əmirləri arasında hakimiyyət davası qızışdığı zaman *Çuxa sultan Təkəlü* də Taclu bəyimin nüfuzundan yararlanmaq üçün ona müraciət etmiş, amma uğur qazanmamışdı.

Taclu bəyimlə bağlı tarixi mənbələrdə yazılanlar bəzən I Şah İsmayılın digər həyat yoldaşı *Bəhruzə xanıma* aid edilir. Hər iki xanımın Çaldıran döyüşündə iştirakı, sonrakı taleyi, övladları barədə məlumatlar mənbələrdə qarışıq şəkildə təqdim olunmuşdur.

Taclu bəyimin I Şah İsmayılla izdivacdan doğulmuş övladları barədə məlumatlar da fərqlidir. Bəzi müəlliflər I Şah Təhmasibi onun oğlu hesab edir, bəzi müəlliflər isə şahın digər xanımından doğulduğunu yazırlar. Səfəvilər tarixi barədə ən mötəbər mənbələrdən olan İsgəndər bəy Münşinin *"Tarixi-aləmarayi-Abbasi"* əsərində yazılıb: "Təhmasib Mirzə və *Bəhram Mirzə* türkman *Mosullu* əmirlərindən birinin möhtərəm qızından doğulmuşlar. *Əlqas Mirzə* və *Sam Mirzə* isə müxtəlif xanımlardandırlar". *"Aləmarayi-Səfəvi"* kitabında da Taclu bəyimin ilk oğlunu – Təhmasib Mirzəni (gələcək I Şah Təhmasib) dünyaya gətirməsi ətraflı şəkildə təsvir edilmişdir. Həmin kitaba görə, Təhmasib Mirzə 1514-cü ilin fevralında Həmədanda, yaxud İsfahanda doğulmuşdur.

Lakin digər Səfəvi salnaməçisi Budaq bəy Münşi *"Cəvahir əl-əxbar"* kitabında Taclu bəyimin ömrünün sonlarında gözdən düşməsinin səbəbini bununla izah edir ki, guya o, şahın anasını zəhərləmək istəmişdir. Buradan aydın olur ki, müəllif Taclu bəyimi I Şah Təhmasibin anası hesab etmir. Bəzi tədqiqatçılarda Taclu bəyimin I Şah Təhmasibin doğma anası olmadığı, həyat yoldaşının vəsiyyətinə sadiq qalaraq öz doğma övladını deyil, məhz Təhmasib Mirzəni taxta çıxardığı barədə fikir for-

malaşmışdır. Hər bir halda I Şah İsmayılın vəfatından sonra qızılbaş əmirlərinin qızğın mübarizəsi fonunda I Şah Təhmasibin taxta çıxmasında və öz mövqeyini möhkəmləndirməsində Taclu bəyimin də rolunun olması şübhəsizdir.

Taclu bəyimin həyatının ən mühüm və mübahisəli məqamlarından biri onun Çaldıran savaşında iştirakı və savaşdan sonrakı taleyi ilə bağlıdır. Səfəvi mənbələrində Taclu bəyimin Çaldıran savaşına qatılması barədə ya ümumiyyətlə məlumat verilmir, ya da bu məlumatlar səthi xarakter daşıyır. Bunun əksinə olaraq, bir çox osmanlı müəllifi onun Çaldıran savaşında iştirak etdiyini və döyüş zamanı əsir alındığını israrla iddia edir. Taclu bəyimin döyüşdən sonrakı taleyi barədə də osmanlı mənbələrinin verdiyi məlumatlar daha əhatəlidir. Bu məlumatları ümumiləşdirərkən belə bir nəticə alınır ki, Çaldıran savaşında Səfəvi qoşunundan xeyli qadın, o cümlədən I Şah İsmayılın xanımlarından biri əsir alınmışdır. (Bəzi araşdırmaçılar şahın Taclu bəyim və Bəhruzə bəyim adlı iki xanımının əsir düşdüyünü qeyd edirlər). Bu qadının adını bəzi müəlliflər Taclu bəyim kimi qeyd etmiş, bəziləri isə Bəhruzə bəyim kimi yazmış və ya ümumiyyətlə adını göstərməmişlər. I Sultan Səlim Taclu bəyimi özünün etibar etdiyi qazıəsgər Tacızadə Cəfər Çələbiyə tapşırmış, onu toxunulmaz halda qorumağı əmr etmişdir. Lakin bir müddətdən sonra Taclu bəyimin hamilə olduğunu öyrənincə Tacızadəni əmanətə xəyanət ittihamı ilə edam etdirmişdir. Lakin Tacızadə Cəfər Çələbinin əslində yeniçəri qiyamında əli olduğuna görə öldürüldüyü bir çox mənbədə öz əksini tapmışdır.

Bəzi osmanlı müəllifləri isə Taclu bəyimin Məsih Paşazadə adlı sərkərdəyə əsir düşdüyünü, amma bir gün sonra azad edilərək Xoy şəhərinə gəldiyini, burada şahın adamları tərəfindən aşkar edildiyini xəbər verirlər. Daha bir rəvayətə görə, Taclu bəyim öz şəxsi zinət əşyalarını, o cümlədən yuxarıda adı çəkilən "ləli-böbrək" daşından hazırlanmış sırğasını osmanlı paşasına verməklə əsirlikdən qurtula bilmişdir. XVI əsr osmanlı tarixçisi Xoca Sədəddin Əfəndi "Tac ət-təvarix" əsərində hadisəni hər iki variantda təsvir etmişdir. O, birinci variantı qızılbaşların tərəfində olan babası Hafız Məhəmməddən, ikinci variantı isə osmanlı qoşununda qulluq edən atası Həsən Candan rəvayət etmişdir.

XVII əsr osmanlı tarixçisi Münəccimbaşı Əhməd Dədə məşhur "Münəccimbaşı tarixi"ndə bu iki variantı təhlil edərək, üstünlüyü ikinciyə vermişdir. O, sultana əsir düşmüş xanımın yanlışlıq üzündən Taclu bəyim hesab edildiyini, əslində isə Bəhruzə xanım olduğunu yazır. Müəllifin fikrincə, Taclu bəyim isə Məsih Paşazadə tərəfindən əsir alınmış, amma iki gündən sonra zinət əşyalarını verərək azad olmuş, Xoya gələrək burada öz həyat yoldaşına qovuşmuşdur. Daha sonra Münəccimbaşı əlavə edir ki, sultanın əmri ilə Tacızadə Cəfər Çələbiyə etibar edilmiş xanım Bəhruzə bəyim olmuş, I Şah İsmayılın



xahişlərinə rəğmən sultan onu geri qaytarmamışdır.

"Tarixi-elçiyi-Nizamşah" müəllifi I Şah İsmayılın Çaldıran savaşından sonra Təbrizə çəkildiyini, amma Taclu bəyimin aqibətindən xəbərsiz və narahat olduğunu, bu arada savaşdan sonra Xoy şəhərində məlikin (şəhər böyüyünün) himayəsi altında qalmış Taclu bəyimin Təbrizə gəldiyini yazır. Xoy məliki bu xidmətinə görə şah tərəfindən mükafatlandırılmışdı.

"Ələmarayi-Səfəvi" əsərində yazıldığına görə, Çaldıran döyüşündəki məğlubiyyətdən sonra I Şah İsmayıl Taclu bəyimi döyüş meydanından kənara göndərmiş, I Sultan Səlim Taclu bəyimi əsir tutmağa çalışsa da, buna nail olmamışdır. Döyüş bitdikdən sonra Taclu bəyimi görməyən I Şah İsmayıl onun əsir alına biləcəyindən narahat olmuş və qardaşı *Durmuş xanı* 300 nəfərlə onu axtarmağa göndərmişdi. Taclu bəyim isə Çaldıran döyüşündən yaralı halda salamat çıxmış və əsir düşməmək üçün çöllük əraziyə qaçmışdı. Burada iki gün ərzində onun rastına heç kim çıxmamışdır. Bu arada Durmuş xanın adından Heratı idarə edən vəziri *Mirzə Şah Hüseyn İsfahani* Heratın vergilərini özü ilə götürüb Təbrizə gəlirmiş. Çaldıran döyüşünün aqibətindən xəbərsiz olan vəzir Təbriz şəhərindən iki mənzil məsafədə Taclu bəyimlə qarşılaşır və onu da özü ilə götürüb daha təhlükəsiz olan Marağa yolu ilə paytaxta sarı yola düşür. Təbrizin girəcəyində Durmuş xan onları qarşılayır. I Şah İsmayıl Taclu bəyimə and içdirir ki, bundan sonra bir daha döyüşlərə qatılmayacaq. Xidmətinin əvəzi olaraq Mirzə Şah Hüseyn İsfahaniyə isə dövlətdə ən yüksək vəzifə olan *vəkil* mənsəbi verilir.

Hər bir halda Taclu bəyimin Səfəvi dövlətindəki sonrakı taleyi məlumdur. Taclu bəyim I Şah Təhmasibin hakimiyyətinin təqribən ilk 15 ili boyunca sarayda yüksək mövqe sahibi olmuş, lakin birdən-birə nüfuzunu itirmiş, saraydan uzaqlaşmışdır. Bunun dəqiq səbəbini söyləmək çətindir. Bir ehtimala görə, I Şah Təhmasib hakimiyyətdə möhkəmləndikdən sonra anasının təsiri altında qalmaq istəməmiş və onu saraydan uzaqlaşdırmaq qərarına gəlmişdir. Qazı Əhməd Qumi *"Xülasət ət-təvarix"* kitabında 1540-cı ilin hadisələrindən bəhs edərkən Taclu bəyim haqqında bəzi maraqlı məlumatlar vermişdir. O yazır ki, həmin il Təbrizdə taun xəstəliyi yayılmışdı. I Şah Təhmasib özü şəhəri tərk etmiş, lakin Taclu bəyim şəhərdə qalmışdı. Taun təhlükəsi aradan qalxdıqdan sonra şah Təbrizə qayıdıb Taclu bəyimə Şiraz şəhərinə yola düşmək və ömrünün sonunadək orada qalmaq barədə göstəriş vermişdi.

Digər ehtimala görə, Taclu bəyim yaşlandıqdan sonra özü sarayda qalmaq istəməmiş, qalan həyatını ibadət və xeyriyyəçiliklə keçirmək üçün saraydan uzaq bir yerə getmək istəmiş və bu məqsədlə Şirazı seçmişdir.

Dəvə kəcavəsində uzun yol gələn Taclu bəyim Şiraza çatdıqdan bir müddət sonra dünyasını dəyişmişdir. Onu şəhərdəki

Bibi düxtəran qəbiristanlığında dəfn etmişlər. O, bəzi kəndləri seyidlərə *vəqf* etmiş, bir sıra müqəddəs ziyarətgahlarda təmir-tikinti işlərini maliyyələşdirmişdir. Qumdakı Məsumə xanım (ə) hərəmini təmir etdirmiş, buraya min tümən məbləğində vəqf ayırmışdır (bu xeyriyyə işini bəzən onun qızına aid edirlər). Taclu bəyim həmçinin Ərdəbildə I Şah İsmayıldan ötrü Cənnətsəra adlı möhtəşəm türbə tikdirmiş, amma tikintini tamamlamağa və şahın cəsədini oraya köçürməyə ömrü çatmamışdır.

***Mənbələr:*** *Tufan Gündüz. Şah İsmail'in Eşi Taçlu Begüm (Turk Kulturu ve Hacı Bektaş Veli Araştırma Dergisi, Sayı 51) s. 223-233; Vedat Turğut. Şah İsmail'in Hatunu (OTAM, 39, Bahar 2016), s.27-35; Hüseyn Mircəfəri. Çaldıranın igid qadını Taclu xanım (Təbriz Universiteti Ədəbiyyat və humanitar elmlər fakültəsinin nəşri, 1353 h.-ş., № 112), s.468-481; M.K.Yusifcəmali. I Şah İsmayılın həyatı, s.227-230; Azərbaycan Səfəvi dövlətində Birinci Xanım titulu ("Türküstan", 26 fevral-6 mart 2017), s.8-9; Mehman Süleymanov. Səfəvilər (Şah İsmayıl Səfəvi), III, 535-549; Qazı Əhməd Qumi. Xülasət ət-təvarix, I, 289-290; Budaq Qəzvini. Cəvahir əl-əxbar, s.122-123, 137 və 191; Aləmarayi-Səfəvi (nəşrə hazırlayan: Yədullah Şükri), s.495, 501-502; Walther Hinz. Uzun Hasan ve Şeyh Cüneyd (çeviren: Tevfik Bıyıklıoğlu), s.78; Xurşah ibn Qubad Hüseyni. Tarixi-elçiyi-Nizamşah (nəşrə hazırlayan: M.R.Nəsiri), s.27-28 və 70; Tarix-i aləmara-yi Abbasi (tərcümə və şərhlər: O.Əfəndiyev, N.Musalı), s.120; Müneccimbaşı Ahmet Dede. Müneccimbaşı Tarihi, II, 465-466; Hoca Sadettin Efendi. Tacü't-Tevarih, IV, 211-212.*

**TƏHMASİB MİRZƏ** – Səfəvi şahzadəsi, *Şah Məhəmməd Xudabəndənin* beşinci (ən kiçik) oğlu. Anası *Məhdi-ülya* ləqəbli Xeyrənnisa xanımdır. Babası *I Şah Təhmasibin* vəfatından (1576) sonra doğulduğu üçün onun şərəfinə adlandırılmışdır. Vəliəhd *Həmzə Mirzə* Azərbaycan (Təbriz) bəylərbəyi *Əmir xan Mosullunu* vəzifəsindən azad edib həbsə atdıqdan sonra *Türkman* və *Təkəlü* əmirlərinin əksəriyyəti onun vəliəhdliyini qəbul etmədi. Narazı əmirlər azyaşlı Təhmasib Mirzəni oğurlayıb Qəzvini özlərinə qərargah etdilər. Burada Təhmasib Mirzə vəliəhd elan olundu. Beləliklə, Həmzə Mirzə ilə Abbas Mirzə (gələcək *I Şah Abbas*) arasındakı rəqabət səhnəsinə Təhmasib Mirzəni dəstəkləyən üçüncü qüvvə də daxil oldu. 1586-cı ildə Təkəlü-Türkman alyansı Həmzə Mirzə tərəfdarları ilə döyüşə girdi. Döyüş Həmzə Mirzənin qələbəsi ilə başa çatdı, Təhmasib Mirzə ələ keçirilib Ələmut qalasına göndərildi. I Şah Abbasın hakimiyyətə gəlişinə kimi burada həbsdə qalan şahzadəyə daha sonralar qardaşı *Əbu Talib Mirzə* və atası, hakimiyyətdən salınmış Şah Məhəmməd Xudabəndə də qoşuldu. Qardaşları tərəfindən gələcəkdə hakimiyyət iddiası ilə üzləşə biləcəyindən ehtiyat edən I Şah Abbas onların hər ikisinin gözlərinə mil çəkdirdi. Kor olmuş Təhmasib Mirzə ömrünün qalan hissəsini Ələmut qalasında həbsdə keçirdi; I Şah Abbas vəfat edərkən o, hələ sağ idi.

***Mənbələr:*** *İsgəndər bəy Münşi. Tarix-i aləm-*



*ara-yi Abbasi (tərcümə və şərhlər: O.Əfəndiyev, N.Musalı), s.294-295; Nəsrullah Fəlsəfi. I Şah Abbasın həyatı, I, 114-115 və II, 167-169.*



**UZUN HƏSƏN** (1423-78) – Ağqoyunlu hökmdarı, görkəmli dövlət xadimi, sərkərdə. Qədim oğuz tayfalarından olan Bayandur tayfasından Qara Yuluq Osman bəyin nəvəsidir. Atası Bayandur tayfasının başçısı Cəlaləddin Əli bəy, anası onun əmisi qızı Sara(y) xatundur. Mənbələrdə "Həsən bəy", "Həsən padşah" adlandırılmış, arıq və hündürboy olduğuna görə "Uzun Həsən" kimi tanınmışdır. Bundan əvvəl tayfa birliyi şəklində mövcud olmuş və məhdud ərazidə hökm sürmüş Bayandurlar Uzun Həsənin başçılığı altında Ağqoyunlu dövləti adlı güclü bir imperiya qurmağa nail oldular. Uzun Həsən hakimiyyətinin əvvəllərində Diyarbəkir ətrafında kiçik bir ərazidə bəyliyin başçısı idi. O, qısa müddətdə tayfadaxili mübarizədə öz rəqiblərini (o cümlədən qardaşı Cahangir Mirzəni) məğlub edərək gücləndi və tabeliyində olan əraziləri genişləndirməyə başladı. Yaxın Şərqə hakim olmaq uğrunda onunla Qaraqoyunlu və Teymuri qüvvələrinin maraqları toqquşurdu. Uzun Həsən 1467-ci ildə Muş savaşında Qaraqoyunlu Cahan şahı məğlubiyyətə uğratdı, döyüş meydanından qaçan Cahan şah gecə öz düşərgəsində onun basqınına məruz qalıb öldürüldü. İki ildən sonra Ağqoyunlu qoşunu Cahan şahın oğlu Həsən Əli ilə Teymuri hökmdarı Əbu Səidin müttəfiq ordusunu Xoy şəhəri ətrafında darmadağın etdi. Bununla da Qaraqoyunlular dövlətinə məxsus bütün ərazilər Uzun Həsənin hökmü altına keçdi. Ağqoyunlu dövləti Uzun Həsənin hakimiyyəti dövründə müsəlman Şərqinin ən böyük imperiyalarından biri kimi indiki Azərbaycan, İran, İraq ərazilərini, indiki Türkiyə, Suriya və Gürcüstanın bir hissəsini əhatə edirdi. İmperiyanın paytaxtı əvvəlcə Diyarbəkirdəki Amid şəhəri, daha sonra *Təbriz* olmuşdur.

Ağqoyunlu dövlətinin durmadan genişlənib çiçəklənməsi, Şərqin siyasi-iqtisadi cəhətdən ən güclü dövlətlərindən birinə çevrilməsi Osmanlı imperiyasını narahat edirdi. Ağqoyunlular dövlətinin ərazisində istehsal olunan ipəkdən toxunmuş parçalar Avropa bazarlarında baha qiymətə satılırdı. Osmanlı sultanı II Mehmet Fateh Ağqoyunluların ticarət imkanlarını məhdudlaşdırmaq məqsədilə onun hakimiyyəti altında olan torpaqlardan keçən ticarət karvanlarına ağır gömrük vergisi tətbiq etdi. Həmçinin Ağqoyunlu dövlətinin Avropaya çıxışını təmin edən, onun iqtisadi tərəf-müqabili olan Trabzon (Trapezund) imperiyası və Qaraman bəyliyi II Mehmet tərəfindən ələ keçirilərək Osmanlı imperiyasının tərkibinə qatıldı. Uzun Həsən öz güclü qonşusu Osmanlı imperiyası ilə toqquşmanın qaçılmaz olduğunu anlayaraq Avropa ilə danışıqları sürətləndirdi. Venesiya Respublikası ona odlu silah (artilleriya) göndərəcəyini vəd etdi. Planın ilk hissəsi olaraq Uzun Həsən Qaraman bəyliyinin ərazisinə qoşun göndərdi və bu torpaqlar Ağqoyunlular tərəfindən

ələ keçirildi. Lakin Venesiya həmin keçid vasitəsilə odlu silah göndərilməsini gecikdirdi. Nəticədə Uzun Həsənin fəth etdiyi torpaqlar yenidən osmanlılara qayıtdı, o özü də düşmənlə müharibədə artilleriyasız qaldı. İlk Osmanlı-Ağqoyunlu toqquşmaları birinci tərəfin qələbəsi ilə nəticələndi, Venesiya Respublikası osmanlılarla separat danışıqlara girdi, bunun nəticəsində Sultan II Mehmet qərb sərhədlərindən arxayın olaraq bütün qüvvəsini Ağqoyunlularla döyüş cəbhəsinə yönəltdi. 1473-cü ildə baş vermiş Otluqbeli savaşı osmanlıların qələbəsi ilə bitdi.

Uzun Həsənin həyatı *Səfəvilər sülaləsi* və *səfəviyyə təriqəti* ilə birbaşa bağlıdır. O, Səfəvilər dövlətinin banisi *I Şah İsmayılın* ana babasıdır. Belə ki, I Şah İsmayılın anası *Aləmşah bəyim* Uzun Həsənlə Trabzon (Trapezund) imperatoru IV Böyük İohann Komninin (ləqəbi "Kalo-İoannes" – "gözəl İohann") qızı Teodoranın (*Dəspinə xatun*) izdivacından təqribən 1460-cı ildə doğulmuşdur. Uzun Həsənlə Trabzon imperatriçəsinin evliliyi siyasi mahiyyət daşıyırdı və Osmanlı dövlətinə qarşı müttəfiqlik məqsədilə bağlanmışdı. Uzun Həsənlə Səfəvilər sülaləsi arasında bundan əvvəl də qohumluq əlaqəsi qurulmuşdu. I Şah İsmayılın babası *Şeyx Cüneyd* Qaraqoyunlular tərəfindən dəstəklənən əmisi *Şeyx Cəfərlə* rəqabətdə üstünlüyü əldən verərək *Ərdəbili* tərk etdikdən sonra Osmanlı dövləti, Qaraman bəyliyi, Şam və digər bölgələrdə təbliğat aparmış, lakin uğursuzluğa düçar olmuşdu. O, nəhayət, Diyarbəkirə gəlmiş, burada Uzun Həsən tərəfindən səmimi şəkildə qarşılanmış və 3 il Ağqoyunlu torpaqlarında yaşamışdır (1456-59). Uzun Həsənlə Şeyx Cüneydi Qaraqoyunlulara qarşı ümumi düşmənçilik motivi birləşdirirdi. Şeyx Cüneyd Ağqoyunlu hökmdarının bacısı Xədicə bəyimlə evlənmiş (1458/59), bu izdivacdan I Şah İsmayılın atası *Şeyx Heydər* doğulmuşdur (1460). Şeyx Heydər özü də 9 yaşınadək Diyarbəkrin mərkəzi və Ağqoyunlular dövlətinin paytaxtı olan Amid şəhərində, Uzun Həsənin himayəsi və tərbiyəsi altında böyümüşdür. Uzun Həsən 1469-cu ildə öz rəqibləri olan Qaraqoyunlu və Teymuri qoşunlarını məğlub etdikdən və paytaxtı *Təbrizə* köçürdükdən sonra Şeyx Heydər Ərdəbil xanəgahına qayıtmış və ata-baba ocağının rəhbərliyinə keçmişdir.

Uzun Həsən tarixi mənbələrdə ədalətli hökmdar kimi xarakterizə edilir. Onun hakimiyyəti dövründə vergilər xeyli azaldılmış, bəzi vergi növləri ümumiyyətlə ləğv edilmişdi. Hətta onun bütün vergiləri ləğv etmək fikrində olduğunu, amma dövlət adamları tərəfindən sərt narazılıqla qarşılandığı üçün bu addımın həyata keçmədiyini yazırlar. Ölkədaxili nizam-intizamı möhkəmləndirmək, dövlətin siyasi və iqtisadi gücünü artırmaq məqsədilə Uzun Həsənin rəhbərliyi altında "Qanunnamə" adlı qanunlar məcəlləsi tərtib edilmişdi. Bu "Qanunnamə" Səfəvilər dövlətinin ilk onilliklərinə – I Şah Təhmasibin əmri ilə yeni qanunnamə hazırlananadək istifadədə ol-



muşdur. Uzun Həsənin sifarişi əsasında Əbu Bəkr Tehrani "Kitabi-Diyarbəkriyyə" əsərini qələmə almışdır; bu kitab Ağqoyunlular dövlətinin tarixi mövzusunda ən mühüm mənbələrdən sayılır.

Uzun Həsənin zamanında Ağqoyunlular dövlətinin ərazisində 4 min *təkkə* fəaliyyət göstərir, *səfəviyyə*, *xəlvətiyyə*, nəqşbəndiyyə, *bayramiyyə*, gülşəniyyə kimi təriqətlər sərbəst şəkildə təbliğ edilirdi. Dədə Ömər Rövşəni, Şahqubad Şirvani kimi təsəvvüf şeyxləri, xəlvətiyyə, *bektaşiyyə*, kübrəviyyə, nemətullahiyyə, səfəviyyə və digər təriqətlərin ardıcılları bu dövlətdə azad şəkildə öz təriqət həyatlarını yaşayırdılar. Ölkə elm və sənət baxımından da çox inkişaf etmişdi. Sarayda elm məclisləri, şeir və musiqi yığıncaqları təşkil olunur, hökmdar özü də bəzən bu toplantılara qatılaraq müzakirələrdə fikir bildirirdi. *Təbriz miniatür məktəbinin* ilk nümunələri Uzun Həsən zamanında yaradılmışdı. Uzun Həsən Qurani-Kərimi Azərbaycan türkcəsinə tərcümə etdirmişdi, onun hüzurunda mütəmadi olaraq "Səhihi-Buxari"dən hədislər oxunub türkcəyə tərcümə edilir və onlara şərh verilirdi.

Uzun Həsənin vəfatından (1478) sonra qısa müddət ərzində Ağqoyunlu dövləti zəiflədi. Ondan sonra əvvəlcə oğulları Sultan Xəlil və Sultan Yaqub, daha sonra nəvələri Baysunqur Mirzə, Rüstəm padşah, Gödək Əhməd, Əlvənd Mirzə, Məhəmməd Mirzə və Sultan Murad hakimiyyət sürmüşlər. Uzun Həsənin xələflərinin səfəviyyə təriqətinə münasibəti mənfi olmuş, Ağqoyunlu taxtında bir-birini sürətlə əvəz edən hökmdarlar Səfəvilər sülaləsinə qarşı düşmənçilik siyasəti yürütmüşlər.

*bax:* **DƏSPİNƏ XATUN**, **ALƏMŞAH BƏYİM.**

***Mənbələr:*** *Walther Hinz. Uzun Hasan ve Şeyh Cüneyd (türkcə tərcümə: Tevfik Bıyıklıoğlu), s.26-27 və 62-64; John E. Woods. 300 Yıllık Türk İmparatorluğu: Akkoyunlular (türkcə tərcümə: Sibel Özbudun), s.149; Yaqub Mahmudov. Azərbaycan diplomatiyası, s.99-169; Y.Mahmudov. Azərbaycan: qısa dövlətçilik tarixi, s.28-30; Azərbaycan tarixi (7 cilddə), III, 80-89; Əliyar Səfərli. Azərbaycan tarixi uzaq keçmişdən 1870-ci ilə qədər, s.319-323; A.A.Bakıxanov. Gülüstani-İrəm, s.97-100; Ahmet Özcan. Uzun Hasan Kanunları ve Osmanlı Dönemine yansımaları (OTAM Ankara Üniversitesi Osmanlı Tarihi Araştırma ve Uygulama Merkezi Dergisi, Yıl: 2011, Sayı: 29), s.173-192; Türkiye Diyanet Vakfı İslam Ansiklopedisi, XLII, 261-264; Əbu Bəkr Tehrani. Kitabi-Diyarbəkriyyə (tərcümə edən: R.Şükürova).*

**YALANÇI II ŞAH İSMAYILLAR** – Səfəvi hökmdarı *II Şah İsmayılın* qəfil və vaxtsız ölmündən (1577), eləcə də ondan sonra hakimiyyətə keçmiş *Məhəmməd şah Xudabəndənin* zəif xarakterindən istifadə edərək Səfəvilər dövləti ərazisində özünü II Şah İsmayıl elan etmiş avantürist şəxslər.

1580-ci ildə Kuhgiluyə bölgəsindəki lurların arasından bir *qələndər* dərviş özünü II Şah İsmayıl elan edərək 3 il əvvəl ölmüş şəxsin əslində şah deyil, ona bənzəyən bir nökər olduğu iddiasını irəli sürdü. Lurlardan böyük bir kütlə ona

qoşuldu. Qələndər dərviş Anadoluda da çoxlu tərəfdarı olduğunu, onların köməyi ilə bütün Anadolunu fəth edəcəyini söyləyirdi. Yalançı II Şah İsmayılın tərəfdarları Kuhgiluyə hakimi Xəlil xan Əfşara qarşı qiyam qaldırdılar, döyüşdə Xəlil xanın oğlu Rüstəm bəy öldürüldü. Xəlil xan oğlunun intiqamını almaq məqsədilə qoşun toplayıb üsyançıların üzərinə yürüdü, amma dağ keçidində gizlənən üsyançılar onun qoşununu tüfəng atəşinə və daşa tutdular. Güllələrdən biri Xəlil xanın həyatına son qoydu, onun tabeliyindəki döyüşçülər pərakəndə halda dağılışdılar. Yalnız *əfşarlarla zülqədərlərin* birləşmiş qüvvələri yalançı şahın öhdəsindən gələ bildilər. Qələndər dərviş ələ keçirilib öldürüldü, başı kəsilərək Şah Məhəmməd Xudabəndəyə göndərildi.

Qələndərin ölümündən sonra başqa yalançı şahlar da zühur etdilər. Onlardan biri kürd və lur tayfalarını başına topladı, amma *Çuxa sultanın* nəvəsi Solaq Hüseyn sultan Təkəlü tərəfindən əsir tutulub Qəzvində edam edildi. Daha bir yalançı II Şah İsmayıl talışların arasında zühur etdi, Ərdəbildə boynu vuruldu. Gurlu tayfasından çıxmış növbəti yalançı şah əfşar əmirləri üzərində bir neçə dəfə qələbə qazandıqdan sonra öz tərəfdarları ilə münaqişə zəminində həyatını itirdi. Diqqətəlayiq cəhət budur ki, göründüyü kimi, yalançı II Şah İsmayıllar *qızılbaş tayfalarından* deyil, digər millətlərə mənsub tayfalardan çıxmışlar. Ehtimala görə, həmin tayfalar hakimiyyətdə istədikləri səviyyədə təmsil olunmadıqları üçün narazılıqlarını bu formada büruzə verirdilər.

Bunlardan bir qədər əvvəl yalançı II Şah İsmayıl hərəkatlarına Anadoluda da rast gəlinmişdir. Onlardan biri şahın vəfat xəbərindən dərhal sonra (1577) *Şambayatı* tayfasında zühur etmiş və xalq arasında kifayət qədər böyük nüfuz qazanmağa nail olmuşdu. Bundan bir il sonra daha bir yalançı şah Malatya bölgəsində ortaya çıxmışdı.

***Mənbələr:*** *Faruk Sümer. Safevi Devletinin Kuruluşu ve Gelişmesinde Anadolu Türklerinin Rolü, s.132-134; İsgəndər bəy Münşi. Tarix-i aləmara-yi Abbasi (tərcümə və şərhlər: O.Əfəndiyev, N.Musalı), s.541-543; C.Səvaqib, M.M.Rövşənfikr. Səfəvilər dövründə Şah Qələndər üsyanına bir baxış (İsfahan Universiteti Ədəbiyyat və humanitar elmlər fakültəsinin "Tarix araşdırmaları" dərgisi, 1377 h.-ş., № 1), s.17-50; Roger Savory. Səfəvilər dövrü İran tarixinə dair araşdırmalar, s.366-374.*



**YELENA XANIM** – Səfəvi şahbanusu, *Şah Süleymanın* xanımı, *Şah Sultan Hüseynin* anası. Həyatı haqqında məlumat azdır. Gürcüstanın Yuxarı Kartli bölgəsində hökm sürmüş Samtsxe atabəyliyinin hakiminin qızıdır. Şah Süleymanın vəfatından sonra şahzadə Hüseynlə (gələcək Şah Sultan Hüseyn) şahzadə Abbas tərəfdarları arasında rəqabət zamanı təşəbbüsü ələ alaraq öz oğlu şahzadə Hüseynin taxta çıxmasını təşkil etmişdir. O, hərəmxana üzvlərini toplayaraq fikrini bu şəkildə əsaslandırmışdı ki, onun oğlu dindar, savadlı və həlim təbiətlidir, amma rəqibi şahzadə Abbas çıl-



ğın və mübariz xasiyyətli gəncdir. Əgər Abbas hakimiyyətə gəlsə, bütün saray əhli onun qəzəbinə düçar olacaq və ölkəni müharibə alovu bürüyəcək, amma əgər Hüseyn taxta çıxsa, dövlət adamlarından heç kimi incitməyəcək və ölkəni insafla idarə edəcək. Zəif təbiətli, anasının nüfuzu altında olan şahzadəni hakimiyyətə gətirmək saray adamlarına da sərf etdiyi üçün onlar şahbanunun təklifini qəbul edib şahzadə Hüseynin tərəfinə keçdilər. Şahzadə Hüseynin Səfəvi hökumətinə gətirilməsində atasının bibisi *Məryəm bəyimin* də həlledici rolu vardır.

Şah Sultan Hüseyn hakimiyyətə keçdikdən sonra anası Yelena xanımın və Məryəm bəyimin güclü təsiri altında olmuşdur.

Yelena xanım İsfahanın Çaharbağ məhəlləsində mədrəsə tikdirmiş (Madərşah mədrəsəsi də adlandırılır), yaxınlıqdakı bazarı və karvansaranı da ona *vəqf* etmişdir.

***Mənbələr:*** *Kruşinskinin səyahətnaməsi (fars dilinə tərcümə: Ə.Dünbüli Məftun), s.21; M.H.Riyahi. Səfəvilər dövrü İsfahanının qadınlarından yadigar qalmış vəqflər ("Vəqfi-mirasi-cavidan" dərgisi, 1389 h.-ş., № 71), s.143-168; Əbdülməcid Şüca. Səfəvilər dövründə qadın, siyasət və hərəmxana, s.174-177; M.H.Riyahi. İsfahanın məşhur qadınları, s.247-28.*

**ZAHİD GİLANİ** (1218-1301) – görkəmli təsəvvüf xadimi, *səfəviyyə*, *xəlvətiyyə*, *bayramiyyə* və digər təriqətlər üçün baza rolunu oynamış *zahidiyyə* cərəyanının banisi. O, *səfəviyyə təriqətinin* banisi *Şeyx Səfiəddin Ərdəbilinin mürşidi* və qayınatası olmuşdur.

Əsl adı İbrahim, ləqəbi Tacəddin, atasının adı Şeyx Rövşən Əmir olan, Zahid ləqəbi ilə tanınan bu böyük sufi o zamanlar Gilan bölgəsinə aid edilən Lənkəranın Siyavurd kəndində doğulmuşdur. Həyatı haqqında konkret tarixi məlumat azdır, mənbələrdəki məlumatların böyük qismi mənqəbə (*kəramət* və möcüzələr, əxlaqi keyfiyyətlərin təsviri) qisminə aiddir. Şeyx Zahidin yeddi nəsil əcdadının təsəvvüf şeyxi olduğunu yazırlar, bəzi məlumatlara görə, ulu babası Xorasandan gəlmişdir. *"Səfvət əs-səfa"* kitabında Şeyx Zahid Gilaninin atasının babası Bündar Səncan bölgəsinə mənsub kürd kimi təqdim edilir. Lakin klassik mənbələrə əsasən Səncanın Mərv ətrafında yerləşdiyini nəzərə alsaq, bu yerlərin köklü əhalisi kimi onun da türk mənşəli olduğunu düşünmək daha düzgündür. Zahid Gilani Şirazda *sührəvərdiyyə* təriqətinin piri olan böyük şair Sədi Şirazi ilə görüşmüş, bir müddət onun *müridi* olmuş, sonra onun tövsiyəsi ilə Gilana qayıdaraq Seyid Cəmaləddin Məhəmməd Təbrizinin müridlərinin cərgəsinə qoşulmuşdur. Getdikcə təsəvvüf dünyasında püxtələşən Şeyx Zahid, nəhayət, öz məktəbini yaratmış, bu məktəb zahidiyyə təlimi kimi tanınmışdır. Tədqiqatlar söyləməyə əsas verir ki, zahidiyyə konkret təriqət olmaqdan daha çox bir məşrəb (cərəyan, istiqamət) xarakteri daşımışdır. Səfəviyyə təriqətinin banisi Şeyx Səfiəddin Ər-

dəbili, xəlvətiyyə təriqətinin banisi Əbu Abdullah Siracəddin Ömər Xəlvətinin əmisi və ustadı Şeyx Kəriməddin Əxi Məhəmməd və digər təsəvvüf xadimləri Şeyx Zahidin müridi olmuşlar. Onun müridləri arasında Əxi Yusif Şirvani, Əbdürrəhman Şirvani, gəncəli Pir Hikmət də önəmli yer tutmuşlar. Şeyx Zahiddən 25 il təriqət dərsi almış və qızı ilə evlənmiş Səfiəddin Ərdəbili onun əsas mənəvi varisi sayılır.

Şeyx Zahid Gilani Azərbaycanda çox məşhur olmuş, müridlərinin sayı 100 mini keçmişdir. Elxani hökmdarı Qazan xanın onunla görüşdüyü, Şirvanşah Axsitanın ondan ötrü Güşitasfidə (Muğandakı suqovuşan bölgəsi) *təkkə* tikdirdiyi rəvayət edilir. Sonralar Şeyx Ərdəbilə köçmüş və buranı öz fikir məktəbinin mərkəzinə çevirmişdir. Şirvanşahın onu öz torpaqlarına dəvətindən sonra Şeyx Zahid bir müddət Şirvanda fəaliyyət göstərdi, lakin onun artmaqda olan nüfuzu hakim dairələri və rəqib təriqət mənsublarını narahat etməyə başladı. *Qələndərlər* ona sui-qəsd təşkil etsələr də, uğur qazana bilmədilər. Şeyx Zahid ömrünün sonuna yaxın Guşitasfidə xəstələnmiş, vəsiyyətinə əsasən Şeyx Səfi onu Siyavurd kəndinə aparmışdır. Burada iki həftə xəstə yatdıqdan sonra Şeyx Zahid Gilani dünyasını dəyişmişdir. Onu əvvəlcə Siyavurdda dəfn etmiş, amma bir neçə ildən sonra kəndi su basdığı və məzarlıq su altında qaldığı üçün Şeyx Səfi mürşidinin nəşini Hiyəkəran kəndinə köçürmüşdü. Sonralar bu kənd Şeyx Zahidin şərəfinə Şıxəkəran adını almışdır. Hazırda Şeyxin buradakı qəbri böyük ziyarətgahdır.

Şeyx Zahid Gilaninin iki xanımı olmuşdur, bunlardan biri Lənkəranın Siyavurd kəndində, digəri yenə həmin bölgənin Hiyəkəran kəndində yaşayırdı. Oğlu Şeyx Cəmaləddin Əli *xəlifəlik* uğrunda Şeyx Səfiəddin Ərdəbili ilə rəqabətdə idi. Cəmaləddinin nəslini oğlu Sultan Bürhanəddin və onun oğlu Sultan Maqsud davam etdirmişlər. Sultan Maqsud Səfəvi tarixinə dair mühüm klassik mənbələrdən sayılan "Əqaidi-övliyayi-səbə" kitabının müəllifidir. Zahid Gilaninin nəslinin bir qolu (Səfəvi şahları da daxil olmaqla) Şeyx Səfiəddin Ərdəbili ilə ailə qurmuş qızı *Bibi Fatimə* vasitəsilə davam etmişdir.

***Mənbələr:*** *Türkiye Diyanet Vakfı İslam Ansiklopedisi, XXI, 359-360; Natig Rahimov. Azerbaijan's Contribution to Islamic Culture. An Undicsovered Treasure ("Contributions of The Eurasian Nations to Islamic Culture"), p.181; Lüğətnameyi-Dehxuda, VIII, 12581-12586; Təsəvvüf tarixi (BİU Zaqatala şöbəsinin nəşri), s.219.*

**ZEYNƏB BƏYİM** (vəf. 1641) – Səfəvi şahzadəsi, *I Şah Təhmasibin* qızı. Anası gürcü əsilzadələrindən Hurixan xanımdır. I Şah Təhmasib bu qızına çox bağlı idi, onu çox sevirdi. Zeynəb bəyimin *lələsi* qılınc qorçusu (yəni şahın şəxsi qılıncını daşıyan) Şahəli bəy Şamlu idi. I Şah Təhmasibin vəfatından sonra *II Şah İsmayılın* hakimiyyət dövründə (1577) Zeynəb bəyim atasının bibisi oğlu *Durmuş xan Şamlunun* nəvəsi *Əliqulu xan*



*Şamluya* (gələcək *I Şah Abbasın* lələsi və Herat hakimi) nişanlandı, amma toy baş tutmadı. Çünki nişan mərasimindən bir il sonra gəlini Herata göndərmək qərara alınmışdı. Amma Əliqulu xanın şahzadə Abbas Mirzəni (gələcək I Şah Abbas) dəstəkləməsi nəticəsində onunla mərkəzi hakimiyyət arasında qarşıdurma yarandı, nəticədə *Şah Məhəmməd Xudabəndə* bu izdivacın həyata keçməsinə razılıq vermədi.

Şah Məhəmməd Xudabəndənin hakimiyyətinin sonlarında başlamış siyasi mübarizələr zamanı Zeynəb bəyim qardaşı oğlu Abbas Mirzənin tərəfində olmuşdur.

Zeynəb xanım ağıllı və mülayim xasiyyətli qadın idi, geniş miqyasda xeyriyyəçilik işləri ilə məşğul olurdu. I Şah Abbasın zamanında hərəmxanada böyük hörmətə malik idi. Şahın hüzurunda toplanan ali məşvərət şurasında (*cəngi*) o da iştirak edir, mühüm dövlət qərarlarının verilməsində öz fikrini bildirirdi. Səfəvilər sarayında olmuş Qərb səyyahları onların şahla görüşü və digər mühüm tədbirlər zamanı Zeynəb xanımın da məclisdə iştirak etdiyini yazmışlar. *Sufiyan savaşından* (1605) qabaq I Şah Abbasın öz bibisi ilə məşvərət etməsi tarix kitablarında əks olunmuşdur. Həmçinin I Şah Abbas 1620-ci ilin yayında ağır xəstələndiyi zaman Zeynəb bəyim ona məsləhət görmüşdü ki, əmirlər arasında baş qaldıran həyəcanın qarşısını almaq üçün ordunun qarşısına çıxsın. I Şah Abbas məsləhətə qulaq asaraq çətinliklə də olsa sərkərdələrlə görüşdü və onlar şahın sağ olduğunu gözləri ilə gördükdən sonra sakitləşdilər. Zeynəb bəyimin nüfuzundan ölkə xaricində də xəbərdar idilər. Osmanlı sultanı I Əhməd I Şah Abbasla apardığı müharibədə ardıcıl uğursuzluqlar qazandığı zaman əsirlikdə saxladığı gürcü çarının xanımı Gülsarəyə tapşırmışdı ki, Zeynəb xanımla əlaqə yaradıb ondan öz qardaşı oğlunu sülhə razı salmağı xahiş etsin.

Zeynəb bəyim *I Şah Səfinin* hakimiyyəti dövründə də bir müddət ehtiram sahibi olmuş, amma sonralar saraydan kənarlaşdırılmışdır. O, 1632-ci ildən ömrünün sonuna kimi dövlət işlərindən və siyasətdən uzaq şəkildə Qəzvində yaşamış, 1641-ci ildə orada vəfat etmiş və Məşhəddə, İmam Rza (ə) hərəmində dəfn olunmuşdur.

***Mənbələr:*** *İsgəndər bəy Münşi. Tarix-i aləm-ara-yi Abbasi (tərcümə və şərhlər: O.Əfəndiyev, N.Musalı), s.301; Həsən bəy Rumlu. Əhsən ət-təvarix (nəşrə hazırlayan: Ə.Nəvai), s.638; Nəsrullah Fəlsəfi. I Şah Abbasın həyatı, I, 25; Kioumars Ghereghlou. Zaynab Begum (Encyclopaedia Iranica).*

**ZİBEYDƏ BƏYİM** – Səfəvi şahzadəsi, *I Şah Abbasın* qızı. Həyatı haqqında məlumat azdır. *Qorçubaşı İsa xan Şeyxavənd* ilə ailə qurmuşdur. İsa xan Səfəvilər nəslindən *Məsum bəyin* nəvəsi idi, hərbi karyera pilləsi üzrə yüzbaşılıqdan sürətlə irəliləyərək 1611/12-ci illərdə *qorçubaşı* vəzifəsinə kimi yüksəlmişdi. Qərb səyyahlarının yazdığına əsasən, Zibeydə bəyimin evliliyinin əvvəllərində həyat yoldaşına münasibəti müsbət

olmamış, amma İsa xanın şikayətindən sonra şah öz qızını danlayaraq ərinə qarşı mehriban olmasını tapşırmışdır. 1618-ci ildə bağlanmış *Sərab sülh müqaviləsinin* şərtlərinə görə, Səfəvilər dövləti osmanlılara 100 tay ipək parça verməyi öhdəsinə aldığı zaman xəzinədə kifayət qədər məbləğ olmadığı üçün Zibeydə bəyim öz vəsaiti hesabına parçaları tədarük edib atasına təhvil vermişdi.

Zibeydə bəyimin İsa xanla izdivacından üç oğlu olmuşdur. Onların böyük oğlu Seyid Məhəmməd xan babası I Şah Abbasın vəfatı zamanı 18 yaşında idi. Şahın vəfatından sonra yaranmış qarışıqlıq mühitində bir dəstə onun vəsiyyətinə əməl edərək nəvəsi Sam Mirzəni (gələcək *I Şah Səfi*), bir dəstə isə gözlərinə mil çəkilmiş şahzadə *İmamqulu Mirzəni* taxta çıxarmaq fikrində idi. Daha bir dəstə Seyid Məhəmməd xanı hakimiyyətə gətirməyi təklif edirdi. Onların fikrincə, Seyid Məhəmməd xan həm ata, həm də ana tərəfdən Səfəvilər sülaləsinə mənsub olduğuna görə şahlığa daha layiq idi. İsa xan bu təxribatçı təklifə nəinki razı olmamış, hətta belə demişdi: "Əgər fikriniz fitnə salmaqdırsa, özüm üç balamın başını kəsib saraya göndərərəm".

Qorçubaşının bu sədaqətinə baxmayaraq, I Şah Səfi hakimiyyətə keçdikdən sonra əvvəlcə onun oğullarını aradan götürdü. İsa xanın əmlakı müsadirə edildi, qısa müddətdən sonra özü də öldürüldü (1632). Bəzi məlumatlara görə, Zibeydə bəyim də I Şah Səfinin əmri ilə öldürülmüşdür.

Səfəvilər nəslinin daha bir qolu Zibeydə bəyimin qızı Cahanbanu bəyim vasitəsilə davam etmişdir; özünü Səfəvi taxttacının varisi elan etmiş *II Şah Süleyman* (1714-63) bu nəsildəndir.

***Mənbələr:*** *Nəsrullah Fəlsəfi. I Şah Abbasın həyatı, II, 198-200; İsgəndər bəy Münşi. Zeyli-Tarixi-aləmarayi-Abbasi, s.90; Şeyx Səfidən Şah Səfiyə kimi ("Tarixi-sultani"-dən, nəşrə hazırlayan: E.İşraqi), s.243-244.*





**QIZILBAŞLIQ** – türkman tayfalarının qədim inam və ənənələrinin İslami düşüncə ilə birləşməsindən meydana çıxan, mistik inancları özündə ehtiva etməklə yanaşı dərin sosial köklərə malik olan təlim. Qızılbaş məfhumunun kökünü bəzi tədqiqatçılar *xürrəmiliklə* bağlayırlar. VIII əsrin sonlarından etibarən yayılmağa başlamış, bundan əvvəlki məzdəkilik inancından bəhrələnmiş xürrəmi cərəyanı ərəb mənbələrində "mühəmmərə" adı ilə qeyd edilir ki, bunun da kökü "al-qırmızı" sözündəndir. Qırmızı rəngə xüsusi əhəmiyyət verən, bayraqları da bu rəngdə olan xürrəmilər IX əsrin birinci yarısında Babəkin başçılığı altında ərəb xilafətinə qarşı həm hərbi, həm də ideoloji cəbhədə mübarizə aparmışlar. Tarixi mənbələrdəki bəzi məlumatlar Babəkin və tərəfdarlarının ifrat şiə əqidəsinə bağlı olduqlarını, batini cərəyanlardan biri sayıldıqlarını düşünməyə əsas verir. Məlumdur ki, onun qoşununda türk (türkman) mənşəli döyüşçülər, tərəfdarları arasında da eyni mənşəli əhali çox olmuşdur.

Qırmızı rəngdə libas, xüsusilə baş geyimi qədim türklər arasında çox yayılmışdı. Ümumiyyətlə, onların arasında baş geyiminin rənginə görə qruplara ayrılma ənənəsi mövcud idi. Qaraqalpaq xalqının, qıpçaqlara aid Qarabörklü tayfasının, Buxara sufilərindən olan Yaşılbaş zümrəsinin adları bunu təsdiq edir. Altay şamanları ayin zamanı başlarına vəhşi toyuq tükü ilə bəzədilmiş qırmızı rəngli papaq qoyurdular. Həm qırğız tayfalarından biri, həm də Əfqanıstanın şiə icmasının böyük bir hissəsi qızılbaş adını daşıyır. Ola bilər ki, zaman keçdikcə yalnız *ələvi-bektaşi* inancına bağlı qalan türkmanlar qırmızı papaqdan istifadə etdikləri üçün bu ad onlara aid edilmişdir.

Bununla belə, tarixi mənbələrdə "qızılbaş" sözünün ilk dəfə istifadə edilmə tarixini XV əsrin son rübünə aid edir və I Şah İsmayılın atası *Şeyx Heydərlə* bağlayırlar. Rəvayətə görə, bir gecə yuxuda *İmam Əli (ə)* Şeyx Heydərə qırmızı parçadan papaq hazırlamaq qaydasını öyrətmiş, bu papağı geyinməsini və öz tərəfdarlarına da bunu əmr etməsini tapşırmışdı. O vaxtdan Şeyx Heydər və tərəfdarları ənənəvi türkman börkünü bir kənara qoyaraq qırmızı parçadan 12 zolağı olan papaq qoymağa başlamış və "qızılbaş" adını qazanmışlar (burada "qızıl" sözü qırmızı mənasını verir). Qızılbaş düşüncəsində bununla bağlı digər rəvayətlər də mövcuddur. Belə ki, guya həzrət Əli (ə) özü Xeybər savaşında başına qırmızı rəngdə əmmamə bağlamış, Siffeyn döyüşündə tərəfdarlarını Müaviyənin qoşunundan fərqləndirmək üçün onlara qırmızı əmmamə bağlamalarını tapşırmışdı.

Anadolunun türkman tayfaları Şeyx Heydərin *xəlifələri* tərəfindən təlimatlandırılır və onun əmri ilə Osmanlı üsuli-idarəsinə qarşı itaətsizlik göstərirdilər. Buna görə Osmanlı dövlətində "qızılbaş" adı hökumətə qarşı çıxan, üsyankar mənasında, eyni zamanda dini çalar da qazanaraq *şiə* anlamında işlənmişdir. Əksinə, Səfəvi mənbələrində isə çox

zaman dövlətin əsasını təşkil edən tayfaları "qızılbaş tayfaları", qoşunu "qızılbaş ordusu", dövlət adamlarını "qızılbaş əmirləri", hökmdarı "qızılbaş padşahı", dövlətin özünü isə "Qızılbaş ölkəsi", "Qızılbaş dövləti" adlandırırdılar. Qızılbaşlıq Səfəvilər dövründə türkman tayfalarının milli kimliyinin identifikasiya kodlarından birinə çevrilmişdi. Bu ad həm də siyasi anlamda Səfəvilər dövlətinin tərəfdarı olmaq mənasını verirdi. Qızılbaşlığı tərk etmək Səfəvilər dövlətinə xəyanət etmək, düşmən tərəfinə keçmək anlamına gəlirdi. Qızılbaş sözü hətta Səfəvilər dövründə Azərbaycan türkcəsinin sinonimi kimi işlənirdi. XVII əsrin sonunda I Şah Süleymanın sarayında *münşi* (katib) vəzifəsində xidmət etmiş Məhəmməd Rza Nəsiri və oğlu Əbdülcəmil çoxdilli lüğət tərtib etmişdilər. Həmin lüğət türk dilinin 5 əsas qolundakı sözlərin farsca qarşılığını əhatə edir. Maraqlıdır ki, burada cığatay, rumi (Osmanlı dövlətinin dili), rus (tatar) və kalmık şivələri ilə yanaşı qızılbaşi şivəsində də sözlər verilmişdir. Buradan aydın olur ki, Səfəvi sarayında işlədilən Azərbaycan türkcəsini qızılbaşi dili adlandırırdılar.

Qızılbaşlıq *ələvilik* və *bektaşiliklə* birbaşa bağlıdır. Klassik dönəmdə qızılbaş termini daha çox işlənsə də, sonralar bunun yerini ələvi və bektaşi məfhumları tutmuşdur. Hazırda bu inancın daşıyıcıları əsasən ələvi adı ilə tanınırlar. Araşdırmalarda qızılbaşlıqla ələvi-bektaşilik arasındakı oxşar və fərqli cəhətlər tam dəqiqliyi ilə müəyyən edilməmişdir, bəzi tədqiqatlarda bunlar tam şəkildə eyniləşdirilir. Hər halda qızılbaşlıqla ələvi-bektaşiliyin çox yaxın və oxşar mahiyyətə malik olduqları şübhəsizdir. Onları birləşdirən mühüm cəhətlərdən biri *babailik* cərəyanından qaynaqlanmalarıdır. Qızılbaşlığı bəzən "kənd bektaşiliyi" adlandırırlar. Bektaşilər tarix boyunca Osmanlı üsuli-idarəsi ilə o qədər də ciddi problem yaşamamışlar (əksinə, Osmanlı ordusunun zərbə qüvvəsini təşkil edən yeniçərilər bektaşi ocağı sayılırdı), amma qızılbaşlar adətən daim təqib olunmuş, *rafizi* sayılmış, dini diskriminasiyaya məruz qalmışlar.

Türkman tayfaları arasında qızılbaşlıq inancının ilk cücərtilərinin yaranma tarixi İslamın ilk əsrlərinə gedib çıxır. İslam dini ilə tanışlıqdan sonra Əməvi zülmü qarşısında *Əhli-beytə* sevgini seçmiş türkmanlar bu sevgini öz yaşam tərzlərinə çevirmişlər. Orta Asiyadan Xorasana, oradan da Azərbaycandan keçərək Anadoluya köç etmiş gələcək qızılbaş tayfaları bu inancın ilk ocaqları, özəkləri idilər. Təsadüfi deyil ki, ələvi-bektaşi mənbələrində *"Rum abdalları"* ilə yanaşı *"Xorasan ərənləri"ndən* də bəhs edilir. Qızılbaşlıq uzun inkişaf yolu keçərək *qələndərilik, məlamətilik, axilik* və *hürufilikdən* də kifayət qədər faydalanmış, özündə bu təlimləri əritmişdir. Bütün bunlarla yanaşı, tədqiqatlar qızılbaş inancında qədim türk dünyagörüşünün və İslamaqədərki təfəkkürün də müəyyən izlərinin olduğunu göstərir.

Qızılbaş inancının inkişafında dövrün



siyasi mənzərəsinin də müəyyən rolu olmuşdur. Hakim əhli-sünnə ideologiyasına qarşı müxalifət mövqeyində durduğuna görə təzyiqlərlə üzləşən, buna görə daim qapanma halında qalmağa, müdafiə olunmağa ehtiyac duyan qızılbaşlar öz əqidələrini *batini* (simvolik) ayinlərlə pərdələməyə çalışmışlar. Bununla yanaşı, sonralar Səfəvilər dövlətinin ərazisinə qatılmış torpaqlarda qısamüddətli hakimiyyət sürmüş şiə məzhəbli və ya şiəliyə meyilli dövlətlər də qızılbaşlığın qol-budaq atmasına şərait yaratmışlar.

***Mənbələr:*** *Ə.Gölpınarlı. Qızılbaş (tərcümə edən: V.Vəli; "Fərhəng" dərgisi, h.-ş. 1366, №1), s.169-184; Ahmet Turan. Anadolu Alevileri-Kızılbaşlar (Ondokuz Mayıs Üniversitesi İlahiyat Fakültesi Dergisi, Cilt 6, Sayı 6, 1992), s.45-60; Türkiye Diyanet Vakfı İslam Ansiklopedisi, XXV, 546-557; Vatan Özgül. Kızılbaşlık ve Türkmenler (Türk Kültürü ve Hacı Bektaş Veli Araştırma Dergisi, 2004/32), s.255-274; Fuad Köprülü. Türk Edebiyatı'nda İlk Mutasavvıflar, s.300-305; Mehmet Eröz. Türkiye'de Alevîlik Bektaşîlik; Səccadi Hüseyni. "Qızılbaş" sözünün semantik məna formaları ("Mütaliati-tarixi-İslam" dərgisi, 1396 h.-ş., №32, s.73-101); Aləmarayi-Səfəvi, s.30; Tarix-i aləm-ara-yi Abbasi (tərcümə və şərhlər: O.Əfəndiyev, N.Musalı), s.66; Hans R.Roemer. Qızılbaşlar – Səfəvi hökumətinin baniləri və qurbanları (farsca tərcümə: M.Cəlilvənd, "Ayəndə", il: 13), s.11-27; Ahmet Yaşar Ocak. Babaîler İsyanından Kızılbaşlığa: Anadolu'da İslâm Heterodoksisinin Doğuş ve Gelişim Tarihine Kısa Bir Bakış (Belleten Türk Tarih Kurumu, 2000, Cilt: 44, Sayı: 239), 129-159; Sadiq Nağıyev. Qızılbaşlıq haqqında; Hasan Onat. Buyruklara Göre Kızılbaşlık (doktora tezi); Ali Yaman. Alevilik ve Kızılbaşlık Tarihi.*



**ABDAL** – ərəb dilində "əvəz, dəyişik" mənasını verən "bədəl" sözünün cəm halıdır. Abdallar *rical əl-ğeyb* təbəqəsinə mənsub ali məqamlı şəxslərdir. Saylarının 7 olduğu deyilir. Yeddi iqlimin hər birində bir abdal sakindir və həmin iqlimi qoruyur. Onların hər biri öz gücünü 7 səmanın birindəki peyğəmbərdən alır. Abdallar istədikləri zaman istədikləri yerə ani olaraq səfər edirlər (tayyül-ərz), onların duası mütləq müstəcab olur. Abdallar məqam baxımından *qütbdən* aşağıda dururlar. Onlar maddiyyat aləmindən tam xilas olmuş, Haqqa qovuşmuşlar, dünya malından heç nələri yoxdur. Fərqli surətlərə düşə bilir, yalnız zərurət halında yeyir, yatır və danışırlar. Onların sükutu hikmət, elmi qüdrətdir. Abdallardan biri dünyasını dəyişəndə başqası onun yerini tutur, beləliklə, 7 abdalın yeri boş qalmır (sözün mənası da buradandır). Abdalların sayının 40, 70 və daha çox olduğu barədə də məlumatlar vardır, bəzi kitablarda onların hansı məntəqələrdən olmaları da qeyd edilib.

Klassik dini qaynaqlarda abdallar haqqında hədislərə rast gəlmək mümkündür. Ümumiyyətlə, abdallar haqqında mənbələrdəki məlumatlar bol olmaqla yanaşı, həm də ziddiyyətlidir.

Rəvayətə görə, 7 abdalın adları bu şəkildədir: Əbdülhəyy, Əbdülhəlim, Əbdülmürid, Əbdülqadir, Əbdülqahir, Əbdüs-

səmi və Əbdülbəsir. Bunları cəm halda "əbadilə" (əbdüllər) də adlandırırlar.
İslamın ilk əsrlərində bəzi böyük hədis və fiqh alimlərinə də abdal deyilmişdir. XIV əsrdə Bakı ətrafında yaşamış sufi Əbu Səid Abdal Bakuvinin *xanəgahı* xalq arasında məşhur idi. Neft quyularından biri ona *vəqf* edilmişdi, o da quyudan çıxan neftin qazancı ilə dolanır və ehtiyaclılara yardım edirdi. "Gülüstani-İrəm" kitabında yazılıb ki, Elxani sultanı Olcaytu onunla görüşmüş, Bakuvinin göndərdiyi hədiyyələrin tam halal olduğuna inandığı üçün onları satıb puluna özündən ötrü kəfən alınmasını tapşırmışdı. Abdal Bakuvinin məzarı Xəlifə damı adı ilə tanınırdı. Sonralar Xəlifə damı torpaq altında qalsa da, yeri pir kimi ziyarət edilirdi. XX əsrin əvvəllərində onun yerində Bakının mərkəzi ibadət ocağı sayılan Təzəpir məscidi tikildi.
Bəzən "abdal" məfhumu *"qələndər"lə* eyni tutulur. Qədim mənbələrdə abdal adlandırılan *dərviş* təbəqəsinin qiyafə və davranış baxımından qələndərlərə bənzədiyi görünür. Bəzən isə abdalları bektaşi dərvişləri ilə eyniləşdirirlər. Həqiqətən, mənbələrdə bir neşə bektaşi dərvişi Abdal ləqəbi ilə qeyd edilmişdir. Orta əsrlərdə İslam coğrafiyasında, xüsusilə Anadoluda məşhur dərvişlərə abdal deyirdilər (Abdal Musa, Abdal Murad, Kumral Abdal, Abdal Mehmed, Abdal Yaqub və b.). Şah İsmayıl Xətai *"Nəsihətnamə"də* Allahı müqəddəs dəyərlərə və şəxslərə and verdikdən sonra Rum abdallarını da qeyd etmişdir:

Urum abdalları sidqi həqiçün,
Xorasan pirləri nitqi həqiçün!

*(Ş.İ.Xətai)*

Səfəvilər zamanında abdal ləqəbi kifayət qədər geniş yayılmışdı. I Şah İsmayılın ilk və ən yaxın silahdaşlarından biri *Abdal bəy Dədə Zülqədər* idi. Ələvi-bektaşi ənənələrini öz əsərlərində yaşatmış *Pir Sultan Abdal*, *Miskin Abdal* kimi *ozan*-şairlər qızılbaş mədəni irsinin formalaşmasında mühüm rol oynamışlar. "Tarixi-aləmarayi-Abbasi" kitabında Səfəvilər dövrünün siyasi hadisələrində mühüm rol oynamış Abdal sultan Qacar, Xan Abdal Mokri və başqa şəxslərin adları çəkilir.
I Şah İsmayılın şeirlərindən məlum olur ki, qızılbaş qoşununda abdallar da xidmət edirdi:

Şahın övladına iqrar edənlər
Əxilər, qazılar, abdallar oldu.

*(Ş.İ.Xətai)*

"Şeyx Səfi təzkirəsi"ndə deyilir ki, *Şeyx Səfinin* qardaşı *Xacə Səlahəddin Rəşid* əvvəlcə *Şeyx Zahidin* xidmətində olmuş və uca məqama çatmışdı. Amma ilahi sirri gizli saxlamadığı və yaydığı üçün qardaşı ilə aralarında narazılıq yarandı və Şeyx Səfi ondan Şeyx Zahidə şikayət etdi. Şeyx Zahid də Xacə Səlahəddini mərtəbəsindən aşağı endirməyi qərara aldı: "Onu ol mərtəbədən endürmək gərək". Pəs, məşayix (şeyxlər) ikisi dəxi ittifaq eyləyüb ol yuxarı qütblük aləmdən bir parə endürdilər və abdallıq mərtəbəsinə yetürdilər. Amma kəşf ilə qədəm ondan almadılar və Xacə Səlahəd-



din Rəşid bu halda qaldı ol çağadəkin kim, Şeyx Zahid Yəmən ilə Şam məmləkətlərinün xilafətlığı ona rücu eylədi və ondan sonra onun əvvəlki halı olmaz idi".

Sonralar "abdal" kəlməsi sadəlövh, hətta əqli cəhətdən qüsurlu şəxs mənasında işlənməyə başlamışdır; bu, *təsəvvüf* terminologiyasındakı abdal anlayışının tam ziddinədir.

***Mənbələr:*** *Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.47-48; Türkiye Diyanet Vakfi İslam Ansiklopedisi, I, 59-62; Ahmet Yıldırım. Tasavvufda Ricalu'l-Gayb Telakkisi ve Konuyla İlgili Bazi Rivayetler, Süleyman Demirel Üniversitesi İlahiyat Fakültesi Dergisi, Yıl: 1997, Sayı: 4, s.122-125; Şeyx Səfi təzkirəsi ("Səfvətüs-səfa"nın XVI əsr türk tərcüməsi), s.100; Natig Rahimov. Azerbaijan's Contribution to Islamic Culture. An Undicsovered Treasure ("Contributions of The Eurasian Nations to Islamic Culture"), p.180; Şah İsmayıl Xətai. Əsərləri (2 cilddə), I, 58 və II, 392.*

**ABİ-HƏYAT** – təsəvvüf ədəbiyyatında və irfani şeirlərdə tez-tez rast gəlinən ifadə. "Abi-heyvan" şəklində də işlədilir (ərəbcə dirilik, həyat suyu deməkdir). Dini rəvayətlərə görə, zülmət dünyasında, hamıdan gizli olan məkanda bir çeşmə var ki, ondan su içən adam əbədi həyat qazanır və ölümsüz olur. Xızr və İlyas həmin çeşməni tapıb suyundan içmiş və ölümsüzlük qazanmışlar, Zülqərneyn isə buna müvəffəq olmamışdır.

Təsəvvüfdə abi-həyat *eşq* və *mərifət* çeşməsidir. Bunu içən *arifin* qəlbi əbədiyyət qazanar, heç zaman Allahın rəhmətindən və mərifət aləmindən ayrı düşməz (məcazi mənada "ölməz"). Bəzən abi-həyatı elm və hikmət kimi də təfsir edirlər.

Səfəviyyə təriqətinin banisi Şeyx Səfiəddin Ərdəbili deyirdi: "Pəs *talib* (*seyrü-süluk* yoluna təzə qədəm qoymuş şəxs) gərək kim, dilini bağlayub *mürşidün* əmrinə müti olub mütləqa etirazdan eraz eyləsün (çəkinsin), ta hikmət ilə mərifətün heyvan suyuna yetə. Və ol cavidanlu zülal Tanrınun məhəbbət şərabıdur kim, mərifət çanağı ilən içilür. Və onun susuzu dirilik suyu içməz, zira kim həyat suyu dirilik xatiri içün içərlər və eşqün susuzu canın oynamağın istər".

Zülmat içində abi-həyat istəməz könül,
Ləlin zülali çeşmeyi-heyvan yetər mana.

Xızri-cavidan əlindən içmişüz abi-həyat,
İsiyi-Məryəm qatında qurmuşuz xərgahimiz.
*(Ş.İ.Xətai)*

Bəzən abi-həyatı aşiqlərin gözündən axan yaş kimi də təfsir edirlər. İbadət və dua zamanı Allahın şövqündən bəndənin göz çeşməsindən süzülən su ölü qəlbi dirildən, dünya zülmətinə nur saçan dirilik suyudur.

***Mənbələr:*** *Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.2-3; Şeyx Səfi təzkirəsi ("Səfvətüs-səfa"nın XVI əsr türk tərcüməsi), s.439; Şah İsmayıl Xətai. Əsərləri (2 cilddə), I, 70 və 268; S.Ə.B.Şirazi. Şərhi-cünun (Hafiz Şirazi divanının mövzular üzrə şərhi), I, 469-470.*

**ALƏMİ-ZƏRR** – İslam inancına və sufi dünyagörüşünə əsasən, insanlar hələ cisim kimi xəlq olunmazdan qabaq yaradılışdan əvvəlki misal aləmində fərqli bir formada mövcud olmuşlar. Allah-Taala onların imanını yoxlamaq üçün hamısını bir yerə toplayaraq "Məgər mən sizin Rəbbiniz deyiləmmi?" sualını vermiş, mömin ruhlar bu suala müsbət ("*qalu bəla*", yəni "dedilər: bəli"), kafir ruhlar isə mənfi cavab vermişlər. Bu məclisə insanların hansı formada qatılmaları barədə alimlərin fikirləri fərqlidir. Bəzilərinin fikrincə, insanlar bu zaman xırda zərrələr şəklində mövcud idilər; ona görə həmin hadisəyə "aləmi-zərr" demişlər. Digər nəzəriyyəyə görə, bu ifadə "zürriyyə" (nəsil) sözündən götürülüb, çünki həmin məclisdə iştirak edənlərin hamısı həzrət Adəmin (ə) zürriyyəsi idi.

Aləmi-zərr məfhumu *ələst məclisi*, bəzmi-ələst, qalu bəla anlayışları ilə paralel şəkildə istifadə edilir.

*bax:* **ƏLƏST MƏCLİSİ.**

***Mənbələr:*** *Əllamə Məclisi. Mirat əl-üqul, VII, 37-38; Əllamə Məclisi. Bihar əl-ənvar, III, 281; V, 261; Qurani-Məcidin ədəbi və irfani təfsiri (Xacə Abdullah Ənsarinin kəlamları əsasında Miybədinin qələmə aldığı "Kəşf əl-əsrar" təfsirinin xülasəsi), s.361; Qısa İslam Ensiklopediyası (N.Rəhimovun ümumi redaktəsi ilə, 2 cilddə), I, 16-17.*



**ALƏMLƏR** – İbn Ərəbi tərəfindən əsası qoyulmuş *vəhdəti-vücud* nəzəriyyəsinə görə, aləmlərin sayı sonsuzdur, amma onları şərti olaraq 18 min aləm adlandırırlar. Bu aləmlər 5 təbəqəyə bölünüb: *lahut aləmi, cəbərut aləmi, mələkut aləmi, nasut aləmi* və insan. Bunları sufi ədəbiyyatında "həzərati-xəmsə" (beş həzrət) də adlandırırlar.

Varlıq Tək Həqiqətdən (Allahdan) ibarətdir, Allah əzəldə var idi, Onunla yanaşı heç nə yox idi. Bu aləmə lahut aləmi, əhədiyyət, qeybi-mütləq, ümmül-kitab, la təəyyün (qeyri-müəyyən) də deyirlər. Orada Allahın sifətləri və isimləri hələ *təcəlla* etməmişdi. (İrfani şeirlərdə rast gəlinən və hədisi-qüdsidən götürülmüş "küntü kənz" ifadəsi bununla bağlıdır).

Sonra Allah Öz sifətlərini aşkara çıxarmaq üçün Zatının ilk təcəllasını etdi. Bu təcəlladan cəbərut aləmi yarandı. Ona əqli-əvvəl, həqiqəti-Mühəmmədiyyə, *Lövhi-məhfuz*, təəyyüni-əvvəl də deyirlər. Bu aləm mahiyyətlər aləmidir, kamil varlıqlar burada toplanıb.

Cəbərut aləmindən mələkut aləmi yarandı, onun digər adları əmr aləmi, ikinci təəyyün aləmi, misal aləmidir.

Sonra mülk aləmi, başqa sözlə desək, nasut aləmi, fələklər aləmi meydana çıxdı. Bura şühudiyyət məqamıdır, yəni Allahın ad və sifətləri bu aləmin sakinləri tərəfindən müşahidə edilir.

Nəhayət, aləmlərin beşinci mərtəbəsi insan aləmidir. Əvvəlki dörd aləm birlikdə aləmi-kübranı (böyük aləmi) təşkil edir. İnsan isə aləmi-suğradır (kiçik aləm), böyük aləmin modelidir. İnsan əvvəlki dörd aləmin məcmusudur və Allahı özündə tam təcəlla etdirməyə qadirdir.



Sufilər Mühəmməd Peyğəmbərin (s): "Allah Adəmi Öz surətində yaratdı" hədisini və həzrət Əlinin (ə) aşağıdakı kəlamını buna sübut gətirirlər:

Ey insan, sən özünü kiçik bir zərrə
sayırsan,
Amma sənin daxilində böyük bir aləm
toplanıb.

Bütün aləmlər bir dairə şəklində təsəvvür edilə bilər, onun mərkəzində lahut aləminin tək varlığı olan Allah durur. Dairənin yuxarısında cəbərut aləmi, aşağısında insan aləmi yerləşir, qalan bütün aləmlər (mələkut və mülk aləmlərinin bölümləri) bu dairənin içini doldurur. Allah bütün aləmlərə təcəlla edir və bütün aləmlərin nəzər-diqqəti mərkəzdə duran Allaha yönəlib.
Bəzi kitablarda aləmlərin təsnifatı 5 yox, 7 qrup üzrə bölünüb: 1. Əhadiyyət (la təəyyün) aləmi; 2. Birinci təəyyün (həqiqəti-Mühəmmədiyyə) aləmi; 3. İkinci təəyyün aləmi; 4. Ruhlar aləmi; 5. Misal (cəbərut) aləmi; 6. Cisimlər (mülk) aləmi; 7. İnsan aləmi.

***Mənbələr:** Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.115-117 və 284; Əzizəddin Nəsəfi. İnsani-kamil, 12-ci risalə; Süleyman Ateş. İşari Tefsir Okulu, s.260-264; Ahmet Avni Konuk. Fususu'l-Hikem Tercüme ve Şerhi, I, 5-17; İbrahim Həqqi. Mərifətnamə, 5-6; Divani-Əmirəlmöminin, s.175-178 (599-602-ci beytlər).*



**ARİF** – təsəvvüf ədəbiyyatında *mərifət* və *irfan* sahibinə verilən ad, *seyrü-süluk* yolunun yüksək mərhələsində olan şəxs. Sözün ərəb dilindən hərfi tərcüməsi "tanıyan, bələd olan" deməkdir. Allah-Taalanın zati, sifati və feili təcəllalarını müşahidə edən, bunları elm yox, hal və mükaşifə yolu ilə qazanan şəxs arif sayılır. Arifin sahib olduğu biliyə mərifət və irfan deyirlər. Təsəvvüf mənbələrində arifin məqamı *sufidən* daha üstün sayılır; hər arif sufidir, amma hər sufi arif deyil.
Dini mətnlərdə arifin dərəcəsi çox uca tutulur. Həzrət Əli ibn Əbu Talib (ə) buyurmuşdur: "Arif dünyadan köçəndən sonra onu nə qiyamətdə, nə behiştdə, nə də cəhənnəmdə taparlar". Soruşdular: "Bəs arif harada olar?" Cavab verdi: "Mülk və qüdrət sahibi olan Allahın hüzurunda, sidq məkanında".
İmam Cəfər Sadiqə (ə) mənsub edilən "Misbah əş-şəriə" ("Şəriət çırağı") kitabında isə ariflər haqqında deyilir: "Arif o şəxsdir ki, özü xalq ilə, qəlbi isə Allah ilədir. Əgər bir göz qırpımı müddətində qəlbi Allahdan ayrılsa, onun şövqündən ölər. Ariflər Allahın əmanətlərinə, Onun sirlər xəzinəsinə, nurlar mədəninə, xəlqinə olan rəhmət dəlilinə, elmlər miniyinə, fəzilət və ədalət mizanına əmindirlər. Onlar xəlqdən, arzulardan və dünyadan ehtiyacsızdırlar. Onların Allahdan başqa munisləri yoxdur; onların nitqi Allah ilə, nəfəsləri də Allah ilədir".
İslamın ilk əsrlərində "sufi" sözü əvəzinə çox zaman həmin mənanı ifadə edən "arif" və "zahid" kəlmələri işlədilirdi. Hicri III əsrə qədərki dövrə aid olan mənbələrdə "arif" deyilərkən məhz sonralar sufi adı altında qəbul edilən məna

başa düşülürdü. Məsələn, məşhur sufi Bayezid Bistaminin aşağıdakı kəlamında "arif" sözü altında sufi nəzərdə tutulur: "Arifin kamilliyi haqqın məhəbbəti ilə yanmasındadır". "Arif Mərufu (tanınanı, yəni Allahı) görər, alim isə aləmlə məşğul olar. Alim düşünər ki, nə edim. Arif xəbər verər ki, O (Allah) nə edir".

Arif isən, qoymagil əldən həqiqət mənzilin,
Aqil isən, dinyeyi-ğəddarə vermə ixtiyar.
*(Ş.İ.Xətai)*

***Mənbələr:*** *Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.565-566; Seyid Ziyaəddin Səccadi. İrfan və təsəvvüfün əsaslarına giriş, s.8-9; İmam Cəfər Sadiq. Şəriət çırağı (Misbah əş-şəriə, ərəb dilindən tərcümə edən: Ə.Əhmədov), s.109; Şah İsmayıl Xətai. Əsərləri (2 cilddə), I, 195; M.Mütəhhəri. İslam elmləri külliyyatı, II, 130-134.*



**AŞİQ** – bütün davranışları eşqə tabe olan, qəlbi *eşq* ilə dolu insan. *İrfan* aləmində *vəcd* ilə Allahı axtaran, həqiqi Məşuqdan (Allahdan) savayı heç nəyin axtarışında olmayan şəxs aşiq sayılır. Həqiqi aşiq zaman və məkan çərçivəsindən çıxar, özündən bixəbər olar, Məşuqun həsrətindən qəlbi yanar, daim ahfəğan edər. Klassik ədəbiyyatda əql (ağıl) ilə eşq bir-birinin ziddi kimi təqdim edilir, əql olan yerdə eşq yaranmaz, eşq olan yerdə isə əql qalmaz. Aşiq əgər əqlə tabe olsa, deməli, həqiqi aşiq deyil. Sufilər deyiblər ki, aqilin yeri dünya, aşiqin yeri isə axirətdir. Aşiqi-sadiq (əhdinə vəfalı olan aşiq) öz canını Məşuqa təslim edər, bununla da kamilliyə çatar.

Aşiq oldur kim, bilə Cananını,
Ona qurban eyləyə öz canını.
*("Şeyx Səfi təzkirəsi"ndən)*

Dünyada aşiq olan geydi məlamət donunu,
Hər yetən aşiq olurmu dərd ana kar olmasa.
Aşiqin meydanda başı top yerinə çalınur,
Başını meydana qoymaz kim ki sərdar olmasa.
*(Ş.İ.Xətai)*

*Şeyx Səfiəddin Ərdəbili* kəlamlarının birində *seyrü-süluk* yolunun yolçularını mərtəbələr üzrə sadalayır: müqəllid (ilk pillə olan *şəriət* mənzilindədir), arif, aşiq və məşuq. Aşiq Allahı sevərək elə bir məqama çatar ki, Allah da ona eşq bəsləyər və aşiqin özü məşuqa çevrilər. Bu, ən üstün dərəcə olan məqami-mahmuddur və peyğəmbərə (s) məxsusdur.
Şeyx Səfinin bir irfani şeirə verdiyi şərhdən məlum olur ki, aşiqin qəlbini atəşkədəyə (atəşgaha) bənzətmişlər, ona "deyri-muğan" (atəşpərəst muğların məbədi) da demişlər. Atəşgah od məkanı olduğu kimi, aşiqin qəlbində də ilahi eşqin tonqalı alovlanır. Atəşpərəstlər oda tapındıqları kimi, aşiq də yalnız eşqi qəbul edər, eşqə inanar və eşqə tabe olar.
*bax:* **EŞQ.**

***Mənbələr:*** *Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.566-567; Qara məcmuə, s.57; Şeyx Səfi təzkirəsi ("Səfvətüs-səfa"nın XVI əsr türk tərcüməsi), s.443; Şah İsmayıl Xətai. Əsərləri (2 cilddə), I, 89.*



**AYİN** – sufi təriqətlərində, o cümlədən *ələvi-bektaşilikdə* icra edilən xüsusi



rituallar məcmusu. *Təriqətləri* birləşdirən ümumi ayinlər olduğu kimi, hər təriqətin spesifik ayinləri də vardır. Ümumi ayinlərin ən geniş yayılmışları *zikr*, *xəlvət*, *tövbə* təlqini, *səma* və s.-dir. Təriqət ayinləri reqlamentə uyğun, dəqiq və ciddi şəkildə icra edilirdi, çünki bu ayinlər sufi üçün ibadət qədər mühüm idi. Ayinlərə etinasız yanaşmaq, adabı pozmaq sufiyə yaraşmayan nöqsan idi. Bəzi təriqətlər öz ayinlərini gizli saxlayır, yalnız ləyaqəti çatanların (əhlullah) bu ayinləri icra və müşahidə etməsinə şərait yaradırdı.

Mövləviyyə təriqətində səma, nəqşbəndiyyə təriqətində xətmi-xacəgan, qadiriyyə təriqətində dövran, şaziliyyədə hədra, xəlvətiyyədə zərbi-əsma, yəsəvilikdə zikri-ərrə kimi ayinlər mövcuddur. Ələvi-bektaşi ayinləri arasında *cəm məclisi* xüsusi yer tutur.

Sufi ayinləri incəsənət və folklorla sıx bağlıdır. Səma ayini, bir qayda olaraq, ney və qaval musiqisi ilə müşayiət edilirdi, onun təqsim, peşrev, yürük kimi instrumental tərkib hissələri var idi. Ayinxan adlanan sufilər səma zalının nisbətən yüksək bir yerində musiqiçilərin yanında oturur və əsasən Mövlananın "Məsnəvi"sindən müəyyən parçaları avazla oxuyurdular. Orta əsrlərdə səma ayininin icrası üçün onlarla musiqi bəstələnmişdi. Ələvi-bektaşi ayinlərində oxunan saz havaları, dini motivlərə dayanan rituallar zəngin folklor xəzinəsini təşkil edir.

***Mənbələr:*** *Türkiye Diyanet Vakfı İslam Ansiklopedisi, IV, 250-252; Ethem Cebecioğlu. Tasavvuf Terimleri ve Deyimleri Sözlüğü, "ayin" ve "ayin-i ehlullah" maddələri.*

**AYİNİ-CƏM** – *bax:* **CƏM AYİNİ.**

**BABA** – *bax:* **DƏDƏ.**

**BABAİLİK** – XIII əsrdə yaranmış təsəvvüf təriqəti və fikir cərəyanı. Babaiyyə təriqətinin banisi Xorasan əsilli Baba İlyasdır, onun vəfaiyyə təriqətindən olduğu deyilir. Xorasandan Anadoluya köçmüş, Amasyada məskunlaşmış Baba İlyas əhali arasında xeyli məşhurlaşmış, nəticədə hətta Anadolu səlcuqları tərəfindən yüksək dövlət vəzifəsinə gətirilmişdi. Adındakı "*baba*" sözü türk təsəvvüf ənənələrinə bağlı olduğunu göstərir. Baba İlyasın yaratdığı təriqət özündə ənənəvi İslamı, *batiniliyi* və türk inancını birləşdirirdi. Müasirləri onu əhlisünnə əqidəsindən uzaq, batini biliklərə və simvolikaya bağlı, *Əhli-beyt* sevgisini yayan bir təriqət *şeyxi* kimi xarakterizə etmişlər. Baba İlyasın *müridi* Baba İshaqın zamanında təriqət özünə xeyli tərəfdar topladı, hətta Səlcuq sarayına da nüfuz etdi. Hakimiyyətin rəğbətini qazanmış babailər bölgədə söz sahibi olmağa başladılar. 1220-ci illərdə Xarəzmşahlar dövlətinin monqol hücumu qarşısında süqut etməsindən sonra Orta Asiyadan Anadoluya köç etmiş türkmanlar burada məskunlaşma ilə bağlı ciddi problemlər qarşısında qaldılar. Yerli əhali ilə onların arasında yaylaq və qışlaq torpaqları mövzusunda gərginlik yarandı. Belə bir şəraitdə Baba İshaq köç-

kün türkmanların etibarını qazanaraq onları öz ətrafında birləşdirdi və onlara gözəl yaşayış vəd etdi. Problemin həllini silahlı üsyanda görən türkmanlar 1239-cu ildə Baba İshaqın ideoloji rəhbərliyi altında hərəkata başladılar. Üsyançılar qısa müddət ərzində Malatya, Sivas, Maraş, Kırşehir şəhərlərini ələ keçirdilər və Anadolu Səlcuq dövlətinin bir neçə ordusunu ardıcıl olaraq məğlubiyyətə uğratdılar. Lakin bir ildən sonra babai üsyanı amansızlıqla yatırıldı, cəzadan can qurtaran üsyan iştirakçıları isə təriqətə daha sıx bağlandılar. Üsyanın yatırılmasından sonra babai təriqəti daha çox qapalı və batini xarakter aldı. Əhli-beytə ifrat sevgi, əhli-sünnə əqidəsi ilə barışmazlıq, dini hökmləri türk milli adət-ənənələri ilə birləşdirmə cəhdləri, xalq ədəbiyyatı vasitəsilə təriqətin yayılması babailiyin xarakterik cəhətlərini təşkil edirdi.

Babailik *bektaşilik*, *ələvilik*, *qızılbaşlıq* təlimlərinin yaranması üçün əsas baza rolunu oynamışdır. Bektaşiliyin banisi Hacı Bektaş Vəli Xorasandan Kayseriyə gəldikdən sonra Baba İlyasla görüşmüş, ona müridlik etmiş, daha sonra öz təriqətini yaratmışdır. Qızılbaş inanc sisteminin bəzi mühüm elementləri də babailikdən qaynaqlanır.

***Mənbələr:*** *Türkiye Diyanet Vakfı İslam Ansiklopedisi, IV, 373-374; Enver Behnan Şapolyo. Mezhepler ve Tarikatlar Tarihi, s.415-418; The Encyclopaedia of Islam (New Edition), I, 843-844; Ahmet Yaşar Ocak. Babailer İsyanı. Aleviligin Tarihsel Altyapısı; Ahmet Yaşar Ocak. Babaîler İsyanından Kızılbaşlığa: Anadolu'da İslâm Heterodoksisinin Doğuş ve Gelişim Tarihine Kısa Bir Bakış (Belleten Türk Tarih Kurumu, 2000, LXIV, Sayı: 239), 129-159; Bahattin Keleş. Baba Ishak Isyanı'nın Anadolu Selçuklu Tarihindeki Yeri ve Önemi (Fırat Üniversitesi Ilahiyat Fakültesi Dergisi 23:1 (2018), s.73-91.*



**BABƏKİYYƏ** – *xürrəmiyyə* hərəkatını klassik mənbələrdə bəzən bu şəkildə adlandırmışlar. Babəkdən əvvəl də xürrəmiyyə hərəkatını ayrı-ayrı bölgələrdəki xürrəmi qruplaşma rəhbərlərinin (cavidaniyyə), yaxud bundan əvvəl və ya paralel şəkildə baş vermiş hərəkatların başçılarının adı ilə bağlamışlar (Əbu Müslimiyyə, sunbaziyyə, məzdəkiyyə, mazyariyyə və s.). 816/817-ci illərdə Cavidanın ölümünün ardınca Babək xürrəmiyyə hərəkatının başına keçmiş, bundan sonra hərəkata bəzən babəkiyyə də deyilmişdir.

*bax:* **XÜRRƏMİYYƏ**.



**BACİYANİ-RUM** – ifadənin hərfi tərcüməsi "Rum bacıları" deməkdir. Anadoludakı təsəvvüf hərəkatında özünəməxsus yer tutan, qadınlardan ibarət bir təbəqədir. "Baciyani-Rum" ifadəsinə klassik mətnlərdən yalnız XV əsrdə yaşamış "Aşiqi" təxəllüslü ədib və tarixçi Dərviş Əhməd Aşikpaşazadənin tarix kitabında rast gəlinir. İfadənin yalnız bir mənbədə mövcudluğu hətta onun nüsxə fərqləri nəticəsində "haciyani-Rum" (Rum hacıları) və ya "bahşiyani-Rum" (Rum ruhaniləri) sözlərinin təhrifindən yaranması nəzəriyyəsini yarat-



mışdır. Aşikpaşazadə tarixində deyilir: "Və bu Rumda dörd tayfa vardur kim, müsafirlər içində anılur. Biri qaziyani-Rum və biri əxiyani-Rum və biri abdalani-Rum və biri baciyani-Rum. İndi Hacı Bektaş Sultan bunlarun içində baciyani-Rum ixtiyar etdi kim, o, Xatun Anadur. Onu özünə qız etdi, kəşfü kəramətini ona göstərdi, təslim etdi, özü Allahın rəhmətinə vardı". Bəzi tədqiqatçıların fikrincə, baciyani-Rum şəbəkəsinin qurucusu Anadolu *əxi* hərəkatının lideri Əxi Evrənin xanımı (və şeyxinin qızı) Fatimə olmuşdur.

Türk ənənəsinə uyğun olaraq Anadoluda qadınlar da kişilərlə yanaşı ictimai-mədəni həyatda fəal iştirak etmişlər. Bektaşi təriqətinin qadın üzvlərini "bacı" adlandırırdılar, təriqət başçılarının xanımlarına isə təriqət üzvləri "ana-bacı" deyə müraciət edirdilər. XV əsrdə müsəlman Şərqinə səfər etmiş Burqundiya səyyahı Bertrandon de la Broquiere *Zülqədəroğulları bəyliyinin* hərbi qüvvələrində kişilərlə yanaşı 30 min (və ya hətta 100 min) qadının da xidmət etdiyini yazmışdır.

Baciyani-Rumun ən mühüm siması Hacı Bektaş Vəlinin qızlığa qəbul etdiyi Xatun Anadır (o, Kadıncık Ana adı ilə də tanınır). Rəvayətə görə, Xatun Ana öz var-dövlətini ərənlərin yolunda xərcləmiş, İdris adlı bir sufi ilə evlənmiş və yeddi oğul sahibi olmuşdur. Amma evliliyinin əvvəllərində sonsuz olduğu, Hacı Bektaş Vəlinin kəraməti sayəsində hamilə qaldığı da rəvayət edilir. O, *bektaşiyyə* təriqətinin məşhur nümayəndəsi Abdal Musanın müəllimi olmuş, Hacı Bektaş Vəlinin vəfatından sonra onun qəbrinin üzərində türbə tikdirmişdir.

***Mənbələr:*** *Aşikpaşazadə tarixi, s.571; Fuad Köprülü. Osmanlı Devleti'nin Kuruluşu, s.93-94; Türkiye Diyanet Vakfi İslam Ansiklopedisi, IV, 415; Mikail Bayram. Anadolu Selçukluları Devrinde Anadolu Bacıları (Baciyan-i Rum) Örgütünün Kurucusu Fatma Bacı Kimdir? (Yıl: 1981, Cilt: 45/2, Sayı: 180), s.457-482.*



**BADƏ** – *irfan* ədəbiyyatında işlədilən əsas terminlərdən biri. *Mey* və şərab anlayışlarına yaxın məna ifadə edir. Təsəvvüfdə badə deyərkən ilahi eşq, şövq nəzərdə tutulur. Salikin (*seyrü-süluk* yolçusunun) qəlbinə dolan Allah sevgisi onu şərab kimi məst edər. Badə bəzən ilahi mərifət mənasında da işlədilir ki, *saqi* və *pir* (piri-muğan) onu salikə təqdim edir. Mey və badə anlayışını Allahın *zikrindən* yaranan nəşə (ləzzət, zövq) kimi də izah edirlər. Həmçinin bəzən *arifin* ilahi eşq və irfanla dolu qəlbi badəyə (qədəhə) bənzədilir. Bu mənada klassik şeirlərdə "badeyi-ləbriz" (dolu, aşıb-daşan qədəh) ifadəsinə də rast gəlirik.

Arayişi-söhbət eylə, saqi,
Ver badə, mürüvvət eylə, saqi.
Bir cam ilə qıl dimağımı tər,
Ver badə, bir iltifat göstər!

*(M.Füzuli)*

Ey Xətai, içdigin mey abi-kövsərdir müdam,
Nuşi-can et, badədən bir ləhzə ikrah eyləmə!

Hər xəstədil ki, badeyi-eşqinlə oldu məst,
Çeşmini saqi, ləlini cami-şərab oxur.

*(Ş.İ.Xətai)*

*bax:* **MEY**, **SAQİ.**

***Mənbələr:*** *Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.177-178; Seyid Ziyaəddin Səccadi. İrfan və təsəvvüfün əsaslarına giriş, s.41-42; 277; Rzaqulu xan Hidayət. Riyaz əl-arifin, s.41; Qısa İslam Ensiklopediyası (N.Rəhimovun ümumi redaktəsi ilə, 2 cilddə), I, 276-278; Şah İsmayıl Xətai. Əsərləri (2 cilddə), I, 187 və 441.*

**BATİNİYYƏ** – məfhumların batini (iç) mənalarına əhəmiyyət verən, hər şeyin batini mahiyyətini zahiri mahiyyətindən üstün tutan ezoterik təlim. Geniş anlamda hələ İslamın gəlişindən əvvəl də metafizik təmayüllü batini təlimlər Şərqdə geniş yayılmışdı. Hətta xristianlığın müqəddəs kitabı olan Bibliyada həvari Pyotrun korinflilərə ikinci məktubunda da ilahi təlimin zahirə (yazıya, hərflərə) deyil, batinə (mənaya) bağlı olduğu deyilir: “Bu Yeni Əhd yazılı Qanuna (hərflərə) deyil, Ruha əsaslanır. Çünki yazılı Qanun öldürür, Ruh isə həyat verir” (Pyotrun korinflilərə ikinci məktubu, 3:6). İslamın gəlişindən sonra batiniyyə təlimi xüsusilə inkişaf edərək genişmiqyaslı bir təlim kimi formalaşmışdır. Bəzən dar mənada batiniyyə adını *şiəliyin* ismailiyyə təriqətinə və bu təriqətin məşhur nümayəndələrindən olan Abdullah ibn Meymun Qəddah Əhvazinin ardıcıllarına aid edirlər. Batiniyyə təlimi Fatimi xəlifələri tərəfindən dəstəklənmiş, qərmətilər və həşşaşilər zamanında özünün ən yüksək inkişaf mərhələsini yaşamışdır.

Batiniyyə təliminə əsasən, hər bir məfhumun zahiri mənası olduğu kimi, batini mahiyyəti də vardır, batini mahiyyət zahirdən daha mühüm və daha həlledicidir. Hətta Qurani-Kərimin ayələrinin də zahiri şərhi (təfsir) ilə yanaşı batini izahı (təvil) mövcuddur. Batini mənaları anlamağa hər kəs qadir deyildir, bunu yalnız Allah tərəfindən təyin edilmiş məsum imam və ya onun nümayəndəsi bacarar. Buna görə də batiniyyə təliminə aid biliklər çox gizli şəkildə şəxsdən-şəxsə ötürülmüş, “əhli olmayan”lardan səylə gizlədilmişdir. Batiniyyə mövzusunda qələmə alınmış ədəbiyyatın da son dərəcə üstüörtülü və simvolik dilə malik olmasının səbəbi budur.

İslam mədəniyyəti çərçivəsində batiniyyə düşüncəsinə əsaslanan bir neçə metafizik elm (ülumi-ğəraib) və cərəyan yaranmışdır. Hərflərin batini mənalarından və gücündən bəhs edən elmi-hüruf (hərflər elmi), hər bir sözün ədədi ekvivalentinin müxtəlif metodlarla hesablanmasına əsaslanan əbcəd elmi, göy cisimlərinin, planet və ulduzların səmadakı düzülüşünün Yer üzərindəki hadisələrə təsir edə bilməsi inancına əsaslanan nücum (astrologiya) elmi, hər bir əşyanın cədvəllər vasitəsilə dəqiq koordinatlarının təyin edilə bilməsini əsas tutan cəfr və rəml elmləri, kimyəvi elementlərin daxilindəki qüvvədən istifadə yolu ilə onun mahiyyətinin dəyişdirilə bilməsini, hətta fərqli metallardan qızıl alınmasını əsaslandıran əl-kimiya elmi, insanların zahiri görünüşü, qiyafəsi, danışığı



əsasında gələcəkdən xəbər vermək iddiaları və s. bura aiddir. Bəzi surələrin əvvəlində rast gəlinən hərflərin (*hürufi-müqəttəə*) mənası barədə mübahisələr, Quranın yeddi hərf üzərində nazil olması barədə hədislər də batiniyyə inancının müzakirə mövzusuna çevrilmişdir. *Xürrəmilik*, *hürufilik*, *vəhdəti-vücud* kimi cərəyanlar, ismailiyyənin qolları olan nizarilər, druzlar, qərmətilər də batiniyyə ilə birbaşa əlaqəlidir. Batiniyyə təlimi təsəvvüf və fəlsəfə ilə, astronomiya, kimya, hesab elmləri ilə sıx surətdə bağlıdır.

Batinilər öz mövqelərini isbat etmək üçün Qurani-Kərimin bəzi ayələrinə əsaslanırdılar: “Onların (möminlərlə münafiqlərin) arasına qapısının batinində (içəri tərəfində) mərhəmət və zahirində (bayır tərəfində) əzab olan bir sədd çəkiləcəkdir” (Hədid, 13). “Onların (yozuma ehtiyacı olan ayələrin) yozumunu (həqiqi mənasını) Allahdan və elmdə qüvvətli olanlardan başqa heç kəs bilməz” (Ali-İmran, 7). “Kafirlər elmini qavraya bilmədikləri və hələ yozumu onlara gəlib çatmamış Quranı yalan hesab etdilər” (Yunus, 39).

Mühəmməd Peyğəmbərin (s) Qurani-Kərim haqqında belə buyurduğunu rəvayət etmişlər: “Quranın zahiri və batini var, hər batinin də iç-içə yeddiyə kimi batini vardır”. Həzrət Əlinin (ə) bu hədisi də yaxın mənanı ifadə edir: “Onun (Quranın) zahiri vacib olan əməldir, batini isə gizli, pərdəli elmdir”. Batinilərə görə, Qurani-Kərim ayələrinin və hədislərin zahiri mənası qabıq kimidir, onların məğzi (batini mənası) isə bu qabığın altındakı ləpəyə oxşayır. Batini mənaları anlamağa qadir olmayanlar hər şeyin zahirində ilişib qalmışlar, onlar kor-koranə təqlid əhlidirlər. Yalnız seçilmişlər zahirin altındakı batini görməyə qadirdirlər.

Batinilərin inancına görə, peyğəmbər (s) aldığı vəhyi söz qəlibinə salaraq insanlara çatdırır, amma onlar bu kəlamların yalnız zahiri tərəfini görürlər. İmamlar (ə) isə bu zahirin altında gizlənmiş batini mənaları açıb izah edirlər. Batinilər cənnət və cəhənnəmin bu dünyada mövcud olduğunu iddia edir, cənnəti xoşbəxt həyat, cəhənnəmi isə əzablı və bədbəxt yaşayış tərzi kimi görürlər.

Batiniyyə təliminə görə, hətta şəriət hökmlərinin də batini mənaları var. Hökmlərin batini mənasını dərk edənlərin üzərindən təklif (dini vəzifə) götürülmüşdür, onlar bu hökmlərin batini mahiyyətini gördükləri üçün zahirə uyğun davranmaqdan azaddırlar. Məsələn, namazın batini mənası imama itaət etməkdən, orucun batini mahiyyəti öz əqidəsini gizli saxlamaqdan, həccin batini mənası imama doğru yönəlməkdən, zəkatın batini isə elm paylamaqdan (öyrətməkdən) ibarətdir. Buna görə batinilərin əleyhdarları onları “ibahiyyə” (halalı haram bilənlər) də adlandırırdılar. Batinilər ənənəvi müsəlmanlar tərəfindən etirazla qarşılandıqları üçün öz əqidələrini daim gizlətmək məcburiyyəti qarşısında qalmış, təqiyyəyə meyil etmişlər.

Batinilər İslam müqəddəslərinin bəzi mətləbləri öz ardıcıllarından gizlətdik-

ləri, hər şeyi açıb söyləməkdən çəkindikləri barədə hədislərə də istinad edirlər. Bu hədislərə əsasən, məsumlar ona görə bəzi fikirləri gizli saxlayırdılar ki, insanlar onları anlamaqdan acizdirlər, hətta bu fikirləri eşitsələr, küfrə düşə bilərlər. Qurani-Kərimin "Kəhf" surəsində təsvir edilmiş hadisələrdə həzrət Musa (ə) öz sirli yol yoldaşının (Xızır) bəzi davranışlarının mənasını (batini mahiyyətini) başa düşməmiş, ona ciddi şəkildə etiraz etmişdi. Axırda yol yoldaşı öz davranışlarının səbəbini ona bu şəkildə açıqlamışdı: "Mən bunları öz-özümdən etmədim. Sənin səbir edib dözə bilmədiyin şeylərin yozumu (batini mənası) budur" (Kəhf, 82).

Batiniyyə təlimində ifrat şiə inancına *(qülüvv)* məxsus elementlər güclüdür. Hətta bəzi ənənəvi şiə alimlərinin əsərlərində də batiniyyənin izlərinə rast gəlmək mümkündür. Xüsusilə Səfəvilər zamanında güclənmiş *əxbari* cərəyanına mənsub alimlərin təfsir çalışmalarında ayələrin batini mənalarına (təvil) həddən artıq yer ayrılmışdır.

Qurani-Kərimin bəzi ayələrinin təvilə ehtiyaclı olduğunu və bu təvilin yalnız məsumlar tərəfindən bilindiyini yalnız ifrat şiələr deyil, ənənəvi şiələr və ümumilikdə bütün müsəlmanlar da qəbul edirlər. Görkəmli İslam filosofu və Quran təfsirçisi Əllamə Təbatəbai bu barədə yazırdı: "Quranın hər bir ayəsinin təvili vardır və onu sadə təfəkkür yolu ilə dərk etmək olmaz; bunları sözlə ifadə etmək də mümkün deyildir. Bu kimi yozumları yalnız bəşəriyyətin düçar olduğu nöqsanlardan uzaq olan peyğəmbərlər, pak imamlar və ilahi övliyalar batini müşahidə yolu ilə dərk edə bilərlər. Qeyd etmək lazımdır ki, Quranın təvili Qiyamət günü hamı üçün aşkar olacaqdır" (Bununla belə, qeyd etməliyik ki, Əllamə Təbatəbainin fikrincə, Quranın zahiri və batini mənaları bir-birini rədd etmir, əksinə, tamamlayır). Təfsir alimləri "Vaqiə" surəsinin "Ona (Qurana) yalnız pak olanlar toxuna bilər" ayəsindəki (Vaqiə, 79) paklığı yalnız dini-şəri mənada deyil, həm də məsumluq mənasında qəbul edərək, ayələrin batini mənasının yalnız məsumlara məlum olduğunu bildirmişlər.

Batiniyyə düşüncəsi bəzi məşhur müsəlman alimləri tərəfindən tənqid edilmiş və orta əsrlərdə bu fikir cərəyanına qarşı güclü təbliğat aparılmışdır. Əbu Hamid Qəzzalinin batinilərə qarşı "Fəzaih əl-batiniyyə və fəzail əl-müztəzhəriyyə" (Batinilərin azğınlığı və zahirə tabe olanların üstünlüyü) adlı risalə qələmə aldığı məlumdur. Maliki məzhəbinin banisi Malik ibn Ənəsin isə belə söylədiyini rəvayət edirlər: "Batinilərin tövbəsi də qəbul edilməz, çünki onların tövbəsinin də batini olacaq". Məzhəbi mövzularda radikallığı ilə tanınan Nizamülmülk "Siyasətnamə" əsərində batinilərdən söz açarkən yazırdı: "Onlar meydana çıxdıqda dövrün şahının onları yer üzündən götürüb öz ölkəsini onlardan silib təmizləməkdən daha vacib heç bir işi ola bilməz". Bəzi batini cərəyanların siyasi mübarizə səhnəsinə atılması, bəzilərinin radikal mübarizə və terror



yoluna keçməsi kimi amillər də onlara qarşı sərt münasibətin yaranmasına səbəb olmuşdur.

Demək olar ki, bütün sufi təriqətlərində, böyük sufilərin kəlam və kitablarında, ələvilik, bektaşilik, qızılbaşlıq təlimlərində batiniyyə inancının bu və ya digər dərəcədə izlərinə rast gəlmək mümkündür. Bəzi tədqiqatlarda bu təlimlərdəki batiniyyə izlərinin həddən artıq qabardılması və bu yolla onların ənənəvi İslama tam zidd olduğu düşüncəsinin süni surətdə yaradılması cəhdləri də müşahidə edilməkdədir.

***Mənbələr:*** *Türkiye Diyanet Vakfı İslam Ansiklopedisi, V, 190-194; Lüğətnameyi-Dehxuda, III, 4170-4172; Dairət əl-məarifi-təşəyyö, III, 46-51; Əllamə Təbatəbai. İslamda şiəlik, s.105-106; Əllamə Təbatəbai. İslamda Quran, s.33-42; M.F.Köprülüzade. Küçük Asya'da İslâm Batınîliğinin Tekâmül-i Tarihîsi Hakkında Bir Tecrübe (Bektaşîliğin Menşe'leri, Türk Yurdu 2, no. 8, Mayıs 1341/1925), s.121-40; Məhəmməd ibn Əbdülkərim Şəhristani. Məfatih əl-əsrar və məsabih əl-əbrar, I, 66; Nizamülmülk. Siyasətnamə, s.136; Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.181-182.*



**BAYRAMİYYƏ** – XV əsrdə Hacı Bayram Vəli (vəf. 1429/30) tərəfindən əsası qoyulmuş *sufi təriqəti*. Bayramiyyəni türk mənşəli şəxs tərəfindən qurulmuş ilk təriqət hesab edirlər. Bayramiyyənin *silsiləsi* barədə iki nəzəriyyə mövcuddur. Geniş yayılmış silsilə zənciri *Şeyx Səfiəddin Ərdəbili* vasitəsilə *Şeyx Zahid Gilaniyə*, ondan Sührəvərdiyə, ondan da Həzrət Əli (ə) vasitəsilə Məhəmməd Peyğəmbərə (s) bağlanır. İkinci nəzəriyyəyə görə, bayramiyyəni Bayezid Bistamiyə bağlayırlar, bu da onunla nəqşbəndilik arasında yaxınlıq yaradır.

Təriqətin banisi Hacı Bayram Vəlinin həyatı barədə mənbələrdə məlumat azdır. Onun əsl adı Numandır, 1352-ci ildə Ankara yaxınlığında doğulmuşdur. *Mürşidi səfəviyyə* təriqətinin şeyxi, bu təriqətin Anadoluda yayılmasının səbəbkarı olan Somuncu Baba ləqəbli Şeyx Həmidəddin Aksarayidir. Hacı Bayram Vəli təqribən 1412-ci ildə Ankarada məskunlaşaraq öz təriqətini qurmağa başlamışdır. Bu dövrdə 12 dilimli qırmızı tac qoyması onun səfəviliklə eyni köklərə malik olduğunu təsdiq edir. *Şiəliyə* meyilliyinə görə Hacı Bayram Vəli Osmanlı sultanı II Murad tərəfindən paytaxt Ədirnəyə çağırılıb sorğu-sual edilmiş, amma bəraət qazanaraq hörmətlə geri qayıtmışdır. O və ardıcılları sultanın əmri ilə vergidən azad edilmişlər. Sultanla görüşündən sonrakı illərdə Hacı Bayram Vəli arxayınlıqla öz təriqətini yaymış və ətrafına xeyli tərəfdar toplamışdı. Osmanlı dövlətinin müxtəlif nöqtələrində onun *xəlifələri* fəaliyyət göstərirdi. Xəlifələrin ən məşhuru Sultan II Mehmetin (Fateh) mənəvi ustadı və məsləhətçisi Ağşəmsəddin idi. Hacı Bayram Vəli əkinçiliklə məşğul olur, sənətkarlar arasında "Əxi Baba" ləqəbi ilə tanınırdı. Bəzi mənbələr onun bazarda diləndiyini və topladığı pulu öz *müridlərinə* payladığını xəbər verir.

Bayramiyyə təriqətindən şəmsiyyeyi-bay-

ramiyyə, himmətiyyə və məlamiyyə qolları törəmişdir, *cəlvətiyyə* təriqətinin də silsiləsi ona birləşir.

Bayramiyyə təriqəti kəndli və sənətkar təbəqəsi arasında geniş yayılmışdı, təriqətin yayılma arealının genişliyinə görə Hacı Bayram Vəliyə "Şeyx ər-Rum" deyirdilər.

Müasirlərinin yazdıqlarına əsasən, bayramilər ibadətlə ardıcıl məşğul olur, fasiləsiz oruc tutur, bu *riyazətlərin* sonunda axirətdə ilahi mərhəmətə layiq olacaqlarına və axirətin onlardan ötrü bayrama dönəcəyinə inanırdılar; təriqətin adının da buradan yarandığı ehtimal olunur. Bayramilikdə 12 rükət təhəccüd (gecə) namazı qılmaq, uzun *vird (zikr)* və Qurandan bəzi surələr oxumaq, Allahın qüdrəti barədə düşünmək ənənəvi ibadətlərdən sayılır. Təriqətdə *xəlvət* ayini də xüsusi qaydada yerinə yetirilir, xəlvətin hər gecəsində hərəsi min dəfə təkrar edilməklə iki cür fərqli zikr oxunur və iki rükət namaz qılınır.

Bayramiyyə sufilərinin baş geyimi 6 sarıqlı papaq (tac) idi; ilk dövrlərdə qoyulan 12 sarıqlı tacın yerinə sonralar bu forma qəbul edilmişdir. 6 sarıq sufiliyin 6 əsas prinsipini simvolizə edir: az yemək, az yatmaq, az danışmaq, ardıcıl zikr, *nəfsi* tərk etmək və təfəkkür. Bunun 6 cəhəti (istiqaməti) və ya imanın 6 şərtini ifadə etdiyini də deyirlər. Tacın yuxarısında iç-içə 3 dairə (gül) tövhidin 3 dərəcəsinə işarədir. (İlahi feillərdə tövhid, ilahi sifətlərdə tövhid və İlahi Zatda tövhid).

Orta əsrlərdə bayramiyyə təriqəti Osmanlı imperiyası ərazisində əsasən Ankara, Ədirnə və İstanbul şəhərlərində daha geniş yayılmış, bu şəhərlərdə təriqətin *təkkələri* qurulmuşdu. Bayramiyyə müridləri Ağşəmsəddinlə birlikdə İstanbulun fəthində fəal iştirak etmişlər.

***Mənbələr:*** *Türkiye Diyanet Vakfı İslam Ansiklopedisi, V, 269-273; Enver Behnan Şapolyo. Mezhepler ve Tarikatlar Tarihi, s.117-134; The Encyclopaedia of Islam (New Edition), I, 1137.*



**BEKTAŞİYYƏ** – məşhur *sufi təriqətlərindən* biri. Təriqətin adı onun banisi Hacı Bektaş Vəlinin (1209-71) adından götürülmüşdür. Xorasan təsəvvüf məktəbinin yetirməsi və yəsəviyyə təriqətinin nümayəndəsi olan Hacı Bektaş Vəli Anadoluya köçərək burada öz təlimlərini yaymağa başlayır. O, *Çəpni* tayfasının içində yaşamış, ilk *müridləri* də bu tayfadan İbrahim, Süleyman, İdris və Saru adlı dörd qardaş olmuşdur. Bektaşi müridlərinin Anadoluya kütləvi köçünü Xarəzmşah Cəlaləddinin Anadolu Səlcuq dövləti üzərinə yürüşü ilə bağlayırlar (1230). Bektaşiyyə təriqətinin formalaşmasında yəsəviyyə ilə yanaşı *məlamətiyyə, qələndəriyyə, babaiyyə, bayramiyyə,* heydəriyyə, vəfaiyyə kimi təriqət və cərəyanların mühüm rolu olmuşdur. Səlcuqlar zamanından bəri təsəvvüf daxilində güclənməkdə olan *şiə* təmayülü bektaşilikdə özünün ən bariz şəklini almışdır. Bektaşi şeyxləri xalq arasında qaynayıb-qarışaraq *"dədə", "abdal"* ləqəbləri altında fəaliyyət göstərmiş, *Əhli-beyt* sevgisini təbliğ etmişlər. Bektaşilər



*əxilər* şəbəkəsi ilə də sıx əlaqədə olmuşlar. (Hacı Bektaş Vəli Anadolu əxilərinin başçısı Əxi Evrənlə dost idi). Osmanlı dövlətinin quruluş mərhələsində Anadolunun ictimai strukturunun formalaşması prosesi bektaşiyyənin yaxından iştirakı ilə baş vermişdir.

Əldə olan məlumatlara görə, Anadoludakı ilk bektaşi dərvişləri hələ özlərini bəktaşi kimi deyil, *babaiyyə* və vəfaiyyə təriqətlərinin mənsubu kimi təqdim edirdilər. XIV əsrdən etibarən Anadolu şiələri arasında bektaşiyyə təriqəti və Hacı Bektaş Vəli kultu sürətlə inkişaf etməyə başladı. Anadolunun mərkəzində, Nevşehir bölgəsində məskunlaşmış Hacı Bektaş Vəlinin qurduğu dərgahın bu prosesdə həlledici rolu olmuşdur. Anadoluda yaşadığı 36 il ərzində Hacı Bektaş Vəlinin 36 min *mürid* yetişdirdiyi rəvayət edilir. (Bunların sayı ilə bağlı fərqli rəqəmlər də mövcuddur). Onun əmri altında 99 min Xorasan ərəni ilə 47 min Rum ərəninin birləşdiyini yazırlar. Hacım sultan, Saru İsmayıl, Pirabi sultan, Abdal Musa kimi dərvişlər bu təriqəti Anadolunun hər guşəsinə yaymağa nail olmuşlar. Hacı Bektaş Vəlinin tələbələrindən biri də Xatun Ana (Kadıncık Ana) ləqəbli qadındır. O, yuxarıda adı çəkilən dörd qardaşdan biri olan İdrisin xanımı idi, övladsızlıqdan əziyyət çəkirdi. Hacı Bektaş Vəli onu qızlığa qəbul etmiş, duası ilə Xatun Ana hamilə qalmış və Timurtaş dədəni dünyaya gətirmişdir. Abdal Musa kimi məşhur bektaşi şeyxi də Xatun Ananın yetirməsidir. Bektaşilik Anadoluda o qədər geniş yayılmışdı ki, hətta bəzi rəvayətlərə görə, Hacı Bektaş Vəli Osmanlı dövlətinin banisi Osman qazının başına tac qoyub belinə qılınc bağlamış, yəni onun hakimiyyətinin legitimliyini təsdiq etmişdi. Bektaşi müridləri Osmanlı ordusunun Avropa istiqamətindəki yürüşlərinə fəal şəkildə qatılmışlar.

Bektaşilikdə Hacı Bektaş Vəlidən sonra Balım sultan (vəf. 1516) ən mühüm fiqur sayılır. Təriqətin ikinci şeyxi adlandırılan Balım sultanın zamanında bektaşiyyə *qələndəriyyədən* fərqlənərək spesifik xüsusiyyətlər kəsb edir. O vaxtadək qələndəriyyə ilə iç-içə mövcud olan bektaşiyyə təriqəti XVI əsrdən etibarən Anadolunun ictimai-siyasi həyatında müstəqil təriqət kimi çıxış etməyə başlayır. Bəzi tədqiqatlar bu zamandan etibarən bektaşiyyədə şiə meyillərinin daha da gücləndiyini göstərir.

*Rum abdalları* adlandırılan bektaşi dərvişləri xalq kütlələrinə uğurla qarışaraq bu təriqəti sürətlə yaymağa nail olurdular. Osmanlı fəthləri Qərbə doğru genişləndikcə fəth edilən torpaqlarda bektaşilik də yayılırdı. Ənənəvi sünni əqidəsində yetişmiş əhalidən fərqli olaraq, İslamı yeni qəbul etmiş avropalıları bektaşilik inancına gətirmək daha asan idi. Buna görə də bektaşilik inancı avropalılardan təşkil edilən yeniçəri adlı səfərbərlik qüvvələri arasında özünə daha çox ardıcıl toplaya bilmişdi. Geniş yayılmış bir rəvayətə görə, hətta yeniçəri bölükləri Orxan Qazının zamanında Hacı Bektaş Vəlinin xeyir-duası ilə təsis edilmişdir. Lakin Hacı Bektaş Vəlinin

Orxan Qazı dövrünə kimi yaşamadığını və yeniçəri bölüklərinin Orxan Qazı zamanında deyil, onun oğlu I Sultan Murad zamanında (1362-89) təşkil edildiyini nəzərə alsaq, bu rəvayətin səhihliyi şübhə altına düşür. Bununla belə, yeniçərilər arasında bektaşiliyin hakim olması faktı şübhəsizdir, belə ki, hətta yeniçəri ocağını "bektaşi ocağı", yeniçəriləri isə "Hacı Bektaş Vəlinin uşaqları" adlandırırdılar. Yeniçəri bölüyündə bektaşi *dədəsi* fəaliyyət göstərir, bütün hərbi yürüşlərdə ordunu müşayiət edirdi. Bu bektaşi dədəsi bektaşiyyə təriqətinin şeyxinin təqdimatı əsasında yeniçəriağası tərəfindən İstanbulda qurulan bir mərasimdə vəzifə başına gətirilirdi. Yeniçərilərin nizamnaməsində bektaşi təlimləri mühüm yer tuturdu. Yeniçəri bölüyünün yeməyi Hacı Bektaş Vəli tərəfindən hədiyyə edildiyi rəvayət olunan iri qazanda bişirilir, bu qazan bütün yürüşlərdə ordu ilə birlikdə daşınırdı. Təntənəli mərasimlərdə və məvacib verilən günlərdə baş çavuşun ucadan oxuduğu gülbang adlı and xarakterli duada bektaşilik motivləri aydın hiss olunurdu: "Allah-Allah, illəllah! Baş üryan, sinə püryan, qılınc al qan! Bu meydanda neçə başlar kəsilir, heç soran olmaz! Eyvallah, eyvallah, qəhrimiz, qılıncımız düşmənə ziyan, qulluğumuz padişaha əyan! *Üçlər, yeddilər, qırxlar,* gülbangi-Mühəmmədi, nuri-Nəbi, kərəmi-Əli, pirimiz, sultanımız Hünkar Hacı Bektaşi-Vəli dəminə-dövranına hu deyəlim! Hu!"
Klassik mənbələrdə yazılanlara görə, yeniçəri bölüyünün fəaliyyət metodları və daxili nizam-intizam qaydaları bektaşi şeyxlərinin yaxından iştirakı ilə işlənib hazırlanmışdır. Yeniçəri sıralarına səfərbərlik mexanizmi, yeniçəri geyim tərzi, yeniçərilərin oturuş-duruş qaydaları Hacı Bektaş Vəlinin mənəvi nəvəsi Timurtaş dədə tərəfindən təklif edilmişdir.
I Sultan Süleymanın Naxçıvan səfəri zamanı yeniçəriağası Pertev paşa yeniçərilərə tapşırıq vermək məqsədilə onları toplamış və dövlətin onlara verdiyi dəyəri bu sözlərlə ifadə etmişdi: "Sizin ocağınız Hacı Bektaş Vəli ocağıdır, İslam dininin və Osmanoğullarının qolqanadıdır. Osmanoğulları hər yerdə sizinlə iftixar edir. Osmanlı dövlətinin şərəfi və zinəti sizinlədir".
XV əsrdən etibarən *hürufilik* cərəyanının da bektaşiliyə təsiri güclənmiş, təqib edilən hürufilər bektaşi *təkkələrinə* sığınaraq özlərini bu təriqətin ardıcılı kimi göstərmişlər. Həmin dövrdə bektaşiyyə ənənəvi şiəliyə bəzən uyğun gəlməyən ifrat inanc elementləri ilə yüklənmiş, digər din və təlimlərdən də yararlanaraq sinkretik mahiyyət kəsb etmişdi.
Bektaşiliyin *ələviliklə* rabitəsi xüsusilə güclü olmuş, bu iki təlim çox zaman eyniləşdirilmiş, yaxud yanaşı (ələvi-bektaşi təlimi şəklində) xatırlanmışdır. Lakin ələvilik bektaşiliyə nisbətən daha geniş anlayışdır. Hər bektaşi ələvi sayıldığı halda, hər ələvi bektaşi deyildir. Bəzi tədqiqatçılar ələvi-bektaşi fərqliliyini onların yayılma arealı ilə bağlamış, kəndlərdə yaşayanların ələvi, şəhərlərdə ya-



şayanların isə bektaşi adlandığını iddia etmişlər. Ələviliyə xas olan *4 qapı, 40 məqam* məfhumu bektaşilik üçün də xarakterikdir. Bu mənəvi mərhələləri uğurla keçmiş mürid Haqqa çatmış sayılır. *Cəm ayin*i də bektaşiliklə ələviliyi yaxınlaşdıran cəhətlərdəndir.

Digər təriqətlərdə (o cümlədən *səfəviyyədə*) rast gəlinən, təriqətə daxil olma zamanı icra edilən iqrar ayini (təlqini) bektaşilikdə də mövcuddur. Bektaşi *müridləri* qulaqlarına menguş adlı sırğa taxır, boyunlarından 12 imamı simvolizə edən 12 guşəli daş asır, adətən ailə qurmayıb subay yaşayırdılar. Bektaşi tacı adlanan ağ rəngli baş geyimi 12 dilimli olub, aşağı hissəsi yaşıl zolaqlı kəmərlə əhatələnmişdi. Dərvişlər təbər (balta) ilə yanaşı haça tiyəli *Zülfüqar* simvolundan da istifadə edirdilər. Bektaşi icmaları məhərrəmlik mərasiminin keçirilməsinə daim ciddi yanaşmışlar. Bektaşi *ozan-şairlərin* qoşduqları ilahilər, nəfəslər təsəvvüf ədəbiyyatının şah əsərləri sayılmaqla yanaşı, *qızılbaş ədəbiyyatının* formalaşmasına güclü təsir göstərmişdir. Ümumilikdə bektaşi təriqəti qızılbaş inancının ən mühüm ideya mənbələrindən biri sayılır.

Bektaşi təriqətinin əsas başçısı Hacı Bektaş Vəli *təkkəsində* oturur və *dədə-baba* ləqəbini daşıyırdı. Onun təkkələrə göndərdiyi *xəlifələrə* baba deyirdilər. Sıravi müridlər *can* və ya mühib təbəqəsinə mənsub idilər. Təriqətə hələ daxil olmayan, amma buna həvəs göstərənləri isə aşiq adlandırırdılar.

Bektaşiyyə təriqətinin iqtisadi bazasını *vəqf* qurumları təşkil edirdi. Hər təkkəyə bağlı olan vəqfin gəlirləri mütəvəlli (vəqf müdiri) tərəfindən toplanır, təkkənin ehtiyacları ödəndikdən sonra artıq qalan hissə dədə-babanın oturduğu Hacı Bektaş Vəli zaviyəsinə göndərilirdi. Bundan əlavə, dövlət adamları və imkanlı şəxslər də bektaşi təkkələrinə külli miqdarda bəxşiş (ianə) göndərirdilər. Maddi imkan baxımından bektaşiyyə təriqəti yalnız mövləviyyədən geri qalırdı.

XVI əsrin birinci yarısında Anadoluda qalxan *qızılbaş üsyanlarında* bektaşi müridləri fəal iştirak etmişlər. 1526-27-ci illərdə baş vermiş üsyanın başçısı Qələndər Çələbi (Şah Qələndər) özü bektaşi şeyxi idi və Hacı Bektaş Vəlinin nəslindən olduğunu iddia edirdi.

Bektaşilik təliminin əsasları Hacı Bektaş Vəliyə aid edilən "Vəlayətnamə" (böyük və kiçik olmaqla iki variantı mövcuddur), "Məqalati-ərbəin" və digər əsərlərdə öz əksini tapmışdır.

***Mənbələr:*** *Türkiye Diyanet Vakfı İslam Ansiklopedisi, V, 373-379; Lüğətnameyi-Dehxuda, IV, 4917; T.H.Balcıoğlu. Türk Tarihinde Mezheb Cereyanları, s.184; Hilmi Ziya Ülken. Anadolu'nun Dini Sosyal Tarihi, s.88-105; Mehtap Aydın Kaim. Türk Tasavvuf Edebiyatında Gülbang (Doktora Tezi), s.196-198; D.G.Erdem Kük. Alevi-Bektaşi Gülbankları: Bağlam Merkezli Bir Yaklaşım, s.34-36; Kavanin-i Yeniçeriyan (nəşrə hazırlayan: Tayfun Toroser), s.56-58, 216; Kibar Bal. Tarihsel Süreç İçerisinde Bektaşiliğin Yeniçeriler İçerisinde Aldığı Şekil (IV. Uluslararası Alevilik ve Bektaşilik Sempozyumu, 18-20 Ekim 2018, Ankara, Bildiriler Kitabı), s.177-190; Mehmet Eröz. Türkiye'de Alevi-*

*lik ve Bektaşilik, s.52-79; Seyhun Şahin. Hacı Bektaş-ı Veli ve yaşadığı dönemde Anadolu'nun siyasi ve sosyal durumu (Nevşehir Hacı Bektaş Veli Üniversitesi SBE Dergisi, 12/1), s.448-456; M.F.Köprülüzade. Küçük Asya'da İslâm Batınîliğinin Tekâmül-i Tarihîsi Hakkında Bir Tecrübe (Bektaşîliğin Menşe'leri, Türk Yurdu 2, no. 8, Mayıs 1341/1925), s.121-40.*



**BEYTULLAH** – sözün hərfi tərcüməsi "Allahın evi" deməkdir. Dini terminologiyada müqəddəs Kəbə evi beytullah adlandırılır. Bu söz hərfi mənada deyil, məcazi mənada qəbul edilir. Allah cisim olmadığı üçün məkana sığışmaz və Onun evə ehtiyacı yoxdur. Lakin Kəbə sırf Allaha ibadət məqsədilə ziyarət edildiyi üçün Allah buranı Özünə məxsus edib və Öz evi adlandırıb. Qurani-Kərimdə buyurulur: "İbrahimə və İsmailə də: "Evimi (Kəbəni) təvaf edənlər, orada qalıb həmişə ibadətdə olanlar, rüku və səcdə ilə namaz qılanlar üçün (bütlərdən) təmizləyin! – deyə tövsiyə etdik" (Bəqərə, 125).

Beytullah irfani mənada möminin qəlbi kimi təsəvvür edilir, çünki möminin qəlbi də Allahın məkanıdır. Möminin qəlbini sındırmaq Kəbəni dağıtmaq qədər, hətta ondan daha artıq dərəcədə günahdır. Səfəviyyə təriqətinin banisi Şeyx Səfiəddin Ərdəbilinin hikmətli kəlamlarının toplandığı *"Qara məcmuə"də* yazılıb: "Beytullah ikidir. Yəni Kəbə ikidir yer üzündə. Biri beytullahdır kim, xəlayiq onu kəndilərinə fərz olduğca təvaf edərlər və biri daha könül Kəbəsidir... Əgərci ədayi-rükni-İslam ol zahir Kəbə ilə hasil olur, amma mərifətullah könül Kəbəsində hasil olur".

Beytullah sözünə və sinonim ifadələrə irfan şairlərinin əsərlərində də tez-tez rast gəlinir:

Ey həq əhli, sən sənin cismində beytul lahi gör,
Xancaru əzm eyləsən, lövhində ərşul lahi gör.

Dili-viranimə ta gəldi eşqin,
Sanasan Beyti-məmur oldu könlüm.
*(Ş.İ.Xətai)*

*bax:* **KƏBƏ.**

***Mənbələr:*** *Qara məcmuə, s.48; Qısa İslam Ensiklopediyası (N.Rəhimovun ümumi redaktəsi ilə, 2 cilddə), I, 132-133; II, 145-147; Şah İsmayıl Xətai. Əsərləri (2 cilddə), I, 143 və 349.*



**BƏQA** – qalmaq, yox olmamaq; *fənanın* əksi mənasında işlədilir. Mühüm təsəvvüf termini olaraq bəqa məfhumu fəna ilə sıx bağlıdır. Əgər fəna bəndənin bəyənilməyən xüsusiyyətlərdən təmizlənməsi kimi qəbul edilirsə, bəqa gözəl xüsusiyyətləri özündə inkişaf etdirmək anlamını verir. Bəqa *seyrü-süluk* yolunun ikinci yarısıdır. *Salik* Allaha doğru yolun sonunda fəna məqamına çatır, bundan sonra Allahda yol başlayır. Allahda fani olmuş sufi artıq mənəmlikdən tam xilas olmuşdur, onda özünə məxsus olan heç nə yoxdur. Bundan sonra o, Allahın gözəl əxlaqı ilə özünü bəzəyir, ilahi sifətləri özündə təcəlla etdirir.

*bax:* **FƏNA.**



*Mənbələr: Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.628-630; Seyid Ziyaəddin Səccadi. İrfan və təsəvvüfün əsaslarına giriş, s.269; Rzaqulu xan Hidayət. Riyaz əl-arifin, s.41; Yaqub Babayev. Təriqət ədəbiyyatı; sufizm, hürufizm, s.31-32; K.Bünyadzadə. Sərrac Tusinin "əl-Lümə" əsəri, s.187; Nəsirəddin Tusi. Ovsaf əl-əşraf, s.101; Risaleyi-Qüşeyriyyə (farsca tərcümə: Bədiüzzaman Firuzənfər), s.106-109; İzzəddin Kaşani. Misbah əl-hidayə və miftah əl-kifayə, s.426-429; Qara məcmuə, s.36; Şeyx Səfi təzkirəsi ("Səfvətüs-səfa"nın XVI əsr türk tərcüməsi), s.379 və 405.*

**BƏSİRƏT** – ərəb dilindən hərfi tərcüməsi "görmək" olsa da, irfani mənada *qəlbin* "görməsi", yəni hadisələrin və əşyaların mahiyyətinə nüfuz etmək, əsl mənasını anlamaq mənalarında işlədilir. Bəsirətli insan hissləri, duyğuları, vicdanı oyaq olan, başqalarının görə bilmədiyi mənaları duyan şəxsdir. Quranda belə insanlara müraciət edilir: "Ey bəsirət sahibləri! İbrət alın!" (Həşr, 2).

Qafil, cahil adam haqqında deyirlər ki, bəsirət gözü bağlıdır. Qurani-Kərim belələri haqqında buyurur: "Allah onların ürəyinə və qulağına möhür vurmuşdur. Gözlərində də pərdə vardır. Onları böyük bir əzab gözləyir" (Bəqərə, 7). Məhəmməd Peyğəmbər (s) insan üçün bəsirət gözünün əhəmiyyətini belə açıqlayırdı: "Əsl kor o deyil ki, gözü görmür. Əsl kor odur ki, bəsirəti yoxdur". Həzrət Əlinin (ə): "Mən görmədiyim Rəbbə ibadət etmərəm!" sözü də Allahı bəsirət gözü ilə "görmək" barəsindədir.

Qurani-Kərimdə "bəsirət" sözü bəzən insanın hidayətə qovuşması üçün Allah tərəfindən ona göstərilən dəlil, sübut mənasını da ifadə edir: "Rəbbinizdən sizə parlaq dəlillər (bəsirətlər) gəlmişdir. Kim onları görsə öz lehinə, kim görməsə öz əleyhinədir" (Ənam, 104).

*İrfanda* bəsirətin 3 dərəcəsi vardır. Birinci mərhələdə insan dərk edir ki, *şəriətin* bütün göstərişləri və dinin bütün qaydaları haqdır, düzgündür, bəşəriyyətin xeyrinədir. Onlara əməl etmək xoşbəxtliyə, onları tərk etmək bəsbəxtliyə səbəb olar. Bəsirətin ikinci mərhələsində insan bütün varlığı ilə anlayır ki, hidayət də, zəlalət də Allahdandır, hər ikisi Allahın ədalətindən qaynaqlanır. Nəhayət, üçüncü mərhələdə insan uca aləmdə (əmr aləmi) baş verənlərin batinini görür, mənasını dərk edir. Onun qəlbi ilahi *mərifət* üçün tam açılır.

Səfəviyyə təriqətinin şeyxi Səfiəddin Ərdəbili müridin qəlb gözünün açılması barədə deyirdi: "Ol talib hər nəyə kim baxarsa, Mürəbbisin görür, könül gözü açılır". (Burada "mürəbbi" deyərkən Rəbb, yəni Allah nəzərdə tutulur). "Könül gözü ilə bax və könül qulağı ilə dinlə və söyləyəni qav, söylədənə bax".

*Mənbələr: Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.196-197; Məhəmməd Reyşəhri. Mizan əl-hikmə (12 cilddə), I, 350-351; Qısa İslam Ensiklopediyası (N.Rəhimovun ümumi redaktəsi ilə, 2 cilddə), I, 14-15; Qara məcmuə, s.22 və 56.*

**BÜT** – *irfan* düşüncəsində və *təsəvvüf* ədəbiyyatında mühüm məfhumlardan biridir. Terminoloji baxımdan fərqli mə-

nalara malikdir.
Bəzi sufilərin düşüncəsində büt mütləq varlığın, yəni Allahın zühur yeridir. Bütpərəst əslində haqpərəstdir, Allaha iman edəndir. Bütyonanlar adətən bütü ən gözəl və cazibədar formada hazırlayırlar, ona görə ariflər Allahı da kamal sifətləri ilə bütə bənzətmişlər.
Daha bir izaha görə, büt ruhani həqiqətlərin zahiri *təcəllasıdır*, yəni *pir*, *mürşid* və *insani-kamildir*. *Arif seyrü-sülukda* elə bir məqama çatır ki, artıq pir və mürşid də onunla Allah arasında maneəyə və bütə çevrilir.
Daha bir izaha görə, insanı özünə cəlb edən Allahdan başqa hər şeyə büt deyilir. Bu büt ibadət edilən heykəl də ola bilər, insanın çox bağlandığı bir şəxs, mal-dövlət də olması mümkündür. Arif daim bütləri öz qəlbindən təmizləməklə məşğul olur, həzrət İbrahim (ə) kimi nəfsinin bütlərini sındırır.

Mən büti-Leyli əlindən olmuşam Məcnun kimi,
İştiyaqindən dəmadəm ağlaram məhzun kimi.

Dilbəra, dərdimə dərman səndən özgə kimsə yox,
Həm dəxi könlümdə iman səndən özgə kimsə yox.
Hicr evində mən kiminlə həmdəm olum, ey sənəm,
Könlümün şəhrində mehman səndən özgə kimsə yox.
*(Ş.İ.Xətai)*

Klassik ədəbiyyatda eyni mənanı ifadə edən "*sənəm*" sözü də işlədilir.

***Mənbələr:*** *Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.183-185 və 534; Seyid Ziyaəddin Səccadi. İrfan və təsəvvüfün əsaslarına giriş, s.275; Yaqub Babayev. Təriqət ədəbiyyatı; sufizm, hürufizm, s.48; Şah İsmayıl Xətai. Əsərləri (2 cilddə), I, 110 və 537.*



**BÜTXANA, BÜTKƏDƏ** – *təsəvvüf* terminologiyasında ilahi aləmə *(aləmi-lahut)* işarədir, Allahın zühur yeri, vəhdət məkanıdır. Digər izaha görə, kamilliyə çatmış *arifin* batini aləmi, qəlbi bütxana adlandırılır. Bütxana bütün məkanı olduğu kimi, arifin qəlbində ilahi *mərifət* şövqü məskən salmışdır.

Bütpərəst oldu könül, bütxanələr küncündədir,
Mən bilürmən bu dili-şeyda nələr küncündədir.
*(Ş.İ.Xətai)*

Sufi ədəbiyyatında məscidlə bütxana eyni mahiyyət daşıyır, hər ikisi Allahın evi sayılır. Çünki Kainatda hər şey Allahın təcəllasıdır, o cümlədən bütlər də. Bütün dinlər fərqli adlar altında eyni ideyanı təbliğ edir, bütün insanlar Allaha, Məsihə, Buddaya, canlı və ya cansız hər nəyə ibadət edirlər-etsinlər, son mənada eyni Varlığın fərqli adlarına tapınırlar. Ona görə də tərsa ilə müsəlman, Kəbə ilə bütxana arifin gözündə eynidir.
Xəyali Buxarayi adlı şairin Allaha ünvanlanmış farsca məşhur qəzəlində deyilir. (Bu qəzəli Səfəvilər dövründə yaşamış məşhur din alimi, dünyəvi elmlərin xəzinəsi və həm də böyük arif *Şeyx*



*Bəhai* təxmis etmişdir):

Gah kilsədə ibadətə qapılıram, gah məsciddə sakin oluram,
Yəni evbəev Səni axtarıram.
Hər kəs bir dil ilə Sənin eşqindən söz açır –
Aşiq ğəm avazı etməklə, müğənni mahnı oxumaqla.
Kəbə ilə bütxanadan mənim məqsədim Sənsən,
Nəzərdə tutduğum məqsəd Sənsən, Kəbə ilə bütxana bəhanədir.

***Mənbələr:*** *Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.185-186; Şah İsmayıl Xətai. Əsərləri (2 cilddə), I, 206; Kəşküli-Şeyx Bəhai (farsca tərcümə Əzizullah Katib), müqəddimə.*

**CAM** – qədəh deməkdir. Məclislərdə *saqının mey* süzüb verdiyi qablara cam deyirlər. *İrfan* aləmində isə *aşiqin* Allahdan aldığı ilahi eşqlə dolmuş qəlbini cam və sağər adlındırırlar.

Həq əzəl meyxanəsindən verdi bu camı mana,
Kainat əhli təəccüb qıldılar qamu mana.
*(Ş.İ.Xətai)*

Bəzən irfan ədəbiyyatında ərafındakıları öz səthində əks etdirən çox cilalanmış camdan söhbət açılır. Bu, *riyazətlər* vasitəsilə cilalanmış *qəlbdir* ki, bütün dünyanı, hətta Allahı da özündə əks etdirməyə qadirdir. Hədislərdə buyurulur ki, arifin qəlbi Allahın güzgüsüdür.

Səfəviyyə təriqətinin əxlaq kodeksi və nizamnaməsi sayılan, Şeyx Səfiəddin Ərdəbilinin öyüdləri toplanmış *"Qara məcmuə"də* onun belə dediyi yazılır: "*Mürşidi-kamil* adəmi cami-cahannüma edər. Cami-cahannüma nədir? Ayineyi-Xudadır".
Bəzən arifin ilahi şövqdən yaşarmış gözünü də cam (və ya eyni mənanı ifadə edən sağər) adlandırırlar:

Ey hurivəş ki, əksi-rüxün sağərimdədir,
Kövsər zülalı badeyi-canpərvərimdədir.
*(S.Ə.Şirvani)*

*bax:* **CAMİ-CƏM**.

***Mənbələr:*** *Seyid Ziyaəddin Səccadi. İrfan və təsəvvüfün əsaslarına giriş, s.273-284; Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.280-283, 451-452; Qara məcmuə, s.25.*

**CAMİ-CƏM** – qədim əsatirə və "Şahnamə" motivlərinə əsasən, Pişdadilər sülaləsindən olan Cəmşid şahın (və ya Keyxosrovun) möcüzəvi xüsusiyyətə malik bir camı (qədəhi) var idi. Bu qədəhdə bütün dünyanın hadisələri, ən uzaq nöqtələrdə baş verən və hətta gələcəkdə baş verəcək olaylar əks olunurdu. Cami-Cəm hər şeyi əhatə edirdi, bu cama baxmaqla bütün dünyadan xəbər tutmaq mümkün idi. Keçmiş dövrlərin əksər alim və ədibləri cami-Cəmi mistik anlamda qəbul etsələr də, bəzən buna hər hansı elmi və məntiqi izah vermək cəhdləri də olmuşdur. Bəzilərinin fikrincə, cami-Cəm astrologiya barədə zəruri bilikləri və cədvəlləri özündə ehtiva edən bir lövhə idi. (Astronomiyada istifadə edilən üstürlab olduğunu da yazırlar). Bəziləri onu Yer kürəsinin modeli (kiçik qlobus) hesab etmişlər. Bəziləri isə

bu qədəhin hər şeyi özündə əks etdirən adi su ilə doldurulduğunu güman etmişlər.
Təsəvvüfdə adətən arifin *qəlbinə* cami-Cəm deyirlər. Heç nə qəlb qədər tutuma malik deyil, hətta hədislərdə deyilir ki, Allah qəlbdən başqa heç yerə sığışmaz. Orta əsrlərin klassik şairləri öz əsərlərində cami-Cəm ifadəsini arifin ilahi *mərifətlə* dolu qəlbi mənasında işlətmişlər. O, *seyrü-süluk* yolunda o qədər təkamül etmişdir ki, qəlbi Allahın *təcəlla* yerinə dönmüşdür.
Səfəviyyə təriqətinin banisi Şeyx Səfiəddin Ərdəbili *"Qara məcmuə"də* insana xitabən deyir: "Cami-Cəm padşahı ikən nə üçün dilənçi olursan? Aləmin canı və məqsudu ikən nə üçün çakəritən (bədənin qulu) olursan?"
Əsatirə görə, İsgəndər Zülqərneynin güzgüsü də eyni xüsusiyyətə malik olmuşdur. Cami-Cəmlə ayineyi-İsgəndər klassik ədəbiyyatda bəzən yanaşı işlədilir və eyni mənanı ifadə edir:

Ayineyi-Sikəndərü həm cami-Cəm budur,
İzhar edər cahanı, qılur şeyxi çün şəbab.
*(Ş.İ.Xətai)*

***Mənbələr:** Lüğətnameyi-Dehxuda, V, 7373-7377; Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.281-282; Seyid Ziyaəddin Səccadi. İrfan və təsəvvüfün əsaslarına giriş, s.281; Şah İsmayıl Xətai. Əsərləri (2 cilddə), I, 102; Qara məcmuə, s.56.*



**CAN** – *ələvi-bektaşi* ənənəsində mühüm yer tutan bir anlayışdır. Canı bəzən ruh və *nəfslə* eyniləşdirirlər, lakin daha dəqiq araşdırma bunların fərqli olduğunu göstərir. Ruh insana Allah tərəfindən əta olunan bir nemətdir, uca və ülvi dəyərləri özündə daşıyır. Ana bətnində insan hələ canlı ikən bir müddət ruhsuz qalır, yalnız müəyyən müddətdən sonra rüşeymə ruh daxil olur. Nəfs insanın həyatını təmin edən qüvvələrin məcmusudur, yeyib-içmək, böyümək, yatmaq, ləzzət almaq kimi istəklər bura aiddir. Əgər nəfs cilovlanmasa, insan bu istəklərin əlində əsir qalar, bunları cilovlayan insanın varlığına ilahi ruh hakim olar. Can isə insanın həyatını təmin edən qüvvədir, insan öldükdə can da yox olar (ruhdan fərqli olaraq).
Xalq dilində "can" əzizləmə, məhəbbət mənasında işlədilir. "Can deyib, can eşitmək", "candan da şirin", "canım sənə qurban olsun" kimi ifadələr, mehribanlıq məqsədilə qarşı tərəfin müraciətinə "can" deyə cavab vermək buna misaldır.
Ələvi icmasının üzvləri bir-birinə "can" deyə müraciət edirlər. Bu yolla onlar hər cür ayrı-seçkiliyi, cinsi fərqi, hətta ad fərqini də kənara qoyaraq icmalaşırlar (*cəm məclisinin* parçasına çevrilirlər). Ələvi dədələri cəm məclisini açarkən hamıya ümumi şəkildə "canlar" deyə xitab edirlər.
Məşhur ələvi şairi, *yeddi ulu ozandan* biri *Pir Sultan Abdal* qoşmalarının birində "Gəlin, canlar, bir olalım", - deyə insanları dostluğa və sevgiyə səsləyirdi. Şah İsmayıl Xətai ona qoşulan qızılbaşları bu şəkildə salamlayırdı:

Biz də xanədanə gedər der idik,
Mehman canlar, bizə səfa gəldiniz!



Hər sabah, hər sabah yüzüm üstünə,
Mehman canlar, bizə səfa gəldiniz!

Qəzəllərində də şah öz müridlərini "canlar" adlandırırdı:

Xəlilullah donin geymiş, verilmiş adı İsmail,
Ona qurban olun, canlar, ki Allahdan nida gəldi.
*(Ş.İ.Xətai)*

***Mənbələr:** İbrahim Gül. Alevi İnancında Can, Ruh Kavramı ve Nefsin Egitimi, "Folklor/Edebiyat" Dergisi, 2021; Sayı: 27(1), s.211-228; Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.283; Türkiye Diyanet Vakfı İslam Ansiklopedisi, VII, 138-139; Pir Sultan Abdal. Hayatı, Sanatı, Şiirleri, s.37; Şah İsmayıl Xətayi. Əsərləri, s.352; Şah İsmayıl Xətai. Əsərləri (2 cilddə), I, 528.*

**CAVANMƏRD, COMƏRD** – haqq yolçularına verilən ad. Comərd *fütüvvət* sahibidir, bütün davranışları ətrafdakılara faydalı olmaq prinsipinə əsaslanır. Comərd insanın əlindən və dilindən başqasına zərər gəlməz. O, malik olduğu hər şeyi təmənnasız olaraq paylayar (iysar edər), qarşısındakını özündən üstün bilər, onun xidmətində durar. Orta əsrlərdə fütüvvət təşkilatlarının və *əxi* dərnəklərinin üzvləri cavanmərd, comərd adlandırılırdı. Gəncə şəhərində həzrət Əlinin (ə) zamanında yaşadığı iddia edilən Comərd Qəssabın türbəsi qədimdən bəri insanların ziyarət məkanı olmuşdur.
*bax:* **FÜTÜVVƏT.**

*Mənbələr: Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.294-295, 618; Саламзаде А.В., Архитектура Азербайджана XVI-XIX вв., стр. 50-51.*

**CƏBƏRUT ALƏMİ** – *ariflərin* düşüncəsində varlıq aləmlərindən biri. Yalnız Allahın yer aldığı əhədiyyət aləmindən sonra gəlir. Bu aləmə cəbərut aləmi, əqli-əvvəl, həqiqəti-Mühəmmədiyyə və s. adlar da verilib. Cəbərut aləmi Allahın ilk *təcəllasından* yaranıb. O, özündən sonra və aşağıda duran iki aləmlə (*mələkut* və *mülk* aləmləri) bağlıdır. Bu aləmlər bir-birindən ayrı deyil, bir-birinin içindədir (paralel dünyalar). Mülk və mələkut aləmlərini xəlq və əmr, şəhadət və qeyb, zülmət və nur aləmləri də adlandırmışlar. Cəbərut aləmi mülk və mələkut aləmlərinin zatıdır (əslidir), mülk və mələkut aləmləri isə cəbərut aləminin surətləri, obrazlarıdır. Cəbərut aləmini toxuma, mülk və mələkut aləmlərini ağaca bənzətmək olar, bitkilər, heyvanlar və insan bu ağacın meyvələridir. Cəbərut aləmində gizli olan hər şey mülk və mələkut aləmində zühura gəlmiş, açılmışdır. Mülk aləmi hissiyyata, mələkut aləmi ağla, cəbərut aləmi mahiyyətə bağlıdır. Varlıqların duyulan xüsusiyyətləri mülk (materiya) aləmində, dərk edilən xüsusiyyətləri əql (ideya) aləmində mövcuddur, onların mahiyyəti isə cəbərut aləminə məxsusdur. Digər iki aləmdən fərqli olaraq, cəbərut aləmində dəyişiklik yoxdur, çünki mahiyyət dəyişməzdir, sabitdir. Buna görə cəbərut aləminə aid olanlara əyani-sabitə (dəyişməz komponentlər) deyirlər. Cəbərut aləmi sonsuzdur, onu dərk etmək insanın

imkanı xaricindədir, mülk və mələkut aləmləri bütün böyüklük və əzəmətləri ilə birlikdə cəbərut aləminin yanında dəryadan bir damcı kimidirlər.

Arifin qəlbinə bəzən cəbərut aləmindən bəzi ilham və *kəşflər* enir, sonra onlar surət aləmində (mələkut aləmi) ağılda müəyyən təsəvvürə düşür. Şeyx Səfiəddin Ərdəbili deyirdi: "*Salik* səy və kəsb ilə öz mənzilində uyğunun arasında qərib şəkillər ilən rənglər görər öz məqamında və mənzillərində. Əql onu nəqşbəndilik eyləyib təəqqül edər (anlayar) və həman kim onu surət aləminə gətürə, ona vaqiə derlər".

***Mənbələr:*** *Əzizəddin Nəsəfi. İnsani-kamil, 12-ci risalə; Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.115-117 və 284; Şeyx Səfi təzkirəsi ("Səfvətüs-səfa"nın XVI əsr türk tərcüməsi), s.399; Türkiye Diyanet Vakfi İslam Ansiklopedisi, VII, 193.*

**CƏLVƏTİYYƏ** – məşhur sufi təriqətlərindən biri. "Cəlvət" (aşkarlıq) sözü "xəlvət" (gizlilik) məfhumunun əksidir. Silsilə baxımından *zahidiyyə*, *səfəviyyə*, *xəlvətiyyə* və *bayramiyyə* təriqətləri ilə müştərək cəhətləri vardır, cəlvətiyyənin *silsilə* zənciri *Şeyx Zahid Gilanidə* zahidiyyə təriqəti ilə birləşir. Cəlvətiyyəni çox zaman xəlvətiyyənin və ya bayramiyyənin qolu hesab edirlər. Təriqətin banisi XVI-XVII əsrlərdə yaşamış Əziz Mahmud Xudayidir (vəf. 1628), onun şeyxləri arasında bu iki təriqətin mənsubları da olmuşdur. Bayramiyyə təriqəti ilə yaxınlığı sayəsində cəlvətiyyədə nəqşbəndiliyin də izləri görünür. Belə bir deyim vardır ki, cəlvətiyyə təriqəti Şeyx Zahid Gilaninin zamanında hilal, Üftadənin (Xudayinin şeyxi) zamanında yarımay, Xudayinin zamanında isə bədr halında olmuşdur.

Təriqətin silsiləsi həzrət Əli (ə) vasitəsilə peyğəmbərə (s) bağlanır, buna görə də aşkar zikrə *(zikri-cəliyy)* üstünlük verilir. Cəlvətiyyədə "tövhid zikri" geniş yayılmışdır, təriqətə daxil olanlar təkamül dərəcələrinə uyğun olaraq bu zikri fərqli keyfiyyətlərlə icra edirlər. İlk mərhələdə "la məbudə illəllah" (Allahdan savayı ibadət edilən yoxdur) formasında söylənilən zikr ən aşağı dərəcə sayılır. Daha sonra "la mətlubə illəllah" (Allahdan savayı arzu və tələb edilən heç nə yoxdur), "la məqsudə illəllah" (Allahdan savayı məqsəd yoxdur), "la məhbubə illəllah" (Allahdan savayı sevgili yoxdur) formasına keçilir. Nəhayət, salik "la mövcudə illəllah" (Allahdan savayı mövcud yoxdur) mərtəbəsinə daxil olur, bütün Kainat onun gözündə öz etibarını itirənə və tövhid nuru qəlbində parlayanadək bu zikrlə məşğul olur. Bu zikrlərin ilk mərtəbələri xəfiyy (gizli), üst mərtəbələri isə cəliyy (aşkar) şəkildə icra edilir. Cəlvətiyyədə yeddi zikr (əsmayi-səbə) də geniş yayılmışdır: "la ilahə illəllah", "Allah", "hu", "Haqq", "Həyy", "Qəyyum" və "Qəhhar". Zikrlər adətən "nisfi-qiyam" şəklində, yəni diz üstə dikəlmiş halda oxunur.

Təriqətə daxil olmağın xüsusi adabı vardır. Təriqət üzvünün həmişə dəstəmazlı olması, ilin bəlli günlərində oruc tutması, 100 dəfə "əstəğfirullah", 100 dəfə sa-



lavat, 700 dəfə "la ilahə illəllah" kəlmələrini söyləməsi, sübh namazından sonra mənəvi mövzularda düşünməsi, nafilə namazları qılması və s. tövsiyə edilir. Cəlvətiyyə təriqətinə görə, *seyrüsüluk* yolunda irəlilədikcə *salik* dörd mərhələyə daxil olur. Bu mərhələlər dörd təbii ünsürlə və dörd rənglə assosiasiya edilir. Birinci mərtəbə təbiət mərtəbəsidir, onun rəmzi torpaq, rəngi qaradır. İkinci mərtəbə *nəfs* pilləsidir, onun rəmzi hava, rəngi qırmızıdır. Üçüncü ruh mərtəbəsi odla və qırmızı rənglə eynilik təşkil edir. Nəhayət, ən üstün dərəcə olan sirr mərtəbəsinin simvolu su, rəngi isə şəffafdır. Bu dörd mərhələni uğurla keçən salik yalnız Allahın vacib olan vücudunu duyur və *xəlifəlik* məqamını qazanır, özü irşad (mənəvi hidayət) ilə məşğul olmağa başlayır.

Cəlvətiyyə müridləri 13 sarıqlı papaq (tac) qoyurlar. Sarıqlardan 12-si "la ilahə illəllah" cümləsindəki hərflərin və imamların sayını simvolizə edir, 13-cü sarıq Əziz Mahmud Xudayinin *qütblüyünə* işarədir, tacın ortasındakı düymə isə peyğəmbərlik məqamının rəmzi sayılır. Tacın sarınma qaydası digər təriqətlərdən bir qədər fərqlənir.

Cəlvətiyyə təriqəti həm Anadoluda, həm də Rumelidə və Balkan yarımadasında geniş yayılmış, xüsusilə Balkan müsəlmanları arasında çoxlu tərəfdar qazanmışdır. Hazırda təriqətin əsas *təkkələri* İstanbulun Üsküdar məhəlləsində yerləşir.

*Mənbələr: Türkiye Diyanet Vakfı İslam Ansiklopedisi, VII, 273-275; Ethem Cebecioğlu. Tasavvuf Terimleri ve Deyimleri Sözlüğü, "celvet" ve "celvetiyye" maddələri; Enver Behnan Şapolyo. Mezhepler ve Tarikatlar Tarihi, s.203-206.*



**CƏM AYİNİ** – *ələvilikdə* mühüm sayılan, ələviliyin əsasını təşkil edən ayin. Sözün mənşəyini mifolojik obraz olan Cəmşidin adı ilə, yaxud ərəbcə "toplaşmaq" (cəm) sözü ilə əlaqələndirirlər. Cəm ayininin kökü Mühəmməd Peyğəmbərin (s) merac səfərinə əsaslanan mifolojik təsəvvürə bağlanır. Ələvi inancına görə, peyğəmbər (s) merac səfərindən qayıdarkən bir otaqda 40 nəfərin toplandığını görmüş, icazə alıb otağa daxil olmuş və onlara qoşulub ilk cəm ayinini yerinə yetirmişdir. Bu məclisdəkilər peyğəmbərə (s) özlərini dünya malına arxa çevirmiş, 40 bədəndə bir can olmuş şəxslər kimi təqdim etmişlər; hətta onların birinin biləyinə neştər vuranda hamısının qolundan qan axmışdır. *"Qırxlar məclisi"* ifadəsinin və can məfhumunun da kökü buradandır.

Ələvilərin cəm məclisi həmin qırxlar məclisinin simvolik modelini özündə ehtiva edir. Keçmişdə cəm məclisi payız-qış aylarında, adətən həftənin cümə axşamından cüməyə keçən gecəsində, ələvi icmasının mötəbər üzvlərindən birinin evində icra edilirdi. Hazırda adətən həftə sonları bu məqsədlə ayrılmış xüsusi cəm evərində təşkil edilir. Cəm məclisinə o bölgənin ələvi icmasının bütün üzvləri qatılır, günahkar, əxlaq-

sız, boynunda bəndə haqqı olan, haram yeyən, oğurluq edən, hətta qonşusunu incidən adamlar məclisə buraxılmaz. Cəm məclisinə buraxılmamaq ictimai qınağın bir növü və sosial baykot metodudur.

Cəm ayini xüsusi ardıcıllıqla və nizam-intizamla icra edilir. Ayin *pir* tərəfindən idarə olunur, ona *dədə, baba* da deyirlər. Ondan əlavə cəm məclisinin digər xidmətçiləri də olur. Rəhbər pirin müavini olaraq ayinə ümumi nəzarəti öhdəyə alır, peyk insanları məclisə dəvət edir, gözçü məclisə daxil olanları yerləşdirir, çıraqçı məclisin mühüm atributu olan şamı (mumu) yandırır, sazçı saz çalıb irfani nəğmələr oxuyur, süpürgəçi təmizlik işlərinə baxır, səqqa su gətirir, süfrəçi yemək paylayır, pərvanə səma ayininə nəzarət edir, qapıçı qapıda durub gələnləri qəbul edir, iznikçi təmizlik işlərinə baxır. Bu 12 nəfərin vəzifəsi 12 xidmət adlanır.

Cəm məclisində pir başqa oturur, qalan məclis iştirakçıları dairə şəklində və ya üz-üzə cərgələrlə əyləşirlər. Cəm ayinində kişilərlə yanaşı qadınlar da iştirak edir. Pir məclisi açdıqdan sonra bir-birinin ardınca dualar (gülbang), salavatlar deyilir, meracnamə və irfani şeirlər oxunur, saz çalınıb nəğmələr ifa edilir, *səma* rəqsi yerinə yetirilir, təriqət dəstəmazı alınır (iştirakçılar bir-birinin əlinə su tökürlər), süfrə salınıb yemək yeyilir, yemək bitdikdən sonra süfrə duası edilir və s. Cəm məclislərində əsasən *yeddi ulu ozanın* şeirlərinə (bunları deyiş adlandırırlar) müraciət edirlər.

Cəm məclisləri həm də mühüm maarifləndirici və sosial-əxlaqi mahiyyət daşıyır. Belə ki, məclisin başçısı olan dədə iştirakçıların ələvi inancı barədə suallarına cavab verir, toplaşanlar arasında küsülülər varsa barışdırılır, yardıma ehtiyacı olanlar üçün ianə elanları verilir, problemlərin ümumi həlli üçün məşvərət edilir. Tədbirin əvvəlində mum (şam) yandırılır, sonda mum dincəldilir (söndürülür), buna görə cəm məclislərinə bəzən "mumsöndü" də deyirlər. Keçmişdə ələviliyə düşmənçilik bəsləyənlərin dilində bu söz mənfi mənada işlədilirdi; şayiə yayılmışdı ki, guya cəm məclisinin sonunda şamı söndürdükdən sonra ələvilər əxlaqa zidd əməllər edirlər.

Cəm məclisləri adətən qapalı keçirilir, ələvi inancında olmayan adamlar məclisə buraxılmır. Ələvilər bu yolla öz təriqət sirlərini qoruduqlarını iddia edirlər.

***Mənbələr:** Musa Kazım Engin. Hak ve Hakikat Yolu Alevilik, s.152-185; Alevi-Bektaşi İnancının Esasları (DABF Danimarka Alevi Birlikleri Federasyonu), s.39-46; Mehmet Eröz. Türkiye'de Alevilik Ve Bektaşilik, s.96-138; Enver Behnan Şapolyo. Mezhepler ve Tarikatlar Tarihi, s.314-318.*



**CƏZBƏ** – *salikin seyrü-süluk* yolunda heç bir səy göstərmədən, Allahın lütfü sayəsində irəliləməsi, başqa sözlə, Allahın sufini Özünə sarı cəzb etməsi. *Riyazət* çəkmədən, özünün də xəbəri olmadan salik Allaha gedən yolda xeyli məsafəni cəzbə sayəsində qət edir. Başqa vaxtda uzun-uzadı fikir və *zikrlə, çilə*



və *səma* ilə əldə edilən tərəqqi cəzbə nəticəsində bir anda hasil olur. Təsəvvüfdə belə bir deyim var: "Haqdan gələn cəzbə səqəleynin (bəşər ilə cinlərin) əməlinə bərabərdir". Yəni insanın və cinin uzun illər və ağır zəhmətlər bahasına çatdığı məqamı Allahdan gələn ani bir cəzbə vasitəsilə qazanmaq olar. Cəzbə peyğəmbərlərə və övliyalara xasdır. *Arifin* qəlbinə daxil olan ilham cəzbədir. Sufilər peyğəmbərin Allahdan vəhy almasını da cəzbə sayırlar. Sufilərin dilində Allaha doğru yolun adi qaydada qət edilməsi seyr (səfər, səyahət) adlanırsa, cəzbə ilə qət edilməsi teyr (uçuş) adlanır, yəni sufi cəzbə anında quş kimi uçub böyük məsafələri qısa müddət ərzində arxada buraxır.

Cəzbə iki cür ola bilər. Bəzən Allah bir insana heç bir hazırlığı olmadan cəzbə bəxş edir, cəzbənin təhriki ilə həmin şəxs özünə *mürşid* seçib *təriqətə* daxil olur və təriqətin adabını öyrənir. Bəzən də sufi təriqət işində tərəqqi edəndən sonra cəzbəyə layiq olur, yəni cəzbəni hazır vəziyyətdə qəbul edir.

Allahın cəzbəsini qazanmış salikə "məczub" deyirlər.

***Mənbələr:*** *Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.285-286; Ethem Cebecioğlu. Tasavvuf Terimleri ve Deyimleri Sözlüğü, "cezbe" maddəsi; İzzəddin Kaşani. Misbah əl-hidayə və miftah əl-kifayə, s.110-111; Şeyx Səfi təzkirəsi ("Səfvətüs-səfa"nın XVI əsr türk tərcüməsi), s.430.*

**CİHADİ-ƏKBƏR** – tərcüməsi "böyük cihad" deməkdir. İslam əxlaqı barədə yazılmış kitablarda, eləcə də sufi mənbələrində insanın öz *nəfsi* ilə mübarizəsi belə adlandırılır. Bu ifadə Mühəmməd Peyğəmbərin (s) məşhur bir hədisindən götürülüb. Bir çox mənbələrdə qeyd edilmiş bu hədisə əsasən, Mühəmməd Peyğəmbər (s) hərbi yürüşdən qayıdan müsəlman əsgərlərini qarşılayarkən buyurmuşdu: "Kiçik cihaddan üzüağ qayıdanlara əhsən olsun! Amma onların qarşısında hələ böyük cihad durur". Peyğəmbərdən: "Böyük cihad nədir?" – deyə soruşduqda cavab vermişdi: "Nəfslə mübarizə". Yenə hədislərdə buyurulur: "Güclü şəxs odur ki, öz nəfsinə qalib gələ bilsin".

Ariflər deyib ki, qazilərin cihadı qılınc vasitəsilə kafirlərə qarşıdır. Ariflərin cihadı isə nəfsi öldürmək vasitəsilə özlərinə qarşıdır. Nəfslə cihadın yolu budur ki, *mürid* təriqət qaydalarına riayət etsin, *riyazətlə* məşğul olsun, mürşidin göstərişlərini dəqiq yerinə yetirsin. Əgər onun iradəsi güclüdürsə, bu cihaddan qalib və üzüağ çıxacaq.

"Şeyx Səfi təzkirəsi"ndə nəfslə mübarizə aparan təriqət müridləri haqqında deyilir: "Bu mərtəbə mücahidlərün, yəni ğazi salikləründür ki, nəfs ilən cihaddadurlar ki, saətbəsaət nəfsanlıq həva ilə həvəsi nəfy (ləğv) edüb sürərlər".

***Mənbələr:*** *Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.295-296; Şeyx Səfi təzkirəsi ("Səfvətüs-səfa"nın XVI əsr türk tərcüməsi), s.404; Məhəmməd Reyşəhri. Mizan əl-hikmə (12 cilddə), II, 594-599.*

**ÇİLƏ (ÇİLLƏ)** – məşhur sufi ayinlərindən biri. Fars dilində 40 ədədini ifadə edən "çehel" sözündən götürülmüşdür.

Çiləyə oturmaq 40 gün hamıdan gizli və tənha halda ibadət etmək mənasını verir. Çilə müddətinin niyə 40 gün olmasını sufilər həzrət Musanın (ə) Allahdan vəhy almaq üçün 40 gün Tur dağında qalması, həzrət Adəmin (ə) yaradılışının 40 gün ərzində tamamlanması və həzrət Mühəmmədin (s) peyğəmbərlik verilməzdən əvvəl hər ilin ramazan ayında Hira mağarasında *xəlvətə* çəkilməsi ilə bağlayırlar.

Mühəmməd Peyğəmbərə (s) aid edilən bu hədis də sufilər tərəfindən çilə üçün əsas götürülür: "Hər kim 40 gün Allaha ixlaslı olsa, hikmət çeşmələri qəlbindən dilinə süzülər".

Bununla belə, sufilər arasında fərqli çilə müddətləri də yayılmışdı. Bəzi sufilər fasiləsiz olaraq 40 gün, bəziləri iki ay, bəziləri də üç ay və daha artıq çilə dövrü keçirmişlər. Hər il 3-4 dəfə (hər dəfə 40 gün olmaq şərti ilə) çiləyə oturan sufilər haqqında da məlumatlar var.

Çilə ayini əksər sufi mənbələrində xəlvət adlandırılır, kitablarda xəlvət ayini barədə yazılanlar elə çiləyə də aiddir.

Mövləviyyə təriqətində 1001 günlük çilə ənənəsi mövcud idi (bu ədəd "riza" sözünün əbcəd hesabı ilə ekvivalentidir). Təriqətə daxil olmaq istəyən şəxs 3 il müddətində hər il 9 dəfə çilə keçməli, yəni 40 gün ev heyvanlarına xidmət etməli, 40 gün xanəgahı süpürməli, 40 gün quyudan su çəkməli, 40 gün xalça-palaz çırpmalı, 40 gün odun doğrayıb daşımalı, 40 gün aşpazlıq etməli, 40 gün dükandan lazım olan şeyləri almalı, 40 gün sufi məclislərində xidmətçilik etməli və 40 gün gözətçi qalmalı idi. Çilənin sonunda şeyx müridi təbrik edər, ona kiçik hədiyyə verərdi.

*bax:* **XƏLVƏT.**

***Mənbələr:** Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.305-306; Seyid Ziyaəddin Səccadi. İrfan və təsəvvüfün əsaslarına giriş, s.259-261; Türkiye Diyanet Vakfı İslam Ansiklopedisi, VIII, 315-316.*



**ÇİLƏXANA** – sufilərin *çilə* (*xəlvət*, etikaf) ayinini icra etdikləri məkan. Mənbələrdə bu məkanın adı "*xəlvətxana*" şəklində də qeyd edilmişdir. Adətən çilə təcrübəsindən faydalanan bütün təriqətlərin *xanəgahlarında* çiləxana adlı xüsusi məkan olurdu; hətta Səfəvi sarayında da xəlvətxana vardı.

Ərdəbildəki Şeyx Səfi xanəgahında iki çiləxana mövcud olmuşdur. Bunlardan "qədim çiləxana" adlı birinci bina Şeyx Səfiəddin Ərdəbilinin xəlvət ayinini icra etdiyi yer idi. Sonralar onun oğlu Şeyx Sədrəddin həyətdə ikinci çiləxananı ("təzə çiləxana") tikdirmişdir. Qədim çiləxana zaman keçdikcə dağılmışdır. Səfəvilər dövründə genişləndirilmiş təzə çiləxana 40 otaqdan ibarət ikimərtəbəli bina idi. Sonralar binanın damı uçulmuş, tikili baxımsız hala düşmüşdür. Hazırda təzə çiləxana binası təmir edilmişdir.

*bax:* **XƏLVƏTXANA.**

***Mənbələr:** Türkiye Diyanet Vakfı İslam Ansiklopedisi, XV, 388; Rəuf Musəvi. Ərdəbil Səfəvilər dövründə, s.91; Tarix-i aləmara-yi Abbasi (tərcümə və şərhlər: O.Əfəndiyev, N.Musalı), s.52; İbn Bəzzaz Ərdəbili. Səfvət əs-səfa, s.173; Aləmarayi-Səfəvi, s.15-16;*



*Şeyx Səfi təzkirəsi ("Səfvətüs-səfa"nın XVI əsr türk tərcüməsi), s.70.*



**DƏDƏ** – *qızılbaş-bektaşi* ənənəsində, eləcə də digər sufi təriqətlərində sıravi *sufilərdən* fərqlənən və daha yüksək mənəvi dərəcələrə nail olan təsəvvüf adamı. İlk dəfə yəsəviyyə təriqətinin bəzi ardıcıllarına "dədə" deyildiyini yazırlar. Daha əvvəllər işlənilmiş "ata" və "baba" ləqəblərinin yerini tutmuşdur. Belə ki, məşhur el *ozanı* Dədə Qorqudu bəzən Qorqud ata da adlandırırlar. Mövləviyyə təriqətində *çilə* keçirmiş və mənəvi cəhətdən təmizlənmiş *dərviş* dədəlik məqamına layiq görülür. Bektaşilikdə "*dədə baba*" mərtəbəsi təriqət xadimləri arasında ən yüksək yerdə durur (aşiq, *talib*, mühibb, dərviş, baba, *xəlifə* və dədə baba). Səfəviyyə kimi öz kökünü *zahidiyyə* təriqətindən götürən *xəlvətiyyənin* ən məşhur pirlərindən birinin də adı Dədə Ömər Rövşənidir (1407-87). Ələvilikdə dədə icmanın ağsaqqalıdır və ocaqzadədir, yəni bu məqam ocaq sahibi olan şəxslərin nəslinə məxsusdur, atadan oğula ötürülür. Dədə böyük nüfuz sahibidir, *ələvi cəm məclisinə* başçılıq edir, küsülüləri barışdırır, mübahisələri həll edir.

Qızılbaş düşüncəsində dədə təriqət üzvləri arasında bəlli yeri olan, bu yola yeni qədəm basanları irşad edən bir pir, ağsaqqaldır. Səfəvilər dövlətində şahzadələrin təlim-tərbiyəsiylə *lələ* ilə yanaşı dədə də məşğul olurdu. Lələ şahzadənin dünyəvi baxımdan mürəbbisi, dədə isə təriqət məsələlərində müəllimi idi. Bu vəzifələrə yalnız türk qızılbaş tayfalarının mənsubları təyin edilirdi. I Şah İsmayılın uşaq və yeniyetməlik yaşlarında dədəsi *Abdal bəy Zülqədər* idi, o, sonralar *qorçubaşı* vəzifəsinə yüksəldi.

Sufilikdə "dədə" və "baba" ləqəbləri oxşar mahiyyət daşıyır və təriqətdə müəyyən məqama çatmış şəxslərə verilir. Bir neçə böyük təsəvvüf xadimi və şair bu ləqəblərlə tanınırdı (məsələn, Baba Tahir Üryan, Baba Kuhi Bakuvi, Baba İshaq, Baba Nemətullah Naxçıvani, Baba Fərəc Təbrizi, Dədə Ömər Rövşəni, Dədə Sultan, Dədə Ətiq). Ənənəyə görə, ustad aşıqlara da ozan irsinin davamçısı olaraq "dədə" deyirlər (Dədə Ələsgər, Dədə Şəmşir).

Ələvilikdə imamların soyundan gələn *seyid* və şəriflərə "dədə" deyilir.

***Mənbələr:*** *Tarix-i aləmara-yi Abbasi (tərcümə və şərhlər: O.Əfəndiyev, N.Musalı), s.392; O.Əfəndiyev. Azərbaycan Səfəvilər dövləti, s.248; Faruk Sümer. Safevi Devletinin Kuruluşu ve Gelişmesinde Anadolu Türklerinin Rolü, s.15, 22, Türkiye Diyanet Vakfı İslam Ansiklopedisi, IX, 76.*



**DƏRVİŞ** – lüğəti tərcüməsi "fəqir, əliboş, miskin" deməkdir. "Dərvişlik" sözü kasıblıq və möhtacluq mənasında işlədilir. Adətən sufi təriqətinin üzvünü dərviş adlandırırlar. Təsəvvüf terminologiyasında dünyadan əl üzüb özünü Allaha təslim etmiş şəxsə dərviş deyirlər. Keçmişdə dərvişlərin əksəriyyəti əyninə yun kürk geyinib əlinə *kəşkül* alır, şəhərləri, kəndləri gəzir, dini-irfani şeirlər oxuyub camaatın verdiyi sədəqə

hesabına dolanırdı (bax: *qələndər*). Hətta bəzi dərvişlər tərkidünyalığa qapılır, ac-yalavac və səfil həyat tərzi sürür, evlənmir, səliqəsiz və kirli paltar geyinirdilər. Təsəvvüf adabı baxımından bu davranışlar düzgün sayılmır. Əsl sufi başqalarına möhtac olmamalı, sədəqə istəməməli, öz şəxsiyyətini və izzəti-nəfsini qorumalıdır. Sufi mənbələrində əsl dərviş özünü Allaha həsr edən, *seyrü-süluk* yolunu layiqincə qət edən, mənsub olduğu təriqətin göstərişlərini və şeyxin tapşırıqlarını tam ciddiyyətlə yerinə yetirən, başqalarına möhtac olmayan, dünya əhlindən ehtiyacını kəsən, öz rəftarı, əxlaqı, ibadəti, qiyafəsi ilə insanlara nümunə olan şəxsdir. Əsl dərviş *övliya* məqamına yüksəlmiş arifdir.

Əzizəddin Nəsəfi yazırdı: "İnsanların ən ağıllıları öz ixtiyarı ilə dərvişlik edən və şüurlu şəkildə arzu-kamlardan imtina edən dərvişlərdir. Çünki hər arzu-kamın altında onlarla, bəlkə yüzlərlə nakamlıq gizlənib. Ağıllı adam bir arzu-kama çatmaqdan ötrü yüz nakamlığa dözməz".

Dərviş ətrafdakıların gözündə *fəqir* görünsə də, öz halından məmnundur. Dərviş özünü bütün sultanlardan daha üstün bilir, çünki o, dərvişlik və fəqirlik mülkünün sultanıdır: "Fəxr edib dərvişliyə, aləmdə sultan olmuşuz" *(Ş.İ.Xətai)*.

Şeyx Səfiəddin Ərdəbili təriqətə qədəm basmış sufinin (*talibin*) aşağıdakı xüsusiyyətlərə sahib olmasını şərt bilirdi: "Siratül-müstəqimdə doğru yeriyə və doğru söyləyə, dost könlünü ağrıtmaya, könlü dərvişlikdə, dili mürüvvətdə ola, ta ki bu yolda məqsudunu bula". Göründüyü kimi, Şeyx Səfinin düçüncəsində dərvişlik zahiri görüntüyə deyil, qəlbə bağlıdır və sufinin qəlbi dərvişlik halında olmalıdır. Şeyx Səfiəddin əsl dərvişləri bu cür vəsf edirdi: "Dərvişlikdə yalan söyləmək yoxdur". "Dərvişlərün məzhəbi Həqqün məzhəbidür".

İstər *"Qara məcmuə"də*, istərsə də *"Şeyx Səfi təzkirəsi"ndə ("Səfvət əs-səfa")* dərvişlərə xidmət göstərmək böyük şərəf sayılır, dərvişin könlünü qırmaq, incitmək, haqqını yemək, barəsində pis söz danışmaq və hətta pis fikirə düşmək böyük günah hesab edilir, bu günahları edənlər bəzən dərhal bəlaya düçar olur, amma tövbə edincə bəladan qurtulurlar. Şeyx Səfi deyirdi: "Sən bilməzsən ki, dərvişlərün həqqində yaman söz deməmək gərək, bəlkə xəyalında dəxi keçürməmək gərək, yoxsa hər yamanlıq kim onlarun həqqində kimsə eylər, yamanlığı həm ona dönər".

Sufi mənbələrində "*qələndər*", "*abdal*", "*baba (dədə)*", "*sufi*" sözləri də "dərviş" kəlməsinə yaxın mənada işlədilir.

***Mənbələr:*** *Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.383; Ethem Cebecioğlu. Tasavvuf Terimleri ve Deyimleri Sözlüğü, "derviş" maddəsi; Qara məcmuə, s.25; Şeyx Səfi təzkirəsi ("Səfvətüs-səfa"nın XVI əsr türk tərcüməsi), s.339.*



**DÖRD QAPI və QIRX MƏQAM** – mühüm təsəvvüf terminlərindən biri. *Seyrü-süluk* yolunun dörd mərhələsi (*şəriət, təriqət, mərifət* və *həqiqət*) birlikdə dörd qapı adlandırılır. Dörd qapı anlayışına məşhur sufi müəlliflərdən



Hacı Bektaş Vəli, Yunis Əmrə, Əhməd Yəsəvi, Pir Sultan Abdal və başqalarının əsərlərində rast gəlirik. Dörd qapı və qırx məqam bektaşi-ələvi inancında əsas yer tutur.

Hacı Bektaş Vəli "Məqalat" əsərinin birinci bölümündə qeyd edir ki, Allah-Taala bəşəriyyəti dörd ünsürdən yaratmışdır: torpaq, su, od və hava (külək). İnsanların bəzilərində bu, bəzilərində də digər ünsür üstünlük təşkil edir, buna uyğun olaraq da insanlar dörd təbəqəyə bölünür. Birinci təbəqə şəriət əhli olan abidlərdir və onların əsli havadır. İkinci təbəqə zahidlərdir, bunlar təriqət əhli olub, əslləri oddandır. Üçüncüsü *ariflər* təbəqəsidir, *mərifət* əhlidirlər, əslləri də sudur. Nəhayət, dördüncü qisim mühiblərdir (məhəbbət əhli, sevənlər), onların əsli torpaqdır, onlar təslimiyyət və *riza* əhlidirlər, həqiqətə yetişmişlər.

Hacı Bektaş Vəli yazır ki, bəndə qırx məqamda Allaha qovuşar. Bu məqamların onu şəriətə, onu təriqətə, onu mərifətə və onu həqiqətə aiddir. "Məqalat"ın növbəti bölümlərində müəllif bu qırx məqamı bir-bir açıqlayır.

*Şəriətə* aid olan məqamlar:

1. Allaha iman gətirmək;
2. Elm öyrənmək;
3. Zəkat vermək, oruc tutmaq, imkan daxilində həccə getmək, din yolunda cihad etmək, cənabətdən pak olmaq;
4. Halal qazanmaq, sələmi haram saymaq;
5. Ailə qurmaq;
6. Heyz və nifas halında qadınla cinsi əlaqədə olmamaq;
7. Sünnəti-camaat;
8. Şəfqətli olmaq;
9. Təmiz geyinib təmiz yemək;
10. İnsanları yaxşı əməllərə çağırıb pis işlərdən çəkindirmək.

*Təriqətin* on məqamı aşağıdakılardır:

1. Günahlardan tövbə etmək;
2. Mürşidə müridlik etmək;
3. Saçları qırxıb təriqətə uyğun geyinmək;
4. Cihad eşqi ilə yanmaq;
5. İnsanlara xidmət etmək;
6. Allahın əzabından qorxmaq;
7. Allahın rəhmətinə ümidvar olmaq;
8. Xirqə geyinib, təsbeh, səccadə gəzdirmək, hər şeydən ibrət almaq;
9. Nəsihət və məhəbbət sahibi olmaq;
10. Elm, şövq, fəqirlik sahibi olmaq.

*Mərifətin* 10 məqamı:

1. Ədəb;
2. Allahdan qorxmaq;
3. Təqva (nəfsin istəklərinə yox demək);
4. Səbir;
5. Həya;
6. Comərdlik (fütüvvət);
7. Elm;
8. Miskinlik;
9. Mərifət;
10. Özünü tanımaq.

Nəhayət, *həqiqətin* on məqamı bunlardan ibarətdir:

1. Torpaq olmaq;
2. Yetmiş iki milləti (məzhəbi) əskik bilməmək;
3. Əlində olanı əsirgəməmək;
4. Dünyadakı hər şeyə dəyər vermək;
5. Mülkün mütləq sahibi olan Allahın hü-

zurunda əyilib etibar qazanmaq;
6. Söhbət, həqiqət sirlərini söyləmək;
7. Mənəvi səfər (seyr);
8. Sirr;
9. Allaha yalvarmaq;
10. Xəlqi Həqdə görmək (müşahidə) və Allaha qovuşmaq.

Hacı Bektaş Vəli bu qırx məqamı saydıqdan sonra qeyd edir ki, əgər bunlardan biri əskik olsa, həqiqət tamamlanmaz və naqis qalar.

Bektaşi-ələvi ənənəsində dörd qapı məfhumuna müxtəlif simvolik mənalar verilmişdir. Məsələn, şəriət – ana, təriqət – ata, mərifət – oğul, həqiqət – oğlun oğludur. Şəriət – şərq, təriqət – qərb, mərifət – şimal, həqiqət – cənubdur (qiblə istiqaməti). Şəriət – fərz, təriqət – vacib, mərifət – sünnət, həqiqət – nafilədir.

Bektaşi şəriət mərhələsində bir evə, ailəyə məxsusdur, ata-ananın övladıdır, ailə qarşısında vəzifələri var. Təriqət mərhələsində yol oğludur, bir yola (təriqətə) bağlıdır. Mərifət mərhələsində el oğludur, cəmiyyət üçün düşünər, çalışar, xalqa xidmət edər. Həqiqət mərhələsinə qədəm qoyanda isə “atam göydür, anam yerdir” deyər, bütün mənliyindən sıyrılıb çıxar.

***Mənbələr:*** *Hacı Bektaş Veli. Makalat (hazırlayanlar: A.Yılmaz, M.Akkuş, A.Öztürk), s.44-52 və 68-81; Abdullah Kahraman. Yunus Emre Divanında Şeriat, Tarikat, Hakikat ve Marifet (Dört Kapı), Kocaeli İlahiyat Dergisi, c. 1, sy. 1, Mayıs 2017, s.1-18; Hüseyin Özcan. Bektaşîlikte Dört Kapı Kırk Makam, Türklük Bilgisi Araştırmaları (TUBA), Volume 28/1, 2004, s. 241-245; Anton Jozef Dierl. Anadolu Aleviliği, s.123-126; Musa Kazım Engin. Hak ve Hakikat Yolu Alevilik, s.31-47.*



**DUA** – ərəb dilindən tərcüməsi çağırmaq deməkdir. Dini terminologiyada bəndənin Allaha müraciəti, öz arzu-istəklərini və ya həmd-sənasını dil ilə Ona bildirməsi dua adlanır. Dua bəndənin Allahla söhbəti, ünsiyyətidir, qəlbə aramlıq gətirən, ruhu möhkəmləndirən, insana əmin-amanlıq bəxş edən vasitədir. Dua etməklə ürəklər boşalıb yüngülləşir, kədər, həsrət, ümidsizlik, intiqam kimi mənfi emosiyalar insandan uzaqlaşır. Qurani-Kərimdə deyilir: “Rəbbiniz buyurdu: “Dua edin, Mən də sizin dualarınızı qəbul edim” (Mömin, 60). “De: “Əgər duanız olmasa, Rəbbimin yanında nə qədir-qiymətiniz olar?” (Fürqan, 77). İmam Cəfər Sadiq (ə) buyurmuşdur: “Dua et, demə ki, iş işdən keçib. Həqiqətən, Allahın yanında elə bir məqam var ki, dua etmədən o məqama yetmək olmaz”.

Məsumların hədislərində dua möminin silahı, dinin sütunu, göylərin və yerin nuru, möminin sipəri, nizədən daha kəsərli silah, peyğəmbərlərin silahı, nicat açarı, xoşbəxtlik xəzinəsi, hər dərdin şəfası adlandırılıb. Qurani-Kərimdə Allah vəd verir: “(Ya Rəsulum!) Bəndələrim Məni səndən soruşduqda söylə ki, Mən (onlara) yaxınam. Dua edib məni çağıranın duasını qəbul edərəm. Gərək onlar da mənim çağırışımı qəbul edib Mənə iman gətirsinlər. Bununla da, ola bilsin ki, doğru yola yetişsinlər” (Bəqərə, 186).



İmam Cəfər Sadiqə (ə) aid edilən "Misbah əş-şəriə" risaləsində tövsiyə edilir ki, dua edərkən bu məsələlər barədə düşün: Kimi çağırırsan, necə çağırırsan və nə üçün çağırırsan? Allahdan nə istəyirsən, nə qədər istəyirsən və nə üçün istəyirsən?

Dua təsəvvüfdə mühüm yerə malikdir. Sufi uca məqamları Allaha dua etməklə qazanır. *Xəlvət*, *zikr* ayinlərinin mahiyyəti səsli və ya səssiz duadan ibarətdir. Təsəvvüfdə hər şeyin adabı olduğu kimi, duanın da adabı vardır.

Təriqətdə *şeyxin* duasını qazanmaq böyük şərəf və xoşbəxtlik sayılırdı. Səfəviyyə təriqəti barədə yazılmış mənbələrdən aydın olur ki, müridləri tez-tez Şeyx Səfiəddin Ərdəbilinin yanına gəlib onların barəsində dua etməsini istəyirdilər. *"Qara məcmuə", "Şeyx Səfi təzkirəsi"* və digər kitablarda Şeyxin xeyir və bəd dualarının müstəcab olması barədə onlarla rəvayət qeyd edilmişdir.

***Mənbələr:*** *Məhəmməd Reyşəhri. Mizan əl-hikmə, III, 1158-1189; Şəriət çırağı (tərcümə edən: Ə.Əhmədov), s.23-24.*



**EHSAN (İHSAN)** – ərəb dilindən tərcüməsi "yaxşılıq etmək" deməkdir. Həm Allah-Taala tərəfindən öz bəndələrinə ünvanlanmış sonsuz nemətlər mənasında, həm də insanların qarşılıqlı yardımı və qayğısı anlamında qəbul edilir. Qurani-Kərimdə buyurulur: "Həqiqətən, Allah ədalətli olmağı, yaxşılıq etməyi, qohumlara (haqqını) verməyi buyurur, zina etməyi, pis işlər görməyi və zülm etməyi isə qadağan edir..." (Nəhl, 90). "Allah sənə yaxşılıq etdiyi kimi, sən də yaxşılıq et..." (Qəsəs, 77). "Yaxşılıq edin. Allah yaxşılıq edənləri sevər!" (Bəqərə, 195).

Allahın razılığına səbəb olan bütün əməllər, xüsusilə insanın başqalarına münasibətdə göstərdiyi xeyirxahlıq ehsan sayılır. Ehsan müsəlman əxlaqının ən mühüm xüsusiyyətlərindən biridir. Hədisə görə, dünya və axirətdə insana ən çox xeyir verəcək əməllər sənə zülm edəni bağışlamaq, səninlə əlaqəni kəsənlərlə rabitə yaratmaq, sənə pislik edənlərə yaxşılıq etmək, səndən əsirgəyənlərə bəxşiş verməkdir.

Ehsan təsəvvüfdə də mühüm məfhumlardan biridir. Sufi ədəbiyyatında tez-tez rast gəlinən "Cəbrail (Cibril) hədisi" adlı rəvayətdə də ehsan diqqət mərkəzinə alınıb. Həmin hədisə görə, vəhy mələyi Cəbrail (ə) Mühəmməd Peyğəmbərə (s) nazil olub, onu Allah tərəfindən imtahan etmək üçün bir neçə sual verdi. İslamın, imanın, ehsanın mənaları və qiyamətin əlamətləri barədə mələyin suallarını Həzrət Peyğəmbər (s) qısa, amma dolğun şəkildə cavablandırdı. "Cəbrail hədisi"ndə "Ehsan nədir" sualına həzrət belə cavab vermişdi: "Ehsan – Allaha Onu görürmüşsən kimi ibadət etməkdir. Sən Onu görməsən də, O səni görür".

Əsl *arif* və *salik* ehsan sahibidir, hər kəsə yaxşılıq edir. O, Allahın bəndələrinə pislik etməyi Allaha asi olmaq kimi görür. Ehsan salikin həyat düsturudur, Allahın bəndələrinə yaxşılıq və xidmət etmək onun gözündə ibadətdir. O, eh-

san edərkən fədakarlıq göstərər, hər şeyindən keçər. Buna görə böyük müsəlman alimi Rağib İsfahani ehsanı hətta ədalətdən də yüksək qiymətləndirirdi. Onun fikrincə, ədalət odur ki, insan öz vəzifəsini yerinə yetirsin və haqqı çatanı alsın. Amma ehsan odur ki, insan öz vəzifəsindən daha artığını etsin və haqqı çatandan daha aza qane olsun.

Sufilərin gözündə ehsan həqiqət qapılarının ümumi adıdır, yəni yalnız ehsan vasitəsilə həqiqəti dərk etmək mümkündür. Sufi mənbələrinin birində deyilir: "Ehsan ibadətləri də, müamilələri də əhatə edir, yəni həqiqətlərin qapısıdır. Hər kim *seyrü-süluk* yoluna ehsanla qədəm qoymasa, həqiqətlərə qovuşmağın qapısı onun üzünə açılmaz, Allahla vəd olunmuş görüş ona nəsib olmaz".

***Mənbələr:*** *Səhih əl-Buxari, Kitab əl-iman, bab 37, hədis 50; Türkiye Diyanet Vakfı İslam Ansiklopedisi, XXI, 544-546; Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.6-61; Rağib İsfahani. Əl-Müfrədat fi ğərib əl-Quran, s.119; Güldane Gündüzöz. Tasavvufta İhsan Teriminin Kavram Ağı Üzerine Analitik Bir Değerlendirme, İlahiyat Tetkikleri Dergisi, Aralık/December, 2021/2; s. 71-93.*

**ELMİ-LƏDÜNNİ** – öyrənməklə, dərs almaqla əldə edilməyən (əldə edilə bilməyən) elm. Sözün mənşəyi Quran ayəsidir. Allah-Taala həzrət Musanın (ə) görüşdüyü *övliya* (bunun Həzrət Xızr olduğunu deyirlər) haqqında "Öz tərəfimizdən elm öyrətdiyimiz bəndəmiz" deyə söz açır. Ayənin ərəbcə mətnindəki "və əlləmnahu min lədünna ilma" ifadəsi "elmi-lədünni" anlayışının yaranmasına səbəb olmuşdur (Kəhf, 65).

İslam inancına görə, peyğəmbərlərin biliyi elmi-lədünni qəbilindəndir. Hər alim öz elmini ustaddan əxz etdiyi halda peyğəmbərlər öz elmlərini birbaşa Allahdan almışlar. Heç kimdən dərs almadıqları halda peyğəmbərlər hamıdan daha savadlı, daha elmlidirlər.

Təsəvvüfdə lədünni elmi peyğəmbərlərlə yanaşı övliyalara da şamil edilir. Sufi təsəvvürünə görə, böyük təriqət şeyxləri irfani bilikləri bilavasitə Allahdan almışlar. Lədünni elmi 3 qisimdir: vəhy, ilham və firasət. Vəhy peyğəmbərlərə, ilham və firasət isə övliyalara aiddir.

"Şeyx Səfi təzkirəsi"ndə deyilir ki, Şeyx Səfiəddin Ərdəbilinin elminin lədünni olduğunu eşidən xəbərsiz adamlar təəccüblə deyirdilər: "Çün anun elmi yox, məsələlərün cavablarını necə verür?" Bilməzdik kim, ol elmlərün ucaraqı (ən ucası) ilə əlaraqı (ən yüksəyi) kim ol Tanrınun elmidür, bilicidür...

Hər kimə elm-lədünni eylədi Tanrı nəsib,
Heç gərəkməzdür ana elmü qələm, xəttü kətib".

***Mənbələr:*** *Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.596; Seyid Cəfər Səccadi. İslam maarifi lüğəti, II, 1336; İzzəddin Kaşani. Misbah əl-hidayə və miftah əl-kifayə, s.76; Şeyx Səfi təzkirəsi ("Səfvətüs-səfa"nın XVI əsr türk tərcüməsi), s.575.*

**EŞQ** – ən mühüm təsəvvüf məfhumlarından biri. Lüğəti mənada "əşqə" bitki



növüdür. O, ağacın dibində bitir, ağaca sarılaraq boy atır, bütünlükdə ağacı əhatə edir və ağac onun əsirinə çevrilir. Əşəqə ağaca verilən bütün suyu və mineralları mənimsəyir, axırda ağacı qurudub məhv edir. Sufilər deyiblər ki, eşqdə aşiqin qəlbini tan bürüyər, ona hakim olar və axırda aşiqi öldürər (Allaha qovuşdurar). Sufi mənbələrində yazılıb ki, ifrat düşüncələrinə (amma ariflərin dili ilə desək, "Allahın sirrini açdığına") görə edam edilmiş Həllac Mənsurdan bir nəfər soruşdu: "Eşq nədir?" Həllac cavab verdi: "Eşqin nə olduğunu bu gün, sabah və birisigün görəcəksən". Deyirlər ki, həmin gün Mənsur Həllacı öldürdülər, ertəsi gün cəsədini yandırdılar, o biri gün külünü havaya sovurdular.

Təsəvvüf aləmində eşq *məhəbbətin* son pilləsi və şiddətli mərhələsidir. XI əsrə kimi sufi mənbələrində daha çox "məhəbbət" kəlməsi işlədilirdi, sonralar "eşq" sözü onun yerini tutdu. Orta əsrlərdə böyük ariflər öz əsərlərində eşqin mənasından ətraflı söz açmış, hətta bu barədə müstəqil risalə qələmə almışlar (İbn Sina və Sührəvərdi kimi). Sührəvərdi "Həqiqət əl-eşq" risaləsində yazırdı ki, Allah-Taala hər şeydən əvvəl ağlı (əql) yaratmışdır. Ağla üç bacarıq verilmişdir: insanın Allahı tanıması, özünü tanıması və varlıq aləmini tanıması. İnsanın Allahı tanımaq bacarığından hüsn (gözəllik), özünü tanımaq bacarığından eşq, ətrafdakıları tanımaq bacarığından hüzn yarandı. Sührəvərdi eşqi məhəbbətin ifrat həddi sayır və hətta *mərifətdən* üstün bilirdi.

Təsəvvüf aləmində əsl eşq yalnız Allah-Taalaya yönəlir, digər varlıqlara olan sevgi nisbi və ötəridir. Bütün sevgilər Allahın eşqində birləşməli və həll olmalıdır. Əsl sufi bütün sevgilərdən üz çevirməli və yalnız Allaha eşq bəsləməlidir. Allahdan başqasını sevmək sufini kamillikdən uzaqlaşdırır və ona nöqsan sayılır. Orta əsrlərdə yaşamış bütün arif şairlərin əsərlərində rast gəldiyimiz "eşq" kəlməsi Allaha olan sevgini ifadə edir, hətta dünyəvi sevginin təsviri kimi anlaşılan şeirləri də simvollar vasitəsilə şərh etdikdə aydın olur ki, burada ilahi eşq nəzərdə tutulur. Arifin düşüncəsində məşuq – Allahdır, Onun vüsalına çatmaq isə ölüm deməkdir. Sufilər aşağıdakı kəlamı Mühəmməd Peyğəmbərə (s) aid edirlər: "Kim aşiq olsa, iffətlə davransa və (eşqini) gizlədib ölsə, şəhid kimi ölər".

İrfani dünyagörüşünə görə, əslində bütün Kainatı eşq idarə edir, Allah-Taala bütün cansız və canlı aləmin daxilində eşq yerləşdirmişdir. Hər şey eşqə tabedir, bunu dərk etməyən xilqətin mənasından xəbərsizdir. Buna görə klassik ədəbiyyatda "zahid, naseh" adlandırılan xəyali obraz həmişə aşiqə tənə edir; çünki o, aşiqdən fərqli olaraq eşq zövqündən bixəbərdir.

Təsəvvüf ədəbiyyatının əsas mövzularından biri də ağılla eşqin ziddiyyəti və mübahisəsidir. Ağıl öz tədbiri və çəkingənliyi ilə arifi kamillikdən saxlayır, eşq isə onu hər cür ağlasığmaz fədakarlıqlara səsləyir. Bəzi irfani şeirlərdə ağılla eşqin mübahisəsi dialoq şəklində təs-

vir edilir, üstünlük eşqə verilir və bu mübahisələrdə həmişə eşq qalib gəlir.

Səfəviyyə təriqətinin banisi Şeyx Səfiəddin Ərdəbili sufinin öz qəlbində Allaha saf eşq bəsləməsini kamil insana çevrilməyin şərtlərindən biri sayırdı. Şeyx Səfinin fikrincə, mənfi xasiyyətlərdən özünü təmizləmiş sufi "insan dərəcəsinə təriq bulur, nəfsi-mütməinə ayaq basar, ol vaxt könlü və gözü açılar, eşq arı olar, ziyadə məhəbbət hasil olar, səfayi-qəlb edər. Hansı talib ki bu mərtəbəyə irsə, insani-kamil olmuş olur".

Eşq qızılbaş sufi şairlərin də yaradıcılığında əsas mövzulardan birini təşkil edirdi. Şah İsmayıl Xətainin şeirlərində eşq barəsində dərin mənalara malik poetik ifadələrlə tez-tez rastlaşırıq:

Çün ğəmi-eşqində ölməkdir həyati-cavidan,
Həq bilür ölmək degil ol, eyni-rahətdir mana...

Çareyi-behbudimi sordum müalicdən, dedi:
Dərd dərdi-eşq isə, mümkün degil səhhət sana...

Zahida, vermə nəsihət eşqi tərk etgil deyü,
Aşiqin, Allah bilür kim, sevgisi rəhmanıdır.

*(Ş.İ.Xətai)*

***Mənbələr:*** *Seyid Ziyaəddin Səccadi. İrfan və təsəvvüfün əsaslarına giriş, s.285-302; Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.58-583; Qara məcmuə, s.24; Şah İsmayıl Xətai. Əsərləri (2 cilddə), I, 78, 84 və 226.*

**ƏBU-I-VƏQT** – təsəvvüf aləmində sufinin çatdığı yüksək məqam. Vaxt anlayışı təsəvvüfdə mühüm yerə malikdir. Vaxt hər bir sufidən öz halına uyğun fərdi davranış tələb edir. Sufi vaxta tabedir, onu itirməməyə və haqqını verməyə çalışır. Lakin zamanın çərçivəsindən çıxan, bir hala və məqama bağlanmayan, təmkin halında olan sufiyə əbu-l-vəqt deyirlər. Bu ifadənin hərfi mənası "vaxtın atası" və ya "vaxtın sahibi, vaxtı öz ixtiyarında saxlayan şəxs" deməkdir. Bu, *ibn əl-vəqtdən* daha üstün dərəcədir. Sufi *seyrü-süluk* yolunda haldan-hala keçib təmkin mərhələsinə yetişir. Ondan ötrü zaman dayanmış olur. O, zamanın fövqündədir, zamanın zəncirindən qurtulmuş, zamana qalib gəlmişdir.

İşrətü zövqü səfayə, ey könül, şad ol müdam,
Eyş nihan olur, görünməz, aşikarə əldən gedər.

*(Ş.İ.Xətai)*

*bax:* **VƏQT.**

***Mənbələr:*** *Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.789-791; M.Mütəhhəri. İslam elmləri külliyyatı, II, 130-134; Risaleyi-Qüşeyriyyə (farsca tərcümə: Bədiüzzaman Firuzənfər), s.88-91; Alper Günaydın. "İbnü'l-vakt" ve "ebü'l-vakt" kavramlarının klasik Türk tasavvuf edebiyatındaki kullanımı (Rumelide Dil ve Edebiyat Araştırmaları Dergisi, №8), s.326-336; K.Özköse. İbnü'l-Vakt Ya Da Ebu'l-Vakt Olabilmek (Somuncu Baba Dergisi, №64), s.22-25; İzzəddin Kaşani. Misbah əl-hidayə və miftah əl-kifayə, s.138-140; K.Bünyadzadə. Sərrac Tusinin "əl-Lümə" əsəri, s.188; Şah İsmayıl Xətai. Əsərləri (2 cilddə), I, 222.*



**ƏDƏB** (cəm halda **ADAB**) – təsəvvüfdə mühüm məfhum. Sufilərin düşüncəsində hər şey ədəbə bağlıdır, sufinin bütün həyatı, davranışı, təriqət daxilindəki fəaliyyəti ədəb çərçivəsində olmalıdır. Sufi mənbələrində hər bir əməl və davranışın ədəbi geniş şəkildə təsvir edilmişdir. Məsələn, mühüm təsəvvüf mənbələrindən sayılan İzzəddin Kaşaninin "Misbah əl-hidayə" əsərində yeddinci bab bütünlükdə ədəblərə həsr edilib. Allaha münasibətdə gözlənilməli olan ədəb ibadət, dua, istixarə zamanı nəzərə alınmalıdır. Peyğəmbərə münasibətdə gözlənilməli olan ədəb onu sevməklə, onun ruhunun daim nəzarətçi olduğunu bilməklə, sünnəsinə əməl etməklə, hətta adına ehtiram göstərməklə həyata keçməlidir. Sufilikdə *müridlə mürşidin* münasibətlərində incə və dəqiq ədəb qaydaları müəyyən edilib; həm mürşid, həm də mürid öz öhdəsində olan ədəb qaydalarına ciddi riayət etməlidir. *Xəlvət*, *səma* kimi sufi ayinlərinin də öz ədəbi vardır. Sufinin yeməyi, yatmağı, paltar geyinməyi, səfərə çıxmağı, oturub-durmağı, danışmağı, ünsiyyəti ədəb çərçivəsində olmalıdır. Hətta *fəqirliyin* də öz ədəbi var. Bəzi sufilər uzun onilliklər boyunca nəinki cəmiyyət içində, hətta təklikdə də oturan zaman ayaqlarını qabağa uzatmamışlar ki, Allahın qarşısında ədəbsizlik olmasın.

Ədəbdən kənar yerinə yetirilən heç bir əməl bərəkətli olmaz, sufiyə *seyrü-süluk* yolunda tərəqqi gətirməz.

Orta əsrlərdə *xanəgahların* xüsusi ədəb qaydaları vardı, müasir dildə bunları daxili intizam qaydaları adlandırmaq olar. Xanəgah daxilində hətta ucadan danışmaq, yeriyərkən ayaqları yerə möhkəm vurmaq ədəbsizlik sayılırdı, çünki bu, digər dərvişlərin təfəkkürünə və xəlvətinə mane ola bilərdi. Xanəgahların qapısında və içərisində üzərində "ədəb, ya hu" sözləri yazılmış lövhələr asılardı ki, dərvişlər ədəb qaydalarını unutmasınlar.

***Mənbələr:*** *Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.4-38; İzzəddin Kaşani. Misbah əl-hidayə, s.203-284; Risaleyi-Qüşeyriyyə (farsca tərcümə: Bədiüzzaman Firuzənfər), s.477-485.*



**ƏHLİ-SUFFƏ** – *sufilərin* təsəvvürünüə görə, İslam tarixində ilk sufi toplumu. Mühəmməd Peyğəmbər (s) öz səhabələri ilə birlikdə Məkkədən Mədinəyə hicrət etdikdən sonra mühacirlərin böyük bir hissəsi ev-eşiksiz qaldı. Yeni şəhərdə onların nə qohumu, nə sərvəti, nə də evi var idi. Ümumiyyətlə, yüzlərlə insanı yaşayış yeri və işlə təmin etmək qısa müddət ərzində qeyri-mümkün idi. Ona görə peyğəmbər (s) bu şəxslərə Məscidi-nəbəvinin qarşısında ayrılmış "suffə" (səki) adlanan xüsusi sahədə yaşamağı təklif etdi. Əhli-suffə bir-biri ilə qardaş kimi mehribanlıqla dolanır, gündüzlər səhradan odun toplayıb gətirir, boş vaxtlarını ibadət, dua və Quran tilavəti ilə keçirirdi. Rəsulüllah onlara sayğı və nəvazişlə yanaşır, bəzən suffə əhlinə qonaq gedir, onlarla birlikdə əyləşir, çörək yeyir, söhbət edirdi. Təfsirçilər Qurani-Kərimin bu ayəsinin suffə əhli barəsində nazil olduğunu yazırlar: "Sədəqə

Allah yolunda canından keçərək, (dolanmaq, ruzi qazanmaq üçün) yer üzündə hərəkət edə bilməyən (və ya buna imkanı olmayan) yoxsullar üçündür. Belə şəxslər həyalı olub dilənçilikdən çəkindiklərinə görə nadanlar onları dövlətli hesab edirlər. Sən isə onları üzlərindən tanıyırsan. Onlar heç kəsdən israrla bir şey istəməzlər. Sizin öz malınızdan bunlara nə verdiyinizi, şübhəsiz ki, Allah bilir" (Bəqərə, 273).
Suffə müsəlmanların ilk mədrəsəsi idi, burada onlara Qurani-Kərim, şəriət öyrədilirdi. Evi olmayan, ailəsini itirmiş, yaxud özünü elmə və ibadətə həsr etmiş müsəlmanlar suffədə məskunlaşmışdılar. Suffə əhlinin sayı 400 nəfərə çatırdı. Onlar özlərini dua və ibadətə həsr etmişdilər, yaşayış xərclərini imkanlı müsəlmanlar ödəyirdi. Salman Farsi, Əbuzər, Süheybi Rumi, Əmmar ibn Yasir əhli-suffənin ən məşhur nümayəndələri olmuşlar.
"Sufi" sözünün kökü barədə nəzəriyyələrdən biri də budur ki, bu söz suffə əhli anlayışından törəmişdir. Sufilər də, suffə əhli kimi, dünya işlərinə etina göstərməyib axirət işləri ilə məşğul olduqlarına, ev və sərvətdən özlərini ehtiyacsız bildiklərinə, əldə etdikləri hər şeyi öz aralarında tən böldüklərinə görə onlara "sufi" deyilmişdir.
*bax:* **SUFİ.**

***Mənbələr:*** *S.Z.Səccadi. İrfan və təsəvvüfün əsaslarına giriş, s.1; S.C.Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.537-538; Qısa İslam Ensiklopediyası (N.Rəhimovun ümumi redaktəsi ilə, 2 cilddə), II, 246-247.*

**ƏXİ** – əxi dərnəyinin üzvü. Sözün ərəb dilindən tərcüməsi "qardaş" deməkdir. Əxilər qardaşlıq, qarşılıqlı yardımlaşma, sosial bərabərlik prinsipləri əsasında fəaliyyət göstərən təşkilatlarda (əxi dərnəklərində) birləşmişdilər. Onlar ciddi şəkildə *fütüvvət* kodeksinə tabe idilər.
Səfəviyyə təriqətinə aid mühüm mənbələrdən sayılan *"Səfvət əs-səfa"* kitabında 21 nəfər əxi ləqəbli şəxsin adı çəkilir. Onlar *səfəviyyə təriqətinin* üzvü olmuş və Şeyx Səfi xanəgahının fəaliyyətində yaxından iştirak etmişlər. Əxilər Səfəvilərin hakimiyyətə gəlməsində də mühüm rol oynamış, əxi başçıları Səfəvilər dövlətində yüksək vəzifələrə təyin olunmuşdular. I Şah İsmayılın sərkərdələrindən biri Əxi Sultan Təkəli, I Şah Təhmasibin vəzirlərindən biri Xacə Əxi bəy idi.
Şah İsmayıl Xətai şeirlərininn birində yazırdı:

Şahın övladına iqrar edənlər
Əxilər, qazılar, abdallar oldu.
*bax:* **ƏXİLİK.**

***Mənbələr:*** *Namiq Musalı. Safeviler ve Ahiler, "Ahilik Uluslararası Sempozyumu Bildiri Kitabı" (Erciyes Üniversitesi, 20-22 Eylül 2011) s. 45-68; Şah İsmayıl Xətai. Əsərləri (2 cilddə), I, 58.*



**ƏXİLİK** – orta əsrlərdə müsəlman Şərqində *fütüvvət* (comərdlik) prinsipi üzərində qurulan, mənəvi dəyərlərə, sağlam ictimai münasibətlərə, qarşılıqlı yardımlaşmaya əsaslanan təlim və bu təlim əsasında qurulan sosial-iqtisadi, dini-əxlaqi yönümlü təşkilatlar. Ərəb dilin-



dən tərcümədə "əxi" qardaş deməkdir, bu təlim ətrafında birləşmiş şəxslər bir-birini qardaş hesab edirdilər. Əxilər sosial bərabərliyi, sinfi ayrı-seçkiliklərin aradan qaldırılmasını, dostluq və qardaşlıq, sevgi və şəfqət ideyalarını təbliğ edirdilər. Əxi ocaqlarına cəmiyyətin əsasən aşağı və orta təbəqələrinin nümayəndələri, sənətkarlar qoşulurdular. Əxilər yalnız öz əllərinin zəhməti ilə dolanır, nəinki başqalarından yardım ummur, hətta özləri onlara yardım edirdilər. Xalqa xidmət əxiliyin əsasını təşkil edirdi. Bu baxımdan əxilik sufiliyin *dərvişlik* və *qələndərlik* yönlərindən fərqlənirdi.

Əxi ocaqları şəbəkəsi Azərbaycanın bütün iri şəhərlərini bürümüşdü. Hətta Nizami, Məhsəti, Xaqani kimi böyük şairlərin əxi birliklərinə üzv olduğu mənbələrdə göstərilir. S.Aşurbəyli "Şirvanşahlar dövləti" kitabında yazır: "Feodalların zülm və zorakılığına qarşı mübarizə aparan "əxi" mənsubları Şirvan və Abşeron şəhərlərində, Bakıda və Şamaxıda mövcud idilər". Əxi təşkilatlarının Beyləqan, Gəncə, Şabran, Naxçıvan məntəqələrində də mövcudluğu sübuta yetmişdir.

Naxçıvanda doğulmuş Xacə Məhəmməd Xoşnam əxi böyüklərindən olan zəncanlı Əxi Fərəcin müridlərindən idi. M.Tərbiyət "Danişməndani-Azərbaycan" əsərində yazırdı ki, deyilənlərə görə, Azərbaycanda təsəvvüf təriqəti onun vasitəsilə yayılmışdır. Xacə Fərəcin 1064-cü ildə vəfat etdiyini nəzərə alaraq deyə bilərik ki, Xacə Xoşnam XI əsrdə yaşamışdır.

Bakı qalasının cənub darvazasındakı kitabədə (1384-cü il) Əxi Ramazan Şirvaninin, Abşeronun Kürdəxanı kəndindəki zaviyənin kitabəsində Əxi Nurullah ibn Hacı Əbayilənin adının həkk edilməsi, Dərələyəzdəki Ələyəz kəndində Əxi Təvəkkül zaviyəsi (XVI əsr), Gəncə şəhərindəki Comərd Qəssab türbəsi, Zəngəzurdakı Comərdli kəndi, Qubada Comərd adlı müqəddəs yerlərin mövcudluğu da Azərbaycan ərazisində əxi təşkilatlarının yayıldığını göstərir.

***Mənbələr:*** *Сара Ашурбейли. Государство Ширваншахов, стр.209; M.Tərbiyət. Danişməndani-Azərbaycan, s.371; Ə.Əhməd. XII-XV əsrlərdə Azərbaycanın mənəvi mədəniyyəti, s.200-201; Natig Rahimov. Azerbaijan's Contribution to Islamic Culture. An Undicsovered Treasure ("Contributions of The Eurasian Nations to Islamic Culture"), pp.180-181.*



**ƏXYAR** – "xeyr" sözünün cəmidir, xeyirlilər deməkdir. Sufi terminologiyasında *övliyalara* əxyar deyirlər. Bəzi mənbələrdə *rical əl-ğeybə* aid olan təbəqələrdən biri əxyar təbəqəsi sayılır, onların sayının 300 nəfər olduğu bildirilir. Bəzən bunun əvəzində "əbrar" (yaxşılar) və ya "*abdal*" ifadələrini işlədir və saylarının 7 olduğunu yazırlar. Onlar yerdəki səbəblərdə ilişib-qalmaz, səmanın yollarını görərlər, Allaha yəqin bəsləyər, şeytanın hiylələrini, nəfsin vəsvəsələrini qəlbə yaxın buraxmazlar.

***Mənbələr:*** *Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.68; Əbdürrəh-*

*man Cami. Nəfəhat əl-üns, 25; Metinlerle Tasavvuf Terimleri Sözlüğü, s.77.*

**ƏLƏST MƏCLİSİ** – İslam inancına görə, insanlar hələ cisim halında yaradılmazdan çox-çox əvvəl ruh halında mövcud olmuşlar. Allah-Taala onları Öz hüzuruna toplamış, kimin Ona iman etdiyini soruşmuş və ruhlar bu sualı müvafiq şəkildə cavablandırmışlar. Allahın: "Mən sizin Rəbbiniz deyiləmmi" sualına mömin ruhlar "bəli", kafir ruhlar isə "yox" cavabını vermişlər. Bununla da hələ ruhlar aləmində insanların aqibəti müəyyən olunmuş, möminlər kafirlərdən seçilmişlər. Təfsir alimləri Qurani-Kərimin "Əraf" surəsinin 172-ci ayəsində ələst məclisinin nəzərdə tutulduğunu yazırlar.

Ələst məclisini "aləmi-zərr", yəni zərrələr aləmi də adlandırmışlar. Bunun bir səbəbi bu ola bilər ki, Allah insanları xırda zərrə ölçüsündə yaratmış və onlardan əhd-peyman almışdır. Digər səbəb isə ayədə keçən "zürriyyə" (övlad, nəsil) sözü ilə bağlı ola bilər.

Ələst məclisi barədə dini mətnlərdəki məlumatlar çox dağınıq və qarışıqdır. Bu məlumatlar bəzən bir-biri ilə ziddiyyət təşkil edir. Səfəvilər dövrünün böyük hədisşünas alimi Əllamə Məclisi bu mövzu ilə bağlı hədisləri "mütəşabeh xəbərlər və dolaşıq rəvayətlər" adlandırırdı. O yazırdı: "Əksər insanların ağlı bu məsələnin həllində acizdir". "Yaxşı olar ki, dərinliyini qavramaqda ağlımızın aciz olduğu bu cür dolaşıq məsələlər barədə düşünməyi kənara qoyaq. Xüsusilə bu məsələ barədə dərin düşünməyi imamlarımız bizə qadağan etmişlər".

Ələst məclisinin və orada insanlardan alınmış əhd-peymanın necəliyi, həzrət Adəmin (ə) cismani şəkildə yaradılmasından əvvəl, ya sonra, maddi aləmdə, yoxsa misal aləmində (abstrakt dünyada), həzrət Adəmin (ə) iştirakı ilə, yoxsa Adəm övladları ilə bağlı baş verməsi barədə fikir ayrılıqları vardır. Bu barədə Əllamə Təbatəbai "əl-Mizan" təfsirində, "Əraf" surəsinin 172-ci ayəsinin şərhində geniş və maraqlı bəhs açmışdır.

Ariflərin nəzərində bu məclis onların Allahla vüsal günü olmuşdur. Ariflər həmin günün yenidən qayıtması intizarı ilə, yəni Allah-Taalanın hüzurunda duracaqları günün şövqü ilə yaşamışlar. İrfani dünyagörüşündə günahkar bəndələr aləmi-zərdə bağladıqları əhdi unutmuş şəxslərdir.

Təsəvvüf ədəbiyyatının şah əsəri, məşhur arif Xacə Abdullah Ənsarinin kəlamlarının toplusu olan "Kəşf əl-əsrar" təfsirində deyilir ki, ələst məclisi Allahın Öz bəndələrinə bir lütfüdür. Bununla Allah Özünü bəndələrinə tanıtmış, onları azğınlıq girdabından qorumuşdur. Diqqətçəkici məqam budur ki, Allah bəndələrindən məhz "Mən sizin Rəbbiniz deyiləmmi?" soruşmuşdur. Əgər "mən kiməm?" soruşsaydı, bəndələr bu sualın cavabında aciz qala bilərdilər, çünki Allahın Zatını anlamaq qabiliyyəti bəşər şüurunda yoxdur. Allah-Taala bəndəsindən "sən kimsən?" soruşmamışdır, çünki bu halda bəndə öz məqamı ilə



lovğalanıb təkəbbürə giriftar ola bilərdi. "Sizin Rəbbiniz kimdir" sualı da verilməmişdi, çünki bəndələrin o zamana kimi Allahla ünsiyyətləri olmamış və Onu tanımamışdılar. Allahın sualı "Məgər siz mənim bəndələrim deyilsinizmi?" şəklində də verilməmişdi, çünki bu halda bəndəlik qabardılmış olar və bəndəliyin şərti ön plana keçərdi; əgər bəndəlikdə nöqsan olsaydı, bu bağlılıq da qırılmış olardı və əhd öz mənasını itirərdi. Allahın rübubiyyəti (Rəbliyi, bəndə ilə rabitəsi) isə qırılan deyil, Allah Öz bəndəsini kənara atmaz. Allah-Taala sualı "Məgər Mən sizin Rəbbiniz deyiləmmi?" şəklində verməklə bir növ bəndələri təsdiq məcburiyyəti qarşısında qoymuş və onları səhv cavab verməkdən qorumuşdur.

Bəzi alimlərin fikrincə, insanlardan alınan əhd-peyman heç də qədim zamanlarda, Adəmin (ə) dövründə və toplum şəklində baş verməmişdir. Ayədə fitri allahpərəstlik duyğusuna işarə edilir. Allah-Taala bütün insanları yaratmazdan əvvəl onların batinində Öz rübubiyyətinə inam hissini yerləşdirir. Məhz fitri allahpərəstlik hissi insanı batilə uymaqdan müəyyən qədər sığortalayır. İnsanın daxilində fitri olaraq müsbətə, həqiqətə, imana meyil mövcuddur. Əgər insan öz fitrətinə tabe olarsa, Rəbbini tanıyacaq. Qurani-Kərimdə deyilir: "Batildən haqqa tapınaraq üzünü Allahın fitri olaraq insanlara verdiyi dinə tərəf tut. Allahın dinini heç vəchlə dəyişdirmək olmaz. Doğru din budur, lakin insanların əksəriyyəti bunu bilməz" (Rum, 30). Mühəmməd Peyğəmbər (s) buyurub: "Hər doğulan fitrət üzərində (yəni Allaha inanaraq) doğulur. Sonra valideynləri onu yəhudi, ya xristian edirlər". Ələst məclisi irfan ədəbiyyatında "*aləmi-zərr*", "*qalu bəla*" sözləri ilə də ifadə edilir.

***Mənbələr:*** *Əllamə Məclisi. Mirat əl-üqul, VII, 37-38; Əllamə Məclisi. Bihar əl-ənvar, III, 281; V, 261; Qurani-Məcidin ədəbi və irfani təfsiri (Xacə Abdullah Ənsarinin kəlamları əsasında Miybədinin qələmə aldığı "Kəşf əl-əsrar" təfsirinin xülasəsi), s.361; Qısa İslam Ensiklopediyası (N.Rəhimovun ümumi redaktəsi ilə, 2 cilddə), I, 16-17.*



**ƏLƏVİLİK** – "ələvi" sözünün hərfi mənası "Əliyə aid olan", yaxud "Əliyə bağlanan" deməkdir. *İmam Əlinin (ə)* nəslindən olan *seyidlər*, həzrət Əli ibn Əbu Talibə (ə) bağlı olan siyasi qruplaşmalar da bu adla tanınmışlar. Təsəvvüf təriqətləri *zikr* mövzusunda iki böyük qrupa bölünür: öz silsiləsini həzrət Əli (ə) vasitəsilə Mühəmməd Peyğəmbərə (s) bağlayan təriqətlər "ələviyyə", Əbu Bəkr vasitəsilə Peyğəmbərə (s) bağlanan təriqətlər isə "siddiqiyyə" adlandırılır. Ələviyyə təriqətlərində cəliyy (aşkar şəkildə, yəni ucadan deyilən) zikr, siddiqiyyə təriqətlərində isə xəfiyy (gizli şəkildə, yəni yavaşca deyilən) zikr praktikası tətbiq olunur.

Lakin ələvilik adı daha çox İmam Əli ibn Əbu Talibə (ə) xüsusi, hətta ifrat sevgi üzərində qurulmuş mistik təlimə aid edilir. Ələviliyin İslam cərəyanları arasındakı yerinə münasibət birmənalı

deyildir. Tarixin müəyyən dönəmlərində baş vermiş ictimai-siyasi proseslərdən, eləcə də ayrı-ayrı tədqiqatçıların baxış bucağından asılı olaraq ələvilik bəzən heterodoks İslam cərəyanlarından biri sayılmış, bəzən də ümumiyyətlə İslamdan kənar və küfr kimi təqdim edilmişdir.

Ələviliyin yaranma tarixi barədə dəqiq fikir irəli sürmək çətindir. Bəzi hədislərə görə, Mühəmməd Peyğəmbər (s) Əli ibn Talibə (ə) gələcəkdə ona münasibətdə İslam daxilində iki ifrat cərəyanın yaranacağı, bir dəstənin onunla düşmənçilik edəcəyi, bir dəstənin isə onu ilahiləşdirəcəyi barədə xəbər vermiş, hətta bu məsələdə onu İsa Məsihə (ə) bənzətmişdir. Hələ İmam Əlinin (ə) zamanında onun fövqəlbəşər, ilahi təbiətinə inanan şəxslər olmuş, amma onların təbliğatının qarşısı ilk müsəlmanlar, o cümlədən həzrət Əli (ə) tərəfindən alınmışdır.

İmam Əli (ə) kultu sonralar türkman tayfaları arasında sürətlə yayılmağa başladı. Bu prosesdə Xorasan təsəvvüf məktəbinin yetirmələri olan *məlaməti* dərvişlər mühüm rol oynamışlar. Ələviliyin türkmanlar arasında intişar tapmasının əsas səbəbləri sırasında *babailər* hərəkatını xüsusi qeyd etmək lazımdır. Hacı Bektaş Vəli və ardıcıllarının səyləri nəticəsində Anadoluda iri *ələvi-bektaşi* icmaları meydana gəldi. Bu prosesdə Ərdəbil səfəviyyə xanəgahının rolu da inkaredilməzdir. Səfəviyyə təriqətinin banisi *Şeyx Səfiəddin Ərdəbilinin* nəvəsi *Xacə Əli Siyahpuş* Ankara döyüşündən qayıdan Əmir Teymurla görüş zamanı ondan əsir alıb özü ilə gətirdiyi Anadolu türkmanlarını azad etməyi istəmişdi. Həmin əsirlərin böyük hissəsi *səfəviyyə təriqətini* qəbul edərək öz vətəninə qayıtdı. Daha sonralar *hürufi* mübəlliğləri ələviliyin ideoloji bazasını daha da təkmilləşdirdilər. XV əsrin ikinci yarısında *Şeyx Cüneyd* və *Şeyx Heydər* də Anadolunun, Şamın türkman tayfaları arasında *Əhli-beyt* ideyasını yaymaqla məşğul oldular. Bu qruplaşmalar ələvi icmasının özəyini təşkil edirdi.

XV əsrin sonlarından (Şeyx Heydərin zamanından) etibarən Anadolu şiələrini ələvi və bektaşi adı ilə yanaşı *qızılbaş* adı ilə çağırmağa başladılar. Sonralar qızılbaşlıq birbaşa Səfəvilər dövlətinə aid edildiyi, Anadolunun qızılbaş tayfaları Osmanlı üsuli-idarəsinə qarşı ardıcıl şəkildə üsyanlar qaldırdığı üçün bu ad mənfi çalar qazanaraq dövlətə asi olan düşmən mənasında işləndi. Orta əsrlərdə Anadolunun bütün şiə icması iqtidara bağlı dairələrdə *rafizi* adlandırılırdı. Yeniçəri bektaşi ocağının ləğvindən (1826) sonra Anadolunun heterodoks şiələri, demək olar ki, yalnız ələvi adı ilə tanındılar. Adana, Maraş, İçel, Antalya, Burdur, İsparta, Denizli, Muğla, Aydın, İzmir, Balıkesir və Trakyada məskunlaşmış ələviləri isə taxtaçı adlandırırlar ki, bu da onların tarixən ağac emalı ilə məşğul olmalarına görədir. Hazırda akademik dairələrdə bəzən ələvilər nüseyri adı ilə təqdim edilirlər.

Ələvilik əqidəsində adları çəkilən cərəyanlarla yanaşı İslamaqədərki qədim türk



inancının, *batiniyyə* təliminin, mistika və metafizikanın dərin izləri mövcuddur. Uzun formalaşma dövrü keçmiş ələvilik bu düşüncə məktəblərinin hamısından bəhrələnmiş, onları özündə sintez etmişdir.
Sxolastik şiə məzhəbindən fərqli olaraq, ələvilik din alimlərinin, müctəhidlərin vasitəsilə deyil, oba-oba gəzən *"baba"* və *"dədə"* adlı dərviş-*ozanların* səyləri ilə yayılırdı. Onlar Əhli-beyt sevgisini xalqın başa düşəcəyi sadə dildə, şeir və nəğmələrlə, söhbət və hekayələrlə, çox zaman ifrat sevgidən qaynaqlanan fərqli formalarda (ənənəvi İslamda buna *ğülüvv* deyilir) təbliğ edirdilər. Buna görə də ələviliyi sadə xalq şiəliyi adlandırmaq mümkündür. Bəzi ələvi inanc və adətlərinin ənənəvi şiəliklə uyğun gəlməməsi də bununla əlaqədardır. *Şəriət* məfhumlarının hər biri ələvi interpretasiyasında fərqli formaya düşmüşdür. Belə ki, ələvilərin məscidi *cəm evləri*, ələvilərin namazı gündəlik gülbang adlı ayinlərdir, onlar ramazan orucu əvəzinə məhərrəm ayında və ramazanın Qədr gecələrinin gündüzündə oruc tuturlar. Ələvi icması sədrinin (dədənin) görüşünə getmək onlar üçün həccə bərabərdir, xüms və zəkatı isə icma daxilindəki xeyriyyə ödənişləri əvəz edir. Ənənəvi şiələr üçün Quran tilavəti nə qədər müqəddəsdirsə, ələvilər üçün də cəm ayinində ifa edilən nəğmələr, *yeddi ulu ozanın* şeirləri o qədər dəyərlidir. Ənənəvi İslamdan fərqli olaraq, ələvilikdə kişilərlə qadınların bütün dini ayinləri qarışıq şəkildə icra etmələrinə icazə verilir, qadınların hicabla örtülməsi vacib sayılmır. Bütün bu deyilənlər ənənəvi müsəlmanların (hətta bəzi şiələrin) gözündə ələviliyin İslamdan kənar, təhrif olunmuş bir təlim kimi qəbul edilməsinə səbəb olmuşdur.
Hazırda dünyanın ən böyük ələvi icması Türkiyədədir, onların böyük hissəsi İstanbulda məskunlaşmışdır, Ankara, Adana, Əskişehir, Bursa, Antalya, Ərzincan, Sivas, Tokat və digər məntəqələrdə də iri ələvi icmaları mövcuddur. Lakin Türkiyədə ələviliyə hüquqi status verilməsi, cəm evlərinin ibadət ocağı kimi, ələvi dədələrin də dövlət məmuru kimi tanınması istiqamətindəki iddialar dövlət tərəfindən qəbul edilməmişdir. Türkiyədən əlavə Albaniya, İran və İraqda da çoxlu ələvi yaşayır.
Ələvilikdə mənəvi təmizlik, əxlaqi dəyərlər, qarşılıqlı yardımlaşma amilləri, kollektivçilik çox güclüdür; sonuncu amil orta əsrlərdə ələvilərin *əxi* icmaları ilə sıx bağlı olmalarından qaynaqlanır. Ələviliyin əsas təbliğ məkanları cəm evləridir. Həftənin müəyyən günlərində burada toplaşan ələvilər *cəm ayini* adlanan mərasimi icra edirlər. Bu mərasim ələvi inancının əsaslarından birini təşkil edən *"qırxlar məclisi"nin* simvolik modelidir. Hər bir ələvi *dörd qapı və qırx məqam* məfhumunu öz həyatında tətbiq etməyə, bununla mənəvi kamilliyə çatmağa çalışır.
Ələvilər həm keçmişdə, həm də hazırda dini və siyasi baxımdan azlıqda və müxalif mövqedə olduqları üçün qapalı şəkildə fəaliyyət göstərmişlər; bu da onla-

rın inancı, adət-ənənələri, təşkilatlanması barədə tam dolğun məlumat almağa mane olur. Ələvi icmalarının üzvləri adətən eyni əqidədən olmayanlarla ailə qurmurlar; ümumilikdə ələvilik din və məzhəb kimi könüllü şəkildə qəbul edilmir, ələvi sayılmaq üçün ələvi ailəsində doğulmaq lazımdır. Ələvi icmalarına başçılıq edən dədələr iyerarxiya pilləsində üstün mövqedə dururlar, bu mənsəbə layiq olmaq üçün adətən bundan əvvəl də dədələr yetirmiş köklü ələvi nəsillərdən birinə mənsub olmaq tələb edilir. Dədələrin əksəriyyəti öz şəcərəsini ya Peyğəmbərə (s), ya da məşhur ələvi liderlərindən birinə bağlayır. Keçmişdə dədələr biçin zamanı kəndləri gəzib sıravi ələvilərdən "qaraqazan haqqı" deyilən məhsul vergisini alırdılar.

Ələvi şairlərin və dədələrin sadə xalq dilində yazdığı, Əhli-beyti vəsf edən, ələvi ideologiyasını açıqlayan əxlaqi-didaktik məzmunlu şeirlər bu gün də cəm evlərində oxunur. Hacı Bektaş Vəli, Yunus Əmrə, Abdal Musa Sultan, Qayğısız Abdal və Balım Sultanın, eləcə də yeddi ulu ozan adlandırılan *İmadəddin Nəsimi, Şah İsmayıl Xətai, Məhəmməd Füzuli, Yəmini, Virani, Pir Sultan Abdal* və *Qul Hümmətin* şeirləri cəm ayininin bir hissəsi hesab edilir. Türk xalqlarının folklorunda ələvilik inancı ilə bağlı xeyli nümunə mövcuddur.

***Mənbələr:*** *Ali Yaman. Alevilik ve Kızılbaşlık Tarihi; Sayın Dalkıran. Alevi Kimligi ve Anadolu Aleviligi Üzerine Bir Deneme (EKEV Akademi Dergisi Yıl: 6 Sayı: 10 (Kış 20), s.95-117; Musa Kazım Engin. Hak ve Hakikat Yolu Alevilik; Alevi-Bektaşi İnancının Esasları (DABF Danimarka Alevi Birlikleri Federasyonu); Mehmet Eröz. Türkiye'de Alevilik Ve Bektaşilik; A.Turan ve H.Yıldız. Tarihten Günümüze Anadolu Aleviliği (Ondokuz Mayıs Üniversitesi İlahiyat Fakültesi Dergisi, 26/26-27, Eylül 2008); s. 11-24; Ethem Cebecioğlu. Tasavvuf Terimleri ve Deyimleri Sözlüğü, "alevi" maddəsi; A.Gölpınarlı. 101 Soruda Türkiye'de Mezhepler ve Tariketler, s.277-279; E.Aydın. Kimlik Mücadelesinde Alevilik; N.Birdoğan. Anadolu Alevi Ocaklarının Kuruluşu, İşlevleri, Yayılmaları (IV Milletlerarası Türk Halk Kültürü Kongresi Bildirileri), I, 5-16; Anton Jozef Dierl. Anadolu Aleviliği; A.Turan. Anadolu Alevileri – Kızılbaşlar (Ondokuz Mayıs Üniversitesi İlahiyat Fakültesi Dergisi, 6/6, Temmuz 1992), s.45-60; C.Üçer. Aleviler: Yapılar, Grupların Temel Özellikleri ve Bazı Mülahazalar (Dini Araştırmalar, Ocak-Nisan 2009, Cilt: 12, Sayı: 33), s.63-88; A.Y.Ocak. Alevi ve Bektaşı İnançlarının İslam Öncesi Temelleri.*

**ƏMANƏT** – Qurani-Kərimdə buyurulur: "Biz əmanəti göylərə, yerə və dağlara təklif etdik. Onlar ona yüklənməkdən qorxub çəkindilər. Ona insan yükləndi. Həqiqətən, o, çox zalım, çox cahildir" (Əhzab, 72). Ayədən məlum olur ki, Allah-Taala insana çox mühüm bir əmanət etibar etmişdir, bu əmanəti insandan başqa heç bir məxluq qəbul etməyə razı olmamışdır. Deməli, bu, elə ağır və məsuliyyətli yükdür ki, onu yalnız insan (insanın qəlbi) daşıya bilər.

Asiman əmanət yükünü daşıya bilmədi,
Püşk atdılar, mən yazığın adına çıxdı.
*(Hafiz)*



Biz xazini-əmanəti-eşqik ki, kirdgar
Sənduqi-sinəmizdə qoyubdur əmanətin.
*(S.Ə.Şirvani)*

Əmanətin nədən ibarət olması barədə şəriət alimləri və sufilər arasında, eləcə də onların öz içində fikir ayrılıqları var. Bir nəzəriyyəyə görə, ayədəki əmanət Allaha ibadət etməkdən, digər nəzəriyyəyə əsasən, Allahın yer üzündə *xəlifəsi* olmaqdan, daha bir fikrə görə, ağıldan ibarətdir. Bəziləri ilahi əmanəti *imamət* yükü, bəziləri də *vilayət* kimi izah etmişlər.

Arif və sufilərin gözündə əmanət ilahi hədiyyə olan *eşqdir*, bütün yaradılmışlardan yalnız insana xasdır. Ariflərin bir qismi üçün də bu anlayış tövhid sirri, ilahi sirlər mənasını daşımışdır. Sufi əmanətin sirrini qorumalı, bu sirri daşımağa qabiliyyəti çatmayanlara onu açmamalıdır. Əks halda Allahın əmanətinə xəyanət etmiş olar və cəzalanar.

Şeyx Səfiəddin Ərdəbili Qurandakı əmanət ayəsinin təfsiri barədə buyurmuşdur: "Ol əmanət ki Həqq-Taala onu yerlərə və göylərə və dağlara ərz etdi, şərif nəsnədir. Pəs ol şərif nəsnəni götürməgə bir şərif nəsnə gərək. Ol, könüldür. Və göylər və yerlər və dağlar onu götürməkdən iba və işfaq etdilər (yəni çəkinib qorxdular). Zira ki, insanda olan həqiqət onlarda yox idi və bilmədilər, əmanəti götürməgə qüdrəti yetmədi. Və çün insanda könül ki məzhəri-Həqdir, onun taqəti oldu götürməgə, götürdü. Şöylə ki, hədisi-qüdsi ilə sabit olmuşdur: "Mən yerimə və göyümə sığmaram, lakin möminin qəlbinə sığaram".

Şeyx Səfiəddinin digər kəlamında əmanət daha konkret şəkildə şərh edilir: "Şeyx Sədrəddin ayıtdı: "Ya Şeyx! Ol əmanət nə idi kim, yerlər və göylər təhəmmül edəməyib götürə bilmədilər və daha insan götürdü?" Şeyx Səfiəddin ayıtdı: "Ol əmanətlər bunlardır kim: əl, ayaq, göz, qulaq, dil, dodaq və nitq".

*__Mənbələr:__ Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.130-131; Rzaqulu xan Hidayət. Riyaz əl-arifin, s.37; Seyid Heydər Amuli. Came əl-əsrar və mənbə əl-ənvar, s.19-22; Qara məcmuə, s.24 və 71; S.Ə.Şirvani. Əsərləri (3 cilddə), II, 97.*



**ƏRƏNLƏR** – türk təsəvvüf düşüncəsində Allah adamlarına, *vəlilərə* verilən ad. Türk dilində "kişi" mənasını verən "ər" sözünün cəmi kimi yaranmış, sonralar tək halda işlənmişdir. "*Fütüvvət* sahibi", "cavanmərd", "mərd" məfhumlarına uyğun gəlir. Ərənlərin böyüyü Şahi-mərdan İmam Əlidir (mərdlərin şahı). Türk təsəvvüf ənənəsində bu söz *dədə*, *baba*, ata, şah, *can* kimi ləqəblərə bərabər tutulur. Ərənlər *övliya*, *kamil insan,* hətta *rical əl-ğeyb* mənasında da qəbul edilir. Onları mənsub olduqları bölgələrə görə "Rum ərənləri", "Xorasan ərənləri" də adlandırmışlar. Ərənlər insanlara yol göstərən *mürşidlərdir*, çətinliyə düşənlər onların himmətindən yardım umurlar, onların nəfəsi insanlara yeni həyat, yeni ruh bəxş edir. Onların görüşünə nail olmaq böyük səadətdir, bu görüş insanın mərifətini artırar.

Şah İsmayıl Xətai istər klassik üslubda yazdığı qəzəllərdə, istərsə də sadə xalq

dilində yazdığı qoşma və gəraylılarda "ərənlər" sözünü dəfələrlə işlətmişdir. Onun şeirlərində ərənlər dünyaya arxa çevirib Allaha üz tutmuş möhkəm iradəli, dəmir biləkli könül adamları və meydan igidləri kimi vəsf edilir:

Ərənlər dünyaya murdar demişlər,
Nə kərkəsəm, nə murdar əksiyimdir.

Ərənlər mənzili Həq mənzilidir,
Ərənlər sahibi-irfanə gəlsün.

Şah İsmayılın qoşmalarından biri də "ərənlər" rədiflidir. O, ətrafında olan qızılbaş tayfa başçılarına, öz yardımçı və silahdaşlarına bu adla müraciət edirdi:

Ərənlərin ərkanına, yoluna,
Ta əzəldən talib oldum, ərənlər.
Can ilə könüldən durdum, düşündüm,
Bu gün mürşüdümü buldum, ərənlər.
*(Ş.İ.Xətai)*

***Mənbələr:*** *Türkiye Diyanet Vakfı İslam Ansiklopedisi, XI, 294-295; Ethem Cebecioğlu. Tasavvuf Terimleri ve Deyimleri Sözlüğü, "eren-erenler" maddəsi; Şah İsmayıl Xətai. Əsərləri, s.99, 340; Şah İsmayıl Xətai. Əsərləri (2 cilddə), I, 405.*

**ƏSFARİ-ƏRBƏƏ** (**ƏL-ƏSFAR ƏL-ƏRBƏƏ**) – irfani dünyagörüşünə görə, *seyrü-süluk* yolu boyunca *nəfsin* keçdiyi dörd mərhələni obrazlı ifadə ilə onun dörd səfəri adlandırırlar. Bu ifadənin ərəb dilindən tərcüməsi "dörd səfər" mənasını verir. Həmin dörd səfər (mərhələ) bunlardan ibarətdir:

*Birinci səfər:* Məxluqatın arasından Haqqa doğru səfər (min əl-xəlq ilə-l-Həqq). Bu, seyrü-süluk yolunun ilk mərhələsidir. *Salik* bu mərhələdə öz nəfsini dünya bağlılıqlarından təmizləməyə çalışır. Onun hədəfi paklanmaqdır. O öz naqisliyini anlayır, onu tərəqqidən, təkamüldən saxlayan səbəbləri araşdırır, bunlardan tədriclə xilas olmağa çalışır. Belə yazırlar ki, dörd səfərin ən çətini də elə birinci səfərdir. Salik bu mərhələdə ən böyük maneələrdən biri olan öz mənəmliyindən xilas olmalıdır. *Riyazətlər*, Allaha dualar, ağlayış və yalvarışlar bu səfərdə daha çox köməyə çatır. Bunlar nə qədər çox olsa, yol o qədər tez qət olunar. Bu yolda salikə mütləq bir yolgöstərici rəhbər, *mürşid* lazımdır. Dini ədəbiyyatda bu rəhbəri "*pir*", "xızr" və başqa adlarla ifadə edirlər. Birinci mərhələnin sonunda salik *fəna* dərəcəsinə yetişir. Amma bu, fənanın ilk mərtəbəsidir. Salik hələ ki yalnız öz zatını fani (məhv, yox) edə bilib.

*İkinci səfər:* Haqq ilə birlikdə Haqda olan səfər (bi-l-Həqq fi-l-Həqq). Bu, fənanın daha dərin mərtəbəsidir. Əgər birinci səfərin sonunda arif öz zatını fani etmişdisə, ikinci səfərin sonunda həm də öz iradəsini və əməllərini Allahda fani edir. Arif öz iradəsindən, istəyindən əl çəkir, hər şeyi Allahın öhdəsinə buraxır. Bəzi sufi kitablarında deyilir ki, insan gərək Allahın qarşısında özünü ölüyuyanın əlindəki meyit kimi hiss etsin. Ölüyuyan meyiti istədiyi tərəfə çevirir və meyit heç bir ixtiyar, müqavimət göstərmədən ona tabe olur. Gərək salik də Allaha bu şəkildə tabe olsun. İkinci səfərin sonunda fəna halı başa çatır və bundan sonra *bəqa* dövrü başlayır.



*Üçüncü səfər:* Haqq ilə birlikdə Haqdan xalqa (məxluqata) sarı olan səfər (min əl-Həqq ilə-l-xəlq bi-l-Həqq). Bu, birinci səfərin əksidir, bu mərhələdə salik boşalmış qəlbini doldurmağa başlayır. Çünki fəna halının sonu boşluq və heyranlıqıdr. Üçüncü səfər boyunca arif Allahın ad və sifətləri, feilləri barədə düşünür, bunları müşahidə edir, bunların həqiqətini anlamağa çalışır, özündə bunları tərbiyə etməyə can atır. Bu, bəqa (qalmaq, başqa sözlə, dirilmək) halıdır. Bunun üçün salik Haqqın yaratdıqlarına – məxluqat aləminə baxmalıdır. O, Allahın xilqətindəki nizam-intizamı, hikməti seyr edir, bunları pozmağın fəsadını anlayır. Arifin boş qəlbi ilahi hikmətlərlə dolur. O, gizli sirləri, hikmətləri anlamaq səviyyəsinə çatır, kəşf və ilhamlar onu daim müşayiət edir. Əvvəlki iki səfər kəsrətdən (çoxluqdan) vəhdətə doğru istiqamət götürmüşdüsə, üçüncü səfər vəhdətdən kəsrətə qayıdış deməkdir.

*Dördüncü səfər:* Haqla birlikdə xəlq içində olan səfər (bi-l-Həqq fi-l-xəlq). Bu da ikinci səfərin əksidir. Bu səfər boyunca arif artıq özü pir və şeyx kimi fəaliyyətə başlayır. Əgər birinci səfərin başlanğıcında o, yolgöstərən rəhbərə möhtac idisə, indi artıq özü başqalarına yol göstərir. Elə seyri-sülukun məqsədi də budur. Arif yalnız özünü xilas etməyi qarşısına məqsəd qoymamalıdır. Müəyyən məqama çatdıqdan, Haqqı tapdıqdan sonra mütləq öz biliyini və təcrübəsini səfərə yeni çıxan saliklərlə bölüşməlidir. Əks halda onun səfəri yarımçıq qalar və fayda gətirməz. Dördüncü səfərə qədəm qoyanlar irşad məqamına nail olanlardır, qalanları isə yalnız öz nəfslərinin tərbiyəsində ilişib qalıblar. Bu 4 səfəri seyri-iləllah (Allaha doğru yol), seyri-fillah (Allahda yol), seyriməəllah (Allahla birlikdə yol) və seyriənillah (Allahdan gələn yol) şəklində də qeyd etmişlər.

*bax:* **HİKMƏTİ-MÜTƏALİYƏ.**

***Mənbələr:*** *M.Mütəhhəri. İslam elmləri külliyyatı, I, 158-160; Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.88-89; Seyid Kamal Heydəri. Əl-İrfan əş-şii, s.119-134; Mehdi Hairi Yəzdi. "Əsfar" kitabına giriş, "İranname" dərgisi, 1368 h.-ş., №1, s.48-57; Nasr, Seyyed Hossein. Mulla Sadra: His Teachings (in Seyyed Hossein Nasr and Oliver Leaman, eds. History of Islamic Philosophy), New York, 1996, pp.643-662; Lüğətnameyi-Dehxuda, XIV, 21436.*

**ƏSMA əl-HÜSNA** – Allahın gözəl adları. Ümumilikdə Allah bütün təsəvvürə gələn yaxşı və bəyənilmiş sifətlərə malikdir, bütün pis və nöqsanlı sifətlərdən uzaqdır, mütləq kamillik sahibidir. Onun sifətlərinin sayı qeyri-məhduddur, bu sifətləri ifadə edən adlar da hər hansı ədədlə məhdudlaşa bilməz. Qurani-Kərimdə buyurulur: "Ən gözəl adlar Allahındır. Onu bu adlarla çağırıb dua edin. Onun adları barəsində küfr edənləri tərk edin. Onlar etdikləri əməllərin cəzasını alacaqlar!" (Əraf, 180).

Allahın adlarının arasından ən seçilmişlərini "əsma əl-hüsna" adlandırırlar. Bunların sayı 99-dur. Məhəmməd Peyğəmbər (s) buyurub: "Allahın yüzdən bir ədəd

əskik, yəni 99 adı var. Kim bu adları saysa, cənnətə girər". Əsma əl-hüsnaya Allahın fərqli sifətlərini ifadə edən adlar daxildir. Burada Allahın həm təkliyini (Vahid, Əhəd, Fərd, Vitr), həm mərhəmətini (Rəhman, Rəhim, Rəuf, Vədud, Əkrəm), həm elmini (Əlim, Həkim, Xəbir), həm zalımlara qarşı qəzəbini (Cəbbar, Qahir), həm yaradıcılığını (Xaliq, Bədi, Bari, Sane, Fatir), həm bağışlayan olmasını (Əfüvv, Ğəfur) göstərən adlar daxildir. Bütün bu adların ən kamili "Allah"dır, qalan adların hamısının xüsusiyyətləri bunda cəmlənib.

***Mənbələr:*** *Əllamə Məclisi. Bihar əl-ənvar, IV, 186; Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.98-104; Türkiye Diyanet Vakfı İslam Ansiklopedisi, XI, 404-418.*

**FƏQİR** – *fəqr* məqamında olan sufi. Əsl fəqir yalnız Allah qarşısında öz fəqrini etiraf edər, yalnız Ona möhtac olar. Böyük sufilər fəqirliklə fəxr etmiş, bu halı heç bir sərvətə dəyişmək istəməmişlər. Səfəviyyə təriqətinin banisi Şeyx Səfiəddin Ərdəbili fəqirliyi ulu səadət, peyğəmbərlərin sifəti adlandırırdı. *"Qara məcmuə"də* onun dilindən yazılıb: "Bu fəqirlik dedikləri, əgər sual olunarsa, bir gizli sultanlıqdır. Kimsə bilməz bunun ləzzətini, yenə də füqəra bilir. Və bu fəqirlər uçmaqda (cənnətdə) daha sultan olsalar gərəkdir. Bu fəqirlərə sultanlar demək mənası budur kim, bunlar şeytan qulu olmaqdan qurtulmuşlar".

Şeyx Səfi deyirdi ki, Qiyamət günündə Allah-Taala fəqir bəndələrini hüzuruna toplayıb buyuracaq: "Ey mənim fəqir qullarım! Dünyada sizə dünya vermədigim, sizi fəqir etdigim sevmədigimdən degildir. Bilin, sevdigimdən idi kim, şol çox sevdigim Mühəmmədin sifətilə sizi sifətləndirdim. Ey mənim qullarım! Dünyada mən sizə çox dünya versəm, sizi daha qəni eyləsəm, bunun sizə hesabı qatı olsa gərəkdir. Görün axı şu qənilərə (sərvətlilərə) nə qatı hesab olunur. Gəlin indi, ey fəqirlərim! İşdə sizə uçmaq (cənnət), hangısında gərəksə, sakinlənin!"

Şah İsmayıl Xətai də şeirlərində fəqirliyi sultanlıq adlandıraraq insanları "kuyi-fəqr içrə gədalıq mülkinin sultanı" olmağa çağırırdı. Onun fikrincə, fəqir dərvişin qəbası (kürkü) hər cür fəxrli ipəkdən daha üstündür: "Qəbayi-fəqrü fənadır qumaşi-faxirimiz".

*bax:* **FƏQR.**

***Mənbələr:*** *Qara məcmuə, s.40-41; Şah İsmayıl Xətai. Əsərləri (2 cilddə), I, 276 və 596.*

**FƏQR** – *seyrü-süluk* yolunda dördüncü *məqam*, əksər təsnifatlara görə, zöhd və səbir məqamlarının arasında yerləşir. Mənası ehtiyaclı olmaq deməkdir, "ğəniyy" sözünün əksidir. Qurani-Kərimdə buyurulur: "Ey insanlar! Siz Allaha möhtacsınız. Allah isə (heç nəyə, o cümlədən sizin ibadətinizə) möhtac deyildir. O, (hər cür) şükrə (tərifə) layiqdir!" (Fatir, 15). Ayədə "Allaha möhtac" ifadəsi "füqəra iləllah", Allaha aid olan "ehtiyacsız" ifadəsi isə "ğəniyy" şəklindədir. *Salik zöhd* məqamından keçəndən sonra fəqr məqamına çata bilər. Çünki o, zöhd məqamında dünyadan rəğbətini kəsmə-



lidir ki, fəqr məqamında dünya nemətlərini atıb kasıblıq içində ömür sürə bilsin. Əsl fəqir yalnız tək bir ğəniyyə (varlıya, ehtiyacsıza) – Allaha ehtiyac duyar, Ondan başqa heç kimin qarşısında əyilməz, heç kimə möhtac olmaz:

Fəqirəm, ol gözəldir hüsn içində
Ğənidir, bayə bənzər, bənzəməzmi?
*(Ş.İ.Xətai)*

Ariflər demişlər ki, *təsəvvüfün* əvvəli fəqrdir. Sufi Alahdan başqasına möhtac olsa, fəqir adını itirər.

Təsəvvüf kitablarında yazılıb: "Fəqrin adı, qaydası və həqiqəti vardır. Fəqrin adı – istək olduğu halda mülksüzlükdür. Qaydası – zöhd var ikən (yəni şüurlu surətdə) mülksüzlükdür. Həqiqəti isə maliklik imkanının olmamasıdır. Həqiqət əhli bütün şeyləri əsl və yeganə malikin (Allahın) ixtiyarında bildiyi üçün Allahdan özgəsinə maliklik imkanını rəva görməz. Hətta əgər bütün aləmin ixtiyarını ona versələr, yenə qəbul etməyib özünü kənara çəkər".

Fəqr halında başqalarına möhtac olub dilənçilik etmək İslamda bəyənilmir. Buna görə əksər təriqətlərdə sufilər yalnız onlara könüllü verilən nəzirləri qəbul edərdilər. Amma camaatdan aldığı pul ilə dolanan dərvişlər də vardı, böyük sufilər bunları tənqid etmişlər.

Təsəvvüf böyükləri demişlər ki, iki cür fəqr vardır. Bunların biri barədə Peyğəmbər (s) Allaha dua edərək "Fəqrdən sənə pənah aparıram" deyib. Fəqrin o biri növü haqqında isə buyurub: "Fəqr fəxrimdir". Bunların birincisi küfrə, ikincisi haqqa yaxındır. Küfrə yaxın olan – qəlbin fəqirliyidir ki, elm, hikmət, əxlaq, səbir, təslim və təvəkkül qəlbdən gedər. Amma Peyğəmbərin fəxri olan fəqirlik budur ki, insan dünyanı atsın və bununla Allaha yaxın olsun.

***Mənbələr:*** *S.C.Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.623-627; S.Z.Səccadi. İrfan və təsəvvüfün əsaslarına giriş, s.24-26; İzzəddin Kaşani. Misbah əl-hidayə və miftah əl-kifayə, s.375-379; Sərrac Tusi. Əl-Lümə, s.74-75; Nəsirəddin Tusi. Ovsaf əl-əşraf, s.33-34; Risaleyi-Qüşeyriyyə (farsca tərcümə: Bədiüzzaman Firuzənfər), s.452-466; Qara məcmuə, s.40-41; Şah İsmayıl Xətai. Əsərləri (2 cilddə), I, 530; Əbdürrəhman Cami. Nəfəhat əl-üns, 20-21.*



**FƏNA** – yox olmaq, məhv olmaq. Təsəvvüf terminologiyasında bəndənin öz bəşəriyyət mahiyyətini Haqqın (Allahın) rübubiyyət (rəblik) mahiyyətində məhv etməsinə deyilir. Fəna və *bəqa* məfhumları təsəvvüfdə yanaşı işlədilir. Fəna bəndənin bəyənilməyən xüsusiyyətlərdən təmizlənməsi, bəqa isə gözəl xüsusiyyətləri özündə inkişaf etdirməsidir. Başqa sözlə, fəna Allaha doğru yolun (seyr iləllah) sonu, bəqa isə Allahda yolun (seyr fillah) başlanğıcıdır. *Salik* fəna halının sonunda bütün varlığını Allaha qurban edir, özündən heç bir nişan, əlamət saxlamır, bəqa mərtəbəsində isə Allahın gözəl əxlaqı ilə özünü bəzəyir, ilahi sifətləri özündə *təcəlla* etdirir.

Fənanın iki mərtəbəsinin olduğunu deyirlər. Birincisi zahiri fəna halıdır ki, buna feillərin fənası deyirlər. Bu mərtəbədə Allahın feil və iradəsi salik üçün

təcəlla edir. O, bütün feillərin yalnız Allaha məxsus olduğunu, Allahdan savayı heç kimin müstəqil feil və iradə sahibi olmadığını anlayır, bütün istək və əməllərdən imtina edir. Hətta bu cür fəna halında olan ariflər bəzən yeməkdən və içməkdən imtina edirdilər. Fənanın ikinci mərtəbəsi batini fəna, yaxud sifətlərdə və zatda olan fənadır. Bu mərtəbəyə çatmış arif özünün bütün xasiyyətlərini, hətta zatını Allaha fəda edir. O hətta özünün varlığını da qəbul etmir, onun üçün Allahdan savayı heç nə, o cümlədən onun özü də yoxdur.

İrfanda daha yüksək məqama çatan şəxslərə Allah fənadan sonra bəqa mərtəbəsini nəsib edir. Öz feil və iradəsini Allahda fəna edəndən sonra Allah bir daha onlara feil və iradə qüvvəsini verir, bu dəfə arif yalnız Allahın istədiyini istəyir və Allahın etdiyini edir. Bu mərhələyə çatan ariflər xalqı irşad etməklə məşğul olurlar, yəni nəfsin səfərlərinin (əsfariərbəə) dördüncüsünə qədəm qoyurlar. Artıq onlar üçün nə Haqq (Allah) xəlqin (məxluqatın) qarşısında hicabdır, nə də xəlq Haqqın qarşısında pərdədir. Onlar fəna ilə bəqanı özlərində birləşdirmişlər, fənada baqi, bəqada fani olmuşlar. Bu, dünyada insanın Allaha doğru yolda çata biləcəyi ən son nöqtədir, Allaha bundan daha yaxın olmaq yalnız ölməklə mümkündür. Təsadüfi deyil ki, Nəsirəddin Tusi *seyrü-süluk* yolu haqqında qələmə aldığı "Ovsaf əl-əşraf" risaləsini məhz fəna barədə fəsillə bitirir.

Şeyx Səfiəddin Ərdəbili təriqət *mürşidi* üçün lazım olan xüsusiyyətləri sadalayarkən fəna məqamına çatmağı da qeyd edir: "Dünyaya meyli-məhəbbət etməyə, həqq yoluna varını sərf edə, baş və candan keçmiş ola, fəna şərbətini içmiş ola". Şeyx Səfi fəna ilə bəqanın nə olması barədə suala bu şəkildə cavab vermişdir: "Fəna üçdür. Biri, surətin fənası sifətün bəqasına, yəni surət fani olmayınca sifət baqi olmaz... Və biri, sifətün fənasıdur məna bəqasına kim, ol ruhdur və ona bəşəriyyət fənası derlər və ol, eşqün artıqlığı ilən olur kim, bəşəriyyətün asarını yox eylər. Üçünci, ruhun fənasıdur Tanrı-Taalanın bəqasına. Ol vəqt ki Tanrının ənvarı (nurları) təcəlla qılsa, bəşərlik ilə insanlıq ismi və rəsmi yox eylər və bu üçünci fənayə fillahun fənası derlər... Bu taifənün (yəni sufilərin) bəqası fənadur, yəni ta kimsə kəndüdən fani olmaya, baqi olmaz".

Fəna halında sufi *vəcd* (ekstaz) vəziyyətini yaşayır, bu zaman qeyri-iradi olaraq məntiqə və şəriətə uyğun gəlməyən sözlər danışır; bunlara şəthiyyat deyirlər.

***Mənbələr:*** *Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.628-630; Seyid Ziyaəddin Səccadi. İrfan və təsəvvüfün əsaslarına giriş, s.269; Rzaqulu xan Hidayət. Riyaz əl-arifin, s.41; Yaqub Babayev. Təriqət ədəbiyyatı; sufizm, hürufizm, s.31-32; K.Bünyadzadə. Sərrac Tusinin "əl-Lümə" əsəri, s.187; Nəsirəddin Tusi. Ovsaf əl-əşraf, s.101; Risaleyi-Qüşeyriyyə (farsca tərcümə: Bədiüzzaman Firuzənfər), s.106-109; İzzəddin Kaşani. Misbah əl-hidayə və miftah əl-kifayə, s.426-429; Qara məcmuə, s.36; Şeyx Səfi təzkirəsi ("Səfvətüs-səfa"nın XVI əsr türk tərcüməsi), s.379 və 405.*



**FƏTH** – sufinin *qəlbinin* genişlənməsi, onda ilahi elm və mərifətin zühur etməsi fəth adlanır. Fəthin iki növü var: nəfsin fəthi və ruhun fəthi. Nəfsin fəthində *salikə* Allah tərəfindən elm əta edilir, ruhun fəthində isə mərifət ərməğan olunur.

Dərvişlərə camaat tərəfindən verilən hədiyyə və ianələrə də fütuh deyirlər.

***Mənbələr:*** *Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.617; Seyid Ziyaəddin Səccadi. İrfan və təsəvvüfün əsaslarına giriş, s.272.*

**FİRASƏT** – bəzi şəxslərin əldə edə bildiyi elm. Əsasən obyektlə kontakt halında telepatiya, hipnoz, intuisiya və s. yollarla informasiya əldə etməyə deyilir. Firasəti *lədünni elmlərə* (birbaşa Allahdan verilən, müəllimdən öyrənilməyən biliklərə) aid edirlər. Lədünni elminin 3 növü var: vəhy, ilham və firasət. Vəhy yalnız peyğəmbərlərə verilər. İlham və firasət isə seçilmiş insanlara nəsib olar. Bu ikisinin fərqi budur ki, firasət kontakt yolu ilə telepatiya və s. vasitələrlə elm əldə etməkdir, ilhamın isə bu vasitələrə ehtiyacı yoxdur.

İslamdan əvvəl ərəblər arasında qiyafəşünaslıq (fizionomiya) elmi çox yayılmışdı, bu elmin mütəxəssisləri insana baxıb onun haqqında maksimum dərəcədə informasiya verə bilirdilər. Bəzi mənbələrdə firasət qiyafəşünaslıq mənasında izah edilir.

*Molla Sədra* firasəti iki qismə ayırırdı. Birinci qismə aid olan firasət vasitəsiz yolla ürəyə daxil olan biliklərdir, bu elə ilhamın bir növüdür. İkinci qisim firasət isə öyrənməklə əldə edilir, zahirə əsasən batin barədə hökm verməkdən ibarətdir. Bəzi sufi mənbələrində firasəti 3 qismə bölmüşlər. Birinci qisim firasət hər kəsin qəlbinə xəbərsiz və hazırlıqsız daxil ola bilər. Bu firasət yalnız ariflərə məxsus deyil. Adi insanlar da çalışmadan və mənbəyini bilmədən bu növ firasətə layiq ola bilərlər. İkinci növ firasət imandan qaynaqlanır, qeyb aləmindən biliklər qəlbdə təcəlla etdikdə yaranır. Bu cür firasətə kəramət deyirlər. Üçüncü qisim firasət isə qəlb ən uca məqam olan sirr məqamına yetdikdə yaranır. Bu firasət peyğəmbərlərə verilən vəhydən fərqlidir, *seyrü-süluk* yolunun ardıcıllarına xasdır.

***Mənbələr:*** *Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.619-620; Seyid Cəfər Səccadi. İslam maarifi lüğəti, III, 1406-1407; Lüğətnameyi-Dehxuda, XII, 17013-17014; Türkiye Diyanet Vakfi İslam Ansiklopedisi, XIII, 116-117; Osman Nuri Topbaş. İmandan İhsana Tasavvuf (“Firaset” bölümü); Risaleyi-Qüşeyriyyə (farsca tərcümə: Bədiüzzaman Firuzənfər), s.366-388; İzzəddin Kaşani. Misbah əl-hidayə və miftah əl-kifayə, s.79.*

**FÜTÜVVƏT** – *sufidə* olması gərəkən xüsusiyyət. Sufilikdə fütüvvət iysar, yəni fədakarlıq kimi izah edilir. Bunun ən birinci və aşağı dərəcəsi cah-calalı qurban vermək, ən sonuncu və üstün dərəcəsi isə *nəfsi* fəda etməkdir. Fütüvvətin şərti budur ki, özünü kiçik, başqalarını böyük və səndən üstün biləsən, din qardaşlarının səhvlərindən keçəsən, cama-

atla yaxşı rəftar edəsən, səni incidənlərə yaxşılıq edib bəxşişlər verəsən, başqalarında olan üstün cəhətləri, özündə olan eyib və nöqsanları görə biləsən.

Sufi gərək özündə heç bir üstünlük görməsin. Bu isə üç yolla mümkündür: başqaları ilə düşmənçilik etməmək və onları aşağılamamaq; pisliyin qarşısında yaxşılıq etmək; heç bir işi mükafat xatirinə yerinə yetirməmək, Allaha münasibətdə tam səmimi və ixlaslı olmaq.

Fütüvvət əvvəldə bir sufi məfhumu kimi meydana çıxmış, sonralar ictimailəşərək sənətkarların təşkil etdikləri cəmiyyətlərin kodeksinə çevrilmişdir. Orta əsrlərdə hər bir şəhərdə fütüvvət prinsipləri əsasında yaranan və fəaliyyət göstərən təşkilatlar var idi. Bunları tarix kitablarında *əxi* cəmiyyətləri də adlandırırlar.

Fütüvvət əhlinin (fətyan) başçısı *Həzrət Əlidir (ə).* Məhəmməd Peyğəmbər (s) Ühüd savaşında *Zülfüqar* qılıncını Əlinin (ə) belinə bağlayıb onu döyüş meydanına göndərmiş və belə buyurmuşdu: “La fəta illa Əli, la seyfə illa Zülfiqar” (Əlidən başqa igid, Zülfüqardan başqa qılınc yoxdur). Bu cümlədəki “fəta” kəlməsi və “fütüvvət” sözü eyni kökdəndir.

Fütüvvəti bəzi sufi kitablarında cavanmərdlik, fütüvvət əhlini isə cavanmərd və comərd adları ilə qeyd etmişlər.

***Mənbələr:*** *Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.618; Töhfət əl-ixvan dər bəyani-üsuli-fütüvvət və adabi-fətyan, s.5-67; Əbu Əbdürrəhman Sülәmi. Kitab əl-fütüvvə (farsca tərcümə edən: Qasim Ənsari), s.20-21; Diyanet Vakfı İslam Ansiklopedisi, XIII, 259-263; Risaleyi-Qüşeyriyyə (farsca tərcümə: Bədiüzzaman Firuzənfər), s.355-365.*



**GEYSU** – boynun arxasına tökülən, uzun, qıvrım tel mənasını verir. Təsəvvüf ədəbiyyatında *zülf* məfhumunun sinonimi kimi də işlədilir. Sufi terminologiyasında geysuya fərqli mənalar verilmişdir. Bəzi mənbələrdə bunun *övliya* silsiləsinə işarə olduğunu yazırlar. Digər izaha görə, geysu mahiyyət aləminə (Allaha) doğru tələb yoludur, simvolik ifadə ilə Allahın ipidir. Onun vasitəsilə *salik* Haqqa yetməyə çalışır.

***Mənbələr:*** *Rzaqulu xan Hidayət. Riyaz əl-arifin, s.41; Ethem Cebecioğlu. Tasavvuf Terimleri ve Deyimleri Sözlüğü, “gisu” maddəsi; Fərhəngi-farsiyi-Müin, III, 2401.*



**HAL** – mühüm təsəvvüf termini. *Salikin* (haqq yolçusunun) *seyrü-süluk* yolundakı mənzillərinin bir qismi *məqam*, bir qismi də hal adlandırılır. Hala təsəvvüf mənbələrində bu şəkildə tərif verilib: “Haqq yolçularının dilində hal – qəlbə ixtiyarsız, qəsdsiz və qazanılmadan daxil olan mənalardır”. Halı söz vasitəsilə təsvir və əhatə etmək mümkün deyil. Fərəh, hüzn, şövq, heybət və s. bu kimi emosiyalar hallara aiddir.

Halın məqamdan əsas fərqi onun tez ötüb keçməsi və qəlbdə qərar tutub qalmamasıdır. Məqam çalışmaqla, *riyazət* və *çilələrlə* əldə edilə bilər, hal isə Allah tərəfindən qeyri-iradi olaraq salikə verilir. Hal daimilik qazananda məqama çevrilir. Təsəvvüfdə belə bir deyim var-



dır ki, bütün məqamlar əvvəldə hal, axırda məqam olur.
*bax:* **MƏQAM.**

***Mənbələr:*** *Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.307-310 və 735-739; Seyid Ziyaəddin Səccadi. İrfan və təsəvvüfün əsaslarına giriş, s.19-21 və 32-33; Sərrac Tusi. Əl-Lümə, s.65-104; Qısa İslam Ensiklopediyası (N.Rəhimovun ümumi redaktəsi ilə, 2 cilddə), I, 158-160; Şeyx Səfi təzkirəsi ("Səfvətüs-səfa"nın XVI əsr türk tərcüməsi), s.398.*



**HEYDƏRİ TACI** (*qızılbaş* papağı) – mənbələrdə qızılbaşlığın simvolu, Səfəvi şahlarının və əyanlarının fəxri baş geyimi kimi təsvir edilir. Qırmızı rəngli parçadan tikilirdi, 12 sarığı və ortasında uzun çıxıntısı vardı. Adətən onun ətrafına əmmamə şəklində saya və ya zolaqlı ağ parça sarıyırdılar, amma əmmaməsiz də qoyulurdu. Hətta bəzən dəmir dəbilqənin yuxarısında dəlik açıb, papağın çıxıntısını ora yerləşdirirdilər. Səfəvilər dövrünə aid miniatürlərdə qızılbaş papağının fərqli formalarını görmək mümkündür.

Heydəri tacının mənşəyi, Səfəvi mənbələrinə görə, *I Şah İsmayılın* atası *Şeyx Heydərin* adı ilə bağlıdır. Səfəvi salnamələri ona mistik məna verirlər. *"Aləmarayi-Səfəvi"də* yazılıb ki, bir gecə *Həzrət Əli (ə)* Şeyx Heydərin yuxusuna gəlib ona buyurur: "Ey övladım! Vaxt gəldi ki, sənin belindən bizim bir övladımız dünyaya gəlsin və aləmin üzündən küfr ləkəsini silsin. Amma əvvəlcə gərək öz *sufi* və *müridlərin* üçün tac hazırlayasan". Sonra yuxuda İmam Əli (ə) qayçı götürüb qırmızı parçadan tac kəsir və onu 12 dilim edir. Şeyx Heydər yuxudan ayılıb göstəriş verir ki, hər sufi o qayda ilə tac hazırlayıb başına qoysun. Ona "heydəri tac" adını verirlər. "Aləmarayi-Səfəvi"də göstərilir ki, müridlərin hamısı tac qoyandan sonra türk dilinə uyğun olaraq onlara qızılbaş dedilər. "Tarixi-aləmarayi-Abbasi" və digər mənbələrdə də bu hadisə təsvir edilib. Mənbələrdən məlum olur ki, o zamanadək Şeyx Heydər və ətrafındakılar başlarına türkman taqiyəsi deyilən araqçın qoyurdular.

Yuxarıdakı mənbələrdə bu papağa qızılbaş tacı deyilməsinin səbəbi İmam Əli (ə) tərəfindən Şeyx Heydərə tövsiyə edilməsidir; qızılbaş müəlliflər bu yuxunu imamın Şeyx Heydəri hakimiyyətə təyin etməsi və başına tac qoyması kimi yozurlar. Mənbələrdə bu baş geyimi "qızılbaş papağı (külahı)" kimi də qeyd edilir. Salnamələrdə "başına heydəri tacı və ya qızılbaş papağı qoymaq" ifadəsi qızılbaş əqidəsini qəbul etmək və Səfəvilərin tərəfinə keçmək mənasını verir.

Səfəvi papağının qırmızı rəngdə olmasının səbəbini İslam tarixinin bəzi səhifələri ilə əlaqələndirmək cəhdləri də olmuşdur. Belə ki, rəvayətlərə görə, Peyğəmbərin məşhur səhabəsi Əbu Dücanə döyüşlərdə başına qırmızı rəngdə papaq qoyardı və bu, onun şücaətinin rəmzi sayılardı. İmam Əlinin (ə) Xeybər döyüşündə qırmızı libas və qırmızı dəbilqə geyindiyi, Siffeyn savaşında onun əsgərlərinin başlarına qırmızı rəngli papaq

qoyduqları rəvayət edilir. Səfəvilər nəslinin nümayəndəsi, I Şah İsmayılın ulu babası *Firuz şah Zərrinkülahın* ləqəbinin tərcüməsi də "qızılpapaq" mənasını verir.

Mənbələrin bir qismində qızılbaş tacının meydana gəlməsini I Şah İsmayılın adı ilə bağlayır və onun göstərişi ilə papaqçı tərəfindən hazırlandığını bildirirlər.

Qızılbaş tacının 12 zolağını əsasən imamların sayı ilə əlaqələndirirlər. Digər izaha görə, bu rəqəm sufinin özündən uzaqlaşdırmalı olduğu mənfi xüsusiyyətlərin sayını göstərir (paxıllıq, nifrət, qəzəb, kin, xudbinlik, başqasında eyib tutmaq, təkəbbür, şəhvət, camaata əziyyət vermək, çox yemək, çox yatmaq, pis işlər). Səfəvilərdən əvvəl yaşamış böyük sufi Şah Nemətullah Vəli "Tacnamə" adlı mənzum əsərində buna işarə etmişdir.

Qızılbaş tacına işarəni Şah İsmayıl Xətainin şeirlərində də görürük:

Qızıl ələm, qızıl bayraq, qızıl tac
Geyinsə qazilər, ol gün həzərdür.
*(Ş.İ.Xətai)*

***Mənbələr:*** *Səccadi Hüseyni. "Qızılbaş" sözünün semantik məna formaları ("Mütaliati-tarixi-İslam" dərgisi, 1396 h.-ş., №32, s.73-101); Türkiye Diyanet Vakfı İslam Ansiklopedisi, XXV, 547; Aləmarayi-Səfəvi, s.30; Tarix-i aləmara-yi Abbasi (tərcümə və şərhlər: O.Əfəndiyev, N.Musalı), s.66; Qulamrza Mehdi Ravənci. Səfəvi dövrünə aid geyimlərin xarakteri barədə tarixi araşdırma ("Pejuheşnameyi-tarix" dərgisi, 1399 h.-ş., №58, s.113-132); Budaq Münşi Qəzvini. Cəvahir əl-əxbar, s.119; Seyid Möhsin Əmin. Əyan əş-şiə, I, 21; Şah İsmayıl Xətai. Əsərləri (2 cilddə), I, 131.*



**HƏQİQƏT** – *seyrü-süluk* yolunda sufinin çatdığı üçüncü mərhələ. Həqiqətə çatmaq üçün daha iki mərhələdən – *şəriət* və *təriqətdən* keçmək şərtdir. Yalnız bu iki mərhələni layiqincə keçdikdən sonra həqiqətə yetişmək olar.

Sufi mənbələrində bu üç anlayışın Məhəmməd Peyğəmbərə (s) aid bir hədisdən götürüldüyü iddia olunur: "Şəriət mənim sözlərim, təriqət mənim əməllərim, həqiqət isə mənim hal və vəziyyətlərimdir". Məşhur sufi müəllifi Əzizəddin Nəsəfi "əl-İnsan əl-kamil" kitabında yazırdı: "Bil ki, şəriət peyğəmbərlərin sözü, təriqət peyğəmbərlərin əməli, həqiqət isə peyğəmbərlərin gördükləridir. *Salik* (haqq yolçusu) gərək şəriət elmindən lazım olduğu qədər öyrənsin və yadda saxlasın, sonra təriqət əməllərindən lazım gəldiyi qədər yerinə yetirsin. Bundan sonra səy və çalışqanlığına uyğun olaraq, həqiqət nurları onun üzünə işıq saçar".

Salik *fəna* məqamından *bəqa* mərtəbəsinə keçəndən sonra deyirlər ki, təriqət yolundan həqiqətə çatmışdır.

Ariflərin fikrincə, həqiqət mərhələsi qeyri-məhdud və sonsuzdur. Allahın bütün sifətləri sonsuz və Zatı qeyri-məhdud olduğu üçün onu dərk etməyin də həddi-hüdudu yoxdur.

Sufi şairlərə məxsus bəzi şeir nümunələrində (məsələn, Nəsimi yaradıcılığında) şəriət, təriqət və həqiqət anlayışlarına daha biri, yəni mərifət əlavə olunur



və bu zəncirin halqalarının sayı dördə çatdırılır.

***Mənbələr:*** *S.Z.Səccadi. İrfan və təsəvvüfün əsaslarına giriş, s.13-17; İrfani söz, termin və ibarələr lüğəti, s.323-324; M.Mütəhhəri. İslam elmləri külliyyatı, II, 84-86; Ehsanullah Əli İstəxri. Üsuli-təsəvvüf, s.657-663; Qısa İslam Ensiklopediyası (N.Rəhimovun ümumi redaktəsi ilə, 2 cilddə), I, 78, 254 və 270.*

**HƏQQ** – təsəvvüf aləmində və sufi ədəbiyyatında bu söz Allah-Taalanı ifadə edir. Təsəvvüf nəzəriyyəsi barədə ən mühüm mənbələrdən olan Sərrac Tusinin “əl-Lümə” kitabında sufi terminlərinin izah edildiyi fəsildə deyilir: “Həqq izzət və calal sahibi olan Allahdır. Allah buyurub: “Onlar Allahın açıq-aşkar bir haqq olduğunu biləcəklər” (Nur, 25)”.
Şeyx Səfiəddin Ərdəbili buyurmuşdur: “Səcdə Həqqədir, Həqdən qeyriyə səcdə qılmaq caiz degildir. Əgər qeyri-Həqq üçün edərsə, ol kişi kafiri-mütləq olur”.

Mən Xətaiyəm, Həqi həqq tanımışam, bigüman,
Anın içün ol yaratdı, mən ana dərkar idim.
*(Ş.İ.Xətai)*

***Mənbələr:*** *Qara məcmuə, s.21; Sərrac Tusi. Əl-Lümə, s.413; Şah İsmayıl Xətai. Əsərləri (2 cilddə), I, 373.*

**HİCAB** – tərcüməsi pərdə, örtük deməkdir. İrfan aləmində *talibin* Haqqın *təcəllasını* müşahidə etməsinə mane olan vasitələr hicab adlanır. Aşiq (sufi) ilə Məşuq (Allah) arasında yaranan hicabın səbəbi aşiqin kamal mərtəbəsinə çatmamasıdır. Sufilər hicabın bir neçə səbəbini qeyd etmişlər: mal-dövlət sevgisi, şan-şöhrət sevgisi, günahlar və təqlidçilik. Təqlidçilik deyərkən ruhun azad seyrinə mane olan, onu ənənələrə bağlayan bütün amillər nəzərdə tutulur, hətta bəzi sufilər valideynə itaəti də təqlidçilik saymışlar. Bu maneələri aradan qaldırmayınca Allahla bəndə arasındakı hicab da aradan qalxmaz. Əsl arifin Allaha yəqini elə bir dərəcədə olmalıdır ki, aradakı bütün hicablar və pərdələr götürülsə, bu yəqində heç bir dəyişiklik baş verməsin. Bu mənada arif və sufilər Həzrət Əlinin (ə) aşağıdakı kəlamını tez-tez xatırlatmışlar: “Pərdələr götürülsə belə, yəqinim artmaz”.
Sərrac Tusi “əl-Lümə” kitabında hicab məfhumunu bu şəkildə izah etmişdir: “Hicab istənən, qəsd edilən şeylə istəyən, məqsədə gedən arasında qoyulmuş maneədir. Səriyy Səqəti belə dua edir: “Allahım, mənə hər nə ilə əzab versən də, hicab zilləti ilə əzab vermə”.
Şeyx Səfiəddin Ərdəbilinin təqdimatında bəndə ilə Allahın arasındakı hicab bəndənin *nəfsidir*, nəfs islah olunsa, hicab ortadan götürülər və bəndə ən yüksək məqama çatar: “Və şol hicab ki, *saliki* mətlubə vasil olmaqdan mən edər (ona mane olar), ol nəfsdir. Çün salik hicabını ortadan götürə və könlü ayinəsin pak edə, Həqq-Taalanın didarın müşahidə etməyə ümidvar ola... Hər nəsnə ki, Həqq-Taala afaqda yaratmışdır və aləmi-ülvidə və aləmi-süflidə (uca və aşağı aləmlərdə) onu izhar etmişdir,

onun mislini nəfsi-insanda bənd etmişdir, leykən hicabı ortadadır. Vəqti ki, bu hicabi-nəfs ortada, ol nəsnələr görünməz. Hər xaçan ki nəfs hicabı ortadan götürülə, hər əlamət ki afaqdə vardır, ol əlamətlər nəfsdə peyda olur və mərifətiəşya hasil olur, pəs Həqqin həqiqəti ona zahir olur... Pəs sənin hicabın örtən haman sənsən. Kəndi hicabını ortadan götür, daha vüsal ələ gətir".

Gün təki yüzün cəhanda zahir olmuşdur, vəli
Bu əcib kim, bəndədən daim hicab üstündədir.
*(Ş.İ.Xətai)*

***Mənbələr:*** *S.C.Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.311; S.C.Səccadi. İslam maarifi lüğəti, II, 689; Sərrac Tusi. Əl-Lümə, s.428; K.Bünyadzadə. Sərrac Tusinin "əl-Lümə" əsəri, s.210; Amidi. Ğürər əl-hikəm və dürər əl-kiləm, s.320; Qara məcmuə, s.48, 64 və 76; Şah İsmayıl Xətai. Əsərləri (2 cilddə), I, 192.*

**HU** – sufi ədəbiyyatında və ümumilikdə irfan mədəniyyətində çox rast gəlinən bir ifadədir. Ərəb dilindəki "hüvə" kəlməsinin ("o" şəxs əvəzliyi) tələffüz şəklidir. Təsəvvüf aləmində "hu" sözü Allahın adlarından biri kimi qəbul edilir, çünki Qurani-Kərimin yüzlərlə ayəsində Allah barəsində "hüvə" ifadəsi işlədilir. "Hu" Qeybi-Mütləqə (Allaha) işarədir, Müqəddəs Zatın adlarındandır.

"Allah" sözü elə nadir kəlmələrdəndir ki, onun hər bir hərfini ixtisar etdikdə yerdə qalan söz yenə Allah-Taalanı ifadə edir. Birinci əlifi götürdükdə "lillah" (Allaha), "lam" hərfini ixtisar etdikdə "ləh" (ona), növbəti "lam" hərfini götürdükdə isə "hu" sözü qalır. Təsəvvüf aləmində "hu" kəlməsi Allahın həmişə davam edən gizli *zikri* kimi dəyərləndirilir. Çünki nəfəsi ciyərlərdən buraxdıqda qeyri-ixtiyari olaraq "hu" səsi yaranır. Bu, insan bədənində Allahın yerləşdirdiyi işarələrdən biridir.

"Hu" təsəvvüfdə ən məşhur zikrlərdən biridir. Yəsəviyyə təriqətində bunun xüsusi bir forması vardır ki, bunu "zikriərrə" (mişar zikri) adlandırırlar. Çünki zikr deyənin sinəsindən qopan səs taxtaya sürtünən mişarın xırıltısını xatırladır. Sufilikdə belə bir qayda vardır ki, salik öz *nəfsinin mərtəbələrinə* uyğun olaraq özü üçün zikr seçər. Nəfsi-əmmarə mərtəbəsində "la ilahə illəllah", nəfsi-ləvvamə mərtəbəsində "Allah", nəfsi-mülhimə mərhələsində isə "hu" zikrini deyər. Bununla da o, əvvəlcə tövhidi-əfali (Allahın feillərindəki tövhidi anlamaq), sonra tövhidi-sifati (Allahın sifətləri əsasında tövhidi dərk etmək), daha sonra tövhidi-zati (Allahın Zatına görə tövhidə çatmaq) mərtəbələrini qazanar.

Təsəvvüfyönlü incəsənət nümunələrində "hu" kəlməsi Allahın adının rəmzi kimi gözəl xətlə yazılır.

Təsəvvüfdə geniş yayılmış məfhumlardan biri də "ədəb ya hu" ifadəsidir. Sufi bu sözləri tez-tez özü üçün təkrar etməli və heç vaxt unutmamalıdır. Təsəvvüfdə ədəb-ərkan ən vacib əxlaqi keyfiyyətlərdən sayılır. Əsl sufi bir an da olsa *ədəbi* tərk etməz, hamı ilə ədəb qaydaları əsasında rəftar edər, başqasının kön-



lünü sındırmaz, haqqına təcavüz etməz, incitməz, hər an Allahın nəzarəti altında olduğunu bilər. "Ədəb ya hu" ifadəsi yazılmış lövhələri keçmişdə sufi dərgahlarının, *xanəgahların*, mədrəsələrin qapısından asardılar. Xanəgaha daxil olmaq istəyən şəxs çöldə durub icazə almaq üçün "dəstur" deyər, içəridən "hu" cavabı gələrsə, daxil olmasına icazə verildiyini bilərdi.

Səfəviyyə təriqətinin banisi Şeyx Səfiəddin Ərdəbili *"xəlifə"* sözünü təşkil edən hərflərin rəmzi mənasını açıqlayarkən "h" hərfini bu cür şərh etmişdir: "h" – ismi-"hu"dur, gülbangi-övliyadır, xəlifələrə məxsusdur.

Şah İsmayıl Xətai qəzəllərində yazırdı:

Hər zaman kim, qarşuma ol dilbəri-məhru gəlür,
Canimə bir od düşür, bu dilimə "ya hu" gəlür.

Mən Xətai çəkmənəm ğəm, çün "ənəl-həq" demişəm,
Çəkmişəm Heydər təki meydanda "hu" mərdanə mən.

*(Ş.İ.Xətai)*

***Mənbələr:*** *Qısa İslam Ensiklopediyası (N.Rəhimovun ümumi redaktəsi ilə, 2 cilddə), I, 87; Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.800; Rzaqulu xan Hidayət. Riyaz əl-arifin, s.41; Türkiye Diyanet Vakfı İslam Ansiklopedisi, XVIII, 260-261; XLIV, 411; Lüğətnameyi-Dehxuda, XV, 23574; Qara məcmuə, s.33; Şah İsmayıl Xətai. Əsərləri (2 cilddə), I, 138 və 421.*



**HÜLUL** – ərəb dilindən tərcüməsi "həll olmaq" deməkdir. İlahi Zatın bir varlıqda və ya bütün varlıq aləmində həll olmasına hülul deyirlər. Ənənəvi İslamda qəbul edilməsə də, təsəvvüfdə hülul inancının izlərinə kifayət qədər rast gəlmək mümkündür.

İki cür hülul vardır. Mütləq (ümumi) hülul Allahın Öz Zatı ilə bütün varlıq aləmində həll olması deməkdir. Bu inancı İbn Ərəbi tərəfindən əsası qoyulmuş *vəhdəti-vücud* nəzəriyyəsinə bağlayırlar. Vəhdəti-vücud təliminə görə, Allahla aləm eynidir, Kainatda həqiqi varlıq yalnız Allahdır, ondan başqa həqiqi vücud yoxdur. Hər şey Allahdan yaranmışdır və Allahdadır. İnsan da bütün aləmlərin məcmusudur, bütün varlıq aləmini, o cümlədən Allahı özündə daşıyır. Hülulun ikinci növü müəyyən (xüsusi) hülüldur ki, bunun da kökündə Allahın konkret bir canlıda həll olmasına inam durur. Bəzi məlumatlara görə, IX-X əsrlərdə öz qəribə fikirləri və sözləri (şəthiyyat) ilə tanınmış, bunun üstündə edam olunmuş Həllac Mənsur hülul əqidəsində idi və Allahın onda həll olduğunu iddia edirdi.

Bəzi sufi təriqətlərində və *batini* yönümlü təlimlərdə hülul inancı açıq şəkildə qəbul edilirdi. Onları hüluliyyə, üşşaqiyyə, vasilə, bəzən ittihadiyyə adlandırırlar.

Müasir tədqiqatçılar hülul inancının şamanizm, buddizm, hinduizm, sabiilik, xristianlıq kimi dinlərdən qaynaqlandığını və müsəlmanlar arasına oradan sızdığını bildirirlər. Bəzi mənbələrdə hülul inancının ilk dəfə Abdullah ibn Səbə tərəfindən Allahın Əli ibn Talibdə (ə) həll olması formasında ortaya atıldığı iddia

edilir. Lakin Abdullah ibn Səbənin əslində uydurma və qondarma bir obraz olduğunu, məzhəb düşmənçiliyini əsaslandırmaq üçün yaradıldığını nəzərə aldıqda bu fikrin həqiqətdən uzaq olduğu aydın olur.

***Mənbələr:*** *Türkiye Diyanet Vakfi İslam Ansiklopedisi, XVIII, 340-344; S.C.Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.328-329; Lüğətnameyi-Dehxuda, VI, 9187.*

**HÜRUFİYYƏ** – hərf və rəqəmlər üzərində mürəkkəb simvolik alqoritmlər quran, onların mistik mahiyyətini təbliğ edən təlim. Hürufiyyə təriqət deyil, *batiniyyənin* bir qolu və fikir məktəbi kimi qəbul edilir. Banisi XIV əsrdə yaşamış Fəzlullah Nəimi hesab edilsə də, hürufiyyənin dərin nəzəri-ideoloji köklərinə keçmiş dinlərdə (yəhudilik və xristianlıq) rast gəlmək mümkündür. İslam dünyasında da o zamanadək bu istiqamətdə müəyyən fəaliyyətlər həyata keçirilmişdi (Həllac Mənsur, İbn Ərəbi və b.). Fəzlullah Nəimi (vəf. 1394) bu düşüncəyə yeni həyat verərək onu daha da zənginləşdirdi.

Ə.Gölpınarlı "Hürufilik mətnləri kataloqu" əsərində hürufiliyin əsaslarını qısa olaraq bu cür şərh edir: "Varlığın zühuru səslədir... Səsin kamalı kəlam, yəni sözdür; bu da ancaq insanlarda zühur edir. Söz hərflərdən ibarətdir; elə isə səsin və sözün əsli hərfdir. Həzrət Məhəmməd (s) 28 hərf vasitəsilə danışmışdır. Ərəb əlifbasında 28 hərf var və Quran bu hərflərdən meydana gəlib. Fars dilində 32 hərf var, Fəzlin (Nəiminin) "Cavidannamə"si bu 32 hərfdən ibarətdir".

Hürufilərin inanc sistemi 7, 8, 14, 28 və 32 ədədlərinin müxtəlif mövzularda tətbiqi üzərində qurulub. Məsələn, insanın üzündə anadangəlmə yeddi xətt olur: iki qaş, dörd kiprik və bir saç xətti. Bunlara "ana xətləri" deyilir. Bu xələrin özü və yeri üst-üstə 14 edir. Kişilərin sifətində yetkinlik çağında daha yeddi xətt yaranır: sağ və sol yanaqlarda iki saqqal, iki çənə və iki bığ xətti, bir də çənəaltı xətt. "Ata xətləri" adlanan bunların özü və yerinin cəmi də 14-dür. İnsanın üzü Allah kəlamının zühur yeridir, ana və ata xətlərinin cəmi olan 28 də Quran hərflərinin sayıdır. Saçı və çənəaltı xətti ikiyə ayırsaq, xətlərin özü və yeri 32-yə bərabər olur ki, bu da "Cavidannamə"-nin yazıldığı fars əlifbasındakı hərflərin sayıdır. Hürufilər hətta gündəlik ibadətlərin sayını da mürəkkəb hesablamalarla bu ədədlərə tabe edirdilər. Ümumiyyətlə, hürufi əqidəsində bütün varlıq aləmi müqəddəs ədədlərə tabedir.

Hürufilərə görə, dünyanın tarixi üç dövrə bölünür: nübüvvət (peyğəmbərlik), imamət və üluhiyyət. Nübüvvət dövrü həzrət Adəmlə (ə) başlamış, Məhəmməd Peyğəmbərlə (s) bitmişdir. İmamət dövrününn əvvəli *Həzrət Əli (ə)*, sonu on birinci imam *Həsən Əsgəri (ə)* ilə bağlıdır. Üluhiyyət mərhələsi Fəzlullahla başlamışdır. Bütün peyğəmbərlər Fəzlullahın müjdəçisi və şahidi olmuşlar. Hürufi inancına görə, insan Kainatın göz bəbəyi olduğu kimi, insanlar arasında



da biri vardır ki, bütün bəşəriyyətin göz bəbəyidir. *Kamil İnsan* odur, hamı ona tabedir. Hər zəmanənin öz Kamil İnsanı olmuşdur, üluhiyyət mərhələsinin Kamil İnsanı da Fəzlullahdır. Dünyanın sonuna yaxın zühuru gözlənilən yəhudilərin məsihi, xristianların İsası, müsəlmanların Mehdisi odur.

Fəzlullah Nəimi İsfahan, Xarəzm və Təbrizdə fəaliyyət göstərmiş, daha sonra Bakıya gələrək öz təlimlərini yaymağa başlamışdır. O, hürufiliyin ideya əsaslarını "Cavidannamə", "Məhəbbətnamə", "Ərşnamə" və digər əsərlərində şərh etmişdir. Nəimi Teymurləngin oğlu Miranşahın əmri ilə Naxçıvandakı Əlincə qalasında həbsə atılmış, 1394-cü ildə faciəli şəkildə öldürülmüşdür.

Fəzlullahdan sonra *xəlifələri* (canişinləri) hürufiliyi həm elmi əsaslarla, həm də ədəbiyyat yolu ilə yaymışlar. Onun 9 xəlifə təyin etdiyi, bunlardan da yalnız 4-ünün təriqət sirlərini dərindən bildiyi qeyd edilir. Nəiminin xəlifələri arasında Əliyyül-əla, Mövlana Məcdəddin, Seyid İshaq və Seyid İmadəddin *Nəsimi* xüsusi seçilmişlər. Hürufilik təriqətinin inkişafında Nəsiminin xüsusi xidmətləri olmuşdur. Hətta bəzi müəlliflərə görə, Nəsimi öz ustadı Nəiminin açıb deyə bilmədiklərini söyləmiş, özündən əvvəl heç kimin çata bilmədiyi məqama çatmışdır, Nəsimi olmasaydı, hürufilik məhv olub aradan gedərdi.

Həm ənənəvi İslam üləması tərəfindən qəbul edilmədiyinə, həm də siyasi görüşlərinə görə hürufilik təqib edilmişdir. Nəiminin edamından sonra onun müridləri hürufi əqidəsini İran, İraq, Suriya, Anadolu, Misir və Hindistanda yaymağa çalışmışlar. Təzyiqlər nəticəsində hürufilik digər sufi təriqətlərinin (xüsusilə *bektaşiliyin*) içində ərimişdir. Hürufiyyə təliminin *qızılbaşlığa* da müəyyən təsir göstərdiyi məlumdur.

***Mənbələr:*** *A.Gölpinarlı. Hürufilik metinleri kataloğu, s.18-25; M.Tərbiyət. Danişməndani-Azərbaycan, s.246; Abbas Əzzavi. Tarix əl-İraq beyn ihtilaleyn, III, 45 (əl-Hükumat ət-türkmaniyyə); K.E.Kürkçüoğlu. Nəsimi Divanından seçmələr, XXI; Natig Rahimov. Azerbaijan's Contribution to Islamic Culture. An Undicsovered Treasure ("Contributions of The Eurasian Nations to Islamic Culture"), pp.184-186.*



**XAL** – sufi şeirlərində çox rast gəlinən istilah. Onun mənası barədə fərqli izahlar verilmişdir. Bəzən xal vəhdət məqamına işarə kimi qəbul edilir. Kəsrətin (çoxluğun) əvvəli və axırı olan vəhdət nöqtəsi xala bənzədilir. Sufi kəsrət aləmindən üz çevirmək və vəhdət nöqtəsinə meyil etmək istəyir. Xalın qaralığı da vəhdətin dərkedilməzliyi və mübhəmliyi ilə bərabər tutulur.

Bəzən qara xal qeyb aləminə işarə kimi qəbul edilir. Bəzi ariflərin düşüncəsində xal günahlara işarədir.

Şair bəzən ilham və mükaşifələr nəticəsində şad olmuş könlünü məşuqun parlaq üzünə bənzədir, bəzən də aşiqin hicran dərdindən pərişan olan qəlbi məşuqun xalı kimi qaralıb zülmətə qərq olur.

***Mənbələr:*** *Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.336-337, 353:*

*Seyid Ziyaəddin Səccadi. İrfan və təsəvvüfün əsaslarına giriş, s.275; Əbdülbaqi Hiyləmən. İrfan və təsəvvüf terminləri və nüanslar, s.94; Rzaqulu Hidayət. Riyaz əl-arifin, s.39.*



**XANƏGAH** – sufilərin toplaşma və yaşayış yeri. Bəziləri bu sözün "süfrə, yemək olan yer", bəziləri isə "ev, xanə" mənası verdiyini yazmışlar. İlk dövrlərdə xanəgahların kasıb və miskin dərvişlərdən ötrü tikildiyi ehtimal edilir.

Bəzi sufi mənbələrində xanəgah Peyğəmbər (s) zamanında əhli-suffənin yaşadığı suffənin prototipi hesab edilir. Sufi ədəbiyyatında xanəgahın sinonimi olaraq *təkkə*, ribat, zaviyə, sovmiə məfhumları da işlənir.

XI-XII əsrlərdən etibarən İslam dünyasında xanəgahların sayı sürətlə çoxalmağa başlamışdı. Böyük sufi Əbu Səid Əbul-xeyrin (967-1049) nəslindən Məhəmməd ibn Münəvvər tərəfindən qələmə alınmış "Əsrar ət-tövhid fi məqamat Şeyx Əbi Səid Əbi-l-xeyr" risaləsində qeyd edilir ki, XII əsrdə təkcə Şirvanda Əbu Səid Əbül-xeyrin ardıcıllarına məxsus 400-dən artıq xanəgah vardı və dərvişlər orada rahatlıq içində təriqət həyatını yaşayırdılar.

Xanəgahlar adətən hökmdarlar, vəzirlər, sərvətli şəxslər tərəfindən tikilir və maliyyələşdirilirdi. Məsələn, Elxani hökmdarlarının vəziri olmuş, həm də görkəmli tarixçi, filosof, şeir və sənət hamisi kimi tanınmış Rəşidəddin Fəzlullah (1247-1318) bir neçə xanəgahın, o cümlədən Şeyx Səfiəddin Ərdəbili xanəgahının bütün xərclərini ödəyirdi.

Xanəgahlar gah yerləşdiyi məntəqənin, gah da məxsus olduğu təriqət şeyxinin adı ilə adlandırılırdı. Xanəgahlarda həm daimi sakinlər yaşayır, həm də müsafirlər müvəqqəti qalırdılar. Müsafirlər adətən günortaya kimi qəbul edilirdilər. Onlar xanəgaha daxil olandan sonra iki rükət namaz qılır, yemək zamanı bütün azuqələrini süfrəyə qoyub xanəgah sakinləri ilə bölüşürdülər.

Xanəgahda *mürşid* və *qütb* (təriqət şeyxi) üçün ayrıca otaq, ibadət yeri olardı. Xanəgah əhlinin toplaşması və *mürşidin* moizəsinə qulaq asması üçün nəzərdə tutulan zala isə "camaatxana" deyilirdi. *Xəlvət* ayininə riayət olunan təriqətlərin xanəgahlarında *xəlvətxana* üçün də otaqlar ayrılırdı.

Xanəgahın başçısı şeyx idi, əsas qərarlar onun tərəfindən verilirdi. Xanəgahın idari və təsərrüfat işlərini şeyxin seçdiyi pişrov və ya müqəddəm aparırdı. Xanəgaha məxsus adətlər və qaydalar mövcud idi ki, onlara ciddi əməl olunurdu. Xanəgaha daxil olan müsafir orada olanlara ədəblə salam verməli, ayaqqabısını çıxarandan sonra ayaqlarını yumalı, iki rükət təhiyyə namazı qılmalı idi. Xanəgahda üç gündən artıq qalan müsafir də təsərrüfat işlərinə qatılırdı. Burada sufilər növbə ilə işləyir, hər işi ədalət əsasında icra edirdilər. Yemək bişirmək, süfrə salmaq, qabları yumaq, xanəgahı süpürmək, xalça-palazı çırpmaq, xanəgah əhlinin paltarlarını yumaq, namaz üçün azan vermək, qapıda ayaqqabıları cütləmək və s. işlər fəxr sayılırdı.

Səfəvilər dövlətində ən böyük xanəgah



Ərdəbil şəhərində yerləşən Şeyx Səfiəddin Ərdəbili ocağı idi. Şahlar tərəfindən verilmiş *vəqf* torpaqları, ticarət obyektləri, daşınmaz əmlakı ilə birlikdə bu xanəgah zənginlik baxımından yalnız İmam Rza (ə) hərəmindən geri qalırdı. Hər gün Şeyx Səfi xanəgahında fəqir insanlar üçün yemək ehsanı verilərdi. Elxanilər dövründən qalmış, Səfəvilər zamanında da davam etmiş ənənəyə görə, xanəgahın qapısında təbil vurulub şeypur çalınardı, səsi eşidən fəqirlər bura axışıb süfrə arxasında oturardılar.

*bax:* **ŞEYX SƏFİ KOMPLEKSİ.**

***Mənbələr:*** *Qısa İslam Ensiklopediyası (N.Rəhimovun ümumi redaktəsi ilə, 2 cilddə), I, 89-90; S.C.Səccadi. İrfan və təsəvvüfün əsaslarına giriş, s.256-259; S.C.Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.338-340; Türkiye Diyanet Vakfı İslam Ansiklopedisi, XVI, 42-46; Məhəmməd ibn Münəvvər. Əsrar ət-tövhid fi məqamat Şeyx Əbi Səid Əbil-xeyr, I, 135; Şeyx Səfi təzkirəsi (“Səfvətüs-səfa”nın XVI əsr türk tərcüməsi), s.593.*

**XƏLİFƏ** – lüğəti mənası ardınca gələn, yerini tutan, canişin deməkdir. Hər hansı mühüm vəzifə sahibinin öz yerinə təyin etdiyi şəxsə xəlifə deyirlər. Dini terminologiyada xəlifə – Mühəmməd Peyğəmbərdən (s) sonra müsəlmanlara başçılıq edən, yəni onun yerini tutan, canişinlik edən şəxsdir. Xəlifəlik hüququna, eləcə də xəlifənin hökmü altında olan yerlərə xilafət deyilir.

Xəlifə məfhumu təsəvvüfdə də mühüm yer tutur. Sufi təriqətlərinin başçıları, bir qayda olaraq, ən layiqli şagirdləri arasından özlərinə xəlifə seçirdilər. Xəlifələr şeyxin tapşırığı ilə ətraf bölgələrə yayılır və təriqəti təbliğ edirdilər. Onlar təriqət şeyxinin silsilə zənciri vasitəsilə Peyğəmbərdən (s) aldığı mənəvi hakimiyyət hüququnun təmsilçisi sayılırdılar. Xəlifələrdən biri şeyx tərəfindən canişin olaraq tanıdılırdı və onun vəfatından sonra həmin xəlifə şeyxin yerini tuturdu. Şeyx Səfiəddin Ərdəbilinin *mürşidi* Şeyx Zahid Gilaninin ətrafa səpələnmiş 400 müridi vardı.

Səfəviyyə təriqətinin banisi Şeyx Səfiəddin Ərdəbilinin öyüdlərindən ibarət olan və qızılbaşlığın mühüm təlim kitabı sayılan *“Qara məcmuə”də* deyilir: “Rəsulun qaimməqamı və həm vəsisi Həzrət Əli ibn Əbu Talibdir. Və on bir övladı həmcinin xəlifədir, onların nəsli də xəlifədirlər. Hər kimi nəsb edib yerlərinə göndərsələr, o da xəlifədir”. Şeyx Səfi “xəlifə” sözünün “Allah” və “Mühəmməd” adları kimi 5 hərfdən (ərəb əlifbası ilə) ibarət olduğuna diqqət çəkir və onu *Ali-əbanın* 5 üzvünə bənzədir. Daha sonra deyir: “Bir mənaya görə də xəlifə oğula deyilir. Xəlifə salehdən ibarətdir. Öylə olsa, “xa” xəlifədir, yəni oğuldur, “lam” lütf və kərəmdir, “ye” yer kimi sakit olmağa işarədir, “fa” fariq əl-bal (dünyaya əlaqəsiz) olmaqdır, “he” ismi-“hu”dur, gülbangi-övliyadır, xəlifələrə məxsusdur”.

Şeyx Səfi əsl xəlifənin 7 üzə və 12 şərtə sahib olmasını lazım bilir: “Xəlifə məqamında olan kişi gərəkdir ki, bu şərtləri və on iki xasiyyəti bilə. Ol zaman ona xəlifə demək layiq olar. Əgər bu

yeddi üzü və on iki xasiyyəti bilməsə, ona xəlifə demək böhtandır". "Qara məcmuə"nin növbəti səhifələrində 7 üz (vəhdət, xidmət, iradət, imamət, səlamət, məlamət və dövlət) və 12 şərt (səxavət, səadət, qeyrət, ibrət, hörmət, söhbət, mürüvvət, şəfqət, iqrar, isar, təvəlla və təbərra) izah edilir.

Səfəvi qızılbaş tarixində xəlifələrin mühüm rolu olmuşdur. Səfəvilər hakimiyyətə keçməzdən əvvəl məhz təriqət şeyxlərinin göndərdikləri xəlifələr yerlərdə təbliğ və irşadla məşğul olur, xalq kütlələrini təriqət şeyxinə tərəf yönəldir, camaatdan nəzirləri toplayıb Ərdəbil *təkkəsinə* göndərirdilər. Xəlifələr öz tayfaları arasında üstün mövqe sahibi idilər və tayfanın dini-siyasi, hərbi-təşkilati həyatına rəhbərlik edirdilər. Məsələn, Şərqi Anadoludakı Səfəvi tərəfdarı olan *Varsaq* eli 5 min ailədən ibarət idi və bu oymağa "xəlifə" tituluna malik üç qardaş (Yusif xəlifə, Qasım xəlifə və Həsən xəlifə) başçılıq edirdi.

I Şah İsmayılın hakimiyyətə gəlməsində xəlifələr aparıcı rol oynamışlar. Anadoluda məskunlaşmış qızılbaş tayfaları məhz xəlifələr tərəfindən səfərbər edilərək Səfəvi torpaqlarına köçdü və Səfəvi dövlətinin əsas hərbi gücünü təşkil etdi. Qarabağ, Muğan və digər bölgələrə göndərilmiş xəlifələr də buradakı əhalini I Şah İsmayıln bayrağı altında birləşdirdilər. Bu səfərbərlik prosesi I Şah İsmayılın hakimiyyətə gəlməsindən sonra da davam etmişdir. Onun Anadoluya göndərdiyi Həsən xəlifə Təkəlü və oğlu *Şahqulu xəlifə* öz ətraflarına böyük xalq kütlələri toplamağa nail olmuşdular. Şahqulu xəlifənin qaldırdığı qiyam (1511-ci il) on minlərlə insanı əhatə edirdi, Osmanlı dövləti bu qiyamı çox çətinliklə sakitləşdirə bilmiş, faktiki olaraq yalnız qiyamçılar Osmanlı torpaqlarını tərk etdikdən sonra dövlət özünü təhlükəsizlikdə hiss etmişdi. Bundan sonra şah tərəfindən Anadoluya göndərilmiş *Nurəli xəlifə* də minlərlə qızılbaşı ayağa qaldırmağı bacarmışdı. I Şah İsmayılın Anadolu diyarına göndərdiyi Mustafa xəlifə və oğlu Vəli xəlifə də eyni istiqamətdə fəaliyyət göstərirdilər.

Səfəvilər dövrünün bir çox mühüm dövlət adamı "xəlifə" titulunu daşıyırdı. Məsələn, Qarabağ bəylərbəyi *Yusif xəlifə Ziyadoğlu-Qacar* (v.1570), Şirvan bəylərbəyi *Ənsar xəlifə Qaradağlu* (vəf. 1583), baş vəzir *Xəlifə sultan Sultan əl-üləma* (vəf. 1654), *möhürdar*, *eşikağasıbaşı* və Qum hakimi olmuş *Şahqulu xəlifə Zülqədər* (vəf. 1558), möhürdar Məhəmmədqulu Xəlifə Qoruğlu Zülqədər və b. I Şah Təhmasibin zamanında *Şamlu* tayfasından 5 əmir təbil sahibi idi (yəni sarayının qarşısında və ordu ilə hərəkəti zamanı təbil vurdurmaq hüququna malik idi), bunların bir neçəsinin adında "xəlifə" ləqəbini görürük: Məşhəd hakimi Vəli xəlifə Avcı, Həmədan hakimi Polad xəlifə, Astarabad hakimi Süleyman xəlifə.

Xəlifələr Səfəvi təriqətinə xüsusilə bağlı olan şəxslərdən ibarət idi. Onlar dövlət qulluğundan əlavə həm də təriqət xidmətində idilər. Səfəvilər dövründə xəlifə fəxri adı ilə çağırılanların hamısı-



nın türk qızılbaş tayfalarından olduğu yazılır. Milli və əqidəvi sahələrdə eyniyyət amili onların şahlar tərəfindən xüsusi etimadla qarşılanmalarına səbəb olurdu. Xəlifələr dövlət idarəçiliyində fəaliyyət göstərdikləri quruma tabe olsalar da, onların mənəvi lideri şahın sağ əli olan *xəlifət əl-xüləfa* idi.

Mənbələrdə xəlifələrlə yanaşı seçilmiş təriqət üzvü olan *"pirə"* ləqəbinə də rast gəlirik.

*bax:* **PİRƏ.**

***Mənbələr:*** *Zülfiye Veliyeva. Safevi Devlet Teskilatı (Tezkiretü'l-Mülük'e Göre), doktora tezi, s.414-419; O.Əfəndiyev. Azərbaycan Səfəvilər dövləti, s.257-258; Namiq Musalı. I Şah İsmayılın hakimiyyəti ("Tarix-i aləmara-yi Şah İsmayıl" əsəri əsasında), s.239-241, 321-322, 345; Faruk Sümer. Safevi Devletinin Kuruluşu ve Gelişmesinde Anadolu Türklerinin Rolü, s.130; Qara məcmuə, s.33-34.*



**XƏLVƏT** – yalnız qalmaq, xarici aləmdən tənhalığa çəkilmək. Təsəvvüfdə "xəlvət" məfhumu mühüm yerə malikdir. Şeyxin öz *müridini* müəyyən müddətə xarici dünyadan təcrid olunmuş uzaq və ya qapalı bir məkana zikr və ibadət (meditasiya) üçün göndərməsinə xəlvət deyilir. Düşüncəni Allahdan savayı hər şeydən təmizləmək xəlvətin əsasıdır. Əgər insanın qəlbi və beyni Allahdan başqası ilə məşğul olsa, 40 il də bu vəziyyətdə qalsa, xəlvət sayılmaz. Həzrət Mühəmmədin (s) peyğəmbərlikdən qabaq Hira mağarasında tənhalığa çəkilməsi, Həzrət Musanın (ə) 40 gün Tur dağında qalması sufilər tərəfindən xəlvət kimi dəyərləndirilir.

Nəsirəddin Tusi "Övsaf əl-əşraf" kitabında xəlvət barədə yazırdı: "Xəlvət sahibi elə bir yer seçməlidir ki, zahiri və batini hisslər onu özünə məşğul edə bilməsin. O, nəfsindəki heyvani qüvvələri də tərbiyə etməlidir ki, onu həmin qüvvələrə xoş gələn şeylərin cəzbinə və xoş gəlməyən şeylərin dəfinə təhrik etməsin. Məcazi fikirlərdən tamamilə üz döndərməlidir, çünki bu cür fikirlərin hamısı fani dünyanın məsləhətinə görə olur, amma axirət məsləhəti bilinən işlərin sonu insan ruhunda əbədi qalacaq ləzzətlərin əldə edilməsidir. Salik zahiri və batini maneələri, insanı Allahdan qeyri işlərə məşğul edən amilləri aradan qaldırdıqdan sonra bütün bacarığını, iradəsini işə salıb qeybi töfhələri və həqiqi zehniyyəti, yəni təfəkkürü qazanmağa çalışmalıdır".

Sufilikdə (xüsusilə nəqşbəndiyyə təriqətində) "xəlvət dər əncümən" adlı bir anlayış da geniş yayılıb. Xəlvət təsəvvüfdə mühümdür, lakin tərkidünyalıq da İslamda bəyənilmir. Ona görə sufilər bu iki məsələni birləşdirməyə çalışaraq deyirdilər ki, əsl arif gərək xalq arasında da özünü xəlvətdəki kimi hiss etsin. Onun cismi (bədəni) insanlarla, ruhu isə Allahla olsun.

Təsəvvüf tarixinin ilk mərhələlərində sufilər insan ayağı dəyməyən mağaralarda xəlvətə çəkilərdilər. Sonralar sufi xanəgahlarında *xəlvətxana* adlı ayrıca otaqlar yaranmağa başladı. Səfəviyyə təriqətində də xəlvət ayini mövcud idi

və Səfəvi xanəgahlarında xəlvətxanalar vardı. Mahiyyət baxımından xəlvət və *çilə (çillə)* ayinləri eynidir.
*bax:* **XƏLVƏTXANA.**

***Mənbələr:*** *Nəsirəddin Tusi. Ovsaf əl-əşraf (tərcümə: Füzuli Şəfiyev), s.52-53; Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.359-367; Seyid Ziyaəddin Səccadi. İrfan və təsəvvüfün əsaslarına giriş, s.259-261; Türkiye Diyanet Vakfi İslam Ansiklopedisi, XV, 386-388; Risaleyi-Qüşeyriyyə (farsca tərcümə: Bədiüzzaman Firuzənfər), s.153-159.*



**XƏLVƏTXANA** – sufi *təkkələrində* dərvişlərin *xəlvət* ayinini yerinə yetirmələri üçün xüsusi məkan. İlk dövrlərdə sufilər mağaraya, susuz quyuya çəkilərək, oranı özlərinə xəlvətxana edirdilər. *Şeyx Səfiəddin Ərdəbilinin* mürşidi *Şeyx Zahid Gilani* dəniz kənarında xəlvət ayinini icra edərdi. *"Şeyx Səfi təzkirəsi"ndə* deyilir ki, Şeyx Səfi gəncliyində Şeyx Zahidə qoşulmaq üçün onu axtaranda yerini bu şəkildə nişan vermişdilər: "...Xəlvəti dənizün qırağunda vaqe olubdur. Qaçan kim dəniz mövc urar, dənizin suyı xəlvətinün eşiginədək gəlür və xəlvətinün qapusı məşriq sarusındadur, eylə kim, çün Günəş məşriqdən tülu eylər, Günəşün şövqi xəlvətinün içinə düşər".
Sonralar *təkkə* və *xanəgahlarda* xəlvətxanalar quruldu. Bu otaqlar xəlvət ayininin şərtlərinə əsasən tərtib olunurdu. Sufilər öz nəfslərini tərbiyə etmək, *seyrü-süluk* yolunda irəliləyib mənəvi təkamülə nail olmaq üçün günlərlə xəlvətxanaya çəkilir, burada təklikdə təfəkkürə dalır, şeyxin buyurduğu təlimat əsasında zikr edir, ibadətlə məşğul olurdular. Xəlvətxanalar adətən qaranlıq və kiçik hücrələrdən ibarət olurdu. Dərviş burada onun fikrini dünyaya bağlayan, diqqətini Allahdan yayındıran heç nə və heç bir nişanə ilə üzləşməməli idi. Xəlvətxanada xəlvətə çəkilən şəxs yalnız dəstəmazını təzələmək və bəzən də camaat namazlarına qatılmaq üçün buranı tərk edirdi. Sufi bütün xəlvət müddəti boyunca oruc tutmalı, həmişə dəstəmazlı olmalı, az yeməli və az yatmalı idi. Hər həftə, yaxud hər on gündən bir şeyx xəlvətxanaya gəlir, müridə mənəvi yardım edir, çətinliklər zamanı yol göstərirdi.
Klassik dini anlamda bunu etikaf adlandırmaq olar. Xəlvətxanalara "çiləxana", "xəlvətgah" da deyilirdi.
"Şeyx Səfi təzkirəsi"ndə təsvir edilən hadisələrin böyük bir qismi xəlvətxanada baş verir, bu da Şeyx Səfiəddinin xəlvət ayininə nə qədər böyük əhəmiyyət verdiyini və vaxtının müəyyən hissəsini xəlvətxanada keçirdiyini göstərir. Şeyx Səfiəddinin hələ Şeyx Zahid Gilaninin müridi olduğu zamanlarda özünün xəlvətxanası vardı. "Tarixi-aləmarayi-Abbasi"də yazılıb ki, Şeyx Zahidə niyə öz yerinə oğlunu deyil, Şeyx Səfini *xəlifə* qoyması barədə irad ediləndə soruşmuşdu: "Oğlumun xəlvətxanası haradadır?" Dedilər: "Xanəgahın yanında". Soruşdu: "Bəs Səfinin xəlvətxanası haradadır?" Dedilər: "Buradan yarım fərsəx məsafədə". Dedi: "İkisini də çağıraca-



ğam ki, hər birinin rütbə və dərəcəsi sizə məlum olsun". O, üç dəfə oğlunu çağırsa da, oğlu cavab vermədi. Səfini səsləyəndə cavab gəldi: "Gəldim, yetişdim, ya şeyxim və mürşidim!" Ardınca Səfiəddin dərhal otağa qədəm qoydu. Şeyx Zahid soruşdu: "Səfi, harada idin?" Dedi: "Öz xəlvətxanamda idim ki, şövq artıran səsinizi eşidib yanınıza gəldim". Şeyx Zahid ətrafındakılara dedi: "Allah mənim nəzərimdə tutduğumu (canişinliyi) oğlum Cəmaləddinə deyil, Səfiyə vermişdir. Mən də Allahın əmanətinə xəyanət etmədim, onu sahibinə çatdırdım".

Səfəvilər zamanında sarayda da xəlvətxana mövcud idi. Şahlar səfəviyyə təriqətinin *mürşidi* (rəhbəri) sayıldıqları üçün vaxtaşırı xəlvətxanaya çəkilir və təriqət adabı üzrə ayinləri icra edirdilər. Hətta bəzi mənbələrdə sarayı "dövlətxana" və "xəlvətxana" adlı iki hissəyə ayırırlar ki, birinci hissəyə dünyəvi hökumət işlərinə aid otaqlar, ikincisinə isə mənəvi məkanlar aiddir.

***Mənbələr:*** *Türkiye Diyanet Vakfı İslam Ansiklopedisi, XV, 388; Rəuf Musəvi. Ərdəbil Səfəvilər dövründə, s.91; Tarix-i aləmara-yi Abbasi (tərcümə və şərhlər: O.Əfəndiyev, N.Musalı), s.52; İbn Bəzzaz Ərdəbili. Səfvət əs-səfa, s.173; Aləmarayi-Səfəvi, s.15-16; Şeyx Səfi təzkirəsi ("Səfvətüs-səfa"nın XVI əsr türk tərcüməsi), s.70.*

**XƏLVƏTİYYƏ** – məşhur sufi təriqətlərindən biri, müsəlman Şərqinin, o cümlədən Azərbaycanın tarixi mənəvi irsinin mühüm tərkib hissəsi. Xəlvətiyyə təriqətində, adından da göründüyü kimi, xəlvət ayini əsas sayılır. *Seyrü-süluk* yolu 7 əsas *zikri* söyləməklə keçilir (La ilahə illəllah, Allah, Hu, Haqq, Həyy, Qəyyum, Qəhhar). Bunlar nəfsin 7 mərtəbəsinə uyğundur. Bəzi xəlvətiyyə şeyxləri bu 7 zikrin sayını 12-yə çatdırmışlar.

Təriqətin banisi və ilk şeyxi XIV əsrdə yaşamış Əbu Abdullah Siracəddin Ömər Xəlvətidir. Onun əmisi şirvanlı Şeyx Kəriməddin Əxi Məhəmməd, *səfəviyyə* təriqətinin banisi Şeyx Səfiəddin Ərdəbili kimi, Şeyx Zahid Gilaninin müridi olmuşdur. Xəlvətiyyə və səfəviyyə təriqətlərinin silsiləsi Şeyx Zahid Gilanidə qovuşur.

Ömər Xəlvəti Şamaxının Avaxıl kəndində doğulmuş, təsəvvüf elmini əmisindən mənimsəmiş, Şirvanda, daha sonra Xoy şəhərində, Misirdə yaşamış, Cəlayiri hökmdarı Sultan Üveysin əmri ilə Təbrizdə məskunlaşıb burada da vəfat etmişdir. Məzarının Təbrizdə, yaxud Avaxıl kəndində onun adını daşıyan qəbiristanlıqda olduğu ehtimal edilir.

Ömər Xəlvətidən sonra təriqətə onun şirvanlı müridləri başçılıq etmişlər. Təriqətin ikinci parlaq siması da Azərbaycanın yetirməsi olan Seyid Yəhya Şirvani Bakuvidir. Onu xəlvətiyyə təriqətində "piri-sani", yəni "ikinci pir (şeyx)" adlandırırlar. Hətta təriqətin təşəkkülündə müstəsna rolunu nəzərə alaraq onu xəlvətiyyənin əsl banisi sayanlar da var. Xəlvətiyyənin məhəlli təriqət şəklindən çıxaraq Şirvanın hüdudlarını aşmaqla ətraf bölgələrə yayılması onun və mürid-

lərinin sayəsində mümkün olmuşdur.
Seyid Yəhya Şirvani Bakuvi əvvəlcə Şamaxıda yaşamış, daha sonra Şirvanşah I Xəlilullahın dəvəti ilə Bakıya köçmüşdür. Şirvanşah onun üçün Bakıda *xanəgah* tikdirmişdi, Seyid Yəhya burada müridlərin təlim-tərbiyəsi ilə məşğul olurdu. O, təqribən 40 il Bakıda yaşayıb-yaratmış, bəzi məlumatlara görə, 20 min mürid yetişdirmiş, müxtəlif mövzularda ərəb, türk və fars dillərində 23 kitab yazmışdır. Ən məşhur əsəri "Şifa əl-əsrar" türk dilindədir. O həm də incə zövqlü, zərif təbli şair idi. Seyid Yəhya 1466-cı ildə Bakıda vəfat etmişdir, türbəsi Şirvanşahlar sarayındadır.
Xəlvətiyyə ən geniş yayılmış təsəvvüf təriqətlərindən biri olmuş, onlarla qola və şöbəyə bölünmüşdür. Onun rövşəniyyə və gülşəniyyə adlı iki mühüm qolu Dədə Ömər Rövşəni və İbrahim Gülşəni adlı arif-şairlər tərəfindən yaradılmışdır. Dədə Ömər Rövşəni (1407-1487) Azərbaycanda təriqəti yaymaqla məşğul idi. Rövşəninin müridi olan Şeyx İbrahim Gülşəni (vəf. 1534) Təbrizdə Ağqoyunlu sarayında mühüm dövlət tapşırıqlarını yerinə yetirirdi. Təbriz şəhəri I Şah İsmayıl tərəfindən fəth edildikdən sonra İbrahim Gülşəni Diyarbəkrə köçmüş, daha sonra Misirə səfər edib orada ömrünü başa vurmuşdur. Onun 75 min beytlik nəhəng ədəbi irsə malik olduğu deyilir.
*bax:* **XƏLVƏT.**

***Mənbələr:*** *Natig Rahimov. Azerbaijan's Contribution to Islamic Culture. An Undicsovered Treasure ("Contributions of The Eurasian Nations to Islamic Culture"), pp.183-184; Türkiye Diyanet Vakfı İslam Ansiklopedisi, XV, 393-395; Mehmet Rıhtım. Halvetiligin Pir-i Sanisi Seyid Yahya Eş-Şirvani El-Bakúvi, Uluslarası Seyid Yahya Şirvani ve Halvetilik Sempozyumu (Eskişehir, 21-23 Kasım, 2013 – Bakü, 25-27 Kasım, 2013), s.193-209.*



**XƏRABAT** – bu sözün izahı barədə deyirlər ki, şərab içmək günah olduğu üçün şərab məclisləri gözdən uzaq xarabalıqlarda qurulurdu. *Məlamət* əhli olan ariflər də sərxoşlara xas olan sözləri simvolik mənada işlədirdilər. İrfani terminologiyada *mey*, *meyxanə*, *saqi* kimi məfhumlarla yanaşı xərabat termini də rəmzi məna daşıyır. Xərabat həm feili, həm sifati, həm də zati mənada vəhdət məqamıdır. Yəni *seyrü-süluk* yolunda arif elə bir yerə çatır ki, onun üçün hər şeyin feil və sifətləri Allahın feil və sifətlərində məhv və fani olur. Nə özünə, nə də başqalarına heç bir sifət aid etmir. O, özündən keçib və özünü yoxluğa atıb. Xərabat əhli olan *salik* "öz"ünü kənara qoyub, çünki "öz"ünü qəbul etmək özünə feil və sifət aid etməkdir, bu isə mütləq vəhdət mərtəbəsinə ziddir. Xərabat əhli kamil insandır, ixtiyarsız olaraq ondan ilahi mərifət süzülür. Ona görə irfani şeirlərdə xərabat əhli ilə yoldaş olmaq, özünü onlara yetirmək istəyi hiss edilir.
İrfan ədəbiyyatında xərabat həm də meyxanə məfhumuna bərabər tutulur və haqq yolçularının toplandığı mərifət məclislərinə deyilir.
*bax:* **MEYXANƏ.**



*Mənbələr: Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.342-344; Seyid Ziyaəddin Səccadi. İrfan və təsəvvüfün əsaslarına giriş, s.275.*

**XƏTT** – sufi şeirlərində tez-tez rast gəlinən istilah. İrfan ədəbiyyatında çox zaman xal ilə yanaşı qeyd edilir. Qeyb və şəhadət aləmlərinə, bəzən ruhlar aləminə (aləmi-kibriyayi), ruhların cisimlərə bağlılığına işarə kimi qəbul olunur. Bəzi sufilərin düşüncəsində xətt həqiqətlərin zühur yeridir.

Sufi ədəbiyyatında məşuqun parlaq üzü ilə nazik və dəqiq xətti vəhdət və kəsrətə işarə kimi də götürülür. Allah-Taalanı vəhdət məqamında görmək istəyən *salik* buna nail ola bilmir, çünki ağıl bunu dərk etməkdən acizdir, Allah da Özünü ad və sifətlər çərçivəsində (kəsrət içində) insanlara tanıdır. Aşiq məşuqun üzünə və xəttinə diqqətlə baxsa, vəhdətlə kəsrəti bir bütövün yarımları kimi görər, anlayar ki, vəhdət sanki gündüz, kəsrət sanki gecədir.

Yarın üzündəki xəttin başlanğıcı vəhdət nöqtəsi olan xaldır, ona görə də çox zaman xal və xətt birlikdə qeyd edilir.

*Mənbələr: Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.336-337, 353: Seyid Ziyaəddin Səccadi. İrfan və təsəvvüfün əsaslarına giriş, s.275; Əbdülbaqi Hiyləmən. İrfan və təsəvvüf terminləri və nüanslar, s.98; Rzaqulu Hidayət. Riyaz əl-arifin, s.39.*

**XİRQƏ** – sufilərin geyindiyi, xırda parça tikələrindən və zolaqlarından tikilən, astarı adətən qoyun dərisindən, bəzən də xəzdən olan geyimdir. Haqq yolçusunun ləyaqəti yoxlanılıb təsdiq ediləndən sonra təriqət *mürşidi* və *piri* (buna "piri-xirqə" deyilir) tərəfindən ona xirqə bağışlanır. Sufi ədəbiyyatında oxşar mənaları ifadə edən "mürəqqe", "peşmin" (yun), "dəlq" və s. kəlmələr də işlənir.

Təsəvvüf ədəbiyyatında da xirqə sufinin əsas atributlarından biri kimi təqdim edilir:

Dil mürşidinə xəyali-zülfün
Həm xirqəvü həməsadır, ey dust.
*(Ş.İ.Xətai)*

Sufilər xirqə geyindirmək ənənəsinin Mühəmməd Peyğəmbər (s) dövründən qaldığını iddia edirlər. Bəzi məlumatlara görə, Peyğəmbər (s) bir neçə köynəyin parçalarından qara rəngli geyim hazırlamış və Ümmi-Xalid adlı qadına geyindirmiş, bununla da xirqə geyindirmək dəbinin əsasını qoymuşdu.

Sufi mənbələrində üç cür xirqədən söhbət açılır: iradət xirqəsi, təbərrük xirqəsi və vəlayət xirqəsi.

İradət xirqəsini müəyyən səviyyəyə çatmış *müridin* əyninə *mürşid* geyindirir. Mürid təsəvvüf yolunda əldə etdiyi nailiyyətlərə uyğun olaraq iradət xirqəsini özü qazanır.

Təbərrük xirqəsini mürid öz mürşidindən xahiş edir. Yəni şeyxə qarşı duyduğu məhəbbət üzündən, ondan bir xatirə və yadigar olaraq xirqəsini istəyir. Əgər mürid bu cür hədiyyəyə layiqdirsə, mürşid təbərrük xirqəsini ona bağışlayır.

Vəlayət xirqəsini isə mürşid özündən sonra canişin kimi görmək istədiyi və müridlər arasında ən üstün bildiyi şəxsə rəhbərlik rəmzi kimi verir.

İlk dövrlərdə sufilər yalnız ağ rəngdə xirqə geyinirdilər. Sonralar başqa rəngli (xüsusilə mavi və göy) xirqə geyinməyə başladılar. Bəzən dərvişləri kirli geyimdə təsvir edirlər; bu, yanlış təsəvvürdür. Əsl sufi hər nə geyinir-geyinsin, mütləq təmizliyi və səliqəni gözləməlidir.

Təsəvvüf aləmində həm xirqə geyinənin, həm də xirqə geyindirənin bəzi xüsusiyyətlərə sahib olması şərt sayılır. Məşhur sufi Nəcməddin Kübra bu barədə yazır: "Hər kim bu yolu getmək fikrinə düşsə və xirqə geyinmək istəsə, gərək *şəriət*, *təriqət* və *həqiqət* elmlərini yaxşı bilən, şəriət əsaslarına alim, təriqət dəblərinə arif və həqiqət sirlərinə vaqif olan pirin əli ilə xirqə geyinsin. Mürid isə xirqəni geyinərkən dərk etməlidir ki, onu qoruyacaq, təriqətin məşəqqət və çətinliklərinə, həqiqət əhlinin mücahidələrinə dözəcək və xirqə daşımaq şərəfinin öhdəsindən gələ biləcək".

Xirqə sufinin *vəcd* və şövq halında vəziyyətini göstərən əlamətlərdən sayılır. *Səma* və *zikr* zamanı vəcdin ən yüksək mərtəbəsinə çatan sufilər xirqələrini əyinlərindən çıxarıb atmış, bəzən də şövqdən xirqənin yaxasını cırmışlar. Bu hallar sufi məclislərinin kulminasiya nöqtəsi sayılır.

Sufilik aləmində xirqə təriqətin qədimliyini və mötəbərliyini göstərən simvol sayılır. Məsələn, məşhur sufi Məruf Kərxinin öz xirqəsini *İmam Rzadan (ə)*, Bayezid Bistaminin isə *İmam Sadiqdən (ə)* aldığını söyləyirlər.

Səfəvi mənbələrində *Şeyx Səfiəddin Ərdəbilinin* öz mürşidi *Şeyx Zahid Gilaniyə* varislik etməsi və onun canişini olması da ondan xirqə alması şəklində təqdim edilir. Səfəvi təriqətinin tarixi barədə ən mühüm mənbələrdən sayılan *"Səfvət əs-səfa"* kitabında deyilir: "Şeyx Səfiəddinin tövbə, xirqə və tərbiyəsi mühəqqiqlərin sultanı, aləmlərdəki *qütblərin* mürşidi, Haqqın, millətin və dinin tacı Şeyx İbrahim Zahid Gilanidən idi".

***Mənbələr:*** *Seyid Ziyaəddin Səccadi. İrfan və təsəvvüfün əsaslarına giriş, s.251-256; Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.345-350; İbn Bəzzaz Ərdəbili. Səfvət əs-səfa, s.180; İbn Əsir. Üsüd əl-ğabə, V, 579; Qısa İslam Ensiklopediyası (N.Rəhimovun ümumi redaktəsi ilə, 2 cilddə), I, 94-95.*



**XORASAN ƏRƏNLƏRİ** – *bax:* **RUM ABDALLARI.**



**XOVF** – təsəvvüf aləmində 10 *haldan* biri, əksər təsnifatlarda *rəca* ilə yanaşı *məhəbbətdən* sonra, *şövqdən* əvvəl yerləşdirilir. Zünnun Misri deyib: "Mühibb (Allahı sevən şəxs, sufi) məhəbbət camından içən kimi Allahın xovfu onun qəlbini dağlayar". Xovf bəndənin Allahdan qorxu halıdır. Ariflərin biri deyib ki, xovf Allahın qırmancıdır, onunla Öz dərgahından qaçmış şəxsi cəzalandırar. Əsl arif yalnız Allahdan qorxar, Allahdan savayı heç kim onu qorxuda bilməz.



Təsəvvüf nəzəriyyəsinə görə, xovf qeyb aləminə imandan doğur və iki cür olur. Birinci xovf bütün möminlərə xasdır və iki səbəbdən qaynaqlanır: vəd olunanı (yəni hər kəsə əməllərinə görə əvəz veriləcəyini) təsdiq etməkdən və öz günahlarını nəzərə almaqdan. İkinci xovf isə Allahın aşiqlərinin sifətidir. Onlar Allahın camal sifətlərinə (rəhmət, lütf və s.) ümidli, Allahın calal sifətlərindən (qəhr, cəza və s.) isə xovflu olarlar.

Təsəvvüf ədəbiyyatında adətən xovf *rəca* (Allahın mərhəmət və əfvinə ümid bəsləmək) ilə yanaşı qeyd edilir. Xovf və rəca ilk baxışda bir-birinə zidd görünsə də, əslində sufinin qəlbində onların hər ikisi harmonik vəziyyətdə yer tutmalıdır. Sufilər demişlər ki, xovf və rəca *salik* üçün iki ayaq kimidir, onların vasitəsilə mənzil və mərhələləri keçir. Qurani-Kərim ayəsində də Allahdan qorxu ilə Allaha ümid yanaşı xatırlanır: "Onlar ibadət üçün yataqlarından qalxar (gecələr az yatar), qorxu və ümid içində Rəbbinə dua edər və onlara verdiyimiz ruzilərdən (ehtiyacı olanlara) sərf edərlər" (Səcdə, 16). İmam Cəfər Sadiq (ə) buyurmuşdur: "Elə bir mömin yoxdur ki, ürəyində xovf və rəca adlı iki nur olmasın. Bunların hansı birini ölçsən, o birindən ağır gəlməz (yəni ikisi də bərabər olar)". Yenə Cəfər Sadiq (ə) buyurmuşdur: "Öz savablarına etimad edən kəs həlak olar. Allahın mərhəmətinə ümidvar olub günahlarına davam edən kəs də nicat tapmaz". Soruşdular: "Bəs kim nicat tapar?" İmam cavab verdi: "Xovf və rəca arasında olanlar. O kəslər ki, qəlbləri qartalın caynağındakı ov kimi savablara şövq bəsləyər, əzabdan isə qorxar".

*"Qara məcmuə"də* Şeyx Səfiəddin Ərdəbilinin belə söylədiyi nəql olunur: "Nə qədər ki *talibə* mərifətullah ziyadə olur, Həqqi-Taaladan xovf və xəşyət dəxi ziyadə olur. Əgər Həqqi-Taaladan xovfu olmasa, ol kimsə ziyankar olar".

*bax:* **RƏCA.**

***Mənbələr:*** *Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.374-378; Seyid Ziyaəddin Səccadi. İrfan və təsəvvüfün əsaslarına giriş, s.38-41; Risaleyi-Qüşeyriyyə (farsca tərcümə: Bədiüzzaman Firuzənfər), s.189-207; Sərrac Tusi. Əl-Lümə, s.89-93; Qara məcmuə, s.64; Şeyx Səfi təzkirəsi ("Səfvətüs-səfa"nın XVI əsr türk tərcüməsi), s.344-345; Üsul əl-Kafi, II, 67; Müstədrək əl-Vəsail, XI, 226.*



**XÜRRƏMİYYƏ** – IX əsrdə Abbasilər xilafətində yaranmış dini-ideoloji cərəyan və xilafətin iri ərazilərini bürümüş, geniş kütlələri əhatə etmiş xalq hərəkatı. Tarixi mənbələrdə "xürrəmiyyə", "xürrəmdiniyyə" və ya "mühəmmərə" şəklində qeyd edilmişdir. Bu adların mənşəyi barədə ziddiyyətli məlumatlar mövcuddur. Geniş yayılmış fikrə əsasən, "xürrəmdin" sözü "gözəl din, xoş din" mənasını verir. Bəzi tədqiqatçılar bu adı qədim fars dilindəki "xur" (Günəş) sözü ilə əlaqələndirirlər. Hərəkatın "mühəmmərə" (qırmızılar) adlanmasının səbəbi isə üsyanın simvolik rənginin qırmızı olması idi (Abbasilərin rəmzi olan qara rəngin qarşılığında).

Xürrəmilər hərəkatı Abbasiləri hakimiyyətə gətirmiş Əbu Müslim Xorasaninin elə Abbasilər tərəfindən qətlə yetirilməsindən (755) sonra, onun intiqamını almaq şüarı ilə başlamışdır. Əsas etibarilə qeyri-ərəb (türk və fars) mənşəli kütlələrdən ibarət olan ilk xürrəmilər Xorasandan Reyə kimi irəliləyib böyük bir ərazini ələ keçirdilər. Lakin xəlifə Mənsurun göndərdiyi qoşunla döyüşdə 60 min nəfərdən artıq xürrəmi həlak oldu. Tarixçi Məsudi bu hadisənin hicri 136-cı ildə (miladi 753/754-cü illər), Əbu Müslimin qətlindən bir neçə ay sonra baş verdiyini yazır. Lakin daha dəqiq məlumata görə, Əbu Müslim Xorasani hicri 137 (miladi 755-ci) ildə qətlə yetirilmiş, deməli, xürrəmilərin ilk çıxışı da həmin ilə təsadüf etmişdir.

Xürrəmilər uzun sürən fasilədən sonra ikinci dəfə Abbasi xəlifəsi Mehdinin hakimiyyəti dövründə hicri 162-ci ildə (miladi 778/779-cu illər) İsfahan ətrafında qiyam etdilər, 30 ildən sonra, Harun ər-Rəşidin dövründə bir daha bu hərəkat qeydə alındı. Lakin hər iki dəfə üsyan asanlıqla yatırıldı. Üsyanların yayılma ərazisi və başçılarının şəxsiyyəti arasındakı fərqlərdən belə bir ehtimal yaranır ki, xürrəmilik uzun illər ərzində formalaşmış, bir neçə bölgədə ayrı-ayrı şəxslər tərəfindən idarə olunmuş pərakəndə hərəkat idi. Ərdəbil ətrafındakı xürrəmi icmasına Şəhrək oğlu Cavidan başçılıq edirdi, lakin Cavidanın dövründə hərəkat miqyasca dar və ideya baxımından qeyri-yetkin formada idi. O, digər dəstə başçısı ilə savaşda yaralanıb həlak olduqdan sonra Babək xürrəmilərin başçısı oldu. Hicri 201-ci il (miladi 816/817-ci illər) Babəkin rəhbərliyi altında mütəşəkkil xürrəmi hərəkatının başlanğıc tarixi kimi qəbul edilir. Xürrəmiyyə hərəkatında Babəkin mühüm roluna görə bu hərəkatı klassik mənbələrdə bəzən "babəkiyyə" də adlandırırlar.

Babəkin əsil-nəsəbi barədə mənbələrdə iki nəzəriyyə mövcuddur. Birinci nəzəriyyəyə görə, o, Əbu Müslim Xorasaninin qızı Fatimənin oğlu Mütəhhərin nəslindən idi. İkinci nəzəriyyəyə əsasən, Babək indiki Cənubi Azərbaycanın Miməd nahiyəsindəki Bilalabad kəndində yaşayan bir qadınla əslən Mədain şəhərindən olan Abdullah adlı yağsatan kişinin izdivacından doğulmuşdu. Atasını uşaq vaxtı itirmiş Babək yerli hakimlərə xidmət edib çobanlıqla məşğul olurdu.

Orta əsr mənbələrində xürrəmilər haqqında verilmiş məlumatlar ziddiyyətli və əksər hallarda qərəzlidir. Bu mənbələrdə xürrəmilər İslamdan kənar, mürtəd, şərabı, zinanı halal bilən, tənasüxə (ruhun bədəndən-bədənə keçməsinə) inanan bir məzhəb kimi tanıdılır, onların əxlaqi pozğunluğu barədə oxucuda nifrət oyadan məsələlər xüsusilə qabardılır. Lakin xürrəmiləri tənqid edib ləkələyən tarixçilərin də sözləri bir çox məsələdə üst-üstə düşmür; onların bəziləri xürrəmiləri atəşpərəst, bəziləri İslamdan dönmüş, bəziləri batini, bəziləri isə ibahiyyə (hər şeyi halal bilən) sufisi adlandırmışlar.

Salnamələrdəki məlumatlara görə, Babəkin əsl adı Həsən, atasının adı Abdullah, onunla birlikdə Bağdadda edam



olunmuş qardaşının adı Abdullah idi. Bu adların müsəlman mənşəli olması Babəkin müsəlman olduğunu ehtimal etməyə əsas verir.

Babək hicri 201-ci ildə (miladi 816/817-ci illər) xürrəmi hərəkatının başına keçmişdir. Bu, Abbasilər üçün böhranla dolu il idi, xilafət torpaqları başdan-başa üsyanlara qərq olmuşdu. Əbus-Sərayanın başçılıq etdiyi üsyan yenicə yatırılmışdı, əl-Cəzirədə Nəsr ibn Şibsin tərəfdarları ağalıq edirdi, Misir üzərində nəzarət, demək olar ki, itirilmişdi. Bu hərəkatların heç biri anti-İslam xarakteri daşımırdı, əksinə, islami motivə malik idi. Peyğəmbər nəslindən olan Məhəmməd ibn Cəfər Dibacın və Əbus-Sərayanın qiyamları açıq-aşkar şiə təmayülü ilə seçilirdi. Nəsr ibn Şibs və Misir qiyamçıları da müsəlman olduqlarını gizlətmirdilər.

Xilafətdə ciddi hakimiyyət böhranı yaşanırdı. Bağdadda Məmunu hakimiyyətdən uzaqlaşdırıb əmisi İbrahim ibn Mehdini taxta çıxarmaq üçün hazırlıq görülürdü. Bundan bir qədər əvvəl xilafətin adlı-sanlı sərkərdəsi, Əminə qarşı müharibədə şöhrət qazanmış Hərsəmə ibn Əyən saray intriqalarının qurbanı olmuşdu. Diqqət yetirilməli cəhət budur ki, Hərsəmənin oğlu, Qafqaz bölgəsinin hakimi Hatəm xəlifənin əleyhinə qiyam qaldırmaq üçün yerli hakimlərlə, o cümlədən Babəklə danışıqlar aparmışdır.

Abbasi xəlifəsi Məmun bir-birinin ardınca qopan şiə təmayüllü üsyanları zərərsizləşdirmək üçün məhz hicri 201-ci ildə (miladi 816/817-ci illər) İmam Rzanı (ə) özünə vəliəhd təyin etmişdi. Babəkin xürrəmilərə başçılıq etdiyi ilk illərdə Abbasilərə qarşı ciddi hərbi əməliyyatlar aparmaqdan çəkinməsinin səbəbi İmam Rzanın (ə) vəliəhd təyin edilməsi ilə bağlı ola bilərdi. Xürrəmilərlə xilafət qoşunları arasında döyüşlər məhz onun şəhid edilməsindən (818) sonra baş vermişdir.

Bəzi tarixi mənbələrdə rast gəlinən məlumatlar da Babək hərəkatının islami çalar daşıdığını söyləməyə əsas verir. Belə ki, din və məzhəblərin təsnifatı mövzusunda qələmə alınmış qədim və orijinal mənbələrdən sayılan “Təbsirət əl-əvam fi mərifət məqalat əl-ənam” kitabında (müəllifi Seyid Mürtəza ibn Dai Həsəni Razi) xürrəmilər İslam məzhəbləri sırasında, Əbu Müslimiyyə təriqətinin qollarından biri kimi göstərilir. Müəllif onların özlərini şiə adlandırdıqlarını yazır. Lakin müəllifin fikrincə, xürrəmilər Əhli-beyt hakimiyyətini təbliğ etsələr də, şiə deyildilər. Onlar hakimiyyət haqqını peyğəmbərin əmisi Abbasın nəslindən olan İbrahim ibn Məhəmmədə aid bilirdilər. Müəllif yazırdı: “İsfahan və ətrafında onlara “xürrəmiyyə”, Qəzvin və Reydə “məzdəki” və “sünbadi”, Maheyndə “mühəmmərə”, Azərbaycanda “qovliyyə” və Mavəraünnəhrdə (Orta Asiyada) “muğan” deyirlər”. Müəllif daha sonra ismaililərdən söhbət açarkən onları “batiniyyə”, “qəramitə”, “xürrəmiyyə”, “səbiyyə”, “babəkiyyə” və “mühəmmirə” adları ilə qeyd edir.

Şəhristaninin qələmə aldığı “əl-Miləl və-

l-nihəl" kitabında da xürrəmilər "ğaliyə" (*ğülüvv* əhli, ifratçı) başlığı altında yerləşdirilib. Müəllif onların şiələrlə müəyyən oxşarlıqlara malik olduqlarını qeyd etdikdən sonra yazır: "Hər şəhərdə onların öz ləqəbləri var. İsfahanda onlara "xürrəmiyyə" və "kuziyyə", Reydə "məzdəkiyyə" və "sunbaziyyə", Azərbaycanda "duquliyyə", başqa bir yerdə "mühəmmərə" (qırmızılar), Mavəraünnəhrdə isə "mübəyyəzə" (ağlar) deyirlər".

Böyük İslam alimi, tarix və rical mütəxəssisi mərhum Ayətullah əl-üzma Seyid Şihabəddin Mərəşi Nəcəfinin məsləhəti və redaktəsi ilə A.M.Abadaninin qələmə aldığı üçcildlik "Tarixi-ədyan və məzahibi-cəhan" (Dünya dinlərinin və məzhəblərinin tarixi) kitabında yazılmışdır: "Babək Xürrəmdinin firqəsi. Onlar Babəkin dostları və tərəfdarlarıdır; "babəkiyyə" adı ilə tanınırlar və ifrat şiələrdəndirlər".

Bəzi tarixi mənbələrdə xürrəmiləri *"rafizi"* adlandırmışlar; məlum olduğu kimi, bu ad şiə məzhəbinin ardıcıllarına düşmənləri tərəfindən verilmişdir.

Deyilənləri ümumiləşdirərək belə bir nəticəyə gəlmək olar ki, Babəkin başçılıq etdiyi xürrəmilər qiyamı, ehtimala görə, Əbu Müslim Xorasani tərəfindən başlanmış hərəkatın bir qolu idi. Əbu Müslimin hakimiyyətə gətirdiyi Abbasilər tərəfindən ortadan götürülməsi onun tərəfdarlarının hakim sülaləyə inamını kökündən sarsıtdı. Xürrəmilər İslam dininə qarşı deyil, zor və hiylə gücünə hakimiyyətə gəlmiş, öz keçmiş müttəfiqlərini qılınc və zəhərlə aradan götürməyə adət etmiş, Əhli-beytin haqqını əlindən almış Abbasi sülaləsinə qarşı yönəlmişdi.

Bəzi tədqiqatçılar xürrəmiliklə *qızılbaşlıq* arasında ideoloji əlaqənin mövcudluğunu iddia etmiş və qızılbaşlığın yaranmasında xürrəmi hərəkatının da təsiri olduğunu söyləmişlər. Görkəmli rus şərqşünas alimi İ.P.Petruşevski "İslamın hökmranlığı dövründə Məzdəkilər tarixinə dair" məqaləsində yazırdı ki, xürrəmilərin qalıqları sonralar qızılbaşlığı qəbul etmişdilər. Qızılbaşlıqla xürrəmilik arasında əlaqə quranların əsas istinad nöqtəsi bu cərəyanların hər ikisində qırmızı rəngə xüsusi önəm verilməsidir. "The Encyclopaedia of Islam"dakı "qızılbaş" məqaləsinin müəllifi, görkəmli şərqşünas Roger Savory və "MEB İslam Ansiklopedisi"ndəki eyniadlı məqalənin müəllifi Abdülbaqi Gölpınarlı qızılbaşlıqla xürrəmilik arasında ciddi bağlılıq olduğunu ön plana çıxararaq qızılbaşlığı xürrəmiliyin mənəvi varisi adlandırmışlar.

***Mənbələr:*** *Z.Bünyadov. Azərbaycan VII-IX əsrlərdə, s.219-235; N.Rəhimov. İslam tarixi (Abbasilər xilafəti), s.130-136; A.M.Abadani. Tarixi-ədyan və məzahibi-cəhan (3 cilddə), III, 1386; Şəhristani. Əl-Miləl və-l-nihəl (2 cilddə), I, 155; Seyid Mürtəza ibn Dai Həsəni Razi. Təbsirət əl-əvam fi mərifət məqalat əl-ənam, s.179-182; Mehmet Azimli. Babek el-Hurremi İsyanı ve Bizans İle İlişkileri (Fırat Üniversitesi Orta Doğu Araştırmaları Merkezi Beşinci Uluslar Arası Orta Doğu Semineri, İslamiyet'in Doğuşundan Osmanlı İdaresine Kadar Orta Doğu, Şam, 2-4 Kasım 2010), s.149-165; The Encyclo-*



*paedia of Islam, V, 243; MEB İslam Ansiklopedisi, VI, 789.*

**İBN əl-VƏQT** – ifadənin hərfi tərcüməsi "vaxtın oğlu" deməkdir. Təsəvvüf anlayışında Allah tərəfindən sufiyə hədiyyə edilmiş mənəvi hal müəyyən vaxta bağlıdır, ötəridir. Buna görə vaxtın qədrini bilmək, vaxtı qənimət saymaq təsəvvüfdə böyük əhəmiyyət daşıyır. Hər sufinin öz vaxtı vardır. Əsl sufi indiki halı ilə məşğuldur, nə keçmişi yada salır, nə də gələcəyi düşünür. Vaxtı itirmək onun üçün fəlakətdir, çünki "vəqt əzizdir, ötərsə dərk edilməz (bir daha əldə edilməz)". Buna görə sufini "ibn əl-vəqt" adlandırırlar.
*bax:* **VƏQT.**

***Mənbələr:*** *Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.789-791; M.Mütəhhəri. İslam elmləri külliyyatı, II, 130-134; Risaleyi-Qüşeyriyyə (farsca tərcümə: Bədiüzzaman Firuzənfər), s.88-91; Alper Günaydın. "İbnü'l-vakt" ve "ebü'l-vakt" kavramlarının klasik Türk tasavvuf edebiyatındaki kullanımı (Rumelide Dil ve Edebiyat Araştırmaları Dergisi, №8), s.326-336; K.Özköse. İbnü'l-Vakt Ya Da Ebu'l-Vakt Olabilmek (Somuncu Baba Dergisi, №64), s.22-25; İzzəddin Kaşani. Misbah əl-hidayə və miftah əl-kifayə, s.138-140; K.Bünyadzadə. Sərrac Tusinin "əl-Lümə" əsəri, s.188.*

**İXLAS** – İslam əxlaqında ən vacib keyfiyyətlərdən, təsəvvüfdə ən mühüm anlayışlardan biridir. Bəndə hər bir əməli ixlasla etməli, yalnız Allahın razılığını nəzərdə tutmalıdır.
Hədislərdə buyurulur ki, əməli xalisləşdirmək əməlin özünü yerinə yetirməkdən daha çətindir. İmam Əli (ə) buyurmuşdur: "Əməlini və elmini, sevgini və nifrətini, əldə etməyini və kənara qoymağını, danışığını və sükutunu Allaha xatir xalis (səmimi) et".
Hansısa mənfəət xatirinə edilmiş əməl ixlasdan uzaqdır və riyadır. Riya isə *seyrü-süluk* yolunun ən böyük təhlükələrindən biridir. Təsəvvüf aləmində hətta belə tövsiyə edilir ki, hansısa bir əməli edəndə onun fərqində olmamalısan, nə etdiyini görməməli və söyləməməlisən. Çünki hər kəs feili (əməli) görsə, faili (əməl sahibini) də görər. Əgər insan öz əməlinin fərqində olsa, həmin əməlin sahibi kimi özünü görər, bu isə xudbinlikdir. Xudbin olan şəxs Allahı görə bilməz.
Şeyx Səfiəddin Ərdəbilinin əxlaqi tövsiyələrinin toplandığı *"Qara məcmuə"-də* deyilir: "O zaman ki günah qapısı bağlanar, şeytani və nəfsani istəklər, hiylələr kəsilər, ondan sonra əməl ixlaslı və pak olar: "Bil ki, xalis din (sırf ibadət, təmiz itaət) ancaq Allaha məxsusdur" (Zümər, 3)".
Xətai də öz şeirlərində ixlasın əhəmiyyətini vurğulamışdır:

Yəqin, ixlas gərək eşqin yolunda,
Get, ey münkir ləin, səndə güman var.
*(Ş.İ.Xətai)*

*Mənbələr: Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.65; Qara məcmuə, 13-cü faidə; Qürər əl-hikəm, s.178; Şah İsmayıl Xətai. Əsərləri (2 cilddə), I, 246.*

**İNSANİ-KAMİL** – təsəvvüf aləmində bəşərin çata biləcəyi ən yüksək mərtəbə. İnsani-kamil bütün aləmlərin məcmusudur, bütün varlıq aləmi, hətta Allahın Özü də onda *təcəlla* etmişdir. İnsani-kamil Haqqın aynasıdır, Allah Özünün bütün isim və sifətlərini ona bəxş etmişdir. İnsani-kamil həm *lahut* aləmini, həm də *cəbərut*, *mələkut* və *nasut* aləmlərini özündə cəmləmişdir. Bütün dünyada nə varsa, onda da vardır, hətta varlığın özü insani-kamildir. Allahın ərşi, kürsisi, sidrət əl-müntəha, lövh, qələm, dörd ünsür, yeddi fələk, planetlər, mələklər, dağlar, meşələr, dənizlər, bəşəriyyət, hətta heyvanat, nəbatat və cansız aləm onda toplanıb. O, Allahın mükəmməl *xəlifəsidir*. İnsani-kamil hər kəsin qazanmaq istədiyi dörd fəziləti ən mükəmməl şəkildə mənimsəyib: gözəl söz, gözəl əməl, gözəl əxlaq və mərifət.

İnsani-kamilin yalnız özünə xas olan mahiyyəti vardır, amma bu mahiyyət fərqli sifətlərdə zahir olur. İnsani-kamilin ən gözəl nümunəsi həzrət Məhəmməd Peyğəmbərdir (s). Hər zamanda mütləq bir insani-kamil vardır, o, *qütbdür*, Kainatın məhvəridir. Peyğəmbərin mahiyyəti onda zahir olur. İnsani-kamilin fərqli zamanlarda adı Həsən, Hüseyn, Abdullah və s. ola bilər, amma mahiyyətcə o, Məhəmməddir (s). Bəzi böyük sufilər öz mürşidlərində insani-kamili tapdıqlarını söyləmişlər. Məsələn, XIV əsrdə yaşamış böyük sufi, "əl-İnsan əl-kamil" kitabının müəllifi Əbdülkərim Cili öz ustadı İsmail əl-Cəbərutini insani-kamil kimi görürdü. Bununla yanaşı, o, tənasüxü (reinkarnasiyanı) qəbul etmədiyini bildirir və Peyğəmbərin başqa sifətdə zühur etməsini tənasüx saymırdı. Deyirlər ki, məşhur sufi Şibli özünün rəsulüllah olduğunu, yəni insani-kamil surəti ilə peyğəmbərin onda təzahür etdiyini iddia etmişdir. Sufi ədəbiyyatında insani-kamil ən müxtəlif ləqəblərlə qeyd edilir, məsələn, iksiri-əzəm, kibriti-əhmər, cami-Cəm, bəhri-mühit, sahibi-zaman və s.

Şeyx Səfiəddin öz tövsiyələrində qeyd edirdi ki, dağların götürməyə cəsarət etmədiyi, amma insanın öhdəsinə aldığı əmanət – əl, ayaq, göz, qulaq, dil, dodaq və nitqi nəzarətdə saxlamaq, bunlara aid olan günahlardan uzaq durmaqdır. O, daha sonra əlavə edir: "Nə kim varsa, bu yeddi sifətdən qopar. İndi bir talib ki bu məzmumə sifətləri tərk edərsə, insan dərəcəsinə təriq bulur, nəfsi mütməinə ayaq basar, ol vaxt könlü və gözü açılar, eşq arı olar, ziyadə məhəbbət hasil olar, səfayi-qəlb edər. Hansı talib ki bu mərtəbəyə irsə, insani-kamil olmuş olur".

***Mənbələr:*** *Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.150-151; Süleyman Ateş. İşari Tefsir Okulu, s.282-284; Əzizəddin Nəsəfi. İnsani-kamil, "İnsani-kamilin bəyanı" fəsli; Rzaqulu xan Hidayət. Riyaz əl-arifin, s.37; Qara məcmuə, s.24.*



**İRFAN** – ərəb dilindən tərcümədə "böyük və əhatəli bilik" mənasını verir. Belə ki, ərəb dilində ismin "fə(ə)lan", "fi(i)lan" və "fü(ü)lan" babları bolluq



və kamillik həddini ifadə edir (məsələn, rəhman, irfan, qurban və s.). "Mərifət" sözü də eyni kökdən törəmişdir. Ümumi mənada irfan – həyatın və insanlığın mahiyyəti, dünyada baş verən hadisələrin hikməti, Allah-Taalanın varlığının və sifətlərinin təhlili haqqında bilik və düşüncələrin məcmusu kimi qəbul edilir. İrfan quru elm deyil, dünyagörüşüdür.

Klassik mənbələrdə Allahı tanımağın iki yolu olduğunu yazırlar. Birinci yol istidlalidir (əsaslandırma metodu), yəni yaradılmışların əsasında Yaradanın Özünü tanımaq metodudur. Məntiq və təfəkkür vasitəsilə Allahın feilləri əsasında onun sifətlərini, sifətləri əsasında da zatını tanımaq mümkündür. Peyğəmbərlərin təlimi, din alimlərinin yazıları bu metoda tabedir. İkinci yol isə kəşfü şühud yoludur (intuitiv metod). Burada Allah ağılla deyil, *eşqlə* tanınır və bu, *ariflərin*, *övliyaların* yoludur.

İrfanda Mühəmməd Peyğəmbərdən (s) və İmam Əlidən (ə) rəvayət olunan bu hədisə çox istinad edilir: "Kim nəfsini tanıdısa, Rəbbini də tanıdı". Sufilərin fikrincə, Allahı düzgün tanımaq üçün insan mütləq öz nəfsini yaxşı tanımalıdır. Yalnız öz nəfsini tanıyan insan onun istəklərinə müqavimət göstərə və onu paklaşdıra bilər. Öz nəfsini paklaşdırmaq isə *seyrü-süluk* yolunun əsas problemidir.

Ariflərin ikinci mühüm istinadı Allah-Taala tərəfindən Davud peyğəmbərə (ə) xitabən söylənmiş hədisi-qüdsidir: "Mən gizli xəzinə idim. Tanınmaq istədim; məxluqatı yaratdım ki, tanınım". Məşhur sufi müəllifi Əzizəddin Nəsəfi "Kəşf əl-həqaiq" əsərində yazır: "İnsanın bu qədər uca məqama malik olmasının səbəbi budur ki, özünü tanıyır, bununla da Allahı tanıyır. Bütün məxluqat aləminin yaradılışı Adəmdən ötrüdür, qalan hər şey ona möhtacdır. Yaradılışın hikməti budur ki, O (Allah), tanınsın. Davud (ə) Allaha minacatında söylədi: "İlahi, məxluqatı niyə yaratmısan?" Allah buyurdu: "Mən gizli xəzinə idim. Tanınmaq istədim". Yalnız insan Allahı tanımağa qadirdir". Klassik sufi ədəbiyyatında Allaha ünvanlanmış "küntü kənzən" (xəzinə idim), "gənci-məxfi", "gənci-nihan" (gizli dəfinə) və s. bu kimi ifadələrə tez-tez rast gəlmək mümkündür. Şah İsmayıl Xətai də öz şeirlərində bu hədisə işarə emişdir:

Xandadır ol bimisalın ibtidasi, xandadır?
Kim bilir ol küntü kənzin intəhası xan dadır?

Çox zaman irfan təsəvvüflə eyniləşdirilsə də, bunların arasında müəyyən fərqlər mövcuddur. İrfan Allaha doğru yönələn yol (seyrü-süluk) barəsində nəzəri bilikləri əhatə etdiyi halda, təsəvvüf bu yolun təcrübi olaraq keçilməsidir. İrfani biliklərlə möhkəmlənməmiş bir təsəvvüf həyatı düzgün sayılmaz. Eləcə də həyatda yaşanmayan irfan bilgiləri də qətiyyən əhəmiyyət kəsb etməz. İrfansız təsəvvüf, təsəvvüfsüz irfan yoxdur.

"Təsəvvüf" sözü termin olaraq hicrətin II əsrindən sonra meydana çıxdığı üçün

bundan əvvəlki dövrə aid olan İslam mənbələrində eyni mənanı bildirmək məqsədilə “zöhd”, “irfan” və s. kəlmələr işlədilirdi. İstər İslam müqəddəslərinin hədislərində, istərsə də ilk sufilərin söz və yazılarında rast gəldiyimiz “arif” kəlməsinin məna yükü sonralar “sufi” sözünə şamil edilmişdir.

M.Mütəhhəri “İslam elmləri ilə tanışlıq” kitabında yazır: “İrfan barədə iki istiqamətdə danışmaq və tədqiqat aparmaq olar: ictimai baxımdan və mədəni baxımdan. İrfan əhlini mədəni baxımdan yanaşdıqda “ariflər”, ictimai baxımdan yanaşdıqda isə çox vaxt “təsəvvüfçülər” (sufilər) adlandırırlar”.

İrfan bir elmi və mədəni kompleks kimi iki hissədən ibarətdir: əməli (praktiki) irfan və nəzəri irfan. Əməli irfan insanın öz iç dünyası ilə, onu əhatə edən xarici aləmlə və Allahla əlaqələrini, bunların qarşısında daşıdığı vəzifələri öyrənir. Bu cəhətdən irfan əxlaq elminə bənzəyir; yəni onun kimi təcrübi elmdir. Əməli irfanı həm də “seyrü-süluk” adlandırırlar. Burada insaniyyətin ən yüksək nöqtəsinə, yəni tövhid mərhələsinə çatmaq üçün salikin mənəviyyat səfərinə haradan başlayacağı, hansı məqamları ardıcıllıqla keçəcəyi, bu yol boyunca nə kimi hallarla üzləşəcəyi və hansı vəziyyətlərə düşəcəyi izah edilir. Bütün bu məqamlar həmin yolu əvvəlcədən keçmiş, onun qayda-qanunlarından xəbərdar olan kamil və yetkin bir şəxsin (mürşidin, şeyxin) nəzarəti və rəhbərliyi altında keçilməlidir. Bir mənzili keçmədən növbəti mənzilə çatmaq mümkün deyil. İrfanı əxlaq elmindən fərqləndirən əsas cəhət də budur. İrfanda bəşər ruhu bir bitki, yaxud körpə uşaq kimidir; onun kamilliyi xüsusi qanun üzrə inkişaf etməsindədir. Bu baxımdan irfan təkamülpərvər, mütəhərrik bir təlimdir. Əxlaq elmində isə sadəcə olaraq ruhun fəzilətləri (gözəl xüsusiyyətləri) sadalanır və bunların təsviri verilir. Əxlaq nöqteyi-nəzərindən insan ruhu naxışlarla bəzədilməsi lazım olan evə bənzəyir, amma işin hansı ardıcıllıqla görülməsi, haradan başlayıb harada qurtarmaq lazım gəldiyi göstərilmir.

Nəzəri irfan isə varlığın təfsiri, yəni Allah, aləm və insanın izahı ilə məşğuldur. Nəzəri irfan fəlsəfə və kəlam elmlərinə yaxındır, amma bunların da arasında bəzi fərqlər vardır. Fəlsəfə və kəlam yalnız əqli prinsiplərə və metodlara əsaslanır, irfanda isə *kəşf* (intuisiya) əsas sayılır. Kəlam aliminin nəzərində həm Allah, həm də Allahdan qeyri şeylərin hamısı həqiqidir. Fərq bundadır ki, Allah “vacib əl-vücud”, Ondan savayı hər şey “mümkün əl-vücud”dur. *Arif* isə bu fikirdədir ki, Allahdan savayı heç nə Allah qarşısında qərar tuta biləcək vücuda malik deyil. Hər şey yalnız Allahın ad, sifət, iradə və təcəllasıdır, Ondan başqa bir şey deyildir. Həqiqi mövcud olan yalnız Allahdır, Allahdan savayı hər şey görünüşdür, təzahürdür, varlıq deyil. Arifin tövhid anlayışı “Allahdan savayı məbud yoxdur”, arifin tövhidi isə “Allahdan savayı heç nə yoxdur” prinsipi üzərində qurulub.



*Mənbələr: Seyid Ziyaəddin Səccadi. İrfan və təsəvvüfün əsaslarına giriş, s.8-13; Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.577; M.Mütəhhəri. İslam elmləri külliyyatı, II, 75-97; Qısa İslam Ensiklopediyası (N.Rəhimovun ümumi redaktəsi ilə, 2 cilddə), I, 110-111; R.A.Nikolson. Müsəlman ariflərin irfanı (tərcümə: Ə.Azad); Şah İsmayıl Xətai. Əsərləri (2 cilddə), I, 241.*

**İSMİ-ƏZƏM** – dini inanca və sufi mənbələrə görə, Allahın möcüzəvi xüsusiyyətlərə malik olan adı. Sözün tərcüməsi "ən böyük, ən əzəmətli ad" deməkdir. Bu ad Allahın bütün sifətlərini özündə ehtiva edir. İsmi-əzəm elə bir addır ki, Allaha bu adı and verən şəxsin duası mütləq qəbul olar. Bu adı söyləməklə qeyri-mümkün işləri həyata keçirmək mümkündür. Asəf ibn Bərxiya ismi-əzəmin qüvvəsi ilə Səba məlikəsi Bilqeysin taxtını həzrət Süleymanın (ə) hüzuruna gətirmişdi, İsa peyğəmbər (ə) ismi-əzəmin köməyi ilə hətta ölüləri dirildirdi.

İsmi-əzəmin konkret nədən ibarət olduğu barədə məlumatlar çox fərqli və rəngarəngdir. Hədislərdə bu və ya digər adın, ifadənin, hətta ayə və duanın ismi-əzəm olduğu bildirilib. Məsələn, əsma-ül-hüsnadan bəzilərinin, "Bismillahir-Rəhmanir-Rəhim" ayəsinin ismi-əzəm olması, bu adın bəzi surələrdə (o cümlədən "Fatihə" surəsində) hissələrə bölünmüş şəkildə gizlədildiyi ehtimal edilir.

Sufi mənbələrində yazılıb ki, bir kasıb insan İmam Əlidən (ə) pul istəyir. Üstündə pulu olmayan imam yerdən bir ovuc torpaq götürür, ona nə isə oxuyub həmin adama uzadır. Ovcunu açanda məlum olur ki, əlindəki torpaq qızıla dönüb. O adam heyrətlə bunu necə etdiyini soruşur. İmam buyurur ki, oxuduğum "Fatihə" surəsi idi. Həmin adam da bunu təkrar etmək istəyir, amma alınmır. İmam ona buyurur: "Oxuduğun həmin şeydir. Amma oxuyan qəlb başqadır".

Sufilərə görə böyük övliyalar və Allah dostları da ismi-əzəmə vaqif idilər. Məsələn, Əbdülqadir Gilaninin bu yolla ölünü diriltdiyini yazırlar.

*Mənbələr: Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.95; Bihar əl-ənvar, XI, 68; XCIII, 223-227; Həvizi. Nur əs-səqəleyn təfsiri, IV, 90; Sünən Əbu Davud, 1495-ci hədis; Sünən ən-Nəsai, 1301-ci hədis; O.N.Topbaş. İmandan İhsana Tasavvuf, s.375; Türkiye Diyanet Vakfi İslam Ansiklopedisi, XXIII, 75-76.*

**İŞRAQİYYƏ** – XII əsrdə yaşamış və cəsarətli fikirlərinə görə edam edilmiş görkəmli Azərbaycan filosofu Şihabəddin Əbülfütuh Yəhya ibn Həbəş Sührəvərdi (1155-1191) tərəfindən yaradılan fəlsəfi təlim. Sührəvərdi özü də yaratdığı təlimin adına uyğun olaraq mənbələrdə "şeyxi-işraq" adlandırılır. "İşraq" sözü ərəb dilindən tərcümədə "parlama, işıq saçma" mənasını verir (illüminativizm). Sührəvərdi bu təlimi özündən əvvəlki qədim hind, yunan, İran fəlsəfələrindən, eləcə də məşşailikdən (Şərq peripatetizmi) bəhrələnərək yaratmışdır. XII əsrədək fəlsəfədə hakim mövqe tut-

muş məşşailiyə alternativ dünyagörüşü olmaqla işraqilik müsəlman fikir tarixinin inkişafında mühüm pillə sayılır.

İşraqiyyə təliminin kökündə nur və onun parıltıları (işraq) durur. İşraqiyyəyə görə, bütün varlıq aləmi yalnız nurlardan və onların təcəllalarından ibarətdir. Kainatda hər şey nurun fərqli dərəcələrindən ibarətdir. Dünya substansional deyil, nurötürücü mahiyyətə malikdir. Nur gözlə görülməz, ona hədd qoyula bilməz. Nur özü-özlüyündə mövcuddur, başqa hər şeyin mövcudluğunun səbəbi də odur. Nura tərif vermək mümkün deyil, o, hər şeyin dərk edilməsi üçün meyardır. Nur əşyalardakı mövcudluq keyfiyyətinin özüdür, varlığın ilkin mənbəyidir. Bütün varlıq aləmi nurların iyerarxik düzülüşündən ibarətdir. Ən yüksək pillədə Mütləq nur dayanır, o, nuraniyyətin ən parlaq həddindədir. "Nur əl-ənvar" (nurlar nuru) adlanan bu məfhum Allah deməkdir. Ondan daha aşağı pillədə nuraniyyəti ondan az olan və öz nuraniyyətini ondan alan mələklər durur. Mələklər də şaquli və üfüqi iyerarxiyaya tabedirlər. Ən böyük mələk öz nurunu birbaşa Mütləq nurdan alıb digər mələklərə ötürür. Sonrakı pillədə duran hər varlıq da həm Mütləq nurdan, həm də özündən əvvəlki varlığın nurundan bəhrələnir və özündən sonrakılara bu nurdan pay verir. Beləliklə, bütün varlıq aləmi bir-biri ilə qarşılıqlı işraq (işıqlandırma) halındadır. Bu zəncirin hər üzvünün özündən sonrakına ötürdüyü nur həm də kölgə yaradır; kölgə özlüyündə nurun ziddi deyil, onun zəifləməsi deməkdir. Bu zəncir mütləq zülmətə ən yaxın olan, yəni nuru ən az əks etdirə bilən varlıqlarla bitir. Varlıqların nuru əksetdirmə bacarığı onların fərqli xüsusiyyətlərinə bağlıdır; belə ki, bəzi nurlar zərif (rəqiq), bəziləri qatıdır (qəliz). Zərif nurlar daha yaxşı nurötürücülük qabiliyyətinə (işraq) malikdir, qatı nurlar isə aldıqları nuru "udurlar". Bu qarşılıqlı işraq prosesi insanlar arasında da mövcuddur; "güclü" nuru olan insanların başqalarını işıqlandırması "feyz" adlanır.

İşraqiyyə təlimi dini inancları fəlsəfə və irfanla uzlaşdırmaq cəhdləri üzərində qurulmuşdur. Sührəvərdinin ilham mənbəyi Qurani-Kərimin bu ayəsidir: "Allah göylərin və yerin nurudur" (Nur, 35). Sührəvərdi işraqiyyə təliminin əsaslarını "Hikmət əl-işraq" ("İşraq hikməti") və "Həyakil ən-nur" ("Nur heykəlləri") əsərlərində şərh etmişdir.

İşraqiyyə təlimi müsəlman düşüncə tarixində yeni mərhələ yaratmış, sonrakı filosof və ariflərin dünyagörüşünə mühüm təsir göstərmişdir. İbn Ərəbinin *vəhdəti-vücud*, *Molla Sədranın hikməti-mütəaliyə* təlimləri işraqiyyədən qaynaqlanır və onun bünövrəsi üzərində qurulub.

***Mənbələr:*** *İbrahim Agah Çubukçu. Sührevedi ve İşrakiyye Felsefesi (Ankara Üniversitesi İlahiyat Fakültesi Dergisi, 1968, Cilt: 16, Sayı: 1-4), s.177-200; İsmail Erdoğan. İşrâkîlik'in İslâm Felsefesi İçerisindeki Yeri ve Kaynakları (Fırat İlahiyat Fakültesi Dergisi, 8, 2003), s.159-178; Sührəvərdi. Hikmət əl-işraq; Mehdi Əmin Rezəvi. Sührəvərdi və işraq məktəbi; Türkiye Diyanet Vakfı*



*İslam Ansiklopedisi, XXIII, 435-439; Eyüp Bekiryazıcı. Şihabuddin Sühreverdi'nin Hikmet-i İşrak Anlayışı (Yüksek Lisans Tezi), s.55-70; Şamil Öçal. İran'da İşraki Düşünce'nin Seyri ("Osmanlı ve İran'da İşrak Felsefesi"), s.31-48; Toşihiko İzutsu. İşraq fəlsəfəsi (tərcümə: M.Məhəmmədi); Философский энциклопедический словарь, стр.235.*

**İTMİYNAN** (arxayınlıq) – təsəvvüfdə səkkizinci *hal* sayılır. Bu anlayışın kökü Qurani-Kərimdəndir: "O kəslər ki, Allaha iman gətirmiş və qəlbləri Allahı zikr etməklə aramlıq (itmiynan) tapmışdır. Bilin ki, qəlblər yalnız Allahı zikr etməklə aramlıq tapar" (Rəd, 28).

İtmiynan Allah-Taalaya olan kamil imanın bəhrəsi və ürəyin Allaha olan etimadıdır. O, davamlı bir duyğudur, ötüb-keçməz.

Sufilər yuxarıdakı ayəyə istinad edərək *zikrə* böyük əhəmiyyət vermişlər. *Seyrü-süluk* yolunda olan adam xalis niyyətlə zikr etdikcə diqqəti Haqqa yönəlir, qəlbinə aramlıq (itmiynan) gəlir, *yəqin* yaranır və o, *müşahidə* adlı növbəti hala hazır olur.

*Mənbələr: S.Z.Səccadi. İrfan və təsəvvüfün əsaslarına giriş, s.43-44; S.C.Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.554; Sərrac Tusi. Əl-Lümə, s.98-99.*

**KAMİL İNSAN** – *bax:* **İNSANİ-KAMİL.**

**KƏBƏ** – Ərəbistanın Hicaz bölgəsində, Məkkə şəhərində yerləşən tikili, müsəlmanların qibləsi və ən müqəddəs məkanı. "Kəbə" sözünün ərəb dilindən tərcüməsi kub deməkdir; bu ad ona ölçülərinə və quruluşuna görə verilmişdir.

İslam rəvayətlərində Kəbənin tarixi Həzrət Adəmlə (ə) ədaqələndirilir. Adəm Peyğəmbər (ə) cənnətdən çıxarıldıqdan sonra öz əməlindən peşman olub *tövbə* etdi. Allah onun ibadətini yüngülləşdirmək üçün daşdan bir ev tikməsini və orada ibadətlə məşğul olmasını vəhy etdi. Kəbə evinin ilk variantı belə yarandı. Nuh Peyğəmbərin (ə) zamanında baş vermiş böyük tufan Kəbəni dağıtdı. Sonra İbrahim Peyğəmbər (ə) oğlu İsmaillə (ə) birlikdə müqəddəs evi yenidən tikdi. Kəbənin yanında yaranmış Zəmzəm bulağı ətrafdakı qəbilələri bu yerə cəlb etməyə başladı. Beləcə, Kəbənin ətrafında yaşayış məskəni yarandı.

Daha sonralar insanlar arasında fitnə-fəsad çoxaldığı zaman Kəbə də öz ilkin mahiyyətini itirib bütxanaya çevrildi. İslamdan əvvəl (cahiliyyə dövründə) Kəbənin içərisində, damında və ətrafında 360-dan artıq irili-xırdalı büt qoyulmuşdu.

Miladi 570-ci ildə Yəmən hökmdarı Əbrəhə Kəbəni yerlə yeksan etmək üçün döyüş filləri ilə birlikdə Məkkə üzərinə yürüş etdi, amma Allahın möcüzəsi sayəsində özü və qoşunu məhv oldu, Kəbə isə toxunulmaz qaldı.

Sonralar Kəbə bir neçə dəfə təbii fəlakət və siyasi çəkişmələr nəticəsində dağılmış, hər dəfə bərpa edilmişdir. Kəbənin dörd küncü (rüknü) var, bunların birinə qara daş (həcər əl-əsvəd) bərkidilib.

Müsəlmanlara namaz əmri nazil olduqdan sonra ilk qiblə Qüdsdəki Beyt əl-Müqəddəs məscidi idi. Mədinəyə hicrətdən 18 ay sonra Allahın əmri ilə Kəbə qiblə elan olundu.

Hicri 8-ci (miladi 630-cu) ildə müsəlmanlar Məkkəni fəth etdikdə Mühəmməd Peyğəmbər (s) Əli ibn Əbu Taliblə (ə) birlikdə Kəbədəki bütün bütləri sındırıb məhv etdi.

Təsəvvüfdə Kəbə insanın qəlbinə bənzədilir, hətta *qəlb* ondan daha üstün tutulur. Sufilər bəzi hədislərə istinadən deyirdilər ki, insan qəlbini qırmaq Kəbəni dəfələrlə dağıtmaqdan daha böyük günahdır. Kəbə dini və irfani ədəbiyyatda "Allahın evi" (beytullah) adlandığı kimi, insan qəlbi də Allahın məkanıdır. Peyğəmbərdən (s) soruşdular: "Allah haradadır: yerdə, ya göydə?" Cavab verdi: "Allah mömin bəndələrinin qəlbindədir". Hədisi-qüdsiyə görə, Allah buyurur: "Mən nə yerə, nə də səmaya yerləşərəm. Yalnız mömin bəndəmin yumşaq və aram qəlbinə yerləşərəm". "Hər kim haqsız yerə fəqir mömini incitsə, on dəfə Kəbəni dağıtmış və Allah dərgahına ən yaxın olan min mələyi öldürmüş kimidir".

Səfəvilər zamanında yaşamış böyük arif və din alimi Sədrəddin Şirazi *(Molla Sədra)* "Üsul əl-Kafi"yə yazdığı şərhdə Kəbə evini mömininin qəlbi ilə müqayisə etmiş və bunların arasında irfani baxımdan maraqlı paralellər aparmışdır.

*"Qara məcmuə"də* yazılana əsasən, Şeyx Səfiəddin Ərdəbili belə söyləmişdir: "Bu övliyaların könlü daha Kəbədir və zahir Kəbəyə "Kəbeyi-Xəlili" (İbrahim Peyğəmbərin Kəbəsi) derlər və bu könül Kəbəsinə "Kəbeyi-Cəlili" (Allahın Kəbəsi) derlər. Və ol zahir Kəbəni daş ilə, topraq ilə Xəlil peyğəmbər yapdı. Və bu könül Kəbəsi ki övliyanın könlüdür, onu Cəlili-Cəbbar (Allah) yapdı".

***Mənbələr:*** *Qara məcmuə, s.47-48; Qısa İslam Ensiklopediyası (N.Rəhimovun ümumi redaktəsi ilə, 2 cilddə), I, 132-133; II, 145-147; Məhəmməd Reyşəhri. Mizan əl-hikmə, III, 2601; Həsən Deyləmi. İrşad əl-qülub iləl-səvab, I, 364.*



**KƏRAMƏT** – mömin və saleh insanlarda, *övliyalarda* meydana çıxan xariqüladə hal. Bəzən saleh olmayan şəxslərdə də fövqəltəbii hal yarana bilər; buna istidrac və ya sehr deyilir. Peyğəmbərlərdə görünən fövqəltəbii hallara isə möcüzə deyirlər. Kəramətlə möcüzə arasında bəzi fərqlər mövcuddur. Möcüzə peyğəmbərliyin isbatı üçün açıqlanmalı, nümayiş edilməlidir, amma kəramətin əsas xüsusiyyəti budur ki, gərək gizli tutulsun və ifşa edilməsin. Peyğəmbərin möcüzəsinə iman etmək vacibdir, övliyanın kəramətinə isə vacib deyil, heç o özü də həmin hadisənin kəramət olduğunu qəti şəkildə iddia edə bilməz.

Bir gün müridləri nəqşbəndi təriqətinin *qütbü* Bəhaəddin Şahi-Nəqşbənddən (1318-1389) kəramət göstərməsini istədilər. Şahi-Nəqşbənd söylədi: "Bizim kəramətimiz aşkardır. Üzərimizdəki bu qədər günah yükü ilə hələ də ayaq üstə durub yer üzündə gəzə biliriksə, bunun



özü ən böyük kəramətdir!" Sonra dedi: "Əgər bir kəs bağçaya girdiyi zaman ağaclardakı hər yarpağın dil açıb: "Ey Allahın dostu, sənə salam olsun!" söylədiyini eşitsə belə, yenə nə zahirdə, nə də batində bu səsə fikir verməməlidir, əksinə, daha artıq səylə xidmətə davam etməlidir". Müridləri "Nə qədər gizlətsəniz də, yenə sizdən bəzi kəramətlər görürük" deyəndə Şahi-Nəqşbənd onlara bu cavabı verdi: "Gördükləriniz mənim yox, müridlərimin kəramətidir".

*"Səfvət əs-səfa"* kitabında Şeyx Səfiəddin Ərdəbilinin onlarla kəraməti təsvir edilib, bunlar bir neçə bölüm üzrə qruplaşdırılıb və fərqli xüsusiyyətlərə malikdir.

Bəzən təsəvvüf ədəbiyyatında kəramətlə *kəşf* və mükaşifə anlayışları yanaşı işlədilir. Şeyx Səfiəddin kəşf ilə kəramətə bu cür tərif vermişdir: "Kəşf oldur ki, kişi öz eybinə və hünərinə görücü ola və içindəkinə bilici ola. Və kəramət oldur ki, batinindən əlayiqi (dünyaya olan bağlılığı) görə və öz könlünü mücərrəd (dünyadan uzaq) eyləyə".

***Mənbələr:*** *O.N.Topbaş. İmandan İhsana Tasavvuf, s.455-456; Sərrac Tusi. Əl-Lümə, s.422; İbn Bəzzaz Ərdəbili. Səfvət əs-səfa, s.294-432, 598-640 və 656-880; Şeyx Səfi təzkirəsi ("Səfvətüs-səfa"nın XVI əsr türk tərcüməsi), s.379; Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.653-658; Seyid Ziyaəddin Səccadi. İrfan və təsəvvüfün əsaslarına giriş, s.272-273.*

**KƏŞF** – mühüm sufi anlayışlarından biri. Hadisələrin üzərindəki məchulluq pərdəsini qaldırıb qəlb gözü ilə onların batinini görmək kəşf adlanır. Buna bəzən mükaşifə də deyirlər (eyni kökdəndir). Elm və duyğu (hissiyyat) yolu ilə bilik alınması mümkün olmayan yerlərdə böyük sufilər Allah-Taaladan kəşf adlanan biliklər *(mərifət)* əldə edirlər. Kəşf sufinin konkret hala və məqama uyğun olaraq gəldiyi qənaətdir.

Məşhur sufi müəllif Sərrac Tusi "əl-Lümə" kitabında yazır: "Kəşf fəhmdən gizlənən şeyin bəyanı, öz gözləri ilə görürmüş kimi qul üçün açıqlanmasıdır. Əbu Məhəmməd Cüreyri deyir: "Kim özü ilə Allah-Taala arasında olanlara *təqva* və nəzarətlə əməl etməsə, kəşf və müşahidəyə çatmaz". Nuri isə: "Gözlərin kəşfləri görməklə, qəlblərin kəşfləri qovuşma ilə olar", – söyləyib".

Mükaşifə insan nəfsinin (ruhunun) dünya ilə əlaqələrini kəsib ülvi aləmə *(lahut aləmi)* bağlanması nəticəsində mümkün olur. Bu zaman həmin aləmdən bəzi görüntülər güzgü kimi insan ruhunda əks olunur. Bu hal həm yuxuda, həm də oyaqlıq halında – davamlı *zikr* və təfəkkür, səmimi ibadət, *riyazət, çilə, səma* vasitəsilə mümkün olur.

Kəşf sözü çox zaman *kəramətlə* yanaşı işlədilir.

***Mənbələr:*** *O.N.Topbaş. İmandan İhsana Tasavvuf, s.455-456; Sərrac Tusi. Əl-Lümə, s.422; İbn Bəzzaz Ərdəbili. Səfvət əs-səfa, s.294-432, 598-640 və 656-880; Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.653-658, 740; Seyid Ziyaəddin Səccadi. İrfan və təsəvvüfün əsaslarına giriş, s.272-273. Sərrac Tusi. Əl-Lümə, s.102.*

**KƏŞKÜL** – *sufi* atributlarından biri. Adətən sərt qabıqlı meyvələrin (məsələn, hindqozu) qabığından, bəzən də taxtadan və ya dəmirdən yumurtavari formada hazırlanmış içiboş qabdan ibarət olurdu. Keçmişdə dərvişlər özləri ilə mütləq kəşkül gəzdirərdilər. Kəşkül dərviş üçün hər şey demək idi; onun içində yemək yeyir, su içirdi, camaatdan aldığı ianələri də kəşküldə gəzdirirdi. Sufi ədəbiyyatında kəşkül fəqirliyin və qənaətin rəmzi sayılırdı; çünki sufinin kəşküldən savayı heç bir əmlakı yox idi.

Kəşkül həm də müxtəlif elmi məlumatların, şeir nümunələrinin toplandığı məcmuə mənasını bildirir. Bir çox şair və ədiblər "Kəşkül" adlı kitablar tərtib etmişlər. Bunların ən məşhuru Səfəvilər dövründə yaşamış görkəmli din alimi, dövlət adamı, şair və ədib *Şeyx Bəhainin* (1547-1621) eyniadlı əsəridir. Bu kitabda müxtəlif mövzulara aid dini və dünyəvi məlumatlar, faktlar, şeir nümunələri toplanıb. Şeyx Bəhainin "Kəşkül"ünün müqəddiməsində digər müəlliflər tərəfindən toplanmış 30-a yaxın eyniadlı kitabın adı çəkilir. "Əz-Zəriə ila təsanif əş-şiə" kitabında isə şiə alimləri tərəfindən qələmə alınmış "Kəşkül" adlı 60-dan artıq əsər haqqında məlumat verilir ki, onların bəziləri Səfəvilər zamanında qələmə alınmışdır.

***Mənbələr:*** *Qısa İslam Ensiklopediyası (N.Rəhimovun ümumi redaktəsi ilə, 2 cilddə), I, 128; Lüğətnameyi-Dehxuda, XII, 18371; Türkiye Diyanet Vakfi İslam Ansiklopedisi, XXV, 324; Kəşküli-Şeyx Bəhai (farsca tərcümə Əzizullah Katib), müqəddimə; Ağa Büzürg Tehrani. Əz-Zəriə ila təsanif əş-şiə, XVIII, 70-83.*



**QABÜ QOVSEYN** – təsəvvüf ədəbiyyatında Mühəmməd Peyğəmbərlə (s) bağlı tez-tez işlədilən ifadə. Hərfi tərcüməsi "iki yay (ox kamanı) uzunluğunda" deməkdir. Ərəblər ən kiçik məsafəni bildirmək üçün ölçü kimi kamanın uzunluğunu göstərirdilər. Qurani-Kərimdə Mühəmməd Peyğəmbərin (s) merac zamanı vəhy mələyi Cəbrailə (ə) ən yaxın məqamda durduğunu vurğulamaq məqsədilə deyilir: "(Onların arasındakı məsafə) iki yay uzunluğunda, bəlkə ondan da yaxın oldu" (Nəcm, 9). Bu ifadə peyğəmbərin merac gecəsində necə uca bir məqama nail olduğunu, Allahın ən sevimli mələyinə ən yaxın məsafədə durduğunu göstərir.

Ruzi-meraci-nəbi vəslin günüdür, ey mələk,
Qabü qovseyn oldu əbruyi-hilalındır sənin.
*(Ş.İ.Xətai)*

Sufilər yeganə vacib vücud olan Allahı (aləmi-vücud) və ondan başqa bütün mümkün varlıq aləmini (aləmi-imkan) iki dairə kimi qəbul edir və kamanın iki qövsü adlandırırdılar. "Qabü qovseyn" ifadəsi də aləmi-vücud və aləmi-imkan dairələrinə işarədir. Arif Allahda fani olduqdan sonra onun üçün bu iki aləm eyniləşir.

***Mənbələr:*** *Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.633; Qısa İslam*



*Ensiklopediyası (N.Rəhimovun ümumi redaktəsi ilə, 2 cilddə), I, 129; Şah İsmayıl Xətai. Əsərləri (2 cilddə), I, 313.*

**QALU BƏLA** – insanların cisim formasında yaradılmazdan əvvəl ruh şəklində Allaha bəndəlik barədə sorğu-suala çəkildikləri *ələst məclisinin* irfan ədəbiyyatındakı fərqli adı.

Qurani-Kərimdə həmin hadisə bu cür təsvir edilir: "Xatırla ki, bir zaman Rəbbin Adəm oğullarının (bellərindən) gələcək nəsillərini (zürriyyəsini) çıxarıb, onların özlərinə şahid tutaraq: "Mən sizin Rəbbiniz deyiləmmi?" – soruşmuş, onlar da: "Bəli, Rəbbimizsən", – deyə cavab vermişdilər..." (Əraf, 172). Ayədəki: "Mən sizin Rəbbiniz deyiləmmi?" ifadəsi ərəb dilində "ələstü birəbbiküm" şəklindədir. İnsanların cavabını bildirən: "Dedilər: Bəli" ifadəsi isə ərəb dilində "qalu bəla" şəklində səslənir. Buna görə də dini ədəbiyyatda və irfani şeirlərdə bu hadisəni *"bəzmi-ələst"* və "qalu bəla" şəklində işlədirlər.

Bu Xətai yar ilə qalu bəladən qıldı əhd,
Həq bilir kim, bər səri-an əhdü iqrarəm hənuz.
*(Ş.İ.Xətai)*

*bax:* **ƏLƏST MƏCLİSİ.**

***Mənbələr:*** *Əllamə Məclisi. Mirat əl-üqul, VII, 37-38; Əllamə Məclisi. Bihar əl-ənvar, III, 281; V, 261; Qurani-Məcidin ədəbi və irfani təfsiri (Xacə Abdullah Ənsarinin kəlamları əsasında Miybədinin qələmə aldığı "Kəşf əl-əsrar" təfsirinin xülasəsi), s.361; Qısa İslam Ensiklopediyası (N.Rəhimovun ümumi redaktəsi ilə, 2 cilddə), I, 16-17; Şah İsmayıl Xətai. Əsərləri (2 cilddə), I, 271.*

**QEYB** (əslində **ĞEYB**) – gözlə görülən, hissiyyat orqanları ilə duyulan hadisə və görüntülərin əksinə olaraq, bu yollarla dərk edilməsi mümkün olmayan məfhumlara deyilir. Dini anlamda gələcəkdə, həmçinin insanın olduğu məkandan çox-çox uzaqlarda baş verən hadisələrlə, bu dünyadan kənardakı aləmlərin vəziyyəti ilə, axırət, qiyamət kimi mövzularla, insanın qəlbindən keçənlərlə bağlı biliklər qeybə aiddir. Bu bilik və məlumatlar qeyb aləmi adlanan aləmdə toplanıb. Qurani-Kərimin bir çox ayəsində qeybdən danışılır və qeybin yalnız Allaha məlum olduğu vurğulanır (Nəml, 65; Ənam, 59; Yunus, 20 və s.).

Qurani-Kərimdə qeybi biliklərin bir neçəsi xatırlanır: "Həqiqətən, o saatı (qiyamətin qopacağı vaxtı) ancaq Allah bilir. Yağışı (istədiyi vaxt) göydən o yağdırır, bətnlərdə olanı o bilir. Heç kəs səhər nə kəsb edəcəyini, heç kəs harada öləcəyini bilməz. Allah isə, şübhəsiz ki, (hər şeyi) biləndir, (hər şeydən) xəbərdardır" (Loğman, 34).

Alimlər qeybi bilikləri iki hissəyə bölürlər. Mütləq qeyb qisminə aid biliklər yalnız və yalnız Allaha məlumdur. Məsələn, Allahın Zatının mahiyyəti, qiyamətin vaxtı və s. Təsəvvüf ədəbiyyatında "qeybi-mütləq" ifadəsinin özü Allahı ifadə edir.

İzafi qeyb adlandırılan ikinci növ qeybi xəbərləri isə Allah istədiyi sevimli bəndələrinə verə bilər: "Qeybi bilən ancaq Odur (Allahdır) və Öz qeybini heç kəsə əyan etməz; bəyənib seçdiyi peyğəmbərdən başqa" (Cin, 26-27). Qeyb alə-

mindən bəzi xəbərlər vermək peyğəmbərlərin möcüzəsi sayılır.

Mömin şəxslər *(övliyalar)* də qeyb aləmindən müəyyən biliklər əldə edə bilərlər. Buna *kəramət* deyilir. Təsəvvüf mənbələrində təriqət şeyxlərinin qeybdən verdiyi xəbərlər barədə çoxlu məlumat mövcuddur, hətta bunları "mənqəbə" adlı kitablarda da toplayıblar.

*"Səfvət əs-səfa"* kitabında *Şeyx Səfiəddin Ərdəbilinin* başqalarının fikirlərini oxuması, onun görüşünə gələnlərə yalnız onların bildiyi məsələlərdən xəbər verməsi, eləcə də gələcəkdə baş verəcək hadisələri qabaqcadan görməsi barədə çoxlu əhvalat qeyd edilib. Kitabın bir neçə fəsli Şeyx Səfinin bu cür kəramətlərinə və qeyb aləmindən verdiyi xəbərlərə həsr olunub.

***Mənbələr:*** *İbn Bəzzaz Ərdəbili. Səfvət əs-səfa, s.656-880; Qısa İslam Ensiklopediyası (N.Rəhimovun ümumi redaktəsi ilə, 2 clddə), I, 130-131; Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.610-611.*



**QƏLB** – könül, insanın hissiyyat mərkəzi. Ərəb dilində "qəlibə" feili nəyi isə dəyişdirmək, tərs şəklə salmaq mənasını verir. Həmçinin bir şeyin mərkəzinə də qəlb deyilir. Könülə "qəlb" deyilməsinin səbəbi budur ki, o, haldan-hala düşür, dəyişir. Novruz bayramı il təhvil olanda oxunan duada deyilir: "Ya müqəllib əl-qülub və-l-əbsar" (Ey könülləri və gözləri haldan-hala salan). Həmçinin qəlb bütün bədənin mərkəzidir, insanın davranışlarını tənzimləyir.

Mömininin qəlbi irfan aləmində ən geniş və hüdudsuz məfhum sayılır. Heç bir məkan və heç bir əşya Allah-Taalanı əhatə edə bilmədiyi halda yalnız qəlb buna qadirdir. Allah mömin şəxsin qəlbinə yerləşər. Həzrət peyğəmbərdən (s) soruşdular: "Allah haradadır: yerdə, ya göydə?" Cavab verdi: "Allah mömin bəndələrinin qəlbindədir". Hədisi-qüdsiyə görə, Allah buyurur: "Mən nə yerə, nə də səmaya sığaram. Yalnız mömin bəndəmin yumşaq və aram qəlbinə yerləşərəm". Böyük arif Xacə Abdullah Ənsari yazırdı ki, ürəklər Allahın yer üzündəki qablarıdır. Mərifət nurunu, Allahın əhədiyyət (təklik) sifətini ariflərin qəlbindən soruşmaq lazımdır, onların qəlbi mərifət ocağı, onların başı (beyni) məhəbbət xəzinəsidir.

Quranda möminlərin qəlbi haqqında "qəlbi-səlim" (sağlam qəlb) ifadəsi işlədilib (Şüəra, 88-89). İçində Allahdan savayı heç nə olmayan, şirkə və şəkkə yer saxlamayan, dünya məhəbbətindən uzaq olan qəlb sağlam qəlbdir. Qürani-Kərimə görə, Allahı xatırlamaqla möminlərin qəlbi aram olar (Rəd, 28).

Qəlbin də özünəməxsus xəstəlikləri (mərəz) olur. Qurani-Kərimdə onların bir neçəsi sadalanır: şübhə, şəkk, inkar, qəflət, möhürlənmə, paslanma, bərkimə və s. Qəlbi bu kimi mərəzlərdən sağaltmağın yolları Quran oxumaq, ölümü yada salmaq, ehtiyacı olanlara yardım göstərmək, elmli və əxlaqlı adamlarla durub-oturmaqdır.

*"Qara məcmuə"dəki* bir tövsiyədə Şeyx Səfiəddin Ərdəbili *şeyxliyə* layiq olan şəxslərin xüsusiyyətlərini sadalayarkən



bunu da qeyd edir: “Qəlbi vase (geniş) ola. Heç darılmaya, qarğıyıb kimsəyə kişi surət göstərməyə, gülər üzlü, şirin sözlü, nəfsi həlim və qəlbi səlim ola”.

***Mənbələr:*** *Məhəmməd Reyşəhri. Mizan əl-hikmə, III, 2601; S.C.Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.643; Qısa İslam Ensiklopediyası (N.Rəhimovun ümumi redaktəsi ilə, 2 cilddə), I, 132-133; Qara məcmuə, s.35.*



**QƏLƏNDƏR** – bu sözün mənşəyi barədə tədqiqatçılar arasında fikir ayrılığı vardır. Alimlərin bir çoxu “qələndər” sözünün heç bir dilə aid olmadığını bildirdiyi halda bəziləri bunu yonulmamış ağac mənasını bildirən “kələndər (kələndərə)” sözü ilə bağlayırlar (burada “yonulmamış” ifadəsi bəzi insanlar haqqında işlədilən məcazi mənada qəbul oluna bilər). Qələndər özünü hər iki dünyanın sevgisindən və bağlılıqlarından azad etmiş şəxsdir. Qələndərlər adət-ənənələri rədd edir, *şəriətdə* və *təriqətdə* sadəliyi təbliğ edirdilər. Onlar ibadəti tamamilə rədd etməsələr də, uzun-uzadı ibadəti bəyənmir, nafilə (müstəhəb) əməlləri yerinə yetirmir, yalnız vacibatla kifayətlənirdilər. *Məlamətilərdən* fərqli olaraq, qələndərlər öz hallarını cəmiyyətdən gizlətmir, öz düşüncə və davranışlarını açıq sərgiləyirdilər. “Qələndər” sözünün ərəb əlifbası ilə yazılışı 5 hərfdən ibarətdir. Bu hərflərin hər birini simvolik olaraq bir sözlə ifadə etmişlər. “Qaf” hərfi qənaəti, “lam” hərfi (ilahi) lütfü, “nun” hərfi nədaməti (günahlardan peşmançılığı), “dal” hərfi dəyanəti (dindarlığı və ya möhkəmliyi), “ra” hərfi *riyazəti* (mənəvi kamilliyə çatmaq üçün psixoloji-fiziki təmrinləri) ifadə edir.

Qələndərlik sufiyana bir yaşayış tərzi idi, onu sufilik daxilində bir cərəyan adlandırmaq da olar. Məlamətiyyə kimi, qələndəriyyə də xüsusi bir təriqət deyil, düşüncə məktəbi və həyat tərzi idi.

Qələndərlər “cəvaliq” adlanan qaba yundan libas geyinirdilər; bu parçadan xurçun və palaz da hazırlanırdı. Orta əsr mənbələrində qələndərlərə “cəvaliqi” də deyilirdi. Onların qiyafəsi “çahar zərb” adlanan qaydaya uyğun idi, yəni başlarında bitən dörd cür tükü – saç, qaşlar, bığ və saqqalı tam qırxırdılar. Qələndərlər ayaqyalın gəzir, camaatdan topladıqları ianələr hesabına dolanırdılar. Bəzi dövrlərdə qələndərlər yerli hakimlər tərəfindən təqib edilmiş, hətta onlara cəvaliq geyinmək və çahar zərb etmək qadağan olunmuşdu. Getdikcə qələndərlər bütün müsbət xüsusiyyətləri itirib pinti, səliqəsiz, qapı-qapı gəzib dilənən, şəhər meydanlarında gözübağlıcalıq və şəbədəbazlıqla pul qazanan dərvişlərə çevrildilər. Bununla da əvvəllər hörmət sahibi olan qələndərlər xalq arasında tədricən etibardan düşdülər.

“Şeyx Səfi təzkirəsi”ndə qələndərlərdən bir neçə dəfə söhbət açılır, əksər hallarda onlar Şeyx Səfinin paxıllığını çəkən, hətta onun canına qəsd etmək istəyən mənfi obrazda təqdim olunurlar.

Qələndərlər Səfəviyyə dövlətinin də ərazisində yaşayırdılar. İsgəndər bəy Münşi “Tarixi-aləmarayi-Abbasi”də onlar haq-

qında əsasən mənfi fikir yürüdür. Müəllif yazır ki, 1555-ci ildə tiryəkdən istifadə edən başıpozuq qələndərlərin bir dəstəsi Sultaniyyə yaxınlığındakı yaylaqda I Şah Təhmasibin hüzuruna gəlmişdi. Onlar şahın *Mehdi* olduğunu iddia etdilər, şah bu əqidəni rədd edib onları *tövbəyə* çağırdı. Amma qələndərlər fikirlərindən dönmədilər, buna görə onların təxminən 40 nəfəri ağır cəzalandırıldı.

Səfəvilər dövləti ərazisindəki qələndərlər əsasən Şah Məhəmməd Xudabəndənin hakimiyyət dövrünün əvvəllərində bir neçə dəfə üsyan qaldırmışdılar. Hər bir üsyan başçısı iddia edirdi ki, o, *II Şah İsmayıldır*, hamının ölü zənn etdiyi halda o ölməmiş və bir müddət xalq arasında gizli yaşamışdır. Bu motiv əsasında qaldırılan qiyamlar dövlət tərəfindən yatırılmış və qələndər dəstələri darmadağın edilmişdi. Qələndərlərə Osmanlı dövlətində münasibət əvvəlcə müsbət olsa da, 1492-ci ildə Sultan II Bayezidə qarşı həyata keçirilmiş uğursuz suiqəsddə qələndərlər şübhəli bilinərək təqib edildilər, onların bəzi liderləri edam edildi, minlərlə qələndər dərviş öz məskənindən sürgün olundu.

Qələndər terminoloji baxımdan rind məfhumuna yaxındır. Bəzi şairlər "qələndər və rind", "qələndər və mələməti" sözlərini yanaşı işlətmişlər.

Şah İsmayıl Xətainin divanındakı qəzəllərdən biri "qələndər" rədiflidir, bu qəzəldə şair qələndərləri müsbət mənada təqdim edir:

İki aləmdə sultandır qələndər,
Qədimi küfrü imandır qələndər.

Qələndərdir həqiqət sirri-kövneyn,
Əmiri-həyyi-fərmandır qələndər.

Qələndər Mustafavü Murtəzadır,
Zəhi cism ilə həm candır qələndər.

Cahan içində sər ta pa bürəhnə
Şəhin eşqinə qurbandır qələndər.

Müsafirlər ki, məsti-cami-həqdir,
Vüsali-şahə mehmandır qələndər.

Cəhanın darini buldu gəda boş,
Əcayib əhli-imandır qələndər.

Keç indi, şöhrəti-aləm göründi,
Hesaba cümlə ehsandır qələndər.

Vilayət Kəbəsin açdı Xətai,
Qulami-Şahi-mərdandır qələndər.

*(Ş.İ.Xətai)*

***Mənbələr:*** *S.C.Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.645-646; S.Z.Səccadi. İrfan və təsəvvüfün əsaslarına giriş, s.236-240; Lüğətnameyi-Dehxuda, XI, 17732; Türkiye Diyanet Vakfi İslam Ansiklopedisi, XXIV, 253-256; İsgəndər bəy Münşi. Dünyanı bəzəyən Abbasın tarixi (fars dilindən çevirən: Ş.Fərzəliyev, II kitab), s.2054-2055; Sadullah Gülten. Tahrir Defterlerine Göre Anadolu'da Kalenderîler ve Haydarîler, Tarih Araştırmaları Dergisi, Yıl 2012, Cilt: 31 Sayı: 52, s.35-53; Şah İsmayıl Xətai. Əsərləri (2 cilddə), I, 561-562.*



**QƏLƏNDƏRXANA** – səfərlərdə gününü keçirən *qələndər* dərvişlərin qalması üçün tikilən *təkkə*. Orta əsrlərdə bütün İslam coğrafiyasında, o cümlədən, Azər-



baycanda, Orta Asiyada, Səfəvilər dövlətində və xüsusilə Osmanlı imperiyasının ərazisində yüzlərlə qələndərxana fəaliyyət göstərirdi. İlk qələndərxananın XV əsrdə İstanbulda təsis edildiyi yazılır. Qələndərxanaların daxili intizam qaydası vardı. Bəzi qələndərxanalarda yalnız subay dərvişlərin qalması şərt qoyulurdu, hətta işçi personalın və rəhbərliyin də subay olması şərt idi.
*bax:* **QƏLƏNDƏR.**

**QƏLƏNDƏRİYYƏ** – təsəvvüfdə mühüm cərəyanlardan biri. Bu, konkret təriqət deyil, düşüncə və yaşam tərzidir. Qələndəriyyə düşüncəsinin kökündə hər iki dünyadan əlaqəni kəsmək, nə dünyaya, nə də axirətə bağlı olmaq, adət-ənənələri rədd etmək durur. Qələndəriyyə cərəyanında *şəriət* tamamilə tərk edilmir, amma ibadətdə və *təriqət* ayinlərində son dərəcə sadəliyə üstünlük verilir. *Məlamətiyyə* ilə qələndəriyyə arasındakı əsas fərq bundan ibarətdir ki, məlamətilər öz real həyat tərzlərini gizlədir, özlərini xalq arasında tam əks şəkildə nümayiş etdirirdilər. Qələndəriyyədə isə bu cür gizlilik və qapalılıq prinsipi yoxdur, onlar öz əqidələrini aşkar şəkildə təbliğ edirdilər. Qələndəriyyə düşüncəsinin X əsrdə yaşamış Cəmaləddin Savi tərəfindən formalaşdığı ehtimal edilir. Digər nəzəriyyəyə görə, qələndəriyyənin banisi XIV əsrdə yaşamış Yusif adlı *bektaşi* dərvişi olmuşdur. Kobud xasiyyətinə görə ("qələndər" sözünün "yonulmamış" mənası verdiyini yazırlar) bektaşilər Yusifi öz sıralarından qovmuş, o da yeni bir yol yaradaraq ətrafına tərəfdar toplamağa başlamışdı. Qələndəriyyə Orta Asiyadan Şimali Afrikaya kimi böyük bir ərazidə yayılmışdı.
*bax:* **QƏLƏNDƏR.**

***Mənbələr:*** *Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.645-646; Seyid Ziyaəddin Səccadi. İrfan və təsəvvüfün əsaslarına giriş, s.236-240; Türkiye Diyanet Vakfi İslam Ansiklopedisi, XXIV, 253-256; Sadullah Gülten. Tahrir Defterlerine Göre Anadolu'da Kalenderîler ve Haydarîler, Tarih Araştırmları Dergisi, Yıl 2012, Cilt: 31 Sayı: 52, s.35-53.*

**QIRX MƏQAM** – mühüm təsəvvüf terminlərindən biri. *Salikin* Allaha doğru mənəvi təkamül yolu *(seyrü-süluk)* dörd mərhələdən ibarətdir: *şəriət, təriqət, mərifət* və *həqiqət*. Bunlara simvolik olaraq dörd qapı deyirlər. Hər qapıdan on məqam ayrılır və beləliklə, məqamların ümumi sayı 40 olur. Salik 40 məqamı ardıcıl olaraq mərhələ-mərhələ adlamalı və kamilləşməlidir. 40 məqamın sonunda o, həqiqətə çatır və Haqqa qovuşur. Təsəvvüf ədəbiyyatında 40 məqamın adları və geniş izahları verilir. Dörd qapı və qırx məqam məfhumu *ələvi-bektaşi* və *qızılbaş* inancında mühüm yer tutur.
*bax:* **DÖRD QAPI və QIRX MƏQAM.**

***Mənbələr:*** *Hacı Bektaş Veli. Makalat (hazırlayanlar: A.Yılmaz, M.Akkuş, A.Öztürk), s.44-52 və 68-81; Abdullah Kahraman. Yunus Emre Divanında Şeriat, Tarikat, Hakikat ve*

*Marifet (Dört Kapı), Kocaeli İlahiyat Dergisi, c. 1, sy. 1, Mayıs 2017, s.1-18; Hüseyin Özcan. Bektaşîlikte Dört Kapı Kırk Makam, Türklük Bilgisi Araştırmaları (TUBA), Volume 28/1, 2004, ss. 241-245; Anton Jozef Dierl. Anadolu Aleviliği, s.123-126; Musa Kazım Engin. Hak ve Hakikat Yolu Alevilik, s.31-47.*

**QIRXLAR MƏCLİSİ** – *ələvi* inancında mühüm yeri olan mistik-alleqorik hadisə. Ələvi inancına görə, Mühəmməd Peyğəmbər (s) meracdan qayıdarkən bir otaqda 40 nəfərin toplaşdığını görmüş, onlarla görüşmüşdür. Bu 40 nəfər *rical əl-ğeyb, abdallar, ərənlər* kateqoriyasına mənsub olan seçilmiş şəxslər idi. Onlar gizli sirləri bilirdilər, dünyanın idarəçiliyini Allah onlara tapşırmışdır. Guya Həzrət Məhəmməd (s) həmin gün peyğəmbər deyil, ərənlərin biri kimi onların məclisinə qatılmış, onlarla birlikdə mistik ayinləri icra etmiş, *səma* ayinini yerinə yetirmişdir. Bu hadisə *ələvi-bektaşi* mənbələrində "qırxlar məclisi" adlandırılır. *Həzrət Əli (ə)* və Salman Farsi də həmin məclisin üzvü olmuşlar. Qırxlar məclisi mövzusunda ələvi-bektaşi inancına xurafat və mistika qarışmışdır; bu mövzuda ələvi inancı İslam dininin ənənəvi əqidə əsasları ilə ziddiyyət təşkil edir.

*bax:* **RİCAL əl-ĞEYB.**

***Mənbələr:*** *Ahmet Yıldırım. Tasavvufda Ricalu'l-Gayb Telakkisi ve Konuyla İlgili Bazi Rivayetler, Süleyman Demirel Üniversitesi İlahiyat Fakültesi Dergisi, Yıl: 1997, Sayı: 4, s.117-147; Filiz Kalyon. Alevi Bektaşi Şiirlerinde Kullanılan Sembollere Dair Bir İnceleme, IV. Uluslararası Alevilik ve Bektaşilik Sempozyumu, (18-20 Ekim 2018, Ankara), s.754-755.*

**QIZILBAŞ ƏDƏBİYYATI** – qızılbaş *ozan*-şairlər tərəfindən yaradılmış, qızılbaş-ələvi-bektaşi inancının əsaslarını bədii dillə bəyan edən orta əsrlər türkdilli ədəbiyyatının mühüm tərkib hissəsi. Qızılbaş ədəbiyyatı Şərq təsəvvüf ədəbiyyatının parlaq səhifəsini təşkil edən zəngin ədəbi mirasdır. Bu ədəbiyyat nümunələrinin ən mühüm xüsusiyyətləri sadəlik, xalq düşüncəsinə bağlılıq və türk koloritidir. Qızılbaş ədəbiyyatının təşəkkül tapmasında *ələvilik, bektaşilik, batinilik, hürufilik, məlamətiyyə, fütüvvət* ideyaları böyük rol oynamışdır. Allah-bəndə, təbiət-insan, *mürşid-mürid* münasibətləri, əxlaqi dəyərlər, ümumbəşəri sevgi, xeyirxahlığa dəvət, *Əhli-beyt* imamlarının vəsfi bu ədəbiyyatın başlıca mövzularını təşkil edirdi. Qızılbaş ədəbiyyatı ələvi-bektaşi ədəbiyyatı ilə vahid bütöv halında, bir-birindən ayrılmaz şəkildə mövcud olmuşdur. Hacı Bektaş Vəli, Yunus Əmrə, Seyid Əli Sultan, Səid Əmrə, Abdal Musa Sultan, Qayğısız Abdal, Şeyx Bədrəddin Simavi, Balım Sultan kimi görkəmli sufi şairlərin əsərləri qızılbaş ədəbiyyatının mühüm mənbələri sayılır.

Qızılbaş ədəbiyyatının nümayəndələrinin bir qismi Anadoluda, bir qismi də Səfəvilər dövlətində yaşayıb-yaratmışdır. I Şah İsmayılın sarayında bir neçə qızılbaş şair-ozan fəaliyyət göstərirdi. Müharibədən əvvəl ozanlar qızılbaş or-



dusunun qarşısında çıxış edib öz ifaları ilə döyüşçülərdə ruh yüksəkliyi yaradırdılar. Qızılbaş ədəbiyyatında ələvilikdəki *yeddi ulu ozanın* xüsusi yeri vardır: *İmadəddin Nəsimi, Şah İsmayıl Xətai, Məhəmməd Füzuli, Yəmini, Virani, Pir Sultan Abdal* və *Qul Hümmət*. I Şah İsmayılın yaradıcılığı qızılbaş ədəbiyyatında müstəsna yer tutmuş və sonrakı ozanlar üzərində ciddi təsir qoymuşdur.

Qızılbaş ədəbiyyatı nümunələri əsasən sadə xalq dilində və heca vəznindədir. (Qızılbaşlar özləri bunlara "nəfəs" deyirdilər), əruz vəznində yazılmış şeirlər də öz sadəliyi ilə seçilir. Bu şeirlərdə qızılbaş inancının əsasları ilə yanaşı orta əsrlərdəki türk toplumunun həyat və düşüncə tərzi də bariz şəkildə görünür. Yüksək emosionallıq, fikir azadlığı, fəlsəfi axtarışlar qızılbaş ədəbiyyatının xarakterik xüsusiyyətləri sayılır.

*bax:* **YEDDİ ULU OZAN.**

***Mənbələr:*** *İsmail Özmen. Alevi-Bektaşi Şiirleri Antolojisi (5 clddə); Fuad Köprülü. Türk Edebiyatı'nda İlk Mutasavvıflar, s.300-305; Reyhan Kele. Yedi Ulu Ozan'ın "Yedi" Sembolizmi ("Türk Kültürü ve Hacı Bektaş Veli Araştırma Dergisi", 2017, Sayı: 83), s.49-79; Filiz Kılıç. Alevilik ve Bektaşilikte yedi ulu ozan.*

**QIZILBAŞ PAPAĞI** – *qızılbaşlığın* rəmzi. Səfəvilər dövlətinin yaranmasından əvvəl qızılbaş inancının simvolu sayılmış, Səfəvilər dövlətində də bu cür qəbul edilmişdir. Adından da göründüyü kimi, qırmızı rəngli xüsusi biçimli papaqdan ibarət idi. Qızılbaş papağının tarixini I Şah İsmayılın atası *Şeyx Heydərlə* bağlayır, bu papağın hazırlanma qaydasının ona yuxuda *İmam Əli (ə)* tərəfindən öyrədildiyini, özünün və tərəfdarlarının da başına bu papağı qoymaları barədə ondan göstəriş aldıqlarını yazırlar. Qızılbaş papağı *12 imamı* və ya sufinin özündən uzaqlaşdırmalı olduğu 12 mənfi xüsusiyyəti simvolizə edən 12 qırmızı zolaqdan ibarət olurdu. Hətta döyüş dəbilqələrinin üzərindən də bu papağı geyinirdilər. Mənbələrdə qızılbaş papağı *"heydəri tacı"* adı ilə də xatırlanır. Başına qızılbaş papağı (tacı) qoymaq qızılbaş inancını qəbul etmək və Səfəvilərin tərəfinə keçmək mənasını verirdi.

*bax:* **HEYDƏRİ TACI.**

***Mənbələr:*** *Səccadi Hüseyni. "Qızılbaş" sözünün semantik məna formaları ("Mütaliati-tarixi-İslam" dərgisi, 1396 h.-ş., №32, s.73-101); Türkiye Diyanet Vakfı İslam Ansiklopedisi, XXV, 547; Aləmarayi-Səfəvi, s.30; Tarix-i aləmara-yi Abbasi (tərcümə və şərhlər: O.Əfəndiyev, N.Musalı), s.66; Qulamrza Mehdi Ravənci. Səfəvi dövrünə aid geyimlərin xarakteri barədə tarixi araşdırma ("Pejuheşnameyi-tarix" dərgisi, 1399 h.-ş., №58, s.113-132); Budaq Münşi Qəzvini. Cəvahir əl-əxbar, s.119; Seyid Möhsin Əmin. Əyan əş-şiə, I, 21.*

**QOVS** – əslində "ğavs" olan bu sözün tərcüməsi "yardım" deməkdir. Ərəb dilində Allahdan və ya kimsədən yardım istəyib yalvarmağa "istiğasə" deyirlər. Təsəvvüfdə təriqət *şeyxləri, qütblər* qovs adlandırılır, *mürid* şeyxə yardım üçün müraciət edəndə onu bu adla

çağırır. Belə bir inam vardır ki, mürid çətinliyə düşəndə, nəfsinin ona qalib gəlməyə başladığını görəndə çox uzaqda olsa belə mürşidi çağırıb ondan yardım diləyir və mürşid qeyb aləmindən ona kömək edir.

Bir neçə təriqətin silsiləsində yer tutan Əbdülqadir Gilaniyə "qovsi-əzəm" (ən böyük yardım) ləqəbi verilmişdir.

Səfəviyyə təriqətinin banisi Şeyx Səfiəddin Ərdəbilinin həyatından bəhs edən *"Səfvət əs-səfa"* kitabında onun yardıma ehtiyacı olan şəxslərin dadına yetməsi haqqında çoxlu əhvalat qeyd edilib. Həmin kitabda şahidlərin dilindən nəql edilir ki, yolu itirib azan, çovğuna düşən, həbsdə olan insanlar Şeyx Səfini yardıma çağırır, o da çox uzaq məsafədə olmasına baxmayaraq, köməyə yetişib insanları çətinlikdən xilas edirmiş.

***Mənbələr:** Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.610; Lüğətnameyi-Dehxuda, XI, 16844; İbn Bəzzaz Ərdəbili. Səfvət əs-səfa, s.294-341.*

**QÜRB** – *seyrü-süluk* yolunda *müraqəbədən* sonra gələn növbəti *hal*. Haqq yolçusunun özünü unudub Allaha yaxınlaşması, *fəna* dərəcəsinə çatıb hər şeyi unutmasıdır. "Qürb odur ki, ortaya çıxan hər şeyi ortadan götürəsən, sevən ilə Sevilən arasında yaranan maneələri kənarlaşdırasan". Sufilərdən biri deyib: "Nəyə baxdımsa gördüm ki, Allah ona məndən daha yaxındır".

"Risaleyi-Quşeriyyə"də yazılıb ki, bəndə Allaha itaət etməklə qürb halına yetişər və qürbün şərti davamlı ibadətdir.

Deyirlər ki, bəndənin qəlbi Haqqa nə qədər yaxın olsa, Haqq da ona o qədər yaxın olar.

Sufilər qürb halından danışarkən Qurani-Kərimin bu ayəsinə tez-tez istinad edirlər: "Biz ona (insana) şah damarından da yaxınıq" (Qaf, 16).

Rəvayət edirlər ki, Zünnun Misri həcc mövsümündə Kəbənin ətrafında təvaf edərkən arıq bədənli, gözləri çuxura düşmüş bir cavan oğlan görür. Zünnun ondan soruşur: "Sevgilin varmı?" Oğlan cavab verir: "Bəli, var". Zünnun soruşur: "Sevgilin sənə yaxındır, yoxsa uzaq?" Oğlan deyir: "Yaxındır". Zünnun yenə sual verir: "Səninlə həmdil və həmfikirdir, yoxsa sənin əksinədir?" Oğlan deyir: "Mənimlə həmtay və mənə uyğundur". Zünnun təəccüblə söyləyir: "Sübhan Allah! Sevgilin həm yaxındır, həm də sənə uyğundur, sən isə bu cür pərişan və dərdli gəzirsən?!" Oğlan cavab verir: "Məgər bilmirsən ki, yaxınlığın sonunun əzabı uzaqlığın sonunun əzabından daha şiddətlidir?"

***Mənbələr:** Seyid Ziyaəddin Səccadi. İrfan və təsəvvüfün əsaslarına giriş, s.33-36; Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.637; Sərrac Tusi. Əl-Lümə, s.84-85.*

**QÜTB** – dünyanın oxu, məhvəri deməkdir. Təsəvvüf aləmində ən yüksək dərəcəyə çatmış insanlara qütb deyilir. Qütb Allahın ona öyrətdiyi bütün sirlərə vaqifdir, *ismi-əzəmi* və *hürufi-müqəttəənin* sirrini bilir. Klassik sufi anlamında



qütb heç kəsin konkret tanımadığı, gözlərdən gizli olan *rical əl-ğeybin* birincisi və başçısıdır. Amma ənənəyə əsasən, böyük sufi təriqətlərinin başçılarını da qütb adlandırmışlar. Bəzən "yardım, kömək" mənasını verən *"qovs"* (ğəvs) məfhumunu da qütblə eyniləşdirirlər. Sufilər mənəvi təkamül yolunda çətinliyə düşəndə, *nəfslərinin* əlində aciz qalanda qovsdan yardım istəyirlər. Bu mənada qütb və qovs elə *mürşid* məfhumu ilə eyniyyət təşkil edir. Sufi mənbələrində deyilir ki, varlıq aləmində qütbün məqamı bədəndəki ruhun məqamı kimidir.

Böyük şiə alimi *Şeyx Bəhai* "Tovzih əl-məqasid" əsərində *Şeyx Səfiəddin Ərdəbilidən* söz açarkən onu "qütb əl-əqtab", yəni qütblərin qütbü adlandırır.

***Mənbələr:*** *Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.610 və 641; Şeyx Bəhai. Tovzih əl-məqasid, s.4; Ahmet Yıldırım. Tasavvufda Ricalu'l-Gayb Telakkisi ve Konuyla İlgili Bazi Rivayetler (Süleyman Demirel Üniversitesi İlahiyat Fakültesi Dergisi, Yıl: 1997, Sayı: 4), s.125-127.*

**LAHUT ALƏMİ** – uca, yüksək aləm. Allahın əhədiyyət məqamına işarədir. Təsəvvüf ədəbiyyatında ona əhədiyyət, qeybi-mütləq, ümmül-kitab, la təəyyün (qeyri-müəyyən) aləmi də deyirlər. Bu aləmdə yalnız Allah-Taala var idi, Ondan başqa heç nə xəlq olunmamışdı. Allahın sifətləri və isimləri də hələ *təcəlla* etməmişdi, çünki təcəlla edəcək obyektlər hələ yaradılmamışdı. Sufilər bu aləmi təsəvvür etmək üçün məşhur bir hədisi-qüdsiyə istinad edirlər. Allah-Taala Davud Peyğəmbərə (ə) buyurmuşdur: "Mən gizli xəzinə idim. Tanınmaq istədim, məxluqatı yaratdım ki, tanınım".

Məşhur sufi müəllifi Əzizəddin Nəsəfi "Kəşf əl-həqaiq" əsərində bu rəvayəti şərh edərək yazır: "İnsanın bu qədər uca məqama malik olmasının səbəbi budur ki, özünü bilir, bununla da Allahı tanıyır. Bütün məxluqat aləminin yaradılışı adəmdən ötrüdür, qalan hər şey ona möhtacdır. Yaradılışın hikməti budur ki, O (Allah), tanınsın. Davud (ə) Allaha minacatında söylədi: "İlahi, məxluqatı niyə yaratmısan?" Allah buyurdu: "Mən gizli xəzinə idim. Tanınmaq istədim". Yalnız insan Allahı tanımağa qadirdir". Klassik sufi ədəbiyyatında "kuntu kənzən" (tərcüməsi: "xəzinə idim", hədisin ərəbcə mətnində bu ifadə edilir), "gənci-məxfi", "gənci-nihan" (gizli dəfinə) və s. bu kimi ifadələrə tez-tez rast gəlmək mümkündür:

"Küntü kənz"in ayəti vəsfində olmuşdur nüzul,
Varlığına "kun-fəkan" iqrar edən Pərvərdigar.

Xandadır ol bimisalın ibtidasi, xandadır?
Kim bilir ol küntü kənzin intəhası xandadır?

*(Ş.İ.Xətai)*

*bax:* **ALƏMLƏR.**

***Mənbələr:*** *Seyid Ziyaəddin Səccadi. İrfan və təsəvvüfün əsaslarına giriş, s.11-12; Süleyman Ateş. İşari Tefsir Okulu, s.260-264; Əbdüləziz ibn Məhəmməd Nəsəfi. Kəşf əl-*

*həqaiq (nəşrə hazırlayan: Ə.M.Damğani), s.151; Şah İsmayıl Xətai. Əsərləri (2 cilddə), I, 5 və 241.*

**LƏB** – dodaq deməkdir. İrfani anlamda Allahın öz sevimli bəndələri ilə danışmasını, yəni Allahdan gələn ilhamı bildirir. Klassik ədəbiyyatda "dəhan" (ağız) sözü ilə yanaşı işlədilir. Allah ölü canlara ruh üfürüb onları dirildər, ləb bu prosesin vasitəsidir. Mərifətsiz can da ölü kimidir, yalnız şirin dodaq, yəni Allahla vasitəsiz ünsiyyət ona həyat verər.

Məşuqun dodağının və ağzının şirinliyini, yəni ilahi mərifətin cazibədarlığını bildirmək üçün ariflər ən müxtəlif bənzətmələrdən istifadə etmişlər.

Aşiq həmişə yarının ağzının kiçikliyindən və hətta yoxluğundan şikayət edir. Bu da onun ilahi *mərifəti* qəbul etmə bacarığının azlığından şikayət kimi başa düşülməlidir. Aşiq həmişə bunu arzu edir ki, Məşuqun (Allahın) dodaqlarından daha çox söz eşitsin, çünki ilahi *təcəlla* qarşısında *vəcd* halındadır və bu halını itirməkdən, Allahla rabitənin kəsilməsindən qorxur.

Sordum: ağzın zərrəmi, ya qönçəmidir,
ya dəhan?
Bu sözüm, yoxsa xəyalım, ya gümanımdır mənim.
*(Ş.İ.Xətai)*

***Mənbələr:*** *Qısa İslam Ensiklopediyası (N.Rəhimovun ümumi redaktəsi ilə, 2 cilddə), I, 278; Əbdülbaqi Hiyləmən. İrfan terminləri və nüanslar, s.185; Ethem Cebecioğlu. Tasavvuf Terimleri ve Deyimleri Sözlüğü, "leb" maddəsi; Şah İsmayıl Xətai. Əsərləri (2 cilddə), I, 366.*

**LÖVHİ-MƏHFUZ** – ərəb dilindən tərcüməsi qorunan lövhə deməkdir. Dünyanın əvvəlindən sonuna kimi baş vermiş və baş verəcək hər şey, bütün hadisələr, əməllər, sözlər, savab və günahlar, o cümlədən, Qurani-Kərim və digər səmavi kitablar Lövhi-məhfuzda pozulmaz və möhkəm şəkildə yazılıb. Lövhi-məhfuz qəza və qədərin qeyd edildiyi bir kitabdır, Allahın hüzurundadır. Allah Quran barədə buyurur: "O, şanlı-şərəfli Qurandır. O, Lövhi-məhfuzdadır!" Heç nə lövhdəki yazıdan kənar baş verə bilməz. Lövhi-məhfuzda yazılana pozu yoxdur. Qiyamət günündə bəzi həqiqətlərin üstü açılacaq və onlar Lövhi-məhfuzdan canlandırılacaq.

Allahın daha bir lövhü (kitabı) vardır ki, orada yazılanlar dəyişə bilər. Məsələn, insanın *duası*, yaxşı və ya pis əməlləri onun aqibətini pisliyə və ya yaxşılığa doğru dəyişdirə bilər. Buna "lövhi-məhv və isbat" (yazıla və pozula bilən lövhə) deyirlər. Bu iki kitab barədə Quranda buyurulur: "Allah (həmin kitabdan) istədiyi şeyi məhv edər, istədiyini də sabit saxlayar. Kitabın əsli (Lövhi-məhfuz) onun yanındadır" (Rəd, 39)).

Ş.İ.Xətainin qəzəllərində "Lövhi-məhfuz" ifadəsi gözəl poetik boyalarla işlədilib:

Gəldi "sübhan-əlləzi əsra bi-əbdeh"
şəninə,
Lövhi-məhfuz üstə ol hüsnin bəyani
xandadır?



Lövhi-məhfuzin Xətai əbcədin qıldı
bəyan,
Div deyilsən, xatəmin xətmində Fəzlül-
lahı gör.
*(Ş.İ.Xətai)*

Məşhur təsəvvüf xadimi Nəsəfi yazırdı ki, iki cür Lövhi-məhfuz vardır: xüsusi və ümumi. Dünyada olmuş, var olan və olacaq hər şey ümumi Lövhi-məhfuzda yazılıb. Amma xüsusi Lövhi-məhfuzda bunların hamısı yox, bir qismi qeyd edilib.

Klassik ədəbiyyat nümunələrində aşiqin qəlbi də lövhə bənzədilir, bu lövhün üzərində onun məşuqdan çəkdiyi bəlalar yazılıb:

Lövhi-dildə boylə təskin tapmış ikən
qəmləri,
Bir dəxi yengidən inşa qıldığın yəni ki nə?
*(Ş.İ.Xətai)*

***Mənbələr:*** *Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.689-690; Təfsiri-nümunə, X cild ("Rəd" surəsinin 39-cu ayəsinin təfsiri); Türkiye Diyanet Vakfı İslam Ansiklopedisi, XXVII, 151; Şah İsmayıl Xətai. Əsərləri (2 cilddə), I, 143, 169, 460.*

**MEY** – zahiri mənası şərab, məstedici içki deməkdir. İrfan aləminə bələd olmayan şəxslər bəzi şeirlərdəki "şərab" və "mey" sözlərini zahiri mənada qəbul edirlər. Amma Nizami, Xaqani, Ömər Xəyyam, Sənai, Hafiz, Şəms Təbrizi, Nəsimi, Xətai, Füzuli kimi böyük ariflərin yaradıcılığına nəzər salanda görürük ki, əslində onlar məcazi meydən və şərabdan danışır, həqiqi şərabı isə haram bilirdilər. Həqiqətən, sufi terminləri arasında bir qrup sözlərə rast gəlirik ki, onların hamı tərəfindən başadüşülən və qəbul edilən zahiri mənası ilə təsəvvüf aləmindəki mənası arasında kəskin fərq var. Bu sözlər adi anlamda ya təsəvvüflə qəti əlaqəsi olmayan əşyaları, bəzi hallarda isə hətta dünyəvi həyatın ləzzətlərini, eyş-işrət məclislərinə xas əməlləri ifadə edir. Amma sufilərin dilində bu sözlər ən ülvi mənaları, Allah-bəndə münasibətlərini kəsb edir.

Bu ziddiyyətin səbəbini müxtəlif cür izah edənlər var. Ən geniş yayılmış fikrə görə, sufilər bu yolla öz fikirlərini gizlətməyə, öz daxili aləmlərini biganə insanlardan qorumağa çalışırdılar.

Ey dünyanın meyindən ulaşan xumarına,
Eşqin şərabın istə ki, dəfi-xumar edər.

Düşməz xumarın rəncinə vəhdət meyin-
dən ta əbəd
Şol məsti-həq kim, saqisi ol nərgisi-
məstanədir.

Maül-ənəbdəndir əgər hər sərxoşun sər
xoşluğu,
Mən içmişəm eşqin meyin, sərməstü
xumar olmuşam.
*(Nəsimi)*

Bu Xətayi içdi andan dər əzəl bir cür'ə
mey,
Ta əbəd hüşyar olmaz, məsti-cavidan-
durur.
*(Ş.İ.Xətai)*

Ariflərin dilində mey müxtəlif mənalarda işlədilib. İlahi *təcəllanı* görüncə haqq yolçusu *vəcd* halına düşür, *eşq* ona

qələbə çalır. Onun vəziyyəti sərxoş və məst adamların halına bənzəyir; bu, mənəvi ekstaz halıdır.

Klassik şeirlərdə mey ilahi mərifət mənasında da işlədilir. *"Piri-muğan"* adlandırılan təriqət başçısının işarəsi ilə *saqi* (irfan yolunun bələdçisi, *mürşid*, ustad) onun *camına (qəlbinə)* mey süzür (ilahi bilikləri ötürür).

Bəzən isə mey vəcd halında olan aşiqin gözlərindən süzülən yaşdır. Allaha ibadət edən aşiq minacat halında riqqətə gələrək göz camını meylə (göz yaşı ilə) doldurur. Bu göz yaşı ürək qanı ilə birləşib qırmızı rəng alır və şəraba bənzəyir.

Səfəviyyə təriqətinin əsaslarını özündə ehtiva edən *"Şeyx Səfi təzkirəsi"ndə* deyilir: "İmdi bu şürb ilən şərab üç qismdürlər. Bir(inci) qism mömin ilə sufiyi-əvamundur (ümumi sufilərin) ki, ol "şərabən təhura"dur (pak içkidir) və anı içməkdən vüsalun tələbi və təmənnası hasil olur. Və ikinci qism bir şərabdur ki, Tanrı-Taala onu kəndü xass bəndələri içün saxlayubdur kim, ol eşq ilə məhəbbətün şərabıdur və anı içməkdən masəvallahı (Allahdan savayı hər şeyi) tərk etmək və Tanrıya vasil olmaq hasil olur. Və üçüncü bir şərabdur ki, Tanrı-Taala kəndü xassül-xass bəndələri içün mühəyya (hazır) qılubdur və ol, mərifət şərabıdur..."

*bax:* **ŞƏRAB.**

***Mənbələr:*** *Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.751; Seyid Ziyaəddin Səccadi. İrfan və təsəvvüfün əsaslarına giriş, s.275; Şah İsmayıl Xətai. Əsərləri (2 cilddə), I, 210; Şeyx Səfi təzkirəsi ("Səfvətüs-səfa"nın XVI əsr türk tərcüməsi), s.408.*



**MEYXANƏ** – hərfi mənada şərab məclisi, şərab içilən yer deməkdir. İrfan terminologiyasında arifin *eşq* və *mərifətlə* dolu *qəlbini* belə adlandırırlar. Eləcə də haqq aşiqlərinin toplaşdığı yığıncaqlara, təriqət *şeyxinin* dərs və söhbət məclislərinə də meyxanə deyilir. Meyxanədə aşiqlər saqidən mey alıb içirlər, yəni onlara Allahdan ilham və *kəşf* gəlir, təriqət mürşidi onlara *seyrü-sülukun* incəliklərini öyrədir.

Əzəldən eşq ilə divanə gəldim,
Yerim meyxanədir, məstanə gəldim.
*(Ş.İ.Xətai)*

Çox zaman irfan şeirlərində meyxanə məscidə qarşı qoyulur, məscid eşqdən bixəbər, zövqsüz zahidlərin məskəni kimi tanıdılır. Şair məscidi və məscidə aid atributları (səccadə, *təsbeh*, namaz və s.) tənqid atəşinə tutur. Bunları da simvolik mənada qəbul etmək lazımdır. Orta əsrlərdə sxolastik İslamın nümayəndələri olan ruhanilər arifləri küfrdə ittiham edir, onların yolunu azğınlıq sayır, məscidlərdə, dini ocaqlarda irfan və təsəvvüf əleyhinə təbliğat aparırdılar. Ona görə də irfan ədəbiyyatında məscidlər və məscid adamları mənfi obraz kimi təqdim edilir:

Zahid, qoparma sən məni meyxanədən bu gün,
Ruzi-əzəldə yar ilə peyman yetər mana.



Zahid aydır: - Ey Xətayi, rəxtü dəstarın xanı?
- Qoymuşam meyçün girov, meyxanələr küncündədir.
*(Ş.İ.Xətai)*

İrfan ədəbiyyatında "xərabat" sözü də eyni mənada işlədilir.

***Mənbələr:*** *Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.752; Qısa İslam Ensiklopediyası (N.Rəhimovun ümumi redaktəsi ilə, 2 cilddə), I, 277; Şah İsmayıl Xətai. Əsərləri (2 cilddə), I, 70, 207 və 575.*

**MƏCZUB** – *cəzbə* halında olan salikə verilən ad. Allahın cəzbəsini qazanmış *salikə* "məczub" deyirlər. Məczub sufiyə ətrafdakılar dəli kimi baxarlar.

Şeyx Səfiəddin Ərdəbili məczubun vəziyyətini bu cür təsvir edirdi: "Salik ol vəqt bəşəriyyətdən xilas olur ki, Tanrı-Taalanun cəzbələri yetə və onu məczublardan eyləyə. Yəni ... məczub olub Tanrınun cəzəbatında bəşəri aləmdən xilaslıq tapa, bəşəri aləmün fikri və pərvası ondan götürülə və mərifətlər hasil edə və sirlər məlum qıla və Allahına bilici ola".

*bax:* **CƏZBƏ.**

***Mənbələr:*** *Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.285-286; Ethem Cebecioğlu. Tasavvuf Terimleri ve Deyimleri Sözlüğü, "cezbe" maddəsi; İzzəddin Kaşani. Misbah əl-hidayə və miftah əl-kifayə, s.110-111; Şeyx Səfi təzkirəsi ("Səfvətüs-səfa"nın XVI əsr türk tərcüməsi), s.430.*

**MƏHƏBBƏT** – *seyrü-süluk* yolunda sufinin keçdiyi 10 *haldan* biri. Əbu Nəsr Sərrac Tusi "əl-Lümə" kitabında onu halların sırasında üçüncü yerdə (*qürb* ilə *xovfun* arasında) yerləşdirir. Sufilərin fikrincə, bütün *məqamların* bünövrəsi və əsası *tövbə* olduğu kimi, bütün halların da bünövrəsi məhəbbətdir. Deyirlər ki, Allahın bəndəyə məhəbbəti rəhmətdən də üstündür və yalnız seçilmişlərin seçilmişlərinə şamil olar. Təsəvvüfdə məhəbbətdən danışılarkən Allaha olan sevgi nəzərdə tutulur, əsl sevgi Ona ünvanlanmalıdır, Ondan başqasına yönələn sevgi *saliki* düz yoldan azdırar. Qəlbi digər sevgilərdən boşaltmaq və yalnız Allahın məhəbbəti ilə doldurmaq lazımdır.

Məhəbbətə çoxlu təriflər verilmişdir. Təriflərin birində deyilir: "Məhəbbət ürəkdə olan bir oddur ki, məhbubun (sevgilinin) istəyinə uyğun gəlməyən hər şeyi yandırar".

İnsanın məhəbbətini 6 mərhələyə ayırırlar: Birinci mərhələ xasiyyət və zövqün nəyə isə uyğun gəlməsi, onunla üst-üstə düşməsidir. İkinci mərhələ – meyil, üçüncü – vüdd, dördüncü – məhəbbət adlanır. Beşinci mərhələni valehlik, yəni sərgərdanlıq və heyranlıq adlandırırlar. Nəhayət, altıncısı həva mərhələsidir ki, hava kimi saf və qarışıqsız olar, bu mərhələdə sevgilidən savayı bütün arzu və istəklər ürəkdən çıxar.

Şeyx Səfiəddin Ərdəbili deyirdi ki, Günəş torpağı qızdırıb bitkiləri cücərtdiyi kimi, Allahı zikr etmək nəticəsində sufinin qəlbində Allahın məhəbbət odu alışar, bu od onun qəlbini bürümüş nəfs buzunu əridər. Yumşalmış və "əkinə"

hazır olan qəlbə Allah Öz rəhmət yağışını yağdırar və bunun nəticəsində cürbəcür mərifət gülləri qəlbdə cücərər.

Sufi mənbələrində məhəbbət üçün sadalanmış xüsusiyyətlərdən məlum olur ki, əslində məhəbbət *eşqin* əvvəli və müqəddiməsidir. Məhəbbət kamilləşərək sonda eşqə çevrilir. Eşq bəndənin Allaha münasibətinin ən kamil formasıdır.

***Mənbələr:*** *Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.700-705; Sərrac Tusi. Əl-Lümə, s.86-88; Seyid Ziyaəddin Səccadi. İrfan və təsəvvüfün əsaslarına giriş, s.36-38; Şeyx Səfi təzkirəsi ("Səfvətüs-səfa"nın XVI əsr türk tərcüməsi), s.357-358; İzzəddin Kaşani. Misbah əl-hidayə və miftah əl-kifayə, s.404-410.*



**MƏQAM və HAL** – mühüm təsəvvüf terminləri, *salikin* (haqq yolçusunun) *seyrü-süluk* yolundakı mənzilləri.

Təsəvvüf mövzusundakı kitablarda məqam bu şəkildə izah edilir: "Ariflərin yanında hər kəsin məqamı müəyyən *ədəb* və *ayinləri* icra etdikdən, xüsusi hazırlığı keçdikdən və lazımi çətinliklərə dözdükdən sonra tutduğu yerdən ibarətdir. Bir məqamda durub onun əməllərini yerinə yetirən adam həmin məqamın əməllərini lazımınca başa vurub haqqını icra etməyincə, digər məqama keçə bilməz".

Hal haqqında isə belə deyirlər: "Haqq yolçularının dilində hal – qəlbə ixtiyarsız, qəsdsiz və qazanılmadan daxil olan mənalardır".

Məqam və hal oxşar anlayışlar olsa da, aralarında fərq vardır. Belə ki, məqamdan fərqli olaraq, hal tez ötüb keçəndir və qəlbdə qərar tutub qalmaz. Halı söz vasitəsilə təsvir və əhatə etmək mümkün deyil. Fərəh, hüzn, şövq, heybət və s. bu kimi emosiyaları da hallara aid etmişlər.

İzzəddin Mahmud Kaşani "Misbah əl-hidayə" əsərində məqamla halın fərqini belə şərh edir: "Hallar (Allahdan) hədiyyədir, məqamlar isə qazanılandır (kəsb ediləndir). Hal və məqamlar barədə şeyxlərin fikir ayrılığının səbəbi bundadır ki, bəziləri bir şeyi hal, digərləri isə məqam saymışlar. Elə bütün məqamlar əvvəldə hal, axırda məqam olur".

Şeyx Səfiəddin Ərdəbili də bu barədə söyləmişdir: "Məqam kəsb ilən hasil etmək olur, amma hal kəsb ilən hasil olmaz və ol Tanrınun ətasından olur kim, çün birində riyazət çəkməğə layiq görür, öz fəzli ilən Tanrı ona hasil edər".

Hal daimilik qazanarsa, sufinin xasiyyətinə çevrilər və ona məqam deyərlər. Məqam sahibi öz səy və çalışmalarına bağlı olar. Hal sahibi isə özündən fani olub, Allahın onda yaratdığı hala bağlanar və ondan asılı vəziyyətə düşər.

Sədi Şirazi "Gülüstan" kitabında yazır ki, bir gün *kəramət* sahibi kimi tanınan bir şeyx məscidə gəlir. Hovuz kənarında dəstəmaz alarkən ayağı sürüşüb hovuza yıxılır, çox çətinliklə sudan kənara çıxır. Müridlərindən biri ondan soruşur: "Sən həmin adamsan ki, vaxtilə suyun üzəri ilə gəzdiyini müşahidə etmişik. O vaxt heç ayaqların da islanmamışdı. Bəs indi niyə az qalmışdı ki, hovuzda boğulasan?!" Şeyx cavab verir: "Məgər



eşitməmisənmi, Həzrət Rəsulüllah buyurub: "Allahla mənim aramda elə anlar olur ki, nə bir mələk, nə də peyğəmbər bu məqama çata bilər". Amma Peyğəmbər (s) buyurmayıb ki, belə hallar ona həmişə müyəssər olur və həmişə davam edir. Peyğəmbər bəzən mələklərlə ünsiyyətdə olur, bəzən isə həyat yoldaşları ilə vaxt keçirirdi".

Yenə "Gülüstan"nda yazılıb ki, Yəqub Peyğəmbərdən (ə) soruşdular: "Yusif (ə) öz köynəyini Misirdən sənə göndərəndə uzaqdan onun ətrini hiss etdin, köynək yolda ikən onun gətirilməsindən xəbərdar oldun. Bəs niyə Yusif (ə) qat-qat yaxında – quyuda olarkən ətrini duymadın və yerini bilmədin?" Həzrət Yəqub (ə) cavab verdi: "Bizim halımız şimşək kimi ani olaraq dəyişər, bir an görünüb tez itər. Mən bəzən ən yüksək nöqtəyə qalxıb ətrafı görürəm, bəzən isə heç ayağımın altını seçə bilmirəm".

Sufi mənbələrində məqam və halların sayı, adları barədə fərqli fikirlərə rast gəlmək mümkündür. Əsasən belə qəbul edilib ki, məqamların sayı 7, halların sayı 10-dur. Mühüm sufi mənbələrindən olan Sərrac Tusinin "əl-Lümə" kitabına görə, məqamlar bunlardır: *tövbə, vərə, zöhd, fəqr, səbir, təvəkkül* və *riza*. Hallar isə aşağıdakılardan ibarətdir: *müraqəbə, qürb, məhəbbət, xovf, rəca, şövq, üns, itmiynan, müşahidə* və *yəqin*.

Məqam və halların hər biri barədə kitabda ayrıca məlumat verilir.

**Mənbələr:** *Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.307-310 və 735-739; Seyid Ziyaəddin Səccadi. İrfan və təsəvvüfün əsaslarına giriş, s.19-21 və 32-33; Sərrac Tusi. Əl-Lümə, s.65-104; Qısa İslam Ensiklopediyası (N.Rəhimovun ümumi redaktəsi ilə, 2 cilddə), I, 158-160; Şeyx Səfi təzkirəsi ("Səfvətüs-səfa"nın XVI əsr türk tərcüməsi), s.398.*



**MƏQAMİ-MAHMUD** – tərcüməsi "təriflənmiş (uca) məqam" deməkdir. Bu ifadə həm Quranda, həm də hədislərdə Məhəmməd Peyğəmbərlə (s) bağlı işlənmişdir. Quranda buyurulur: "(Ya Rəsulum!) Gecənin bir vaxtı durub ancaq sənə xas olan əlavə (təhəccüd) namazı qıl. Ola bilsin ki, Rəbbin səni bəyənilib təriflənən bir məqama göndərsin!" (İsra, 79). Hədislərdə də məqami-mahmud Həzrət Rəsulüllahın nail olduğu ən yüksək məqam kimi xatırlanır. Təfsir və hədis alimləri bu ifadəyə fərqli mənalar vermişlər. Geniş yayılmış nəzəriyyəyə görə, məqami-mahmud Məhəmməd Peyğəmbərin (s) Qiyamət günündə heç kimə nəsib olmayan miqyasda şəfaət etmək ixtiyarına işarədir. Bu məqamın sahibi olaraq o, günahkar bəndələrin təqsirinin bağışlanması üçün Allah qarşısında zamin duracaq (şəfaət edəcək).

İrfan və təsəvvüf aləmində məqami-mahmud anlayışı mistik pərdəyə bürünmüşdür. Sufi ədəbiyyatında və irfan şairlərinin əsərlərində bu ifadəyə tez-tez rast gəlirik.

Məşhur sufi mənbələrindən olan Xacə Abdullah Ənsarinin "Kəşf əl-əsrar" təfsirində "İsra" surəsinin 79-cu ayəsinin şərhində deyilir: "(Allahdan) Məhəmməd Mustafaya əmr gəldi ki, ey Mü-

həmməd, qiyamətdə şəfaət məqamı böyük məqamdır, məqami-mahmuddur və sənə məxsusdur. Onu əldə etməyin yolu budur ki, gecələr qalxıb namaz qılasan... Ey Mühəmməd, əgər bizim razılığımızı qazanmaq istəyirsənsə, gündüzlər peyğəmbərlik vəzifəsini yerinə yetir. Əgər məqami-mahmud istəyirsənsə, gecəni ibadətlə keçir və gecə namazı qıl".

Səfəvilər sülaləsinin banisi, böyük sufi Şeyx Səfiəddinin düşüncəsində məqami-mahmud *seyrü-süluk* yolunda ən uca mərtəbədir və bu məqam yalnız seçilmişlərə nəsib olar: "Onlar kim "Ərəfə"-yə girdilər, arif oldular. Onların gecəsi "qədr", gündüzü "eyd" olmuşdur. Onlara irən müqəllid ikən arif olur, arif ikən aşiq olur, aşiq ikən məşuq olur. Bundan iləri məqam olmaz. Buna "məqami-mahmud" derlər ki, bunuariflər bilər".

***Mənbələr:*** *Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.737; Qurani-Məcidin ədəbi və irfani təfsirinin xülasəsi (Xacə Abdullah Ənsarinin "Kəşf əl-əsrar" təfsirinin Miybədi tərəfindən xülasəsi), I, 579; Qara məcmuə ("Könül risaləsi" bölümü).*

**MƏLAMƏTİYYƏ (MƏLAMİYYƏ)** – təsəvvüfdə mühüm cərəyanlardan biri. Məlamətiyyə ayrıca bir sufi təriqətinə məxsus təlim deyildi, bir düşüncə və həyat tərzi idi. "Məlamət" sözü ərəb dilində "rişxənd etmək, bəyənməmək" mənasını verir. Məlamətilər riyadan hədsiz dərəcədə ehtiyat edir və əməldə ixlası, səmimiliyi yüksək dəyərləndirirdilər. Əslində ibadətə, halal-harama çox ciddi riayət edən məlamətilər bunu səylə xalqdan gizlədirdilər. Məlamətilər Allahın nemətlərini böyük, öz ibadətlərini isə kiçik görür, ibadətdən ləzzət almamağa çalışır, başqalarının nöqsanlarını müzakirə etməkdənsə öz eyiblərini düzəltməyə can atır, düşdükləri mənəvi halları cidd-cəhdlə camaatdan gizlədib özləri ilə Allahın arasında sirr kimi saxlayır, camaata qaynayıb-qarışır, zahirdə xalqla, batində Haqla olur, cəmiyyətdən seçiləcək heç bir fərqlənmə nişanını daşımır, sufilərə məxsus geyim və qiyafədən imtina edir, səma kimi ayinləri qəbul etmir, işləyib əllərinin zəhməti ilə dolanırdılar. Hətta bəzi məlamətilər təriflənməmək üçün özlərini zahirdə ibadətsiz, günahkar və rəzil şəkildə aparır, əyyaş və əxlaqsız bir adam kimi cəmiyyətdə tanınmaq istəyirdilər. Zahirdəki əməllərinə görə camaat onlara mənfi münasibət bəsləyirdi.

Məlamətiliyin ilk təbliğçiləri IX əsrdə yaşamış Xorasan təsəvvüf məktəbinin nümayəndələri Həmdun əl-Qəssar və Əbu Həfs əl-Həddad sayılır. Məlamətiliyi bəzən bunlardan birincisinin adı ilə qəssariyyə də adlandırırlar. Məlamətiliyin tarixini 3 mərhələyə bölürlər: ilk dövr məlamətiyyəsi (IX-XI əsrlər), *bayramiyyə* məlamətiyyəsi (XVI əsr) və nuriyyə məlamətiyyəsi (XIX əsr).

***Mənbələr:*** *Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.743-744; Seyid Ziyaəddin Səccadi. İrfan və təsəvvüfün əsaslarına giriş, s.240-244; İzzəddin Kaşani. Misbah əl-hidayə və miftah əl-kifayə, s.115-116; Lüğətnameyi-Dehxuda, XIV, 21446; Türkiye Diyanet Vakfi İslam Ansiklopedisi,*



*XXIX, 24-35; Mehmet Hakan Alşan. Horasan Erenleri, s.19-45; Mehmet Necmettin Bardakçı. Tasavvufun Teşekkül Devrinde Melâmetîlik (Uluslararası Melâmilik ve Seyid Muhammed Nûru'l-Arabî Sempozyumu Bildirileri, 9-10 Mayıs 2015/Antalya), s.21-43.*



**MƏLAMİ** (**MƏLAMƏTİ**) – *məlamətiyyə* (məlamiyyə) cərəyanının üzvü. Məlamətilər riyanı ən böyük günahlardan sayır, xalqın gözündə yaxşı görünməyi nəfs üçün təhlükəli hesab edir, öz mənəmliyini əzmək üçün əsl simalarını gizlədərək özlərini olduqlarından fərqli (daha aşağı və mənfi) şəkildə göstərməyə çalışırdılar. Nail olduğu mənəvi məqamı ətrafdakılardan gizli saxlamaq, özünə qarşı hədsiz dərəcədə tənqidi yanaşmaq məlamətinin əsas həyat prinsipini təşkil edirdi.

Məlamətini bəzən *qələndərlə* eyni tuturlar, amma bunların arasında fərq vardır. Məlaməti riya və ücbə düşməmək üçün zahirdə özünü qınağa layiq şəkildə aparır, amma əslində bütün qayda-qanunları ciddi şəkildə gözləyirdi. Qələndər isə həqiqətən qayda-qanun çərçivələrini qırır, reqlamentləri aradan götürməyə çalışırdı.

Bəzi təsəvvüf böyüklərinin fikrincə, məlaməti hələ *seyrü-sülukda* kamilliyə çatmayıb, Allahda layiqincə qərq və *fəna* olmayıb. Çünki o hələ də öz mənliyindən keçməmişdir, ətrafdakı insanların münasibətindən narahatdır. Kamil sufi isə elə bir məqama çatmışdır ki, başqalarının onun haqqında düşündükləri onu maraqlandırmır. Kamilliyə çatmış sufi lazım bildiyi zaman ibadətlərini camaatdan gizlədir, lazim bildiyi zaman da aşkar edir. Ücb və riya kimi nöqsanlar artıq onu tamamilə tərk etmişdir. Bəlkə də ənənəvi sufilərlə məlamətilər arasındakı bu ziddiyyətə görə Sərrac Tusi, Qüşeyri kimi məşhur sufi müəlliflər öz əsərlərində məlamətiyyə cərəyanına toxunmamışlar. (Baxmayaraq ki, bir termin olaraq bu sözə X əsrdən etibarən bəzi mənbələrdə rast gəlinirdi). İzzəddin Kaşani “Misbah əl-hidayə” əsərində məlamətiləri sufilərlə yanaşı, onlardan fərqli bir dəstə kimi xatırlatmış və fərqlərini izah etməyə çalışmışdır. İbn Ərəbi isə, bundan fərqli olaraq, məlamətiləri seyrü-sülukun ən yüksək mərtəbəsində görür, onları “əminlər” (üməna) adlandırırdı.

Şah İsmayıl Xətai özünü *rind* və məlaməti adlandırır, qəzəllərində deyirdi:

Dünyada aşiq olan geydi məlamət donunu,
Hər yetən aşiq olurmi, dərd ana kar olmasa?
*(Ş.İ.Xətai)*

*bax:* **MƏLAMƏTİYYƏ.**

***Mənbələr:*** *Mehmet Necmettin Bardakçı. Tasavvufun Teşekkül Devrinde Melâmetîlik (Uluslararası Melâmilik ve Seyid Muhammed Nûru'l-Arabî Sempozyumu Bildirileri, 9-10 Mayıs 2015/Antalya), s.21-43; Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.743-744; Seyid Ziyaəddin Səccadi. İrfan və təsəvvüfün əsaslarına giriş, s.240-244; İzzəddin Kaşani. Misbah əl-hidayə və miftah əl-kifayə, s.115-116; Türkiye Diyanet Vakfı İslam Ansiklopedisi, XXIX, 24-35; Şah İsmayıl Xətai. Əsərləri (2 cilddə), I, 89.*

**MƏLƏKUT ALƏMİ** – ariflərin düşüncəsində varlıq aləmlərindən biri. *Vəhdəti-vücud* təliminə görə 5 növ aləmin içində ortada – *cəbərut* və *mülk* aləmlərinin arasında yerləşən aləmdir. Mələkut aləmi cəbərut aləmindən aşağıda, mülk aləmindən yuxarıda yer tutur. O, cəbərut aləmindən törəmişdir, digər adları əmr aləmi, ikinci təəyyün aləmi, misal aləmidir. Cəbərut aləmində mövcud olan hər şeyin misalı (surəti) mələkut aləmində mövcuddur, bu aləmi dərk etmək üçün ağlın köməyinə ehtiyac vardır, amma hissiyyat üzvləri ilə bu aləmi dərk etmək olmaz. Mülk aləmində konkret və maddi olan məfhumların da daha ülvi və daha abstrakt surətləri mələkut aləmində mövcuddur.
*bax:* **CƏBƏRUT ALƏMİ.**

***Mənbələr:*** *Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.744; Əzizəddin Nəsəfi. İnsani-kamil, 12-ci risalə; Türkiye Diyanet Vakfi İslam Ansiklopedisi, XXIX, 47-48.*

**MƏNQƏBƏ** – məşhur bir şəxsiyyətin həyatını, müsbət xüsusiyyətlərini, *kəramət* və ya möcüzələrini, onun barəsində başqalarının söylədikləri fikirləri əhatə edən kitab. İslam tarixində mənqəbə (cəm halında: mənaqib) üslubunda çoxlu əsərlər yazılmışdır. Məsum imamların, səhabələrin, böyük alimlərin, o cümlədən məşhur sufi və ariflərin mənqəbələri istər müasirləri, istərsə də sonrakı müəlliflər tərəfindən qələmə alınıb. Şeyx Səfiəddin Ərdəbili haqqında yazılmış ən mühüm mənqəbə kitabı İbn Bəzzaz Ərdəbilinin *“Səfvət əs-səfa”* əsəridir. Bu kitab hələ XVI əsrdə Məhəmməd ibn Hüseyn Katib Nişati tərəfindən Azərbaycan türkcəsinə tərcümə edilmişdir (Əsərin orta əsrlərdə edilmiş daha bir müxtəsər tərcüməsi də məlumdur). Mənqəbələrdə bəzən həqiqətdən uzaq, şox şişirdilmiş məlumatlara da rast gəlinir ki, bunlar adətən haqqında danışılan şəxsə ifrat məhəbbətdən yaranır.

***Mənbələr:*** *Şeyx Səfi təzkirəsi (“Səfvətüs-səfa”nın XVI əsr türk tərcüməsi), s.3-9.*

**MƏRİFƏT** – hərfi tərcüməsi bilik, tanışlıq deməkdir. Ariflərin dilində mərifət Haqqı (Allahı) tanımaqdan ibarətdir. İrfanın və təsəvvüfün kökünü də mərifət təşkil edir. “Mərifətullah bütün Kainatdakı sirr və hikmətləri ehtiva edən, hüdudsuz və sonsuz bir elmi-ilahidir. Bu elmi tam anlamı ilə tanıtmaq bəşər idrakının xaricindədir. Amma hər kəs öz qüvvəsi, istedadı və qeyrəti (iradəsi) nisbətində bu elmdən həzz duyar və nəsib alar”.
Sufilər deyiblər ki, mərifət iki qisimdir: ümumi insanların mərifəti eşitmək əsasında əldə edilir, xüsusi insanların (ariflərin) mərifəti isə əyani kəsb olunur. Buna izah verərək demişlər ki, adi insanların mərifəti elmidir, elm və biliklə, məntiqi əsaslandırmalarla hasil olur. Ariflərin mərifəti isə hala bağlıdır, oxuyub öyrənməklə qazanılmaz, Allahın lütfü sayəsində mərifət onların qəlbinə birbaşa daxil olar.
İlahi mərifətin dörd mərhələsi vardır: birinci mərhələ budur ki, insan gördüyü



və bildiyi hər şeyi Allahın əsəri kimi qəbul etsin; ikinci mərhələ budur ki, bu əsərin Allahın hansı sifətindən qaynaqlandığını müəyyən etsin; üçüncü mərhələdə gərək Allahın hər sifətinin *təcəllasının* səbəbini aydınlaşdırsın; nəhayət, dördüncü mərhələdə gərək insan qəbul etsin ki, onun mərifəti Allahın elm sifətinin təcəllasından başqa bir şey deyil, gərək özünü elm və mərifətdən, hətta varlıqdan da məhrum bilsin.

Sufilərin nəzərində hər kəsin dəyəri mərifəti ilə ölçülər; kimin mərifəti çoxdursa, dəyəri də ucadır; kimin mərifəti yoxdursa, dəyərsizdir.

Bəzi sufi mənbələrində, eləcə də klassik şairlərin əsərlərində (Yunis Əmrə, *Nəsimi*) *seyrü-süluk* yolunun *şəriət*, *təriqət* və *həqiqət* mərhələlərindən əlavə mərifət mərhələsi də (təriqətlə həqiqətin arasında) qeyd edilir.

***Mənbələr:*** *Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.730-733; Osman Nuri Topbaş. İmandan İhsana Tasavvuf ("Marifetullah ve Ariflerdeki Tecelliler" bölümü); Nəsirəddin Tusi. Ovsaf əl-əşraf, s.73-75; Risaleyi-Qüşeyriyyə (farsca tərcümə: Bədiüzzaman Firuzənfər), s.539-551.*

**MƏŞUQ** – sevgili, aşiqin *eşqinin* hədəfi. Təsəvvüfdə məşuq deyilərkən yalnız Allah-Taala nəzərdə tutulur. Əsl eşq Allaha olan eşqdir, qalan hisslər ötəri və nisbidir, əsl məşuq da Allahdır. Sufi öz qəlbindən bütün başqa sevgiləri çıxarmalıdır, çünki *qəlb* Allaha məxsusdur və orada yalnız Allahın eşqi qərar tutmalıdır. Ariflərin gözündə Allahdan başqasını sevmək Allaha qarşı xəyanətdir, ən böyük günahdır və hətta Allaha şərik qoşmaq kimidir. Varlıq dünyasındakı bütün hərəkətlərin səbəbi və hədəfi həqiqi məşuq olan Allahdır.

İrfani şeirlərdə də Məşuq və Məşuqi-əzəl deyilərkən Allah-Taala nəzərdə tutulur:

Kimsə ki geyməyə meydani-məhəbbətdə kəfən,
Onu Məşuqi-əzəl məhşərə üryan aparır.
*(S.Ə.Şirvani)*

***Mənbələr:*** *Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.733; Yaqub Babayev. Təriqət ədəbiyyatı; sufizm, hürufizm, s.47; Seyid Əzim Şirvani. Əsərləri, I, 210.*

**MÖVLA** – ərəb dilində fərqli mənaları ifadə edən kəlmədir. Lüğət kitablarında "mövla" sözünün aşağıdakı mənalarını qeyd ediblər: Rəbb, əmi, əmioğlu, oğul, bacıoğlu, kölə, kölənin ağası, tabe olan, nemət verilən, şərik, başqası ilə əhd bağlamış şəxs, qonşu, qonaq, kürəkən, dost, rəhbər, ağa, sevgili və s. Əllamə Əmini "əl-Ğədir" kitabında "mövla" sözünün 27 mənasını qeyd etmişdir.

Bu söz Mühəmməd Peyğəmbərin (s) Qədir-Xüm günündə həzrət Əli (ə) haqqında buyurduğu "Mən kimin mövlasıyamsa, Əli də onun mövlasıdır" hədisində işlənir və bu hədis şiələr tərəfindən İmam Əlinin (ə) Peyğəmbərdən (s) sonra bilavasitə xilafət haqqının sübutlarından biri sayılır. Buna görə də hədisdə bu kəlmənin hansı mənanı ifadə etdiyi barədə məzhəblər arasında ciddi

fikir ayrılıqları mövcuddur. Əhli-sünnə məzhəbinin alimləri hədisdəki "mövla" sözünü adətən "dost" mənasında, şiələr isə "övla" (daha üstün) kəlməsi ilə yaxın mənada qəbul edirlər.

"Mövla" sözü Qurani-Kərimdə əksər hallarda Allaha aid edilmiş və "başçı, rəhbər" mənasında işlədilmişdir: "Xeyr, Allah sizin mövlanızdır. O, yardım edənlərin ən yaxşısıdır" (Ali-İmran, 150). "Bilin ki, Allah sizin mövlanızdır. O, ən yaxşı mövla və ən yaxşı imdada çatandır" (Ənfal, 40; Həcc, 78; bax: Təhrim, 2 və 4; Ənam, 62; Yunus, 30 və s.). Qurana görə, möminlər də Allahı "mövlana" (ağamız) deyə çağırarlar (Bəqərə, 286; Tövbə, 51).

Daha bir neçə ayədə "mövla" kəlməsi "ağa, qul sahibi", "cəhənnəm" və "dost" mənalarında işlədilib (Nəhl, 76; Hədid, 15 və Duxan, 41).

Təsəvvüf aləmində böyük təriqət *şeyxləri*, şairlər "mövlana" (ağamız) ləqəbinə layiq görülüb (məsələn, Mövlana Cəlaləddin Rumi, Mövlana Füzuli).

Bəzi məşhur şəriət alimlərini də "mövlana" ləqəbi ilə çağırmaq orta əsrlərdə, o cümlədən Səfəvilər dövründə ənənəyə çevrilmişdi. Məsələn, Səfəvilər dövrünə aid ən mühüm mənbələrdən sayılan "Tarixi-aləmarayi-Abbasi"də bir neçə din alimi bu ləqəblə xatırlanır (*Mövlana Şəmsəddin Lahici Gilani* (Səfəvilər dövlətində *sədr* vəzifəsinə təyin edilmiş ilk şəxs), *Mövlana Abdullah Şüştəri,* Mövlana Mirzəcan Şirazi, Mövlana Məhəmməd Əli Təbrizi və b.). Həmin kitabda bir neçə şair və xəttatın adında da bu ləqəbi görürük (Mövlana Əbdi Nişapuri, Mövlana Şahmahmud Zərrinqələm, Mövlana Dost Herati, Mövlana Siyavuşani, *Mövlana Möhtəşəm Kaşani, Mövlana Vəhşi Yəzdi (Bafqi)* və b.). Bu da onu göstərir ki, Səfəvilər zamanında elm və sənət adamları yüksək hörmətə sahib olmuşlar.

Sufi ədəbiyyatında "mövla" sözü əsasən Allah-Taalaya aid edilmişdir. Şah İsmayıl Xətai də şeirlərində bu sözü bir neçə dəfə həmin mənada işlətmişdir: "Vadi-yi-üsyanda qaldı, anmadı Mövlasını", "Verən Mövla alır canı". Ənənəvi dini məzmunlu şeirlərdə "mövla" sözü *İmam Əliyə (ə)* də aid edilir.

***Mənbələr:*** *Əbdülhüseyn Əmini. Əl-Ğədir, I, 362-363; Tarix-i aləmara-yi Abbasi (tərcümə və şərhlər: O.Əfəndiyev, N.Musalı), s.360-392; Şah İsmayıl Xətai. Əsərləri (2 cilddə), s.592; Qısa İslam Ensiklopediyası (N.Rəhimovun ümumi redaktəsi ilə, 2 cilddə), I, 175.*



**MÜKAŞİFƏ** – *ariflər* deyiblər ki, mükaşifə – Allahın əzəmətinin dərinliyi qarşısında davamlı heyrət halıdır. Sufi ədəbiyyatında kəşf (mükaşifə) əksər hallarda *yəqinlə* əlaqələndirilir və yəqinin nəticəsi, məhsulu kimi təqdim edilir (kəşf əl-yəqin). Mükaşifəni bəzən müşahidə halına yaxın hesab edirlər, amma mükaşifə ondan daha əhatəli və üstündür. Nəzərə almalıyıq ki, halların təsnifatında müşahidə yəqindən əvvəl gəlir və onun müqəddiməsi sayılır.

Təsəvvüf ədəbiyyatının ən məşhur nümunələrindən sayılan "əl-Lümə" kita-



bında Sərrac Tusi yazırdı: "Yəqinlik mükaşifədir və mükaşifə üç cür olur:
(Birincisi), Qiyamət günü baxmaqla gözlərin əyani mükaşifəsi.
(İkincisi), necəsiz və hüdudsuz, bilavasitə yəqinliklə qəlblərə iman həqiqətlərinin kəşf olması.
Üçüncü isə peyğəmbərlərə (Allahın) qüdrətinin izharı ilə ayətlərin və möcüzələrin, başqaları (sufilər nəzərdə tutulur) üçün *kəramətlərin* və təsdiqlərin kəşf olması".

***Mənbələr:*** *Sərrac Tusi. Əl-Lümə, s.102; Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.740; Seyid Ziyaəddin Səccadi. İrfan və təsəvvüfün əsaslarına giriş, 273.*



**MÜLK ALƏMİ** – təsəvvüf düşüncəsində aləmlərdən biri. *Vəhdəti-vücud* təliminə əsasən 5 növ aləmin dördüncüsü, *mələkut* aləmindən aşağıda yerləşir. Mülk aləmi mələkut aləmi ilə birlikdə *cəbərut* aləmindən törəmişdir. Bu aləm mələkut aləminə nisbətən daha bəsit və konkretdir. Mələkut aləmində ideya şəklində mövcud olan hər şeyin mülk aləmində materiya formasında qarşılığı vardır. Mülk aləmi hissiyyatla dərk olunur. Klassik mənbələrdə mülk aləmini *nasut* aləmi də adlandırmışlar.
*bax:* **CƏBƏRUT ALƏMİ.**

***Mənbələr:*** *Türkiye Diyanet Vakfı İslam Ansiklopedisi, XXXII, 431-432; Süleyman Ateş. İşari Tefsir Okulu, s.260-264; Ahmet Avni Konuk. Fususu'l-Hikem Tercüme ve Şerhi, I, 5-17; Əzizəddin Nəsəfi. İnsani-kamil, 12-ci risalə.*

**MÜRAQƏBƏ** – əksər təsnifatlara görə, *seyrü-süluk* yolundakı hallardan birincisidir. Allahın hər an ondan və onun əməllərindən xəbərdar olması barədə bəndənin biliyi müraqəbə adlanır. Qurani-Kərimdə buyurulur: "Allah hər şeyə nəzarət edəndir" (Əhzab, 52). Həzrət Məhəmməd Peyğəmbər (s) buyurmuşdur: "Allaha sanki Onu görürmüşsən kimi ibadət et. Əgər sən Onu görmürsənsə, O, səni görür".
Məşhur sufi İbn Ətadan soruşdular ki, ən üstün itaət hansıdır? Cavab verdi: "Hər zaman Haqq ilə müraqəbə halında olmaq".
Sərrac Tusi "əl-Lümə" kitabında sufilərdən birinin bu sözünü xatırladır: "Qəlbinizi qoruyun, çünki o, daxilinizdə (gizli) olanlardan xəbərdardır".

***Mənbələr:*** *Seyid Ziyaəddin Səccadi. İrfan və təsəvvüfün əsaslarına giriş, s.33; Sərrac Tusi. Əl-Lümə, s.82-83.*



**MÜRİD** – ərəb dilindən tərcüməsi "iradə edən" deməkdir. Təsəvvüf aləmində dərvişin öz *şeyxinə (mürşidinə)* bağlanması, *seyrü-süluk* yolunda onun verdiyi təlimatlara tam etibar etməsi və bunları canü-dildən yerinə yetirməsi iradə (iradət) adlanır. "Mürid" sözü adətən hələ şeyxlik mərtəbəsinə çatmamış sıravi təriqət üzvü mənasında işlədilir. Təsəvvüfdə müriddən öz mürşidinə qeydsiz-şərtsiz itaət etmək tələb olunur, hətta bu zaman mürşidə "nə üçün" sualını vermək də ədəbsizlik və itaətsizlik sayılır. Təriqət qaydalarına əsasən, mürşidinə daha çox bağlanan, addımını onun gös-

tərdiyi yoldan kənara qoymayan və asilik etməyən mürid kamilliyə daha tez çatar.
Müridin daxilindəki istedadı üzə çıxarmaq, onu layiqincə tərbiyə etmək mürşidin bacarığınıdan asılıdır. Mürid ilə mürşidin münasibəti ata-oğul münasibətindən daha dərin və güclüdür. Sufilər həzrət İsa (ə) misalında bioloji ata olmadan da Kamil İnsan yetişməsinin mümkünlüyünü mürid-mürşid münasibətlərinə şamil edirdilər.
*bax:* **ŞEYX.**



**MÜRŞİD** – ərəb dilindən tərcüməsi "irşad edən, yol göstərən, bələdçilik edən" deməkdir. Təsəvvüf aləmində öz *müridlərinə təriqətin* sirlərini öyrədən, onlara *seyrü-süluk* yolunda irəliləmək üçün təlimatlar verən *şeyx (pir)* bu cür adlanır.
*"Qara məcmuə"də səfəviyyə* təriqətinin banisi Şeyx Səfiəddin Ərdəbilinin belə dediyi yazılıb: "Mürşid su kimidir, su hər nəyə toxunsa, arıdar, pak edər. Mürşid də *talibin* könlünü təmizlər. Mürşidi-kamil adəmi *cami*-cahannüma edər. Cami-cahannüma nədir? Ayineyi-Xudadır".
Səfəvilər dövlətində şah Şeyx Səfinin nəslindən gəldiyi üçün təriqətin başçısı və *"mürşidi-kamil"* adlanırdı.
*bax:* **ŞEYX.**



**MÜRŞİDİ-KAMİL** – kamil mürşid, Səfəvi şahlarının ləqəbi. Səfəvi şahları *səfəviyyə təriqətinin* banisi Şeyx Səfiəddinin nəslindən olduqları üçün təriqətin şeyxliyi *(mürşidliyi)* də irsən onlarda idi. Səfəvi şahları ölkə daxilində və ölkə sərhədlərindən kənarda yaşayan bütün *qızılbaşların* mürşidi idilər. Onlar bütün fəaliyyətləri ilə bu mürşidlik məqamını sübut etməyə çalışır, təriqətin real lideri kimi davranırdılar. Dövlət işləri ilə məşğulluq maneçilik yaradanda şah *xəlifət əl-xüləfanın* (təriqət işləri üzrə öz müavininin) köməyindən yararlanırdı.
Qərb səyyahları xəbər verirdilər ki, qızılbaş əsgərləri döyüşə atılanda Azərbaycan dilində "qurban olduğum, sədəqə olduğum, pirim, mürşidim" deyə nərə çəkirdilər.
I Şah İsmayılın Anadoluya təbliğat üçün göndərdiyi *Nurəli xəlifə* ilə oradakı qızılbaşların görüşü *"Aləmarayi-Səfəvi"* salnaməsində bu cür təsvir edilir: "Nurəli xəlifənin Ruma getməsi xəbəri sufilərə çatdıqda 10 min nəfərə qədər sufi onun başına cəm oldu və məktubu onun əlindən alıb gözlərinin üstünə sürtərək ziyarət etdilər. Nurəli xəlifə hökmdarın başmağını sufilərin yanına aparmışdı və onlar o başmağı öpüb gözlərinin üstünə qoyaraq dedilər ki, xoş olsun sizin halınıza, hər gün mürşidi-kamili görürsünüz. Məktubu açdıqda çoxlu ehsanlar tökdülər, az qaldı ki, öz canlarını qurban etsinlər. Daha sonra o məktub oxunduqda hamısı birdən yerlərindən qalxdılar, bəziləri *xəlifənin* ayağını öpürdü, bəziləri onun əlini öpürdü. Deyirdilər: əmr mürşidi-kamilin əmridir ki, biz sənə xidmət edib başımızı sənin yolunda qoyaq". Bu hadisədən sonra Anadolu torpaqlarındakı 4 min nəfər qızılbaş ailəsi Nurəli xəlifəyə beyət etdi.



"Ələmarayi-Səfəvi"də xəbər verilir ki, I Sultan Səlim 1515-ci ildə Diyarbəkr qalasının hakimi *Qara xan Ustacluya* məktub yazıb ona təslim olmağı təklif edəndə Qara xan bu cavabı göndərmişdi: "Biz İsmayıl Bahadurun nökəriyik, sufiyik, bu ocağın bəndəsiyik. Sufini və müridi öz mürşidi-kamilindən döndərmək mümkün deyil. Bundan başqa, biz nəsilbənəsil möminlərin əmiri və təqvalıların imamı həzrət Əli ibn Əbu Talibin (ə) ocağının bəndəsi və nökəriyik. Mürşidimiz Həzrət Şeyx Səfi və onun seçilmiş övladlarıdır". Eyni mənbədən məlum olur ki, I Şah İsmayıl zamanında ən böyük and "Şeyx Səfi ocağına and olsun", ən ağır qarğış və nifrin isə "ocaq sənin qənimin olsun" ifadələri idi.

***Mənbələr:*** *E.G.Browne. A Literary History of Persia, volume IV, p.15; Namiq Musalı. I Şah İsmayılın hakimiyyəti ("Tarix-i aləmarayi Şah İsmayıl" əsəri əsasında), s.342; Aləmarayi-Səfəvi, s.515 və 525.*

**MÜŞAHİDƏ** – təsəvvüfdə *salikin* əldə etdiyi *hallardan* biri, təsnifat üzrə doqquzuncu yerdə durur. Müşahidənin mənası qəlb gözüylə Haqqı görməkdir. Müşahidə halında salikin vəziyyətini sufi ədəbiyyatında *işraq, cəzbə* və *fəna* da adlandırmışlar. Haqq yolçusu hər şeydə yalnız Allahı görər, Allahdan savayı heç nə onun gözündə olmaz.

Sufi mənbələrində müşahidədən söz açılanda həzrət Əlinin (ə) bir məşhur kəlamına tez-tez istinad edilir. Ondan: "Rəbbini gördünmü?" – soruşduqda belə cavab vermişdi: "Görmədiyim Rəbbə ibadət etmərəm!"

Sufi müəlliflər tərəfindən dəfələrlə təfsir olunmuş Nur ayəsində buyurulur: "Allah göylərin və yerin Nurudur. Onun Nuru içində çıraq olan bir taxçaya bənzər. Taxçadakı o çıraq bir qəndilin içindədir; o qəndil isə sanki parlaq bir ulduzdur..." (Nur, 35). Ayədəki "mişkat" (taxça) sözünü mömin ariflərin qəlbi kimi izah etmişlər. Arif həmişə ilahi nur içində olar və bu nurun ziyasında hərəkət edər.

Arifin müşahidə qabiliyyəti qəlbinin paklığından və ruhunun hazırlıq səviyyəsindən asılıdır. Daha yüksək mənəvi məqama malik olanlar daha dərin müşahidə sahibidirlər. Müşahidə halı növbəti, yəni onuncu hal olan *yəqinə* yol açır.

Təsəvvüfdə müşahidə məfhumuna yaxın olan digər məfhumlar da vardır (məsələn, *şahid*, məşhud). Əbu Bəkr Vasiti adlı sufi demişdir: "Şahid Rəbdir, məşhud Kainatdır. Onları yox edən, sonra var edən Odur (Allahdır)".

***Mənbələr:*** *Seyid Ziyaəddin Səccadi. İrfan və təsəvvüfün əsaslarına giriş, s.45-46; Sərrac Tusi. Əl-Lümə, s.100-101.*

**NASUT ALƏMİ** – aşağı, alçaq aləm. Təsəvvüf ədəbiyyatında buna *mülk* aləmi, şəhadət aləmi, hiss aləmi, fələklər aləmi də deyirlər. *Mələkut* aləmindən daha aşağıda yerləşir, mələkut aləmində ideya şəklində mövcud olan hər şey mülk (nasut) aləminə materiya şəklində proyeksiya olunub (əqlin hissiyyata proyeksiyası).

Səfəvilər dövründə yaşamış məşhur filosof və arif *Molla Sədra* şəhadət (nasut) aləmini mələkut aləminin qabığı kimi təsəvvür edir, bunları bədənlə ruha bənzədirdi. "Nasut" sözünün mənşəyi barədə nəzəriyyələr fərqlidir, amma əksər tədqiqatçılar bu sözü insanla (ərəbcə "nas") bağlayırlar. "Şəhadət aləmi" adlanmasının səbəbi isə müşahidə və hiss oluna bilməsidir.

*bax:* **CƏBƏRUT ALƏMİ.**

***Mənbələr:*** *Türkiye Diyanet Vakfı İslam Ansiklopedisi, XXXII, 430-431; Ethem Cebecioğlu. Tasavvuf Terimleri ve Deyimleri Sözlüğü, "nasut" maddəsi; Seyid Cəfər Səccadi. İslam maarifi lüğəti, II, 1228.*

**NƏFS və ONUN MƏRTƏBƏLƏRİ** – təsəvvüf anlamında nəfs daxilində iradi hərəkət, hiss və həyat qüvvəsi olan qeyri-maddi substansiyadır. Quranda "nəfs" sözü müxtəlif mənalarda işlədilir. Adətən nəfs məfhumunu ruhla eyniləşdirirlər. Nəfsinə hakim olmaq, yəni arzu və istəklərə, qəzəbə qalib gəlmək, səbir etmək deməkdir.

Nəfs təkamül etdikcə mərtəbədən-mərtəbəyə adlayır. Haqq yolçusunun *(Salikin)* nəfsi kamilləşdikcə bu mərtəbələri bir-bir keçir və son mərtəbəyə yetişir. Nəfsin mərtəbələri barədə əxlaq və *irfan* kitablarında fərqli təsnifatlar verilmişdir. Bəzi mənbələrdə nəfsin yalnız 3 mərtəbəsindən (əmmarə, ləvvamə və mütməinnə) danışılır, bəzi mənbələrdə buna dördüncü mərtəbə (raziyyə mərziyyə) əlavə edilir, bəzən onların sayı 7-yə çatdırılır.

Əxlaq və irfan kitablarında nəfsin daha çox xatırlanan 7 mərtəbəsi bunlardan ibarətdir:

1. ***Nəfsi-əmmarə***, yəni əmr edən nəfs. Bu nəfs bədəni maddi dünyaya meyil etdirir, ondakı ləzzət və şəhvət istəklərini alovlandırır, qəlbi rəzalətə doğru sürükləyir. "Rəbbimin rəhm etdiyi kimsə istisna olmaqla, nəfs (insana) pis işlər görməyi əmr edər" (Yusif, 53). Nəfsi-əmmarə şər yuvası, pis əxlaqın və davranışın mənbəyidir. Bu mərhələdə insanın təbiəti heyvandan fərqlənmir, hətta ondan daha pis ola bilir.
2. ***Nəfsi-ləvvamə***, yəni qınayan nəfs. Qurani-Kərimdə ona işarə edilib: "And içirəm özünü qınayan nəfsə!" (Qiyamət, 2). Bu nəfs öz oyaqlığını qoruya bilmişdir, o, yaxşı ilə pisin fərqini anlayır, etdiyi bəzi əməllərin pis olduğunu dərk edir. Buna görə özünü qınayır, bu əməlləri təkrar etmək istəmir. Ancaq kifayət qədər kamilləşmədiyinə görə yenə həmin günahları işləməkdə davam edir. Nəfsi-ləvvamədə bəzi müsbət irəliləyişlər görünür və o, kamilləşməyə hazırdır.
3. ***Nəfsi-natiqə*** və ya ***mütəfəkkirə***, yəni danışan və ya təfəkkür edən qəlb. Bu mərhələdə nəfs ciddi şəkildə əməllərin mənası və aiqbəti barədə düşünür, ətrafdan ibrətlər alır. Özünütərbiyə tədbirləri nəticəsində nəfs qüvvətlənir və yeni mərtəbəyə daxil olur.

Adı çəkilən 3 mərtəbə nəfsin təmizlənməsi dövrünü əks etdirir. Bura kimi nəfs rəzalətlərlə mübarizə aparır, bundan sonra isə artıq fəzilətləri əldə etməyə başlayır.



4. ***Nəfsi-mülhəmə*** və ya ***aqilə***, yəni ilhama və kəşfə nail olan və ya ağıllı nəfs. Bəzi əxlaq alimləri onu nəfsi-natiqənin əvəzinə nəfsin üçüncü mərtəbəsi saymışlar. Quranda nəfsin bu mərtəbəsi belə təsvir edilir: "And olsun nəfsə və onu yaradana (ona biçim verənə). Sonra da ona günahlarını və pis əməllərdən çəkinməsini öyrədənə ki, nəfsini təmizləyən mütləq nicat tapacaqdır!" (Şəms, 7-9). Bu mərtəbə nəfsin ilk 3 və son 3 mərtəbəsi arasında keçid rolunu oynayır. Nəfsi-mülhəmə mərtəbəsində *salik* hələ də onu rəzalətə tərəf çağıran son vəsvəsələri duyur, amma daxili mübarizə nəticəsində onları susdura bilir. Nəfs *eşqin* ləzzətini duymağa başlayır, elmi sevir, comərd, qənaətkar və təvazökar olur, zəhmətə və əziyyətə qatlaşır, Kainatın sirrinə heyran qalır, camaatı tərk edib Allaha yaxınlaşır.

5. ***Nəfsi-mütməinnə***, yəni rahatlığa, aramlığa qovuşmuş nəfs. Bu nəfs pis sifətlərdən uzaqlaşıb, gözəl əxlaqla zinətlənib. Rəzalətlərlə mübarizə başa çatıb, qarşıya çıxan çətinliklər, ümidsizlik və qorxular arxayınlıq sayəsində aşılıb. Allah-Taala Quranda "Fəcr" surəsinin son ayələrində bu cür nəfsin sahibini cənnətə çağırır. Allaha doğru gedən bu nəfs sahibinin qəlbi tam və həqiqi bir inanca malikdir, daim təvəkkül, təslim, səbir və riza halındadır.

6. ***Nəfsi-raziyyə***, yəni razı olan nəfs. Bu, *riza* məqamına çatmış nəfsdir, öz iradəsindən dönüb Allahın iradəsinə tabe olmuşdur. O, heç nədən şikayət etməz, çünki bəşəri özəlliklərdən qurtularaq *fəna* məqamına qovuşmuşdur. Əmr və qadağanlara bütünlüklə tabedir, gözəl əxlaqa malikdir. Nəfsi-raziyyə həqqül-yəqin mərtəbəsinə çatmışdır.

7. ***Nəfsi-mərziyyə***, yəni Allahın ondan razı qaldığı nəfs. Bu, bəşəri istəkləri tərk edən, qüsurları bağışlayan, gözəl düşünən, şəfqətli, əliaçıq, insanları yalnız Allah xatirinə sevən nəfsdir. O, Allahın icazə verdiyi miqdarda bəzi *qeybi* sirlərdən xəbərdar olur. Bunlar Allahın ona ehsanıdır. "Mən onun eşidən qulağı, görən gözü, tutan əli, danışan dili olaram" hədisi-qüdsisində bu nəfs nəzərdə tutulur. Qurani-Kərimdə nəfsin həm rəziyyə, həm də mərziyyə mərtəbələrinin adı çəkilir: "Dön Rəbbinə, sən Ondan razı olaraq, O da səndən!" (Fəcr, 28).

Bəzi mənəbələrdə nəfsin sonuncu – yeddinci mərtəbəsi ***nəfsi-kamilə***, yəni kamilləşmiş nəfs sayılır (bu təsnifatda nəfsi-natiqə mərtəbəsi yoxdur). Bu mərtəbəyə yetişmiş nəfs bütün kamil xüsusiyyətləri özündə cəmləşdirmiş, kamillik zirvəsinə, irşad səviyyəsinə çatmışdır. Onu nəfsi-qüdsiyyə, nəfsi-safiyyə, nəfsi-zəkiyyə də adlandırırlar.

***Mənbələr:*** *Hüseyn Ənsariyan. İrfani-İslami, I, 172-180; Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.756-768; Osman Nuri Topbaş. İmandan İhsana Tasavvuf ("Nefsin mertebeleri" fəsli).*



**ON SƏKKİZ MİN ALƏM** – Qurani-Kərimin bəzi ayələrinə verilmiş şərhlərdə və məsumların hədislərində aləmlərin çoxluğunu, bizim aləmimizdən baş-

qa dünyaların mövcudluğunu təsdiq edən işarələr vardır. Məsələn, alimlər "Fatihə" surəsinin "Əlhəmdu lillahi rəbbil-aləmin" ayəsindəki "aləmin" kəlməsini yaşadığımız dünyadan fərqli olan digər aləmlərlə əlaqələndirirlər. Bəzi təfsirlərdə yazılır ki, Quranda rast gəlinən "yeddi göy, yer və onlarda olanlar" ifadəsində yalnız səmada uçan quşlar və mələklər deyil, bizim xəbərimiz olmayan digər məxluqlar, o cümlədən başqa planetlərdə yaşayan canlılar nəzərdə tutulub.

Məsum imamların hədislərində də buna işarələr mövcuddur. İmam Cəfər Sadiq (ə) buyurmuşdur: "Allahın on iki min aləmi var, hər aləm yeddi səmadan və yeddi yerdən daha böyükdür. O aləmlərdən heç biri sizə görünmür. Allahın bunlardan başqa da aləmi var. Mən bu aləmlərin hamısına hüccətəm".

İmam Əlidən (ə) rəvayət edilən bir hədisdə buyurulur: "Səmada gördüyümüz bu ulduzlar yerdəki şəhərlər kimi şəhərlərdir. Bu şəhərlər bir-biri ilə nur sütunu vasitəsilə əlaqə saxlayırlar".

İmam Baqirdən (ə) rəvayət edilən bir hədisə görə, Allah bizim Günəşdən əlavə daha qırx Günəş, bizim Aydan əlavə daha qırx Ay xəlq edib. Bu günəşlərin və ayların bir-birindən məsafəsi qırx illik yoldur. Onların hər birində çoxlu canlı yaşayır və bu canlıların bizim mövcudluğumuzdan heç xəbərləri yoxdur.

İrfan və təsəvvüf ədəbiyyatında aləmlərin sayının 18 min və ya hətta 50 min olması barədə məlumatlar vardır. İrfan ədəbiyyatının böyük simalarından olan Əttar Nişapuri şeirlərinin birində yazırdı (fars dlindən tərcümə):

(Allah) bir anlıq Öz sirrini Özündən
Özündə aşkar etdi,
On səkkiz min sirli aləm vücuda gəldi.

Klassik Azərbaycan ədəbiyyatının görkəmli simaları *İmadəddin Nəsimi, Şah İsmayıl Xətai* və başqalarının şeirləri də bu baxımdan diqqətəlayiqdir:

On səkiz min aləmə mən gərdiş ilə gəl-
mişəm,
Ol səbəbdən Həqq ilə sirdar idim, sər-
dar idim.

Ey Xətayi, sən təvəkkül həqqə qılgil,
çəkmə ğəm,
On səkiz min aləmə hökm eyləyən
sərdar bir.
*(Ş.İ.Xətai)*

*bax:* **ALƏMLƏR.**

***Mənbələr:*** *Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.567; Nur əs-səqəleyn təfsiri, I, 16-17; Təfsiri-nümunə, XX, 439; Şeyx Abbas Qumi. Səfinət əl-Bihar, II, 574; Seyid Haşim Bəhrani. Əl-Bürhan təfsiri, I, 47; Şah İsmayıl Xətai. Əsərləri (2 cilddə), I, 258 və 373.*

**ÖVLİYA** – *bax:* **VƏLİ.**

**PİR** – fars dilində "qoca" mənasını verir. Təsəvvüf aləmində təriqət başçısı, mənəvi rəhbər pir sayılır. Təsəvvüf ədəbiyyatında "pir" sözü *"mürşid", "şeyx"* sözləri ilə eyni cərgədə işlənir. Sufi şeirlərində rast gəlinən *"piri-muğan",* "piri-*xərabat*" ifadələri *saliklərə* doğru



yolu göstərən, onları haqqa doğru hidayət edən kamil rəhbər mənasını verir.

Gəl bir pirə xidmət elə, əmək zaye olmaz ola,
Mürşid ətəgin möhkəm tut, kimsəlindən almaz ola.
*(Ş.İ.Xətai)*

Qızılbaş sufilər Səfəvi şahlarını özlərinə *mürşidi-kamil* və pir bilirdilər, şaha müraciətlərində də "pirim, mürşidim" ifadələrindən istifadə edirdilər.

Bəzi təsəvvüf mənbələrində pir və piri-*xərabat* ifadələrinin Allahı ifadə etdiyi yazılıb. Xərabat eşq məskəni, pir isə onun sahibi, yəni Allah-Taaladır. O, daim xərabat əhlinin (aşiqlərin) dadına yetişir, onlara məstlik şərabı *(mərifət)* içirir.

Dini kitablarda ziyarətgah və ocaqlara da "pir" deyilir.

*bax:* **MÜRŞİD**, **ŞEYX**, **ÖVLİYA.**

***Mənbə:*** *Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.216-217; Qara məcmuə, s.27; S.Ə.B.Şirazi. Şərhi-cünun (Hafiz Şirazi divanının mövzular üzrə şərhi), I, 339; Ahilik Ansiklopedisi, II, 201-202.*

**PİRƏ** – Səfəvi dövrünə aid mənbələrdə seçilmiş təriqət üzvlərinə verilən ləqəb, *xəlifə* məqamına uyğundur. Onların təriqətdaxili iyerarxiya zəncirində hansı pillədə durduqlarını dəqiq təyin etmək çətindir. "Pirə" sözünün Gilan və Mazandaran ləhcəsinə uyğun olaraq "pir" sözündən qaynaqlandığı ehtimal olunur. Səfəviyyə təriqətinə aid qədim mənbələrdə, o cümlədən "Şeyx Səfi təzkirəsi"ndə bu sözə tez-tez rast gəlinir. Bəzi mənbələrdə "pirə" və *"dədə"* ləqəbləri eyniləşdirilir. Səfəvi dövlətində, xüsusilə ilk dövrlərdə "pirə" ləqəbi ilə xatırlanan bir neçə görkəmli sərkərdənin adı salnamələrdə qeyd edilir. Onlardan biri – I Şah İsmayılın *qorçubaşısı Sarı Pirə Ustaclu Çaldıran döyüşündə* həlak olmuşdu. Çaldıran savaşının qurbanlarından daha biri – Pirə bəy (yaxud Pir bəy) *şirəçibaşı* (içəcək təminatçısı) vəzifəsində idi. I Şah Təhmasib zamanında Gilan valisi olmuş *Ustaclu* elinin *Çavuşlu* oymağından *Pirə Məhəmməd xanın*, onun oğlu Pirə Murad xanın, hətta Şeyx Heydərin müridi Pirə Sinan Təkəlünün adlarında bu ifadəni görürük.

*bax:* **XƏLİFƏ.**

***Mənbələr:*** *Zülfiye Veliyeva. Safevi Devlet Teskilatı (Tezkiretü'l-Mülük'e Göre), doktora tezi, s.419; Faruk Sümer. Safevi Devletinin Kuruluşu ve Gelişmesinde Anadolu Türklerinin Rolü, s.130; O.Əfəndiyev. Azərbaycan Səfəvilər dövləti, s.257.*

**PİRİ-MUĞAN** – qədim İranda Əhəmənilər və Sasanilər zamanında dini ayinlərin icrasına rəhbərlik edən zərdüşti kahinlərə "muğ" deyirdilər. Bəziləri bunu Qərb dillərindəki "maq" kəlməsi ilə eyniləşdirirlər. Muğlar cəmiyyətin ali təbəqəsi sayılırdılar, böyük imtiyazlar sahibi idilər.

Təsəvvüf ədəbiyyatında təriqət başçısı, *şeyx*, *mürşid* də piri-muğan adlandırılır. Sufiliyin əksər terminləri dünyəvi mövzulardan, xüsusilə də eyş-işrət məclislərinə aid sözlərdən götürülüb, "piri-mu-

ğan" ifadəsi də bu qəbildəndir. Keçmişdə müsəlman ölkələrində şərab satışı ilə atəşpərəstlər gizlində məşğul olurdular, keyfiyyətli şərab onlarda olurdu. Buna görə də onlara "piri-muğan" (qoca zərdüşti kahin), "piri-meyfürüş" (şərabsatan qoca) deyirdilər. Sufi terminologiyasında müridlərə təriqət adabını, ilahi mərifəti öyrədən mürşidi meyxanədə şərab paylayan (və ya satan) muğa bənzədirlər. Yüksəkkeyfiyyətli, insanı məst edən şərab, yəni müridi *vəcd* halına gətirən biliklər, təlimlər yalnız onlarda olur və onun sirrini heç kimə vermirlər. Piri-muğandan yaxşı şərab (dürdi-nab) ala bilmək üçün ona təzim etmək, tapşırıqlarını yerinə yetirmək lazımdır. Təriqətdə də şeyxə qeydsiz-şərtsiz itaət müridə vacibdir. Piri-muğan təsəvvüf ədəbiyyatının əsas personajlarından biridir və demək olar ki, bütün sufi şairlərin əsərlərində ona rast gəlmək mümkündür.

Təriqətlərin çoxunun *silsiləsi* Peyğəmbərə (s) *İmam Əli (ə)* vasitəsilə bağlandığı üçün bəzən piri-muğan deyərkən Həzrət Əli (ə) nəzərdə tutulurdu.

*bax:* **MEY**, **XƏRABAT.**

***Mənbələr:*** *Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.217 və 734; Rzaqulu xan Hidayət. Riyaz əl-arifin, s.38; Seyid Ziyaəddin Səccadi. İrfan və təsəvvüfün əsaslarına giriş, s.276.*

**RƏCA** – təsəvvüf ədəbiyyatında *seyrü-süluk* yolunda sufinin keçdiyi 10 *haldan* biri. *Xovf* ilə yanaşı, *məhəbbət* və *şövq* hallarının arasında yerləşir. Rəca Allahın mərhəmətinə ümidvar olmaq mənasında qəbul edilir. Əsl mömin həm Allahın qəzəbindən qorxmalı (xovf), həm də onun mərhəmətinə ümid etməlidir (rəca). Bu iki hal mömininin qəlbində bərabər şəkildə yer tutmalıdır. Əgər xovf ilə rəcanın biri olmasa, yaxud biri o birinin üzərində üstünlük qazansa, iman nöqsanlı olar. Allahdan qorxmayan şəxs bütün məsuliyyəti itirər, öz əməllərinə cavabdehlik daşımaz, özbaşınalıq edər. Əksinə, Allahın mərhəmətinə inanmayan şəxs də öz günahlarının böyüklüyünü yada salıb ümidsizliyə qapılar, "onsuz da cəhənnəmə düşəcəyəm" düşüncəsi ilə heç bir savab iş görməz, günahdan çəkinməz. Sufilərin gözündə xovf və rəca iki ayaq kimidir, *salik* bunların vasitəsilə seyrü-süluk yolunda uğurla irəliləyər. Bunların birində nöqsan olsa, salikin mənəvi hərəkəti (təkamülü) də nöqsana düçar olar.

*bax:* **XOVF.**

***Mənbələr:*** *Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.374-378; Seyid Ziyaəddin Səccadi. İrfan və təsəvvüfün əsaslarına giriş, s.38-41; Risaleyi-Qüşeyriyyə (farsca tərcümə: Bədiüzzaman Firuzənfər), s.189-207; Sərrac Tusi. Əl-Lümə, s.89-93.*

**RİCAL əl-ĞEYB** – *qeyb* aləminə məxsus olan kişilər, ərənlər. Sufilikdə mistik məna daşıyan bu inanca görə, hər zaman dünyada Allahın seçdiyi bir dəstə *övliya* yaşayır. Onlar hamının gözündən gizlidirlər, onların məqamından heç kimin xəbəri yoxdur. Bu şəxslər Allahın onlara öyrətdiyi gizli sirləri bilir, Alla-



hın izni ilə dünyadakı bir çox hadisələri və prosesləri idarə edirlər. Onlar insanları qeyb yolu ilə irşad edir, köməyə ehtiyacı olanlara yardım göstərir, amma bu zaman gizli qalmaqda davam edirlər. Onların hörmətinə göydən yağış yağır, yerdən bitki göyərir, onların duası sayəsində müsəlmanlar kafirlərin üzərində qələbə çalırlar. İlahi sirrin daşıyıcıları olan bu şəxslərin biri öldükdə yerini dərhal başqası tutur və onların yeri heç zaman boş qalmır. Çünki əgər dünya bunlarsız qalsa, məhv olar. Dünyanı siyasi baxımdan hökmdarlar idarə etdiyi kimi, mənəvi baxımdan rical əl-ğeyb idarə edir.

Rical əl-ğeyb bir neçə təbəqəyə mənsubdur, onların sayı, neçə təbəqədə cəm olmaları, təbəqələrin adları barədə fikir ayrılıqları vardır. Rical əl-ğeybin ümumi sayının 356 və ya 589 nəfər olduğunu deyirlər, bu sayı 4.000-dək və daha çox artıranlar da var ("Şeyx Səfi təzkirəsi"ndə onların sayı 347 nəfər göstərilir). Sufi müəlliflər (İbn Ərəbi, Heydər Amuli, Hücviri və b.) onları 6-dan 35-ə kimi təbəqədə birləşdirmişlər. Geniş yayılmış təsnifata görə, iyerarxik pilləyə əsasən bu təbəqələr aşağıdan yuxarıya bu şəkildə sıralanır: nücəba, nüqəba, abdal, ovtad, imameyn və qütb. Ən yuxarı pillədə duran qütb bütün *hal* və *məqamları* özündə birləşdirir. Mühəmməd Peyğəmbər (s) də öz zamanının qütbü idi. Qütbün iki köməkçisinə (müavininə) "imameyn" (iki imam) deyirlər. Onların biri *mələkut* aləmi, digəri isə *mülk aləmi* ilə məşğul olar. *Qütb* və imameyn birlikdə təsəvvüfdə "üçlər" adlandırılır. Ovtadın sayı 4-dür, onlar Həzrət Adəm (ə), Həzrət İbrahim (ə), Həzrət İsa (ə) və Həzrət Mühəmmədin (s) ruhlarından, həm də 4 mələkdən (Cəbrail, Mikail, İsrafil və Əzrail) yardım alırlar, hərəsi Kəbənin bir küncünə (rüknünə) sahibdir. *Abdalların* sayı 7-dir, onlara da "yeddilər" deyirlər. Nücəbanın sayı 8 və ya 12, nüqəbanın sayı 12 və ya 300-dür.

Əbdürrəhman Cami "Nəfəhat əl-üns" kitabında rical əl-ğeybin ümumi sayının 4000 nəfər olduğunu qeyd etdikdən sonra onların təbəqələrini bu şəkildə sıralayır: 300 nəfər əxyar (xeyirlilər), 40 nəfər abdal, 7 nəfər əbrar (yaxşılar), 4 nəfər ovtad, 3 nəfər nüqəba, 1 nəfər qütb əl-əqtab və ya qovs.

*Ələvi* inancına görə, Mühəmməd Peyğəmbər (s) meracdan qayıdarkən bir otaqda 40 nəfərin toplaşdığını görmüş, onlarla görüşmüşdür. Bu 40 nəfər ələvi-bektaşi mənbələrində *"qırxlar məclisi"* adlandırılır. Bu mövzuda ələvi-bektaşi inancına xurafat və mistika qarışmışdır. Ələvi şairlərin əsərlərində və ələvi ayinlərində *"üçlər", "yeddilər", "qırxlar"* ifadələrinə tez-tez rast gəlinir. Bəzi mənbələrdə "üçlər" və "yeddilər"ə yuxarıdakından fərqli izahlar da verilir. Məsələn, "üçlər"i həzrət Mühəmməd (s), *Həzrət Əli (ə)* və Salman Farsi ilə, "yeddi"ləri isə bunlardan əlavə *Həzrət Fatimə (ə), İmam Həsən (ə), İmam Hüseyn (ə)* və Peyğəmbərin xanımı Xədiceyi-Kübra ilə də bağlayırlar. Ümumiyyətlə, ələvi-bektaşi inancında bəzi rəqəmlər müqəd-

dəs sayılır. Yeddi ulu ozan, Fatma ananın qurşağı (7 rəngli göy qurşağı), 40 günlük *çilə* ayini, 40 *məqam* buna misaldır.

Şeyx Səfiəddin Ərdəbilinin tövsiyələrinin toplandığı və qızılbaşlığın əsas təlimat kitabı sayılan *"Qara məcmuə"də* Şeyx Səfinin belə söylədiyi qeyd edilir: "Talibin üçü bir yerdə olsa, cənnəti-övliyadır, üçlər məqamıdır. Ol üçün biri qütbdür övliya mərtəbəsində. Ol ikisi imamın mərtəbəsində olurlar. Biri qütbün sağ yanında və biri sol yanındadır. Əgər kim, talibin yeddisi bir yerdə olsa, sidqi-övliyadır, yeddilər məqamıdır. Ol vaxt yeddinin biri övliya mərtəbəsindədir. Və əgər talibin qırxı bir yerdə olsalar, təriqi-məşayixdir, qırxlar məqamıdır".

Şah İsmayıl Xətai də "Nəsihətnamə" məsnəvisində yazırdı:

Ki, üçlər, yeddilər, qırxlar həqiçün,
Bu vala qovmi-sərməstlər həqiçün!

*(Ş.İ.Xətai)*

***Mənbələr:*** *Ahmet Yıldırım. Tasavvufda Ricalu'l-Gayb Telakkisi ve Konuyla İlgili Bazi Rivayetler, Süleyman Demirel Üniversitesi İlahiyat Fakültesi Dergisi, Yıl: 1997, Sayı: 4, s.117-147; Qara məcmuə, s.28; Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.413; Əbdürrəhman Cami. Nəfəhat əl-üns, s.24-25; Filiz Kalyon. Alevi Bektaşi Şiirlerinde Kullanılan Sembollere Dair Bir İnceleme, IV. Uluslararası Alevilik ve Bektaşilik Sempozyumu, (18-20 Ekim 2018, Ankara), s.754-755; Türkiye Diyanet Vakfi İslam Ansiklopedisi, XL, 122; Şah İsmayıl Xətai. Əsərləri (2 cilddə), II, 391.*

**RİND** – təsəvvüf aləmində uca məqama çatmış sufiyə rind deyirlər. O, elə bir dərəcəyə yetmişdir ki, kəsrət aləmindən üz çevirmiş, hətta Allahın ad və sifətlərinin dərkindən ehtiyacsız olmuş, aləmlərin və bəşəriyyətin fövqünə qalxmışdır. O, bütün bağlılıqlardan nicat tapmış, həqiqətin içində qərq olmuş, surətdən qurtulub mahiyyətə varmışdır. Rind ağla və məntiqə deyil, *eşqə* və *vəcdə* tabedir. Onun məskəni *xərabatdır*. Rindin əməllərini və hərəkətlərini başqaları anlamazlar, ona qəribə baxarlar. Füzulinin "Rindü Zahid" poeamasında da bu ziddiyyət ön plana çəkilir.

Şeydavü məstü valehü heyranəm, ey sənəm,
İxlas ilə yolunda mənəm rindü canfəda.

Gər rindəmü məlamətiyü aşiqəm, vəli
Bağrım yaxanda zahidi-gümrahə şükr edim.

*(Ş.İ.Xətai)*

***Mənbələr:*** *Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.425-426; Ethem Cebecioğlu. Tasavvuf Terimleri ve Deyimleri Sözlüğü, "rind" maddəsi; Şah İsmayıl Xətai. Əsərləri (2 cilddə), I, 92 və 374.*

**RİYAZƏT** – bədəni və *nəfsi* təmizləmək üçün xüsusi təmrinlər keçmək, özünü çətinliklərə salmaqla möhkəmlənməkdir. Əxlaq və təsəvvüf mövzusunda qələmə alınmış kitablarda riyazətin faydaları, şərtləri və növləri barədə məlumatlar verilmişdir. Həzrət Əlinin (ə) nəzərində *şəriətin* məqsədi elə nəfsi ram etməkdən ibarətdir: "Şəriət nəfsin riyazə-



tidir".

İmam Qəzzali "Nəsihətnamə" əsərində yazırdı: "Salik gərək mütləq öz nəfsinə əziyyət versin. Bu, yalnız o zaman mümkün olar ki, pis adamlarla oturub-durmaqdan çəkinsin, qəlbinə ins və cindən olan şeytanların hökmetmə yolu kəsilsin, şeytanlıq ləkəsi qəlbindən təmizlənsin".

Sufilərin əməl etdikləri riyazətlər əsasən nəfsin maddi istəklərini məhdudlaşdırmağa yönəlir. Məsələn, az və sadə yeməklə qidalanmaq, az yatmaq, qaba parçadan libas geyinmək, ardıcıl oruc tutmaq, əks cinslə ünsiyyətdən uzaq olmaq, ağır fiziki işlə yüklənmək, nafilə ibadətləri çoxaltmaq, insanlarla ünsiyyətdən qaçmaq və s. Nəfslə mübarizə təsəvvüfün əsasını təşkil edir, riyazət də bu mübarizədə uğur qazanmaq üçün praktiki göstərişlər məcmusudur. Qeyd edək ki, sufi təriqətlərində tövsiyə edilən riyazət növlərinin əksəriyyəti dini təlimatlardan qaynaqlanır, amma bəzən ifrat həddə çatır.

***Mənbələr:*** *Mizan əl-hikmə, II, 1137, hədis 7531; Fəzail əl-ənam min rəsail Hüccət əl-İslam (İmam Qəzzalinin farsca məktubları), s.104; N.Rəhimov. İrfan əlifbası, s.46.*

**RİZA** – Allahın iradəsinə tabe olmaq, baş verən hər hadisədən razı qalmaq. Rizanın *məqam*, yoxsa *hal* olduğu barədə sufilər fikir ayrılığına malikdirlər. Xorasan məktəbinin arifləri və sufiləri rizanı *təvəkküldən* sonrakı məqam saymış və arifin öz istəyi ilə bu məqama çatmasını mümkün bilmişlər. İraq təsəvvüf məktəbində isə riza hal hesab edilir və *arifin* iradəsi olmadan qəlbinə Haqdan verildiyi iddia olunur. "Risale-yi-Quşeyriyyə"də hər iki nəzəriyyə birləşdirilir: "Hər iki fikri birləşdirmək mümkündür. Rizanın başlanğıcı məqamdır və bəndə onu qazana bilər. Sonu isə haldır və qazanılmaz". Sərrac Tusinin təsnifatına əsasən, riza məqamların sonuncusudur və təvəkküldən sonra gəlir.

Deyirlər ki, rizanın üç əlaməti vardır: bəladan və qəzavü-qədərdən əvvəl qüvvət və ixtiyarı əldən vermək, bəladan sonra ağrı-acı duymamaq və bəla anında məhəbbət hiss etmək.

Sufilərin birindən soruşdular ki, riza məqamını necə hiss etdin? Cavab verdi: "Rizanın heç ətri də burnuma dəyməyib. Amma Qiyamət günündə əgər məni cəhənnəmin üstündən salınan körpü etsələr, hamı mənim üzərimdən keçib cənnətə daxil olsa, məni isə cəhənnəmə atsalar, zərrə qədər narazı qalmaram".

Ariflər demişlər ki, Allah Öz bəndəsindən razı olmayınca bəndə ondan razı ola bilməz: "Allah onlardan razıdır, onlar da Allahdan razıdırlar" (Maidə, 119). *Nəfsin* üstün mərtəbələrindən biri də raziyyə və mərziyyə nəfsdir (Allahdan razı olan və Allahın razı qaldığı nəfs).

Səfəviyyə təriqətində də riza vacib məqamlardan biridir. Şeyx Səfiəddin Ərdəbili deyirdi: "Bu təriq içində olan kişiyə lazımdır ki, əhli-riza ola. Əgər böylə olmaz isə, təriqətdən durdur (uzaqdır)".

Təriqət adabında hər işdə şeyxin razılığını almaq da ən mühüm şərtlərdən

sayılır. *"Qara məcmuə"yə* əsasən, Şeyx Səfiəddin Ərdəbili buyurub: "(Talibin) etdigi iş və getdigi yol şeyxin rizası ilə ola. Əgər şeyxin əmrinə müvafiq olmazsa, ol talibin çəkdigi zəhmət və möhnət və məşəqqət filcümlə zaye olur... Pəs talib olan kişi övliya izin izləyib, *mürşid* rizasını gözləyib əmrinə görə əməl etmək gərək, ta kim, Tanrı dostu ola. Zira kim, ustad nəfəsi təriqətdə imandır".

Şah İsmayıl Xətainin şeirlərində də riza məfhumu gözəl poetik formada işlədilib:

Könlün alub, bəhasını versən vüsal ona,
Mürvət sənin bu işdə, rizadır Xətainin.

*(Ş.İ.Xətai)*

***Mənbələr:*** *Risaleyi-Qüşeyriyyə (farsca tərcümə: Bədiüzzaman Firuzənfər), s.294-301; Sərrac Tusi. Əl-Lümə, s.80-81; İzzəddin Kaşani. Misbah əl-hidayə və miftah əl-kifayə, s.399-403; Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.416-421; Seyid Ziyaəddin Səccadi. İrfan və təsəvvüfün əsaslarına giriş, s.30-31; Qara məcmuə, s.19, 24 və 29; Şah İsmayıl Xətai. Əsərləri (2 cilddə), I, 303.*



**RUM ABDALLARI** – Osmanlı dövlətinin quruluşu ərəfəsində Anadolunun ictimai-siyasi, elmi-mədəni həyatında mühüm rolu olmuş heterodoks təbəqələrdən biri. XIII əsrdə meydana çıxmış *babailər* hərəkatının, daha sonra *bektaşiyyə* təriqətinin üzvlərinə bu ad (abdalani-Rum) verilmişdir. XIII əsrin birinci yarısında monqol təhlükəsi qarşısında Orta Asiyadan Anadoluya köçüb gəlmiş türkman tayfaları arasında yaşayan sufilərə Rum abdalları, yaxud yol boyunca Xorasandan keçdikləri üçün Xorasan ərənləri demişlər. Bunlar yəsəviyyə təriqətinin içində yetişmiş, yəsəviyyə, *məlamətiyyə*, *qələndəriyyə*, babaiyyə, heydəriyyə ideyalarının sintezini daşımışlar. Babai hərəkatının süqutundan sonra Anadolunun qərb və şimal-qərb uclarına çəkilmiş dərvişlər XIII əsrin ortalarına doğru Anadolu Səlcuq dövlətinin zəifləməsindən sonra müstəqillik qazanmış türkman bəyliklərində şiə təmayüllü, ezoterik yönümlü ələvi-bektaşi hərəkatının özəyini təşkil etmişlər. Bu hərəkatın üzvləri olan, *abdal, dədə, baba* ləqəbləri ilə tanınan dərvişlər xalq arasında öz təlimlərini sürətlə yayırdılar. Əllərindəki Əbu Müslim təbərzini (baltası) ilə odun doğrayır və təhlükələrdən qorunur, yanlarında gəzdirdikləri çaxmaqla ocaq qalayır, *kəşküllə* pul və yemək toplayırdılar. Yarıçılpaq geyinir, saqqallarını qırxıb uzun bığ saxlayırdılar, dəriləri yanmış, sinələrində Ay, *Zülfüqar* rəsmləri və *İmam Əlinin (ə)* adı həkk olunmuşdu.

Rum abdalları Osmanlı dövlətinin quruluşunda, ilk Osmanlı fəthlərində fəal iştirak etmişlər. Onların sayəsində Osmanlı fəthləri yalnız qılınc gücünə deyil, həm də təbliğat və dəvət yolu ilə baş vermişdir. Ordunun yürüşündən əvvəl Rum abdalları bölgələrə gedərək əhali arasında mənəvi mövzularda təbliğat aparır, onlarda İslama və müsəlmanlara müsbət münasibət formalaşdırırdılar. Fəthdən sonrakı müsəlmanlaşma prose-



sində də abdalların mühüm rolu olmuşdur. XV əsrdə yaşamış görkəmli ədib və tarixçi Aşikpaşazadə öz tarixində Rumda 4 tayfanın mövcudluğundan bəhs etmişdir: Rum qazıları, Rum *əxiləri*, Rum abdalları və *Rum bacıları.* XVI əsrdən etibarən *bektaşiyyənin* ikinci piri Balım sultanın səyləri nəticəsində təriqətin strukturu formalaşdıqdan sonra bektaşi kimliyini qazanmış Rum abdalları yeniçəri bölüklərinin içinə daxil olaraq burada təriqəti təbliğ etmişlər.

Rum abdallarının ən məşhurları: Qumral Abdal, Doğlu Baba, Abdal Murad, Abdal Mehmed, Qaraca Əhməd, Geyikli Baba, Abdal Musa, Qayğısız Abdal, Budala Sultan, Postinpuş Baba və b. Bunların bir çoxu *ozan*-aşıq kimi məşhur olmuş, şeirləri dərvişlər tərəfindən oxunmuşdur. Abdal Musanın müridi Qayğısız Abdal nəfəslərinin (qoşmalarının) birində yazırdı:

Bəylərimiz Əlvan gölün üstünə
Ağlar gəlir şahım Abdal Musaya.
Urum abdalları postun əyninə
Bağlar gəlir şahım Abdal Musaya.

Urum abdalları gəlir dost deyü,
Əynimizdə əba, xirqə, post deyü,
Xəstələri gəlir dərman istəyü,
Sağlar gəlir şahım Abdal Musaya.

***Mənbələr:*** *Haşim Şahin. Osmanlı Devletinin Kuruluş Döneminde Abdalân-i Rum, 1300-1400 (Yüksek Lisans Tezi); Mehmet Hakan Alşan. Melametiler, Horasan Erenleri, Abdalan-i Rum, Baciyan-i Rum, Qaziyan-i Rum, Ahiyan-i Rum, s.29-43; Türkiye Diyanet Vakfı İslam Ansiklopedisi, I, 61; Fuad Köprülü. Osmanlı Devleti'nin Kuruluşu, s.94-102; Alevi-Bektaşi Şiirleri Antolojisi, I, 220; Aşikpaşazadə tarixi, s.571.*

**SAĞƏR** – piyalə, qədəh deməkdir. *Mey* məclislərində istifadə edilir, *saqi* tərəfindən doldurulub təqdim olunur. İrfan və təsəvvüf terminologiyasında *qeyb* nurunun müşahidə edildiyi və qeyb mənalarının dərk olunduğu hər şey sağər sayılır. Yəni simvolik obraz olaraq sağər – Allahı dərk etməyin vasitəsidir, bu yolla Allah Özünü bəndəsinə tanıdır. Arifin *qəlbini* də sağərə bənzətmişlər. Bu mənada sağər *cam (cami-Cəm)* məfhumu ilə eyniyyət təşkil edir.

***Mənbələr:*** *Əbdülbaqi Hiyləmən. İrfan və təsəvvüf terminləri və nüanslar, s.124; Fərhənfi-farsiyi-Müin, II, 1262; S.Z.Səccadi. İrfan və təsəvvüfün əsaslarına giriş, s.276; S.C.Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.451-452.*

**SAQİ** – məclislərdə xidmət edən və qədəhlərə içki süzən şəxsə deyilir. İrfan ədəbiyyatında isə aşiqlərin qəlbini *eşq meyi* ilə dolduran, gözlərini eşq riqqəti ilə yaşardan Allah-Taala saqi adlandırılır. Qurani-Kərimdə cənnət əhlinin təsvir edildiyi ayələrin birində buyurulur: "Rəbbi onlara çox pak bir içki içirəcək" (Həlәta (İnsan), 21).

Xətai bəndəyə saqi içirmiş cami-səhbadən,
Görün meyxanəküncündə, əcəb məstanə düşmüşdür.

Saqiyi-baqi əlində məst olub içməkdəyüz,
Nərgisi-məstin kimi məstanə gəlmişlərdənüz.

Klassik şeir nümunələrində "saqi" sözü bəzən Mühəmməd Peyğəmbərə (s) və başqa din müqəddəslərinə işarə olaraq işlədilir:

Piri-meyxanyei-qədimü qidəm,
Saqiyi-bəzmü həlqeyi-xatəm.
*(M.Füzuli)*

Bəzən haqq yolçusunun irfan yolundakı rəhbərinə – *mürşidə* də saqi deyirlər. Bəzən də şair qarşıya qoyduğu məqsədə çatmaq və nəzərdə tutduğu mətləbləri uğurla vəsf edə bilmək üçün saqi adlı xəyali varlıqdan imdad istəyir. Bu saqi şairə ilham verir və qələmə aldığı əsəri bitirməkdə ona yardımçı olur. Şah İsmayıl Xətai rübailərinin birində deyir:

Ta badeyi-xoşgüvar var, ey saqi,
Ta vardır əlində ixtiyar, ey saqi,
Bir dövr elə ki, dövrü dolanmış dövran
Nə badə qoyar, nə badəsar, ey saqi!

Klassik şeirlərdə "saqi" *İmam Əlinin (ə)* ləqəbi kimi də işlədilir. Çünki hədislərə görə, o, axirətdə Kövsər bulağının başında öz tərəfdarlarına su içirəcək. Xətai yazır:

"Həlata"də Həq sənə çün saqiyi-mütləq dedi,
Abi-Kövsərdən sənin dəstindədir yaquti-cam.

***Mənbələr:*** *Seyid Ziyaəddin Səccadi. İrfan və təsəvvüfün əsaslarına giriş, s.273-284; Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.452; Əbdülbaqi Hiyləmən. İrfan və təsəvvüf terminləri və nüanslar, s.125.*

**SALİK** – ərəb dilindən tərcümədə "yol gedən" mənasını verir. Təsəvvüf terminologiyasında *seyrü-süluk* yoluna qədəm basmış, bir *mürşidin* tərbiyəsi altında təriqət yolunda irəliləyən, amma hələ şeyxlik və mürşidlik mərtəbəsinə yetişməmiş *müridə* salik deyirlər. Salik seyrü-süluk yolunda müvəffəqiyyət qazanmaq üçün təriqət adabına və mürşidin göstərişlərinə tam diqqətlə əməl etməlidir.

Sufi ədəbiyyatında salik və onun yolu haqqında deyilir: "Salik o kəsdir ki, *məqamlar* üzərində öz elmi və təsəvvürü ilə yox, *halı* ilə hərəkət edir". "Salik – Allaha doğru səfər edən kəsdir. Süluk – bağlılıqdan azadlığa (xilasa), kəsrətdən (çoxluq aləmindən) vəhdətə sarı olan yoldur".

Salik təriqətdə buyurulmuş *riyazətlər* vasitəsilə öz *nəfsini* təmizləyir. Seyrü-süluk yolunda o, halları adlayaraq məqamdan-məqama keçir, onun nəfsi də mərtəbədən-mərtəbəyə yüksəlir. Anlayır ki, əslində göründüyü kimi bədən və nəfsdən ibarət deyil, onun əsl həqiqəti üluhiyyət məqamıdır, bu məqamdan enərək hazırkı qəlibə düşüb. O, tövhid dəryasında bir qətrə kimi təlatümə gəlir, Allahda fani olur. Sonra o, daha da təkamül edərək Allahla baqi olmaq dərəcəsinə çatır. İnsanlıq həqiqəti bütün kamilliyi ilə onda *təcəlla* edir, salik Allahın bütün ad və sifətlərinin məzhərinə (zühur yerinə) çevrilir. Bu məqama çatmış salik artıq özü mürşiddir, təriqət şeyxidir.

Şah İsmayıl Xətai təsəvvüf yolunda irə-



liləyən salikə xitabən deyirdi:

Yürü, sufi, yürü, yolundan azma,
Elin qeybətinə quyular qazma.
Yorulma bihudə, boşuna gəzmə,
Yanında mürşidin yar olmayınca.

*bax:* **SEYRÜ-SÜLUK, NƏFS və ONUN MƏRTƏBƏLƏRİ.**

***Mənbələr:*** *Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.454-456; Qısa İslam Ensiklopediyası (N.Rəhimovun ümumi redaktəsi ilə, 2 cilddə), I, 228; Xətai. Əsərləri, s.330.*



**SEYRÜ-SÜLUK** – ərəb dilindən tərcüməsi "seyr etmək, gəzib-dolaşmaq" deməkdir. Təsəvvüf aləmində insanın Allaha doğru mənəvi təkamül yolunu seyrü-süluk adlandırırlar. Təsəvvüf mövzusunda yazılmış klassik əsərlərin birində deyilir ki, seyrü-süluk pis sözlərdən yaxşı sözlərə, bəd əməllərdən xeyir əməllərə, mənfi əxlaqdan müsbət əxlaqa, özündən Allaha doğru yönəlməkdir. Bu yolun yolçusuna *salik* deyirlər.

Seyrü-süluk əslində hər bir varlığın fitrətində, batinində qoyulmuş bir proqramdır. Bütün dünya hərəkət halındadır və hərəkətlər iki əsas istiqamətdə cərəyan edir. Bu istiqamətlərin biri Allahdan məxluqata, ən yüksək pillədən ən aşağı pilləyə doğru yönəlib və "qovsi-nüzul" (eniş yarımdairəsi) adlanır. Buna irfanda *təcəlla* da deyirlər. Allahın təcəllası hər şeydə əks olunur, sadəcə hər əşya öz tutumu qədərində Allahı təcəlla etdirir. İkinci hərəkət isə aşağıdan yuxarıya, məxluqatdan Xaliqə (Allaha) doğru hərəkətdir. Bu, "qovsi-süud" və ya "qovsi-üruc", yəni yüksəliş yarımdairəsidir, buna *eşq* deyirlər. Kainatda olan hər bir varlığın əsli, kökü Allahdandır, hər bir varlıq öz əslinə qayıtmaq istəyir. Eşq hər şeyi Allaha doğru çəkir. Mövlananın təbirincə desək, qamışlıqdan kəsilmiş ney fəryad edərək öz vətəninə qayıtmaq istədiyi kimi, *arif* də Allaha doğru qayıtmaq eşqi ilə alışıb yanır. Bu qayıdış seyrü-süllukdur. Hər kəsin Allahdan uzaqlığı, səviyyəsi, tutumu, xasiyyəti (temperamenti) fərqli olduğu üçün bu yolu fərqli sürətlə, fərqli metodlarla və fərqli uğurlarla keçir. Daxilində eşq adlı hərəkətverici qüvvəsi olan hər kəs bu yolda irəliləməyə çalışır.

Seyrü-sülukun başlanğıcında insanın mütləq *mürşidi* (ustadı, rəhbəri) olmalıdır, yəni insan hər hansı sufi *təriqətinə* bağlanmalıdır. Ariflər seyrü-süluk yoluna mürşidsiz çıxmağı mənasız və nəticəsiz sayırlar.

Seyrü-süluku fərqli təsnifatlara əsasən mərhələlərə bölmüşlər. Bir təsnifata əsasən, seyrü-süluk 3 (və ya 4) mərhələdən ibarətdir: *şəriət, təriqət, (mərifət)* və *həqiqət*.

Digər təsnifata görə, seyrü-süluk qəlbin 3 mərhələni keçməsindən ibarətdir: təxəlli, təhəlla və təcəlli. Bu adlar bircə hərflə fərqlənir. Fərqləndikləri "x", "h" və "c" hərflərinin ərəb əlifbası ilə yazılış şəkli də, demək olar ki, eynidir və yalnız nöqtə təfavütünə malikdir. Təxəlli pis sifətlərdən təmizlənmək və insanı Allahdan uzaqlaşdıran əməlləri tərk etməkdir. Təhəlli gözəl və bəyənilən sifətləri özündə tərbiyə etmək və öz

əxlaqını bunlarla bəzəməkdir. *Təcəlli* (təcəlla) isə salikin qəlbində Haqq nurunun parlamasıdır.

Daha bir təsnifata görə, seyrü-süluk boyunca salikin *nəfsi* mərhələdən-mərhələyə keçir, əmmarə, ləvvamə, mülhimə, mütməinnə, raziyə, mərziyyə və kamilə pillələrini adlayır, bütün eyib və rəzilətlərdən təmizlənir, paklıq əldə edir. Salik seyrü-süluk yolunda haldan-hala düşür, məqamdan-məqama adlayır; bu *hal* və *məqamlar* təsəvvüf mənbələrində ətraflı izah edilib.

Seyrü-sülukun *"əl-əsfar əl-ərbəə"* (dörd səfər) adlandırılan 4 əsas mərhələsinin də olduğunu yazırlar, salik bunları keçməklə Allaha doğru yaxınlaşır. Bunlar *Molla Sədranın hikməti-mütəaliyə* fəlsəfəsində və eyniadlı əsərində geniş izah edilib.

Sufi təriqətlərinin əksəriyyətində seyrü-süluk yolunun uğurla keçilməsi üçün *çilələrin* (bədəni və ruhu əziyyətə salan təmrinlərin) vacib olduğu vurğulanır. Bu yol yalnız elm və biliyin gücünə keçilməz, onu yaşayaraq, duyaraq, təcrübə edərək keçmək lazımdır. Buna görə də ayrı-ayrı sufi təriqətlərinin və məşhur təsəvvüf xadimlərinin seyrü-süluk barədə təsəvvürləri fərqlidir. Bu fərqliliklər onların mənəvi hazırlıq dərəcəsindən, xasiyyətindən, qavrama bacarığından və emosional durumundan qaynaqlanır.

*bax:* **SALİK, NƏFS və ONUN MƏRTƏBƏLƏRİ, HİKMƏTİ-MÜTƏALİYƏ.**

***Mənbələr:*** *Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.475-476; Qısa İslam Ensiklopediyası (N.Rəhimovun ümumi redaktəsi ilə, 2 cilddə), I, 228; Mürtəza Mütəhhəri. İslam elmləri külliyyatı, II, 136-137.*



**SƏBİR** – təsəvvüfdə 7 *məqamdan* beşincisidir, *fəqrdən* sonra, *təvəkküldən* əvvəl gəlir. Qurani-Kərimdə buyurulur: "Allah səbir edənlərlədir" (Ali-İmran, 146). Rəsulüllahdan iman barədə soruşdular, "Səbir və xoş əxlaqdan ibarətdir" cavabını verdi. Başqa bir hədisdə isə deyilir: "İman iki hissədən ibarətdir, yarısı səbir, yarısı da şükürdür".

Səbir məqamının fəqrdən sonra gəlməsi təsadüfi deyil, bu məqamda arif fəqrdən doğan əziyyətlərə dözər. Arifə istər nemət verilsin, istərsə bəla, başa düşər ki, bunlar Allahın iradəsi və Öz bəndəsindən ötrü seçimidir. Əgər sınaq üçün verilirsə, mömin *səbir* edər; əgər məhəbbət və lütf məqsədilə verilirsə, *şükür* söyləyər.

Ariflərin fikrincə, səbrin ən yüksək dərəcəsi odur ki, bəladan xilas olmağın intizarını çəkməyəsən.

Nəsirəddin Tusi "Ovsaf əl-əşraf" kitabında səbrin 3 növü olduğunu göstərir: Səbrin birinci növü avamlara məxsusdur; onlar əsl *ariflərə* bənzəmək arzusu ilə bəladan şikayət etməz və dözərlər. Səbrin ikinci növü abidlərə, zahidlərə və *təqva* əhlinə məxsusdur ki, axirət mükafatının təmənnası ilə səbir edərlər. Ariflərin səbri bunların hamısından üstündür. Onlar bəlanı Allahdan bir lütf kimi qəbul edib bundan ləzzət alarlar.



İrfan ədəbiyyatında səbir salikin vücudunu misdən qızıla çevirən sehirli maddəyə, Həzrət Yusifi (ə) quyudan çıxaran xilaskar ipə bənzədilir.

***Mənbələr:*** *Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.521-524; Seyid Ziyaəddin Səccadi. İrfan və təsəvvüfün əsaslarına giriş, s.26-27; Risaleyi-Qüşeyriyyə (farsca tərcümə: Bədiüzzaman Firuzənfər), s.278-287; Sərrac Tusi. Əl-Lümə, s.76-77; Nəsirəddin Tusi. Ovsaf əl-əşraf, s.59-60.*

**SƏFƏVİYYƏ** – XIV əsrdə böyük təsəvvüf xadimi, Səfəvilər sülaləsinin əcdadı, *Şah İsmayıl Xətainin* ulu babası, *İmam Musa Kazimin (ə)* nəslindən olan Şeyx *Səfiəddin İshaq ibn Cəbrail Ərdəbili* (1252-1334) tərəfindən əsası qoyulmuş təriqət. Səfəviyyə təriqətinin adı öz banisinin ləqəbindən (Şeyx Səfi) götürülmüşdür. Şeyx Səfiəddin Ərdəbili əvvəlcə məşhur sufi Şeyx *Zahid Gilaninin* müridi olmuş, onun vəfatından sonra (1301-ci il) səfəviyyə təriqətini təsis etmişdir. Səfəviyyənin ideoloji əsasları *sührəvərdiyyə* və *zahidiyyə* təriqətlərinin görüşləri əsasında formalaşmış, öz növbəsində *bektaşi* və *hürufi* ənənələrinə böyük təsir göstərmişdir. Təriqətin *silsiləsində* Şeyx Zahid Gilani, Əbunnəcib Sührəvərdi, Qütbəddin Əbhəri, Cüneyd Bağdadi, Səriyy Səqəti, Məruf Kərxi, Davud Tai kimi məşhur təsəvvüf xadimləri yer tutur. Silsilə Həsən Bəsri vasitəsilə *Həzrət Əliyə (ə)*, onun vasitəsilə də Mühəmməd Peyğəmbərə (s) bağlanır.

Səfəviyyə təriqəti müxtəlif dövrlərdə İslam coğrafiyasının böyük bir hissəsində – Azərbaycan, Qafqaz, İran, Anadolu, İraq, Suriya, Ərəbistan, Orta Asiya, Livan, hətta Hindistan, Seylon, Şimali Çin torpaqlarında yayılmışdır. Təriqət o qədər güclü idi ki, Elxani sərkərdəsi Əmir Çoban Sulduzun "Mənim əsgərlərimin sayı çoxdur, ya sənin müridlərinin" sualına Şeyx Səfi bu şəkildə cavab vermişdi: "Başqa ölkələrlə işim yoxdur, təkcə bu diyarda sənin hər əsgərinin müqabilində bizim yüz *müridimiz* var".

Şeyx Səfidən sonra onun nəslindən olan canişinləri Ərdəbil *təkkəsinə* rəhbərlik etməklə bərabər, bölgənin ictimai-siyasi həyatında da mühüm rol oynamışlar. Şeyx Səfinin oğlu Şeyx *Musa Sədrəddinin* zamanından başlayaraq hər il Osmanlı sultanları təriqətin Ərdəbildəki təkkəsinə çıraq ağçası adı ilə pul və bahalı hədiyyələr göndərirdilər. Şeyx Sədrəddinin oğlu *Xacə Əli Siyahpuş* Teymurlənglə görüşmüş, onun rəğbətini qazanmışdı. Hətta Xacə Əlinin xahişi ilə Teymurləng Osmanlı dövləti ilə müharibədə ələ keçirdiyi on minlərlə əsiri ona bağışlamışdı. (Onların sayının 30 min, hətta 40 min nəfər olduğunu yazırlar). Bu əsirlər Xacə Əli tərəfindən azad edildikdən sonra səfəviyyə təriqətinə qoşuldular. Onların əksər hissəsi Anadoluya qayıtdı və orada səfəviliyi yaymağa başladı. XV əsrin ikinci yarısından etibarən Səfəviyyə şeyxləri siyasi fəaliyyətə qoşuldular. Şeyx Səfinin nəslindən olan Şeyx Cüneyd və *Şeyx Heydər* təriqəti həm də hərbi gücə çevirərək, siyasət səhnəsinə daxil oldular.

Məhz Şeyx Heydərin zamanında səfəvilik daxilində şiə-qızılbaş kimliyi formalaşdı. Səfəvi müridləri başlarına 12 şiə imamının şərəfinə 12 zolaqlı qırmızı papaq qoyaraq, *"qızılbaş"* kimi tanındılar. Nəhayət, Şeyx Səfiəddinin altıncı nəsildən xələfi Şah İsmayıl Səfəvi bölgədəki bütün rəqiblərini məğlub edərək möhtəşəm Səfəvilər dövlətinin əsasını qoydu.

Səfəviyyə təriqətinin İslam tarixində rolu o qədər mühümdür ki, hər xalq onu öz mənəvi irsi hesab edir və özününküləşdirir. Şeyx Səfinin fars, kürd, ya türk mənşəli olması barədə mübahisələr getsə də, danılmaz tarixi faktlar onun məhz Azərbaycan türkü olduğunu təsdiq edir. Görkəmli şərqşünas V.V.Bartold bu barədə yazırdı: "Şübhəsiz, bu Ərdəbil dərvişləri fars deyil, türk mənşəlidirlər. Azərbaycan artıq o zamanlar əhalinin tərkibi baxımından türk ölkəsi idi. Türk tayfaları şeyxlərin ətrafında getdikcə daha sıx birləşirdilər".

Səfəviyyə təriqəti sufi ənənələrinin ən müsbət cəhətlətini əxz edərək özündə toplamışdır. Bu təriqətin nizamnaməsi sayılan *"Qara məcmuə"* və *"Şeyx Səfi təzkirəsi" ("Səfvət əs-səfa")* Şeyx Səfinin əxlaqi tövsiyələrini, irfani terminlərə verdiyi sadə, amma dolğun izahları, təriqətin adab və ərkanını ehtiva edir. Bəzi mənbələrdə səfəviyyə təriqətində də, zahidiyyədə olduğu kimi, *səma* ayininin qəbul edilmədiyi yazılsa da, adıkeçən mənbələrdə Şeyx Səfinin və ətrafındakı dərvişlərin səma ayini icra etmələri barədə dəfələrlə məlumat verilmişdir. Səfəviyyə təriqətində *xəlvət* ayini geniş yayılmışdı, *xanəgahlarda zikr* və *tövbə təlqini* ayinləri yerinə yetirilirdi. Şeyx Zahid Gilaninin formalaşdırdığı 12 zikr nəzəriyyəsi səfəviyyə təriqətində də mövcuddur. Allahın 1001 adı arasından 12-si xüsusi seçilmiş, bunlar da "əsmai-səbiyyə" (yeddi isim) və "əsmai-xəmsə" (beş isim) adlı iki hissəyə bölünmüşdü. Allahın yeddi adından yaranan zikrlərə bunlar aiddir: La ilahə illəllah, Allah, Hu, Həqq, Həyy, Qəyyum və Qəhhar. Beş isim isə bunlardan ibarətdir: Səməd, Əhəd, Vahid, Fəttah və Vəhhab. Bu beş ismə "bəqa isimləri" də deyilir. Çünki təriqət adabına görə, bu adları ardıcıllıqla və dərəcəsini anlayaraq zikr edən sufi əvvəlcə *fəna*, daha sonra *bəqa* mərtəbəsinə yetişər.

Səfəviyyə təriqəti maddi imkan baxımından ən üstdə duran sufi təriqətlərindən idi. Onun Ərdəbil və ətrafında, eləcə də digər məntəqələrdə zəngin daşınan və daşınmaz *vəqf* əmlakı vardı. Bazarlar, dükanlar, karvansaralar, bağlar, hətta ayrı-ayrı kəndlər təriqətin Ərdəbildəki *təkkəsinə* vəqf edilmişdi. Ərdəbil *xanəgahının* vəqflərinin həcmi Qərb səyyahlarını heyrətə gətirirdi. Təriqət geniş xeyriyyəçilik fəaliyyəti ilə məşğul olurdu, hər gün yüzlərlə imkansız adama xanəgahda yemək verilirdi.

*Bayramiyyə* təriqətinin banisi Hacı Bayram Vəlinin mürşidi Somuncu Baba, görkəmli şair *Qasimi-Ənvar,* Elxanilərin vəziri Rəşidəddin Fəzlullah, onun oğlu Qiyasəddin Rəşidi, hətta bəzi mə-



lumatlara görə, Elxani hökmdarı Əbu Səid və Elxanilər dövlətinin ən güclü fiquru Əmir Çoban Sulduz səfəviyyə təriqətinin müridi olmuşlar.

***Mənbələr:*** *Türkiye Diyanet Vakfı İslam Ansiklopedisi, XXXV, 460-462; Qazı Nurullah Şüştəri. Məcalis əl-möminin, II, 43; Бартольд В.В. Сочинения, 2-ой том, 1-ая часть, стр.748; Natig Rahimov. Azerbaijan's Contribution to Islamic Culture. An Undicsovered Treasure ("Contributions of The Eurasian Nations to Islamic Culture"), pp.182; İzahlı dini terminlər lüğəti, s.258.*



**SƏMA** – geniş yayılmış təriqət ayini. Ərəb dilindən tərcümədə eşitmək deməkdir. Təsəvvüf terminologiyasında müəyyən avaz və musiqi sədalarını dinləyən sufilərin *vəcdə* gələrək rəqsəbənzər hərəkətlər etməsinə səma deyilir. Səma bir çox sufi təriqətlərinin xarakterik xüsusiyyətlərindən sayılır və bir təriqət ayini kimi dəqiq qaydalar çərçivəsində və xüsusi ardıcıllıqla icra olunur. Səma ayini ya vokal ifanın, ya da ney və sairə musiqi alətlərində ifa olunan instrumental melodiyanın sədaları altında yerinə yetirilir.

Sufilərin fikrincə, *salikin* haqqa doğru cəzb olunması, onun malik olduğu *halın* dəyişməsi, *qəlbin* ətalətdən çıxaraq hərəkətə gəlməsi üçün səma əvəzsiz rola malikdir. Təsəvvüf aləmində vəcdin hansı səsdən alınmasına baxmayaraq, bu, səma adlanır. Sufi istər azan səsindən, istər Quran tilavətindən, istər külək əsintısindən, istərsə də ney sədasından vəcdə gələrək səmaya hazır ola bilər. Sufilər deyirlər ki, gözəl avaz körpə uşağı sakitləşdirib yatırdığı kimi, xəstə ürəkləri və incimiş könülləri də aram edir, onlara şəfa verir. Səma zamanı insanın batinində toplanıb qalmış emosiyalar və hallar (*xovf* və *rəca*, şadlıq və hüzn, *şövq* və *məhəbbət*) gah sevinc, gah da ağlamaq şəklində zahirə çıxır. Səmadan insan bədəninin hər bir üzvü özünəməxsus həzz alır və səma hər kəsə bir cür təsir edir: kimini fəryada gətirir, kimini ağladır, kimini oynadır, kimini əl çalmağa məcbur edir, kiminin də huşunu başdan aparır.

Səma zamanı ney və daha bir neçə köməkçi alətin müşayiəti altında dərvişlər dəqiq trayektoriya üzrə fırlanır, bu zaman sanki təbiətin (kosmosun) səsini eşitdiklərini təsəvvür edirlər ("səma" sözünün mənasına uyğun olaraq). Enli ətəkli ağ paltar geyinmiş, çiyinlərinə qara örtük salmış, başlarına dəridən ağ uzun papaq qoymuş dərvişlər bir-birinə toxunmadan, həm öz oxunun, həm də mürşidin ətrafında dövrə cızırlar. Bu zaman dərvişin sağ əli yuxarıya, sol əli isə aşağıya doğru tutulur, bununla onlar sanki ilahi enerjini göydən alıb yerə ötürmüş olurlar. Fırlanmanı asanlaşdırmaq üçün dərviş başını çox zaman yana əyir. Getdikcə səmanın ritmi tezləşir, dərvişlər çiyinlərindəki qara örtüyü yerə atır, Allahın hüzurunda ağ kəfənə bürünmüş kimi durduqlarını təsəvvür edərək rəqsi davam etdirirlər. Səma halında fasiləsiz olaraq fırlanan dərviş trans halına düşür, ətrafdakı hər şeyin bir-birinə qarışdığını, əriyərək yox olduğunu, yal-

nız özünün qaldığını hiss edir.

Təsəvvüf aləmində hər kəs səmaya layiq deyil və əyləncə, kef, ləzzət dalınca qaçanlara səma nəinki fayda verməz, hətta onlara qadağandır.

Təsəvvüflə ilahiyyatı birləşdirməyə çalışan Əbu Hamid Qəzzali "Kimiyayi-səadət" əsərində səma haqqında yazırdı: "Bil ki, insanın daxilində Allah-Taalanın sirri vardır. Atəş dəmirin içində gizli olduğu kimi, bu sirr də qəlbdə gizlidir. Dəmirə daş sürtündükdə atəşin sirri aşkara çıxar və ətrafı yandırar. Eləcə də səmanın xoş avazı insanlıq gövhərini hərəkətə gətirər və insanın özündən ixtiyarsız olaraq daxilindəkiləri üzə çıxarar".

Qəzzali səmanı mütləq mənada haram bilənləri zahir əhli və qafil adlandıraraq bu fikri irəli sürür ki, səma üç növdür və uyğun olaraq hər növün öz hökmü vardır:

1) Qəlbində gözəl sifətlər və *şəriətə* meyil olan şəxsə səma müsbət təsir göstərir, həmin xüsusiyyətləri daha da gücləndirir. Bu cür səmanın savabı vardır.

2) Hər kimin qəlbində batil vardırsa, səma ilə daha da güclənər və kök salar. Belə səma haramdır.

3) Hər kimin qəlbində bu iki cəhət bərabərdirsə, özü də səmaya qulaq asıb öz təbiətinə uyğun şəkildə ləzzət alırsa, onun üçün səma mübahdır (icazə veriləndir).

Həmçinin Qəzzali 5 halda səmanı haram hesab edir: 1) Səma avazını qadın oxuyarsa; 2) Rübab, çəng, bərbət kimi musiqi alətlərində ifa edilərsə; 3) Səmanın sözlərində söyüş, həcv və din əhlinə təhqir olarsa; 4) Səmanı eşidən cavandırsa və şəhvət ona qalib gəlib Allahın yolundan döndərərsə; 5) Avam camaat səmanı özünə peşə edib əyləncə və eyş-işrət vasitəsinə çevirərsə.

Səma mövzusuna təsəvvüfün ilk dövrlərindən etibarən məşhur sufilərin kəlamlarında və praktikasında rast gəlinirdi; lakin bu söz bəzən sadəcə olaraq dinləmək, eşitmək, gözəl səsdən zövq almaq mənalarında qəbul edilirdi. Hələ Sərrac Tusi (X əsr), Qüşeyri (XI əsr), Əbu Hamid Qəzzali (XI-XII əsrlər) öz əsərlərində səmadan ətraflı şəkildə bəhs etmiş, onun adabından yazmışlar. Amma səma öz dəqiq, əsaslandırılmış, kompleks həllini məhz mövləviyyə təriqətində tapmışdır.

Səfəviyyə təriqətinin banisi Şeyx Səfiəddin Ərdəbilinin həyatı barədə yazılmış mənbələrdən aydın olur ki, o da səma ayinini qəbul edirdi. "Şeyx Səfi təzkirəsi"ndə onun həm Şeyx Zahidin xidmətində olduğu zamanlarda, həm də sonralar öz *təkkəsində* səma etməsi barədə çoxlu misal vardır. Səfəviyyə müridləri Şeyx Səfinin hüzurunda səma ayinini icra edirdilər. Şeyx Səfi qeyd edirdi ki, səma insanlara fərqli təsir edir, bəziləri öz istəyi ilə səma edib-etməməyi seçə bilirlər, amma bəziləri *vəcd* halında qeyri-ixtiyari olaraq səmaya başlayırlar: "Səmai-əhli-vəcd ixtiyari degildir. Şol dəgirman çərxi kimi onun hərəkəti və dövranı kəndü ixtiyarı ilə degildir. Nə qədr kim, ol çərxin suyu ziyadə ola, onun hərəkəti dəxi ziyadə olur".



Şeyx Səfiəddin fəlsəfəsini anlamadan səma edənlər haqqında deyirdi: "Amma şunlar ki qəvvaldan (irfani şeirlər və sözlər danışanlardan) sözü nəfs ilə eşidələr və ortaya girib rəqsi-nəfsani və şəhvani edələr, anlara ol səma haramdır". O, qadın və kişilərin səma ayinini birlikdə icra etmələrini günah bilir və qadağan edirdi.
Əksər şəriət alimlərinin səmaya münasibəti mənfi olmuşdur. Onlar səmada istifadə olunan avazları ğina (haram musiqi) hesab etmiş, səmanın rəqsəbənzər hərəkətlərini də haram saymışlar.

***Mənbələr:*** *Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.477-487; Seyid Ziyaəddin Səccadi. İrfan və təsəvvüfün əsaslarına giriş, s.262-268; Lüğətnameyi-Dehxuda, IX, 13749-13750; Türkiye Diyanet Vakfı İslam Ansiklopedisi, XXXVI, 455-457; Sərrac Tusi. Əl-Lümə, s.349-36; K.Bünyadzadə. Sərrac Tusinin "əl-Lümə" əsəri, s.128-133; Risaleyi-Qüşeyriyyə (farsca tərcümə: Bədiüzzaman Firuzənfər), s.591-621; Qısa İslam Ensiklopediyası (N.Rəhimovun ümumi redaktəsi ilə, 2 cilddə), I, 238-240; Ğəzzali. Kimiyayi-səadət, s.369-389; Davud İlhami. İrfan və təsəvvüf, s.290-291; Arif Demir. İlk Mutasavvıfların Musiki Anlayışları (Çukurova Üniversitesi İlahiyat Fakültesi Dergisi, 15 (2), s.65-87; Qara məcmuə, s.78-79.*

**SƏNƏM** – *büt* deməkdir. İrfani terminologiyada fərqli mənalara malikdir, bəzən bu mənalar bir-biri ilə ziddiyyət təşkil edir. Sənəm (büt) bəzən insanın nəfsi istəkləri (həvavü həvəs), Allahdan başqa hər şey (masivallah) mənasında qəbul edilir. Bəzi ariflər isə sənəm (büt) deyərkən vəhdət məqamını və ya şühud (Allahı müşahidə) aləmini nəzərdə tutmuşlar. Büt eşqin təzahürü mənasında da qəbul edilir; aydındır ki, burada ilahi eşqdən söhbət gedir. Ruhani həqiqətlərin obraz şəklində təzahürü, yəni kamil insan və mürşid də sənəm adlandırılır.
*bax:* **BÜT.**

***Mənbələr:*** *Əbdülbaqi Hiyləmən. İrfan və təsəvvüf terminləri və nüanslar, s.48-49; Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.534.*

**SİLSİLƏ** – sufi təriqətlərində rəhbərliyin bir *şeyxdən* digərinə ötürülmə zənciri. Bu ötürülmə ardıcıllığını təsdiqləyən sənədə "icazətnamə", "silsilənamə", "tumar" deyilir. Təsəvvüfün ilkin mərhələlərində silsilələr şifahi şəkildə məlum idi, təriqətləşmə prosesi inkişaf etdikdən sonra silsilənamələr yazıya alınmağa başladı. Ən qədim silsilənamənin XIII əsrin əvvəllərində kübrəviyyə təriqətinin banisi Nəcməddin Kübra tərəfindən öz *xəlifəsi* Rəziyəddin Əli Lala üçün yazıldığı məlumdur. Adətən uzun əsrlər boyunca təriqətin arxivində saxlanılan silsilənamədə hər şeyx öz adının qarşısında imza qoyub möhür basır və bununla da xəlifəliyi kimə ötürdüyünü təsdiqləyir.
Təriqətdə silsilənin dəqiq və etibarlı olması mühümdür, çünki təriqətin legitimliyi bundan asılıdır. Silsilə xətti mütləq konkret tarixi şəxsiyyətlər vasitəsilə Məhəmməd Peyğəmbərə (s) kimi uzanmalıdır. Bəzi təriqət silsilələrində fərq-

lilik və qeyri-dəqiqliklər mövcuddur ki, bu da uzun zaman keçməsi və ilk zamanlar məlumatların yazıya alınmaması ilə bağlıdır.

Sufi təriqətlərinin hamısı Mühəmməd Peyğəmbərə (s) Həzrət Əli ibn Əbu Talibin (ə) vasitəsilə bağlanır, yalnız nəqşbəndiyyə təriqətinin silsiləsi Əbubəkr xətti ilə gəlir.

Səfəviyyə təriqətinin mötəbər mənbələrindən sayılan *"Səfvət əs-səfa"* kitabında təriqətin silsiləsi Şeyx Səfiəddin Ərdəbilidən Peyğəmbərə (s) kimi bu şəkildə qeyd edilib:

Şeyx Səfiəddin Ərdəbili – Şeyx İbrahim Zahid Gilani – Seyid Cəmaləddin Təbrizi – Şeyx Şihabəddin Mahmud Təbrizi – Rüknəddin Sücasi – Əbubəkr Əbhəri – Əbunnəcib Sührəvərdi – Qazi Vəcihəddin Ömər Bəkri – Məhəmməd Bəkri – Əhməd Əsvəd Dinəvəri – Mümşad Dinəvəri – Cüneyd Bağdadi – Səriyy Səqəti – Məruf Kərxi – Davud Tai – Həbib Əcəmi – Həsən Bəsri – İmam Əli ibn Əbu Talib (ə) – Həzrət Mühəmməd Peyğəmbər (s).

Bəzi nüsxələrdə Əhməd Əsvəd Dinəvərinin Əhməd Qəzzali (İmam Qəzzalinin qardaşı) olduğu qeyd edilib və onunla Cüneyd Bağdadinin arasında (Mümşad Dinəvərinin əvəzinə) 5 nəfərin adı əlavə olunub: Əbubəkr Nəssac – Əbu Əli Farmədi – Əbülqasim Kərgani – Səid ibn Silm Əbu Osman Məğribi – Əbu Əmr Zücaci.

Səfəviyyə təriqəti silsiləsinin daha bir variantı da vardır, orada Məruf Kərxi ilə Peyğəmbər (s) arasındakı halqalar bu şəkildədir: Məruf Kərxi – İmam Rza (ə) – İmam Musa Kazim (ə) – İmam Cəfər Sadiq (ə) – İmam Mühəmməd Baqir (ə) – İmam Əli Zeynülabidin (ə) – İmam Hüseyn (ə) – İmam Əli ibn Əbu Talib (ə) – Həzrət Mühəmməd Peyğəmbər (s).

***Mənbələr:*** *İbn Bəzzaz Ərdəbili. Səfvət əs-səfa, s.180-181, 1203-1204; Tarix-i aləmara-yi Abbasi (tərcümə və şərhlər: O.Əfəndiyev, N.Musalı), s.53; Türkiye Diyanet Vakfi İslam Ansiklopedisi, XXXV, 460-461; S.Nağıyev. Qızılbaşlıq haqqında, s.9-10.*



**SİMÜRĞ** – Şərq xalqları mifologiyasında əfsanəvi quşdur. Dara düşənlərin köməyinə gəlir. Simürğ Azərbaycan dastanlarında da çətinliyə düşənlərə yardım edən əfsanəvi obrazdır. Onun digər adları Zümrüd və Ənqadır, dünyada ən uzaq və ən uca zirvə olan Qaf dağında yaşayır. Simürğ qərb mifologiyasındakı Phoenix adlı varlığa uyğun gəlir. Simürğ dirilik suyu içdiyinə görə heç zaman ölməz, o qədər yaşlıdır ki, bu dünyanın üç dəfə məhv olub yenidən yaranmasına şahid olmuşdur. Ömrü sona çatanda Simürğ quşu yanır, daha sonra külündən yeni Simürğ yaranır.

Sufi ədəbiyyatının şah əsərlərindən sayılan Əttar Nişapurinin "Məntiq ət-teyr" poemasında Simürğ quşların hökmdarı kimi təqdim edilir. O, quşlardan çox uzaqda məskən salıb. Bir gün quşlar onu tapmaq qərarına gəlib yola çıxırlar. Onların yolu tələb, *eşq*, *mərifət*, istiğna (ehtiyacsızlıq), tövhid, heyrət və *fəqr* adlı 7 çətin vadidən keçir. Bu vadilərin



hər birində quşların bir hissəsi çətinliyə düşüb məqsəddən dönür. Nəhayət, bütün çətinliklərdən çıxmış 30 quş *fəna* mülkünə gəlib çatır. Burada onlara aydın olur ki, Simürğ elə onların hər biridir, onlar bu ağır yolun məşəqqətlərinə dözməklə özləri Simürğə çevriliblər. Bu poemada 7 vadi *seyrü-sülik* yolundakı 7 *məqamı* bildirir, 30 quş isə bu yolu başa vurub son məqsədə – Haqqa çatıb və onun özünə çevrilib. Qeyd edək ki, fars dilində "30 quş" ifadəsi də "si mürğ" kimi səslənir.

"Məntiq ət-teyr" poemasında Simürğ Allahın obrazı kimi təsvir edilsə də, təsəvvüf terminologiyasında çox vaxt *insani-kamil* və ya *mürşid*, *pir* simürğ adlandırılır. O da öz müridlərinin yardımına yetişir, onları çətinliklərdən xilas edir.

Şah İsmayıl Xətai qəzəllərinin birində özünün mürşidlik məqamına işarə edərək demişdir:

Mən ol şəhbazi-kuhsarəm, baş əgməm qülleyi-Qafə,
Neçə Ənqa kimi yavru uçurdum aşiyanimdə.

***Mənbələr:*** *Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.491-493; Rzaqulu xan Hidayət. Riyaz əl-arifin, s.40; Ethem Cebecioğlu. Tasavvuf Terimleri ve Deyimleri Sözlüğü, "simürğ" maddəsi; Şah İsmayıl Xətai. Əsərləri (2 cilddə), I, 468; Ozkan Daşdemir. Simürg İle İlgili Açıklayıcı Metin: Der Beyan-i Ahval-i Simürg-i Anka, Atatürk Üniversitesi Edebiyat Fakültesi Dergisi, Sayı 67, Aralık 2021, s.42-51; H. Dilek Batîslam. Divan Şiirinin Mitolojik Kuşları: Hüma, Anka ve Simurg, Türk Kültürü İncelemeleri Dergisi, İstanbul 2002, s.185-208.*



**SUFİ** – *təsəvvüf* adamı, özünü *irfana*, ibadətə həsr etmiş, zahidanə həyat tərzi sürən insan. Bu sözün mənası və kökü barədə müxtəlif nəzəriyyələr mövcuddur. Bəziləri onun "səfa" kökündən qaynaqlandığını bildirmişlər. Sufinin qəlbi batini səfaya (təmizlik və gözəlliyə) malik olduğundan ona bu ad verilib. Bəziləri sözün kökündə "səff" (cərgə, səf) kəlməsinin durduğunu söyləmişlər. Sufi Allaha hamıdan artıq yaxındır və onun hüzurunda, bəndələrin lap ilk cərgəsində qərar tutub. Əbu Reyhan Biruniyə görə, "sufi" sözü ərəb mənşəli deyil, yunan dilində hikmət mənasını verən "sofiya" sözündəndir.

"Sufi" sözünün kökü barədə nəzəriyyələrdən biri də budur ki, bu söz suffə əhli anlayışından törəmişdir. Həzrət Məhəmməd Peyğəmbərin (s) zamanında Yəsrib (Mədinə) məscidinə bitişik olan bir məkana "suffə" deyirdilər. Suffə müsəlmanların ilk mədrəsəsi idi, burada onlara Qurani-Kərim, şəriət öyrədilirdi. Evi olmayan, ailəsini itirmiş, yaxud özünü elmə və ibadətə həsr etmiş müsəlmanlar suffədə məskunlaşmışdılar. Suffə əhlinin sayı 400 nəfərə çatırdı. Onlar özlərini dua və ibadətə həsr etmişdilər, onların yaşayış xərcini imkanlı müsəlmanlar ödəyirdilər. Sufilər də suffə əhli kimi dünya işlərinə etina göstərməyib axirət işləri ilə məşğul olduqlarına, ev və sərvətdən özlərini ehtiyacsız bildiklərinə, əldə etdikləri hər şeyi öz arala-

rında tən böldüklərinə görə onlara “sufi” deyilmişdir.
Sufilik mövzusuna toxunmuş müəlliflərin əksəriyyətinin fikrincə, “sufi” sözü ərəb dilindən tərcümədə yun mənasını bildirən “suf” sözündən yaranmışdır və yun geyim geyinən deməkdir. Sufilər bəzəkli və rahat geyimlərdən imtina edir, heyvan yunundan toxunmuş kobud, qaba paltar geyinirdilər. Bu, onların dünya nemətlərinə arxa çevirmələrinin rəmzi idi və riyazət şərtlərindən sayılırdı.
Məşhur sufi müəllifi Əbu Nəsr Sərrac Tusi “Əl-Lümə fi-l-təsəvvüf” əsərində sufiləri digər təbəqələr kimi əqidələrinə, ya peşələrinə görə deyil, libaslarına görə adlandırmağın səbəbini bu cür izah edir: “Çünki sufilər bir elmlə fərqləndirilməzlər. Onlar hal və məqamın hər hansı bir növü ilə səciyyələnməzlər, onlarda əvvəldə və axırda mövcud olan bütün elmlərin mənbəyi, bütün fəzilətli halların, şərəfli əxlaqın yeri var. Onlar Allahla (bərabər) haldan-hala keçir və daha üstününə can atırlar. Onlar həqiqətən belə olduqlarına görə bir adla kifayətlənməzlər. Buna görə də mən onları hər hansı bir halla, elmlə təsvir etmirəm”.
Sufi ədəbiyyatında Mühəmməd Peyğəmbərin (s) aşağıdakı hədisləri tez-tez xatırlanır: “Yun paltar geyinin və doyunca yeməyin; bu yolla asimanın ən uca nöqtəsinə (mələkuta) yol taparsınız”. “Yun paltar geyinin ki, imanın şirinliyini dada biləsiniz. Az yeyin ki, axirətdə (fəzilətinizlə) tanınasınız. Yuna baxmaq insanda təfəkkür yaradar, təfəkkürdən hikmət doğar, nəticədə hikmət qan kimi damarlarınızda axar”. “Ölənə kimi beş xasiyyətdən əl çəkmərəm: kölələrin əhatəsində çörək yemək, uzunqulağa süvar olmaq, öz əllərimlə keçinin südünü sağmaq, yun paltar geyinmək və uşaqlara salam vermək. İstəyirəm ki, bunlar məndən sonra sünnə (dəb) olsun”.
Sufilər deyirlər ki, “suf” sözü üç hərfdən ibarətdir: sad hərfi *səbir*, sidq və səfanın, vav hərfi vədd *(məhəbbət), vird (zikr)* və vəfanın, fa hərfi isə fərd (tənhalıq), *fəqr* və *fənanın* rəmzidir.
Geniş yayılmış nəzəriyyəyə görə, ilk dəfə “sufi” adı ilə tanınmış şəxslər miladi VIII əsrdə yaşamış Əbu Haşim Kufi və məşhur kimyaçı Cabir ibn Həyyan olmuşlar. Yazılı şəkildə “sufi” kəlməsinə ilk dəfə görkəmli ərəb ədibi Cahizin “əl-Bəyan və-l-təbyin” əsərində rast gəlinir, müəllif bu ləqəbi Əbu Haşim Kufiyə aid etmişdir. Bəzilərinin fikrincə, ilk dəfə “sufi” adı ilə tanınmış şəxs miladi 825/826-cı illərdə Bağdadda vəfat etmiş Əbdək əs-Sufi olmuşdur.
Məşhur təsəvvüf xadimləri sufinin əsas xüsusiyyətlərini bu şəkildə bəyan etmişlər: “Doğrucul sufinin əlaməti budur ki, dövlət qazandıqdan sonra dərviş (miskin, kasıb) olsun, əzizlikdən sonra xar, məşhurluqdan sonra gizli olsun” (Əbu Həmzə Bağdadi). “Sufi odur ki, öz canını qisasdan (qanbahasından) azad saysın, öz əmlakını camaata halal bilsin” (Səhl ibn Abdullah Şüştəri). “Onlar Allahı hər şeydən üstün bilərlər, Allah da onları hamıdan üstün bilər” (Zünnun Misri).



"Sufi" sözü tarixin müəyyən mərhələlərində gah müsbət, gah da mənfi mənada işlənmişdir. Bu sözün mənfi məna qazanmasının səbəbi budur ki, özünü sufilik pərdəsinə bürüyən bəzi şəxslər fırıldaqçılıqla məşğul olmağa, tüfeyli həyat tərzi sürməyə başladılar, yun paltar geyinmək özünü göstərmək vasitəsinə çevrildi. XII-XIII əsrlərdən etibarən elə təsəvvüf ədəbiyyatında yun paltar geyinən, başqalarına moizə və nəsihət edən, əslində isə dünyapərəst olan sufi obrazı mənfi surətə çevrildi. İbn Covzi "Təlbisi İblis" əsərində onları nəzərdə tutaraq Peyğəmbərin bu hədisini qeyd edirdi: "Camaatın onu tanıması xatirinə yun paltar geyinən adama Allah-Taala qoturluq paltarı geyindirər, bədənindən ətini tökər".

Mövlana Cəlaləddin Rumi "Məsnəvi"-nin ikinci dəftərində, "Sufilərin *səmadan* ötrü qonağın uzunqulağını oğurlayıb satmaları" əhvalatında *xanəgahda* məskunlaşmış sufilərin hiyləgərliyini və onlara kor-koranə inanmış qərib sufinin avamlığını təsvir edir.

Şah İsmayıl Xətainin şeirlərində "sufi" sözü həm müsbət, həm də mənfi məna çalarlarında işlənir. Şah öz şeirlərində *qızılbaş* əsgərlərinə "sufilərim" deyə müraciət edirdi: "Ləşkərim, qazilərim, sufilərim, pirlərim". Xətainin şeirlərində onun qızılbaş sufilərə nə qədər yaxın və mehriban olduğu aydın görünür:

Uçmaqda tuti quşuyam, ağır ləşgərlər başıyam,
Mən sufilər yoldaşıyam, ğazilər deyən şah mənəm.
Nerdə əkərsən bitərəm, xanda çağırsan yetərəm,
Sufilər əlin dutaram, ğazilər deyən şah mənəm.

Səfəvi təriqətinin *mürşidi-kamili* olan I Şah İsmayıl öz şeirləri ilə sufilərə təlimat verirdi:

Sufi isən, aləb satma,
Hilalına haram qatma,
Yolun əyrisinə getmə,
Doğru yola nəzər eylə.

Xətai bəzi qəzəllərində haqqı dərk etməyən və zahirə qapılan sufiləri tənqid atəşinə tuturdu:

Cami-müsəffadən mənə saqi içirdi bir qədəh,
Sufi nə bilsin mən necə ol camdən buldum səfa!

Tanımamış o nəfsini, necə bilsün ki Rəbbini,
Qalıbdır ladə-illadə, görün nə zikr edər sufi.

I Şah İsmayıl son vəsiyyətində ətrafındakı qızılbaş əmirlərinə demişdir: "Əgər sufigərlik edirsinizsə (yəni sufilik yolunu tutmusunuzsa), ocağı sönməyə qoymayın. Düşmən dörd tərəfdən baş qaldıracaq. Aranızda nifaq olmayınca, heç bir padşahın cəsarəti çatmaz ki, sizinlə döyüşməyə gəlsin".

*"Qara məcmuə"də* Şeyx Səfiəddin Ərdəbili sufilərə xeyli təlimatlar verir. Kitabçanın bir bölümü "Rəhmani sufilər" adlanır. Bir gün Şeyx Səfi bir bağçadan keçəndə ağacda 3 alma olduğunu görür, bir müddətdən sonra yenə həmin

yerə qayıdanda ağacda 2 alma qaldığının şahidi olur. Bağbanı çağırıb soruşur ki, almanın biri hanı? Bağban almanı Şeyx Səfinin müridi olan bir sufiyə verdiyini deyir. Şeyx israrla xəbər alır ki, həmin sufi almanı özü istədimi, zorla aldımı, pulunu verdimi? Bağban cavab verir ki, almanı sufiyə könüllü şəkildə verdim, amma sufi almanın qiymətini ödədi. Aldığı cavablardan razı qalan Şeyx Səfi Allaha şükürlər edib deyir: "Əlhəmdu lillah, Əliyyən Vəliyyullah! Sufilərim rəhmani imişlər, şeytani degillərmiş".

Qızılbaş sufilər təriqətin dövlətləşmə mərhələsinin başlanğıcında *Şeyx Cüneydin* və *Şeyx Heydərin* ətraflnda birləşmiş, daha sonralar I Şah İsmayılın başçılığı altında qurulan Səfəvilər dövlətinin özəyini təşkil etmişlər.

Səfəvi dövləti hər şeydən əvvəl sufi ənənələrinə bağlı, mənəvi köklər üzərində qurulmuş bir səltənət kimi tanınırdı. Təsadüfi deyil ki, I Şah İsmayıl və sonrakı şahlar Qərb dövlət başçılarının, səyyahların, hətta incəsənət adamlarının gözündə "Sufi Şah" və "Böyük Sufi" idilər. Şah İsmayılın həqiqətə ən yaxın təsviri sayılan, XVI əsr italyan rəssamı tərəfindən çəkilmiş məşhur portretdə latın dilində "İsmayıl Sofu şah" sözləri yazılıb. I Şah Abbasın Qərb rəssamı tərəfindən çəkilmiş litoqrafik təsvirində də "Böyük Sufi" sözü oxunur. Səfəvi dövlətində "sufi" (sofu) sözü ən geniş yayılmış müraciət formalarından biri idi, əyanlar, əsgərlər bir-birini bu adla çağırırdılar. Əksinə, "nasufi" sözü təhqir və məzəmmət mənasında işlənirdi.

İsgəndər bəy Münşinin qələmə aldığı "Tarixi-aləmarayi-Abbasi" kitabında sufilik təmizlik və saflıq rəmzi kimi təqdim olunur, "sədaqət" sözü ilə yanaşı işlədilir. "Saf ürəkli sufilər", "sufigərlik etmək" ifadələrindən şaha sadiq olmaq mənasında istifadə edilir, ləyaqətsiz əməllər "sufiliyə layiq olmayan işlər" adlandırılır.

Bunun əksinə olaraq Osmanlı mənbələrində "sufi" sözü ənənəvi İslam dinindən kənara çıxmış, batil əqidədə olan şəxs mənasında işlədilirdi. I Şah İsmayılın Anadoludakı nümayəndəsi *Şahqulu xəlifə* silahlı üsyan qaldırdığı zaman Osmanlı dövləti bir müddət onun öhdəsindən gələ bilməmişdi, bu arada hələ hakimiyyətə keçməmiş I Sultan Səlim atası II Sultan Bayezidə göndərdiyi tənə dolu məktubda yazırdı: "Bir sufinin oğlu peyda olub, gəlib at çapıb Kayseriyə çatır, siz də baxa-baxa durursunuz!"

***Mənbələr:*** *S.Z.Səccadi. İrfan və təsəvvüfün əsaslarına giriş, s.1-7; S.C.Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.537-544; K.Bünyadzadə. Sərrac Tusinin "əl-Lümə" əsəri, s.150; Əbu Nüeym İsfahani. Hilyət əl-övliya (10 cilddə), I, 17-21; Qısa İslam Ensiklopediyası (N.Rəhimovun ümumi redaktəsi ilə, 2 cilddə), I, 241-245; Qara məcmuə, s.29; Xətai. Əsərləri, s.347; Şah İsmayıl Xətai. Əsərləri (2 cilddə), I, 95 və 591; Ömer Faruk Teber. XVI. Yüzyılda Kızılbaşlık farklılaşması, s.112; Namiq Musalı. I Şah İsmayılın hakimiyyəti ("Tarix-i aləmara-yi Şah İsmayıl" əsəri əsasında), s.233, 286; Aləmarayi-Səfəvi, s.599; Rəziyəddin Təbrisi. Məkarim əl-əxlaq, s.149-150.*



**SÜHRƏVƏRDİYYƏ** – məşhur sufi təriqətlərindən biridir. Banisi Cənubi Azərbaycan mənşəli sufi Ziyaüddin Əbunnəcib Əbdülqahir Sührəvərdi (1097-1168) və ya onun qardaşı oğlu Şihabəddin Əbu Həfs Ömər ibn Məhəmməd Sührəvərdidir (1145-1234). Əbunnəcib Sührəvərdinin "Adab əl-müridin", Şihabəddin Sührəvərdinin "Əvarif əl-məarif" kitabları təsəvvüf aləmində və xüsusilə sührəvərdiyyə təriqətində ən məşhur əsərlərdən sayılır.

Şihabəddin Sührəvərdi öz zamanında böyük nüfuza sahib idi, "şeyx əş-şüyux" (şeyxlərin şeyxi) çağırılırdı. Bağdad şəhərindəki bütün sufi *təkkələrinin* idarəçiliyi ona həvalə edilmişdi.

Sührəvərdiyyə təriqəti əvvəlcə İraq, Suriya və İran ərazisində, daha sonralar Orta Asiya, Hindistan və Anadoluda yayıldı. Məşhur müsəlman ədibləri Sədi Şirazi, Qütbəddin Şirazi, Fəxrəddin İraqi və Əbdürrəzzaq Kaşani, məşhur səyyah İbn Bəttutə sührəvərdiyyə təriqətinə mənsub idilər.

Sührəvərdiyyə təriqətinin silsiləsi Əxi Fərəc Zəncani, Cüneyd Bağdadi, Səriyy Səqəti, Məruf Kərxi, Həsən Bəsri və digər böyük şəxsiyyətlər vasitəsilə İmam Əliyə (ə) bağlanır. Bu təriqətin səfəviyyə ilə xüsusi bağlılığı vardır. Belə ki, səfəviyyə təriqətinin qurucusu Şeyx Səfiəddin Ərdəbilinin təriqət *silsiləsi*, yəni şeyxlərinin zənciri 6 halqa vasitəsilə Sührəvərdiyə birləşir (Şeyx Zahid Gilani – Seyid Cəmaləddin Təbrizi – Şeyx Şihabəddin Mahmud Təbrizi – Rüknəddin Sücasi – Qütbəddin Əbhəri – Əbunnəcib Sührəvərdi). Şeyx Səfiəddinin *mürşidi Şeyx Zahid Gilani* həm də Şirazda Əbunnəcib Sührəvərdinin *xəlifəsi* (canişini) Nəcibəddin Əli ibn Büzğuşdan icazət almışdı, yəni təriqət adabını onun dilindən rəvayət edirdi.

Hazırda sührəvərdiyyə təriqəti Hindistan və Pakistan ərazilərində daha çox intişar tapmışdır. Təriqət barədə əsas ədəbiyyat da urdu və pəncab dillərindədir. Sührəvərdiyyə təriqətində *zikr* oturaq vəziyyətdə, açıq (cəli) formada edilir. *Mürid* günahlardan tövbə edib qaranlıq bir otaqda üzü qibləyə bardaş qurub oturur, özünü *mürşidin* hüzurundakı kimi hiss edir. Qəlbində Allahı zikr edir, dilində isə "la ilahə illəllah" zikrini söyləyir. Zikri 3 hissəyə bölür, "la" söyləyərkən başını sinəsinə əyir, "ilahə" deyərkən sürətlə başını qaldırıb sola çevirir, sonra yenə başını sinəsinə sallayıb "illəllah" deyir, bu şəkildə sürətlə başını tərpədərək zikri təkrarlayır. Gündəlik namazların qılınma vaxtından başqa bütün gün bu zikrə həsr olunur, bu qayda bir neçə gün ardıcıl davam edir. Hindistanda sührəvərdi sufiləri sübh namazından sonra Allahın 99 və Peyğəmbərin adlarını, müxtəlif dua və zikrləri oxuyurlar. Hər il Sührəvərdinin vəfat günü təriqət üzvləri tərəfindən qeyd edilir.

***Mənbələr:*** *İbn Bəzzaz Ərdəbili. Səfvət əs-səfa, s.180; Türkiye Diyanet Vakfı İslam Ansiklopedisi, XXI, 359, XXXVIII, 42-45; Seyid Ziyaəddin Səccadi. İrfan və təsəvvüfün əsaslarına giriş, s.132-134; Lüğətname-yi-Dehxuda, IX, 13857.*

**ŞAHİD** – təsəvvüf terminologiyasında Allah-Taalaya işarədir. Allahın camalının *təcəllasını* da şahid adlandırırlar. Bu təcəllanın ən kamil nümunəsi insandır ki, Haqqın güzgüsü sayılır. Ona görə də bəzi ariflərin düşüncəsində şahid *Kamil İnsan* mənasını daşıyır.
bax: **MÜŞAHİDƏ.**



**ŞEYX** – ərəb dilindən tərcüməsi "yaşlı adam, qoca" və ya "başçı, rəhbər" deməkdir. Təsəvvüfdə sufi icmasının rəhbəri bu cür adlandırılır. Həm ümumilikdə təriqətin başçısı *(qütbü)*, həm də bir *təkkədə*, *xanəgahda* toplaşmış dərvişlərin böyüyü şeyx adlanır. Şeyx *təriqət* iyerarxiyasında *müridlərdən* üst pillədə durur və müridlərin ona qeyd-şərtsiz tabe olmaları şərt sayılır.
Səfəviyyə təriqətinin təlimatnaməsi sayılan, Şeyx Səfiəddin Ərdəbilinin həyatını, təsəvvüf yolunu və tövsiyələrini özündə əks etdirən *"Qara məcmuə"nin* bir bölümü "Şeyx ilə mürid" adlanır. Burada müridin şeyxə (mürşidə) necə itaət etməli olduğu ətraflı şəkildə izah edilib. Bu təlimatnaməyə görə, mürid şeyxlə eyni süfrə arxasında, eyni xalça üzərində oturmamalı, onunla eyni bardaqdan su içməməli, onun paltarını və xirqəsini icazəsiz geyinməməlidir. Bütün bu işləri yalnız şeyxin icazəsi ilə etmək olar, icazəsiz etmək isə ona qarşı ədəbsizlik sayılır və təriqət adabına ziddir. Şeyxin əlini öpmək istəyən mürid mütləq dəstəmazlı olmalı, həmişə ondan arxada getməli, şeyxin qabağından qalan yeməyi yeməməlidir, şeyxin özünə ehtiram göstərdiyi kimi, onun övladlarına, xidmətçilərinə, hətta atına da sevgi ilə yanaşmalıdır. Əgər mürid görsə ki, şeyx onun ata-anasını, oğul-qızını sevmir, o da bunlardan üz çevirməlidir, şeyxin rədd etdiyini rədd etməli, qəbul etdiyini qəbul etməlidir. Mürşidlə mübahisə etmək, ona lazımsız suallar vermək müridliyin adabına ziddir.
"Pəs ədəb budur kim, hərgah kim bir iş işlər, şeyx məşvərətilə işləyə. Və hər nə kim edər, şeyxinə danışmayınca işləməyə. Ya səfərə getməli olsa və ya nəsnə satmalı, ya almalı olsa və ya oğul evləndirməli, qız köçürməli olsa, şeyxinə danışmaq gərəkdir. Danışmadan mürid başlı-başına bir iş işləmək küstaxlıq, ədəbsizlikdir. Və mürid bir işində mütəhəyyir olsa, varıb şeyxinə: "Şunu mən necə edəyim? Şu işimdə aciz qaldım", – demək gərəkdir. Şeyx necə məsləhət görərsə, necə buyurarsa, elə etmək gərəkdir. Və əgər danışmazsa, qatı yaramazlıq edər".
Bu şərtlərə əməl etməyən mürid "kazib" (yalançı) müriddir, şeyxə deyil, öz nəfsinə bağlanmışdır.

***Mənbələr:*** *Qara məcmuə, s.25, 47-53; Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.712, 715-718.*



**ŞƏRAB** – *bax :* **MEY.**



**ŞƏRİƏT** – ərəb dilindən tərcüməsi "yol, ənənə, qayda" deməkdir. Ərəblər hamının su içə bildiyi su bulağına da "şəriə" deyirlər. İri yolu (prospekti) ərəb dilin-



də "şare" adlandırırlar. Dini terminologiyada Allah-Taalanın Öz peyğəmbərləri vasitəsilə insanlara göndərdiyi qayda-qanunlara şəriət deyilir. Daha geniş anlama malik olan din məfhumundan fərqli olaraq, şəriət əsasən ibadət əməlləri ilə, haram və halalla əlaqəli məsələləri özündə birləşdirir və dinin təfərrüatı sayılır. Bütün peyğəmbərlərin təbliğ etdikləri din etiqadi cəhətdən eyni idi (buna İslam deyılir), fərq yalnız şəriət hökmlərini əhatə edirdi.

Şəriət həm də təsəvvüfdə *seyri-süluk* yolunun ilk mərhələsi, *təriqət* və *həqiqət* mərtəbəsinin müqəddiməsi sayılır. Təriqətə qədəm qoymaq üçün mütləq şəriət mərhələsini kamil surətdə keçmək, onu layiqincə mənimsəmək lazımdır. Şəriətə əməl etməyən sufinin üzünə təriqət və həqiqət qapıları bağlı olar. Sufi ədəbiyyatında deyilir ki, şəriət zahiri hökmlərdən ibarətdir və qabıq kimidir, təriqət onun içi, ləpəsidir. Mövlana Cəlaləddin Rumi "Məsnəvi"də yazır: "Şəriət yolu işıqlandıran şama bənzəyir. Əlinə şam götürməsən, yol gedə bilməzsən və bunsuz bir iş görmək mümkün olmaz. Yola düşəndən sonra sənin gedişin təriqətdir. Çatdığın məqsəd və hədəf isə həqiqətdir".

Bəzən sufiliyə qarşı bu iddia irəli sürülür ki, guya təsəvvüf aləmində həqiqət mərhələsinə qədəm qoyan şəxsin boynundan bütün şəriət vəzifələri götürülür. Şəriətə əməl etməyin vacibliyi müvəqqətidir. Nə qədər ki sufi hələ kamala yetməyib, seyrü-süluk yolunun əvvəlində şəriətə bağlanmağa borcludur. Lakin təkamül yolu ilə irəliləyib haqda fani və haqq ilə baqi olduqda bütün məhdudiyyətlər, bağlılıqlar, tabeliklər qırılır.

Bəzi təsəvvüf ədəbiyyatında və sufilərin sözlərində bu cür fikirlərə rast gəlinirsə də, nəzərə almaq lazımdır ki, bunları mütləq rəmzi mənada yozmaq lazımdır. Ariflərin və sufilərin dilində həqiqətə çatmaq yalnız ölümdən sonra mümkündür. Öldükdən (həqiqətə yetdikdən) sonra isə şəriət öz qüvvəsini itirir.

Böyük sufilərin hamısı şəriətə bağlı olmuşdur. Əksər sufi təriqətlərinin, o cümlədən səfəviyyə təriqətinin *silsiləsində* önəmli yeri olan Cüneyd Bağdadi deyirdi: "Təsəvvüf bir evə bənzəyir ki, şəriət onun qapısıdır". Bayezid Bistami şəriətin əhəmiyyətini bu şəkildə bəyan etmişdir: "Bir kəs Allahın əmr və qadağanlarına, peyğəmbərin sünnəsinə tabe deyilsə, havada bardaş qurub oturduğunu görsəniz belə sözünə etibar etməyin".

***Mənbələr:*** *Seyid Ziyaəddin Səccadi. İrfan və təsəvvüfün əsaslarına giriş, s.13-17; Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.504-505; Mürtəza Mütəhhəri. İslam elmləri külliyyatı, II, 84-86; Ehsanullah Əli İstəxri. Üsuli-təsəvvüf, s.657-663; Osman Nuri Topbaş. İmandan İhsana Tasavvuf.*



**ŞÖVQ** – təsəvvüf aləmində *hallardan* biri. Bəzilərinə görə, *məhəbbətdən* sonrakı, bəzilərinə görə də *xovf* və *rəcadan* sonrakı hala şövq deyilir. Məşhur təsəvvüf bilicisi Qüşeyri şövqə belə tərif vermişdir: "Şövq sevgilinin (Allahın) görüşü üçün qəlbin yerindən oynamasıdır

və məhəbbətin miqdarında olur".
İbn Ətadan soruşdular ki, şövq üstündür, yoxsa məhəbbət? Cavab verdi: "Məhəbbət üstündür, çünki şövq də məhəbbətdən yaranır".
Şövqün davamı məhəbbətə bağlıdır. Nə qədər ki məhəbbət vardır, şövqün də varlığı zərurətdir. *Arif* seyrü-süluk yolunda nə qədər çox irəliləsə, şövqü o qədər artar, səbri isə azalar, nəhayət, öz məqsədinə çatar (Allaha qovuşar).
Təsəvvüf barədə mühüm mənbələrdən olan Əbu Nəsr Sərrac Tusinin "əl-Lümə" əsərində şövq halı *rəca* ilə *üns* hallarının arasında yerləşdirilib. Həmin kitabda Peyğəmbərin Allaha belə bir minacatı verilir: "Səndən Sənin vəchini (camal sifətlərini) görmə ləzzətini və Səninlə görüşün şövqünü istəyirəm". Müəllif hədisə şərh verərək yazır: "Allahın vəchini görmə ləzzəti axirətdə, Onunla görüşün şövqü isə bu dünyada olur... Şövq Allahın Öz övliyalarının qəlblərində yandırdığı oddur ki, oradakı (qəlblərdəki) düşüncə, iradə, səbəb və maneələri yandırar".

***Mənbələr:*** *Sərrac Tusi. Əl-Lümə, s.94-95; Seyid Ziyaəddin Səccadi. İrfan və təsəvvüfün əsaslarına giriş, s.41-42; Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.512-513; İzzəddin Kaşani. Misbah əl-hidayə və miftah əl-kifayə, s.411-413.*

**ŞÜKÜR** – İslam əxlaqının və təsəvvüf adabının mühüm tərkib hissələrindən biridir. Allahın verdiyi nemətlər qarşısında ona minnətdar olmaq, həmd-səna etmək mənasını bildirir.
Şükür etmək Allah-Taalanın bəyəndiyi ən gözəl əməllərdəndir. Hər kim Allahdan aldığı nemətə görə şükür etsə, Allah ona qat-qat artıq nemət bağışlayar: "Yadınıza salın ki, o zaman Rəbbiniz belə bildirmişdi: "Əgər şükür etsəniz, sizə (olan nemətimi) artıracağam. Yox, əgər nankorluq etsəniz, (unutmayın ki) Mənim əzabım, həqiqətən, şiddətlidir" (İbrahim, 7).
Mühəmməd Peyğəmbər (s) gecələr yoruluncayadək ibadət edər, "Axı Allah sənin keçmiş və gələcək günahlarını bağışlayıb, niyə özünə əziyyət verib gecələr ibadət edirsən?" deyənlərə bu cür cavab verirdi: "Deyirsiniz ki, Allaha şükür edən bəndə olmayım?"
Hədisdə buyurulub: "Mömin əgər sevindirici bir işlə qarşılaşsa, şükür edər və həmin iş onun üçün xeyirli olar. Əgər kədərli bir işlə qarşılaşsa, *səbir* edər və bu iş də onun üçün xeyirli olar".
Ariflər deyiblər ki, şükrün 3 növü var: 1. *Ürəyin şükrü*, yəni Allahın nemətlərini dərk etmək. 2. *Dilin şükrü*, yəni Allaha dua şəklində təşəkkür etmək. 3. *Bədənin şükrü*, yəni nemət verənə (Allaha) itaət etmək.
Nəsirəddin Tusi qeyd edirdi ki, 3 şeyə görə şükür etmək lazımdır: 1. Allahın nemətlərini görüb anlayanda. 2. Əldə edilən nemətlərə görə sevinəndə. 3. Nemət verənin razılığını qazanmaqdan ötrü. Bu da batində onu sevməklə, zahirdə dil və əməl vasitəsilə onu öyməklə mümkündür.
Səfəviyyə təriqətinin banisi Şeyx Səfiəddin Ərdəbili öz müridlərinə tövsiyə



edirdi: "Əgər kimsənün başına bir müsibət gəlür, səbirdən artuq şükür etmək gərəkdür. Zira kim, gərək səbir eyləyə, gərək eyləməyə, olan olur və faidə verməz. Bəli, gərək kim, səbir ilən şükür eyləsün kim, ol imanun nişanəsidür. "İman iki qisimdən ibarətdir, yarısı səbir, yarısı şükürdür". Və şükrü həman yalnız dili ilən eyləməsün, bəlkə bütün gövdəsi ilən (eyləsin)".

İrfanda şükür adətən səbirlə yanaşı qeyd olunur. Əsl arif yalnız nəfsinə xoş gələn nemətlər üçün yox, bəla və müsibətlər üçün də Allaha şükür etməlidir. Çünki bunların Məşuqdan gəldiyinə və onun xeyrinə olduğuna inanmalıdır. Müsibətlər qarşısında şükür etməmək təsəvvüfdə nankorluq sayılır.

***Mənbələr:*** *Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.506-511; Nəsirəddin Tusi. Ovsaf əl-əşraf, s.61; Şeyx Səfi təzkirəsi ("Səfvətüs-səfa"nın XVI əsr türk tərcüməsi), s.706.*

**TALİB** – *seyrü-süluk* yoluna təzə qədəm basmış, yolun əvvəlində olan *mürid*. Bu yolda uca məqama çatmağı istədiyi (tələb etdiyi) üçün ona talib deyilir. Təsəvvüf ədəbiyyatında çox zaman mürid və *salik* məfhumları ilə yanaşı işlədilir.

*bax:* **SALİK**, **MÜRİD.**

**TƏCƏLLA (TƏCƏLLİ)** – lüğəti mənada ortaya çıxma, görünmə deməkdir. Qurani-Kərimdə öz qövmünün təhriki ilə Musa Peyğəmbərin (ə) Allahı görmək istəyi müqabilində Allah-Taalanın Öz nurunu dağa yönəltməsi təcəlla kimi ifadə edilir: "Rəbbi dağa təcəlla etdikdə onu parça-parça etdi" (Əraf, 143).

Təcəlla mühüm irfani termindir. Ariflərin düşüncəsində bütün varlıq aləmi Allahın təcəlla məkanıdır və bütün əşyalar Allahın təcəlla (zühur) yeridir. Həqiqətdə var olan yalnız Allahdır, qalan hər şey onun təcəllasıdır. Əgər qəlb təmizdirsə, bu təcəllanı görər.

Təcəllanın uğurlu olması üçün ondan qabaq qəlb daha 2 mərhələdən keçməlidir: təxəlli (boşalma) mərhələsində qəlb pis xüsusiyyətlərdən tam təmizlənməlidir; təhəlli (bəzənmə) mərhələsində qəlb gözəl əxlaqla zinətlənməlidir. Bundan sonra Allahın nuru həmin qəlbdə təcəlla edər.

Sufilərin fikrincə, təcəllanın üç növü var: əfali, sifati və zati. Yəni mərhələlər üzrə arifin qəlbində əvvəlcə Allahın feil və əməlləri, sonra ad və sifətləri, ən sonda isə Zatı zahir olar (təcəlla edər).

Şeyx Səfiəddin Ərdəbili təcəllanın necəliyi və növləri barədə bəzi izahlar vermiş, bəzi izahları isə sözlə anlatmağa çətinlik çəkdiyini bildirmişdir. O, təcəlla ilə yanaşı sitr (örtük, pərdə) anlayışını da işlədir və qeyd edir ki, sitr hərdən təcəllanın üstünü örtər və əslində Allahın bir lütfüdür. Çünki əgər təcəlla daimi olsaydı, bəndənin buna dözməyə taqəti qalmazdı. Təcəllanın mənbəyi Allahın lütfü (camalı) də ola bilər, qəhri (calalı) də. Məsələn, Musa Peyğəmbərə (ə) Turi-Sinada zahir olan və dağı parçalayan təcəlla Allahın qəhrindən doğmuşdu, Mühəmməd Peyğəmbərə (s) me-

racda zahir olan təcəlla isə Onun lütfündən qaynaqlanmışdı.

***Mənbələr:*** *Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.223-227; Seyid Ziyaəddin Səccadi. İrfan və təsəvvüfün əsaslarına giriş, s.16; Şeyx Səfi təzkirəsi ("Səfvətüs-səfa"nın XVI əsr türk tərcüməsi), s.410; K.Bünyadzadə. Sərrac Tusinin "əl-Lümə" əsəri, s.208.*

**TƏKKƏ** – sufilərin birlikdə icma halında təriqət həyatı yaşadıqları məkan. Sözün mənşəyi barədə dəqiq məlumat yoxdur. "Təkyə" və "təkkə" şəklində qeyd edilir. Təkkələr adətən şeyx tərəfindən idarə edilirdi və müəyyən sufi təriqətinə bağlı olurdu. Təkkələrin möhkəm daxili nizam-intizam qaydaları vardı. Həm təkkədə yaşayan sufilər, həm də vaxtaşırı burada qonaq olan müsafirlər həmin qaydalara riayət etməli idilər. Klassik mənbələrdə eyni mənanı bildirən *xanəgah*, zaviyə, dərgah, ribat, məqam, sovmiə, asitanə, camaatxana kəlmələri də işlədilir. Səfəvilər zamanında ən böyük təkkə Ərdəbildəki Şeyx Səfiəddin Ərdəbili təkkəsi (xanəgahı) idi.

*bax:* **XANƏGAH.**

***Mənbələr:*** *Türkiye Diyanet Vakfı İslam Ansiklopedisi, XL, 368-370; Ethem Cebecioğlu. Tasavvuf Terimleri ve Deyimleri Sözlüğü, "tekke" maddəsi.*

**TƏQVA** – ərəb dilindən tərcüməsi "çəkinmək, uzaq durmaq" deməkdir. Dini terminologiyada insan ruhunu zərərli olan sifətlərdən, günahlardan uzaq saxlamaq təqva adlanır. Başqa sözlə desək, təqva Allahdan qorxmaq, özünü həmişə Onun nəzarəti altında hiss etmək, halal və haramlara ciddi riayət etmək mənasını verir. Hədislərin bırində buyurulur: "Təqvalı insan odur ki, əgər onun bütün əməllərini açıb insanlara göstərsələr, utanmağa layiq bir əməl tapmaq mümkün olmasın".

Təqva gözəl xasiyyətlərin birincisidir, peyğəmbər əxlaqındandır. Həzrət Əli (ə) buyurub: "Təqvanın zahiri tərəfi dünyada insana şərəf gətirər, batini tərəfi isə axirətdə". Peyğəmbər və imamlar öz xütbələrini adətən "Allaha münasibətdə təqvalı olun" cümləsi ilə başlayırdılar.

Qurani-Kərimdə Allah-Taala aşkar şəkildə bildirir ki, insanların dəyəri yalnız onların təqvasındadır: "Allah yanında ən hörmətli olanınız ən təqvalı olanınızdır" (Hücurat, 13).

Bəzi ariflər təqvalı olmağı tikanlıqda yeriyən insanın halına bənzətmişlər. Tikanlıqda gəzən adam ayağını yerə diqqətlə qoyar, ətəyini yuxarı qaldırar, tikanlıqla daha az təmasda olmağa çalışar. Təqvalı insan da dünya ləzzətlərinin qarşısında o cür davranmalıdır.

Təsəvvüf böyükləri təqvanın 3 mərtəbəsi olduğunu söyləmişlər: onun ən aşağı həddi budur ki, insan əbədi cəzaya məhkum olmamaq üçün özünü böyük günahlardan, şirkdən qorusun. Təqvanın ikinci mərtəbəsi bütün günahlardan, hətta kiçik xətalardan da təmizlənməkdir. Nəhayət, təqvanın üçüncü və ən üstün dərəcəsi budur ki, insan onu Allahdan yayındıran hər şeyə arxa çevirsin,



bütün diqqətini Allaha yönəltsin.
İmam Cəfər Sadiq (ə) də hədislərinin birində təqvanın 3 dərəcəsinin olduğunu buyurmuşdur: "Təqva üç qisimdir: 1. Allah xatirinə olan təqva – halallığına şübhə olan hər şeydən çəkinməkdir; buna "xass əl-xass təqva" (təqvanın ikiqat dərəcəsi) deyirlər. 2. Allahdan qorxmaq üzündən olan təqva – haram olması şübhə doğuran şeylərdən çəkinməkdir; buna "xass təqva" (xüsusi təqva) deyirlər. 3. Cəza və cəhənnəm qorxusundan olan təqva – haramı tərk etməkdir; buna da "ümumi təqva" deyirlər.
Təqvanın misalı çayda axan su kimidir. Bu üç təbəqə də çayın kənarında əkilmiş müxtəlif növlərdən olan fərqli rənglərə malik ağaclara bənzəyər. Ağacların hamısı çaydan öz cövhəri, dadı, lətafəti və ya kəsafəti qədər su sorub çəkir. Xalqın bu ağaclardan və onların meyvəsindən aldığı fayda da öz qədəri və qiymətinə görə olur..."
Həzrət Əlinin (ə) "Nəhc əl-bəlağə"dəki xütbələrindən biri təqvalıların xüsusiyyətləri haqqındadır. Həmmam adlı bir nəfərin xahişi ilə söylənmiş bu xütbədə həzrət Əli (ə) buyurur: "Allah onlarda təcəlla edəndə Allahdan savayı hər şey onların gözündə xırdalaşar. Cənnətə elə münasibət bəsləyərlər ki, sanki onu görür və içindəki nemətləri dadırlar. Cəhənnəmə münasibətləri də elədir ki, elə bil alovu görür və içində əzab çəkirlər. Onların qəlbi hüznlüdür, xalqa pislik etməzlər... Bir neçə günlük dünyada səbir edib, əvəzində Rəbbin onlardan ötrü hazırladığı əbədi rahatlığı umarlar. Dünya onları özünə tabe etmək istəyər, onlar dünyadan qaçarlar... Etdikləri yaxşı əməllərin azlığına qane olmaz, qazandıqları savabın çoxluğu ilə fəxr etməzlər... İnsanlardan təkəbbür üzündən kənar qaçmaz, adamlara hiylə və kələk məqsədilə yaxın gəlməzlər..." Bu xütbə Həmmama elə dərin təsir etdi ki, ucadan bir ah çəkib canını tapşırmışdı.
Sufilərin təqvası barədə kitablarda heyrətamiz məlumatlar mövcuddur. Deyirlər ki, Bayezid Bəstami Həmədandan toxum alıbmış. Bəstama qayıdandan sonra torbada iki qarışqanın da olduğunu görəndə Həmədana qayıdıb qarışqaları öz yerlərinə qaytardı. Bir gün Bayezid Bəstami bir müridi ilə səfərdə ikən paltarlarını yuduqdan sonra qurutmağa yer axtarırdı. Yol yoldaşı təklif etdi ki, divara mismar vurub paltarları assınlar. Bayezid sahibindən icazəsiz kimsənin evinin divarına mismar vurmağa razı olmadı. Mürid dedi ki, gəl paltarları ağacdan asaq, amma ağacın budaqları sınar deyə Bayezid bununla da razılaşmadı. Yoldaşı təklif etdi ki, paltarları otların üstünə sərək, amma Bayezid otyeyən heyvanların və quşların ruzisinə mane olmaq istəmədi. Axırda paltarı geyinib günün altında durdu ki, əynində qurusun.
Şeyx Səfiəddin Ərdəbili təriqət yoluna qədəm qoyan şəxsə vacib olan 6 şərtdən birini də "təqvası təmiz olmaq gərək, yəni daima pak təharətli olmaq" şəklində təqdim edir. Ümumiyyətlə, Şeyx Səfinin öyüdlərində təqva məfhumu çox zaman təharətlə yanaşı işlədilir.

Şeyx Səfinin təlimlərinə görə, "haramı tərk etmək vacibdür və halal tələbi lazım və şübhə loğmalarından pərhiz etmək sünnət kim, ol təqvadur. Batinün təqvası oldur kim, dünyanun məhəbbətini tərk eyləsün və könlü onun məhəbbətindən götürə və axirətün əmalına məşğul eyləyə".

***Mənbələr:*** *Nəhc əl-bəlağə (farsca tərcümə edən: M.Zamani), 184-cü xütbə, s.462-469; Ğürər əl-hikəm, 1990-cı kəlam; Şəriət çırağı (tərcümə edən: Ə.Əhmədov), s.96-97; Şeyx Abbas Qumi. Səfinət əl-Bihar, II, 678; Natiq Rəhimov. Bu məqama necə çatdılar, s.9-14; Hidayət əl-ələm fi tənzim Ğürər əl-hikəm, s.646; Risaleyi-Qüşeyriyyə (farsca tərcümə: Bədiüzzaman Firuzənfər), s.160-165; Şeyx Səfi təzkirəsi ("Səfvətüs-səfa"nın XVI əsr türk tərcüməsi), s.693.*

**TƏLQİN** – təsəvvüfdə mühüm yer tutan ayinlərdən biri, *mürşidin müridə* bəzi təlimatları verməsi. Sufi ədəbiyyatında "tövbə ilə təlqin", "zikr ilə təlqin" ifadələrinə tez-tez rast gəlirik. Sufi adabına görə, *zikr* və *tövbə* mütləq şeyxin hüzurunda, onun xeyir-duası ilə yerinə yetirilməlidir. Şeyxdən təlqin yolu ilə alınmayan zikr və şeyxin hüzurunda təlqin yolu ilə edilməyən tövbə təriqət ədəbindən sayılmaz və Allah dərgahında qəbul edilməz.

Təlqin ayinindən əvvəl *talib* qüsl alıb iki rükət namaz qılır, sədəqə verir, sonra mürşidin hüzuruna gedib diz üstə otururdu. Mürşid onu indiyədək yol verdiyi günahlardan tövbə etməyə, öhdəsində bəndə haqqı varsa halallıq almağa, borcu varsa qaytarmağa çağırırdı. Sonra mürşid talibin sağ əlindən tutub istiğfar edir, talib gözlərini yumurdı. Şeyx Allahın mübarək adını üç dəfə qəlbində zikr edib talibə təlqin edirdi, o da eyni qayda ilə həmin zikri qəlbində söyləyirdi. Axırda şeyx dua oxuyur, talib amin deyirdi.

Sufi düşüncəsinə görə, ilk zikr təlqini Mühəmməd Peyğəmbər (s) tərəfindən həyata keçirilmişdir. O, Həzrət Əliyə (ə) *zikri-cəliyy* (aşkar zikr), Əbubəkrə isə *zikri-xəfiyy* (gizli zikr) təlqin etmişdir.

Mürid hər hansı çətinliyə düşəndə şeyx onun dadına çatır, ona təlqinlə xüsusi zikr öyrədirdi. Müridin düşdüyü vəziyyətdən asılı olaraq şeyx onun üçün zikr seçirdi. Bu zikri söyləməklə müridin çətinliyi həll olur, aramlıq tapırdı. "Şeyx Səfi təzkirəsi"ndə deyilir: "Çün salikün sülukində halətlər vaqe olur, mürşidi ona bir zikr təlqin edər və ol cu (aclıq, ehtiyac) ondan gidərür. Çün Şeyx Səfiəddində bu halət vaqe oldı və işi bir qayətə yetdi kim, həlaka yaxın oldı, ol vəqtdə Şeyx Zahidi gördi kim, gəlüb onu təlqinlədi və ol halətdən qurtardı".

Şeyx öz müridlərindən birini irşad (təbliğat) üçün ətraf məntəqələrə göndərəndə ona tövbə ilə təlqin almaq icazəsi verirdi. Bu icazə əsasında həmin mürid şeyxin adından insanların tövbəsini qəbul edib onları təriqətə üzv edirdi. "Səfvət əs-səfa" və digər mənbələrdən məlum olur ki, Şeyx Səfiəddin Ərdəbili də vaxtilə *Şeyx Zahid Gilanidən* bu cür icazə almışdı.

Təlqin icazəsi bəzən şeyx tərəfindən geri alına da bilərdi. "Şeyx Səfi təzkirəsi"ndə qeyd edilir ki, təbrizli Mövlana



Əminəddin adlı bir nəfər Şeyx Səfiəddini dilə tutub ondan tövbə və təlqin icazəsi almış, sonra Şeyx öz oğlu Sədrəddini göndərib icazəni ondan geri almışdı.
*bax:* **TÖVBƏ**, **ZİKR.**

***Mənbələr:*** *Şeyx Səfi təzkirəsi ("Səfvətüs-səfa"nın XVI əsr türk tərcüməsi), s.97 və 123-124; Türkiye Diyanet Vakfi İslam Ansiklopedisi, 120; Metinlerle Tasavvuf Terimleri Sözlüğü, s.1047; Tasavvufun Aslı Hakikat ve Marifetullah İncileri, 8. Bölüm, Telkin-i zikir.*

**TƏLVİN** – mühüm təsəvvüf terminlərindən biri. *Təmkinin* əksi olaraq qəbul edilir. Sufinin qəlbinin daim Allaha doğru gedən yolda *(seyrü-süluk)* təkamül etməsi, dəyişməsi, haldan-hala düşməsi təlvin adlandırılır. Bu sözün ərəbcə tərcüməsi "rənglənmək, rəngini dəyişmək" mənalarını verir. Nəfsin iki böyük səfərinin (mərtəbəsinin) birincisində (əs-seyr fillah – Allahda seyr) sufi təlvin halında olur; Allahın sifətlərini müşahidə edir və kamilləşir. İkinci mərhələ (əs-seyr məallah – Allahla birlikdə seyr) isə artıq təmkin məqamıdır; sufi kamilliyə çatmışdır, onun təbiətinə heç nə təsir göstərə bilməz. *Hal* və *məqamları* adlamaq təlvin əhlinə xasdır, təmkin əhli isə həqiqətə çatmışdır.
*bax:* **TƏMKİN.**

***Mənbələr:*** *Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.257-258; Risaleyi-Qüşeyriyyə (farsca tərcümə: Bədiüzzaman Firuzənfər), s.121-124; K.Bünyadzadə. Sərrac Tusinin "əl-Lümə" əsəri, s.211; İbn Bəzzaz Ərdəbili. Səfvət əs-səfa, s.482; Şeyx Səfi təzkirəsi ("Səfvətüs-səfa"nın XVI əsr türk tərcüməsi), s.413-414.*

**TƏMKİN** – təsəvvüf aləmində *arifin* qəlbinin qərarlaşmış bir hala gəlməsinə deyilir. Bunun əksi *təlvindir*. Nə qədər ki *salik seyrü-süluk* yolunda haldan-hala, məqamdan-məqama yüksəlir, o, təlvin mərhələsindədir. Təlvin mərhələsində salik hələ nəfsi ilə məşğuldur, *nəfs* dəyişir, aşağı pillədən (nəfsi-əmmarə) yüksək pilləyə (nəfsi-kamilə və ya mərziyyə) sarı təkamül yolu keçir. O zaman ki arif qəlb mərhələsinə qədəm qoyur, təmkin halına çatır. Sufi mənbələrində yazılıb ki, Musa Peyğəmbər (ə) təlvin mərhələsində olduğu üçün Turi-Sinada Allahın nurunu görəndə huşunu itirdi. Amma Məhəmməd Peyğəmbər (s) təmkin mərtəbəsində idi, buna görə də Allaha daha yaxın olduğu halda *(qabü qovseyn)* əhvalı zərrəcə pozulmadı, getdiyi şəkildə də geri döndü.
Qüşeyri yazırdı ki, təlvin hal əhlinin (*hal* və *məqamlar* üzrə irəliləyən şəxslərin) sifətidir, təmkin isə həqiqət əhlinə məxsusdur.
Şeyx Səfiəddin Ərdəbili ona ünvanlanmış bir sualın cavabında təlvin və təmkinin mənalarını izah etmişdir. O deyirdi ki, Allah-Taala saliki özünün bir sifətinin ardınca digər sifəti ilə tanış edir. "Allahda seyr"in (əs-seyr fillah) mənası "Allahın sifətlərində seyr"dir (əs-seyr fi sifatillah). Salik bir sifətin seyrindən digərinə yüksəldikcə təlvin halındadır. Bundan sonra "əs-seyr məallah" (Allahla birlikdə seyr) başlayır ki, bu, təmkin ha-

lıdır.

"Salik səy ilə cəhddədir kim, özünü mənzildən mənzilə və aləmdən aləmə və sifatdan sifata Tanrının hidayəti ilən tərəqqisi ola və xaçan kim tərəqqidədir, təlvinün yiyəsidür. Və həman kim qamu xovf ilə xətər yolları sidq qədəmi ilən yüriyə və bunlardan keçə, ... ana təmkin yiyəsi derlər".

***Mənbələr:*** *Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.257-258; Risaleyi-Qüşeyriyyə (farsca tərcümə: Bədiüzzaman Firuzənfər), s.121-124; K.Bünyadzadə. Sərrac Tusinin "əl-Lümə" əsəri, s.211; İbn Bəzzaz Ərdəbili. Səfvət əs-səfa, s.482; Şeyx Səfi təzkirəsi ("Səfvətüs-səfa"nın XVI əsr türk tərcüməsi), s.413-414.*

**TƏRİQƏT** – ərəb dilindən tərcüməsi yol deməkdir. Təriqət məzhəblərdən sonra daha xırda parçalanmalar nəticəsində yaranmış qollardır. "Təriqət" ifadəsi daha çox sufi yönlü ayrı-ayrı cərəyanlara aid edilir.

Təsəvvüfdə təriqət Allaha doğru uzanan yoldur. Hər bir sufi şeyxinin təsəvvüründə bu yol fərqli xüsusiyyətlərə malikdir. Sufi əqidəsinə görə, bütün yollar Allaha aparır; ona görə də bunların arasındakı fərqliliklər də təbii və məqbuldur.

İslamın ilk əsrlərində zahid və arif kimi tanınan sufilər hələ öz təriqətlərini yaratmamışdılar. Bu dövrdə sufilər arasında hər hansı təşkilatlanma müşahidə edilmirdi. Hicri III-IV (miladi IX-X) əsrlərdən etibarən bəzi böyük sufilərin ətrafında tərəfdarlar toplanmağa başladı. Onların tövsiyələri, ədəb və davranışları sonralar daha da inkişaf etdirildi və sistemləşdirildi.

Lakin təsəvvüf daxilində əsl təriqətləşmə prosesi hicri VI (miladi XII) əsrdə başlamışdır. Məhz bu zaman təsəvvüf sosial həyatın tərkib hissəsinə çevrildi. Təriqətləşmə mərhələsi boyunca sufi ədəbiyyatının ən gözəl nümunələri yaradıldı. Mövlana Rumi, Sədi Şirazi, Hafiz Şirazi kimi şairlər yaşayıb-yaratdılar. Bu mərhələdə əsas sufi ayinləri, adət-ənənələri formalaşdı, *xanəgah* həyatı yarandı.

Sufi təriqətlərinin haqqa çatmaq üçün təklif etdiyi üsullar kök etibarilə eynidir, amma xarakterlərinə görə bir-birindən seçilir. Məsələn, bütün təriqətlərdə *zikrə* böyük önəm verilir. Lakin zikrin ayaq üstə, yoxsa oturaq halda, bir yerdə duraraq, yoxsa hərlənərək, astadan, yoxsa ucadan söylənməsi məsələlərində təriqətlərin baxışı fərqlənir. Yaxud *çilə* ayininin quruluşu və müddəti təriqətdən-təriqətə fərq edir.

Təriqətlər arasında bəzi zahiri əlamətlər baxımından da fərqlər müşahidə edilir. Məsələn, təriqətə daxil olma şərtləri və ayini, təriqət daxilindəki iyerarxiya quruluşu, təriqət üzvlərinin geyimi və qiyafəsi hər təriqətin spesifik xüsusiyyətlərindəndir.

Təriqətlərin hər biri Mühəmməd Peyğəmbərə (s) kimi uzanan təriqət *silsiləsinə* malikdir. Bu silsilədə təriqət şeyxlərinin *(qütb)* adları ardıcıllıqla düzülür. Təriqətlərin böyük əksəriyyətinin silsiləsi İmam Əli ibn Əbu Talib (ə) vasitəsilə



Peyğəmbərə bağlanır. Səhabələrdən Salman Farsi, Əbuzər, tabiindən Həsən Bəsri, Üveys Qərəni, daha sonrakı dövrlərdə yaşamış məşhur İslam şəxsiyyətlərindən *İmam Cəfər Sadiq (ə),* Məruf Kərxi, İbrahim ibn Ədhəm, Malik ibn Dinar, Davud Tai, Şəqiq Bəlxi və başqalarının adına müxtəlif təriqətlərin silsiləsində rast gəlinir.

Bir çox tədqiqatçılar təriqətlərin yaranma mərhələsini təsəvvüfün süqutunun başlanğıcı hesab edirlər. Onlar təriqətlər dövrünü süfiliyin təşkilatlanması, ayrı-ayrı (bəzən hətta bir-biri ilə rəqabətdə olan) qruplara parçalanması, mürşid (şeyx) kultunun yaranması, İslama zidd bəzi ayin və adətlərin meydana gəlməsi, tüfeyli həyat tərzi sürən, sərgərdan gəzib dolaşan, şəriətə çox da bağlanmayan dərvişlərin ortaya çıxması dövrü kimi xarakterizə edirlər.

Təriqət həm də təsəvvüfdə haqqa doğru gedən yolun *(seyrü-süluk)* ikinci mərhələsi sayılır (*şəriətlə həqiqət* arasında). Təriqət şəriətin batini yolu və həqiqətə çatmağın başlanğıcıdır. Ariflər demişlər: "Təriqət salikin öz yolu ilə irəliləməsidir. Dünyadan üz çevirmək, davamlı zikr, yaradılışın əvvəlinə diqqət yetirmək, dünyaya laqeydlik, tənhalığa qapılmaq, daim təharətli və dəstəmazlı olmaq, doğruculluq, ixlas və sairə sifətlər bura aiddir. Şəriət zahiri hökmlərdən ibarətdir və qabıq kimidir, təriqət onun içi, ləpəsidir. Təriqət yaradılmışdan Əzəliyə (Allaha) doğru hərəkətdir. Salik *fəna* məqamından *baqa* mərtəbəsinə keçəndən sonra deyirlər ki, təriqət yolundan həqiqətə çatmışdır".

***Mənbələr:*** *Seyid Ziyaəddin Səccadi. İrfan və təsəvvüfün əsaslarına giriş, s.13-17; Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.552; Ehsanullah Əli İstəxri. Üsuli-təsəvvüf, s.657-663.*



**TƏSBİH, TƏSBEH** – ərəb dilindən tərcüməsi "müqəddəs saymaq" deməkdir. Allah-Taalanın gözəl adlarından *(əsma əl-hüsna)* biri də Sübhandır (müqəddəs, pak, nöqsandan uzaq). Dini terminologiyada təsbih Allahın müqəddəsliyini dilə gətirmək, onu təqdis etmək deməkdir. Quranda möminlərə tövsiyə edilir ki, Allahı çox təsbih etsinlər: "Ey iman gətirənlər! Allahı çox zikr edin! Ona səhər-axşam təsbih söyləyin!" (Əhzab, 41).

Təsbeh həm də Allahın adlarını *zikr* edərkən, qısa *duaları* oxuyarkən hesabı itirməmək üçün bir vasitədir. Buddizm, hinduizm, xristianlıq və bəhailikdə əsasən din xadimləri təsbehdən istifadə edirlər. İslamda təsbehlər 33 və ya 99 dənəli olur, çünki əsma əl-hüsnanın sayı 99-dur; təsbehlə deyilən zikrlərin sayı da ya 33, ya da 100 olur. Dini mənbələrə görə, İslamda ilk təsbehi Həzrət Fatimeyi-Zəhra (ə) hazırlamışdır. Məhəmməd Peyğəmbər (s) ona aşağıdakı qaydada zikr söyləməyi öyrətmişdi: 34 dəfə "Allahü əkbər", 33 dəfə "əlhəmdü lillah" və 33 dəfə "sübhan Allah". Bu zikrə Həzrət Fatimənin (ə) təsbihi deyirlər. Ən üstün təsbeh *İmam Hüseynin (ə)* məzarı yerləşən Kərbəla torpağından hazırlanmış təsbehdir.

Sufilərin düşüncəsində Kainatdakı hər kəs və hər şey öz dilində Allahı təsbih edir. Mərifət əhli bu təsbihi duya bilər. Bu düşüncənin mənbəyi Quran ayələridir: "Yeddi göy, yer və onlarda olanlar (bütün məxluqat) Allaha təsbih deyir. Elə bir şey yoxdur ki, Allaha həmdlə təsbih etməsin. Lakin siz onların təsbihini anlamazsınız..." (İsra, 44; o cümlədən bax: Hədid, 1; Həşr, 1; Səff, 1).

Səfəviyyə təriqətinin banisi Şeyx Səfiəddin Ərdəbilinin anasından rəvayət edirlər ki, o, Şeyx Səfiyə hamilə olarkən hər gün yuxudan ayılanda öz bətnindən təsbihat səsi eşidirmiş, yəni Şeyx Səfi hələ ana bətnində ikən Allaha dua və təsbih edirmiş. "Təzkireyi-Şeyx Səfi"də Məhəmməd adlı bir nəfərin dilindən nəql edilir: "Bir gün dənizin qırağında oturmuşdum. Suyun üstində bir adamın kölgəsi gördüm kim, mənim sarusına gəlür. Haman kim yaxınlaşdı, baxdım, şeyx idi və neçə min-min dənizin canəvərləri (canlıları) onunla suda gəlürdilər və xamu təsbihlər derdilər və ünlərin eşidürdüm. Çün bu halı gördüm, bir hal məndə zahir oldı kim, istərdim kim, özümi dənizə salam. Özümdən qaib olub mübarək ayağına düşdüm. Buyurdı: "Məhəmməd, yəqinün dürüst oldımı, könlüni saxla!"

Şeyx Səfiəddin Ərdəbilinin Bəhaəddin adlı bir müridi seyrü-sülukda yüksək məqama çatmışdı, bir gün şeyxə dedi: "Ya şeyx, hər tükümdən bir təsbih və zikr ünü eşidürəm". Şeyx dedi: "Sən işündə təqsir etmə kim, bu quru ağaclardan dəxi zikr eşidəcəksən". Və evün üstündəki ağaclara işarət qıldı. Pəs Bəhaəddin yaxşıca baxub ağaclardan zikr ünün eşidürdi. Və in min şeyin illa yüsəbbihu bihəmdih" (Elə bir şey yoxdur ki, onu həmd ilə təsbih etməsin. İsra, 44). Şah İsmayıl Xətai "Nəsihətnamə"də *üçlər, yeddilər və qırxların* haqqı, *Rum abdallarının* sidqi, Xorasan pirlərinin nitqi, dərvişlərin sirri ilə yanaşı Allahı aşiqlərin çəkdikləri ahın atəşinə və sübh çağında etdikləri təsbihlərə də and verir, günahlarının bağışlanmasını diləyir:

Aşiqlər atəşi-ahı həqiçün
Ki, təsbihi-səhərgahi həqiçün!
Müdam çağırdığun ol Şah həqiçün,
Hacat qəbul olan dərgah həqiçün!
Suçum bağışla Şahi-Kərbəlayə,
Qamu aşiqlərə Şah övliyayə.

*(Ş.İ.Xətai)*

Klassik ədəbiyyatda təsbeh riyakar sufilərin və mövhumatçı ruhanilərin bir atributu kimi də təsvir edilir. Onlar mərifət zövqündən bixəbərdirlər, əllərindəki təsbehlə özlərini zahid kimi göstərib xalqı aldadırlar:

Aşiqi-sadiq duzağın quşu, ey zahid,
degil!
Danə düzmə təsbihi, səccadəyi dam
eyləmə!

*(S.İ.Nəsimi)*

***Mənbələr:*** *S.C.Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.236-237; Lüğətnameyi-Dehxuda, V, 6715-6716; Şeyx Səfi təzkirəsi ("Səfvətüs-səfa"nın XVI əsr türk tərcüməsi), s.51, 273 və 495; Şah İsmayıl Xətai. Əsərləri (2 cilddə), II, 392-393; Azərbaycan klassik ədəbiyyatı kitabxanası (20 cilddə), V, 226.*



**TƏSƏVVÜF** – insanın Haqqa (Allaha) doğru yolu *(seyrü-süluk)* uğurla qət etməsinin üsullarını açıqlayan dini-mistik dünyagörüşü, sufizm. Əvvəlcə *"sufi"* sözü yaranmış, ondan "təsəvvüf" sözü törəmişdir, elə hərfi mənada "təsəvvüf" sufilik deməkdir. Sufilik təlimi meydana çıxdığı zamandan bəri onun mahiyyətini açmaq, mənasını sözlə əhatə etmək və söz qəlibində ona tərif vermək cəhdləri çox olmuşdur. Barəsində ən çox danışılan və mahiyyətinə ən çox tərif verilən məfhumlardan biri təsəvvüfdür.

İstər sufilərin özləri, istərsə də sufiliyin tədqiqatçıları tərəfindən təsəvvüf barədə minlərlə tərif irəli sürülmüşdür. Sührəvərdi "Əvarif əl-məarif" kitabında bir neçə nəzəriyyəni qeyd etdikdən sonra yazır: "Təsəvvüfün mahiyyəti barəsində şeyxlərin sözlərinin sayı mindən artıqdır. Onların hamısını yazmaq çətindir. Amma bunlar söz baxımından fərqli, məna baxımından oxşardır".

Böyük sufilər təsəvvüfün mənasını bu cür anladırdılar: "Təsəvvüf – həqiqətləri əldə etmək, dəqiq və incə məsələlərdən söz açmaq, camaata məxsus əmlakdan naümid olmaqdır" (Məruf Kərxi). "Təsəvvüf əvvəldə *zikr*, sonra *vəcddir*. Daha sonra isə nə ondan, nə də bundandır". "Təsəvvüf o kəsin yoludur ki, sağ əlində Allahın kitabını (Qurani-Kərimi), sol əlində Mustafa sünnəsini tutmuş olsun və bu iki şamın işığında yol getsin, nə şübhə girdabına, nə də bidət zülmətinə düşməsin" (Cüneyd Bağdadi). "Təsəvvüf – kitaba və sünnəyə əməl etmək, nəfsani istəklərdən və bidətlərdən uzaq olmaqdır" (Nəsrabadi). "Təsəvvüf – həmişə eyni istiqamətə diqqət kəsilmək və həmişə eyni səviyyədə ömür sürməkdir". "Təsəvvüf – həqiqətdə vaqe olan bir addır; o, tamam olub sona çatdıqda yalnız Allah qalar" (Əbu Səid Əbülxeyr).

Cüneyd Bağdadinin düşüncəsinə görə, təsəvvüf 8 xüsusiyyət üzərində qurulub: səxavət, riza (razılıq), səbir, işarə, qürbət (qəriblik), yun paltar geyinmək, səyahət və fəqr (kasıblıq). Təsəvvüf həmin sifətlərdə 8 peyğəmbərə tabe olmaq deməkdir: səxavətdə İbrahimə (ə), rizada İshaqa (ə), səbirdə Əyyuba (ə), işarədə Zəkəriyyaya (ə), qəriblikdə Yəhyaya (ə), yun paltar geyinməkdə Musaya (ə), səyahətdə İsaya (ə) və fəqrdə Mühəmmədə (s).

Təsəvvüfə verilmiş təriflərin niyə bu qədər rəngarəng olmasını tədqiqatçılar üç əsas səbəblə əlaqələndirmişlər:

Birincisi, təsəvvüf çox geniş bir aləm olduğundan hər kəs onu öz səviyyəsinə uyğun olaraq dərk etmiş və öz tutumu qədərincə ondan bəhrələnmişdir. Hər sufi bu böyük aləmin müəyyən bir nöqtəsinədək irəliləməyə nail olmuş və həmin nöqtədən gördüklərini təsvir etmişdir.

İkincisi, seyrü-süluk, yəni *həqiqət* yolu çoxlu mənzil və məqamlardan ibarətdir. Bunların hər birində arifin halı və müşahidələri müxtəlif olur. Təbii ki, müxtəlif mənzillərdə duran ariflərin təəssüratları da bir-birindən fərqli olacaq. Hətta eyni bir şəxs seyrü-süluk yolunda irəlilədikcə düşüncələri təkamül tapacaq, bu gün dünənkinə nisbətən daha uca

məqamda durduğundan fikirləri daha geniş və əhatəli olacaq. Bu səbəbdən təsəvvüf barədə eyni bir şəxsə aid edilən təriflər bəzən ciddi təfavütlərə malik olur.

Üçüncüsü, sufilər təsəvvüfə tərif verərkən onu fərqli cəhətlərdən araşdırmış, öz fikirlərini qısa və səlis ifadə etmək xatirinə təsəvvüfün yalnız bir və ya bir neçə cəhətini diqqət mərkəzinə çəkmişlər. Çünki təsəvvüf qədər mürəkkəb və əhatəli aləmin bütün xüsusiyyətlərini bir tərifdə cəmləşdirmək sadəcə olaraq mümkün deyil.

Qurani-Kərimin ayələrində rast gəldiyimiz “liqaullah” (Allahın görüşü), “rizvanullah” (Allahın razılığı), “vəchullah” (Allahın üzü), “əsmaullah” (Allahın adları) kimi ifadələr, vəhy, merac, Adəmin yaradılışı, məad və ruh kimi mövzular əslində sırf təsəvvüf və irfan məsələləridir. Sufilərin ən çox müraciət etdiyi ayələrin sırasında aşağıdakılar ilk cərgədə durur: “Şərq də, Qərb də Allahındır: hansı tərəfə yönəlsəniz (üz tutsanız), Allah oradadır. Şübhəsiz ki, Allahın mərhəməti genişdir, (O, hər şeyi) biləndir!” (Bəqərə, 115). “Siz (itaətlə) Məni xatırlayın ki, Mən də sizi yada salım! Mənə şükür edin, Məni danmayın!” (Bəqərə, 152). “Biz Allahınıq və Ona tərəf qayıdacağıq” (Bəqərə, 156). “Ey xatircəm olan nəfs! Dön Rəbbinə, sən Ondan, O da səndən razı olaraq!” (Fəcr, 27-28). “Allah göylərin və yerin nurudur” (Nur, 35). “Ey insan, sən Rəbbinə doğru çalışıb-çabalayırsan. Sən Ona qovuşacaqsan” (İnşiqaq, 6). “Nəfsini təmizləyən mütləq nicat tapacaqdır. Onu günaha batıran isə, əlbəttə, ziyana uğrayacaqdır” (Şəms, 9-10). “Sonra onu (Adəmi) düzəldib insan şəklinə saldı və ona öz ruhundan üfürdü” (Səcdə, 9). “Yer üzündə olan hər kəs fanidir. Yalnız əzəmət və kərəm sahibi olan Rəbbinin vəchi baqidir” (Rəhman, 26-27). “Biz əmanəti göylərə, yerə və dağlara təklif etdik. Onlar ona yüklənməkdən qorxub çəkindilər. Ona insan yükləndi. Həqiqətən, o, çox zalım, çox cahildir” (Əhzab, 72).

Tədqiqatçılar təsəvvüfün tarixini 3 əsas mərhələyə bölürlər:

1. **Zöhd mərhələsi.** Mühəmməd Peyğəmbərin (s) şəxsən nümayiş etdirdiyi, sonralar böyük səhabələr tərəfindən yaşanmış, onlardan sonra tabiin (səhabələrin tələbələri) tərəfindən davam etdirilmiş həyat tərzi sufiliyin ilkin mərhələsinin əsasını təşkil edirdi. Zöhd mərhələsi VIII əsrin sonlarına kimi davam etmişdir. İslamın ilk əsrində bu mərhələnin ən böyük simaları suffə əhli, Üveys Qərəni və başqaları olmuşlar. Sonrakı əsrdə Mədinə, Kufə, Bəsrə və Xorasan bölgələrində güclü zöhd məktəbləri fəaliyyət göstərirdi. Bu şəhərlərdə Səid ibn Müseyyib, Malik ibn Ənəs (Mədinə), Həsən Bəsri, İbn Sirin, Malik ibn Dinar, Rabieyi-Ədəviyyə (Bəsrə), Əbu Haşim Sufi, Cabir ibn Həyyan, Süfyan Sovri, Davud Tai (Kufə), İbrahim ibn Ədhəm, Füzeyl ibn İyaz, Şəqiq Bəlxi (Xorasan) və başqa məşhur şəxsiyyətlər yaşayırdılar.

2. **Təsəvvüf mərhələsi.** IX-X əsrlərdə



"sufi" termini meydana çıxmış, təsəvvüf digər islami elmlərdən ayrılaraq müstəqil bir təlim kimi formalaşmışdır. Bu dövrdə təsəvvüf nəzəriyyəsinə aid ilk əsərlər yazılmağa və ilk təsəvvüf terminləri meydana çıxmağa başladı. Bu mərhələdə Bəsrə, Kufə və Xorasanla yanaşı Nişapur, Misir, Bağdad və Şamda da sufi mərkəzləri fəaliyyət göstərirdi. Təsəvvüfün özəyi bu mərhələdə qurulmuş, təməl anlayışları bu mərhələdə formalaşmışdır.

3. **Təriqət mərhələsi.** XII əsrdən etibarən ilk sufi müəssisələri olan *təriqətlər* meydana çıxdı, təsəvvüf sosial həyatın tərkib hissəsinə çevrildi. Sufi ədəbiyyatının ən gözəl nümunələri yaradıldı (Mövlana Rumi, Sədi Şirazi, Hafiz Şirazi və b. tərəfindən). Sührəvərdi *işraq* fəlsəfəsini, Mühyiddin ibn Ərəbi *vəhdəti-vücud* təlimini işləyib hazırladı. Bu mərhələdə əsas sufi ayinləri, adət-ənənələri formalaşmağa başlamış, *xanəgah* həyatı yaranmışdır.

XVIII-XIX əsrlərdən etibarən müsəlman cəmiyyətinin sosial-mədəni, dini-sıyasi həyatında təsəvvüfün rolu azalmağa başladı. Lakin bəzi bölgələrdə (o cümlədən Şimali Afrika ölkələri) təsəvvüf bugünədək kifayət qədər fəal mövqeyə malikdir.

İslam dini ilə təsəvvüfün qarşılıqlı münasibətləri barədə uzun əsrlərdir mübahisələr davam edir. Bəzi tədqiqatçılar təsəvvüfün İslamla az qala daban-dabana zidd olduğunu və əsasən İslamdan qabaqkı dinlərə dayaqlandığını iddia edirlər. Onların fikrincə, sufilik xristianlıq, buddizm, hinduizm, manilik və atəşpərəstlik dinlərinin mirasıdır və İslamın ruhuna yabançıdır.

Səfəvilər dövlətində təsəvvüf ənənələri kifayət qədər geniş yayılmışdı. *Səfəviyyə* özü sufi təriqətlərindən biri olduğu üçün Səfəvi şahları dövlətdə təriqətin şeyxi sayılırdılar, onların ləqəbi *"mürşidi-kamil"* idi. Təriqətlə bağlı məsələlərdə şah öz müşaviri olan *xəlifət əl-xüləfa* ilə məsləhətləşirdi; xəlifət əl-xüləfanın bütün bölgələrdə, hətta ölkə xaricində nümayəndələri *(xəlifələri)* vardı. Səfəvi sarayında mütəmadi olaraq sufi mərasimləri keçirilirdi, bu məqsədlə sarayda "tövhidxana" adlı xüsusi guşə mövcud idi. Şahlar Ərdəbil *təkkəsinə* böyük ehtiramla yanaşır, onun *vəqf* əmlakını artırır, ildə bir neçə dəfə Şeyx Səfinin məzarını ziyarət edirdilər. Səfəvilər dövründə "sufi" (və ya "sofu") kəlməsi ehtiramla çəkilirdi, əksinə, "nasufi" ifadəsi ən böyük təhqir və dövlətə, şaha xəyanətin meyarı sayılırdı.

Səfəviyyə təriqəti ilə yanaşı nemətullahiyyə, *bektaşiyyə*, zəhəbiyyə, nurbəxşiyyə təriqətlərinin də müəyyən qədər nümayəndəsi Səfəvilər dövlətində yaşayırdı. Şiə təmayüllü olan bu təriqətlər əksər hallarda dövlət mənafeyinə qarşı çıxış etmədikləri üçün onlara münasibət mənfi deyildi.

Bununla yanaşı, Səfəvilər zamanında ifrat düşüncəli sufi təriqətlərinə və sufilərə qarşı təzyiqlər də həyata keçirilirdi. *Əxbari* inancında sufilik xoş qarşılanmadığı üçün müəyyən dövrlərdə bəzi təriqətlərə qarşı mübarizə kampaniyaları başlayır, onların liderləri ağır şəkildə

cəzalandırılır, təkkələri dağıdılırdı. I Şah Abbas zamanında nöqtəvilərə qarşı başlanmış təzyiqlər buna misaldır.

***Mənbələr:*** *Seyid Ziyaəddin Səccadi. İrfan və təsəvvüfün əsaslarına giriş, s.1-13; Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.241-245; Qısa İslam Ensiklopediyası (N.Rəhimovun ümumi redaktəsi ilə, 2 clddə), I, 272-275; K.Bünyadzadə. Sərrac Tusinin "əl-Lümə" əsəri, s.29-37; Osman Nuri Topbaş. İmandan İhsana Tasavvuf ("Tasavvuf'un Mahiyeti" bölümü); Metinlerde Tasavvuf Terimleri Sözlügü (sufi-mutasavvıf-mustasvif/sufiyye) s. 920-939; Röya Payun. Səfəvilər dövründə təsəvvüfün tarixi ("Fərhəngi-İsfahan" dərgisi, 1380 h.-ş., № 19), s.14-32; S.Heydəri. Tövhidxana və Səfəvilər dövründə onun rolu ("Rüşdi-amuzeşi-tarix" dərgisi, il: 4, sayı: 11), s.48-51.*

**TƏVƏKKÜL** – *seyrü-sülukda* altıncı *məqam*, *səbir* və *riza* məqamlarının arasında yerləşir. Təsəvvüfdə təvəkkül hər şeyi mütləq Malikin (yəni Allah-Taalanın) öhdəsinə buraxmaq və Onun qəzavü-qədərinə razı olmaqdır.

Məşhur sufi Səhl ibn Abdullah Tüstəri təvəkkül barədə bu fikirdə idi: "Təvəkkülün əlaməti üçdür: heç nə istəməyəsən, baş verən işi geri qaytarmayasan, əlinə düşəni yığıb saxlamayasan". Tüstəri təvəkkülün ilk mərhələsini bəndənin Allah qarşısında özünü ölüyuyanın qarşısındakı meyit kimi hiss etməsi şəklində təsəvvür edirdi. Necə ki, ölüyuyan meyiti istədiyi tərəfə çevirə bilir, amma ölüdən heç bir hərəkət və iradə müşahidə olunmur, bəndə də Allahın iradəsi qarşısında o cür təslimiyyət və təvəkkül göstərməlidir.

Təvəkkül "Allahın xəzinəsində" mövcud olanlara arxayın olmaq, camaatın əlində olanlardan ümid kəsməkdir. Belə şəxs insanların ən güclüsü olar. Peyğəmbər buyurmuşdur ki, hamıdan güclü olmaq istəyən şəxs Allaha təvəkkül etsin.

Sufilərin təvəkkül barədə fikirləri eyni deyildir. Bəziləri başqasına möhtac olmaq dərəcəsində təvəkkül etməyi bəyənməmiş və hər zaman ehtiyatla, tədbirlə davranmağı məsləhət görmüşlər. Çünki Peyğəmbər dəvəsinin ayaqlarını bağlamadan Allaha təvəkkül edən ərəbə belə söyləmişdi: "Dəvənin ayaqlarını bağla, həm də Allaha təvəkkül et!" Bəzi sufilər isə hər cür düşüncə və tədbiri atıb yalnız Allaha sığınmağı, ruzi dalınca qaçmamağı, camaatdan gələn payla (buna fütuh deyilir) dolanmağı daha üstün bilmişlər.

Səfəviyyə təriqətinin banisi Şeyx Səfiəddin Ərdəbiliyə görə, elmdən *yəqin*, yəqindən də təvəkkül doğar, yəqinsiz təvəkkül düzgün olmaz. Ona dedilər ki, keçmişdəki sufilərin fikrincə, təvəkkül hadisələrin səbəbini nəzərə almamaq deməkdir. Şeyx Səfi cavab verdi ki, səbəblər də Allahdandır. Bəndə səy göstərib halal ruzi qazanmalı, həm də Allah-Taalaya təvəkkül etməlidir, səbəbləri qəbul etmək təvəkkülə maneçilik törətməz.

***Mənbələr:*** *Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.272-274; Seyid Ziyaəddin Səccadi. İrfan və təsəvvüfün əsaslarına giriş, s.28-30; Sərrac Tusi. Əl-Lümə, s.78-80; Nəsirəddin Tusi. Ovsaf əl-əşraf, s.83-85; Risaleyi-Qüşeyriyyə (farsca*



*tərcümə: Bədiüzzaman Firuzənfər), s.245-260; İzzəddin Kaşani. Misbah əl-hidayə və miftah əl-kifayə, s.396-399; Şeyx Səfi təzkirəsi ("Səfvətüs-səfa"nın XVI əsr türk tərcüməsi), s.701.*

**TÖVBEYİ-NƏSUH** – ən səmimi, ən xalis *tövbə*. Qurani-Kərimdə buyurulur: "Ey iman gətirənlər! Allaha səmimiqəlbdən (nəsuh) tövbə edin!" (Təhrim, 8). Tövbeyi-nəsuhun xüsusiyyətləri barədə çoxlu izahlar mövcuddur. Hətta məşhur Quran təfsirçisi Qurtubi tövbeyi-nəsuha müxtəlif şəxsiyyətlər tərəfindən 23 cür tərif verildiyini yazmış və bunlarn hər birini ayrı-ayrılıqda qeyd etmişdir.

Məşhur səhabə Məaz ibn Cəbəl Mühəmməd Peyğəmbərdən (s) tövbeyi-nəsuh haqqında soruşanda həzrət ona belə cavab vermişdi: "Sağılmış süd bir daha döşə qayıtmadığı kimi, bu tövbəni etmiş insan da bir daha günaha qayıtmaz".

*İmam Həsən Əsgəri (ə)* tövbeyi-nəsuhun mənası barədə soruşan şəxsə bu cür cavab yazmışdı: "Onu edənin batini (içərisi) ilə zahiri (çölü) eyni cürdür, hətta batini zahirindən daha üstündür".

***Mənbələr:** Qurtubi. Əl-Came li-əhkam əl-Quran, XXI, 96-98; Təbrisi. Məcmə əl-bəyan, X, 67; Əllamə Məclisi. Bihar əl-ənvar, VI, 22.*

**TÖVBƏ** – *seyrü-süluk* yolundakı birinci *məqam*. *Salik* seyrü-süluk yoluna qədəm basanda əvvəlcə *şəriətə* zidd olan hər işdən tövbə etməli və bundan sonra bütün əməllərini bu əsasda quracağına söz verməlidir.

Ariflərin çoxu bu fikirdədir ki, salik tövbə məqamında kamil rəhbərin (*pir* və ya *mürşidin*) tabeliyində hərəkət etməli, onun tapşırıqlarını qeyd-şərtsiz yerinə yetirməli, onun sözündən çıxmamalıdır. *İmam Əli (ə)* tövbə ilə yaxın mənaya malik olan istiğfarın 6 şərtini aşağıdakı şəkildə bəyan etmişdi: günahdan peşman olmaq, həmin günaha bir daha qayıtmamağı qərara almaq, camaatın haqqını özünə qaytarmaq, sənə vacib olan, amma yerinə yetirmədiyin hər bir əməli (ibadəti) icra etmək, bədənində haramdan yaranmış əti hüzn və kədərlə (peşmançılıqla) əritmək, günahın şirinliyini daddığın kimi, ibadətin əziyyətini də dadmaq.

Böyük arif İzzəddin Kaşani "Misbah əl-hidayə" kitabında tövbənin 5 şərti olduğunu yazır: fərz olan ibadətləri icra etmək, buraxılmış fərzləri qəza etmək, halal ruzi qazanmaq, qəsb olunmuş bütün əmlakı sahibinə qaytarmaq və *nəfslə* mübarizə etmək.

Sufilərə görə tövbənin 6 növü var. Birincisi, əməl sahiblərinin (ümmal) tövbəsi pis işlərdən yaxşı əməllərə üz tutmaqdır. İkincisi, zahidlərin tövbəsi dünya sevgisindən üz çevirməkdir. Üçüncüsü, hüzur əhlinin tövbəsi qəflətdən hüzura doğrudur. Dördüncüsü, ixlaslıların tövbəsi pis əxlaqdan yaxşı əxlaqa yönəlməkdir. Beşincisi, ariflərin tövbəsidir ki, öz yaxşı əməllərini görsələr, tövbə onlara vacib olar. Çünki onlar hər şeyin Allahdan olduğuna inanar, öz yaxşı əməllərini görməyi xudpəsəndlik və

təkəbbür sayarlar. Nəhayət, tövbənin altıncı və ən üstün dərəcəsi müvəhhidlərin (tövhid əhlinin) tövbəsidir. Onlar Allahdan başqasına nəzər salanda tövbə edərlər.

Nəsirəddin Tusi qeyd edirdi ki, aqillər (ağıl sahibləri) haram əməlləri edəndə və vacib əməlləri etməyəndə tövbə edərlər. Peyğəmbərlər müstəhəb əməlləri etməyəndə və məkruh əməlləri edəndə tövbə onlara vacib olar. Saliklər isə Allahdan savayı bir şeyə diqqət yetirəndə və fikrini Allahdan başqasına yönəldəndə tövbə edərlər. Bununla da tövbənin 3 növə ayrıldığı məlum olur: bütün bəndələrə məxsus olan adi tövbə, məsumlara məxsus olan xüsusi tövbə, seyrüsüluk əhlinə məxsus olan xüsusidən də xüsusi tövbə. N.Tusi cənnətdən çıxarılandan sonra Həzrət Adəmin (ə) etdiyi tövbəni ikinci növə, Mühəmməd Peyğəmbərin (s) günahı olmadan etdiyi tövbəni üçüncü növə aid etmişdir.

Sufi təriqətlərinin mühüm ayinlərindən biri tövbə və təlqin ayini idi. *Mürid* təriqətə qoşulmaq istəyəndə əvvəlcə *mürşidin* hüzurunda tövbə edər, mürşid onun tövbəsini qəbul edərdi. Rəvayətə görə, *Şeyx Səfiəddin Ərdəbili* gəncliyinə çox şeyxlərlə görüşmüş, onların əlini tutub tövbə və təlqin ayinini icra etmək istəmişdi. Amma hər dəfə qeyri-iradi olaraq üzü şeyxin üzündən kənara dönüş, bununla da həmin şeyxin ona mürşidlik etməyə layiq olmadığını anlamışdı. Təkcə *Şeyx Zahid Gilaninin* əlindən tutub tövbə edəndə başa düşmüşdü ki, axtardığı mürşid məhz budur.

***Mənbələr:*** *Nəhc əl-bəlağə, 409-cu hikmətli kəlam; S.C.Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.264-266; İzzəddin Kaşani. Misbah əl-hidayə və miftah əl-kifayə, s.368; S.Z.Səccadi. İrfan və təsəvvüfün əsaslarına giriş, s.21-22; Sərrac Tusi. Əl-Lümə, s.68-69; Nəsirəddin Tusi. Ovsaf əl-əşraf, s.25-29; Risaleyi-Qüşeyriyyə (farsca tərcümə: Bədiüzzaman Firuzənfər), s.136-145; Şeyx Səfi təzkirəsi ("Səfvətüs-səfa"nın XVI əsr türk tərcüməsi), s.62 və 77.*



**ÜÇLƏR, YEDDİLƏR, QIRXLAR** – təsəvvüf düşüncəsində *qeyb* aləmini bilən, dünya işlərini idarə edən, Allahın ən sevimli bəndələri. Onları *"rical əl-ğeyb"* (ğeyb aləminin kişiləri), *ərənlər*, *abdallar* da adlandırırlar. Onlar xalq arasında xalqdan gizli yaşayır, insanlara məxfi şəkildə əl tutur, yardıma ehtiyacı olanların dadına çatırlar. Onların biri dünyasını dəyişəndə digəri yerini tutur; beləliklə, onların sayı dəyişməz qalır. Bunların sayı mənsub olduqları iyerarxik pilləyə əsasən fərqli şəkillərdə qeyd edilir. Ən üst pillədə iki müavini ilə *qütb (qövs)* durur, bunlar ilk üçlüyü təşkil edirlər. *Abdalların* sayı yeddidir. Peyğəmbərin meracdan qayıdarkən qatıldığı məclis isə iştirakçıların sayına görə *qırxlar məclisi* adlandırılır. Rical əl-ğeybin sayı barədə sufi mənbələrindəki və ələvi-bektaşi inancındakı məlumatlar fərqlidir.

*bax:* **RİCAL əl-ĞEYB.**

***Mənbələr:*** *Ahmet Yıldırım. Tasavvufda Ricalu'l-Gayb Telakkisi ve Konuyla İlgili Bazi Rivayetler, Süleyman Demirel Üniversitesi İlahiyat Fakültesi Dergisi, Yıl: 1997, Sayı: 4,*



*s.117-147; Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.413; Əbdürrəhman Cami. Nəfəhat əl-üns, s.24-25; Filiz Kalyon. Alevi Bektaşi Şiirlerinde Kullanılan Sembollere Dair Bir İnceleme, IV. Uluslararası Alevilik ve Bektaşilik Sempozyumu, (18-20 Ekim 2018, Ankara), s.754-755; Türkiye Diyanet Vakfı İslam Ansiklopedisi, XL, 122.*

**ÜNS** – təsəvvüf aləmində Allahın camalının kamilliyini duymaqdan alınan batini ləzzətə üns deyilir.

Üns əhlinin sifətlərini belə təsvir etmişlər: onlar öz Məhbublarından başqa hamıdan qaçar və özgələrlə ünsiyyətdən qorxarlar. Yalnız Allahla ünsiyyət qurar, hətta öz *nəfslərindən* də hürküb qorxarlar. Həmişə Allahın *zikri* və xəyalı ilə yaşayar, bütün vaxtlarını zikr və düşüncə içində keçirərlər. Allahla daim qarşılıqlı bağlantı və ünsiyyətdə olar, Ona təzimi vacib sayarlar.

Ünsün üç dərəcəsi olduğunu yazmışlar. Allaha itaət ünsü abidlərə xasdır və namaz, oruc, Quran tilavəti, dil zikri kimi ibadətləri əhatə edir. Bundan daha şərəfli olan ilahi sifətlərlə ünsdür ki, ariflərə şamil olar. Onlar Allahın camal və calal sifətlərini həmişə hiss edərlər. Nəhayət, haqqa yetişənlər ünsün ən yüksək dərəcəsinə – Allahın Zatı ilə ünsə nail olarlar və bütün maneələri, əlavələri kənara atıb Allahın Özü ilə ünsiyyətdən həzz alarlar.

Bəzən üns halını heybətlə yanaşı təsvir etmişlər. Heybət – Allahın calal sifətlərini müşahidə etməkdən və bunların əzəmətini anlamaqdan ibarətdir.

***Mənbələr:*** *Seyid Ziyaəddin Səccadi. İrfan və təsəvvüfün əsaslarına giriş, s.42-43; Sərrac Tusi. Əl-Lümə, s.96-97.*

**ÜZLƏT** – insanlardan kənar gəzmək, cəmiyyətə qaynayıb-qarışmamaq, hamıdan uzaq gəzib ibadət və itaətlə məşğul olmaq. Bu anlayış sufi ənənəsində mühüm yer tutur. Üzlət və *xəlvət* yaxın mənaya malikdir. Böyük sufilər öz tələbələrini cəmiyyətdən uzaq durmağa, hətta təhlükəli aslandan qaçırmış kimi ondan qaçmağa çağırırdılar.

Şeyx Səfiəddin Ərdəbilinin tövsiyələrinin toplusu və səfəviyyə təriqətinin məneviyyat kitabı olan *"Qara məcmuə"də* qeybət, riya, yalançılıq, həsəd, təkəbbür, nifaq kimi günahların məhz cəmiyyət içində olmaq nəticəsində yarandığı bildirilir. Daha sonra Süleyman Darani, Süfyan Sovri, Qəzzali kimi böyük sufilərin insanlarla qaynayıb-qarışmağı qadağan edən kəlamları misal gətirilir. Şeyx Səfi deyirdi: "Kişi bu xəlqdən üzlət edib kəsilməyincə dilini, dinini, qarnını, gözünü və bu yeddi əzasını saxlayamaz. Zira bu cəmi əzaları şərrə iltməgə səbəb bu xəlqdir... Və həm neçə dürlü afətlər bu xəlqə qarışmaqdan gələr. Bəzi ariflər demişlərdir kim, bu xəlqə müsahib olmaq haman od ilə müsahib olmaq gibidir... Pəs üzlət salamatlıqdır. Kişi xəlvətdə otursa, neçə mövla ilə müamiləyə yol bulmaz. Xüsusən kim, bu şimdiki zamanda, bu şimdiki zamanın qövmündən üzlət etmək, əlbəttə, gərəkdir".

Qeyd edək ki, bu təlimatlar təriqətdə sıravi mövqeli *müridlərə* aid idi. İnsanlarla ünsiyyət *seyrü-süluk* yolunda hələ iradəsi bərkiməmiş müridi məqsəddən uzaqlaşdıra, onun diqqətini yayındıra, hətta günahlara sövq edə bilər. Amma təsəvvüfdə uca məqama çatmış şəxslər irşad yükünü öhdəyə götürdükləri üçün insanlardan qaçmır, müraciət edən hər kəsə yardım göstərməyə çalışırlar. Bunlar *nəfsin* üç səfərini uğurla keçib dördüncü səfərə qədəm qoymuş *mürşidlərdir*. Haqla birlikdə xəlq içində olan səfər (bi-l-Həqq fi-l-xəlq) onlardan tələb edir ki, peyğəmbərlər və imamlar kimi, xalq arasında olsunlar və irşad missiyasını yerinə yetirsinlər.

İzzəddin Kaşani “Misbah əl-hidayə” əsərində qeyd etmişdir ki, məşhur sifilərin üzlət və söhbət (cəmiyyət içində olmaq) məsələsində fikir ayrılıqları vardı. Səid ibn Müseyyib, Abdullah ibn Mübarək kimi sufilər cəmiyyət içinə çıxdıqları halda, İbrahim Ədhəm, Davud Tai, Füzeyl ibn Əyaz və b. xalqdan uzaq durmağa üstünlük verirdilər. Sonra müəllif hər iki tərəfin sübutlarını öz əsərində açıqlayır.

***Mənbələr:*** *Qara məcmuə, s.46; Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.579-580; İzzəddin Kaşani. Misbah əl-hidayə və miftah əl-kifayə, s.233-238.*



**VƏCD** – *salikin* qəlbinə Allah tərəfindən ötürülən müvəqqəti *mərifət* parıltılarıdır. Sufi hələ öz nəfsani sifətlərindən tam xilas olmamışdır, vücudundan xəbərsiz deyildir, Haqq ilə onun arasında pərdələr vardır. Allah-Taala bəzən bu pərdələrin arxasından onun qəlbinə vəcd göndərir, bir müddətdən sonra pərdələr yenə bunun qarşısını alır. Vəcd halında sufinin qəlbinə həm sevinc, həm də hüzn (kədər) dola bilər, adətən vəcdin hüzndən ibarət olduğunu yazırlar. Vəcd halında sufi bədbinliyə qapılır, Allahın qəzəbini, axirət aləmini güclü şəkildə hiss edir, Allahdan ayrı olmağın acısını yaşayır, Allaha qovuşmağın həsrətini çəkir. Vəcd adətən ağlamaqla və ah-fəryadla müşayiət olunur. Dərvişlər vəcd halına düşəndə qeyri-ixtiyari olaraq *səma* ayininə başlayırdılar.

Sufi ədəbiyyatında vəcd halını ərəb dilindəki “tapmaq” sözü ilə və “vücud” kəlməsi ilə sıx əlaqələndirirlər. Vəcd halının yüksək mərtəbəsi vücud halıdır. Əgər vəcd halında sufi hələ öz varlığından (vücudundan) xilas olmayıbsa, vücud halında artıq o öz vücudundan fani, Allahın vücudunda baqidir. Beləliklə, vücud halını yaşayan şəxs əslində öz vücudunu itirib və Allahın vücudunu qazanıb. Böyük sufi Şibli deyirdi: “Nə zaman itirdiyimi düşündümsə, (gördüm ki) tapmışam. Nə zaman tapdığımı güman etdimsə, (gördüm ki) itirmişəm”.

Səfəviyyə təriqətinin piri Şeyx Səfiəddin Ərdəbili vəcd halını bu cür təsvir edirdi: “Və əhli-vəcdin halı ona bənzər ki, məsələn, əhli-vəcd qəvvaldən (danışandan, moizə edəndən) bir qövli (sözü, söhbəti) eşitsə ki, ol kəndünün məqamı və mənzili olsa, iztirabə düşər, şöylə ki, mətlubuna və məqsuduna irişməyincə aram və qərar etməz”.



***Mənbələr:*** *Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.780-781; İzzəddin Kaşani. Misbah əl-hidayə və miftah əl-kifayə, s.133-136; Qara məcmuə, s.78.*

**VƏHDƏTİ-VÜCUD** – təsəvvüfün əsasını təşkil edən fəlsəfi təlim. Avropa fəlsəfi düşüncəsindəki "panteizm" anlayışına uyğundur. Bu təlim XII-XIII əsrlərdə yaşamış müsəlman filosofu Mühyiddin ibn Ərəbi tərəfindən irəli sürülmüş, onun "əl-Fütuhat əl-Məkkiyyə" və "Füsus əl-hikəm" kitablarında şərh edilmişdir. Sonralar vəhdəti-vücud təlimi digər filosoflar və sufilər tərəfindən inkişaf etdirilmişdir.

Vəhdəti-vücud təliminə görə, bütün varlıq aləminin mahiyyəti və kökü eynidir – Allahdır. Tək həqiqi olan vücud Odur, qalan hər şey Onun təcəllasıdır və etibari (nisbi) mahiyyət daşıyır. Necə ki, dərya, damcı, dalğa, köpük, şeh və s. anlayışların hamısının kökündə su durur və bunlar suyun fərqli formaları, fərqli adlarıdır. Yerə düşən Günəş şüalarının hamısı eynidir, amma bu şüalar hər yerdə müxtəlif şəkildə əks olunur, şüşənin üzərinə düşən Günəş şüası fərqli rənglər alır. Allahın vahid olan vücudundan gələn feyz də hər kəsdə fərqli formalarda təzahür edir və müxtəlif şəkillər alır, amma hamısının mahiyyəti və mənbəyi eynidir. Ariflər bunu "vəhdətdə kəsrət (çoxluq)" da adlandırırlar. Səfəvilər dövründə yaşamış böyük filosof *Molla Sədraya* görə, kəsrət vücuda yox, mövcuda aiddir; vücud tək, mövcud isə çoxdur.

Bəzi araşdırmaçılar vəhdəti-vücud təliminin Hindistandan Qərb neoplatonizminə, oradan da İslama keçdiyini iddia edirlər. Əbu Reyhan Biruni yazırdı ki, Hindistan filosofları belə deyirlər: "Həqiqi mövcud Təkdir, O, həmin ilkin səbəbdir ki, varlıq aləmində fərqli formalara düşür... Onlardan (hindulardan) biri mənə dedi ki, hər kim bütün varlığı ilə ilkin səbəbə bənzəsə, axırda onunla birləşər; bu zaman gərək bütün əlaqə vasitələrini (bağlılıqları) tərk etsin".

Vəhdəti-vücud təliminin mahiyyəti barədə sufi mənbələrində yazılmış sözlər mübhəm simvollar pərdəsinə bürünüb. İslam tarixi boyunca ənənəvi düşüncəli ruhanilərlə sufilər arasında vəhdəti-vücud mövzusunda çox zaman kəskin qarşıdurma mövcud olmuşdur. Sufilər ruhaniləri bu dərin mənaları anlamamaqda, əks tərəf də onları küfrdə ittiham etmişdir.

***Mənbələr:*** *Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.782-783; Lüğətnameyi-Dehxuda, XV, 23135; Abbasəli Əmid Zəncani. Təsəvvüf və irfanın yaranması və inkişafı barədə araşdırma, s.38-39; Əbdülhüseyn Zərrinkub. Sufi irsinin dəyəri, s.145-147; Titus Burckhardt. Təsəvvüf ayininə giriş (farscaya tərcümə: Yəqub Ajənd), s.59-65; Məhəmməd Təqi Müdərrisi. İslami irfan bəşər nəzəriyyələri ilə vəhy bəsirətinin arasında, s.150-151.*

**VƏQT (VAXT)** – mühüm təsəvvüf məfhumlarından biri. Vaxtı düzgün dəyərləndirmək sufilikdə çox mühümdür. Çünki *seyrü-süluk* yolunda *salikin* keçirdiyi *hallar* Allah tərəfindən ona hə-

diyyə edilir, bunlar salikin özündən asılı deyil. Vəqt hər bir sufi üçün spesifik anlayışdır, düşdüyü haldan asılı olaraq konkret davranış tələb edir. Buna görə hər sufinin öz vəqti var, hər vəqtin də tələb etdiyi davranış tərzi var. Allah tərəfindən əta edilmiş vəqt sufinin öhdəsinə müəyyən vəzifələr qoyur. İrfan aləmində salikə tövsiyə edilir ki, düşdüyü halı qənimət bilsin, onu fövtə verməsin və bundan bacarıqla faydalansın. Elə buna görə sufiləri *"ibn əl-vəqt"*, yəni "vaxtın övladı" adlandırırlar; çünki hal zamana bağlıdır.

İrfani şeirlərdə vəqti bəzən "dəm" və ya "eyş" adı altında təqdim edirlər. Sufi düşdüyü halı itirməmək üçün vəqti (dəmi, eyşi) qənimət bilər, ona qərq olar, nə keçmişi yada salar, nə gələcək haqqında düşünər. Sufilər vəqti qılınca bənzətmişlər, çünki zamanın hökmü qılınc kimi qəti və kəskindir, vəqtin tələbinə əməl etməmək, vəqti fövtə vermək sufini həlak, ilahi əmanəti zay edər. Təsəvvüfdə belə bir deyim var: "Vəqt əzizdir, ötərsə dərk edilməz (bir daha əldə edilməz)".

Zamanın çərçivəsindən çıxan, bir hala və məqama bağlanmayan, təmkin halında olan sufiyə isə "*əbu-l-vəqt"* deyirlər.

"Şeyx Səfi təzkirəsi"ndə səfəviyyə təriqətinin banisi Şeyx Səfiəddin Ərdəbili barəsində deyilir ki, həmişə "öz əhvalına və vəqtinə məşğul idi". Təzkirədə sufinin müəyyən hala düşməsi "xoşvəqt olmaq", "öz vəqtində olmaq" şəklində təsvir edilir.

***Mənbələr:*** *Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.789-791; Mürtəza Mütəhhəri. İslam elmləri külliyyatı, II, 130-134; Risaleyi-Qüşeyriyyə (farsca tərcümə: Bədiüzzaman Firuzənfər), s.88-91; Alper Günaydın. "İbnü'l-vakt" ve "ebü'l-vakt" kavramlarının klasik Türk tasavvuf edebiyatındaki kullanımı (Rumelide Dil ve Edebiyat Araştırmaları Dergisi, №8), s.326-336; K.Özköse. İbnü'l-Vakt Ya Da Ebu'l-Vakt Olabilmek (Somuncu Baba Dergisi, №64), s.22-25; İzzəddin Kaşani. Misbah əl-hidayə və miftah əl-kifayə, s.138-140; K.Bünyadzadə. Sərrac Tusinin "əl-Lümə" əsəri, s.188.*



**VƏLİ** – ərəb dilindən tərcümədə "dost" deməkdir. Terminoloji mənada Allahın dostu olan şəxs, yəni Allahın əmrlərini layiqincə yerinə yetirərək onun dostluğunu qazanmış şəxs vəli sayılır. Böyük *arif* və *sufilərə*, gözəl əxlaq və nümunəvi əməl sahibi olan insanlara vəli deyilir. Bu sözün cəm şəkli "övliya"dır, amma bəzən "övliya" sözü tək halda da işlədilir.

Quranda Allahın dostları haqqında buyurulur: "Bilin ki, Allahın dostlarının heç bir qorxusu yoxdur və onlar qəm-qüssə görməzlər" (Yunus, 62). Bəzi təfsirçilər bu ayədəki qorxunu cəhənnəm qorxusu, qəm-qüssəni isə cənnətdən ümidsizlik kimi izah etmişlər. Bir qisim təfsirçilər də haqqında danışılan qorxunu və qəm-qüssəni dünya həyatına aid etmişlər. Yəni Allahın dostları dünya qayğılarından azaddırlar, maddi məhrumiyyətlərdən narahat olmazlar. Məhəmməd Peyğəmbər (s) övliyanı belə təsvir edir: "Onları görəndə Allah yada düşər.



Onların çöhrələri nurludur. Onlarla birlikdə olanlara bədbəxtlik yaxın düşməz”. Allah dostlarını üç əlamətdən tanımaq olar: onların dərəcələri yüksəldikcə təvazöləri artar; imkanları olduğu halda dünyaya meyil göstərməzlər; intiqam almağa gücləri çatdığı halda bağışlayar və mərhəmət edərlər. İrfan sahibləri övliyada bu üç xislətin olduğunu da söyləyiblər: hər bir halda yalnız Allaha arxalanmaq, hər şeydən ehtiyacsız olub yalnız Allaha möhtac olmaq və hər şeydən üz çevirib Allaha sarı dönmək.

Ə.Cami “Nəfəhat əl-üns” əsərində məşhur sufilərdən birinə istinadən vəlini bu cür vəsf etmişdir: “Vəli öz halından fani, haqqın müşahidəsində baqidir. Onun öz nəfsindən xəbəri yoxdur. Əgər o, Allahdan başqası ilə olsa, daha öhdəsində əhd olmaz və özündə qərar qalmaz”.

Təsəvvüf aləmində övliya hədsiz ehtirama layiq görülür və peyğəmbərlərdən sonra ən üstün təbəqə sayılır. Təsadüfi deyil ki, səfəviyyə təriqətinin mühüm qaynaqlarından olan *“Qara məcmuə”də* Şeyx Səfiəddin Ərdəbilinin dilindən verilmiş kəlamlarda övliya dəfələrlə peyğəmbərlərə tay tutulur, harada peyğəmbərlərə sevgi və ehtiramdan danışılırsa, dərhal ardınca övliyadan söz açılır: “Şəriət ənbiyanın (peyğəmbərlərin), təriqət övliyanındır”.

Şeyx Səfi deyirdi ki, vəlilik üç cür olur. Birinci cür vəlilik budur ki, insan özü vəli olduğunu bilir, amma başqaları bilmir. Buna ümumi vəli deyilir, *abdallar*, *ovtadlar* və s. *rical əl-ğeyb* təbəqəsindən olan 347 nəfər bura aiddir. İkinci növ vəlilik budur ki, nə insanın özü, nə də başqaları onun vəli olduğunu bilər. Ona xüsusi (xass) vəli deyilir. Üçüncü növ vəlini isə həm özü, həm də camaat tanıyır; bu, irşad məqamında olan, xalqı tərbiyə edən mənəvi ustaddır. Bu, xass əl-xass (xüsusidən də xüsusi) vəlidir.

Şeyx Səfi övliyanın vəzifəsini bu şəkildə bəyan edir: “Övliya mənzilində otura, talibin könlünə nəzər edə... Bir kişi kim yanına gəldi, nuri-vilayət ilə onun yapdığı xətaları bilə və görə və tərbiyə eyləyə. Və hanki talibin könlü pak degildir, anı yanında qoymuya, rədd edə (qovlaya)”.

Şeyx Səfi oğlu Sədrəddinə xitabən buyurur ki, gərək *talib* (*seyrü-süluk* yolunun başlanğıcında olan *mürid*) üç gündə bir dəfə övliyanın hüzuruna getsin, onunla söhbət etsin, kəlamını dinləsin və çətinliyini söyləyib cavab alsın. Əgər mürid 40 gün övliyanın görüşünə gəlməyib ölsə, övliyadan ayrı düşmüş şəkildə ölər. Daha sonra Şeyx Səfi övliyanın 12 qövlü (sözü, göstərişi) olduğunu buyurur, bunların 6-sı talibə (müridə), 6-sı övliyanın özünə aiddir. Mürid həmin 6 tövsiyəni yerinə yetirməsə, etdiyi dualar batil olar, əgər bunlara əməl etsə, övliyanın dostu sayılar. Həmin 6 söz budur: namaz-niyaz, mücahidə (bir-biri ilə mehriban olmaq, tez-tez bir-birinin görüşünə getmək), camaata ehtiyaclı olmamaq, təqvalı və təharətli olmaq, hər şeyə baş qoşmamaq və qarşı çıxmamaq, daim dildə Allahı zikr etmək.

Şeyx Səfi övliyaya aid olan 6 tövsiyəni

isə izah etmir və deyir: “Amma ol on iki qövlün altısı kim övliyanındır, bəyanə gəlməz, dil ilə şərh olmaz. Ol məqami-haldır, qal degildir”.

Övliyalar adətən özlərini camaatdan gizli saxlayar, ifşa etməzlər. Onların *kəramətləri* və məqamları öləndən sonra aşkara çıxar. “Qara məcmuə”də deyilir: “Talibin dışarısı xəlqdir və içərisi övliyadır. Övliya pakdır, öylə olsa, talibin gərəkdir zahir və batini pak ola. Haçan bir talib övliya məqamın xəlqə göstərsə, həm təriq düşmanıdır və həm bizim düşmanımızdır”.

Övliyadan üz çevirmək, yəni öz şeyxindən, mürşidindən kənarlaşmaq təriqət ərkanında ən pis hərəkət hesab edilir: “Bir talib övliyadan üz döndərsə, pirdən dönmüş olur. Piri qəbul etməmiş, iblisi qəbul etmiş olur. Münkirdir, münafiqdir, üzü qaradır, dünyadan axirətə imansız gedər”.

***Mənbələr:*** *Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.156-158; Qara məcmuə, səh. 20-25; Şeyx Səfi təzkirəsi (“Səfvətüs-səfa”nın XVI əsr türk tərcüməsi), s.374-375; Əbdürrəhman Cami. Nəfəhat əl-üns, s.10.*



**VƏRƏ** – təsəvvüfdə *məqam* və *halların* təsnifatında ikinci məqam sayılır. Əbu Nəsr Sərrac Tusinin “əl-Lümə” əsərində peyğəmbərin bu hədisi verilir: “召Dininizin ölçüsü (meyarı) vərədir”. Məşhur sufi mənbələrindən olan “Risaleyi-Qüşeyriyyə”də Peyğəmbərin bu hədisi xatırlanır: “Bir şəxsin yaxşı müsəlman olmağının meyarı ona lazım olmayan hər şeydən əl üzməsidir”. Buna vərə deyirlər. Böyük arif Şibli bu barədə belə deyib: “Vərə odur ki, Allahdan savayı hər şeydən çəkinəsən, uzaq olasan”.

İbrahim Ədhəmin fikrincə, vərə içində şübhə olan və sənə xeyri olmayan hər şeydən əl çəkməkdir, bu isə (ehtiyacdan) artıq olandan əl üzmək deməkdir.

Şibli vərənin üç dərəcəsi olduğunu söyləyib: birincisi, dilin vərəsi sükut, mənasız danışıqdan qaçmaq və boşboğazlığı tərk etməkdir; ikincisi, əməl vərəsi şübhəli və haram işlərdən uzaqlaşmaqdır; vərənin üçüncü növü qəlbin vərəsidir ki, bu da pis vərdişləri və bəd əxlaqı tərk etməkdir.

Bəzi böyük sufilər haqqında deyiblər ki, vərə onları həmişə haramdan uzaq tutub, hətta bilməyərəkdən şübhəli və haram qida yemək istəyəndə əlləri yeməyə sarı uzanmayıb.

***Mənbələr:*** *Seyid Ziyaəddin Səccadi. İrfan və təsəvvüfün əsaslarına giriş, s.23; Sərrac Tusi. Əl-Lümə, s.70-71; İzzəddin Kaşani. Misbah əl-hidayə və miftah əl-kifayə, s.371-373.*



**VİRD** – məna baxımından *zikr* və *duaya* yaxın olan təsəvvüf məfhumu. Gündəlik müəyyən proqram əsasında təkrar edilən ayə və zikrlərə vird deyilir. Vird şeyx tərəfindən təyin edilir və şeyxin hüzurunda oxuyub mənasını anlatmaqla öyrədilir. Sufi virdi heç zaman tərk etməz, vird onun gündəlik həyatının ayrılmaz parçasıdır. Adətən hər təriqətin konkret virdləri olurdu, bir çox virdlər isə müştərək idi. Böyük irfan şairi Sənai



yazırdı ki, təriqətdə iki vird mütləq olmalıdır: birincisi "əl-həmd" (Fatihə surəsi), ikincisi istiğfar. Bəzi sufi müəlliflər ovrad adlı vird topluları tərtib etmişlər, bu ovradlar sufilərin daim müraciət etdikləri mənbə idi.
*bax:* **ZİKR.**

***Mənbələr:*** *Türkiye Diyanet Vakfi İslam Ansiklopedisi, XI, 533-534; Lüğətnameyi-Dehxuda, XV, 23158.*

**VÜCUD** – varlıq deməkdir. Təsəvvüf terminologiyasında *vəcd* halının üstün mərtəbəsinə deyirlər.
*bax:* **VƏCD.**

**YƏQİN** – təsəvvüfdə 10 *halın* sonuncusu və ən üstünü sayılır. Yəqin Haqq tərəfindən qəlbə ötürülən elmdir. Yəqinin lüğəti mənası şəksiz-şübhəsiz olan elmdir. Həqiqət əhlinin dilində isə iman gücü ilə yaranan əyani görüntüyə yəqin deyilir və onun dəlil-sübutla əlaqəsi yoxdur. Yəqin – istidlala (əsaslandırmağa) ehtiyac duymadan dərk etmək deməkdir.

Böyük sufi Zünnun Misri deyirdi ki, başdakı (zahiri) gözün gördüyünə elm deyirlər, qəlbin gördükləri isə yəqin adlanır.

Bəzi sufilərin düşüncəsinə görə, bəndə Allahın ona ayırdığı nemətdən razı qaldıqca yəqinliyi kamilləşər. Yəqinlik kamilləşdikcə bəla onun üçün nemət, rahatlıq isə müsibət kimi görünər.

Sufilərə görə, yəqinin üç mərtəbəsi vardır: elm əl-yəqin, eyn əl-yəqin və haqq əl-yəqin. Yəqinin ən ali və yüksək mərtəbəsi həqq əl-yəqindir.

***Mənbələr:*** *Seyid Ziyaəddin Səccadi. İrfan və təsəvvüfün əsaslarına giriş, s.47; Sərrac Tusi. Əl-Lümə, s.102-103; Risaleyi-Qüşeyriyyə (farsca tərcümə: Bədiüzzaman Firuzənfər), s.130.*



**YƏQİNİN MƏRTƏBƏLƏRİ** – sufilərə görə, *yəqinin* üç mərtəbəsi vardır: elm əl-yəqin, eyn əl-yəqin və həqq əl-yəqin. Elm əl-yəqin bu dünyaya aid olan hökm və əmrlərlə bağlı elmlərdir, alimlərə məxsus, səy və çalışma ilə qazanılar. Eyn əl-yəqin bu dünyanın mahiyyətidir, *ariflərə* xasdır, ünsiyyətlə əldə edilər. Həqq əl-yəqin isə behiştdəki *kəşf* və görüntüləri əhatə edir, Allah dostlarının *fəna* mənzilidir və *müşahidə* ilə əldə olunar.

Məşhur sufi Şibli yəqinin bu üç mərtəbəsi barədə söyləmişdir: "Elm əl-yəqin peyğəmbərlərin dilindən bizə yetişmişdir. Eyn əl-yəqin Allahın hidayət nurundan birbaşa qəlbə ötürülər. Həqq əl-yəqinə çatmağın isə yolu yoxdur".

"Risaleyi-Qüşeyriyyə"də deyilir: "Elm əl-yəqin ağıl sahiblərinə, eyn əl-yəqin elm sahiblərinə, həqq əl-yəqin isə *mərifət* sultanlarına məxsusdur".

Yəqinin mərtəbələrini əyani anlamaq üçün belə bir misal çəkirlər: Elm əl-yəqin odur ki, insan uzaqdan tüstünü görüb tonqal yandığını dərk edir. Əgər tüstü varsa, deməli, tüstünün göründüyü yerdə alov da var. Məsafənin uzaqlığı alovun görünməsinə mane olsa da, insan əlamətlərə əsasən onun mövcudluğuna yəqin hasil edir. Bu, yəqinin ən

aşağı və ilk mərhələsidir, elmlə, nəzəri şəkildə kəsb edilir. Eyn əl-yəqin odur ki, insan gözü ilə (ərəbcə göz “eyn” deməkdir) alovu görür və onun varlığına daha möhkəm yəqin əldə edir. Yəqinin bu növü elm əl-yəqindən daha güclü olsa da, hələ kamil sayıla bilməz. Ola bilər ki, əlamətlər kimi, görüntü də aldadıcı olsun. Nəhayət, insan əlini oda toxundurmaqla onu tam hiss edir, alov onun əlini yandırır. Artıq alovun həm əlamətləri, həm görünüşü, həm də varlığı onun üçün tam sübuta yetmişdir. Bu, ən yüksək həqq əl-yəqin mərtəbəsinə uyğundur.

***Mənbələr:*** *Seyid Ziyaəddin Səccadi. İrfan və təsəvvüfün əsaslarına giriş, s.47; Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.596-597 və 804-805; Risaleyi-Qüşeyriyyə (farsca tərcümə: Bədiüzzaman Firuzənfər), s.130.*



**ZAHİDİYYƏ** – XIII əsrdə böyük təsəvvüf xadimi Şeyx İbrahim *Zahid Gilani* (1218-1301) tərəfindən təsis edilmiş sufi təriqəti və ya təsəvvüf cərəyanı. Zahidiyyənin başqa təriqətlər kimi spesifik xüsusiyyətlərinin, fərqləndirici cəhətlərinin az olması, eləcə də Şeyx Zahidin vəfatından sonra müstəqil təriqət şəklində qalmaması, onun əsas müridlərinin bu təriqəti davam etdirmək əvəzinə yeni təriqət qurmaları zahidiyyəni təsəvvüf daxilində bir cərəyan (məşrəb) kimi qəbul etməyə əsas verir.

Zahidiyyə *sührəvərdiyyə* təriqətinin bazası əsasında formalaşmışdır. Belə ki, Şeyx Zahid Gilani sührəvərdiyyənin banisi Əbunnəcib Sührəvərdinin *xəlifəsi* (canişini), həm də böyük şair olan Sədi Şirazidən təriqət dərsi almışdı. Bəzi mənbələrdə onun *səma* ayinini qəbul etmədiyi göstərilir. Şeyx Zahid irşad fəaliyyətinə başladıqdan qısa müddət sonra xalq arasında böyük şöhrət qazandı, zamanının böyük sufiləri də onun təliminə rəğbətlə yanaşdılar. Hətta Elxani hökmdarı Qazan xanın onun görüşünə gəldiyi rəvayət edilir. Şirvanşah Axsitan ondan ötrü xüsusi təkkə tikdirmişdi. Şeyx Zahidin *əsas* fəaliyyət mərkəzi Ərdəbil idi, buradan onun *müridləri* dörd tərəfə yayılırdılar.

Zahidiyyənin *silsiləsi* Cəmaləddin Təbrizi, Qütbəddin Əbhəri, Əbunnəcib Sührəvərdi, Əhməd Qəzzali vasitəsilə Cüneyd Bağdadi, Səriyy Səqəti, Məruf Kərxi, Davud Tai kimi məşhur sufilərə, onlardan da Həsən Bəsri vasitəsilə *Həzrət Əliyə (ə)* və Mühəmməd Peyğəmbərə (s) qovuşur.

Zahidiyyə təriqəti *səfəviyyə*, *xəlvətiyyə* və *bayramiyyə* təriqətləri, eləcə də onların qol və şöbələri üçün mənbə rolunu oynamışdır. Belə ki, səfəviyyə təriqətinin banisi *Şeyx Səfiəddin Ərdəbili* 20 il Şeyx Zahidin müridi olmuş, onun kürəkəni və xəlifəsi olmaq şərəfini qazanmışdı. Xəlvətiyyə təriqətinin banisi Əbu Abdullah Siracəddin Ömər Xəlvətinin əmisi və mürşidi şirvanlı Şeyx Kərimməddin Əxi Məhəmməd də Şeyx Zahid Gilaninin müridididir. Bayramiyyə təriqətinin banisi Hacı Bayram Vəlinin mürşidi Somuncu Baba isə Şeyx Səfiəddin Ərdəbilinin müridi hesab edilir.



Şeyx Zahid Gilani *seyrü-sülukda* 12 *zikr* vasitəsilə *fəna* və *bəqa* mərtəbəsinə çatmağın metodunu təklif etmiş ilk sufidir. O, Allahın 1001 adı arasından yeddisini (La ilahə illəllah, Allah, Hu, Həqq, Həyy, Qəyyum və Qəhhar), daha sonra beşini (Səməd, Əhəd, Vahid, Fəttah və Vəhhab) seçmiş, bunları "əsmayi-səbə" (yeddi ad) və "əsmayi-xəmsə" (beş ad) adlandırmışdı. Şeyx Zahid bu adları ardıcıllıqla və diqqətlə zikr etmək sayəsində fəna və bəqa dərəcələrinə çatmağın mümkünlüyünü iddia edirdi.

Zahidiyyə barədə tarixi mənbələrdə geniş məlumat tapmaq çətindir, mövcud məlumatların əksəriyyəti səfəviyyə təriqətinə aid mənbələrdə öz əksini tapmışdır (*"Qara məcmuə"*, *"Səfvət əs-səfa"*, onun Azərbaycan türkcəsinə tərcüməsi olan *"Şeyx Səfi təzkirəsi"* və s.).

***Mənbələr:*** *Türkiye Diyanet Vakfı İslam Ansiklopedisi, XXI, 359-360; Natig Rahimov. Azerbaijan's Contribution to Islamic Culture. An Undicsovered Treasure ("Contributions of The Eurasian Nations to Islamic Culture"), p.181; Lüğətnameyi-Dehxuda, VIII, 12581-12586.*



**ZİKR** – təsəvvüfdə çox mühüm yeri olan məfhumdur. Ərəb dilindən hərfi tərcüməsi xatırlamaq deməkdir. Ümumi anlamda hər zaman Allahın varlığını, bəndəyə nəzarət etdiyini xatırlamaq, bunu bir an belə unutmamaq zikr sayılır.

Qurani-Kərimdə Allahı tez-tez və hər an zikr etmək insanlara əmr olunur: "Ey iman gətirənlər! Allahı çox zikr edin!" (Əhzab, 41). "Siz Məni zikr edin ki, Mən də sizi zikr edim" (Bəqərə, 152). Hər an və hər vəziyyətdə zikr edən şəxslər Qurani-Kərimdə ehtiramla xatırlanır: "O kəslər ki ayaq üstə olanda da, oturanda da, uzananda da Allahı xatırlar, göylərin və yerin yaradılması haqqında düşünər (və deyərlər): "Ey Rəbbimiz! Sən bunları boş yerə yaratmamısan. Sən pak və müqəddəssən. Bizi cəhənnəm odunun əzabından qoru!" (Ali-İmran, 191).

Zikr insanın mənəvi rahatlığı üçün böyük önəm daşıyır. Zikr edən şəxs özünü Allahın himayəsində hiss edir, çətinliklər və bəlalar onun gözündə rahat görünür: "Bilin ki, qəlblər yalnız Allahı zikr etməklə aram tapar" (Rəd, 28).

Təsəvvüfdə hər təriqətin öz zikr proqramları vardır. Şəraitdən, məqsəddən, zikr edənin səviyyəsindən asılı olaraq sufi fərqli zikrlər deyir. Sufi adabına görə, *mürid* gərək zikri *mürşiddən* öyrənsin, buna zikr təlqini deyirlər. Mürşidin tövsiyəsi olmadan edilən zikrin faydası olmaz. "Allah", "hu", "la ilahə illəllah", əsmaül-hüsnaya aid olan ayrı-ayrı müqəddəs adlar və onların müxtəlif kombinasiyaları məşhur zikrlərdir. Zikr oturaq halda və ya ayaq üstə yerinə yetirilir; ayaqüstü zikrlər ya sabit vəziyyətdə, ya da dairəvi xətt üzrə hərlənərək icra edilir.

Zikr *səfəviyyə* təriqətində də çox mühüm sayılır. *Şeyx Səfiəddin Ərdəbili* tövsiyə edirdi ki, salik gərək "daima zikrullahi dilində vird eyləyə, ol zikrin nuru qəlbinə düşə. Leylən və nəharən,

sirrən və cəhrən tövhid eyləyə. Gecə və gündüz, gizli və aşikara tövhid kəlməsin söyləyə və həm nəfsi-əmmarənin kökünü qaza və kəndusunu təqvaya irgürə".

Səfəvilər dövründə yaşamış məşhur alim *Məhəmməd Təqi Məclisi (Əllamə Məclisinin* atası) şəxsi təcrübələrinə əsaslanaraq yazırdı: "Ariflər "ya Həyy, ya Qəyyum, ya mən la ilahə illa əntə" zikrini ardıcıl söyləməyi təcrübədən keçirmişlər, mən də bu zikri təcrübə etmişəm. Amma mənim zikrim daha çox "ya Allah" olub. Bu zaman Allah-Taalanı daim diqqət mərkəzində saxlamaqla Ondan başqa hər şeyi qəlbimdən çıxarmağa çalışmışam. Vacib olan *müraqəbə* (Allahın nəzarəti altında olduğunu hiss etmək) halında bu zikri söyləməkdir, qalan üsullar zikr qədər faydalı deyil. Qırx gün boyunca bu deyilənlərə ardıcıl əməl etmək sayəsində Allah-Taala adamın qəlbinə Öz hikmət, mərifət və məhəbbət nurlarının qapılarını açar, o, Allahda fəna olmaq və Allahla baqi olmaq məqamına yüksələr; çoxlu rəvayətlər (hədislər) də bunu təsdiq edir".

***Mənbələr:*** *Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.402; Natiq Rəhimov. Bu məqama necə çatdılar, s.269-270; Qara məcmuə, s.22; Şeyx Səfi təzkirəsi ("Səfvətüs-səfa"nın XVI əsr türk tərcüməsi), s.383-384; Türkiye Diyanet Vakfı İslam Ansiklopedisi, XLIV, 409-413.*

**ZİKRİ-CƏLİYY** (aşkar zikr) – təsəvvüfdə iki cür *zikr* etmək qaydası vardır: cəliyy (aşkar) və xəfiyy (gizli) zikr. Cəliyy zikr ucadan, aydın formada deyilən zikrdir, xəfiyy zikri isə ürəkdə, səssiz deyirlər. Sufilərə görə, Məhəmməd Peyğəmbər (s) *Həzrət Əliyə (ə)* cəliyy zikri, Əbu Bəkrə xəfiyy zikri öyrətmiş və tövsiyə etmişdi. Buna görə də silsiləsi Əbu Bəkr vasitəsilə Peyğəmbərə gedib çıxan nəqşbəndiyyə təriqətində zikrlərin əksəriyyəti səssiz edilir. Amma silsiləsi Həzrət Əliyə (ə) birləşən təriqətlərdə (qadiriyyə, rifaiyyə, şaziliyyə, movləviyyə, *bayramiyyə*, *sührəvərdiyyə*, *xəlvətiyyə*, o cümlədən *səfəviyyədə*) cəliyy zikrə üstünlük verilir.

Şeyx Səfiəddin Ərdəbilidən gizli, yoxsa aşkar zikrin daha üstün olduğunu soruşanda o, zikr söyləməyi şeytanla döyüşməyə bənzətmiş, döyüşdə zərbənin möhkəm vurulması lazım gəldiyi kimi, zikrin də ucadan və qətiyyətlə deyilməsini məsləhət bilmişdi: "Qatı zikr eyləmək yekraqdır (daha yaxşıdır), o qədər kim, zakir (zikr edən) aşkarən zikrə yetə kim, ol ixtiyarsızlıq zikrdür. Ondan sonra könül gizli zikrə məşğul ola və əvvəlki aşkar zikr ilən gizli zikri cəm etmiş ola".

Şeyx Səfinin və digər təsəvvüf xadimlərinin tövsiyələrindən belə məlum olur ki, təriqətə yeni qədəm basanların zikr ayininə zikri-cəliyy ilə başlaması məsləhətdir, çünki onlar qəlbin zikrinə hələ hazır deyillər. Lakin *seyrü-süluk* yolunda tərəqqi və təkamül etdikcə sufi *zikri-xəfiyyə* də müraciət edər. Şeyx Səfi deyirdi ki, əgər həkim xəstəyə zəif dərman versə, ona təsiri olmaya bilər. Amma xəstə güclü dərman içsə, əvvəlcə mərəz onun canından çıxar. Bundan



sonra zəif dərmanlar içməklə də sağalar.

***Mənbələr:*** *Şeyx Səfi təzkirəsi ("Səfvətüs-səfa"nın XVI əsr türk tərcüməsi), s.383; Türkiye Diyanet Vakfı İslam Ansiklopedisi, XLIV, 411; Nur Əli Tabəndə (Məczubəli şah). Zikr və fikr, s.17.*

**ZİKRİ-XƏFİYY** (gizli zikr) – təsəvvüf ənənəsində iki növ zikrdən biri. Ucadan və aşkar şəkildə edilən zikrdən *(zikri-cəliyy)* fərqli olaraq, zikri-xəfiyy ürəkdə edilir. Silsiləsi *İmam Əli (ə)* vasitəsilə Peyğəmbərə bağlanan təriqətlərdə, bir qayda olaraq, aşkar zikr praktikası daha çox tətbiq edilir. Amma silsiləsi Əbu Bəkr yolu ilə Peyğəmbərə birləşən təriqətlərdə isə (məsələn, nəqşbəndiyyə) zikri-xəfiyyə üstünlük verilir. *Səfəviyyə* təriqətinin banisi *Şeyx Səfiəddin Ərdəbilinin* tövsiyələrindən məlum olur ki, salik ilk dövrlərdə aşkar zikrlə (zikri-cəliyy) başlamalıdır, daha sonra mənəvi cəhətdən təkamül etdikcə zikri-xəfiyyə də üz tuta bilər.
*bax:* **ZİKRİ-CƏLİYY.**

***Mənbələr:*** *Şeyx Səfi təzkirəsi ("Səfvətüs-səfa"nın XVI əsr türk tərcüməsi), s.383; Türkiye Diyanet Vakfı İslam Ansiklopedisi, XLIV, 411; Nur Əli Tabəndə (Məczubəli şah). Zikr və fikr, s.17.*

**ZÖHD** – təsəvvüf kitablarındakı təsnifata görə, *seyrü-süluk* yolundakı üçüncü *məqamdır*. Zöhd məqamına fərqli təriflər verilmişdir. Bəzilərinin fikrincə, zöhd yalnız dünya nemətlərindən imtina etməkdir. Bəziləri isə zöhdü həm dünya, həm də axirətdən üz döndərmək və onlara laqeyd olmaq kimi tanıtmışlar. Sufilərin bir qismi haram şeylərdən çəkinməyi zöhd saymış, halal nemətlərdən uzaqlaşmağı isə bəyənməmişlər. Əksinə, bir dəstə isə haramdan zöhd etməyi vacib, halaldan zöhd etməyi isə fəzilət (üstünlük) bilmişdir.
"Misbah əl-hidayə" kitabında zöhd məqamı barədə belə yazılıb: "Zöhdün mənası dünya malından rəğbəti və istəyi kəsmək, dünya ləzzətlərindən qəlbi uzaqlaşdırmaqdır. Zöhd məqamı *tövbə* və *vərədən* sonra üçüncüdür".
Haqq yolçusu əvvəlcə öz nəfsini *tövbə* sıxıntısı vasitəsilə qadağan olunmuş şeyləri istəməkdən çəkindirir, həzz və şəhvəti ondan uzaqlaşdırır. Sonra vərə və təqva silgisi ilə qəlb aynasını təmizləyir ki, həqiqətlər necə varsa onda əks olunsun. Dünyanın surətinin çirkin və fani olduğunu görüb ondan uzaqlaşır, axirət surətini isə gözəl və əbədi şəkildə gördüyü üçün ona rəğbət göstərir, bununla da zöhd həyata keçmiş olur.

***Mənbələr:*** *Seyid Ziyaəddin Səccadi. İrfan və təsəvvüfün əsaslarına giriş, s.23-24; Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.448; İzzəddin Kaşani. Misbah əl-hidayə və miftah əl-kifayə, s.373-375; Sərrac Tusi. Əl-Lümə, s.72-74.*

**ZÜLF** – sufi istilahlarından biri. Mənası "saç" deməkdir. İrfan terminologiyasında zülf fərqli mənalara malikdir. Allahın calal sifətlərinin *təcəllasını*, məsələn, Allahın qəhr etməsini, bəla göndər-

məsini, Öz rəhmətini kəsməsini bununla ifadə edirlər. Həmçinin zülf Allah-Taalanın camalını seyr etməyə mane olan vasitələrə, aşiqi Allahdan ayıran maneələrə işarədir. Zülf vəhdətin əksinə, kəsrət (çoxluq) aləminin rəmzidir, buna görə də şairlər zülfün uzunluğuna işarə etmişlər. Zülf sifəti örtdüyü kimi, kəsrət (çoxluq) aləmi də vəhdətin üzünə pərdə çəkir. Saçın rəngi qaradır, qara rəng şərin, küfrün rəmzidir. Ona görə klassik ədəbiyyatda zülf məfhumu adətən küfrlə yanaşı götürülür.

Küfri-zülfün salalı rəxnələr imanımıza,
Kafər ağlar bizim əhvali-pərişanımıza.
*(M.Füzuli)*

Zülməti-zülfində könlü bu Xətai xəstənin
Xızra bənzər kim, görünməz çeşmeyi-heyvan ona.
*(Ş.İ.Xətai)*

Zülfün ucu dairə şəklində burular, bu da varlıq aləminin dövrünə (fələyin çərxinə) işarədir.
Bütün ariflərin qəlbi Məşuqun (Allahın) zülfündən asılıdır, çünki Onun hüsnünü görmək qeyri-mümkün olacaq qədər çətindir. Aşiqin qəlbi kəsrət zəncirindən asanlıqla qopa bilmir. Məşuqun zülfünü Öz üzündən kənara çəkməsi *salikə* ilahi *mərifətin* ötürülməsi mənasını verir.
Təsəvvüf ədəbiyyatında zülf mənasında bəzən *"geysu"* (saçın iki tərəfində qıvrılan tellər) ifadəsi də işlədilir.
*bax:* **GEYSU.**

***Mənbələr:*** *Seyid Cəfər Səccadi. İrfani söz, termin və ibarələr lüğəti, s.442-443; Seyid Ziyaəddin Səccadi. İrfan və təsəvvüfün əsaslarına giriş, s.274; Əbdülbaqi Hiyləmən. İrfan və təsəvvüf terminləri və nüanslar, s.121-122; Y.E.Bertels. Təsəvvüf və təsəvvüf ədəbiyyatı (farsca tərcümə: Sirus İyzədi), s.150-163; Şah İsmayıl Xətai. Əsərləri (2 cilddə), I, 67; Rzaqulu xan Hidayət. Riyaz əl-arifin, s.39.*





**QIZILBAŞ TAYFA və OYMAQLARI** – Səfəvilər dövlətinin qurulmasında və inkişafında *qızılbaş* türk tayfaları aparıcı rol oynamış, bunlara mənsub olan əmirlər dövlətdə yüksək vəzifələr tutmuşlar. Bu tayfaların bir qismi üzvlərinin sayına görə fərqlənmiş, dövlətin güc mərkəzinə çevrilmişlər (*Ustaclu, Şamlu, Rumlu, Zülqədər, Təkəlü, Qacar, Əfşar, Mosullu* və *Pörnak* türkmanları və s.). Bunlardan əlavə daha bir neçə nisbətən kiçik tayfa da dövlət xidmətində özünəməxsus yerə malik olmuşdur (*Bayat, Varsaq, Çəpni, Xınıslu, Turğutlu, Qaramanlu, Talış* və s.). Klassik mənbələrdə bunlarla bağlı məlumatlara, birinci təbəqədən olan tayfalar qədər olmasa da, rast gəlinir. Bəzi tayfaların Səfəvilər dövlətindəki mövqeyi və dövlət idarəçiliyindəki yeri barədə məlumatlar isə həddən azdır. Bu da həmin tayfaların o birilərə nisbətən daha zəif və azsaylı olmaları ilə, yaxud hər hansı hadisə nəticəsində hakimiyyətdə öz etibar və nüfuzlarını itirmələri ilə bağlıdır. Bu tayfaları türk və qeyri-türk mənşəli olmaqla iki əsas qrupa ayırmaq mümkündür. Türk mənşəli kiçik qızılbaş tayfalarına Yaka Türkman (və ya Sayınxanlu) tayfa birliyinə daxil olan *Cəlayir, Gəraylu, Qarabayat* tayfaları, Oğuzun 24 boyundan biri olan Yazırın Qaradaşlılar qolu aid idi. Onlar əsasən Xorasan və Astarabad bölgələrində məskunlaşmışdılar. *İsgəndər bəy Münşi* bu tayfaları Elxani (moğol) mənşəli Sulduzlarla birlikdə cığatay köklü hesab edir. Həmçinin İsgəndər bəy *Otuzikilər* tayfa birliyini qızılbaşlara aid etməsə də, bu inkarın siyasi səbəbdən qaynaqlandığı ehtimal olunur (Otuzikilər tayfası Osmanlı üsuli-idarəsi altında yaşamağa razı olmuş və öz məskənini tərk etməmişdi).

Kiçik türk tayfalarına mənsub olan əmirlərdən Şahvəli sultan Cəlayir, Uğurlu sultan Cəlayir, Bayraməli sultan Qarabayat, Təhmasibqulu sultan Qarabayat, Əliyar xan Gəraylu, Rəhmanqulu sultan Qaradaş və başqalarının adları *"Tarixi-aləmarayi-Abbasi"* kitabında I Şah Abbasın vəfatı ərəfəsində hakimiyyətdə olan əmirlərin siyahısında qeyd edilmişdir. Ümumiyyətlə, İsgəndər bəy Münşi bu siyahıda qullar (*qulamlar*) təbəqəsinə aid 21 nəfərdən əlavə 73 nəfər türk və qeyri-türk qızılbaş əmirinin adlarını vermişdir (Əslində 72 nəfərin adını yazacağını qeyd edir). Bu 73 nəfəri o, aşağıdakı şəkildə təsnif etmişdir:

*Şamlu* (7 nəfər), *Zülqədər* (6 nəfər), *Ustaclu*, *Bayat*, *Əfşar* və *Talış* (hər birindən 3 nəfər), *Qacar* və *Türkman* (hər birindən 2 nəfər), *Rumlu*, *İspirlü*, *Qaradağlu*, Alpaut, *Cagirlu*, *Qazaqlu* və *Bayburdlu* (hər birindən 1 nəfər), cığatay (Yaka Türkman, Sayınxani və cığatay, 12 nəfər), *kürd və lur tayfaları* (17 nəfər) və qızılbaş oymaqlarından olmayan əmirlər (8 nəfər). Araşdırmalar bu 73 nəfərdən kürd, lur, əfqan və lək əmirlərini çıxmaqla 50 nəfərdən çoxunun türk mənşəli olduğunu sübuta yetirir (Bunlardan əlavə bəzi kürd tayfalarının da tamamilə türkləşmiş olduğu məlumdur).

Qızılbaş tayfalarının böyük qismi Səfəvilər dövlətinin quruluş mərhələsində, I

Şah İsmayılın hakimiyyətə gəlişindən əvvəl və sonra Anadolu diyarından köçüb gəlmiş və Səfəvilər dövlətinin ərazisində məskunlaşmışdı. Sonralar, hətta I Şah Abbasın dövrünədək türk tayfalarının Osmanlı-Səfəvi sərhədini keçərək Səfəvi torpaqlarına köç etməsi prosesi davam etmişdir. Bu tayfalar ilk dövrlərdə konkret ərazilərdə kompakt şəkildə məskunlaşırdı. Tayfa ya bütöv şəkildə bir ərazini özünə məskən seçir, ya da tayfa qollarının bir hissəsi bir ərazidə, digər hissəsi isə başqa ərazilərdə yurd salırdı.

*Rumlu* tayfası əsasən Azərbaycan vilayətində (indiki Cənubi Azərbaycan) və Aranda, *Çəmişgəzəklü* tayfası Astarabadda, *Cagirlü* tayfası Şirvanda, *Əfşarlar* Xuzistan və Kuhgiluyədə, *İspirlü* tayfası Çuxursəddə, *Qacarlar* və *Qazaqlar* Qarabağda, *Qaracadağlular* indiki Cənubi Azərbaycanın Qaradağ bölgəsində, *Qaramanlular* Gəncə və Bərdə ətrafında, *Sədlü* tayfası sonralar onun adı ilə adlandırılmış Çuxursəd bölgəsində məskunlaşmışdı. Digər tayfalar isə Səfəvilər dövlətinin ərazisinə köç etdikdən sonra parçalanaraq bir neçə bölgədə yurd salmışdı.

I Şah Abbasın həyata keçirdiyi köç siyasəti nəticəsində qızılbaş tayfalarının böyük bir qismi öz yaşayış məskənlərini dəyişərək fərqli məntəqələrə köçürülmüşdü. Şah bununla qızılbaş tayfalarının mərkəzi hakimiyyətə itaətsizlik ehtimalını aradan qaldırmaq, onların nüfuz dairəsini dağıtmaq məqsədini güdürdü. Bəzi tayfaların məskəni osmanlılar tərəfindən tutulduqdan sonra onlar işğal altında yaşamağa razı olmuş, hətta osmanlılarla əməkdaşlığa başlamışdılar. Ərazilər geri alındıqdan sonra I Şah Abbas həmin tayfaların sərhəd bölgəsində qalmasını dövlət təhlükəsizliyi üçün hədə sayaraq onları hissələrə bölməklə ölkənin içərilərinə köçürdü. *Bayat* tayfası əsasən Həmədan ətrafında köç salmışdı. I Şah Abbas onların bir hissəsini Xorasanın Nişapur bölgəsində məskunlaşdırdı. Həmədanda qalanlara *Ağbayatlar* və ya *Özbayatlar*, Nişapura köçürülənlərə isə *Qarabayatlar* deyilirdi. Qarabağın osmanlılardan azad edilməsindən sonra *Qazaqlar* tayfası "dönük" adlandırılaraq Fars bölgəsinə sürgün olundu.

Anadolu qızılbaş tayfalarının Səfəvi dövlətinin quruluşundakı rolu barədə tədqiqatçılar arasında fikir ayrılığı vardır. Bəzi tədqiqatçılar bu rolu şişirdərək qızılbaş tayfalarının hamısının Anadoludan köçüb gəldiyini iddia etmiş, bununla da yerli tayfa və oymaqların rolunu kiçiltmişlər. Görkəmli Türkiyə alimi Faruk Sümer "Safevi Devletinin Kuruluşu ve Gelişmesinde Anadolu Türklerinin Rolü" adlı əsərində Səfəvilər dövlətini "milli İran dövləti" kimi təqdim etməyə çalışan qüvvələrin iddialarını alt-üst edərək bu dövlətin həqiqi türk simasını göstərməyə nail olmuşdur. Bununla belə, o, Səfəvilər dövlətinin quruluş və inkişafında Anadoludan köçüb gəlmiş tayfaların rolunu həddən artıq qabartmaqla yerli tayfaların gücünü gözardına almışdır. F.Sümer adıçəkilən



əsərdə yazır: “Səfəvi dövlətini quran və onu ayaq üstə saxlayan ünsürə gəlincə, bu ünsürü Anadolu türklərinin meydana gətirdiyi yuxarıda söylənmişdi. Bu ünsür Anadolu ulusundan olmadığı kimi, onun Qaraqoyunlularla da heç bir münasibəti yoxdur. Bu ünsür, aşağıda təfsilatlı şəkildə izah edildiyi kimi, Anadolunun mərkəzi və cənub bölgələrinə mənsub yeni bir türk icmasıdır” (s.3). “Səfəvi dövlətini quran və davam etdirən Anadolulu türklər bunlardır. İzah ediləcəyi kimi, bu türklərin böyük əksəriyyəti və ya hamısı Mərkəzi və Cənubi Anadolu bölgələrindən idi” (s.19).

Səfəvilər dövlətinin quruluşunda və inkişafında iştirak etmiş tayfaların mühüm hissəsinin Anadolu torpaqlarından köçüb gəlməsi şübhəsizdir. Bundan çox əvvəl Xorasandan şərqə doğru köç etmiş və nəhayət, Anadolu diyarında məskən salmış türkman tayfaları arasında *ələvi-bektaşi* ənənəsi geniş yayılmışdı. Əvvəllər *Xorasan ərənləri*, daha sonralar *Rum abdalları* adlandırılan bu tayfalar Anadolu şiə icmasının özəyini və zərbə gücünü təşkil edirdi. Bununla belə, qeyd edilməlidir ki, Səfəvilər dövlətinin quruluşunda bundan xeyli əvvəl bu torpaqlarda məskunlaşmış tayfaların da özünəməxsus rolu olmuşdur. Məlumdur ki, Əfşar, Cagirlü, Qacar, Baharlu, Talış və s. tayfalar Səfəvilərin hakimiyyətə gəlişindən əvvəl bu torpaqlarda yaşayırdı.

XVII əsrin əvvəllərində diplomatik korpusun tərkibində Avropaya səfər etmiş və burada qalmış Oruc bəy Bayat xatirələrində Səfəvilər dövlətinin özəyini təşkil edən 32 qızılbaş tayfasının adlarını vermişdir. O yazırdı ki, əksər tayfa adları ayrı-ayrı şəxs adlarının sonuna “lu” şəkilçisini əlavə etməklə yaranmışdır. Bu, onu göstərir ki, həmin şəxs tayfanın başçısı və banisidir. Oruc bəy Bayatın siyahısında 32 ada rast gəlirik ki, bunların bir qismi tayfaların, bir qismi isə tayfa qollarının (oymaqların) adıdır: Ustaclu, Şamlu, Əfşar, Türkman, Bayat, Təkəlü, Xarmandalu, Zülqədərlü, Qacar, Qaramanlu, Bayburtlu, İspirlü, Oryat, Çavuşlu, Asayişlü, Çəmişgəzəklü, Saruzolaqlu, Qarabacaqlu, Baharlu, Qoyunerilü, Qırxlu, Bozcalu, Hacıfəqihlü, Həmzəlü, Solaqlu, Mahmudlu, Qaraçomaqlu, Qaraqoyunlu, Gözüböyüklü, Peyklü, İnazlu (İnallu) və Kuhgiluyəlü. Tədqiqatçılar bu tayfaların bir qisminin mənşəyini tam dəqiqləşdirməyə nail olmamışlar, bəzi araşdırmalar siyahıdakı müəyyən adların Avropa dillərinə tərcümə zamanı təhrif olunduğunu düşünməyə əsas verir.

Səfəvilər dövlətinin idarəçiliyində qızılbaş tayfalarının hər birinin özünəməxsus rolu vardı. Hər tayfa öz mənsublarının sayı, hərbi gücü, məskunlaşdığı bölgənin strateji əhəmiyyəti, dövlətə və şaha sədaqəti, yetirməsi olan əmirlərin dövlət aparatındakı mövqeyi və s. amillərdən asılı olaraq idarəçilikdə müəyyən yer tuturdu. Oruc bəy Bayat qızılbaş tayfaları haqqında məlumat verərkən onların dövlət idarəçiliyindəki yerlərini konkret ifadələrlə təsvir etməyə çalışmışdır. O, Avropa oxucusunun anlama-

sı üçün hər tayfanın mənsublarının saraydakı mövqeyini Avropa saraylarına uyğun olan terminlərlə ifadə etmişdir. Məsələn, o, şaha çox yaxın olan xidmətçilərin əsasən Ustaclu tayfasından çıxdığını, Şamlu tayfası mənsublarının saraydakı mənsəbinin Avropadakı majordom vəzifəsinə (*eşikağası*) uyğun gəldiyini, Əfşarların ədliyyə sistemində, Təkəlülərin hərb sahəsində tanındığını yazır. Oruc bəyin siyahısında bəzi tayfa mənsublarının iyerarxik pillədə Avropadakı qraf rütbəsinə, bəzilərinin isə hersoq və markiz tituluna uyğun gəldiyi qeyd edilir.

Səfəvilər dövlətində yazılmamış qaydalara əsasən, bəzi tayfa mənsubları ənənəvi olaraq konkret vəzifələrə təyinat alır, yəni müəyyən vəzifələr bəzi tayfaların inhisarında sayılırdı. Məsələn, *Qaradağ sufilərindən* olan *Evoğlular* nəslinin nümayəndələri əsasən saray mətbəxində xidmət edirdilər. *Möhürdarlar* arasında Zülqədər tayfasının yetirmələrinə daha çox rast gəlinirdi. Xuzistan, Kuhgiluyə və Kirman vilayətlərinin hakimləri əsasən Əfşar tayfasından, Gəncə və Qarabağ bəylərbəyiləri Qacarlardan (*Ziyadoğulları* nəsli), Xorasan valiləri Şamlulardan, *xəlifət əl-xüləfalar Qaracadağ sufilərindən* seçilirdi.

Qızılbaş tayfalarının Səfəvilər dövlətindəki nüfuzu və dövlət idarəçiliyindəki rolu enişli-yoxuşlu olmuşdur. Ustaclu, Təkəlü, Şamlu kimi iri tayfalar bəzi dövrlərdə şahın dərin etibarını qazanmış, bəzi dövrlərdə isə qəzəbə düçar olaraq bütün üstünlüklərdən məhrum edilmişlər. I Şah Təhmasib Ustaclu tayfasına, I Şah Abbas Şamlu tayfasına daha çox güvənir, onların nümayəndələrini yüksək vəzifələrə gətirirdi.

***Qeyd:*** Kitabda qızılbaş tayfalarının adlarının yazılışı zamanı klassik üsluba riayət olunmuşdur. Məsələn, müxtəlif ədəbiyyatlarda “Ustaclu” və “Ustaclu”, “Təkəli” və “Təkəlü” yazılış formalarının hər ikisinə rast gəlinir. Bu kitabda klassik mətnlərdə daha çox istifadə edilən “lu, lü” şəkilçi formaları əsas götürülmüşdür.

Bu bölümün yazılışı zamanı əsas etibarilə aşağıdakı mənbələrdən istifadə edilmişdir:

*Faruk Sümer. Safevi Devletinin Kuruluşu ve Gelişmesinde Anadolu Türklerinin Rolü;*

*Zabil Bayramlı. Azərbaycan Səfəvi dövlətinin quruluşu və idarə olunmasında türk qızılbaş əyanlarının rolu;*

*Tarix-i aləmara-yi Abbasi (tərcümə və şərhlər: O.Əfəndiyev, N.Musalı);*

*Dünyanı bəzəyən Abbasın tarixi (fars dilindən çevirən: Ş.Fərzəliyev);*

*Həsən bəy Rumlu. Əhsənüt-təvarix (fars dilindən tərcümə və şərhlər: O.Əfəndiyev və N.Musalı);*

*Tufan Gündüz. Anadolu’da Türkmen Aşiretleri (“Bozuluş Türkmenleri 1540-1640”);*

*Ali Sinan Bilgili. Azerbaycan Türkmenleri Tarihi (“Türkler Ansiklopedisi”), VII, 21-43;*

*Oqtay Əfəndiyev. Azərbaycan Səfəvilər dövləti;*

*Z.Bayramlı və B.Şabıyev. Azərbaycan Səfəvi dövləti. XVI-XVII əsrlər;*

*Elnur Neciyev. Anadolu’dan Safevi Devleti’ne Göçler: Sebepleri ve Sonuçları;*



*Bilal Dedeyev. Sosyo-Kültürel İlişkiler Bağlaminda 15.Yüzyil - 16.Yüzyilin İlk Çeyreğinde Anadolu'dan Azerbaycan'a Türkmen Göçleri (Türk Küktürü ve Hacı Bektaş Veli Araştırma Dergisi/2016/77), s.103-125;*
*Ə.Çingizoğlu və A.Avşar. Avşarlar;*
*İ.Kazımov. Bəydililər ("Kredo" qəzeti, 06.06.2019);*
*Əli Əbülqasimi. Səfəvilər dövründə Bozcalu elinin rolu ("Tarixnameyi-Xarəzmi", 1396 h.-ş., № 20), s.1-12;*
*Uluslar Arasi Dulkadir Beyliği Sempozyumu (29 Nisan-1 Mayis 2011, Kahramanmaras, Cilt 1-3);*
*M.M.Rövşənfikr və R.M.Rudbali. Səfəvilər dövründə Kyhgiluyənin siyasi-hərbi rolunun təhlili ("İranın regional tarixi" dərgisi, 1399 h.-ş, № 2/16), s.77-92;*
*Книга Оруджж-бека Байата, Дон-Жуана Персидского (перевод с англ., введение и комментарии: О.Эфендиева и А.Фарзалиева), книга первая, глава третья, "Способ правления в Персии";*
*Don Juani-İrani (farsca tərcümə edən: Məsud Rəcəbniya), s.67-68;*
*Don Juan of Persia. A Shi'ah Catholic 1560-1604 (Translated and Edited with an Introduction by G.Le Strange), p.45-46;*
*M.Ə.Rəncbər və İ.Ş.Bərcuyi. Şah Təhmasib Səfəvinin osmanlılarla nüharibələrində kürd tayfalarının rolu və yeri ("Döyüş tarix mütaliələri" dərgisi, 1398 h.-ş., № 1/7), s.67-90;*
*S.Ə.Üqeyli. Səfəvilər dövlətinin təşkilindən əvvəl və sonra qızılbaşların rolunun tarixi təhlili ("İran və İslam tarix araşdırmaları dərgisi", 1395 h.-ş., № 18), s.135-162;*
*Hans R.Roemer. Qızılbaşlar – Səfəvi hökumətinin baniləri və qurbanları (farsca tərcümə: M.Cəlilvənd, "Ayəndə", il: 13), s.11-27;*
*Ə.R.Cabiri. Səfəvi dövlətinin quruluşu və güclənməsində rumluların rolu ("Parsə" dərgisi, 1394 h.-ş., № 24), s.75-96;*
*H.Mircəfəri. Rumlu tayfası və Səfəvi sülaləsi (Ədəbiyyat və Humanitar Elmlər İnstitutunun nəşri), s.191-207;*
*Richard Tapper. Shahsevan in Safavid Persia (Bulletin of the School of Oriental and African Studies, University of London, Vol. 37, No. 2, 1974), s.321-354;*
*Richard Tapper. Şahsevən (Qaraqoyunlular-Ağqoyunlular, farsca tərcümə: M.Dehram, "Tarix araşdırmaları", İl: 3, sayı: 5), s.317-332;*
*C.Səvaqib və F.Bazgir. Səfəvi dövlətinin quruluş və davamında Şamluların rolu (İsfahan Universiteti Ədəbiyyat və Humanitar Elmlər İnstitutunun tarix elmləri dərgisi, 1394 h.-ş., ; № 1/25), s.19-48;*
*Ə.Tehrani Şəfəq. Saray əmirləri: Silsüpür sülaləsinin tarixi (Səfəvilərdən Qacar dövrünə kimi);*
*H.Əhmədi. Talışlar (Səfəvilər dövründən II İran-Rusiya müharibəsinin sonuna kimi);*
*Qulamhüseyn Bigdili. Bigdili tarixi (3 cilddə);*
*A.Sərəfrazi. I Şah Abbasın hakimiyyətinin sonlarına kimi Səfəvilər dövlətinin güclənməsində və zəifləməsində Təkəlü tayfasının rolu (İsfahan Universiteti Ədəbiyyat və Humanitar Elmlər İnstitutunun elmi araşdırmalar dərgisi, 1384 h.-ş.; № 40), s.109-138;*
*H.Mircəfəri. Təkəlü tayfası və Səfəvi sülaləsi;*
*Əli Pursəfər. Səfəvi hökuməti və türk qızılbaş tayfaları ("Nəşri-daniş" dərgisi, 1372 h.-ş., № 76), s.32-36;*
*M.H.Raznihan. Böyük Ustaclu elində qarşıdurma və böhran ("Ayın kitabı" dərgisi, 1388 h.-ş., № 142), s.16-20 və s.*

**ALPAUT** – qızılbaş tayfalarından biri. Adını bəzən "Alpout", "Alfavut" və "Alpağut" şəklində də yazırlar. Mahmud Kaşğari "Divan lüğat ət-türk" kitabında "alpağut" sözünə bu cür məna vermişdir: təkbaşına düşmənə hücum edən igid, yenilməz güləşçi, bahadır, pəhləvan. Qaraqoyunlu tayfa ittifaqına aid olan alpautların bir neçə böyük sərkərdəsinin adı "Qızılbaşlar tarixi"ndə Qaraqoyunlu sərkərdəsi qismində çəkilmişdir. İlk vaxtlar alpautlar əsasən Çuxursəd bölgəsində məskunlaşmışdılar. 1547/48-ci illərdə Pasin məntəqəsində osmanlı əsgərləri Qayıtmaz bəy Xınıslunun sərkərdəliyi altında düşərgə qurmuş qızılbaş döyüşçülərinün üzərinə gecəyarı hücum çəkib 100 nəfəri həlak etmişdilər. Amma Qayıtmaz bəy əsgərləri toplayaraq əks-hücuma keçmiş və qarşı tərəfdən 700 nəfəri məhv etmişdi. I Şah Təhmasibin hakimiyyətinin sonlarında Alpaut tayfasının əsas əmiri İbrahim bəy (və ya xəlifə) idi və onun Çuxursəddə mülkləri vardı.

I Şah Abbas zamanında tayfa Şirvanda və Qarabağda yaşayırdı, böyük ehtimalla, onlar şahın daxili siyasətinə uyğun olaraq Çuxursəddən bura köçürülmüşdülər. Həmin dövrdə alpautların başçısı Mənsur sultan, əmirlərindən biri də Qazan sultan idi.

Səfəvilər dövlətinin süqutundan sonra da alpautlar Azərbaycan ərazisində yaşamışlar. Azərbaycan Respublikasında Alpaut (Alpout) toponiminə dəfələrlə rast gəlinir, Göyçay, Ucar, Bərdə, Goranboy, Qazax və Laçın rayonlarında Alpout kəndləri mövcuddur.

**ALPOUT** – bax: **ALPAUT.**



**BAYAT** – böyük qızılbaş tayfalarından biri. Bəzən "Bəyat" və "Boyat" şəklində də yazılır. 24 oğuz boyundan biri olan Bayat sonralar Hələb türkmanları tayfa birliyinin üzvü idi. Bayatlar, ehtimala görə, Ağqoyunlular zamanında şərq istiqamətində köç edərək gələcək Səfəvi dövləti torpaqlarında yerləşmişlər.

XVI əsrdə Bayat tayfasının 10 min ailədən ibarət böyük bir qismi Həmədanın cənub-şərqində məskunlaşmışdı. I Şah Təhmasib zamanında onlara Əmir Şah bəy, Seyf bəy və Əli sultan adlı əmirlər başçılıq edirdilər. Bunlardan Seyf bəy Sultan Məhəmməd Xudabəndənin zamanında Bayat tayfasını *təkəlülərlə* düşmənçiliyə sövq etmiş, qarşıdurmada məğlub olmuş, Seyf bəy Təkəlü əmiri Solaq Hüseynə əsir düşmüşdü. Digər Bayat əmiri Süleyman bəy I Şah Təhmasibin qəzəbinə düçar olaraq gözləri çıxarılmışdı. Səfəvilər dövləti ərazisindəki digər bölgələrdə yerləşmiş bayatlardan fərqləndirmək üçün Həmədan civarında yurd salanları *Özbayat* və ya *Ağbayat* (Bayati-mütləq) adlandırırdılar. Eyni dövrdə Gəncə ətrafında da Bayat tayfasının bir qolu yaşayırdı, onların başçısı Məlik oğlu Hacı Üveys sultan idi. Bayatlar I Şah Təhmasibin oğlu *Mustafa Mirzənin* ətrafında birləşmişdilər. Şahın vəfatından sonra yaranmış qarışıqlıq zamanı Hacı Üveys sultan saraydan uzaqlaşmaq istəyən şahzadəni həbs edib Ustaclu tayfasına təhvil verdi, onlar da II Şah İsmayılın rəğbətini qazanmaq üçün şahzadəni öldürdülər (1576).



Sonralar I Şah Abbas Həmədan ətrafındakı ən böyük Bayat toplumunu dağıdaraq hissə-hissə digər məntəqələrə köçürdü, bununla da bayatların bir bölgədə kompakt halda yaşamalarına son qoyuldu. Bayat tayfasının bir qismi *qulam* təbəqəsindən olan Fərrux sultanın idarəçiliyi altında Azərbaycanın şimal-şərq bölgəsində (Dərbənd-Şabran) yaşamağa başladı. (A.A.Bakıxanov bayatların bir qisminin hələ I Şah İsmayıl tərəfindən siyahı üzrə bu bölgəyə köçürüldüyünü yazmışdır). Daha bir Bayat toplumu Nişapur ətrafında məskən saldı, bunlara *Qarabayat* deyirdilər, başçıları da Baba İlyas oğlu Məhəmməd sultan idi.

I Şah Abbas zamanında Bayat tayfasından Yarəli sultan Bayezid qalasında, Gəda Əli sultan Makuda, Bədr sultan Çuxursədin bir tərəfində hakim idilər, Şahəli bəy Bayat isə 1604/05-ci illərdə Səfəvi-Osmanlı müharibəsi gedişində şahın əmri ilə Şürəgil qalasını fəth etmişdi. I Şah Abbas dövrünün əmirləri arasında Bayat tayfasından Şahverdi sultan (vəf. 1587), Həmədan hakimi şahzadə *Məhəmməd Baqir Mirzənin* (I Şah Abbasın oğlu) vəkili Uğurlu sultan və onun qardaşı, Qum ilə Ərak arasındakı Kərəhrud məntəqəsinin hakimi olan Şahqulu sultanın da adları çəkilir.

I Şah Abbasın zamanında Bayat eli bütün divan vergilərindən azad edilmiş və hərbçi silkinə daxil edilərək imtiyaz sahibi olmuşdular.

II Şah Abbas yerli dayaqları möhkəmlətmək üçün Qarabağın Bayat, *Cavanşir* və digər türk oymaqlarından 15 min ailəni Kaxeti diyarına köçürmüşdü.

Bayat tayfası qədimliyinə və üzvlərinin sayının çox olmasına baxmayaraq, Səfəvilər dövrünün siyasi hadisələrində o qədər də fəal iştirak etməmişdir. Siyasi intriqalarda bu tayfa üzvlərinin adı, demək olar ki, hallanmır. Buna görə də Səfəvilər zamanında yüksək vəzifə tutmuş və hakimiyyətdə aparıcı rol oynamış əmirlərin arasında Bayat tayfası mənsublarının adına az rast gəlirik.

Böyük Azərbaycan şairi Məhəmməd *Füzuli* (vəf. 1556) Bayat tayfasına mənsub olmuşdur. Bu tayfanın daha bir yetirməsi gəncliyində Səfəvi ordusunda xidmət etmiş, XVII əsrin əvvəllərində I Şah Abbasın əmri ilə diplomatik heyətin tərkibində Avropaya göndərilmiş *Oruc bəydir.* O, İspaniyada xristian dininə keçərək Don Juan adını qəbul etmişdi. Oruc bəyin qızılbaş tayfaları barədə maraqlı məlumatlardan və səfər xatirələrindən ibarət kitabı Səfəvilər tarixi barədə dəyərli informativ mənbələrdən sayılır.

Azərbaycan şifahi xalq ədəbiyyatının mühüm qismini təşkil edən bayatılar Bayat tayfasının adı ilə bağlıdır. Varsağı aşıq şeir biçiminin adı *Varsaq* tayfasından götürüldüyü kimi, "bayatı" sözünün də "Bayat tayfasına məxsus şeir" mənası verdiyi ehtimal olunur.

Qeyd etmək yerinə düşər ki, "Kitabi-Dədə Qorqud" dastanının baş personajı, el ozanı Dədə Qorqud da Oğuzun Bayat boyuna mənsub olmuşdur.

Azərbaycan Respublikası ərazisində və qonşu ölkələrdə Bayat və Boyat topo-

nimlərinə dəfələrlə rast gəlinir. Keçmişdə Azərbaycan ərazisində Bayat tayfasının adı ilə bağlı xeyli yaşayış məskəni mövcud olmuşdur, hazırda Ağcabədi, Neftçala və Ucar rayonlarında Boyat kəndləri vardır.

**AĞBAYATLAR** – qızılbaş *Bayat* tayfasının böyük bir qisminə verilmiş ad. Hələb türkmanları birliyinə aid olan Bayat tayfası Səfəvilər dövlətinin ərazisinə köçüb əsasən Həmədan bölgəsində kompakt şəkildə məskunlaşmışdı. Onlardan əlavə Nişapur, Gəncə, Dərbənd-Şabran və digər məntəqələrdə də Bayat toplumları vardı. Sonralar I Şah Abbasın göstərişi ilə Həmədandakı bayatların bir hissəsini digər məntəqələrə köçürdülər. Həmədanda qalmış bayatları digər məntəqələrə səpələnmiş həmtayfalarından fərqləndirmək üçün Ağbayat və ya *Özbayat* adlandırırdılar. Onlara bəzən Bayati-mütləq də deyilirdi.
*bax:* **BAYAT.**

**BOYAT** – *bax:* **BAYAT.**

**QARABAYATLAR** – qızılbaş *Bayat* tayfasının böyük bir qisminə verilmiş ad. Bayat tayfası əsasən Həmədan ətrafında məskunlaşmışdı. Sonralar I Şah Abbas bu toplumu dağıdaraq hissə-hissə digər məntəqələrə köçürdü, bununla da bayatların bir bölgədə kompakt halda yaşamalarına son qoyuldu. Nişapur ətrafında məskən salmış bayatlara Qarabayat deyirdilər, onların başçısı Baba İlyas oğlu Məhəmməd sultan idi. Onun qardaşı Mahmud bəy Xorasanda özbəklər tərəfindən öldürülmüşdü (1587). Məhəmməd sultanın vəfatından (1610) sonra Nişapur hakimliyi onun qohumu Bayraməli sultan Qarabayata verildi, 1653-cü ildə Bayraməli sultanın xahişi ilə oğlu İbrahim bəy onun yerini tutdu. Bayraməli sultanın digər oğlu Təhmasibqulu sultan isə Xuzistanın Şüştər və Dizful məntəqələrinin hakimi idi. *İsgəndər bəy Münşi* qarabayatların Cığatay ulusuna mənsub olduqlarını yazır, tarixçi F.Sümer isə onları Yaka türkmanlarına aid edir.
*bax:* **BAYAT.**

**ÖZBAYATLAR** – *bax:* **BAYAT.**

**BAYBURTLU (BAYBURDLU)** – qızılbaş tayfalarından biri. *Oruc bəy Bayatın* xatirələrindəki qızılbaş tayfalarının siyahısında Bayburtlunun da adı çəkilir. Bu tayfanın kökü Ərzincan yaxınlığındakı Bayburt məntəqəsindəndir. Onun adına Səfəvilər dövlətinin quruluş mərhələsindən etibarən mənbələrdə rast gəlirik. 1500-cü ildə I Şah İsmayıl Anadoluya səfər edərkən Çuxursəd bölgəsindəki Dokuz Ulam məntəqəsində bayburtlu Qaraca İlyasın başçılığı altında bir dəstə qızılbaş ona qoşuldu. Qaraca İlyas Bayburtlu sonralar I Şah İsmayılın tərəfində döyüşlərdə fəal iştirak edərək fərqlənmişdir. Onun oğlu Qaraxan bəy I Şah Təhmasibin zamanında Çuxursəd bəylərbəyliyinin bəzi məntəqələrinin hakimi idi və 1577/78-ci illərdə osmanlıların Ərzurum valisi ilə savaşıb ona qalib gəlmişdi.



I Şah Təhmasib qardaşı *Bəhram Mirzə* ilə öz oğlu şahzadə İsmayıl Mirzəni (gələcək *II Şah İsmayıl*) Bayburt istiqamətində osmanlıların üzərinə yollamış, onlar da öz vəzifələrinin öhdəsindən layiqincə gələrək döyüşdə qələbə qazanmışdılar (1548).

Şah Məhəmməd Xudabəndə zamanında Şahverdi bəy Bayburtlu söhbət yasavulu olmuş, I Şah Abbas zamanında da bu vəzifədə qalmışdır (vəf. 1614). I Şah Abbas zamanında Muradxan sultan Bayburtlu Arasbar hakimi olaraq xidmət edirdi, tayfanın əsas hissəsi də həmin bölgədə məskunlaşmışdı.

I Şah Abbasın hərbi yürüşlərində iştirak etmiş və Yəzd şəhərinin valisi olmuş şair *Məhəmməd Əmani* (1536-1610) də Bayburt mahalından idi.

**BOZCALU** – qızılbaş tayfalarından biri. Tarixi mənbələrdə bu tayfanın özü və nümayəndələri haqqında məlumat azdır. Bozcaluların Hələb türkmanlarından olduqları yazılır. I Şah İsmayılın zamanında baş vermiş Mərv savaşında (1510) Bozcalu tayfasından Adi Bahadur ləqəbli Əziz ağa özbək qoşununun başçısı *Şeybani xanın* cəsədini ölülərin arasından tapıb başını bədənindən ayırmış və şahın hüzuruna aparmışdı.

I Şah Abbas dövründə Avropaya diplomatik səfərə göndərilmiş, amma xristianlığı qəbul edərək İspaniyada qalmış *Oruc bəy Bayat* (Don Juan) öz kitabında adlarını sadaladığı qızılbaş oymaqları arasında Bozcalunu da qeyd etmişdir.

I Şah Səfi zamanında Çuxursəd bəylərbəyliyinin Ağcaqala və Lori məntəqələrinin hakimi İsaxan sultan Bozcalu idi. Səfəvilərdən sonrakı dövrdə Bozcalu tayfası Həmədanın şərqində məskunlaşmışdı.

**CAGİRLÜ** – qızılbaş tayfalarından biri. Səfəvilərin hakimiyyətə gəlişindən əvvəl Ərdəbildən Muğana kimi uzanan bölgədə bu tayfanın məskunlaşdığı məlumdur. Cagirlülər kürd mənşəli olsalar da, artıq XV əsrdə qonşu türk tayfaları ilə qaynayıb-qarışmış və demək olar, tamamilə türkləşmişdilər. Bu tayfanın böyükləri Əmir Bəstam, onun oğulları Əmir Bayezid, Əbülfəth bəy və Ömər bəy, eləcə də Əli bəy Qaraqoyunlu dövlətində yüksək vəzifə sahibi idilər. Bəzi Cagirlü əmirləri Ağqoyunlularla müharibələrdə öldürülmüşdülər.

Səfəvi dövlətinin qurulması istiqamətində hərəkatın lap başlanğıcında (1499) I Şah İsmayıl Laricandan Ərdəbil istiqamətində hərəkət edərkən Ərdəbil hakimi Sultan Əli bəy Cagirlü onun şəhərdə qalmasına mane olmuş, buna görə azsaylı qızılbaş dəstəsi döyüşə girməkdən çəkinərək qışı Talış diyarında keçirmişdi.

Səfəvi tarix salnamələrində öz əksini tapmış bəzi hadisələrin təsvirindən məlum olur ki, Cagirlü tayfası əsasən Şirvan bölgəsində məskunlaşmışdı. Bu tayfanın mənsubları Şirvan bəylərbəyinə tabe idi və *Qacar*, *Qaramanlu* kimi tayfalarla çiyin-çiyinə Şirvan qoşununun tərkibində döyüşürdülər.

I Şah Abbasın vəfatı ərəfəsində Cagirlü tayfasından Məhəmməd sultan Şəki hakimi vəzifəsində xidmət edirdi. Mənbələrdə həmin dövrün əmirlərindən Əxi sultan Cagirlünün də adına rast gəlirik.
Azərbaycan ərazisində mövcud olan Cəyirli və Çaxırlı kənd adlarının bu tayfadan qaynaqlandığı ehtimal olunur.



**CƏRİD** – Səfəvilər dövründə mövcud olmuş türk oymaqlarından biri. Bəzi mənbələrdə *Silsüpür* oymağını bu adla qeyd etmişlər. Anadoluda soyğunçuluqla məşğul olmuş və buna görə Silsüpür adını qazanmış oymaq sərhədi keçərək Səfəvilər dövlətinin ərazisində məskunlaşmışdı. Anadoludakı Silsüpür oymağının bir hissəsi Cərid qolundan ibarət idi və Cərid Silsüpür adı ilə tanınırdı.
*bax:* **SİLSÜPÜR.**



**ÇƏKƏNİ** – *bax:* **ÇİGİNİ.**



**ÇƏMİŞGƏZƏKLÜ** – kiçik qızılbaş tayfalarından biri. Anadolunun Tunceli bölgəsində məskunlaşmış eyniadlı tayfanın bir hissəsi Səfəvilər dövlətinin ərazisinə keçərək qızılbaşlığı qəbul etmişdi. *Oruc bəy Bayatın* (Don Juan) xatirələrində verilmiş qızılbaş oymaqları siyahısında Chamish-Qazaqlu adı da mövcuddur. Bu tayfanın bir hissəsi Astarabad bölgəsində yerləşmişdi. I Şah Abbasın vəfatı ərəfəsində (1629) Astarabaddakı Çəmişgəzəklü tayfası *Zülqədər* tayfasına aid olan *Hacılar (Ağçalu)* oymağı ilə birlikdə kompakt şəkildə yaşayırdı və onlara *qulamlar* təbəqəsindən olan Xosrov xan başçı təyin edilmişdi.
Səfəvilər dövrünün inzibati bölgüsü və idarəçilik sistemi barədə ən sanballı mənbələrdən olan *"Təzkirət əl-müluk"* əsərində Şirvan bəylərbəyliyinə tabe olan mahallar arasında Çəmişgəzəkin adı da Ağdaşla yanaşı qeyd edilmişdir. Həmin kitabda yazılanlardan aydın olur ki, Çəmişgəzək Araz çayının şimalında, Göyçə yolunun üstündə yerləşirdi. Ərzincanın cənubundakı Dərsim məntəqəsindən min ailə Səfəvilər dövlətinin xidmətinə keçmiş, onların bir hissəsi Xorasan sərhədində (Astarabadda) yerləşdirilmişdi. "Təzkirət əl-müluk" əsərində Çəmişgəzək tayfasının şiə kürdlərdən ibarət olduğu yazılsa da, müəllif daha sonra Səfəvilər zamanında dövlətin ərazisində məskunlaşmış kürd tayfalarını sadalayarkən Çəmişgəzəki onlara aid etməmişdir. Bu da tayfanın kürd mənşəli olmasına baxmayaraq, türkləşdiyini söyləməyə əsas verir.
*"Qızılbaşlar tarixi"ndə Ərəbgirlü* tayfası haqqındakı bölümdə məlumat verilir ki, onlar Ərəbgir vilayətinin Çəmişgəzək (mahalındandır) və I Şah İsmayılın vaxtında onların arasında böyük əmir olmayıb. Bilindiyi kimi, Ərəbgirlü tayfası əvvəllər müstəqil olmuş, I Şah Abbasın zamanında *Şamlu* tayfasına qoşulmuşdu. Ərəbgir Fərat çayının sağ sahilində, Malatyadan şimalda yerləşən vilayət və şəhərdir, Çəmişgəzək şəhəri isə Xarputdan 35 km cənubda yerləşir.
I Şah Abbasın zamanına aid olan mənbələrdə Çəmişgəzək əmirlərindən Şahəli sultanın adına rast gəlinir. Həmçinin o



dövrdə qulam təbəqəsindən olan Yusif sultan kürd Çəmişgəzəkinin əmiri və Xorasanın Xəbuşan əyalətinin hakimi idi. I Şah Abbasın sərkərdələrindən olan Çəmişgəzəklü Sərdar Mahmud 300 nəfərlik bir dəstə ilə *İrəvandakı* Osmanlı qarnizonuna hücum təşkil etmiş, amma uğursuzluqla qarşılaşıb öldürülmüşdü.

**ÇƏPNİ (ÇEPNİ)** – qızılbaş tayfalarından biri. Qədim Oğuz tayfa birliyinin 24 boyundan biri olan çəpnilərin adı "Divan lüğat ət-türk" kimi qədim mənbələrdə də çəkilmişdir. Səfəvilər dövləti qurulmazdan əvvəl çəpnilərin böyük bir qismi şiə məzhəbində və ya şiəliyə meyilli olmuşdur. XVI əsrdə çəpnilərin bir hissəsi Hələb türkmanları arasında, bir hissəsi də Sivas, Tokat və Amasya bölgələrində yerləşmişdi. Trabzon, Bayburt və digər məntəqələrdə də bu tayfanın xeyli nümayəndəsi yaşayırdı. XVI əsrin ortalarında Çəpni tayfasının şiə olduğunu nəzərə alaraq onların Osmanlı ordusuna hərbi xidmətə qəbul edilməməsi, hətta ordudakı çəpnilərin xidmətdən azad edilib evlərinə göndərilməsi barədə fərman verilmişdi.

I Şah İsmayılın vəfatından sonrakı vətəndaş müharibəsində Çəpni tayfası rumlular və talışlarla birləşib Ustaclu tayfasına qarşı cəbhə açdılar.

1548-ci ildə Sultan Süleyman Qanuni Səfəvilər dövlətinin torpaqlarına yürüş edərkən Təbriz qalasında cəmi 6 gün qala bilmiş, geri qayıdarkən yolüstü Van qalasını ələ keçirmişdi. O zamanlar Van qalasının hakimi Şahəli sultan Çəpni idi. Şahəli sultanın əvvəllər osmanlılara xidmət etdiyi, sonra Səfəvilərin tərəfinə keçdiyi, Van qalasını da könüllü olaraq Sultan Süleymana təslim etdiyi yazılır. I Şah Təhmasib bu hərəkətinə görə Şahəli sultanı edam etdirmiş, onun vəzifəsini həmtayfası Süleyman bəy Çəpniyə vermişdi.

I Şah Təhmasib Ərzurum bölgəsinə yürüşdən qayıtdığı zamanı Trabzon ətrafındakı çəpnilər onunla birlikdə Səfəvi dövlətinin ərazisinə keçmişdilər. Çəpnilərin kompakt halda yaşadıqları əsas bölgələr Qarabağ və Gilan idi.

I Şah Təhmasibin vəfatı ərəfəsində Çəpni tayfasından 3 əmir dövlət qulluğunda idi: Mahmud xəlifə, Dönməz sultan və Məhəmməd sultan Cəlaloğlu. Onlar Qarabağ bəylərbəyinə tabe idilər, 1556-cı ildə Gürcüstandakı qalalardan birinə hücum etmiş gürcülərə qarşı döyüşdə Çəpni tayfası Qarabağ bəylərbəyi *Şahverdi sultan Ziyadoğlu-Qacarın* ümumi komandanlığı altında savaşmışdır. Şah Məhəmməd Xudabəndə zamanındakı bəzi hadisələrin təsvirində Çəpni tayfasından Şahverdi sultan Cəlaloğlunun da adına rast gəlirik.

Çəpni tayfasının bir hissəsi Gilan bölgəsində məskunlaşdığı üçün I Şah Abbas dövründə bu tayfadan Uğurlu sultan Gilanın Fumən şəhərinə hakim təyin edilmişdi. Çəpni tayfasının ümumi başçısı mənsəbini isə I Şah Abbas öz daxili siyasətinə uyğun olaraq onlardan kimsəyə deyil, *qulamlar* təbəqəsindən gürcü mənşəli Qorgin xana vermişdi.

1630-cu ildə Xarəzm hakimi İsfəndiyar

xan qardaşı Əbulqazi ilə birlikdə Xorasan vilayətinə hücum edəndə az sayda qızılbaş əmirləri ona qoşulsalar da, Mərv hakimi Aşur xan və Səbzəvar hakimi Əhməd sultan kimi Çəpni əmirləri ciddi şəkildə müqavimət göstərdilər. 1632-ci ildə Aşur xanın vəfatından istifadə edən özbəklər bir daha Mərv üzərinə yürüdülər, amma bu dəfə də qaladakı *Qacar* tayfasının döyüşçüləri onları müqavimətlə qarşıladı. I Şah Səfi tərəfindən Mərv bəylərbəyi təyin edilmiş Mürtəzaqulu xan Qacar düşmənə əsir düşsə də, qala təslim olmadı. Bir müddət Mərvdə hakimlik etmiş Nağdı bəy Şamlı şəhəri möhkəmlətdi və Mürtəzaqulu xan əsirlikdən qayıtdıqdan sonra vəzifəni ona təhvil verdi.

Bəzi salnamə müəllifləri Çəpni tayfasını kürd mənşəli *Çigini* tayfası ilə qarışdırırlar. *"Aləmarayi-Səfəvi"nin* bəzi qədim nüsxələrində Çəpni tayfası əmirlərinin adı yanlış olaraq Çigini şəklində qeyd edilir. İsgəndər bəy Münşi özü də çəpniləri kürd tayfalarının sırasında təqdim etmişdir. Halbuki Çəpni qədim türk Oğuz tayfa birliyinə aid olmuşdur, tarixi mənbələrdə qeyd edilmiş bəzi Çəpni əmirlərinin adları da türk mənşəlidir.

**ÇİGİNİ** – Səfəvilər dövlətində yaşamış kürd tayfası. Adını "Çigəni", "Çəkəni" və "Çingənə" kimi də yazırlar. Bəzi tədqiqatçılar Çigini tayfasını kürd, bəziləri isə lur mənşəli hesab edirlər. Pərakəndə halda müxtəlif bölgələrdə məskunlaşmışlar, Astarabad, Gilan və Xorasan bölgələrində sayları daha çox olmuşdur. İraq və Kürdüstan bölgələrində yaşayan çiginilər əhli-sünnə məzhəbinə etiqad bəsləmiş, Səfəvilər dövlətinin sərhədləri daxilində yaşayan çiginilər isə şiəliyi qəbul etmişlər. XV əsrdə tayfanın lideri Mənsur bəy və oğlu Şad bəy Ağqoyunluların xidmətində idilər.

Səfəvilər dövlətinin əvvəlində Çigini tayfası soyğunçuluqla məşğul olur və karvanlara təhlükə törədirdi. Buna görə I Şah Təhmasib onları ölkədən sürgün etmək qərarına gəldi, çiginilər isə Xorasanda yaşamalarına icazə verilməsini xahiş etdilər. I Şah Təhmasib onlara öz aralarından *Budaq xanı* başçı qoydu. Budaq xan Məhəmməd Xudabəndənin və I Şah Abbasın zamanında da öz vəzifəsində qalmışdır. Onun oğulları Həsənəli xan, Hüseynəli xan və Bayram bəy də Səfəvilər dövlətinə xidmət etmişlər.

**ÇİNGƏNƏ** – kürd mənşəli *Çigini* tayfasının adı bəzi mənbələrdə bu şəkildə verilir. Bu adı "Çigəni", "Çəkəni" şəklində də yazırlar. Tayfanın adını "Çingənə" şəklində təqdim edənlər də vardır. Fransız dilindəki "tsigane", alman dilindəki "zigeuner" sözləri buradan qaynaqlanır və "qaraçı" mənasını verir.

**DÖGƏR** – qədim türk tayfalarından biri. 24 oğuz boyundan biri, Boz Ok ittifaqına daxil olan Dögər tayfası Şam (Suriya) torpaqlarının Cabir bölgəsində məskunlaşmışdı. Dögər tayfasından olan, Səlcuqilərin əmiri kimi xidmətə başlamış Artuq bəy XI əsrin sonlarında Qüds



şəhərini idarə edirdi. Sonralar o, Anadolunun şərqində bəylik qurmağa nail oldu, onun xələfləri olan Artuqoğulları bəyləri bir müddət burada hökm sürmüşlər.

Məmlüklərin və Qaraqoyunluların güclü təsiri altında olan Dögər tayfası siyasi hadisələrdə fəal iştirak etmiş, bölgənin geosiyasi həyatında özünəməxsus rol oynamışdır. Dögər tayfasının oymaqları Hələb, Dəməşq, Urfa, Kərkük və digər məntəqələrdə yayılmışdı. XV əsrin əvvəllərində onlar Qaraqoyunlu tayfa ittifaqı ilə birlikdə Azərbaycan torpaqlarına köçdülər. Səfəvi hakimiyyəti dövründə dögərlər *qızılbaşlığı* qəbul edərək *türkman* tayfa ittifaqına daxil oldular. Türkman tayfa ittifaqının əsasını *Mosullu*, *Pörnək* və *Baharlu* tayfaları təşkil edirdi, dögərlər bu ittifaqda onlar qədər mühüm yer tutmurdular. XVIII əsrdə dögərlərin *Otuziki* tayfa ittifaqının tərkibində olduqları barədə məlumatlar vardır. Onların qışlağı Arazbasardakı (Gəncə ətrafındakı) Hüseynli kəndi idi. İğdır, Maku və Tiflis ətrafında bu tayfanın adını daşıyan yaşayış məntəqələri vardı. Sadiq bəy Əfşar *"Məcmə əl-xəvas"* təzkirəsində Piri bəy Dögər adlı bir şairdən bəhs edərək yazır: "Türkmandır. Ləyaqət sahibi və ünsiyyətə girən bir cavandır. Onun kimi istiqanlı dost və kamil həmsöhbət az tapılar. Musiqi elmindən faydalanır və bir çox əsəri var".

**"DÖNÜK" QAZAQLAR** – bəzi Səfəvi mənbələrində türk *Qazaqlar* tayfası bu adla xatırlanır. XVI əsrin sonlarında osmanlı qüvvələri Şah Məhəmməd Xudabəndənin zəifliyindən və qızılbaş tayfaları arasındakı qarşıdurmadan istifadə edərək Səfəvilər dövlətinin bir hissəsini, o cümlədən Azərbaycan torpaqlarını işğal etdilər. Bu ərazidə yaşayan bəzi tayfalar Osmanlı tabeliyində qalmaq istəməyib Səfəvilər dövlətinin içərilərinə doğru çəkildi. Lakin əsasən Qarabağda məskunlaşmış qazaqlar və daha bir neçə tayfa öz yaşayış yerini tərk etmədi. Səfəvi dövlətinin yuxarı dairələrində onların bu seçimi xəyanət kimi qiymətləndirildi və Qazaqlar tayfasına "dönük" ləqəbini qoşdular.



**"DÖNÜKLƏR"** – XVI əsrin sonlarında Azərbaycan torpaqları osmanlılar tərəfindən işğal edildikdən sonra müqavimətin mənasız olduğunu görən və Osmanlı üsuli-idarəsi altında yaşamağa razılıq verən bəzi qızılbaş tayfalarına şamil edilmiş məzəmmətverici ləqəb. Səfəvi hakimiyyətinin gözündə onlar qızılbaşlıqdan döndüklərinə görə bu ləqəbi qazanmışdılar. *Otuzikilər*, *Qazaqlar*, *Qaracadağlu* tayfaları, *Qacar* və *Zülqədər* tayfalarının bəzi oymaqları "dönük"lərə aid idi. I Şah Abbas Səfəvi torpaqlarını Osmanlı istilasından azad etdikdən sonra "dönük" tayfalar cəzalandırıldı. Osmanlı dövləti və Gürcüstanla sərhəd bölgələrdə onların yaşamasını dövlət təhlükəsizliyinə hədə sayan şahın əmri ilə "dönük" tayfaların böyük bir qismi öz yurdundan sürgün edilib dövlətin iç bölgələrinə və mərkəzi vilayətlərə köçürüldü. Osmanlı xidmətinə

keçmiş, sonra peşman olub şahın hüzuruna qayıtmış əmirlərin isə əksəriyyəti bağışlandı və öz əvvəlki vəzifəsinə bərpa edildi.

**EVOĞLULAR** – Səfəvilər dövlətində xidmət etmiş *Qaradağ sufilərindən* bir sülalənin adıdır. Evoğlu nəslinin nümayəndələri əsasən Səfəvi sarayında mətbəxin idarəsi ilə məşğul olurdular. Bu nəslin bir neçə yetirməsi sarayda abdarbaşı (su təchizatı müdiri) vəzifəsində xidmət edirdi. Bu vəzifə onların karyerası üçün gözəl bir başlanğıc rolunu oynayırdı. *Əbülqasım bəy Evoğlu* I Şah Abbas zamanında əvvəlcə sarayda abdarbaşı işləmiş, 1618-ci ildə hərəm *eşikağasıbaşısı* Heydər sultan Bəgdilünün vəfatından sonra onun yerinə təyin edilmişdi. Əbülqasim bəyin yeni təyinatından sonra abdarbaşı vəzifəsi qardaşı Çələbi bəyə həvalə edilmiş, Çələbi bəy I Şah Səfinin zamanında hərəm eşikağasıbaşısı təyin ediləndə abdarbaşı vəzifəsinə Əbülqasim bəy Evoğlunun oğlu Cəfər bəy gətirilmişdi. Əbülqasim bəyin digər oğlu Heydər bəy isə atasından sonra eşikağasıbaşı mənsəbini qazanmış, amma 1643-cü ildə baş vəzir *Saru Tağı* ilə konfliktə girdiyi üçün vəzifədən istefa verməyə məcbur olmuşdu. Bu dəfə eşikağasıbaşı mənsəbi Mirzəli sultan Çələbi Evoğlunun oğlu Əliqulu bəyə verilmişdi.

Evoğlular yalnız sarayda inzibati xidmətlə kifayətlənməmiş, digər sahələrdə də bacarıqlarını uğurla nümayiş etdirmişlər. I Şah Abbasın zamanında Əbülqasim bəy Evoğlu və qohumu Talib bəy Evoğlu şah tərəfindən elçi qismində Krıma diplomatik səfər etmişdilər. Əbülqasim bəyin oğlu yüzbaşı Bəktər bəy Evoğlu 1617-ci ildə gürcülərlə döyüşdə güllə yarasından həlak olmuşdu. Taleh bəy Evoğlunun Hindistana, Vüsal bəy Evoğlunun Qəndəhara, Vəli bəy Evoğlunun Mərvə elçi qismində göndərildikləri məlumdur.

Evoğlular nəslindən Teymur bəy də *söhbət yasavulu* vəzifəsində xidmət etməklə yanaşı döyüşlərdə fərqlənmişdi. *Qorçu* Şahgəldi bəy Evoğlu hətta osmanlıların Ərzurum valisi Xəlil paşanı döyüşdə ələ keçirmişdi.

Sadiq bəy Əfşarın *"Məcmə əl-xəvas"* təzkirəsində Mirzə Məhəmməd Evoğlu adlı şair haqqında məlumat verilir. I Şah Təhmasibin oğlu *Sultan Həmzə Mirzənin qorçularından* (elit döyüşçülərindən) olan Mirzə Məhəmməd hər iki dildə (Azərbaycan və fars) şeirlər yazırdı. *Sadiq bəy Əfşar* onu sözünə sadiq, sadəlövh təbiətli, gözəl xətti olan bir gənc kimi vəsf edir və təhsil üçün çox zəhmət çəkib faydasını da gördüyünü yazır.

**ƏFŞAR** – böyük qızılbaş tayfalarından biri. 24 oğuz boyundan biri olan Əfşarın adı Mahmud Kaşğarinin "Divan lüğat ət-türk" əsərində və digər qədim mənbələrdə çəkilir. Rəvayətə görə, Oğuz xaqanın oğlu Ulduz xanın dörd oğlundan birinin adı Əfşar idi. Adın mənasını "çevik, cəld, ova marağı olan" şəklində izah edirlər. Orta əsr mənbələrində tayfanın adı bəzən "Avşar" şəklində qeyd



olunmuşdur. Əfşar tayfası Orta Asiyadan qərbə doğru köç etmiş, Anadolu, Azərbaycan, Suriya, İraq, Əfqanıstan torpaqlarında məskunlaşmışdı. Səfəvilər dövlətinin yaranması ərəfəsində əfşarların bir qismi artıq bu torpaqlarda yaşayırdı. XII əsrdə Məhəmməd Cahan Pəhləvan Eldənizin vaxtında Xuzistan hakimi Şumlə Əfşar onunla rəqabət aparırdı.

Əfşar tayfası XV əsrdə Ağqoyunlu dövlətinin tərkibində idi, Səfəvilərin hakimiyyətə gəlişi ərəfəsində onlara Mənsur bəy başçılıq edirdi. 1503-cü ildə I Şah İsmayıl *Almabulağı savaşında* Ağqoyunlu Sultan Muradı məğlub etdikdən sonra Mənsur bəy şaha itaət edərək *qızılbaş papağı* geyindi (yəni qızılbaşlığı qəbul etdi). O vaxtdan Əfşar tayfası qızılbaşların cərgəsinə qoşularaq Səfəvilər dövlətinin siyasi həyatında fəal iştirak etməyə başladı. Mənsur bəyin rəhbərliyi altında əfşarların böyük bir hissəsi Anadoludan Səfəvilər dövlətinə köç edərək Xuzistan və Kyhgiluyə bölgələrində məskən saldı. Sonralar tayfa genişlənərək ətraf məntəqələrə yayıldı, I Şah Abbasın köçürmə siyasəti nəticəsində əfşarlar da bir neçə dəfə öz yaşayış məskənlərini dəyişdilər. Hazırda əfşarların böyük bir qismi Cənubi Azərbaycan torpaqlarında yaşayır. Azərbaycan Respublikası ərazisində də əfşarlarla bağlı bir neçə toponim mövcuddur.

Hələ I Şah İsmayılın dövrünə aid mənbələrdə Əfşar tayfasının bəzi nümayəndələri haqqında məlumatlara rast gəlinir. I Şah İsmayılın ilk silahdaşlarından biri Hüseyn bəy Əfşar *süfrəçibaşı* təyin edilmişdi. 1509/10-cu illərdə Kirman şəhərində Məhəmməd xan Əfşar hakim idi, *Şeybani xanın* göndərdiyi qoşun onu qəfil haqlayıb bütün şəhər qarnizonunu qırmışdı. I Şah İsmayılın *ələmdarbaşısı* Əfşar tayfasından Danə Məhəmməd xan idi, şah 1510-cu ildə onu Mərv üzərinə hərəkət edən qızılbaş ordusunun ön dəstəsinə komandan təyin etmişdi. Danə Məhəmməd xan özbəklərlə döyüşdə ox yarasından həlak olmuşdur. Səfəvilər dövlətinin *vəkili Nəcmi-saninin* 1512-ci ildə baş vermiş uğursuz Xorasan yürüşünə Vəlican sultan Əfşar da qatılmışdı.

*Çaldıran savaşında* isə I Şah İsmayıl geri çəkilərkən Əfşar tayfasından Sultanəli bəy xarici görünüşcə ona bənzəməsindən istifadə edərək düşmənə özünü şah kimi təqdim etmiş və bununla osmanlı döyüşçülərinin diqqətini yayındıra bilmişdi.

I Şah İsmayıl dövrünün sərkərdələri arasında Sultanşah bəy Əfşarın və Fərahan hakimi Əhməd bəy Əfşarın da adları çəkilir.

Xorasan əmirlərindən Mustafa sultan Əfşar 1527/28-ci illərdə Firuzkuhda özbəklərlə baş vermiş döyüşdə Şamlu sərkərdələri *Zeynal xan* və Çəkirgə sultanla birlikdə həlak olmuşdu.

I Şah Təhmasibin İraq səfərində Kuhgiluyə hakimi Əlvənd xan min nəfər döyüşçü və iki tövlə at ilə şahın xidmətinə gəlmiş, amma o biri il itaətsizlik göstərdiyinə görə edam edilmişdi. Onun vəzifəsi Mənsur bəyin nəvəsi, Həsən

sultanın oğlu Məhəmmədi bəyə (Şahrux xan) verilmişdi. XVI əsrin ortalarında həmin nəslin nümayəndəsi Mahmud bəy Kuhgiluyə vilayətini idarə edirdi və tabeliyində üç min süvarilik hərbi qüvvə vardı. Ondan sonra məntəqənin hakimiyyəti Rüstəm bəy Əfşara verilmişdi.

I Şah Təhmasibin zamanında Xuzistan əfşarlarının (*Gündüzlü* oymağı) başçısı Çulu bəyin oğlu Qanqara ləqəbli Mehdiqulu sultan Gündüzlü idi. 1539/40-cı illərdə şahın əmri ilə o, ortadan götürüldü və yerinə qardaşı *Sevindik bəy* təyin edildi. Sevindik bəy *qorçubaşı* vəzifəsini də daşıyırdı. 90 ildən çox yaşamış Sevindik bəyin Gilan sofularından olduğu deyilir, buna əsasən ehtimal etmək olar ki, hələ I Şah İsmayıl uşaqlıq illərində Gilanda olduğu zamanlar ona qoşulmuşdu.

I Şah Təhmasib zamanında Əfşar tayfasından Pirqulu bəy, Rüstəm bəy, Məhəmməd bəy, Sincab sultan, Danə Məhəmməd xan oğlu Allahqulu bəy, *Əlqas Mirzənin* yaxın ətrafından olan Məhəmməd bəy və b. məsul vəzifələrdə xidmət edirdilər.

Əfşar tayfası nümayəndələrinin adlarına həm Xuzistan və Kuhgiluyə, həm də Kirman hakimlərinin siyahısında rast gəlirik. I Şah Təhmasib zamanında Mustafa sultanın oğlu Şahqulu sultan, Yaqub sultan, qardaşı Qulu sultan (adını Allahqulu sultan kimi də yazırlar, sonralar *qorçubaşı* vəzifəsinə irəli çəkilmişdir) və Vəli xan, daha sonralar Mahmud sultan Kirmanda hakim idilər.

I Şah Təhmasibin zamanında Əfşar tayfasının böyüyü *Əmiraslan sultan Ərəşlü* sayılırdı, qoşununun sayına görə o, digər həmtayfalarından fərqlənirdi, özü də şahzadə *Sultan Əhməd Mirzənin* lələsi idi.

XVI əsrin son onilliklərində əfşarlardan Vəli xanın oğlu *Bektaş xan* Yəzddə, Yusif xan Əbərquhda, Heydərqulu sultan və Əbülfəth sultan Xuzistan bölgəsində, İsgəndər bəy Gilanda, Hüseyn sultan İsfərayində, on min əfşar ailəsinin başçısı olan Xəlil xan Kuhgiluyədə hökm sürürdülər. Xəlil xandan sonra onun yerini qardaşı İsgəndər xan tutdu. Xorasan tərəflərdə Xosrov bəy, Şahəli bəy, Əliyar bəy, Yegan sultan və Xosrov sultan Koroğlu Əfşar tayfasının mənsubu olaraq xidmət göstərirdilər.

Əfşar tayfası I Şah Təhmasibin vəfatından sonra *Heydər Mirzə* və *II Şah İsmayıl* tərəfdarları arasındakı qarşıdurmada ikincini dəstəklədi. *Şah Məhəmməd Xudabəndə* hakimiyyətə gəldikdən sonra nüfuz sahibi olan Şəki hakimi *Şamxal sultanı* Əmiraslan sultan Ərəşlünün əli ilə aradan götürdü (1578).

II Şah İsmayılın ölümündən bir müddət sonra ölkə ərazisində bir neçə nəfər onun guya ölmədiyini iddia etdi. Özlərini II Şah İsmayıl elan edən bu şəxslərin üsyanlarını yatırmağa Əfşar tayfası cəlb edildi. Silsilə döyüşlərdə Kuhgiluyə hakimi Xəlil xan Əfşar və oğlu Rüstəm bəy öldürüldülər. Bu qarışıqlıqda əvvəlcə Xəlil xanın oğlu Şahrux xan əmisi Kuhgiluyə hakimi İsgəndər xanı öldürüb yerinə keçdi, az sonra əfşar əmirlərindən Əbdüllətif bəy oğlu Həsən



xan da onu öldürərək Kuhgiluyə hakimi oldu, amma bir neçə ildən sonra özü və yaxın qohumları şahın qəzəbinə düçar olub Qəhqəhə qalasında həbs edildilər.

I Şah Abbasın zamanında Əfşar əmirlərindən üçü xüsusilə seçilirdi. Bunlar Urmiya hakimi Qasim xan İmanlunun oğlu Kəlbəli sultan, Xorasanın bəzi bölgələrinin hakimi Ərdoğdu xan Alplu və Gavrud hakimi İmamqulu sultan Ovsalu idi.

Sonrakı dövrlərdə Urmiya hakimliyi Gəncəli xan Əfşara (1653/54), daha sonra əmisi Məhəmməd xana (1655) həvalə olunmuşdu.

*Oruc bəy Bayat* Səfəvilər dövlətində Əfşar tayfası nümayəndələrinin əsasən ədliyyə naziri (hakim) qismində xidmət etdiklərini yazır.

Əfşar tayfasının bəzi nümayəndələri Səfəvilər dövlətində yüksək hərbi vəzifə sayılan *qorçubaşı* məqamına yüksəlmişdilər. Şah Məhəmməd Xudabəndə zamanında Qulu bəy (şahzadə *Həmzə Mirzə* tərəfindən cəzalandırılacağından qorxaraq osmanlılara sığınmışdı), daha sonralar onun oğlu Yusif xan (*Mürşidqulu xan Ustacluya* qarşı təşkil edilmiş uğursuz qızılbaş koalisiyasının üzvü idi), Astarabad valisi İsgəndər xan, onun qardaşı Bədr xan (əvvəlcə qardaşının yerinə Astarabad hakimi, sonra qorçubaşı təyin edildi, amma az sonra şahın əmri ilə öldürüldü) və Qulu bəyin qohumu Vəli xan qorçubaşı vəzifəsini icra edirdilər.

Əfşar tayfasından Şahsuvar bəy Şah Məhəmməd Xudabəndənin zamanında *qapuçubaşı,* onun oğlu Təhmasibqulu bəy *qapuçu* kimi xidmət edirdirlər, Təhmasibqulu bəy I Şah Abbasın hakimiyyətinin əvvəllərində qızılbaş tayfaları arasında yaranmış qarşıdurmada fitnəkarlıq ittihamı ilə şah tərəfindən öldürülmüşdü.

Hərbi və siyasi karyerasına Səfəvilər dövlətinin sərkərdəsi kimi başlamış, istilaçı əfqanları ölkə ərazisindən qovmuş və bundan sonra özünü şah elan etmiş *Nadir şah* da Əfşar tayfasının *Qırxlu* oymağından idi.

Əfşar tayfasından bir neçə nəfər istedadlı qələm əhli çıxmışdır. *Qorçubaşı Sevindik bəyin* yaxınlarından olan Məhəmməd bəy Əfşar Şəmsi gözəl *varsağılar* (qoşma və gəraylı ilə yanaşı aşıq şeirinin bir növüdür) qoşurdu. *“Məcmə əl-xəvas”* təzkirəsində Səfəvilər dövründə yaşamış yüzlərlə istedadlı şairin, o cümlədən onlarla türk mənşəli qələm sahibinin yaradıcılığı haqqında məlumat vermiş, saray kitabxanasının rəhbərliyini idarə edən *Sadiq bəy Əfşar*, həmin əsərdə adı çəkilmiş Əmir bəy Əmiri və Dürdi təxəllüslü şairlər bu qəbildəndir.

Əfşar tayfası Azərbaycanın musiqi mədəniyyətində də öz izini qoymuşdur. “Ovşarı” aşıq havasının və eyniadlı zərb-muğamın adı bu tayfanın adından qaynaqlanır.

Əfşar tayfası aşağıda adları çəkilən bir neçə oymaqdan ibarət idi: *Ərəşlü, Gündüzlü, Qırxlu, Ovsalu (Usalu), Əbərlü, Alplu, İmanlu Əfşarı* və s. Bəzi mənbələrdə Əfşar tayfasına mənsub Bəgişlü,

Qasımlu, Qutulu, Əmirlü, Tərzilü, Mahmudlu, Yəhərlü, Yorğanlu, Babalu, İmirlü, Kosaəhmədlü, Davudlu, Təkəşlü, Kuhgiluyəlü, Kərəclü, Giləlü, Tutmaqlu, Qılıclu, Şahboranlu və digər oymaqların da adlarına rast gəlinir. Bu oymaqlardan bəzilərinin adına XVII əsr mənbələrində rast gəlinmədiyi üçün onların son Səfəvi və daha sonrakı dövrlərdə təşəkkül tapması mümkündür. İri Əfşar oymaqlarının bir qismi Səfəvilər dövləti yaranmazdan əvvəl bu torpaqlarda yaşamış, bir qismi XVI əsrin əvvəllərində Mənsur bəyin başçılığı altında Anadoludan köçüb gəlmiş, bəzi oymaqlar isə daha sonralar – ehtimala görə, I Şah Abbasın zamanında Səfəvilər dövlətində özünə sığınacaq tapmışdır.

**ALPLU** – qızılbaş *Əfşar* tayfasının oymaqlarından biri. Oymaq Hələb türkmanları tayfa birliyinə aid idi. Səfəvilər dövlətinin torpaqlarına köç etdikdən sonra alplular Kuhgiluyə məntəqəsində məskunlaşmışdılar. Xorasan vilayətindəki Fərah və Əsfuzar məntəqələrinin valisi Ərdoğdu xan Alplu oymağına mənsub idi. Digər Alplu əmiri İsmayıl xanın adına hələ 1590-cı ildə Kirman bölgəsində tiyullar verilmiş əmirlərin siyahısında rast gəlinir. Sonralar İsmayıl xan Kazerun hakimliyinə layiq görülmüş, daha sonra Ərdoğdu xanın yerinə Fərah hakimi təyin edilmişdi. Bəzi mənbələrdə onun bir müddət Vəli xanla şərikli surətdə Kirmanı idarə etdiyi də qeyd olunub.

**AVŞAR** – *bax:* **ƏFŞAR.**

**ƏBƏRLÜ** – qızılbaş *Əfşar* tayfasının oymaqlarından biri. I Şah Abbasın hakimiyyətə gəlişindən əvvəl Qəzvin ətrafında məskunlaşmışdı. Şah Məhəmməd Xudabəndə zamanındakı hadisələrlə bağlı adları çəkilən bir neçə şəxs, böyük ehtimalla, bu oymağın yetirməsi idi. Onlardan biri *qorçubaşı* Qulu bəydir ki, Şah Məhəmməd Xudabəndənin hakimiyyətə gəlişi ərəfəsində Əfşar tayfasının ən nüfuzlu əmirlərindən sayılırdı, buna görə də tayfanın ağsaqqalı elan edilmişdi. Lakin sonralar o, şahzadə *Həmzə Mirzə* tərəfindən cəzalanacağından qorxub osmanlılara sığındı. Onun oğlu Yusif xan atasının yerinə qorçubaşı təyin edildi, amma I Şah Abbası hakimiyyətə gətirmiş *Mürşidqulu bəy Ustacluya* qarşı intriqada iştirakının üstü açılanda həbsə atıldı. Bir müddətdən sonra ölkədə yaranmış qarışıqlıqdan istifadə edən Yusif xan həbsdən çıxıb Əbərquh bölgəsi üzərində hakimiyyəti ələ keçirdi. I Şah Abbas hakimiyyətə gəldikdən sonra Kirman qalasına pənah aparmış Yusif xanı cəzalandırdı.
Qulu bəyin qohumlarından olan Kirman hakimi Vəli xan dövrünün güclü fiqurlarından idi, I Şah Abbas zamanında dövlətdə ən uca rütbələrdən olan qorçubaşı vəzifəsi ona verilmişdi. Onun oğlu *Bektaş xanı* salnamələrdə çox tədbirli bir şəxs kimi xarakterizə etmişlər. Bektaş xan bəzi gözdən düşmüş qızılbaş əmirlərinin sərvətini öz əlinə keçirməyə müvəffəq olmuş, Səfəvilərlə qohum



olan hörmətli seyid nəslinin nümayəndəsi Mirmiran Yəzdinin qızını almaqla Yəzd hakimliyinə də yiyələnmişdi. Axırda Bektaş xan Fars hakimi *Yaqub xan Zülqədərlə* döyüşdə öldürüldü.

Əbərlü oymağı I Şah Abbas tərəfindən Əbivərdə köçürülmüşdür. Burada onlar *Gündüzlü* oymağı ilə kompakt şəkildə yaşayırdılar. I Şah Abbas Əbivərdə köçürülmüş əbərlülərə gürcü mənşəli Cəmşid sultanı əmir təyin etmişdi.

**ƏRƏŞLÜ** – qızılbaş *Əfşar* tayfasının böyük oymaqlarından biri. Mənsur bəy zamanında (XVI əsrin əvvəlləri) Səfəvilər dövlətinə köç etmiş bu oymaq əvvəlcə Kuhgiluyə bölgəsində məskunlaşmışdı. Bəzi mənbələrdə qeyd edilir ki, Əfşar tayfasının Ərəşlü oymağının başçısı Murad xan I Şah İsmayıla tabe olmaqdan imtina etdiyinə görə edam olunmuş, bundan sonra əfşarlar müqavimətdən əl çəkib qızılbaşlığı qəbul etmişdilər.

Şah Məhəmməd Xudabəndə zamanında Ərəşlü boyu Əfşarın *Ovsalu* boyu ilə birlikdə əsasən İsfahan ətrafında yaşayırdı. Digər qızılbaş oymaqlarının əksəriyyəti kimi, ərəşlülərin də adına Səfəvilər dövlətinin ilk onilliklərinə aid mənbələrdə rast gəlmək çətindir. O zamanadək Əfşar tayfasının əksər nümayəndələrinin adları oymaq mənsubiyyəti göstərilmədən qeyd edilirdi. II Şah İsmayıl və Şah Məhəmməd Xudabəndənin hakimiyyətləri dövründə Ərəşlü oymağının ən nüfuzlu əmiri *Əmiraslan sultan* sayılırdı; o, II Şah İsmayılın gizli göstərişi ilə bəzi qətl sifarişlərini də yerinə yetirirdi.

1590-cı ildə I Şah Abbas Əmiraslan sultanın oğlu Təhmasibqulu xanı Həmədan valisi təyin edərək ona Nəhrivan şəhərini osmanlılardan geri almağı tapşırdı, amma Təhmasibqulu xan bu işin öhdəsindən gələ bilmədiyi üçün növbəti il edam olundu.

I Şah Abbasın hakimiyyətinin əvvəllərində Kuhgiluyədə yaranmış qarışıqlıq nəticəsində Həsən xan Əfşar bölgənin hakimliyinə yiyələndi, amma sonra şahın qəzəbinə uğrayıb qohumları ilə birlikdə həbs edildi. Onun yerinə Əmir sultan Əfşar Kuhgiluyə hakimi təyin edildi, lakin bölgədəki *Ərəşlü* və *Gündüzlü* oymaqları onun başçılığını qəbul etməyib Xəlil xanın nəvəsi Əbülfəth bəyə tabe oldular. Onlar hətta yaxınlıqdakı Ərəbistan (Hüveyzə) valisindən yardım istədilər. I Şah Abbas qəzəblənib gürcü mənşəli *qullarağası Allahverdi xanı* qoşunla onların üzərinə yolladı. Allahverdi xan itaətsizlik edənləri cəzalandırdı, tabeliyindəki qullardan birini Kuhgiluyədəki əfşarların başçısı təyin edib geri qayıtdı.

O dövrdə Ərəşlü oymağının ağsaqqalı (lideri) Hacı Mehdiqulu idi.

I Şah Abbas zamanında Ərəşlü oymağının əmirlərindən biri Zəhrimar sultan idi. (Zülqədər tayfasından Şahqulu sultanın oğlu Əbülqasim xan Zəhrimarla qarışdırmamalı). Ehtimala görə, tünd xasiyyəti üzündən bu ləqəbi almış Zəhrimar sultandan şahın da xoşu gəlmirdi. *Ustaclu* tayfasının *Gözüböyüklü* oyma-

ğından Qənbər sultan onu saraya gətirməyə və Ərəşlü oymağını yaşadığı yerdən köçürməyə məmur edildi. Zəhrimar sultan qaçıb həmtayfası Bədr xana sığındı, lakin onun tərəfindən saraya təslim edildi. Ərəşlü oymağını isə Qənbər sultan Rey və Simnan ətrafına köçürdü. Ərəşlü oymağının bir qismi daha sonra Urmiya ətrafında məskunlaşdı.

**GÜNDÜZLÜ** – qızılbaş *Əfşar* tayfasının oymaqlarından biri. Hələb türkmanlarının nəzərəçarpacaq bir qismi Gündüzlü əfşarlarından ibarət idi, Səfəvilər dövlətində yaşayan Gündüzlü oymağı da onların bir hissəsini təşkil edirdi. Onlar indiki Türkiyənin Hatay ili ərazisində məskunlaşmışdılar. Digər əksər əfşar oymaqarı kimi, gündüzlülər də əsasən Kuhgiluyə və Xuzistan bölgələrində məskunlaşmışdılar. Sonra onların bir hissəsi Xorasanın Əbivərd məntəqəsinə, bir hissəsi də Urmiya ətrafına köçdü.

I Şah Abbasın zamanında Əmir sultan Əfşar Kuhgiluyə hakimi təyin edilən zaman bölgədəki *Ərəşlü* və *Gündüzlü* oymaqları onu qəbul etməyib Xəlil xanın nəvəsi Əbülfəth bəyə tabe oldular. Şahın əmri ilə gürcü mənşəli *qullarağası Allahverdi xan* itaətsizlik edənləri cəzalandırdı və tabeliyində olan qullardan birini Kuhgiluyədəki əfşarların başçısı təyin etdi.

Gündüzlü oymağının bir neçə nümayəndəsi Xuzistan məntəqəsində hökm sürürdü. Onların başçısı Şüştər hakimi Mehdiqulu sultan 1540-cı ildə aradan götürüldü və qardaşı *Sevindik bəy* onun yerinə keçdi. Qısa müddətdə Xuzistan hakimiyyətində bir neçə şəxs bir-birini əvəz etdi, onların hamısı Əfşar tayfasının Gündüzlü oymağından idi: Sevindik bəy, Heydərqulu sultan, Əbülfəth sultan.



**İMANLU ƏFŞARI** – qızılbaş *Əfşar* tayfasının oymaqlarından biri. Onlar əsasən Anadoludakı Zülqədərli elində məskunlaşmışdılar. Şah Məhəmməd Xudabəndənin və hətta ola bilər ki, I Şah Abbasın zamanında İmanlu əfşarlarının bir hissəsi Səfəvilər dövlətinin ərazisinə köç etdi. Bundan əvvəlki dövrlərə aid məlumatlarda oymağın adına rast gəlinmir. İmanlu əfşarlarının görkəmli nümayəndələrindən biri 1590-cı illərdə Həmədan ətrafındakı torpaqlarda hakimlik etmiş Qasim sultandır. O, 1603/04-cü illərdə Lur hakiminin qüvvələri ilə müttəfiq şəkildə hərəkət edərək Mosulun Osmanlı valisi Uzun Əhməd paşanı məğlub edib əsir tutmuşdu. Lakin bir ildən sonra osmanlıların güclü hücumu, tabeliyindəki qarnizonun zəifliyi və vəba xəstəliyi qarşısında Qasim sultan Mosulu boşaltmağa məcbur olmuşdu. 1625-ci ildə şəhəri geri almağa göndərilmiş qoşunun sərkərdələri arasında Qasim xanın oğlu Kəlbəli sultan da var idi. Həmin yürüşə Qasim sultanın başçılıq etməməsi bunu ehtimal etməyə əsas verir ki, öz əmirlərinin ən kiçik qüsurlarını belə cəzasız buraxmayan I Şah Abbas Qasim sultanı uğursuzluğuna görə ya həbs etmiş, ya da



öldürmüşdü. 1627-ci ildə Kəlbəli xan İmanlu Əfşar Urmiya valisi idi. Qasim sultanın Bayram xan adlı daha bir oğlunun da adı Səfəvilər dövrü əmirlərinin arasında qeyd edilir.

**QIRXLU** – qızılbaş *Əfşar* tayfasının oymaqlarından biri. Mənbələrdə Qırxlu bəzən Əfşar tayfasının müstəqil oymağı, bəzən də *Əbərlü* və ya *Gündüzlü* oymağının bir qolu kimi təqdim edilir. Hərbi karyerasına Səfəvilərin sərkərdəsi kimi başlamış, dövlətin torpaqlarını əfqan istilaçılarından tam təmizləmiş, bundan sonra özünü şah elan etmiş və Səfəvilər dövlətinin ərazisini daha da genişləndirməyə nail olmuş *Nadir şah Əfşar* Qırxlu oymağından idi.
Qırxlu oymağının ilk vətəni Orta Asiyadır, monqol istilaları nəticəsində onlar Azərbaycan torpaqlarına köçmüşdülər. I Şah İsmayıl özbəklərin hücumu qarşısında Səfəvilərin mövqeyini möhkəmlətmək üçün Qırxlu oymağını Xorasanın Əbivərd və Mərv bölgələrində məskunlaşdırmışdı. Sonrakı Səfəvi şahları və Nadir şah zamanında Qırxlu oymağının digər bölgələrə səpələnmiş qolları Xorasana köçürülmüş, bununla da oymağın Xorasanda kompakt şəkildə məskunlaşması müəyyən mənada təmin edilmişdi.

**OVSALU** – *bax:* **USALU.**

**USALU** (**OVSALU**) – qızılbaş *Əfşar* tayfasının oymaqlarından biri. Mənbələrdə adı Usanlu, Usallu, Ovsalu və digər şəkillərdə də qeyd edilib. Usalu oymağı *Ərəşlü* və *Gündüzlü* kimi oymaqlara nisbətən o qədər də güclü deyildi və daha az sayda hərbi qüvvəyə malik idi. Hələ I Şah Abbas hakimiyyətə gəlməzdən əvvəl Usalu oymağı İsfahan ətrafında məskunlaşmışdı. Ehtimal olunur ki, I Şah Abbas zamanında oymaq Kürdüstan torpaqlarına köçürülmüşdür. Çünki Kürdüstandakı Gavərud məntəqəsinin hakimi İmamqulu sultan bu oymağa mənsub idi.
Usalu oymağının bir hissəsi Osmanlı dövləti ərazisində sonralar da yaşamışdır. Səfəvilər dövlətinə köç etmiş usaluların nümayəndələri XVIII əsrdə də bölgənin siyasi həyatında və inzibati idarəçiliyində kifayət qədər əlamətdar rol oynamışlar.
Azərbaycanın Quba şəhərində də bu oymağın nümayəndələri yaşayır.

**XINISLU** – qızılbaş tayfalarından biri. Adını "Xunuslu" şəklində də yazırlar. Xınıs Ərzurum ətrafında qədim yaşayış məskəninin adıdır, tayfanın kökü və ilk məskəni bura olmuşdur. Xınıslu tayfasının bəzi üzvləri hələ *Şeyx Heydər* zamanında *qızılbaşlığı* qəbul etmişdilər. Bu tayfa Səfəvi tarixinin ilk dövrlərindən baş verən hadisələrdə fəal iştirak etmiş, I Şah İsmayılın başçılığı altında həyata keçirilən dövlət quruculuğu prosesinə öz töhfəsini vermişdir. 1501-ci ildə Şirvanşahlar üzərində qələbədən sonra şah *Məhəmməd bəy Ustaclu* ilə *İlyas bəy Ayqut oğlu Xınıslunu* Bakı qalasının fəthinə göndərmişdi. Bu, ilk Sə-

fəvi sərkərdələri arasında Xınıslu tayfası üzvlərinin də mühüm yer tutduğunu göstərir. Sultan Murad üzərində qələbə çaldıqdan sonra fəth etdiyi torpaqları öz silahdaşları arasında bölüşdürən I Şah İsmayıl Rey hakimliyini İlyas bəy Xınısluya vermişdi.

I Şah Təhmasibin hakimiyyət illərində Səfəvi-Osmanlı müharibəsində Xınıslu tayfasından Qayıtmaz bəy fərqlənmişdi. *"Tarixi-aləmarayi-Abbasi"* kitabında I Şah Təhmasibin vəfatı ərəfəsində Xınıslu tayfasından cəmi bir əmirin – Hüseynxan sultanın adı çəkilsə də, onun mötəbər əmir olduğu vurğulanır. 1576-cı ildə II Şah İsmayılın hakimiyyətə gəldiyi günlərdə mövcud qarışıqlıqdan istifadə edən bəzi qızılbaş əmirləri öz köhnə tayfa ədavətlərini yada salaraq intiqam almağa başladılar. O zaman *Əmir xan Mosullu-Türkmanla* Hüseynxan sultan Xınıslu birləşərək Vəramindəki *ustacluların* başçısı Piri bəy Qoçulunun evinə basqın etmiş, onunla birlikdə xeyli ustaclunu qətlə yetirmişdilər. II Şah İsmayıl həm Ustaclu tayfasının ağsaqqalı *Pirə Məhəmməd xanın*, həm Şəki hakimi *Şamxal sultanın*, həm də Hüseynxan sultan Xınıslunun qızları ilə evlənmişdi.

Səfəvilər dövründə qələmə alınmış *"Qızılbaşlar tarixi"* kitabında Xınıslu tayfasına ayrıca fəsil ayrılmışdır. Lakin müəllif bu fəsildə *Rumlu* tayfasına mənsub olan əmirləri (*Div sultan*, Ədhəm bəy, Süleyman sultan, Əmir sultan, *Sufiyan xəlifə*, Nurəli xəlifə, *Aras sultan* və b.) Xınıslu tayfasına aid etmişdir. Bunların arasında Hüseyncan sultandan da bəhs edən müəllif onu Div sultanın sərkərdəsi Süleyman sultanın oğlu kimi təqdim edir, Əmir sultan Rumlunun köməyi ilə Rey hakimi olduğunu, daha sonra Çuxursəd *əmir əl-ümərası* təyin edildiyini, amma *İrəvana* hücum edən Osmanlı qoşunu ilə qarşılaşmaqdan çəkindiyini, nəhayət, 1551-ci ildə vəfat etdiyini yazır. Rumlu tayfasından olan sərkərdələrin Xınıslu kimi təqdim edilməsinə digər mənbələrdə rast gəlinmir. Burada nəzərə çarpan ikinci uyğunsuzluq budur ki, *İsgəndər bəy Münşi* Hüseyncan sultanın I Şah Təhmasibin vəfatı zamanı sağ olduğunu yazır, amma "Qızılbaşlar tarixi"ndə isə onun 1536-cı ildə dünyasını dəyişdiyi göstərilir. Ehtimal etmək olar ki, I Şah Təhmasibin uzun sürən hakimiyyət dövründə Səfəvilər dövlətində müəyyən fasilə ilə Xınıslu tayfasından Hüseyncan sultan adlı iki əmir xidmət etmişdir. (Ola bilər ki, bunlar qohum olmuşlar).

*"Təzkirət əl-müluk"* əsərində Xınıslu tayfasının Şirvan bəylərbəyliyinə tabe olduğu qeyd edilir, bu fakt tayfanın Azərbaycan ərazisində, Şirvan bölgəsində yerləşdiyini söyləməyə əsas verir.



**XUNUSLU** – *bax:* **XINISLU.**



**İSPİRLÜ** – qızılbaş tayfalarından biri. Öz adını Ərzurum ətrafındakı İspir məntəqəsindən götürmüşdür. *Oruc bəy Bayatın* kitabında verilmiş qızılbaş tayfalarının siyahısında İspirlünün də adı vardır. XVI əsrdə İspirlü tayfası Çuxur-



səd bəylərbəyliyinin ərazisində məskunlaşmışdı. I Şah İsmayıl zamanında qızılbaşlar *Div sultan Rumlunun* sərkərdəliyi altında bölgədə uğurlu hərbi əməliyyatlar apararaq Osmanlı-gürcü birləşmələri tərəfindən ələ keçirilmiş onlarla qalanı, o cümlədən İspiri də geri qaytarmağa nail olmuşdular (1517).

I Şah Təhmasib dövründəki əmirlərdən biri bu tayfanın yetirməsi olan Əli bəy idi. I Şah Abbasın vəfatı ərəfəsində Sərab və Ərdəbildə bu tayfaya mənsub olan Şikari sultan hakimlik edirdi. İspirlülər öz yurdlarının osmanlılar tərəfindən istila edilməsinə qarşı şiddətli müqavimət göstərmişdilər.



**KÜRD və LUR TAYFALARI** – Səfəvilər dövlətinin təşəkkülündə və idarəçiliyində qeyri-türk tayfaların da özünəməxsus rolları olmuşdur. Qeyri-türk tayfalara əsasən kürd və lur tayfaları aid idi. (*Talış* tayfasının da türkdilli və ya irandilli olması mübahisəlidir). Səfəvilər dövlətində kürdlər əsasən *Çigini* (Çəkəni), Ruzəki, Mükri, Pazuki, Siyahmənsur, Zəngənə, Zig və Ərdəlan tayfaları şəklində təmsil olunurdular. Bu tayfalar dövlətin ərazisi boyunca müxtəlif bölgələrdə qarışıq şəkildə məskunlaşmışdı. Məsələn, Zəngənə tayfası əsasən Kirmanşahda, Ərdəlan tayfası öz adını daşıyan məntəqədə (Kirmanşahın şimalında), pazukilər Tehran ətrafında, mükrilər Urmiya gölünün cənubundakı Məhabadda, türkləşmiş olan Dünbüli tayfası Xoy və Səlmas ətrafında üstünlük təşkil edirdi. *Çigini* tayfasının kürd mənşəli olması barədə tədqiqatçılar arasında fikir ayrılığı vardır.

Kürd tayfalarının böyük bir qismi Səfəvilər dövlətinin tarixi boyunca mütəmadi olaraq mərkəzi hakimiyyətə qarşı itaətsizlik göstərmiş, müxtəlif bölgələrdə davamlı olaraq kürd qiyamları baş vermişdir. Səfəvi şahları bu qiyamları yatırmaq üçün həm türk qızılbaş, həm də kürd mənşəli tayfalardan və sərkərdələrdən istifadə edirdilər. Döyüşkən millət olan kürdlərin üsyanlarını yatırmaq adətən çətinliklə başa gəlirdi.

I Şah Təhmasibin vəfatı ərəfəsində (1576) Səfəvilər dövlətində yüksək vəzifə sahibi olan kürd mənşəli əmirlərin adı *“Tarixi-aləmarayi-Abbasi”* kitabında qeyd edilmişdir: Şərəf xan Ruzəki, məşhur tarixçi Şərəf xan Bidlisi, Xəlil sultan Siyahmənsur, *Budaq xan Çigini*, Qılıc xəlifə Pazuki, Teymur xan Ərdəlan.

Müəllif kitabın növbəti bölümlərində I Şah Abbasın vəfatı ərəfəsində (1629) hakimiyyətdə olmuş 17 nəfər kürd və lur əmirinin də siyahısını təqdim etmişdir: Çigini tayfasından Mərv hakimi Aşur xan və Səbzəvar hakimi Cami Sultan oğlu Əhməd sultan, Dünbüli tayfasından Salman xan subaşı və Bərgüşad hakimi Maqsud sultan, Siyahmənsur tayfasından İsfərain hakimi İmamqulu sultan və Rzaqulu sultan, Zig tayfasından Qəndəhar hakimi *Gəncəli xan* oğlu Əlimərdan bəy, Ərdəlan tayfasından Xanəhməd xan, Şəqaqi tayfasından Əlican sultan, Fiyli tayfasından Luristan bəylərbəyi Hüseyn xan Abbasi Lurfiyli, Cahangir xan oğlu Xəlil xan lur, Bayraməli

sultan sufi, Zəncan hakimi Gədayi sultan Kulani, Qələndər sultan Kiləgir, Mustafa sultan Cüstani, Nəfəs sultan Gorus və Şirvan əmirlərindən Şücaəddin sultan Sevərlə. Bu əmirlərin əksəriyyətinin fəaliyyəti barədə klassik mənbələrdə məlumat azdır və ya yox dərəcəsindədir.

**QACAR** – böyük qızılbaş tayfalarından biri. Oğuz tayfa ittifaqının 24 boyundan biri olan *Bayat* boyunun bir qoludur. Qacarların qədim zamanlarda Orta Asiyadan Anadolu torpaqlarına köçdüyü barədə məlumatlar vardır, onların bir qolu isə Şam bölgəsində məskunlaşmışdı. Buradakı qacarlar *Zülqədər* tayfası ilə qonşuluq şəraitində yaşayırdılar, hətta bu tayfaların bəzi oymaqları bir-birinə qaynayıb-qarışmışdı. Bəzi müəlliflər qacarların monqol yürüşlərindən də əvvəl Orta Asiyadan indiki Cənubi Azərbaycan torpaqlarına köç etdiklərini, Elxanilər zamanında Şam diyarına köçüb *Şam Bayatı* tayfa birliyinə qoşulduqlarını, daha sonralar Əmir Teymur Ankara səfərindən dönərkən onları yenə Azərbaycana qaytardığını yazırlar.

Qaraqoyunlu dövlətinin süqutundan sonra Şam və Anadoludakı qacarların böyük bir hissəsi Ağqoyunluların xidmətinə keçərək Şimali və Cənubi Azərbaycan torpaqlarında yerləşdi. XV əsrin sonlarında onların bir qismi qızılbaşlığı qəbul edərək *Şeyx Heydərə* qoşuldu. Həmin dövrdən etibarən Gəncə ətrafında yurd salmış qacarlar barədə salnamələrdə məlumatlar mövcuddur. Səfəvi hakimiyyəti dövründə Qacar tayfası əsasən mərkəzi Gəncə olan Qarabağ bəylərbəyliyinin ərazisində, *Otuz iki*, *Qazaqlar*, *Qaramanlu* və digər qızılbaş tayfaları ilə birlikdə məskunlaşmışdı.

Göründüyü kimi, Qacar tayfası hələ I Şah İsmayıldan əvvəl qızılbaş hərəkatına qoşulmuşdu. 1488-ci ildə Şeyx Heydərin ölümü ilə nəticələnmiş Tabasaran döyüşündə qızılbaş dəstəsinin sağ cinahına "Tozqoparan" ləqəbli *Qara Piri bəy Qacar* başçılıq edirdi. O, Şeyx Heydərdən sonra böyük oğlu *Sultan Əlinin*, daha sonra kiçik İsmayılın yanında yer tutmuş, ilk döyüşlərdə xüsusi şücaət göstərmişdi. *"Aləmarayi-Səfəvi"dən* məlum olur ki, I Şah İsmayıl Qara Piri bəyi doğma atası kimi sevir və hətta ona "ata" deyə müraciət edirdi. Bəzi mənbələr Qara Piri bəy Qacarın Ağqoyunlu Əlvənd Mirzənin qoşununun ön dəstəsi ilə döyüşdə (1501), bəziləri isə *Nəcmisaninin* rəhbərlik etdiyi Səfəvi qoşunu ilə özbəklər arasında baş vermiş Qicduvan savaşında (1512) həlak olduğunu yazır.

1503-cü ildə Ağqoyunlu Sultan Muradla döyüşdə Səfəvi qoşununun *çərxçi* (avanqard) bölümü Təkəlü *İlyas bəy Halvaçıoğlunun* başçılığı altında iki min nəfər Qacar döyüşçüsündən ibarət idi. 1504-cü ildə *Hüseyn Kiya Çəlaviyə* qarşı yürüşdə Firuzkuh qalasını fəth edib oraya öz dəstəsi ilə birinci daxil olan şəxs Məhəmməd bəy Qacar olmuşdur.

Qara Piri bəyin oğlu Rüstəm bəy 1508-ci ildə Qarabağ bəylərbəyi təyin edilmişdir.



Ağqoyunlu Sultan Muradın böyük qoşununu özünün cəmi 800 nəfərlik dəstəsi ilə darmadağın etdiyinə görə I Şah İsmayıldan "cəsarətli" mənasını verən "Qudurmuş sultan" titulunu almış Əhməd sultan (vəf. 1516) da Qacar tayfasının yetirməsi olmuşdur.

"Aləmarayi-Səfəvi" kitabında I Şah İsmayıl zamanındakı 5 Qacar əmirindən bəhs edilir: Qara Piri bəy, onun oğlu Rüstəm bəy, Əhməd sultan, Mahmud bəy və Xəlil xan.

Qacar tayfasının görkəmli sərkərdələrindən biri də I Şah Təhmasib zamanında yaşamış *Gökçə sultandır* (vəf. 1555). O, İsmayıl Mirzənin (gələcək II Şah İsmayıl) *lələsi* idi. Gökçə sultan müxtəlif zamanlarda Van qalasının hakimi, Qarabağ bəylərbəyi və Nişapur valisi vəzifələrində xidmət etmişdir.

Bəzi mənbələrdə ilk Qarabağ bəylərbəyinin I Şah Təhmasib tərəfindən təyin edilmiş Gökçə sultan Qacar olduğu yazılır. Lakin hələ 1508-ci ildə I Şah İsmayıl Qara Piri bəy Qacarın oğlu Rüstəm bəyi Qarabağ bəylərbəyi vəzifəsinə gətirmişdi.

I Şah Təhmasibin hakimiyyət dövründə qızılbaş əmirləri sırasında Qacar tayfasından *təvaçıbaşı* və Qəndəhar valisi Budaq xan (Qəndəharı iki dəfə özbəklərə təslim etdiyi üçün gözdən düşmüş, amma sonra bəzi hərbi uğurlar qazanmış və döyüşdə öldürülmüşdür), Xorasandakı bəzi məntəqələrin hakimi olan Budaq (və ya Qubad) sultan, Qaya bəy və oğlu Əhməd bəy, Şirvanda mülk sahibi olan Hüseyn bəy, *ələmdarbaşı* Əbülqasim xüləfa, Şəki valisi təyin edilmiş Toygün bəy, Bayram bəy, Mirzəli bəy, Əliqulu bəy, Şikəmoğlu Süleyman sultan, *Ağçalu* oymağından Damğan və Bistam valisi Əli xəlifə, İstanbula elçi qismində göndərilmiş Şahqulu ağa və yüzbaşı Əli ağa, *divanbəyi* Mirzə Əli sultan və başqalarının adları mənbələrdə qeyd edilmişdir.

Qacar tayfasının mühüm simalarından biri də *Ziyad bəydir*. XV əsrin sonlarında Gəncə ətrafında məskunlşmış qacarların başçısı olan Ziyad bəy sonralar Qacar tayfasının ən mühüm qollarından birinə çevrilmiş *Ziyadoğulları* sülaləsinin əcdadıdır. Təqribən əsr yarımlıq müddət ərzində Gəncə və Qarabağ bəylərbəyiləri məhz bu sülalənin nümayəndələri arasından seçilib təyin edilmişdir. (Bu barədə "*Ziyadoğulları*" maddəsində məlumat verilmişdir).

Qacar tayfasının nümayəndələri I Şah Abbas və sonrakı hökmdarların zamanında dövlətdə yüksək mövqeyə sahib olmuşlar. Bu dövrdə yaşamış Qacar mənsublarından Çuxursəd bəylərbəyi *Əmirgünə xan*, *söhbət yasavulu* Alpan bəyin, Səbzəvar valisi Qubad xan oğlu İmamqulu xanın adları mənbələrdə öz əksini tapmışdır. I Şah Abbasın vəfatı ərəfəsində Qacar tayfasından vəzifə sahibi olan iki əmirin adı kitablarda qeyd edilir. Bunların biri Çuxursəd bəylərbəyi Əmirgünə oğlu *Təhmasibqulu xan*, digəri isə *İyirmidörd* oymağından Bərdə hakimi Peykər xan idi.

1655-ci ildə Azərbaycan (Təbriz) bəylərbəyliyinə bundan əvvəl Çuxursəd bəy-

lərbəyi və Ərdəbildəki Şeyx Səfi təkkəsinin mütəvəllisi olmuş *qorçubaşı* Mehrab xan oğlu Mürtəzaqulu xan Qacar təyin edildi. 1663-cü ildə o, edam cəzasına məhkum edilərək bütün əmlakı müsadirə olundu, oğlu Mustafaqulu xan da həbsə atıldı. Həmin ildə İmamqulu xan Qacar qorçubaşı vəzifəsinə gətirildi.

Qacar tayfası bir neçə oymaqdan ibarət olmuşdur: *Ağcaqoyunlu, Ağçalu, Şam Bayatı, Yıva, İyirmidörd* və s.

**AĞCAQOYUNLU** – qızılbaş *Qacar* tayfasının oymaqlarından biri. Anadoluda məskunlaşmış Ağcaqoyunlu oymağının bir qolu olaraq Səfəvi dövlətinin ərazisinə köç etmişdir. Bu böyük oymağın bir qismi də Şam diyarında yerləşmişdi. Anadoludakı Ağcaqoyunlu oymağı *Zülqədər* tayfası ilə qaynayıb-qarışmışdı. Təsadüfi deyil ki, Zülqədər tayfasının oymaqlarından biri *Ağçalu (Hacılar)* adlanırdı. Bəzən Ağcaqoyunlu və Ağçalu oymaqlarını eyni qəbul edirlər. I Şah Təhmasibin zamanında yaşamış Damğan və Bistam hakimi Əli xəlifənin adı Ağçalu və Ağcaqoyunlu kimi mənbələrdə qeyd olunmuşdur.

Ağcaqoyunlu oymağının ən görkəmli yetirməsi "Saru Aslan" ləqəbli *Əmirgünə xan Qacardır*. Zadəgan sülaləsindən deyil, sadə kəndli ailəsindən çıxmış Əmirgünə xan əvvəlcə Qəzvin şəhərinin darğası işləmiş, Səfəvi-Osmanlı müharibələrində fərqləndiyinə görə 1605-ci ildə osmanlılardan geri alınmış Çuxursəd vilayətinə *bəylərbəyi* təyin edilmişdir. Təqribən 20 il bu vəzifədə qalmış Əmirgünə xan 1612-ci il *İstanbul sülh müqaviləsinin* sənədlərinin hazırlanmasında Səfəvilər tərəfindən səlahiyyətli şəxs qismində çıxış etmişdi.

Əmirgünə xan vəfat etdikdən (1625) sonra Çuxursəd bəylərbəyliyi onun oğlu *Təhmasibqulu xana* həvalə olunmuşdu. Təhmasibqulu xan 1635-41-ci illər arasında Osmanlı əsirliyində qalmışdır. Əmirgünə xanın digər oğlu Gülabə bəy Qacar (Ağası bəy) 1645-ci ildə saray intriqasının qurbanı olmuşdur.

**İYİRMİDÖRD** – qızılbaş *Qacar* tayfasının böyük oymaqlarından biri. Bu oymaq Qacar tayfasına sonralar daxil olmuşdur. İyirmidörd oymağı, adından da göründüyü kimi, 24 qoldan ibarət idi, Bərdə və Yavlaq (indiki Yevlax) bölgəsində məskunlaşmışdı. Mənbələrdə İyirmidörd oymağının qollarının adları aşağıdakı şəkildə qeyd edilmişdir: Alışarlu, Bəxşayişlü, Bəxtiyarlu, Dərəbəylü, Dədəxəlillü, Dördlər, Dürhəsənlü, Ərəblü, Gödə Əhmədlü, Gögçəklü, Molla Əlilü, Pirə Mahmudlu, Saru Hacılu, Seyidi Zəng, Tobılu, Toqaclu, Tüləki, Tüllü, Varvara, Yasavullu, Yollu, Zənd və Xəllacan.

I Şah Abbas zamanında Bərdə hakimi olan *Peykər sultan* bu oymağın görkəmli simalarından idi. O, Kaxetinin üsyankar gürcü hakimlərini cəzalandırmaq üçün şahın əmri ilə hərbi yürüşlər təşkil edirdi. 1620-ci ildə o, şah tərəfindən xan rütbəsi alaraq ailəsi və oymağı ilə birlikdə Kaxetiyə köçmüş, amma möhkəmləndiyi qalanı əldə saxlaya bilmə-



mişdi. Gürcüstan səfərlərinin birində Peykər xanın qardaşı Həsənəli bəy tüfəng gülləsindən həlak olmuşdu (1616/ 17).



**ŞAM BAYATI** – qızılbaş *Qacar* tayfasının oymaqlarından biri. Şamda məskunlaşmış, qışı Hələb ətrafında keçirən eyniadlı oymağın bir hissəsi idi. Səfəvilər dövlətinə köç etmiş Şam Bayatıların hər hansı görkəmli nümayəndəsi barədə salnamələrdə məlumata rast gəlinmir.



**YIVA (YUVA)** – qızılbaş *Qacar* tayfasının oymaqlarından, qədim Oğuz tayfa birliyinə aid 24 boydan biri. Adı qədim mənbələrdə, o cümlədən Mahmud Kaşğarinin "Divan lüğat ət-türk" əsərində çəkilir. Yıva oymağının bir hissəsi Osmanlı ərazisində, *Zülqədər* elində, eləcə də Hələb türkmanları arasında yaşayırdı. Qacar tayfasının Yıva oymağının ən mühüm siması *İmamqulu xandır*. O, II Şah İsmayıl zamanında *Peykər sultan Ziyadoğludan* sonra Qarabağ *bəylərbəyi* təyin edilmişdir. Bu, *Çıldır savaşında* (1578) Çuxursəd bəylərbəyi *Məhəmmədi xan Toxmaq Ustaclu* ilə müttəfiq şəkildə Osmanlı ordusuna qarşı döyüşüb məğlub olmuş, *Mollahəsən savaşına* Qarabağ döyüşçüləri ilə birlikdə qatılıb Səfəvi qoşununun qələbəsini təmin etmiş şəxsdir. Gəncə şəhəri və Qarabağ uğrunda osmanlılarla ardıcıl döyüşlər aparan İmamqulu xan 1588-ci ldə dünyasını dəyişmişdir.

**ZİYADOĞULLARI** – Səfəvilər zamanında mühüm dövlət vəzifələri tutmuş qızılbaş *Qacar* tayfasına mənsub ən nüfuzlu nəsillərdən biri. Təqribən əsr yarımlıq müddət boyunca Səfəvilər dövlətində Gəncə və Qarabağ *bəylərbəyiləri* bu nəslin nümayəndələri arasından seçilmişdir.

Ziyadoğulları sülaləsinin əcdadı XV əsrin sonlarında Gəncə ətrafında məskunlaşmış Qacarların başçısı olan *Ziyad bəydir*. Əsl adı Xızır bəy oğlu Əmət bəy olan bu şəxsə Ziyad ləqəbini I Şah İsmayıl vermişdir. (Bəzi kitablarda Əmət adı Ümmət şəkilndə də yazılır). Ziyad bəy I Şah İsmayıla hələ Lahicanda qoşulmuşdu, yəni Səfəvilər dövlətinin özəyini təşkil edən ilk qızılbaş əmirlərdən biri idi.

Ziyad bəyin nəslindən ilk görkəmli Qacar əmiri Qarabağ bəylərbəyi Kəmaləddin *Şahverdi sultan Ziyadoğludur*. I Şah Təhmasib Şahverdi sultanın xatirini əziz tutduğu üçün ona "müsahib" (yoldaş, rəfiq) deyirdi. Şah fərman vermişdi ki, Şahverdi xandan sonra onun nəslindən Qarabağ bəylərbəyi olacaq hər kəs "müsahib" adlandırılsın və bu ləqəb bütün fərmanlarda bəylərbəyinin adından sonra yazılsın. Səfəvilərin Qəndəhar səfərində və digər hərbi yürüşlərdə iştirak etmiş Şahverdi sultan 1567/68-ci illərdə dünyasını dəyişdi və yerinə oğlu *İbrahim sultan* keçərək Qarabağ bəylərbəyi vəzifəsinə təsdiq edildi, şahzadə *Sultan Əli Mirzənin* lələsi də o idi. I Şah Təhmasibin vəfatı ərəfəsində Qarabağın hakimliyi Şahverdi sultanın digər oğlu

*Yusif xəlifəyə* verildi, şahzadəni himayə etmək də ona tapşırıldı. Lakin şahın vəfatı zamanı Yusif xəlifə hələ *Qəzvində* idi və öz mülkünə getməmişdi. II Şah İsmayıl hakimiyyətə keçdikdən sonra Yusif xəlifəni vəzifəsindən uzaqlaşdırıb onun əmisi oğlu *Peykər sultanı* Qarabağ valisi təyin etdi. I Şah Təhmasibin vəfatından sonra baş vermiş qarışıqlıqda Yusif xəlifənin şahzadə *Heydər Mirzəyə* tərəfdarlıq etdiyini yada salan Peykər sultan onu öldürməklə şahın rəğbətini qazanacağını düşündü. Buna görə Yusif xəlifəni qardaşları və anası ilə birlikdə öldürdü, amma II Şah İsmayıl onun hərəkətini bəyənmədi və Qarabağ bəylərbəyliyini *Yıva* oymağından *İmamqulu xan Qacara* həvalə etdi. Şahverdi sultanın daha bir oğlu Xəlil sultan fiziki cəhətdən güclü və pəhləvan cüssəli adam idi, bir neçə il Astarabadda hakimlik etmiş, amma sonra qəzəbə düçar olaraq öldürülmüşdü. Şahverdi sultanın daha bir oğlunun da adı Süleyman bəy idi.

Şah Məhəmməd Xudabəndə zamanında osmanlılar tərəfindən tutulmuş Şirvan torpaqlarını azad etmək uğrunda aparılmış əməliyyatlarda Ziyadoğlu-Qacar nəslinin nümayəndələri fəal iştirak etmişlər. Yuxarıda xatırlanmış Peykər sultan Şirvan bəylərbəyi təyin edildi, Qarabağ bəylərbəyi İmamqulu xana isə əməliyyatın rəhbərliyi həvalə olundu. Peykər sultan Ziyadoğlu Şirvana hücum etmiş Krım tatarlarının başçısı Qazi Gəray xanı əsir tutdu (1581). Bundan az sonra Peykər xan xəstələnib dünyasını dəyişdi və Şirvan hakimliyi *Ənsar xəlifə Qaradağluya* həvalə edildi. İmamqulu xan Yıva Qacarın vəfatından (1588) sonra isə Gəncə və Qarabağ bəylərbəyliyinin başçısı yenə Ziyadoğlu nəslindən Şahverdi xanın nəvəsi, Xəlil xanın oğlu Məhəmməd xan oldu.

1590-cı il *İstanbul sülh müqaviləsinin* şərtlərinə əsasən Gəncə şəhəri və Qarabağ torpaqları Osmanlı dövlətinin ixtiyarına keçdikdən sonra burada qalmaq istəməyən Qacarların çox hissəsi Arazın cənubuna köç etdi. I Şah Abbas onları müvəqqəti olaraq Astarabadda yerləşdirib vilayətin hakimliyini də Hüseyn xan Ziyadoğlu-Qacara verdi. Bir neçə ildən sonra onun da qatıldığı, şahın şəxsən komandanlıq etdiyi Səfəvi qoşunu Gəncə şəhərini və Qarabağı osmanlılardan geri aldı (1606/07). Fəth olunmuş torpaqlara Hüseyn van hakim təyin edilsə də, əhali ilə yaxşı rəftar etmədiyinə görə vəzifəsindən götürüldü və Şahverdi xanın nəvəsi, Xəlil xanın oğlu Məhəmməd xan yenidən Qarabağ bəylərbəyliyinə təyinat aldı. (O, birinci dəfə bu vəzifəyə təyin edildikdən sonra osmanlılara əsir düşmüş, bir neçə ildən sonra azad edilərək Səfəvi dövlətinə qayıtmışdı). I Şah Səfinin zamanında baş vəzir olmuş *Saru Tağı* bundan əvvəl Qarabağ bəylərbəyi Məhəmməd xanın sarayında vəzir kimi xidmət edərkən iş təcrübəsi toplamışdı. Məhəmməd xan 1615-ci ildə gürcülərlə döyüşdə öldürüldükdən sonra onu əvvəlcə böyük oğlu Mürşidqulu xan, daha sonra kiçik oğlu *Məhəmmədqulu xan* əvəz etdilər. Məhəmmədqulu xanın zamanında gürcü əyanları Mouravinin



(Georgi Saakadze) başçılığı altında Qarabağa hücum edib qətl və qarətlər törətdilər. Belə bir şəraitdə I Şah Abbas *qullarağası Allahverdi xanın* oğlu, gürcü mənşəli *Davud xan Undiladzeni* Qarabağa vali göndərdi (1627).

I Şah Abbasın vəfatından bir müddət sonra Davud xan vəzifədən uzaqlaşdırılmış (1633) və I Şah Səfi yenidən Məhəmmədqulu xan Ziyadoğlu-Qacarı Qarabağ bəylərbəyi məqamına qaytarmışdır. Vəfatından sonra hakimiyyətdə onu kiçik qardaşı Mürtəzaqulu xan əvəz etdi. 1664-cü ildə Mürtəzaqulu xan dünyasını dəyişmiş və qardaşı oğlu (Məhəmmədqulu xanın oğlu) *Uğurlu xan Ziyadoğlu-Qacar* II Şah Abbasın fərmanı ilə Qarabağ və Gəncə bəylərbəyi təyin edilmişdi. Qarabağın ən nüfuzlu və güclü hakimi olmuş Uğurlu xan ədalətli, sənətə və sənət adamlarına qayğı göstərən bir şəxs idi, "*Müsahib*" təxəllüsü ilə şeirlər yazırdı. Uğurlu xandan sonra oğulları *Abbasqulu xan* və Kəlbəli xan həm Qarabağ bəylərbəyi, həm də Kaxeti valisi kimi Səfəvilər dövlətində xidmət etmişlər. Kəlbəli xandan sonra Qarabağ bəylərbəyi olmuş *II Uğurlu xan Ziyadoğlu-Qacarın* zamanında (1725) Osmanlı ordusu bir daha Qarabağ bəylərbəyliyinin torpaqlarını tutdu, iki aylıq mühasirədən sonra Gəncə şəhəri Osmanlı qüvvələrinə təslim oldu. Bundan 10 il sonra (1735) hələ Səfəvilər dövlətinin hərbi qüvvələrinin komandanı kimi xidmət edən Nadir xan Əfşar uzun sürən mühasirədən sonra Gəncə şəhərini osmanlılardan geri aldı. Səfəvilər dövlətinə qayıtmış Gəncə şəhərinə və Qarabağ bəylərbəyliyinə yenə II Uğurlu xan gətirildi. Nadir özünü şah elan etdikdən sonra Qarabağ bəylərbəyliyinin ərazisini və II Uğurlu xanın səlahiyyətlərini xeyli daraltdı. 1738-ci ildə II Uğurlu xan dağıstanlılarla döyüşdə öldürüldü. 1747-ci ildə *Nadir şahın* ölümündən sonra Şahverdi xan Ziyadoğlu-Qacar Gəncə xanlığının əsasını qoydu.



**QARACADAĞLULAR (QARADAĞLULAR)** – Səfəvilər dövlətinin idarəçilik sistemində özünəməxsus rol oynamış toplum. Səfəvilər zamanında Qaradağ (Qaracadağ) bölgəsində (Araz çayından cənubda, Təbrizin şimal-şərqində yerləşən, mərkəzi Əhər şəhəri olan vilayət) xeyli *sufi* yaşayırdı. Onlar qızılbaşların əsas yerli gücünü təşkil edirdilər. Qaracadağlular hələ I Şah İsmayılın Lahicanda gizləndiyi uşaqlıq dövründən qızılbaşların cərgəsində olub onu müdafiə etdiklərinə görə "Lahican sufiləri" kimi tanınırdılar; bu status qızılbaşlar arasında böyük imtiyaz hesab edilirdi. I Şah İsmayıl zamanında Çavuş Mirzə Qaracadağlu nüfuzlu əmirlərdən idi. Qaracadağ sufiləri orduda ayrıca hərbi bölüm şəklində xidmət edirdilər, eyni zamanda onların arasından bir neçə təriqət və dövlət xadimi də çıxmışdır. Xüsusilə şahın təriqət məsələləri üzrə baş müşaviri, qızılbaş sufilərlə şah arasında əlaqəçi sayılan *xəlifət əl-xüləfa* mənsəbinə dəfələrlə Qaracadağ sufiləri seçilmişdi (I Şah Təhmasib və Şah Məhəmməd Xudabəndə zamanında *Ənsar xəlifə Qara-*

*cadağlu,* I Şah Abbasın zamanında İlyas xəlifə və oğlu Bürhanəddin xəlifə, I Şah Səfinin dövründə Maqsud sultan və b.).

I Şah Abbas zamanında Qaracadağ sufilərinin nüfuzu xeyli artmış və bu hal şahı narahat etməyə başlamışdı. Şah Şirvan torpaqlarının Osmanlı işğalından əvvəlki son bəylərbəyi Ənsar xəlifə Qaracadağlunun düşmənə layiqli müqavimət göstərmədiyinu unutmamışdı. Üstəlik, Ənsar xəlifənin bir oğlu Şahverdi xan osmanlıların tərəfinə keçmişdi (Digər oğlu Zöhrab bəy isə Səfəvilərin tərəfində idi). I Şah Abbas hakimiyyətə keçdikdən təqribən 5 il sonra Qaracadağ sufilərini bir qədər özündən uzaqlaşdırdı, işğal olunmuş torpaqlar geri qaytarıldıqdan sonra Şahverdi xanın dəstəsindən olan qaradağlular əsir tutulanda onları ağır şəkildə cəzalandırdı.

I Şah Təhmasibin zamanında *eşikağasıbaşı* Fərruxzad bəy Qaracadağlu şahzadə *Heydər Mirzənin* tərəfdarlarından idi. O, diplomatik missiya ilə İstanbula səfər etmiş, danışıqlar gedişində iki dövlət arasında *Amasya sülh müqaviləsi* imzalanmışdı (1555).

I Şah Abbasın *süfrəçibaşı* vəzifəsinə gətirdiyi Xələf bəy Qaracadağlu I Şah Səfi zamanında da öz vəzifəsini qorumuş, bundan əlavə, orduda *çərxçibaşı* kimi xidmət etmişdir. O, 1638-ci ildə Bağdadın mühasirəsi zamanı osmanlılara əsir düşüb öldürüldükdən sonra süfrəçibaşı vəzifəsi oğulları İbrahim sultanla Maqsud sultana verildi.

**QARADAĞLULAR** – *bax:* **QARACADAĞLULAR.**

**QARAMANLU** – böyük qızılbaş tayfalarından biri. *Oruc bəy Bayatın* öz kitabında təqdim etdiyi qızılbaş tayfaları siyahısında Qaramanlunun da adı çəkilir. Qaramanluları Oğuzun Salur boyunun və ya *Əfşar* tayfasının bir qolu hesab edirlər. Tayfanın bir hissəsi Aran (Azərbaycan) torpaqlarında, əsasən Gəncə və Bərdə ətrafında məskunlaşmışdı. Hələ monqol hücumu zamanı Qaramanlu tayfasının böyük bir hissəsi buradan Sivasa köçərək, Anadoluda Qaramanoğulları adlı bəylik qurmuşdu. Tədqiqatçılar Səfəvilər dövlətinin formalaşmasında iştirak etmiş Qaramanluların Anadolu deyil, Azərbaycan mənşəli olduğunu yazırlar. 1500-cü ildə I Şah İsmayıl Anadoludakı tayfalardan özünə tərəfdar toplamaq üçün Ərzincana səfər etdi. Bu səfər zamanı müxtəlif tayfalara məxsus xeyli qızılbaş dəstə-dəstə ona qoşularaq Azərbaycan torpaqlarına gəldi və qızılbaş qoşununun əsas hissəsini təşkil etdi. Lakin o zaman Anadoludakı Qaramanlu tayfasının I Şah İsmayıla qoşulması haqqında mənbələrdə məlumat yoxdur, əksinə, ilk qızılbaş əmirlərindən olan və şahı bu səfərdə müşayiət edən *Bayram bəy Qaramanlu* geri qayıdarkən öz tayfasından deyil, *Zülqədər* və *Təkəlü* tayfalarından olan dəstəyə başçılıq edirdi.

Azərbaycandakı Qaramanlu tayfası əvvəlcə Qaraqoyunlu, daha sonra Ağqoyunlu dövlətinin tərkibində mövcud olmuşdur, bu dövlətlərə xidmət etmiş əmirlərin sırasında Qaramanluların da adları çəkilir. Qaramanlu tayfasının bəzi nümayəndələri qızılbaş hərəkatının əvvəl-



lərindən fəallıq göstərmiş, I Şah İsmayılın dövlət quruculuğu prosesində fəal iştirak etmişlər. İlk qızılbaş əmirləri sayılan yeddi nəfərin *(əhli-ixtisas)* arasında Qaramanlu tayfasının iki nümayəndəsinin adına rast gəlirik: *Bayram bəy Qaramanlu* və *Rüstəm bəy Qaramanlu*. Maraqlıdır ki, yeddi nəfərin digər beşi tək-tək tayfalara mənsub olmuş, təkcə Qaramanlu tayfası iki nəfərlə təmsil olunmuşdur. I Şah Təhmasibin zamanında Qaramanlu tayfasının başçılarından biri İbrahim xəlifə idi; o, Gürcüstan yürüşlərinin birində öldürülmüşdür. Digər Qaramanlu əmiri Hüsam bəy (Bayram bəy Qaramanlunun nəvəsi) 1567/68-ci illərdə Gilan hakimi Xan Əhmədin üsyanını uğurla yatırtdığına görə təbil və bayrağa (fərqləndirici nişanlara) layiq görüldü və Qaramanlu tayfasının başçısı elan edildi, lakin 1577-ci ildə işlətdiyi bir cinayətə görə öldürüldü. I Şah Abbasın zamanında böyük nüfuz sahibi olan, hətta şahın "övlad" deyə müraciət etdiyi, amma sonra nüfuzundan ehtiyat edərək aradan götürdüyü *Fərhad xan Qaramanlu* (vəf. 1598/99), onun qardaşları Əlvənd sultan və bir müddət Şirvan bəylərbəyi olmuş Zülfüqar xan (vəf. 1610), Zülfüqar xanın oğlu, Qızılağac hakimi Hüsam sultan da bu tayfadandır. Bununla belə, yuxarıda adları çəkilən şəxslərdən başqa Qaramanlu tayfasının nümayəndələrinin adına Səfəvi dövlətinin nüfuzlu əmirləri arasında çox rast gəlmirik. I Şah Abbas zamanında Fərhad xanla qardaşı Zülfüqar xanın öldürülməsindən sonra Qaramanlu tayfasının bir hissəsi *qorçu* kimi xidmətə götürüldü, bir hissəsi də *qulam* təbəqəsindən olan Şirvan bəylərbəyi Yusif xanın tabeliyinə verildi.



**QAZAQLAR** – Səfəvilər dövlətində yaşamış türk tayfalarından biri. *Mosullu*, *Pörnak* kimi iri tayfalarla bir sırada əvvəlcə Ağqoyunlu, daha sonra *Türkman* tayfa ittifaqına üzv olmuş, lakin onlar qədər həlledici rola malik olmamışdır. Tayfa əsasən Qarabağ ərazisində məskunlaşmış, *Qacar*, *Qaramanlu*, *Otuziki* və digər tayfalarla qonşuluq şəraitində yaşamışdır. Hazırkı Qazax rayonunun adının və digər oxşar toponimlərin Qazaqlar tayfasından qaldığını yazırlar.

Qazaqlar tayfası qızılbaşlığı qəbul etmiş, Səfəvi-Osmanlı müharibəsində *İspirlü* və digər tayfalarla bir cərgədə Osmanlı işğalına qarşı mübarizə aparmışdır. I Şah Təhmasib zamanında onların başçısı Dönməz xan idi.

Lakin XVI əsrin sonlarında Azərbaycan torpaqları osmanlılar tərəfindən işğal edildikdən sonra Qazaqlar müqavimətin mənasız olduğunu anlamış, bəzi qızılbaş tayfaları kimi öz yurdunu buraxıb Arazın o tayına köçməyə razı olmamışdı. *Cavanşir* və *Müqəddəm* kimi tayfalarla, Qacar və Zülqədər tayfalarının bəzi oymaqları ilə birlikdə Qazaqlar da Osmanlı üsuli-idarəsində yaşamış, buna görə də Səfəvi hakimiyyətində onların osmanlılarla əlbir olmaları düşüncəsi yaranmışdı.

I Şah Abbas Azərbaycan torpaqlarını

geri aldıqdan sonra adları çəkilən tayfalara "dönük" adını verdi. Osmanlıların tərəfinə keçmiş Nəzər sultan Qazaqın oğlu Məhəmməd xan Səfəvi xidmətinə qayıdaraq Lori hakimliyini qazandı. Onun gürcülərlə döyüşdə öldürülməsindən sonra yerinə qardaşı Mustafa bəy keçdi, lakin I Şah Abbasın qəzəbinə düçar olaraq öldürüldü (1614). Bundan sonra Qazaqlar tayfasına bundan əvvəl Osmanlı xidmətinə keçmiş, amma *İrəvanın* fəthi zamanı peşman olub geri qayıtmış Şəmsi xan başçı təyin edildi. Qazaqlar öz təqsirlərini yumaq üçün osmanlılara və onlarla müttəfiq olan gürcülərə qarşı igidliklə döyüşürdülər. Lakin şahın əmri ilə tayfa Səfəvilər dövlətinin mərkəz bölgəsinə – Fars vilayətinin Darabgərd məntəqəsinə köçürüldü. I Şah Abbas "dönük" tayfaların Osmanlı və Gürcüstan sərhədinə yaxın ərazilərdə məskunlaşmasını dövlət üçün təhlükə sayır və onları bölük-bölük digər məntəqələrə sürgün edirdi. Bir müddətdən sonra Şəmsi xan Ahısqa hakimi təyin edildi; bu fakt şahın sürgün əmrini ləğv etdiyini və tayfanın öz yurduna döndüyünü ehtimal etməyə əsas verir.

**LUR TAYFALARI** – Səfəvilər dövlətində məskunlaşmış qeyri-türk tayfaları arasında lurlar haqqında məlumat kürdlərdən xeyli azdır. Mənbələrdə Abbasi adlı lur tayfasının adı çəkilir, Fiyli tayfasının da lur mənşəli olması haqqında məlumatlar vardır. Lurlar əsasən Luristan vilayətində, qismən Xuzistan və Kuhgiluyədə məskunlaşmışdılar. I Şah Təhmasibin vəfatı ərəfəsində (1576) Abbasi tayfasına Şah Rüstəm və qardaşı Məhəmmədi başçılıq edirdilər. I Şah Abbasın vəfatı ərəfəsində (1629) lur əmirlərindən biri Cahangir xan oğlu Xəlil xan idi, Luristan bəylərbəyi vəzifəsində isə Fiyli tayfasından Hüseyn xan Abbasi Lurfiyli xidmət edirdi.

**ORUC BƏY BAYATIN SİYAHISI** – XVII əsrin əvvəllərində I Şah Abbasın göstərişi ilə yüzbaşı Dəniz bəy Rumlunun başçılığı altında Avropaya göndərilmiş böyük diplomatik heyətin üzvü, İspaniyada xristianlığı qəbul edərək orada qalmış *Oruc bəy Bayatın* xatirələrindəki *qızılbaş tayfa və oymaqlarının* siyahısı. Oruc bəy Bayat öz kitabının üçüncü fəslində 32 qızılbaş tayfasının adlarını qeyd edərək yazır ki, bu adlardakı "lu" sonluğu onların tayfa başçısına mənsub olduğunu göstərir. Yəni bu tayfalar onların adındakı tayfa başçısından törəmişdir.

Siyahıdakı adların bir qismi digər mənbələrdəki məşhur qızılbaş tayfalarının adları ilə eyniyyət təşkil edir: *Ustaclu, Şamlu, Əfşar, Türkman, Bayat, Təkəlü, Zülqədərlü, Qacar, Qaramanlu, Bayburtlu*, Baraçlu (yəqin ki, *Baharlu* nəzərdə tutulur), *İspirlü*, *Bozcalu*, *Çəmişgəzəklü*. Müstəqil tayfa kimi təqdim edilən adların bir qisminin əslində yuxarıda sadalanmış tayfaların oymağı olduğu məlumdur: Ustaclu tayfasının oymaqları olan *Çavuşlu*, *Asayişlü*, *Sarusolaqlu* və *Gözüböyüklü*; Şamlu tayfasının oymaqları olan *Xarmandalu*, *Hacıfəqihlü* (*Ma-*



*hifəqihlü*) və İnazlu (*İnallu* olması ehtimal edilir); Əfşar tayfasının oymağı olan *Qırxlu*; *Otuziki* tayfa ittifaqına daxil olan *Qaraqoyunlu*.

Siyahıdakı bəzi tayfa adlarının isə mənşəyi tam aydın deyildir, Səfəvilər tarixinə aid mənbələrdə bunlara aid hər hansı məlumata rast gəlmirik. Ola bilər ki, həmin adlar ya kitabın nəşrləri zamanı təhrif olunmuşdur, ya da Səfəvilər tarixində o qədər də mühüm rol ifa etməmiş xırda oymaqlara və nəsillərə məxsusdur: Oyrat, Qarabacaqlu, Qoyunerilü, Həmzəlü, Solaqlu, Mahmudlu, Qaraçomaqlu, Peyklü və Kuhgiluyəlü. Bunların bir qisminin Anadoluda, bir qisminin isə Azərbaycanda və İranda məkan adları olması məlumdur.



**OTUZİKİLƏR** – Səfəvilər dövlətində yaşamış qızılbaş tayfa ittifaqı. Bəzi mənbələrdə (o cümlədən *"Tarixi-aləmarayi-Abbasi"də*) qeyri-qızılbaş tayfası kimi təsnif olunmuşdur; ehtimala görə, bunun səbəbi tayfanın Osmanlı işğalı ilə barışması və osmanlılar tərəfindən ələ keçirilmiş yurdda qalmağa qərar verməsidir. Adından da göründüyü kimi, Otuzikilər 32 tayfanın qeyri-rəsmi birliyindən meydana gəlmişdir. Əsasən Şimali və Cənubi Azərbaycanda məskunlaşmışdı, xüsusən Qarabağ torpaqlarında *İyirmidörd*, *Qaramanlu*, *Qazaqlar*, *Qacar*, *Zülqədər* tayfaları ilə yanaşı Otuzikilər də qonşuluq şəraitində yaşayırdılar. XVII-XVIII əsrlərə aid Səfəvi və Osmanlı mənbələrində Otuzikilər tayfasının tərkibi barədə müəyyən məlumatlar verilmişdir. Bu tayfa ittifaqına *Cavanşir*, *Müqəddəm*, Kəbirlü, Əhmədlü, Danişməndlü, Gökçəlü, Qaraqoyunlu, Ozan, Altıcalu, Padar, Bəyəhmədlü, Dügərlü, Kəpənəkçi, Kotanlu, Maqsudlu, Mafruzlu, Şəkərbəylü, Buğdayüzü və s. qollar daxil idi. Səfəvilər dövlətinə, xüsusilə son Səfəvilər dövrünə aid inzibati bölgü və vergi-hesabat dəftərlərində bu qolların adı çəkilsə də, onların əksəriyyəti Səfəvilər dövlətinin idarəçiliyində diqqətəlayiq rol oynamamışdır, yalnız ilk iki qola mənsub olan əmirlərin adına klassik mənbələrdə rast gəlirik.

Otuzikilər ittifaqında liderlik mövqeyi Cavanşir oymağına məxsus idi, adətən bu oymağın yetirmələri tayfa ittifaqına başçılıq edirdilər.

XVI əsrin 80-ci illərində Azərbaycan torpaqları osmanlılar tərəfindən işğal edildikdən sonra Qarabağ və Şirvanda məskunlaşmış tayfaların bir qismi Osmanlı idarəçiliyi altında yaşamaq istəməyib Araz çayından cənuba adladı. Onların bu davranışı I Şah Abbas və dövlət adamları tərəfindən müsbət qarşılandı. Əksinə, öz vətənini tərk etməyə razı olmayan və Osmanlı tabeliyində qalan tayfalar isə qınaq hədəfinə çevrildi, hətta bu ərazilər osmanlılardan geri alındıqdan sonra həmin tayfalara "dönük" adı verildi. Otuzikilər tayfa birliyi də bura aid idi. Çuxursəd bəylərbəyi *Əmirgünə xan* Xudafərin körpüsünü keçib Qarabağ torpağına daxil olanda bu yerlərdə yaşayan tayfalar onun xidmətinə gəlib Səfəvi dövlətinə sədaqətli olduqlarını bildirdilər. (Tarixi mənbələrdə

"*şahsevən* oldular" şəklində yazılıb). Bu yolla onlar Osmanlı işğalında yaşamaq barədə vermiş olduqları qərarı yumşaltmağa çalışırdılar. Lakin I Şah Abbas Gürcüstanla və Osmanlı dövləti ilə təmas xəttində bu tayfaların məskunlaşmasını Səfəvilər dövlətinin təhlükəsizliyinə uyğun görmədiyi üçün onları məcburi şəkildə dövlətin iç bölgələrinə köçürməyi əmr etdi. Qarabağda məskunlaşmış tayfaların köçürülməsinə Lətifxan bəy Qacar davatdar, Şirvandakı tayfaların köçürülməsinə isə İsfəndiyar bəy Ovçubaşı Ərəbgirlü təhkim edildilər. Tayfalar Azərbaycandan çıxarılıb Mazandaran vilayətinin Fərahabad bölgəsində yerləşdirildi. Bu zaman Əhmədlü oymağı narazılıq edib köçü ləngitdiyi üçün ağır şəkildə cəzalandırıldı, onların evləri və mülkləri qarət olundu.

Otuzikilər tayfa birliyinin bir neçə nümayəndəsinin adı Səfəvi mənbələrində çəkilir. I Şah Abbas zamanında Müqəddəm oymağından "Mir Müqəddəm" ləqəbini daşıyan əmirlər Zəncan və Marağa hakimi Ağa xan, İsgəndər sultan və Tizrov sultan, Cavanşir oymağından Mirzə Hüseyn bəy və qardaşı Əlixan bəy bu qəbildəndir.

Hazırda Azərbaycanın İmişli rayonu ərazisində Otuziki, Bərdə rayonu ərazisində Otuzikilər kəndi mövcuddur.



**CAVANŞİR** – *Otuzikilər* tayfa birliyinə daxil olan güclü oymaqlardan (ellərdən) biridir. Otuzikilər ittifaqında liderlik mövqeyi Cavanşir oymağına məxsus idi, adətən bu oymağın yetirmələri tayfa ittifaqına başçılıq edir və həlledici məqamlarda qərar verirdilər. Otuzikilər tayfasının içində Cavanşir oymağının yeri o qədər mühüm idi ki, *İsgəndər bəy Münşi* onları eyniləşdirmiş və Cavanşir elinin 32 qoldan ibarət olduğunu yazmışdır: "Qarabağ tərəkəmələrindən olan Cavanşir eli 32 qəbilədən ibarət olduğu üçün "Otuziki" adlanır. (Cavanşir eli) ata-babadan o əşirətin başçısı olmuşdur". Bəzi tarixçilər Cavanşirlərin kökünün Bəhmənlü elinə mənsub Sarıcalu oymağından qaynaqlandığını, Bəhmənlü elinin Qarabağ torpağına Türküstandan (Orta Asiyadan) köçdüyünü yazırlar. Qarabağ xanlarının əcdadı Pənahəli xan da Cavanşir oymağının yetirməsi olmuşdur. Cavanşir oymağının XVIII-XIX əsrlərdə Qarabağın və ümumilikdə Azərbaycanın ictimai-siyasi və elmi-mədəni həyatında mühüm rolu olmuşdur.

Cavanşir oymağının adına klassik Səfəvi mənbələrində I Şah Abbasın zamanında baş vermiş hadisələrin təsvirindən etibarən rast gəlirik. Azərbaycan torpaqlarının Osmanlı qüvvələri tərəfindən işğalından əvvəl bu oymağa Mirzə Hüseyn bəy Cavanşir başçılıq edirdi. Lakin o, Osmanlı üsuli-idarəsi altında yaşamağa etiraz etməmiş, bəzi digər qızılbaş tayfaları kimi öz məskənini tərk edib cənuba çəkilməmişdi. Buna görə hakimiyyət dairələrində Cavanşir oymağı və Mirzə Hüseyn bəy barəsində mənfi təəssürat formalaşmışdı.

Sonrakı zamanlarda da Cavanşirlərə etimadsızlıq davam etmiş, I Şah Abbas zamanında onlara qullar (*qulamlar*) tə-



bəqəsindən olan Novruz sultan, II Şah Abbas zamanında həmin təbəqədən Xosrov xan başçı təyin olunmuşdur. Həmçinin II Şah Abbasın əmri ilə Qarabağda yaşayan *Cavanşir* oymağından və *Bayat* tayfasından 15 min ailə bütün əmlakı, mal-qarası ilə birlikdə Gürcüstana yerləşdirilmiş, onların mühafizəsindən ötrü Şahabad, İslamabad və Nüsrətabad adlı üç qala tikilmişdi.

**MÜQƏDDƏM** – *Otuzikilər* tayfa birliyinə daxil olan oymaqlardan biri. Cavanşir elindən sonra Otuzikilər içində ən güclüsü sayılırdı. Əsasən Marağa ətrafında məskunlaşmışdı, buraya Anadolunun Ərzurum-Pasin bölgəsindən köçüb gəldiyini yazırlar. Müqəddəm oymağının böyükləri adətən "Mir Müqəddəm" ləqəbini daşıyırdılar. Müqəddəm oymağı Otuzikilər tayfa ittifaqına daxil olan digər oymaqlar kimi Osmanlı əsarəti dövründə öz yurdlarında qalmağa üstünlük vermiş, lakin I Şah Abbasın başçılığı altında Azərbaycanın azad edilməsi prosesi başladıqdan sonra onların böyük hissəsi Səfəvi ordusuna qoşulmuşdu. Bu dövrdə Tizrov sultan Müqəddəm hərbi əməliyyatlarda fəal şəkildə iştirak edirdi. Müqəddəm tayfası Maku bölgəsindəki üsyançı kürdləri cəzalandırmaq üçün göndərilən qoşunun da tərkibinə qatılmışdı. Səfəvilərin osmanlılar üzərində parlaq qələbəsi ilə nəticələnmiş *Sufiyan savaşında* (1605) qızılbaş qoşununun *çərxçi* (avanqard) bölümünün sərkərdəsi Niyaz sultan Müqəddəm idi. Bu oymağın yetirmələri olan Zəncan və Marağa hakimi Ağa xan Mir Müqəddəm və İsgəndər sultan I Şah Abbas zamanında dövlət xidmətində fərlənmişlər.

**RUMLU** – böyük qızılbaş tayfalarından biri. Anadolunun Sivas bölgəsindəki Qoyulhisar (Qoyləhisar), Qarahisar məntəqələrində, eləcə də Tokat-Amasya bölgəsində məskunlaşmış türk tayfalarına daxil idi. Adından da göründüyü kimi, bu tayfa Anadolu əsillidir. (Anadolunun yuxarıda adı çəkilən bölgələrinə Rum əyaləti və ya kiçik Rumiyyə (Rumiyyeyi-suğra) deyilirdi).

Rumlu tayfasının *qızılbaşlığa* meyillənməsini I Şah İsmayılın ulu babalarından olan *Xacə Əli Siyahpuşla* bağlayırlar. Əmir Teymur Ankara savaşından (1402) qələbə ilə qayıdanda özü ilə on minlərlə əsir aparırdı. Ərdəbildə Səfəvi şeyxi Xacə Əli ilə görüş hökmdarın üzərində böyük təsir qoymuşdu. Vidalaşarkən Əmir Teymur şeyxdən nə istədiyini soruşmuş, o da Anadoludan gətirilmiş on minlərlə əsirin ona bağışlanmasını xahiş etmişdi. Hökmdar şeyxin xahişinə əməl edib əsirləri ona bağışlamışdı. Xacə Əli tərəfindən azadlığa qovuşmuş bu insanlar, demək olar ki, yekdilliklə *səfəviyyə təriqətini* qəbul etmiş, böyük bir hissəsi öz diyarına qayıdıb o yerlərdə təriqəti yaymaqla məşğul olmuşdu. Beləliklə, Anadoluda səfəviyyə təriqətinin özəyi yaranmışdı. Səfəviyyə şeyxləri XV əsrin ikinci yarısında siyasi mücadilə səhnəsinə qədəm qoyanda Rumlu tayfası onları fəal şəkildə dəstəkləmişdi.

Rumlu tayfasının xeyli üzvü I Şah İsma-

yılın 1500-cü ildə Ərzincana səfəri zamanı ona qoşulmuşdu. Şirvanşah Fərrux Yasara qarşı *Cabanı döyüşündə* I Şah İsmayıl əldə edilmiş bütün qəniməti Kür çayına atmağı qızılbaşlara əmr edəndə Rumlu tayfasından olan yüzbaşı Məhəmməd bəy tərəddüd etmədən Şirvanşahlar xəzinəsindən götürdüyü ləl-cavahiratla dolu kisəni (açıb içindəkilərə baxmadan) çaya tullamışdı. Buradan məlum olur ki, artıq 1500-cü ildə rumlular Səfəvi qoşununda xidmət edirdilər, hətta onların bəzi nümayəndələri yüzbaşı vəzifəsinə yüksəlmişdi.

1501-ci ildə Ağqoyunlu Əlvənd Mirzə ilə savaşda qızılbaş əmirləri arasında *Div sultan Rumlunun* da adına rast gəlirik. O, savaşdan əz əvvəl Tokat ətrafından gələrək I Şah İsmayıla qoşulmuşdu. Əsl adı Əli və ya Div Əli olan bu güclü sərkərdənin sonralar dövlət idarəçiliyində oynadığı mühüm rola rəğmən Səfəvilər dövlətinin quruluş mərhələsindəki hadisələrdə adı o qədər də hallanmır. İsmayıl Təbrizdə özünü şah elan etdikdən sonra dövlətin özəyini təşkil edən vəzifələrə öz silahdaşlarını təyin etmiş, Div sultana isə adı çəkilməyən əyalətlərdən birini vermişdi.

I Şah İsmayılın zamanında bir neçə şəxs onun *xəlifəsi* olaraq Osmanlı dövlətinin ərazisində qızılbaş təbliğatı aparır, öz ətrafına tərəfdar toplayırdı. Osmanlı dövlətini daxildən zəiflətmək, qızılbaşları mütəşəkkil hala gətirərək onları hakimiyyət əleyhinə ayağa qaldırmaq, bu mümkün olmadığı təqdirdə qızılbaşların Səfəvi torpaqlarına keçidini təşkil və təmin etmək bu xəlifələrin fəaliyyət proqramına aid idi. Onlardan biri 1512-ci ildə Osmanlı dövlətinin ərazisində kifayət qədər böyük çaxnaşma yaratmağa nail olmuş *Nurəli xəlifə Rumlu* (vəf. 1515), digəri isə Anadoludan xeyli qızılbaşı şahın hüzuruna gətirmiş Sufiyan xəlifə Rumlu (Nurəli xəlifənin kürəkəni) idi. Sufiyan xəlifə sonralar Məşhəd və Xorasan hakimi olmuş, özbəklərlə savaşda öldürülmüşdür.

*"Aləmarayi-Səfəvi"* kitabında I Şah İsmayıl zamanındakı 6 nəfər Rumlu əmirinin adı çəkilir: Div sultan, Nurəli xəlifə, Xəlil ağa, Sufiyan xəlifə, Badincan sultan və Qaragünə sultan. Xəlil ağa I Şah İsmayıl tərəfindən *Şeybani xana* elçi qismində göndərilmiş, o isə elçini zindana salmışdı. *Badincan sultan Rumlu* (vəf. 1527) müxtəlif döyüşlərə qatılaraq şücaət göstərmiş, o cümlədən Luristan hakimi *Məlikşah Rüstəmlə*, özbək xanları Şeybək xan və Übeyd xanla savaşlarda fərqlənmiş, bir müddət Ərdəbil hakimi olmuşdu.

I Şah İsmayıl zamanındakı Rumlu tayfasının əmirləri arasında Qazaq sultan və Ayqut bəyin də adları çəkilir. Rumlu tayfasına mənsub əmirlərin mülkləri əsasən Azərbaycan və Aranda yerləşirdi, onların əsas dayaq nöqtəsi də bu yerlər sayılırdı.

1510-cu illərdən etibarən yuxarıda adı çəkilən Div sultan Rumlu siyasət və hərb meydanında özünü göstərməyə başlamışdı. Əvvəl Mərv, sonra Çuxursəd bəylərbəyi təyin edilmiş, Gürcüstana dəfələrlə uğurlu hərbi yürüşlər etmiş



Div sultanın nüfuzu şahın gözündə artmaqda idi. I Şah İsmayılın ölümündən (1524) az əvvəl o, *əmir əl-üməra* (ordunun baş komandanı) vəzifəsinə təyin edildi və hərbi məsələlər üzrə şahın *vəkili* olmuşdu. Şah ətrafındakı əmirlərin arasında Div sultanı daha layiq bilərək onu azyaşlı Təhmasib Mirzənin qəyyumu elan etdi. I Şah İsmayılın vəfatından sonra Div sultan vəkillik məqamına tam şəkildə yiyələnməklə Səfəvi dövlətinin idarəçiliyini öz əlində cəmləşdirdi. Digər qızılbaş tayfalarının təzyiqi altında o, əmir əl-üməra səlahiyyətlərini əvvəlcə *Ustaclu*, daha sonra *Təkəlü* tayfasının əmirləri ilə bölüşməli oldu. Təqribən 3 il ərzində (1524-27) bir neçə güclü qızılbaş əmiri qardaş qırğınında öldürüldü. Bu vətəndaş müharibəsinin sonunda təkəlülər getdikcə güclənərək axırda Div sultanı da aradan götürməyə müvəffəq oldular (1527).

Digər qızılbaş tayfalarından fərqli olaraq, Rumlu tayfasının o qədər böyük hərbi qüvvəsi yox idi, bu tayfanın nümayəndələri əsasən bölgələrdə oturaq həyata alışmışdılar. Rumlu əmirlərindən bir neçəsinin *xəlifə* ləqəbi daşıması onların səfəviyyə təriqətinə dərindən bağlı olduqlarını və təriqət xadimi kimi xidmət etdiklərini göstərir.

I Şah Təhmasib zamanında vəzifə başında olmuş Rumlu əmirlərdən biri, Səfəvilər tarixi barədə mühüm mənbələrdən sayılan *"Əhsən ət-təvarix"* kitabının müəllifi *Həsən bəy Rumlunun* babası Əmir sultandır (vəf. 1539/40). Çuxursəd valisi Hüseyncan sultan, Süleyman sultan, Pir sultan xəlifə, Xoy valisi Dəli Budaq, Qurban sultan, Div sultanın oğlu Ədhəm bəy, Vəli xəlifə və oğlu, Gürgan valisi Səfi xan, Şahqulu bəy və b. I Şah Təhmasib dövrünün görkəmli simalarından sayılırdılar. Böyük nüfuza malik olan *Aras xan Rumlu* Şirvan bəylərbəyliyinə layiq görülmüşdü. O, 1578-ci ildə Şirvan torpaqlarını işğal etmiş Osmanlı və Krım tatarlarının müttəfiq qoşunu ilə döyüşdə məğlub olmuş, əsir düşərək oğlu ilə birlikdə edam edilmişdir.

I Şah Təhmasib zamanının ən mühüm fiqurlarından biri olan *Hüseynqulu xəlifə* də Rumlu tayfasına mənsub idi. O, *xəlifət əl-xüləfa* məqamında şahın təriqət məsələləri üzrə baş müşaviri kimi xidmət edirdi, təkcə Qəzvin şəhərində 10 min nəfər sufi ona tabe idi. Hüseynqulu xəlifə ələm, təbil və qoşun sahibi olmasa da, tabeliyindəki qızılbaş sufilər üzərində güclü təsiri vardı. I Şah Təhmasibin vəfatından sonrakı qarışıqlıqda II Şah İsmayılın taxta çıxmasında Hüseynqulu xəlifənin böyük rolu olmuşdur. Lakin II Şah İsmayıl ətrafındakı hər kəsə olduğu kimi, Hüseynqulu xəlifəyə də şübhə ilə yanaşmış, onu xəlifət əl-xüləfa vəzifəsindən uzaqlaşdırmaq istəmiş, Hüseynqulu xəlifə bunu narazılıqla qarşıladığı üçün Qəzvindən sürgün edilmişdi. Bir müddətdən sonra şahın göndərdiyi şəxs Hüseynqulu xəlifənin gözlərinə mil çəkmiş, onun vəzifəsi Bulqar xəlifəyə (Rumlu tayfasından olması ehtimal edilir), ardınca da Ustaclu tayfasından Dədə xəlifəyə verilmişdi. Şah Məhəmməd Xudabəndə xəlifət əl-

xüləfalıq məqamını Şahqulu xəlifə Rumluya həvalə etmişdi. Hakimiyyətə gələn I Şah Abbas bu vəzifəyə Xoy valisi Dəli Budaq xanın oğlu Qorxmaz xəlifəni gətirsə də, az sonra o, *Mürşidqulu xan Ustaclunun* təhriki ilə aradan götürüldü və boş qalmış yer yenə Şahqulu xəlifəyə qismət oldu (1588). Sonrakı hadisələr zamanı mənbələrdə xəlifət əl-xüləfa Məhəmmədqulu xəlifə Rumlunun adına rast gəlirik.

Bu dövrdə Xoy ətrafında məskunlaşmış rumlulara Mahmud sultan, Nişapur bölgəsindəki rumlulara isə Dərviş Məhəmməd xan başçılıq edirdilər (Özbəklər Nişapuru tutduqdan sonra o, Gilan ətrafındakı Biyəpiş məntəqəsinə təhkim edildi).

I Şah Abbas zamanında Dərbənddə Rumlu tayfasından Məhəmməd sultan, ondan sonra Vəli bəy xidmət edirdilər.

I Şah Abbas Rumlu əmirlərindən yüzbaşı Dəniz bəyi böyük bir heyətlə Avropaya diplomatik səfərə göndərmişdi. Heyətin bəzi üzvləri İspaniyada xristianlığı qəbul edərək qaldılar, yazdığı xatirələrlə tanınan *Oruc bəy Bayat* (xristianlığı qəbul etdikdən sonra ona Don Juan adı verilmişdi) da bunlardan biri idi. Bu və digər qəbahətlər üzündən Dəniz bəy Səfəvilər dövlətinə qayıdan kimi edam olundu (1613).

II Şah İsmayılın əmri ilə xəlifət əl-xüləfa Hüseynqulu bəyin gözlərini çıxarmış Kor xəlifə Rumlunun oğlu Məhəmməd bəy I Şah Abbasın əmri ilə iki dəfə İstanbula elçi göndərilmişdi.

Qoyləhisarlu Bayezid sultanın oğlu Heydər sultan Rumlu I Şah Abbasın hakimiyyət dövründə Xəzər dənizinin cənub sahilində yerləşən Tünikabun məntəqəsinin hakimi idi və I Şah Səfinin zamanında edam olunmuşdu (1639/40). I Şah Səfi dövründə *Bayat* və Rumlu tayfalarının bir qolu Şirvanın Bəndər və Şabran məntəqələrinə köçürüldülər.

1606/07-ci illərdə Xorasanın Səbzəvar və ətraf məntəqələri əvvəllər Turşiz hakimi olmuş Yusif xan Urumluya həvalə edilmişdi. Burada qeyd edilən "Urumlu" ləqəbinin Rumlu, yoxsa Urmiyalı olması barədə tutarlı sübut yoxdur.

XIX əsrdə Qərbi Anadoluda Rumlu (Urumlu) adlı bir oymaq məskunlaşmışdı. Bu oymağın XVIII əsrdə Səfəvilər dövləti ərazisindən buraya köç etmiş Rumlu tayfasına mənsub olması ehtimal edilir.

Rumlu tayfasından Ğürəba oğlu Şahqulu bəy gözəl təbə malik idi, şahzadə *Həmzə Mirzənin* himayəsi altında fəaliyyət göstərirdi. Səfəvilər dövrünün məşhur müəllifləri Sadiq bəy Əfşar və İsgəndər bəy Münşi öz kitablarında onu istedadlı şair kimi tərifləmişlər.

Hüseynqulu xan Rumlunun oğlu Məhəmməd bəy hərtərəfli istedad sahibi idi, şairlik təbi və rəssamlıq istedadı vardı, nəstəliq xətti ilə gözəl yazır, beşsimli tənburda ustalıqla ifa edirdi.

Rumlu tayfasının yetirməsi olan ən istedadlı qələm sahiblərindən biri də Səfəvilər tarixinə aid mötəbər mənbələrdən sayılan *"Əhsən ət-təvarix"* kitabının müəllifi *Həsən bəy Rumludur*.

Digər qızılbaş tayfalarından fərqli ola-



raq, Rumlu tayfası oymaqlara bölünməmişdi. Bunu tayfanın oturaq həyat tərzi keçirməsi ilə əlaqələndirirlər. Hər halda, Rumlu tayfasının Sivas ətrafında *Qoyləhisarlu* (Qoyulhisar) adlı bircə oymağı olduğu məlumdur. Yuxarıda adı çəkilən Heydər sultan da həmin oymağa mənsub idi.



**QOYLƏHİSARLU (QOYULHİSARLU)** – qızılbaş *Rumlu* tayfasının oymağı. Mənbələrdə Rumlu tayfasının yalnız Qoyləhisarlu adlı bir oymağının adı çəkilir. Oymağın adı Anadolunun Sivas bölgəsindəki Qoyləhisar (Qoyulhisar) məntəqəsindən götürülmüşdür. Qoyləhisarlu Bayezid sultanın oğlu Heydər sultan Rumlu I Şah Abbasın hakimiyyət dövründə Xəzər dənizinin cənub sahilində yerləşən Tünikabun məntəqəsinin hakimi idi və I Şah Səfinin zamanında edam olunmuşdu (1639/40).
*bax:* **RUMLU.**



**URUMLU** – *bax:* **RUMLU.**



**SƏDLÜ** – qızılbaş tayfalarından biri. Qaraqoyunlu tayfa birliyinə daxil olan Sədlülər qədimdən bəri Naxçıvandan şimaldakı Səd çuxuru bölgəsində məskunlaşmışdılar. Arpaçayla Arazın birləşdiyi yerdən başlayaraq iki çayın arasındakı çökəklik (Şərur yaxınlığında) Sədlü tayfasının qışlağı olub Səd çuxuru adlanırdı. Sonralar Səfəvilər dövlətinin *bəylərbəyliklərindən* biri olmuş Çuxursədin adı da bu məkanın adından götürülmüşdür. Sədlü tayfası Qaraqoyunlulara, daha sonra Ağqoyunlulara xidmət etmiş, Ağqoyunluların süqutundan sonra Səfəvilərin tərəfinə keçmişdi. Məskunlaşdığı ərazi Səfəvi-Osmanlı sərhədində yerləşdiyi üçün Sədlü tayfası hərbi əməliyyatların mərkəzində qərar tuturdu. I Şah Təhmasibin zamanında Sədlü tayfasına Əlvəndxan bəy və Uluğxan (və ya Alovxan) bəy başçılıq edirdilər.
I Şah Abbas 1604-cü ildə *İrəvanı* osmanlılardan azad edərkən Sədlü tayfası qızılbaş qoşununun tərkibində döyüşərək şücaət göstərmişdi. Bunun mükafatı olaraq Sədlü Nəfəs sultan Kağızman məntəqəsinin hakimi təyin edilmişdi. I Şah Abbas dövrünün əmirlərindən biri də Mehdiqulu bəy Sədlü idi. Atası Əliqulu bəy osmanlıların xidmətinə keçsə də, Mehdiqulu bəy İrəvanın fəthindən sonra I Şah Abbasın hüzuruna gəlmiş və Səfəvi ordusunda xidmətə başlamışdı. Əliqulu bəyi isə Pasin ətrafında Koroğlu adlı bəy əsir tutub şahın hüzuruna gətirmişdi.
*"Qızılbaşlar tarixi"* kitabında Qaraqoyunlular dövlətinə xidmət etmiş böyük Sədlü əmirlərinin adları sadalanır. Həmin bölümdə Fərhad xan adlı bir əmirin də başına gələnlər kifayət qədər ətraflı şəkildə təsvir edilmişdir. Amma burada yazılan hadisələr digər mənbələrdə *Fərhad xan Qaramanluya* aid edildiyi üçün ehtimal olunur ki, müəllif Sədlü tayfasını Qaramanlulardan hesab etmiş, yaxud Fərhad xan Qaramanlunu Sədlü tayfasına mənsub bimişdir.



**SİLSÜPÜR** – Səfəvilər dövlətində yaşa-

mış türk oymaqlarından biri. I Şah Abbas 1603/04-cü illərdə *İrəvan* qalasını mühasirədə saxladığı zaman təxminən iki min ailə Anadoludan köç edib Səfəvilər dövlətinin ərazisinə daxil oldu. Onlar öz ölkələrində əsasən soyğunçuluqla məşğul olduqları üçün "Silsüpür" adını qazanmışdılar. (Fars dilində onlara "pakrub" deyirdilər). Anadoludakı Silsüpür oymağının bir hissəsi *Cərid* qolundan ibarət idi və Cərid Silsüpür adı ilə tanınırdı. I Şah Abbas köçkünləri bir neçə hissəyə böldükdən sonra onlara Savə, Rey, Xəvar və Firuzkuh məntəqələrində yer verilməsini əmr etdi. Silsüpürlərdən bir hissəsi *qorçu* qismində orduya qəbul edildi.

Silsüpürlərin öndə gələnlərindən olan Xəlil bəy I Şah Abbas tərəfindən onların başçısı təyin edildi və ona sultan titulu verildi. Xəlil sultan 1609-cu ildə 300 nəfərə yaxın bir qüvvə ilə Kürdüstan üzərinə yürüş etmiş və Urmiya yaxınlığındakı Dumdum qalasının fəthinə qatılmışdı. O, sonralar Bağdadın mühasirəsində (1616) də iştirak etmiş və Osmanlı gəmilərinin Dəclə çayı boyunca irəiləməsinə mane olmaq üçün Samirraya göndərilmişdi.

I Şah Səfi zamanında Silsüpür oymağı Azərbaycanda məskunlaşmışdı. 1654/55-ci illərdə diplomatik missiya ilə İstanbula göndərilmiş Kəlbəli sultan bu oymağın yetirməsi idi. Silsüpür oymağı XVIII əsrdə də mövcud olmuşdur, həmin dövrə aid mənbələrdə onların bəzi nümayəndələri barədə məlumat verilir.

*"Tarixi-aləmarayi-Abbasi"* kitabında I Şah Abbas zamanında dövlət xidmətində olan, amma qızılbaş tayfalarından sayılmayan əmirlər arasında Silsüpür camaatından Xəlil sultanın da adı qeyd edilmişdir. Burada iki min ailəlik silsüpürlər qızılbaşlara aid edilməsə də, onların "bu dərgaha istək (iradət) və sədaqətlə" üz tutduqları vurğulanır. Görünür, silsüpürlərin qızılbaş tayfalarına aid edilməməsi onların qarışıq tərkibi ilə bağlıdır. Həmin siyahıda əksər qızılbaş oymaqlarının "tayfa" və "el" kimi təqdim edilməsinə rəğmən silsüpürlərin "camaat" adlandırılması da bunun göstəricisi ola bilər.



**ŞAHSEVƏN** – bəzi mənbələrdə ayrıca tayfa, bəzilərində isə müxtəlif tayfa parçalarının vahid ideoloji xətt üzrə birləşməsindən yaranmış ittifaq kimi təqdim edilir. Şahsevənlərin mənşəyi barədə nəzəriyyələr fərqlidir. Şahsevənlər arasında dolaşan rəvayətə görə, I Şah Abbasın dövründə onların əcdadları Yünsür paşanın başçılığı altında Osmanlı dövlətindən Səfəvi torpaqlarına köçüb gəlmiş, "şahsevən" adını qəbul etmişlər. Bundan sonra onlar Ərdəbil və Muğan bölgələrində, eləcə də Həmədan və Savə ətrafında məskunlaşmışlar. Onların Şahsevən İnallu, Şahsevən Əfşar, Şahsevən Bağdadi, Şahsevən Cəlali və digər qolları mövcud olmuşdur. Şahsevənlərin bir qolu Talış-Mikeyli adlanırdı. Şahsevənlər Osmanlı işğalına qarşı barışmazlıqları ilə seçilmiş və uzun müddət mübarizə aparmışlar. Şahsevənlərin devizi şaha tam sədaqətli olmaq,



qızılbaş tayfalarının qarşıdurmasında şahın mənafeyini müdafiə etmək idi. Səfəvilər dövlətinin süqutundan sonra şahsevənləri birləşdirən ideoloji məqsəd mövcud olmadığı üçün onlar etnik birlik (tayfa) kimliyini qazanmışlar. *Nadir şahdan* sonra Ərdəbil xanlığını yaratmış, XIX əsrin əvvəllərində Rusiya imperiyası ilə müharibədə Qacarların tərəfində fəallıq göstərmişlər.

Digər nəzəriyyəyə görə, Şahsevən tayfası I Şah Abbasın təşəbbüsü ilə təşkil edilmişdir. Qızılbaş tayfalarının daim rəqabət içində yaşadıqlarını və tez-tez mərkəzi hakimiyyətə qarşı çıxdıqlarını nəzərə alaraq şah özünə möhkəm dayaq yaratmaq məqsədilə hər tayfanın ən sadiq nümayəndələrindən ibarət yeni tayfa yaratmış, onlara "şahsevən" adını vermişdi. "Lüğətnameyi-Dehxuda"da "Nazim əl-ətibba" kitabına istinadən xəbər verilir ki, I Şah Abbas bu dəstənin yarandığını elan edən kimi 10 min nəfər qızılbaş dərhal şahsevən olmuşdu. Bəzi məlumatlara görə, bu addım hələ Şah Məhəmməd Xudabəndənin zamanında atılmışdır.

Daha bir nəzəriyyəyə görə, "şahsevən" sözü etnik mənsubiyyəti deyil, əqidə bağlılığı əsasında yaranmış könüllü qruplaşmanı ifadə edir. "Tarixi-aləmarayi-Abbasi" kitabında I Şah Təhmasibin hakimiyyətinin son dövründə baş vermiş hadisələrin təsviri zamanı qeyd edilir ki, şahın xəstəliyindən istifadə edən qızılbaş əyanlarının bir hissəsi şahzadə *Heydər Mirzənin* taxta gətirilməsi ideyasını müdafiə etməyə başladı. Daha bir dəstə isə Qəhqəhə qalasında həbsdə olan İsmayıl Mirzənin (gələcək *II Şah İsmayıl*) namizədliyini dəstəklədi. Bu zaman ikinci dəstə gözləri zəif olan və hakimiyyətə gəlməsi az ehtimal edilən Məhəmməd Mirzədən (gələcək *Şah Məhəmməd Xudabəndə*) sonra İsmayıl Mirzənin böyük oğul olduğunu əsas gətirirdi. Onlar özlərinə "şahı sevən" deyir, qarşı tərəfi (Heydər Mirzənin tərəfdarlarını) isə "iki-birli" adlandırıb nankorluqda ittiham edirdilər. ("İki-birli", yəni iki gündən-bir öz fikrini dəyişən, hərdəmxəyal). Diqqət yetirmək lazımdır ki, "Tarixi-aləmarayi-Abbasi"də "şahsevən" kəlməsi hələ I Şah İsmayılın zamanındakı hadisələrin təsvirində çəkilir. 1508-ci ildə İraqa hücum edən qızılbaşlar Bağdad hakimi *Barik bəy Pörnakın* quyuda həbs etdiyi *Seyid Məhəmməd Kəmunəni* azadlığa buraxaraq "öz şahsevənliklərini izhar etdilər".

Səfəvilər dövrünün mənbələrində "şahsevən olmaq", "şahsevənlik etmək" qızılbaşlığa xəyanət etdikdən sonra yenidən qızılbaşlar sırasına qayıtmaq və şaha beyəti təzələmək mənasında işlədilirdi. I Şah Abbas Azərbaycan torpaqlarını Osmanlı işğalından azad etdikdən sonra qızılbaş sərkərdəsi, Çuxursəd bəylərbəyi *Əmirgünə xan Qacar* Xudafərin körpüsünü keçib Qarabağ torpağına daxil olanda bu yerlərdə Osmanlı dövlətinin idsarəçiliyi altında yaşayan *Otuzikilər*, *Qacar*, *Türkman* tayfaları onun xidmətinə gəlib Səfəvi dövlətinə sədaqətli olduqlarını bildirmişdilər. Onların bu hərəkəti "Tarixi-aləmarayi-Abbasi"də "şah-

sevən oldular" şəklində qeyd edilib.



**ŞAMLU** – ən böyük qızılbaş tayfalarından biri. Səlcuqlar zamanından etibarən qış mövsümünü Hələb-Anteb ərazisində, yayı isə Sivas ətrafında keçirən köçəri oymaqlara Hələb türkmanları və ya Şam türkmanları deyilirdi (İndiki Suriya ərazisi orta əsrlərdə Şam diyarı adlanırdı). Bunlara *Əfşar, Bəgdilü, İnallu, Xarbəndəlü, Bayat* və digər oymaqlar aid idi. Bu oymaqlar hələ *Şeyx Cüneyd* zamanından Səfəvi sülaləsinin tərəfdarı olmuş, siyasi mücadilələrdə bu sülaləni dəstəkləmişdilər. Sonralar oymaqların bəziləri birləşərək Şamlu tayfasını əmələ gətirdi. İlk zamanlarda Şamlu tayfasına 3 oymaq daxil idi: *Bəgdilü, İnallu* və *Xarbəndəlü*. Səfəvilər dövlətinin ərazisinə köçdükdən sonra onlara daha bir neçə oymaq da birləşdi.

Şamlu tayfası öz igidliyi və Səfəvi xanədanına sədaqəti ilə məşhur idi. Bu tayfanın ən nüfuzlu şəxsi sayılan *Hüseyn bəy Lələ Şeyx Heydər* zamanından Səfəvi sülaləsinin siyasi mücadiləsinə dəstək vermiş, I Şah İsmayıl hakimiyyətə gəlməzdən əvvəl onun ətrafında birləşmiş əmirlərdən biri olmuşdur. I Şah İsmayılın *lələsi* (tərbiyəçisi), daha sonra Səfəvilər dövlətinin ilk *əmir əl-ümərası* (ordu komandanı) təyin edilməsi də onun nüfuzundan xəbər verirdi.

I Şah İsmayılın zamanında Yəzd şəhərinin qarnizonuna Musa bəy Şamlu (Hüseyn bəy Lələnin əmisi nəvəsi) sərkərdəlik edirdi. Şah Herat hakimliyini və Xorasanın idarəçiliyini, daha sonra Astarabad vilayətini *Zeynal xan Şamluya* həvalə etmişdi. O və *Çəkirgə sultan Şamlu* 1527/28-ci illərdə Firuzkuhda özbəklərlə döyüşdə həlak oldular.

Şamlu tayfasının yetirməsi olan Əhməd sultan I Şah İsmayılın atabir qardaşı *Süleyman Mirzənin* lələsi idi və onun adından Təbriz bəylərbəyliyini idarə edirdi. Süleyman Mirzə qardaşına qarşı üsyan qaldıranda lələsi onun qərarı ilə razılaşmamış və şahzadəni öz fikrindən döndərməyə çalışmışdı.

Şamlu tayfasının digər nümayəndəsi *Əbdi bəy* də I Şah İsmayılın köhnə silahdaşlarından biri idi, 300 atlı ilə birlikdə Ərzincandan gəlib ona birləşmiş və *təvaçıbaşı* vəzifəsini almışdı. I Şah İsmayılın bacısı ilə evlənmək şərəfini qazanmış Əbdi bəy 1506/07-ci illərdə *Sarom xan Kürd* ilə döyüşdə öldürüldü. Onun oğlu *Durmuş xan* Herat hakimi və şahzadə *Sam Mirzənin* lələsi idi. Bu, *Çaldıran savaşından* əvvəl I Şah İsmayılın hüzurundakı toplantıda osmanlılara qəfil hücum etməyin əleyhinə çıxmış məşhur Durmuş xandır.

Əbdi bəyin digər oğlu *Hüseyn xan* qardaşının ölümündən sonra Herat hakimi seçilmiş, azyaşlı I Şah Təhmasibin hakimiyyətinin əvvəllərində baş vermiş siyasi qarşıdurmalarda fəal iştirak etmişdi. O, *əmir əl-üməra Çuxa sultan Təkəlünü* aradan götürdükdən sonra özü (*Abdullah xan Ustaclu* ilə şərikli) əmir əl-üməra vəzifəsinə yiyələndi, lakin 1534-cü ildə qəzəbə düçar olaraq edam olundu. Hüseyn xanın edamından sonra Şamlu tayfasının hörməti azaldı, bu tayfanın



nümayəndələri bir-birinin ardınca vəzifədən götürüldü. Şamlı tayfasından özbəklərlə döyüşdə öldürülmüş Dəmri bəyin oğlu, şahzadə Sam Mirzənin lələsi, Herat valisi *Ağzıvar xan* cəzalanacağından ehtiyat etdiyi üçün özbaşına olaraq Qəndəhar üzərinə yürüş edib öldürüldü. Qorçubaşı "Oğlan xəlifə" ləqəbli Məhəmməd bəy Şamlu vəzifəsindən azad edildi. Bununla belə, şamluların bir qismi I Şah Təhmasibin zamanında bölgələrdə xidmətlərini davam etdirmişlər. Mahmud bəy, Əmət bəy, İsfərain hakimləri Zeynəddin sultan, Pirəli sultan və Məcnun sultan, Çərəndab sultan, oğlu Abbasəli bəy, Əhməd xəlifə Vəfadar, yasavulbaşı Hüseyn bəy bu qəbildəndirlər.

İsgəndər bəy Münşi "Tarixi-aləmarayi-Abbasi"də qeyd edir ki, I Şah Təhmasibin vəfatı ərəfəsində Şamlu tayfasından 5 nəfər əmir dövlətdə yüksək məqam sahibi idi, onlar nağara və ələm sahibi sayılırdılar. (Yəni nüfuzlarına, tabeliklərindəki hərbi qüvvəyə görə onlara icazə verilmişdi ki, hərəkət zamanı öz bayraqlarını qaldırsınlar və əzəmət rəmzi olan nağara vurdursunlar). Qum və daha sonra Məşhəd hakimi Vəli xəlifə, Həmədan hakimi Fuad xəlifə, Astarabad hakimi olmuş, sonra sarayda xidmət etmiş Süleyman xəlifə və Kübə İbrahim ləqəbli İbrahim sultan bu dəstəyə aid idilər.

I Şah Abbasın zamanında Şamlu tayfası öz siyasi nüfuzunu yenidən bərpa etdi. I Şah Təhmasib *Ustaclu* tayfasına nə qədər güvənirdisə, I Şah Abbas da şamlulara o qədər etibar edir, onları yüksək vəzifələrə gətirirdi. Bunun səbəblərindən biri də o idi ki, şah kiçik yaşlarından Xorasanda Herat hakimi olan lələsi *Əliqulu xan Şamlunun* tərbiyəsi altında böyümüşdü. "Xanlar xanı" titulunun sahibi Əliqulu xan Əbdi bəy Şamlunun nəslinin davamçısı, Durmuş xanın nəvəsi idi.

İsgəndər bəy Münşi I Şah Abbasın vəfatı ərəfəsində nüfuz sahibi olmuş 7 böyük Şamlı əmirindən söz açır. Bunlar *Zeynal xan Bəgdilü*, Gündoğmuş sultan Bəgdilü, Həsən xan Əbdüllü, Haqverdi sultan Ərəbgirlü, Nağdı sultan Nilqas, Qur hakimi Məhəmməd Zaman sultan və Bala Mürğab valisi Fəzləli sultandır.

I Şah Abbasın zamanında baş vermiş hadisələrin təsvirində bunlardan əlavə daha bir neçə Şamlu əmirinin də adlarına rast gəlirik: Köhnəşəmşir *qorçusu* Təhmasibqulu bəy Şamlu və qardaşı Qaraxan bəy, Həmədan bəylərbəyi Qorxmaz xan, qurxana *yasavulbaşısı* Qasım bəy, *divanbəyibaşı* Əliqulu xan Kəramətlü, Herat hakimi Hüseyn xan Əbdüllü, Məhəmmədi bəy Bəgdilü, Qənbər xanın oğlu və Qain hakimi Nəcəfqulu xan, Nəzərəli sultan, Mühübbəli bəy Şahsevən Şamlu, Bayram bəy Koşte, söhbət yasavulu Kəlbəli bəy Şamlu və b.

I Şah Abbasın zamanında Avropaya diplomatik səfərə göndərilmiş *Oruc bəy Bayat* Şamlu tayfası nümayəndələrinin ənənəvi olaraq sarayda idarəçi məqamına yiyələndiklərini, bu məqamın İspaniya sarayındakı baş kamerger vəzifəsinə uyğun olduğunu yazırdı. Həqiqətən, II

Şah İsmayıl, Şah Məhəmməd Xudabəndə, I Şah Abbas, I Şah Səfi və II Şah Abbasın hakimiyyət dövrlərində Səfəvilər sarayında *eşikağasıbaşı* vəzifəsini şamlular icra edirdilər. Şamlu tayfasının *Biçərlü* oymağından Hüseynqulu sultan, oğlu Mehdiqulu xan, Mürtəzaqulu bəy, *Bəgdilü* oymağından Nağdı xan (həm də *qorçubaşı* və Kuhgiluyə hakimi olmuşdur), oğlu Zeynal xan, Heydər sultan, *Ərəbgirlü* oymağından Məhəmmədqulu bəy, *Kəramətlü* oymağından Əliqulu xan, *İnallu* oymağından İmamqulu xan, eləcə də Şamlu əmirləri Uğurlu xan, Əlixan bəy, Qazı bəy, Qorxmaz xan, Piri bəy və b. müxtəlif dövrlərdə eşikağasıbaşı vəzifəsinə təyinat almışdılar. Şamlu tayfasının üzvləri həm də sarayda *cəbbədarbaşı* vəzifəsini də icra etmişlər. (Sadə ailədən çıxmış Ərəb xan Ağzıvaroğlu, qardaşı Hacı bəy, Əbülfəth bəy və b).

Şamlu tayfasından Canı xan II Şah Abbasın hakimiyyətinin əvvəllərində *qorçubaşı* vəzifəsini icra edirdi. O, *Saru Tağı* ləqəbli baş vəzir Mirzə Məhəmməd Təqiyə qarşı sui-qəsd hazırlamaqda təqsirli bilinib edam edilmişdi (1645). Həmin hadisə zamanı daha bir neçə qızılbaş əmiri, o cümlədən Şamlu tayfasından Canı xanın Xorasanda hərbi xidmətdə olan qardaşı Qara xan, sabiq Kuhgiluyə hakimi qorçubaşı Nağdı xan, sabiq Şirvan bəylərbəyi Ərəb bəy Ağzıvaroğlu, cəbbədarbaşı Əbülfəth bəy də onunla eyni aqibəti bölüşdülər.

Şamlu tayfasının iki nümayəndəsi Səfəvilər dövlətində şahdan sonra birinci məqam sayılan sədri-əzəm (baş vəzir) vəzifəsini daşımışlar. Uzun müddət tarixi mənbələrdə yüksək vəzifə sahibləri arasında adlarına rast gəlmədiyimiz şamlular Səfəvi dövlətinin sonlarına yaxın öz siyasi güclərini bərpa etməyə cəhd göstərmiş, amma dövlətin süqutuna mane ola bilməmişlər. Şah Sultan Hüseynin hakimiyyəti dövründə Şamlu tayfasının Bəgdilü oymağından Məhəmməd Mömin xan sədri-əzəm vəzifəsində xidmət etmişdir (1699-1707). Onun oğlu, əvvəlcə qorçubaşı vəzifəsini daşımış Məhəmmədqulu xan 1721-ci ildə sədri-əzəm məqamına gətirildi və "etimad əd-dövlə" fəxri ləqəbinə layiq görüldü. Məhəmmədqulu xan Bəgdilü Şamlu Səfəvilər dövlətini istila edən və paytaxt İsfahanı mühasirəyə alan əfqanları ölkədən qovmaq üçün uğursuz cəhd etdi, döyüşdə məğlub olaraq öldürüldü (1722).

Səfəvilər dövlətinin bölgələrdəki hakimlərinin arasında Şamlu tayfasının nümayəndələrinə digər bəzi qızılbaş tayfalarına nisbətən daha az rast gəlirik. Bəzi şamlular Azərbaycan (Təbriz), Çuxursəd və digər bölgələrə bəylərbəyi təyin edilmişdilər, Herat bəylərbəyiləri arasında şamlular nisbətən çox idi. Ümumiyyətlə, Şamlu tayfasının əsas nüfuz mərkəzi Xorasan sayılırdı, Səfəvi hakimiyyətinin əvvəllərində də bu tayfanın bəzi nümayəndələri həmin məntəqədə hakimlik etmişdilər. Amma saraydakı Şamlu əmirlərinin sayı üstünlük təşkil edirdi, bu da onların Səfəvi şahları tərəfindən böyük etimada layiq görüldüklərini göstərir.



Şamlu tayfasının bəzi nümayəndələri yaradıcı ruha sahib olmuşlar. I Şah İsmayılın müasiri olan Hüseynqulu mirzə Şamlu atasından sonra *miraxurbaşı* vəzifəsini icra edirdi. Onun həm də gözəl şairliyi vardı, vəzifəsindən azad edildikdən sonra Böyük Moğol hökmdarı Humayun şahın hüzuruna elçi qismində göndərilmişdi. Şamlu tayfasından Yolqulu bəy, Qasim bəy və Dura bəy (təxəllüsü Kirami) də şeir yazırdılar. Onların hər üçü Herat bəylərbəyi Əliqulu xan Şamlunun yaxın ətrafından sayılırdılar. Belə ki, Qasım bəy Əliqulu xanın qaynı, Yolqulu bəy bəylərbəyi sarayındakı kitabxananın müdiri, Dura bəy isə Əliqulu xanın *süfrəçibaşısı* idi.

Şamlu tayfası bir neçə oymaqdan ibarət idi: *Bəgdilü* (Bigdeli), *İnallu*, *Xudabəndəlü* (Xarbəndəlü, Xarmandalu), *Avcı*, *Biçərlü*, *Əbdüllü* (Abdullu), *Kəramətlü*, *Acirlü* (Əcirlü), *Ərəbgirlü*, *Nilqas*, *Balabanlu* və s. Bunların arasında ən güclüsü Bəgdilü oymağı sayılırdı.

**ABDULLU** – *bax:* **ƏBDÜLLÜ.**

**ACİRLÜ** – qızılbaş *Şamlu* tayfasının oymaqlarından biri. Hələb türkmanları arasında sayının çoxluğu ilə seçilən və beş qola bölünən böyük bir oymaq idi. Əvvəllər müstəqil oymaq olub, sonralar Şamlu tayfasına daxil olması ehtimal edilir. Mənbələrdə adı "Əcirlü" şəklində də yazılır. I Şah Abbasın zamanında İmamqulu sultan, I Şah Səfinin hakimiyyət dövründə isə yüzbaşı Saru xan bəy bu oymaqdan idilər. Saru xanın əmisi oğlu Əlixan bəy 1638/39-cu illərdə öz qardaşının yerinə Əcirlü oymağının başçısı təyin edilmişdi. Osmanlı torpaqlarında Diyarbəkir ətrafında məskunlaşmış bu oymağın bir hissəsi Səfəvilər dövlətinə köç etmiş, qalanları isə XVII əsrin sonlarında Raqqa bölgəsinə köçürülmüşdü. Amma Raqqaya köçürülənlər bir ildən sonra öz məskənlərinə qayıtmışdılar. Bəzi mənbələrdən aydın olur ki, Acirlü oymağı bir neçə obaya bölünmüşdü, onlardan biri də *Qaracalu* obası idi.

**AVCI** – qızılbaş *Şamlu* tayfasının oymaqlarından biri. Bu oymağa mənsub iki əmirin adı mənbələrdə xüsusi qeyd edilir. I Şah Təhmasibin vəfatı ərəfəsində Şamlu tayfasının böyüyü Vəli xəlifə Avcı sayılırdı. Məşhəd hakimi olan Vəli xəlifə "Tarixi-aləmarayi-Abbasi" müəllifinin təbirincə desək, "digər Şamlu əmirlərindən daha çox qoşuna və ləşkərə malik idi. Əksər Şamlu əmirzadələri onun qoşununun tərkibinə daxil idilər". Vəli xəlifə Şah Məhəmməd Xudabəndənin hakimiyyəti dövründə qızılbaş tayfaları arasında başlamış vətəndaş müharibəsində I Şah Abbasın tərəfdarları olan Xorasan qüvvələri tərəfindən öldürülmüşdür. Bu döyüşdə Avcı oymağından xeyli adam öz həyatını itirmiş, sonralar onların intiqamı qarşı tərəfdən alınmışdı. Vəli xəlifə Avcının oğlu İsmayılqulu xan Şah Məhəmməd Xudabəndənin zamanında *təvaçıbaşı* vəzifəsində xidmət edirdi. O, *Ustaclu* tayfasından *Əliqulu xan Fəthoğlu (Qıçoğlu)* ilə birlikdə hakimiy-

yəti öz əllərində toplamış, faktiki olaraq dövlətdə birinci dərəcəli ixtiyar sahibi olmuşdu. Ona şahın yaxın ətrafının başçısı mənasında "yoldaşbaşı" fəxri ləqəbi verilmişdi. I Şah Abbasın hakimiyyətə gəlişindən sonra onların hər ikisi edam edildi. İsmayılqulu xanın qardaşı Mürşidqulu sultan Fərəhanda hakimlik edirdi.

Avcı oymağının görkəmli nümayəndələrindən biri də türk dilində yazıb-yaratmış şair *Məlik bəy Avcı* idi.

**BALABANLU** – qızılbaş *Şamlu* tayfasının oymaqlarından biri. Mənbələrdə bu oymaq haqqında məlumat azdır. Xanlar xanı Herat bəylərbəyi *Əliqulu xan Şamlunun* tabeliyində olan əmirlərdən biri də Qazı Sultan Balabanlı Şamlu idi.

**BƏGDİLÜ** – qızılbaş *Şamlu* tayfasının böyük oymaqlarından biri. Qədim mənbələrdə, o cümlədən Mahmud Kaşğarinin "Divan lüğat ət-türk" əsərində 24 oğuz boyunun içində Bəgdilünün də adı çəkilir. Keçmiş mənbələrdə bu adın fərqli variantlarına rast gəlirik (Bigdeli, Bəgtili, Bəydilü, Begdilü və s.). Xarəzmşahların ulu əcdadı Ənuştəkin, 1260-cı ildə Eyni-Calut döyüşündə monqolları darmadağın etmiş məmlük sultanı Qutuz bu oymağın yetirməsi idilər. Bəgdilü oymağı Hələb türkmanlarının ən böyük qollarından biri olaraq Şamlu tayfa ittifaqına daxil idi. Onlar əsasən Hələb və Diyarbəkir arasında, eləcə də Anadolu torpaqlarında məskunlaşmışdılar. Türkiyə ərazisində bu gün də Bəgdilü toponimlərinə rast gəlmək mümkündür, Azərbaycanda da Biləsuvar və Salyan rayonlarında eyniadlı kəndlər mövcuddur.

Bəzi mənbələr Bəgdilünün bir oymaq çərçivəsini aşaraq tayfa və hətta tayfa birliyi miqyasına çatdığını xəbər verir.

Səfəvilər tarixinin ilk dövrlərinə aid mənbələrdə adı çəkilmiş şəxsiyyətlərin konkret olaraq Şamlu tayfasının hansı oymağına aid olduğu, demək olar ki, göstərilmədiyi üçün bu oymağın adına I Şah Abbasın hakimiyyətə gəlişi ərəfəsindəki hadisələrdən etibarən rast gəlirik. (Görkəmli alim Qulamhüseyn Begdili Səfəvilər zamanında yaşamış, əksər mənbələrdə hansı oymağa mənsub olması göstərilməmiş bir çox Şamlu əyanını – o cümlədən *Hüseyn bəy Lələ*, *Durmuş xan*, *Əliqulu xan* və b. – Begdilü oymağına aid edir).

Şamlu tayfasının bir parçası olaraq Bəgdilü əmirləri Səfəvilər dövlətində mühüm hərbi vəzifələrə sahib idilər. *Zeynal xan Bəgdilü* I Şah Abbasın zamanında *tuşmalbaşı*, *eşikağasıbaşı*, Rey valisi təyin edilmiş, bir sıra mühüm döyüşlərə qatılmış, Böyük Moğol imperiyasına səfir qismində göndərilmişdi. I Şah Abbasın vəfatından sonra I Şah Səfi Zeynal xanı *sipəhsalar* (ordu baş komandanı) təyin etdi, lakin 1630-cu ildə Həmədan yaxınlığında Osmanlı qoşununa məğlub olduqdan sonra xan qəzəbə düçar olub edam edildi. Onun qardaşları Məhəmmədi bəy (I Şah Abbasın yaxın ətrafından sayılırdı) və Qapan bəy, sarayda eşikağasıbaşı vəzifəsində xidmət



edən və külli miqdarda var-dövlət sahibi olan Heydər sultan və oğlu Nurəddəhr bəy, Nəcəf qorçularının qorçubaşısı Sarı sultan böyük nüfuz sahibi idilər. Gündoğmuş sultan Bəgdilü Kərkük ətrafında xidmət edirdi, I Şah Abbasın İraq səfəri zamanı onun xidmətinə daxil olmuş, Azərbaycanda iri torpaq mülkləri almışdı.

Bəgdilü oymağının iki nümayəndəsi (Məhəmməd Mömin xan və oğlu Məhəmmədqulu xan) Səfəvilər dövlətinin sonlarında sədri-əzəm vəzifəsinə gətirilmişdi. Məhəmmədqulu xan Bəgdilü bir neçə aylıq sədrlik dövründən sonra 1722-ci ildə İsfahan şəhərini əfqanların mühasirəsindən xilas etməyə çalışmış, amma döyüşdə məğlub olaraq öldürülmüşdü.

"Atəşkədeyi-Azər" təzkirəsinin müəllifi Lütfəli bəy Azər (1722-1780) də Şamlu tayfasının Bəgdilü oymağındandır.

**BİÇƏRLÜ** – qızılbaş *Şamlu* tayfasının oymaqlarından biri. Şah Məhəmməd Xudabəndənin zamanında *eşikağasıbaşı* olmuş, 1580-ci ildə öldürülmüş Hüseynqulu sultan və oğlu Mehdiqulu sultan bu oymağa mənsub idilər. Herat hakimi *Əliqulu xan Şamlunun vəkili* Mahmud bəy də Biçərlü oymağının seçilmiş əmirlərindən sayılırdı. Şah I Səfi zamanında Mürtəzaqulu xan Biçərlü Şamlu sarayda eşikağasıbaşı vəzifəsində xidmət edirdi.

**BİGDELİ** – *bax:* **BƏGDİLÜ.**

**ƏBDÜLLÜ (ABDULLU)** – qızılbaş *Şamlu* tayfasının oymaqlarından biri. Əbdüllü oymağının yetirməsi Hüseyn xan I Şah Abbasın hakimiyyətə gəlişi ərəfəsində onun tərəfdarlarından idi, çətin günlərdə də şahzadəni tərk etməmişdi. Bu sədaqətin cavabı olaraq I Şah Abbasın zamanında Hüseyn xan Əbdüllü Qum valisi və oxçu *qorçubaşısı* oldu, daha sonra Heratın fəthində fərqləndiyinə görə Xorasan bəylərbəyi təyin edildi. 1618-ci ildə Hüseyn xan vəfat etdikdən sonra oğlu Həsən xan onun yerini tutdu. Həsən xan I Şah Səfi zamanında da bu vəzifəni daşıyırdı. Onun vəfatından sonra vəzifəsi oğlu Abbasqulu bəyə verildi.

**ƏCİRLÜ** – *bax:* **ACİRLÜ.**

**ƏRƏBGİRLÜ** – qızılbaş *Şamlu* tayfasının oymaqlarından biri. I Şah İsmayıl və I Şah Təhmasibin hakimiyyətləri zamanında bu oymaq müstəqil idi. 1520-ci illərdə onların başında Əliqulu bəy dururdu. I Şah Abbasın dövründə ərəbgirlülər Şamlu tayfa biriliyinə qoşuldular.

I Şah Təhmasibin *ovçubaşısı* Mahmud ağa, 1525/36-cı illərdə Van yürüşünə qatılmış Mühəlhil Bahadur bu oymağın yetirməsi idilər.

I Şah Abbasın vəfatı ərəfəsində Azərbaycan əmirlərindən Haqverdi sultan və Əfəndi bəy Ərəbgirlü oymağına mənsub idilər. Bu oymağın yetirməsi Məhəmmədqulu bəy *eşikağasıbaşı* məqamına yiyələnmişdi. "Xanədanın saf sufilərindən" olan Kamal bəy Ərəbgirlü Səfəvilər dövlətində *ovçubaşı* vəzifəsində xidmət etmiş, ahıl yaşlarında hərəm *eşik-*

*ağasıbaşısı* təyin edilmişdi; bu təyinat onun sarayda nə qədər böyük etibar sahibi olduğunu göstərirdi. Kamal bəyin oğlu İsfəndiyar bəy Ərəbgirlü atasından sonra ovçubaşı vəzifəsini daşımaqla bərabər I Şah Abbasın xüsusi tapşırıqlarını icra edirdi. (Mokri kürdlərinə qarşı həyata keçirilmiş cəza tədbirlərinə, şirvanlıların Mazandarandakı Fərahabad məntəqəsinə köçürülməsinə o, başçılıq etmişdir). İsfəndiyar bəy Bağdad səfərindən qayıdarkən yolda qəfil halı pisləşmiş, I Şah Abbasın xəstəyə göstərdiyi qayğıya baxmayaraq, qısa müddət ərzində vəfat etmişdi.

Ərəbgirlü oymağına mənsub bir nəslin nümayəndələri qorçuların baş vəziri vəzifəsini daşıyırdılar. Bu nəsildən olan Hüseynəli bəy Ərəbgirlü həm də mahir xəttat idi, təliq xətti ilə gözəl yazırdı. Onun oğlu Əliqulu bəy də nəsil ənənəsinə uyğun olaraq qorçuların baş vəziri təyin edilmiş, amma I Şah Abbasın hakimiyyətinin əvvəllərində dünyasını dəyişmişdi. Ərəbgirlü oymağından digər şəxslərin də gözəl xəttə sahib olması barədə məlumatlar vardır.

**XARBƏNDƏLÜ** – *bax:* **XUDABƏNDƏLÜ.**

**XARMANDALU** – *bax:* **XUDABƏNDƏLÜ.**

**XUDABƏNDƏLÜ** – qızılbaş *Şamlu* tayfasının oymaqlarından biri. Mənbələrdə adı bəzən “Xarbəndəlü” və ya “Xarmandalu” şəklində də çəkilir. I Şah Abbasın zamanındakı bir neçə güclü sərkərdə bu oymaqdan çıxmışdı. Şahəli sultan Xudabəndəlü 1603/04-cü illərdə Qasım sultan İmanlunun başçılığı altında *Əfşar* tayfasının qüvvələri ilə birləşərək Həmədan yaxınlığında Bağdad valisi Uzun Əhməd paşanın qoşununu məğlub edib özünü əsir almışdı. Digər xudabəndəlü əmiri Xəndanqulu sultan 1605/06-cı illərdə Osmanlı sərkərdəsi Səfər paşanı əsir etmişdi. Hüseyn bəy Xudabəndəlü şahın əmri ilə Hindistana və digər məntəqələrə səfir qismində göndərilmişdi. Bunlardan əlavə, oymağın yetirməsi olan Əli bəyin və Uluxan sultanın da adları mənbələrdə çəkilir.

Xudabəndəlü oymağının ən görkəmli nümayəndəsi I Şah Abbasın zamanında saray kitabxanasının müdiri vəzifəsində çalışmış istedadlı qələm sahibi, *“Məcmə əl-xəvas”* təzkirəsinin müəllifi Sadiq bəydir. Sadiq bəy adətən Əfşar tayfasının nümayəndəsi kimi təqdim edilir. Buradan aydın olur ki, Şamlu və Əfşar tayfaları bir-biri ilə çox qaynayıb-qarışmış, Xudabəndəlü oymağı bunlardan hər ikisinə aid edilmişdir.

Xudabəndəlü oymağının *şahsevənlərdən* sayılması barədə də məlumatlar vardır.

**İNALLU (İNANLU) –** qızılbaş *Şamlu* tayfasının oymaqlarından biri. Şam torpaqlarında məskunlaşmış, Anadoluda da (əsasən Amasya ətrafında) yayılmışdı. XV əsrin əvvəllərindən etibarən Anadolu tarixinə aid mənbələrdə İnallu adına rast gəlinir. Şah Məhəmməd Xudabəndə zamanında bu oymaqdan Asan oğlu



Bilmes bəy, *eşikağasıbaşılar* Piri bəy və oğlu Rzaqulu bəy, İmamqulu xan, Şahverdi xəlifə yüksək məqam sahibi idilər. Rzaqulu bəy dəllək Xudaverdi tərəfindən şahzadə *Həmzə Mirzənin* qətlində adı hallanan, daha sonra bu sui-qəsddə əli olduğu ittihamı ilə öldürülən şəxsdir. I Şah Abbas dövrünə aid mənbələrdə Təhmasibqulu sultan İnallunun adı əmirlərin arasında qeyd edilir.

Bəzən İnallu oymağını Əfşar tayfasına, bəzən də Bayata və Şahsevənlərə aid edirlər

**KƏRAMƏTLÜ** – qızılbaş *Şamlu* tayfasının oymaqlarından biri. Şah Məhəmməd Xudabəndənin zamanında bu oymağın yetirməsi olan Şahəli bəyin oğlu Əliqulu (yaxud Əli) xan öz adaşı olan Xorasan valisi Əliqulu xanın yaxın ətrafından sayılırdı. Sonralar I Şah Abbasın hakimiyyətə gəlişi ərəfəsində baş vermiş hadisələrdə o, əksər Şamlu əmirlərindən fərqli olaraq, şahzadə Abbasın yanında qalmışdı. I Şah Abbas hakimiyyətə keçdikdən sonra Əliqulu xan xidməti karyera pilləsində sürətlə irəliləmiş, *eşikağasıbaşı* və *divanbəyi* vəzifələrinə yiyələnmişdi. *Sufiyan savaşında* (1605) o, Şamlu *qorçularının* sol cinahına başçılıq edirdi. 1625-ci ildə vəfat edərkən uşaqları kiçik olduğu üçün onun vəzifəsi *Zeynal bəy Bəgdilüyə* verildi.

**QARACALU** – qızılbaş *Şamlu* tayfasının *Acirlü* (Əcirlü) oymağının qollarından biridir. Qeyd edildiyi kimi, Acirlü Hələb türkmanları tayfa ittifaqına aid olmuş, Anadoluya köç etdikdən sonra Diyarbəkir məntəqəsində məskunlaşmış böyük tayfa idi, Qaracalu oymağı da onun bir parçası olmaqla *Zülqədəroğulları bəyliyinin* torpaqlarında, Mərəş və Əlbistan bölgəsində yerləşmişdi. 1527/28-ci illərdə baş vermiş qızılbaş təmayüllü Qələndər Çələbi üsyanının əsas hərəkətverici qüvvəsi Qaracalu və Bişanlu (Dokuz) oymaqları idi.

Sonralar Acirlü tayfasının bir hissəsi Səfəvilər dövlətinin ərazisinə köç edərək burada Şamlu tayfasına daxil oldu və beləliklə, Acirlü Şamlu tayfasının bir oymağına çevrildi. Acirlü oymağının mühüm qollarından biri Qaracalu qolu idi. Qaracalu qoluna mənsub olan Salman ağa oğlu Ağamverdi bəyin əmri ilə 1668-ci ildə köçürülmüş ən qədim Füzuli divanı nüsxələrindən biri görkəmli tədqiqatçı alim Ə.Gölpınarlının şəxsi kitabxanasında mövcud olmuşdur.

**NİLQAS** – qızılbaş *Şamlu* tayfasının oymaqlarından biri. Bu oymaq Şamlu tayfasına sonralar daxil olmuşdur. Nağdı Sultan Nilqas bu oymağın görkəmli əmirlərindən idi. Nilqas oymağı barədə mənbələrdə məlumat azdır.

**ŞEYXAVƏND** – bəzən müstəqil qızılbaş tayfası kimi təqdim edilən, əslində isə Səfəvi sülaləsinin yan qollarının mənsublarına verilən ad. *Şeyx Səfiəddin Ərdəbilinin* nəslindən olan, şahın uzaq əqrəbası sayılan şeyxavəndlərin adı onların şeyx (Şeyx Səfi) nəslindən olduqlarını göstərir. Şeyxavənd mənsubları Səfəvilər dövlətində böyük ehtirama layiq idilər. Onlar əsasən dini-təriqət hə-

yatı yaşayır, Ərdəbildə məskunlaşaraq Şeyx Səfi xanəgahının idarəçiliyini həyata keçirirdilər. Bəzi hallarda hərbi və ya dövlət xidmətinə daxil olur, yüksək vəzifələr tuturdular. Məsələn, I Şah İsmayılın əmisi *Xacə Məhəmmədin* nəvəsi olan *Məsum bəy Səfəvi* (vəf. 1568/69) I Şah Təhmasibin zamanında ölkədaxili diplomatik missiyaları yerinə yetirmiş, şahın yaxın məsləhətçisi olmuş, hətta bir müddət baş vəzir vəzifəsini daşımışdır. Onun oğulları Sədrəddin bəy və Seyid bəy də dövlət xidmətində idilər (Seyid bəy bir müddət Astarabad hakimi olmuş, sonra vəzifədən kənarlaşdırılmışdı). I Şah Təhmasibin vəfatından sonra şahzadələrin hakimiyyət uğrunda mübarizəsində Sədrəddin bəy başda olmaqla şeyxavəndlər *Heydər Mirzənin* tərəfini tutmuşdular.

I Şah Abbasın zamanında şeyxavəndlərin sayı 2 min nəfərə yaxın idi və əksəriyyəti Ərdəbildə yaşayırdı. Bəzi mənbələrdə I Şah Abbasın şeyxavəndlərə mənfi münasibət bəslədiyi yazılıb. Çünki Məsum bəy Şeyxavəndin oğlu Sədrəddin bəy şahın anası *Məhdi-ülyanın* qətlində iştirak etmişdi. Həmçinin şahın *lələsi Əmir xan Şamlunun* atası *Sultan Hüseyn xan* Ərdəbil *təkkəsinə* sığındığı zaman şeyxavəndlərin bəzi üzvləri onu xəyanətlə tutub düşmənlərinə təhvil vermişdi.

İsgəndər bəy Münşi *"Tarixi-aləmarayi-Abbasi"* kitabında Böyük Moğol hökmdarı Humayun şahın Səfəvilər dövlətində sığınacaq tapdığı dövrdə Ərdəbilə ziyarətə getməsini təsvir edərkən orada əzəmətli Şeyxavənd seyidlərinin ona səmimi-qəlblə xidmət etdiklərini və yol boyunca ona bir neçə mənzil yoldaş olduqlarını yazmışdır. Həmçinin İsgəndər bəy Münşi Məsum bəy Səfəvi və övladları ilə yanaşı İraq seyidlərindən olan Kəmunə nəslinin nünayəndələrini də Şeyxavənd tayfası adı altında qeyd etmişdir.



**TALIŞLAR** – Səfəvilər dövlətinin formalaşmasında və inkişafında rol oynamış tayfalardan biri. Səfəvilər tarixinə aid tədqiqatlarda talışlar adətən yeganə qeyri-türk və irandilli tayfa olaraq qeyd edilir. Onları indiki irandilli talış xalqı ilə eyniləşdirənlərlə yanaşı, türk-moğol mənşəli və türkdilli tayfa olmalarını ehtimal edənlər də vardır (Vladimir Minorski, Babək Cavanşir və b.). Klassik Səfəvi mənbələrində talışlar xalq deyil, digər qızılbaş tayfaları ilə bir sırada tayfa şəklində təqdim edilmişlər.

Talışlar əsasən Xəzər dənizinin cənub-qərb sahillərində, Gilan vilayətində məskunlaşmışdılar. Səfəvilərin fəthindən əvvəl burada Kiya (Karkiya) sülaləsi hakimiyyət sürürdü. Gilan vilayəti iki hissəyə bölünürdü. Səfidrud çayının qərb (yuxarı) sahili boyunca mərkəzi Rəşt olan Biyə-pəs bölgəsi və çayın şərq (aşağı) sahilində mərkəzi Lahican olan Biyəpiş bölgəsi. I Şah İsmayıl uşaq yaşlarında Lahicanda qızılbaş əmirləri tərəfindən bir neçə il gizlədilmiş, bu müddət ərzində İslam dininin və qızılbaş inancının incəliklərini öyrənmişdi.

*Şeyx Heydərin* və daha sonralar *Sultan*



*Əli Mirzənin* tərəfdarları arasında talışlar da vardı. Sultan Əli Mirzənin Ağqoyunlu Rüstəmlə müttəfiq şəkildə Baysunqura qarşı döyüşündə qoşunun sol cinahına talış dəstələri də daxil idi.

Səfəvilər tarixinə aid mənbələrdə talış əmirlərinin adına digər qızılbaş tayfalarının mənsubları ilə müqayisədə az rast gəlirik. Səfəvilər dövründə talışların ən görkəmli nümayəndəsi I Şah İsmayıl zamanında yaşamış, *xəlifət əl-xüləfa* (şahın təriqət məsələləri üzrə müşaviri və qızılbaş sufilərlə şah arasında əlaqələndirici) mənsəbinə layiq görülmüş *Xadim bəy Xüləfadır.* O, I Şah İsmayılın uşaqlıq dövründə onu qorumuş və qızılbaşlıq mücadiləsində mühüm rol oynamış *əhli-ixtisas* adlandırılan yeddi əmirdən biridir.

Bəzən I Şah İsmayılın *dədəsi* (təriqət məsələləri üzrə tərbiyəçisi) *Abdal bəyin* də talışlardan olduğu qeyd edilir, lakin mötəbər mənbələrə görə, o, *Zülqədər* tayfasına mənsub olmuşdur.

Klassik Səfəvi dövrü mənbələrindən olan "Aləmarayi-Səfəvi" kitabında müxtəlif hərbi yürüşlərdən bəhs edilərkən I Şah İsmayılın sərkərdəsi Mirzə Məhəmməd Talışın adı tez-tez çəkilir. Düşmənlər bir neçə dəfə Mirzə Məhəmmədə rüşvət göndərməklə I Şah İsmayılı təhvil verməsini ona təklif etsələr də, sərkərdə xəyanət etməmiş və şaha sadiq qalmışdır. Mərv savaşında Mirzə Məhəmmədin öz tabeliyindəki talış birlikləri ilə böyük şücaət göstərdiyi xüsusi qeyd edilir. Bəzi mənbələrə görə, Məhəmməd bəy Talış Xalxal bölgəsindən çıxmış və I Şah İsmayılın ilk *lələsi* (tərbiyəçisi) olmuşdur. O, Şeyx Heydərin ögey bacısı Şahpaşa xatunla ailə qurmuşdu.

I Şah İsmayıl dövründən bəhs edən mənbələrdə talış tayfasından Nuşirəvan bəy, Məhəmməd bəy və Pirğeyb bəydən də bəhs edilmişdir.

*Çaldıran savaşında* talış birlikləri özünəməxsus döyüş qaydasına görə fərlənmişlər. Onlar əyinlərinə zireh geyinmirdilər, çünki zirehin və ağır silahın döyüşdə maneçilik törətdiyinə inanırdılar. Həmçinin talışlar döyüşə xüsusi qaydada təlim görmüş köpəklərlə qatılırdılar. Bu köpəklər öz sahibləri ilə əlaqələndirilmiş şəkildə hərəkət edir və düşmənə ciddi ziyan vururdular. Hətta Sultan Səlim Yavuz əmr vermişdi ki, həmin köpəklərdən bir neçəsini tutub onların əsasında Osmanlı ordusu üçün də təlim görmüş köpəklər hazırlasınlar, lakin bu əmri yerinə yetirmək mümkün olmamışdı.

I Şah Təhmasibin vəfatı ərəfəsində Səfəvilər dövlətində yüksək vəzifə tutmuş əmirlər arasında talışlardan iki nəfərin adı çəkilir. Bunlardan biri Bayandur xan Astarada hakimiyyət sürürdü. Həmzə xəlifə adlı digər talış əmirinə isə Gilanın Biyəpiş bölgəsində mülklər verilmişdi. Astarada hökm sürən Bayandur xanın adının türk mənşəli olması diqqətəlayiq cəhətdir.

I Şah Abbas zamanında Alpaut tayfasından olan Bədr xan Talış vilayətinin bəzi bölgələrində hakimlik edirdi.

Talışların bir hissəsi sonralar *şahsevənlərin* tərkibinə daxil olmuşdur; belə ki,

şahsevənlərin bir qolu Talış-Mikeyli adlanırdı.



**TƏKƏLÜ** – böyük qızılbaş tayfalarından biri. Mənbələrdə adı Təkə və Təklə şəklində də qeyd edilir. Təkəlülər əsasən Anadolunun Antalya bölgəsində məskunlaşmışdılar, bu tayfaya mənsub *Şərəfəddinoğlu* nəslinin kökü isə Məntəşə bölgəsindən idi. Səfəvilər dövlətinin qurulmasında bu tayfanın nümayəndələri fəal iştirak etmişlər. Onların adına hələ *Şeyx Heydər* dövründəki hadisələrin təsvirində rast gəlirik. Şeyx Heydərin Anadoludakı *xəlifələrindən* (nümayəndələrindən) biri Təkə elinin Yalunlu kəndindən olan Həsən xəlifə idi. Bu, Osmanlı dövlətinin ərazisində baş vermiş ən böyük qızılbaş hərəkatlarından birinin rəhbəri olan *Şahqulu xəlifə Təkəlünün* atasıdır. *Şahqulu xəlifənin üsyanı* Osmanlı dövlətində böyük gərginliyə səbəb olmuş, özündən sonrakı qızılbaş hərəkatları üçün stimul rolunu oynamışdı.

Şahqulu üsyanı yatırıldıqdan sonra Təkə elindən 40 min nəfərdən artıq qızılbaş öldürüldü, xeyli insan öz yurdundan didərgin düşüb yeni fəth olunmuş Peloponnes yarımadasına (Modos və Koron bölgələri) köçürüldü.

Təkəlü tayfasının bir hissəsi hələ bundan əvvəl – I Şah İsmayılın Ərzincana səfəri zamanı (1500) ona beyət etmiş və şahın arxasınca Səfəvilər dövlətinin ərazisinə keçmişdi. İsfahan, Həmədan, Rey, Gilan və Şirvan bölgələrində Təkəlü tayfasına yer ayrılmışdı.

I Şah İsmayıl zamanındakı Təkəlü əmirlərindən Saru Əli bəy və Halvaçıoğlu İlyas bəy döyüşlərdə böyük şücaət göstərmişlər. Səfəvilər dövlətinin ilk *möhürdarı Saru Əli bəy*, ilk *ovçubaşısı Halvaçıoğlu İsa bəy* olmuşdur.

I Şah İsmayıl zamanında Təkəlü tayfasının bir neçə yetirməsi mühüm dövlət vəzifələrində xidmət edir, ordunun nüfuzlu və güclü sərkərdələrindən sayılırdı. Yegan bəy Təkəlüyə *qorçubaşı* vəzifəsi verilmiş, *Şeybani xanla* müharibədə fərqlənmiş Burun sultan (əsl adı Bülənd və ya Pəsənd bəy) Məşhədə, *Çuxa sultan* İsfahana, Qaraca sultan Həmədana, Əli sultan Qəzvinə hakim təyin edilmişdi. Təkəlülərdən Çirkin Həsən xan, Rəis bəy, Şərəfəddin bəy, Məhəmməd bəy və b. da o zamanın görkəmli əmirlərindən sayılırdılar. İlyas bəy Halvaçıoğlunun oğlu *Həsən (Hüseyn) bəy eşikağasıbaşı* naibi, *əmirşikarbaşı* və *söhbət yasavulu* mənsəblərini tuturdu, bu nəsildən olan gənc Yaqub bəy Halvaçıoğluna döyüşlərin birində fərqləndiyinə görə sultan rütbəsi hədiyyə edilmişdi. O zamanlar hərbi karyeraya başlamış *Ulamə sultan Təkəlünün* adına sonrakı hadisələrin gedişində daha tez-tez gəlirik.

1524-cü ildə I Şah İsmayıl *Div sultan Rumlunu* azyaşlı Təhmasib Mirzənin naibi təyin edərək vəfat etdi. Bundan sonra qızılbaş tayfalarının hakimiyyət uğrunda mübarizəsi başladı. Orduda və bölgələrdə böyük nüfuz sahibi olan təkəlülər Çuxa sultanı hakimiyyətdə Div sultanla şərik etməyə nail oldular. Hakimiyyətə iddialı olan *Ustaclu* tayfası ilə



baş vermiş döyüşlərdə Təkəlü tayfasından Burun sultan və Qaraca sultan öldürüldülər. Lakin mübarizədən qələbə ilə çıxan təkəlülər 1527-ci ildə Div sultan Rumlunu da aradan götürdülər. Bundan sonra *əmir əl-üməra* vəzifəsini təkbaşına yerinə yetirən Çuxa sultan öz həmtayfalarını mühüm vəzifələrə təyin etməyə başladı, o cümlədən Şahqulu üsyanının yatırılmasından sonra I Şah İsmayıla qoşulmuş, yasavul və eşikağasıbaşı vəzifələrini qazanmış və igidliyinə görə "Yavuz oğlan" ləqəbini almış Ulamə sultan Təkəlü Azərbaycan bəylərbəyi təyin edildi. Qəzvin hakimi *Şərəfəddin oğlu Məhəmməd xan* Bağdad valiliyinə təyinat aldı, şahzadə *Bəhram Mirzənin* lələsi isə Təkəlü tayfasından Çirkin Həsənin oğlu Qazı xan oldu.

Təkəlülərin hakimiyyəti şəriksiz halda idarə etmək istəyi digər qızılbaş tayfaları tərəfindən narazılıqla qarşılandı. Tayfaların koalisiyası I Şah Təhmasibin də gizli xeyir-duasını aldı. 1531-ci ildə *Hüseyn xan Şamlu* Çuxa sultana qarşı sui-qəsd təşkil etdi. Təkəlülərlə onların düşmənləri arasında baş vermiş çarpışma hətta I Şah Təhmasibin çadırına da keçdi və atılan oxlardan bəziləri şahın tacına sancıldı. Sui-qəsd nəticəsində Çuxa sultan öldürüldükdən sonra oğlu Şahqubad *əmir əl-üməra* oldu, ardınca Təkəlü əmirləri digər tayfalardan bir neçə nüfuzlu şəxsi aradan götürdülər. Lakin I Şah Təhmasib təkəlülərin özbaşınalığından ciddi şəkildə ehtiyat edirdi. Qızılbaş tayfaları təkəlülərə qarşı birləşdilər, *qorçubaşı* Pərvanə bəy, *möhürdar* İbrahim xəlifə kimi Təkəlü əmirləri öldürüldü. Tayfanın sağ qalan üzvləri Bağdad valisi Şərəfəddin oğlu Məhəmməd xanın yanında sığınacaq tapmağa çalışsalar da, o öz həmtayfalarını (o cümlədən Şahqubad xanı) edam edib başlarını şaha yolladı.

Azərbaycan bəylərbəyi Ulamə sultan Təkəlü həmtayfalarının əzildiyini görüb I Şah Təhmasibin Xorasana getməsindən istifadə edərək Təbrizdə qarışıqlıq yaratdı və dövlət çevrilişinə cəhd etdi. Amma şahın yaxınlaşdığını eşidəndə tələsik Van istiqamətinə çəkildi və Osmanlı dövlətindən sığınacaq istədi. Sonralar Ulamə sultan bir neçə dəfə osmanlıların Səfəvilər üzərinə hücumlarına sərkərdə və bələdçi qismində qatılmışdır. Ulamə sultandan nümunə götürən bəzi qızılbaş əmirləri də (onun qardaşı Vəli bəy, Təkəlü tayfasından Vəlican bəy, Burun sultanın oğlu Hüseyn sultan, Bəhram Mirzənin lələsi Qazı xan, o cümlədən Bağdadda xidmət edən Təkəlü əmirləri) Osmanlı dövlətinin himayəsi altına keçdilər. Beləliklə, Təkəlü tayfası əmirlərinin bir hissəsi vətəndaş müharibəsində digər qızılbaş tayfaları tərəfindən öldürüldü, bir hissəsi də düşmən tərəfə keçdi. (Daha bir Təkəlü əmiri Əxi sultan 1526-cı ildə Şeybani Übeyd xanla müharibədə həlak olmuşdur).

Hicri 937-ci ildə (miladi 1530/31-ci illər) Çuxa sultanın ölümü ilə kulminasiya nöqtəsinə çatmış bu hadisələr Səfəvilər tarixində o qədər mühüm yerə malikdir ki, onu orta əsrlər ənənəsinə uyğun olaraq *"afəti-Təkəlü"* (Təkəlü bəlası) şəklin-

də ifadə etmişlər. ("Afəti-Təkəlü" ifadəsinin əbcəd hesabı ilə qarşılığı 937-dir). Bu hadisələrdən sonra Təkəlü tayfasının etibarı uzun müddət sarsılmış oldu və bu tayfanın yetirmələri yüksək vəzifələrə gətirilmədilər. Belə ki, I Şah Təhmasibin vəfatı ərəfəsində mənsəb sahibi olan bircə Təkəlü əmirinin – Şərəfəddinoğlu Məhəmməd xanın adı çəkilir. Herat hakimi olan Məhəmməd xan həm də şahzadə Məhəmmədin (gələcək Şah Məhəmməd Xudabəndənin) lələsi idi.

Şərəfəddinoğlu Məhəmməd xandan sonra oğlu Qazaq xan Herat hakimi oldu, onun tabeliyində 10 min nəfərlik hərbi qüvvə vardı. O, I Şah Təhmasibə qarşı çıxdığı üçün Məsum bəy Səfəvi tərəfindən həbs edilmiş və 1564/65-ci illərdə ölmüşdür.

Təkəlülər II Şah İsmayıl zamanından etibarən tədricən dövlət idarəçiliyinə qayıtmağa başladılar. Hətta onlar fürsətdən istifadə edib bir neçə Ustaclu əmirini öldürməklə köhnə düşmənçiliyin intiqamını da aldılar.

Şah Məhəmməd Xudabəndənin zamanında Şərəfəddinoğlu nəslindən Müseyyib xan Təkəlü şahın xalası oğlu olduğuna görə dövlətdə böyük nüfuz sahibi idi, Rey ətrafında iri mülkləri vardı. Onun qardaşı Muxtar sultana Vəramində, qohumları Vəli sultanla Ərdoğdu xəlifəyə Həmədanda və Şirvanda, Çuxa sultanın nəvəsi Solaq Hüseynə Gilanda mülklər bağışlandı.

Şah Məhəmməd Xudabəndənin zamanında baş vermiş qarışıqlıq şəraitində təkəlülər bir daha kobud səhvə yol verərək şahzadə *Həmzə Mirzənin* əleyhinə şahzadə *Təhmasibi* dəstəklədilər. Müseyyib xan və qardaşı Muxtar sultan, Vəli xan və oğlu Əli sultan Pakmal kimi sərkərdələrin başçılığı altında təkəlülər *türkmanlarla* ittifaqa girib 10 min nəfərlik ordu təşkil etdilər. Həmzə Mirzə *Ustaclu, Şamlu, Zülqədər* və *Rumlu* tayfalarının mənsublarından ibarət 7 min nəfərlik ordu ilə onlara qarşı çıxdı. Döyüşdə Təkəli-Türkman birliyi məğlub oldu (1586), Təkəlü əmirlərinin bütün mülkləri Ustaclu və Şamlu tayfasının nümayəndələrinə verildi.

Təkəlü tayfası I Şah Abbasın hakimiyyətinin əvvəllərində daha bir güclü zərbə aldı. Ondan narazı olan Təkəlü əmirlərinin Mazandaranın Amil bölgəsinə sığındıqlarını öyrənən şah bu tayfanın böyüklərinin bütünlükdə aradan götürülməsini əmr etdi. Həmədan bəylərbəyi, kürd mənşəli Həsən xan Çigini bu vilayətdə yaşayan təkəlülərə divan tutdu, Şərəfəddinoğlu Mustafa xan, Vəli xan, az sonra Solaq Hüseynin oğlu Bayram xan öldürüldülər. Əvvəlcə Tehran hakimliyinə gətirilmiş Müseyyib xan da şahın qəzəbindən xilas olmadı və 1590-cı ildə ömrünü zindanda başa vurdu.

I Şah Abbasın qəzəbi soyuduqdan sonra təkəlüləri əfv etdi, hətta onlardan Şahnəzər sultana Məşhəd vilayətini bağışladı. Bununla belə, sonrakı dövrlərdə Təkəlü tayfası bir daha dövlət idarəçiliyində əvvəlki yerini bərpa edə bilmədi. Mənbələrdə Mürtəzaqulu bəy, qorçu yüzbaşısı Vəli bəy Təkəlü (vəf. 1629/30) kimi şəxslərin adına rast gəlinsə də,



bunlar digər qızılbaş tayfaları ilə rəqib ola biləcək gücə malik deyildilər.

Təkəlü tayfasının bir neçə yetirməsi istedadlı qələm sahibi kimi tanınmışdır. Yuxarıda adı çəkilən Şərəfəddinoğlu Müseyyib xan Təkəlü şair olmaqdan əlavə nəstəliq xəttində gözəl yazan xəttat idi, musiqini yaxşı bilir, hətta özü də musiqi bəstələyirdi. Sadiq bəy Əfşar Müseyyib xanın sağlığında qələmə aldığı öz təzkirəsində onun haqqında tərifli sözlər yazmışdır: "Olduqca təvazökar və ləyaqətli bir gəncdir. Qızılbaş dövlətinin şəxsiyyətləri arasında öz fitri istedadına görə ona bərabəri çox az tapılar". "Məcmə əl-xəvas"dan göründüyü kimi, Qaraca sultan Təkəlünün nəslindən Məhəmməd bəy Məzaqi, Mirzəqulu Meyli, divan sahibi Mövlana Sani, Mövlana İtabi, Xoştəb Balı və Təkəlü bəyzadələrindən Müşribinin də şairlik təbi olmuşdur.

Mənbələrdə Təkəlü tayfasının oymaqları barədə məlumata rast gəlinmir.

**AFƏTİ-TƏKƏLÜ (TƏKƏLÜ BƏLASI)** – I Şah Təhmasibin hakimiyyətinin əvvəllərində qızılbaş *Təkəlü* tayfasının hakimiyyət uğrunda mübarizəsi, hakimiyyətə yiyələnməsi, digər qızılbaş tayfaları ilə qarşıdurması və sonda şahın dəstəyi ilə ağır şəkildə cəzalandırılmasını əhatə edən tarixi mərhələyə salnamələrdə verilmiş ad. Əbcəd hesabı ilə bu ifadənin ekvivalenti 937-dir ki, hicri təqvimdən miladi təqvi mə çevirdikdə 1530/31-ci illəri əhatə edir.
*bax:* **TƏKƏLÜ.**

**ŞƏRƏFƏDDİNOĞLU** – qızılbaş *Təkəlü* tayfasına mənsub, Anadolunun Məntəşə bölgəsindən olan bir nəsildir. XVI-XVII əsrlərdə Səfəvilər dövlətində yaşamış bir neçə görkəmli şəxsiyyət bu nəsildən çıxmışdır.
*bax:* **TƏKƏLÜ.**

**TƏKLƏ** – *bax:* **TƏKƏLÜ.**

**TURĞUDLU (TURĞUDOĞULLARI)** – qızılbaş tayfalarından biri. Səfəvilər dövlətinin quruluş mərhələsində Anadoludan köç edib I Şah İsmayıla qoşulan qızılbaşların arasında Turğudoğulları da var idi. Turğudoğulları 1474-cü ilədək müstəqilliyini qoruyub saxlamış, daha sonra Osmanlı imperiyası tərəfindən fəth edilmiş Qaramanoğulları bəyliyinin ən güclü nəsillərindən sayılırdı. Bu nəsillə Qaramanoğulları sülaləsi arasında yaxın qohumluq əlaqələri vardı. XVI əsrin əvvəllərində Turğudoğulları nəslinin başçısı Musa bəy idi, I Şah İsmayıl ona Azərbaycan türkcəsində məktub göndərərək öz nümayəndəsi Əhməd ağa Qaramanlunun tapşırıqlarına əməl etməsini tapşırmışdı (1512). I Şah Təhmasibin hakimiyyətinin əvvəllərində qızılbaş əmiri Turğud oğlu Həsən sultan Xorasan yürüşünə qatılmışdı. Bu tayfadan olan Pir Bayram və Kökəzoğlu döyüşlərdə şücaət göstərərək Xorasan yürüşündə öldürülmüşdülər. I Şah Təhmasib dövründə Səfəvilər dövlətində xidmət edən Turğudlu əmirlərindən biri də Qasiməli bəy idi. Osmanlı şahzadəsi, Qanuni Süleymanın oğlu Bayezid 1559-

cu ildə Səfəvilər dövlətinə sığındığı zaman yaxın ətrafından olan Pir Hüseyn bəy Turğudoğlu da onu müşayiət etmişdi. Bayezid sultan 1562-ci ildə osmanlılara təhvil verilib öldürüldü, onunla birlikdə gələnlərin böyük bir hissəsi ölümə məhkum edildi. Şahzadə Bayezidin ətrafında olanlardan kim Səfəvilər dövlətində məskunlaşmış tayfalara mənsub idisə, onu öz tayfasının içinə göndərdilər. Pir Hüseyn bəy də sağ qalanlardan biri idi.



**TÜRKMAN** – qızılbaş tayfa ittifaqı. Geniş mənada XV əsrdə Anadolu, Azərbaycan, İraq və Suriya coğrafiyasına yayılmış, Azərbaycan türkcəsində danışan böyük etnik birlik türkman adını daşıyırdı. Səfəvilər dövlətinin özəyini təşkil edən qızılbaş tayfaları da türkman etnik birliyinə mənsub idilər, bu mənada Səfəvilər imperiyası özündən əvvəlki Qaraqoyunlu və Ağqoyunlu dövlətləri kimi türkman konfederasiyası sayıla bilər. Səfəvi Qızılbaş dövlətinin sələfi olan Aqğoyunlu dövlətinin özəyini Bayandur, *Mosullu* və *Pörnak* adlı üç əsas tayfa təşkil edirdi. Qaraqoyunlular üzərində qələbədən sonra *Baharlu* tayfası da bura əlavə oldu. Bunlar ümumilikdə türkman eli sayılır, orta əsr mənbələrində Ağqoyunlu hökmdarı *Uzun Həsən* də "Uzun Həsən Türkman" adlandırılırdı. Səfəvilər dövründə Mosullu, Pörnak və Baharlu tayfalarını birlikdə Türkman adlandırırdılar. (24 oğuz boyundan *Dögərin* qalığı olan Dögər oymağının da türkmanlara bağlı olduğunu, daha sonralar *Otuziki* tayfa ittifaqına qoşulduğunu yazırlar). Səfəvi mənbələrində "türkman" sözü bəzən ümumilikdə türkman tayfalarından hər hansı birinə bağlılığı, bəzən isə yuxarıda adları çəkilən tayfalara mənsubiyyəti ifadə edirdi. Əksər hallarda tarixi mənbələrdə şəxslərin adından sonra "Mosullu" və ya "Pörnak" ifadəsi ilə yanaşı "türkman" sözü də işlədilr. Türkmanlar, xüsusilə Mosullu tayfası Səfəvilər dövlətinin inkişafında və Səfəvilər sülaləsinin genofondunun formalaşmasında mühüm rol oynamışlar.

Səfəvilər dövlətinin qurulmasından əvvəl türkmanlar Ağqoyunlu dövlətinin tabeliyində yaşayırdılar. Təsadüfi deyil ki, *Şeyx Heydərin* və gənc İsmayılın döyüşdükləri qarşı tərəfin bəzi sərkərdələri də Türkman ləqəbini daşıyırdılar (Ağqoyunlu əmirləri Süleyman bəy Bicənoğlu, minbaşı Qasım bəy, Osman sultan, İsfəndiyar sultan, Əli bəy, Murad bəy Türkman, Tarom hakimi Hüseyn sultan Türkman və b). I Şah İsmayıl hakimiyyətdə möhkəmləndikcə türkmanlar onun tabeliyinə keçməyə və qızılbaş inancını qəbul etməyə başladılar.

1508-ci ildə I Şah İsmayılın *Zülqədəroğulları bəyliyi* üzərinə yürüşü zamanı Birəcük hakimi Abdal sultan Türkman ona tabe oldu. Abdal sultanın şaha sədaqəti o qədər güclü idi ki, qızılbaşlığı qəbul etdikdən sonra ona Birəcük qalasının hakimliyində qalmaq təklif edilsə də, razı olmamış, şahın üzəngisinin həndəvərində durub ona xidmət etməyi üstün tutmuşdu.

I Şah İsmayıl 1508-ci ildə İraqı fəth et-



dikdən sonra şeirlərinin birində öz türkman döyüşçüləri ilə fəxr edərək yazırdı:

Yetdikcə tükənir ərəbin kuyi-məskəni,
Bağdad içində hər necə kim türkman qopar.

I Şah İsmayıl uşaq yaşlarında iki qardaşı və anası ilə birlikdə İstəxr qalasında həbsdə olarkən onların mühafizəsi Ağqoyunluların Şiraz hakimi Mənsur bəy Pörnaka tapşırılmış, o da məhbuslarla mehriban rəftar etmişdi. Ağqoyunlu Murad Sultanın məğlubiyyətindən sonra Mənsur bəy I Şah İsmayılın tərəfinə keçdi.

Türkman əmirlərindən Qızıl Məhəmməd I Şah İsmayılın atabir qardaşı *Süleyman Mirzənin* yaxın ətrafından sayılırdı. Süleyman Mirzə qardaşına qarşı üsyan qaldıranda Qızıl Məhəmməd Türkman onu dəstəkləmiş, *Məntəşa sultan Ustaclunun* başçılığı altında şah tərəfindən göndərilmiş qoşunla döyüşdə öldürülmüşdü (1513/14).

1514-cü ildə baş vermiş *Çaldıran savaşında* qızılbaş ordusunun tərkibində döyüşüb həlak olmuş sərkərdələrdən biri də Qazaqlu obasından Vəlican bəy Türkman idi. I Şah İsmayıl zamanındakı türkman əmirlərindən Əlişəkər bəy Türkman Baharlunun (Böyük Moğol hökmdarı Humayun şahın zamanında "xanlar xanı" titulunu qazanmış *Bayram xan Mosullunun* babası) və oğlu Məhəmmədı xanın da adları mənbələrdə qeyd edilmişdir.

I Şah İsmayılın zamanında baş vermiş hadisələrdə *möhürdar* Əmir bəy Mosullunun (sonralar xan titulu qazanmışdır) adı bir neçə dəfə hallanır. Onun qardaşları İbrahim xan və Əli bəy, Əli bəyin oğlu Noxud (Zülfüqar) sultan, oğulları Gülabı xan və Sultan Murad, qohumu Şahbudaq sultan da görkəmli Türkman bəylərindən sayılırdılar.

I Şah İsmayılın *miraxurbaşısı*, *vəkil Mirzə Şah Hüseyn İsfahanini* öldürtmüş Şahqulu bəy də türkmanların Mosullu tayfasından idi (Bəzi mənbələrdə Şamlu tayfasının Ərəbgirlü oymağından olduğu yazılır).

Azərbaycan bəylərbəyi Ulamə sultan Təkəlü osmanlılara sığındıqdan sonra I Şah Təhmasib onun yerinə öz qaynı Musa sultan Mosullu-Türkmanı təyin etmişdi.

I Şah Təhmasibin vəfatından sonra Xorasanın Tun və Təbəs məntəqələrinin hakimi Zöhrab xəlifənin oğlu Süleyman xəlifə (*Mürşidqulu xan Ustaclunun* kürəkəni), Qum hakimi Heydər sultan Çabuk Tərxan, Məşhəd hakimi və Xorasanın yarısının *əmir əl-ümərası Mürtəzaqulu xan Pörnak*, Savə hakimi Yadigar Məhəmməd Tərxanın oğlu Əbu Məsum sultan, şahın kürəkəni, Azərbaycan bəylərbəyi *Əmir xan Türkman* (vəf. 1586), onun qardaşları İsmayıl sultanla Şahqulu sultan, oğlu Murad sultan, Kaşan hakimi Məhəmməd xan oğlu Vəlican sultan, İbrahim sultan Piyada Türkman da Səfəvilər dövlətinin idarəçilik aparatında özünəməxsus yer tutmuşlar.

I Şah Təhmasibin vəfatından sonra şahzadələr İsmayıl Mirzə ilə *Heydər Mirzə* tərəfdarlarının arasındakı qarşıdurmada (1576) Heydər sultan Çabuk, Süleyman

bəy və Xanvəzir (Xanvəli) bəy Baharlu başda olmaqla türkman əmirləri birincini dəstəkləmişdilər.

1586-cı ildə şahzadə *Həmzə Mirzə* tərəfindən *Əmir xan Mosullu-Türkmanın* öldürülməsi türkmanlara ağır təsir etdi və onlar Təkəlü tayfası ilə birləşərək digər şahzadə *Təhmasib Mirzəni* hakimiyyətə gətirmək üçün hərəkətə keçdilər. Lakin qızılbaş tayfalarının döyüşündə Təkəlü-Türkman ittifaqı məğlub oldu və onların mülkiyyəti qalib tərəfin arasında bölüşdürüldü.

I Şah Abbasın hakimiyyət dövründə türkmanlardan *Pirbudaq xan Pörnak* və oğlu *Şahbəndə xan*, Heydər bəy Dəvəlioğlu, Heydər sultan Çabukun oğulları İbrahim xan (İstanbula elçi qismində göndərilmişdi) və Ədhəm xan, dəftərxana darğası Bəstam ağa, Məhəmməd xan Türkmanın oğlu Bektaş bəy və başqaları müxtəlif vəzifələrdə xidmət edirdilər. Lakin onların çoxu I Şah Abbas dövründə cəzalandırılmış qızılbaş əmirlərinin arasında yer tutdu. Nəticədə şahın vəfatı ərəfəsində dövlətdə cəmi iki nəfər türkman əmiri yüksək vəzifə daşıyırdı. Bunların birincisi Azərbaycan bəylərbəyi *Şahbəndə xan* oğlu *Pirbudaq xan Pörnak*, ikincisi isə Qapanat hakimi Həsən sultan Ördəklü idi.

I Şah Abbas, I Şah Səfi və II Şah Abbas zamanlarında bir neçə türkman əmiri ardıcıl olaraq Azərbaycan hakimi təyin olunmuşdur. (*I Pirbudaq xan Pörnak*, oğlu *Şahbəndə xan*, onun oğlu *II Pirbudaq xan*).

Türkman tayfaları Səfəvilər sülaləsinin genofondunun təşəkkülündə də az rol oynamamışlar. I Şah İsmayılın xanımı *Taclu bəyim Mosullu* tayfasından Həmzə bəy Bektaşinin oğlu Mihmad bəyin qızı idi. I Şah Təhmasib də Mosullu tayfasından İsa bəyin qızı *Sultanım xanımla* evlənmişdi. Sonrakı Səfəvi şahları II Şah İsmayıl və Şah Məhəmməd Xudabəndə bu izdivacdan dünyaya gəlmişdilər. I Şah Təhmasibin qızı *Fatimə sultan bəyim Əmir xan Mosullu-Türkmanın* həyat yoldaşı idi.

Qızılbaş tayfaları arasında türkmanlar daha savadlı, elm və sənətə bağlı olmaları ilə seçilirdilər. Səfəvilər tarixində bir neçə görkəmli ədəbiyyat və incəsənət xadimi Türkman ləqəbi ilə mənbələrdə qeyd edilir. Məşhur *"Tarixi-aləmarayi-Abbasi"* kitabının müəllifi *İsgəndər bəy Münşi Türkman*, II Şah İsmayılın qohumu (deməli, Mosullu tayfasından) olan Məhəmməd Əmin sultan və qardaşı Məhəmməd Mömin bəy, Əmir xan Mosullunun oğlu Sultan Mahmud xan, Murad xan Figari, Əlixan Mirzə Sadiqi, Məhəmməd Saleh Mirzə, *Susəni bəy*, Fərruxzad bəy Türkmanın oğlu Abbas bəy, divan sahibi olan Qasim bəy Haləti, Nizami Gəncəviyə təqlid edərək "Xəmsə" yazmış Mahmud bəy Salim, Həsən bəy Şəkəroğlu Müqimi, Piri bəy Dögər, Məvali və başqaları öz dövrlərində şair kimi kifayət qədər tanınmışdılar. Onların barəsində *Sadiq bəy Əfşarın "Məcmə əl-xəvas"* təzkirəsində məlumat verilmişdir.

XVII əsrin görkəmli nəqqaşlarından olan *Müin Müsəvvir* özündən əvvəl Sadiq



bəy Əfşar tərəfindən çəkilməyə başlanmış, amma yarımçıq qalmış "Teymur xan Türkmanın portreti"ni 1684-cü ildə tamamlamışdır. Hazırda bu rəsm əsəri Sankt-Peterburqdakı Şərq Əlyazmaları İnstitutunda mühafizə edilir.

Türkman tayfaları digər qızılbaş tayfaları ilə çox qaynayıb-qarışmışdır. Belə ki, türkman *Baharlu* tayfasını bəzən *Şamlunun* bir qolu hesab edirlər. Tarixi və bədii ədəbiyyat nümunələrində tez-tez "təkə-türkman" ifadəsinə rast gəlirik, bu da təkəlülərlə türkman birliyinə aid tayfaların bir-birinə qaynayıb-qarışmasından xəbər verir.

Azərbaycanda *tərəkəmə* adlandırılan etnoqrafik qrupu da qızılbaş türkman tayfaları ilə əlaqələndirirlər. Köçəri mənasını verən "tərəkəmə" sözü "türkman"ın cəm halı olan "tərakimə" ifadəsindən törəmişdir.

"Tarixi-aləmarayi-Abbasi"də I Şah Abbas zamanında dövlət xidmətində olanların siyahısında qızılbaş oymaqlarından olmayan əmirlər arasında Şirvanın tərəkəmə (tərakəmat) tayfalarından Nurəddin sultan Payidarın adı çəkilir və onun həmişə Tiflis hakiminə tabe olduğu qeyd edilir.



**BAHARLU** – qızılbaş türkman tayfalarından biri. Qaraqoyunlu tayfa ittifaqına daxil idi. Tayfanın adı və mənşəyi barədə fərqli nəzəriyyələr vardır. Bəzi tədqiqatçılar "Baharlu" sözünü Qaraqoyunlu sülaləsinin mənsub olduğu Baranlu tayfası ilə eyniləşdirmişlər. Bəzən Baharlunu *Şamlu* tayfasının bir qolu hesab edirlər. Hələ Səfəvilər dövləti yaranmazdan əvvəl Baharlu tayfasının böyük bir qismi Həmədan ətrafında məskunlaşmışdı.

Baharlu tayfasının bəzi əmirləri Ağqoyunlu dövlətinin hakimiyyəti altında xidmət edirdilər. Onların bir qismi Ağqoyunluların tərəfində Səfəvilərə qarşı döyüşmüş, bir qismi isə *qızılbaşlığı* qəbul etmişdi.

Bu tayfanın nüfuzlu qollarından biri *Əlişəkəroğulları* nəslidir. Hətta Səfəvilər zamanında dövlətin inzibati vahidlərindən olan Həmədan bəylərbəyliyini "Qələmrovi-Əlişəkər" (Əlişəkər ölkəsi) adlandırırdılar. Nəslin banisi Qaraqoyunlu Cahan şahın və ya oğlu Məhəmməd Mirzənin qayınatası Əlişəkər bəy idi.

Əlişəkəroğulları nəslindən I Şah İsmayılın zamanında *Əlişəkər bəy Türkman*, I Şah Abbasın zamanında *Bayram xan Baharlu* və oğlu *Əbdürrəhim xan* Böyük Moğollar dövlətinə mühacirət edərək orada yüksək məqam sahibi olmuşlar.

I Şah Təhmasibin vəfatından sonra şahzadələr İsmayıl Mirzə ilə *Heydər Mirzə* tərəfdarlarının arasındakı qarşıdurmada (1576) Xanvəzir (Xanvəli) bəy Baharlu da daxil olmaqla Türkman əmirləri birincini dəstəkləmişdilər.

Baharlu tayfasının yetirmələri sonrakı dövrlərdə də Azərbaycanın siyasi-ictimai, elmi-mədəni həyatında mühüm rol ifa etmişlər. Qarabağ xanlığının vəziri, Ağa Məhəmməd şah Qacar tərəfindən edam edilmiş Mirzə Vəli bəy Baharlu bu nəslə mənsub idi.

Azərbaycanın Ağdam, Zəngəzur, Zəngilan, Xocalı və digər bölgələrində Baharlu adlı yaşayış məntəqələri mövcuddur.
*bax:* **ƏLİŞƏKƏROĞULLARI (ŞƏKƏR-OĞULLARI).**

**ƏLİŞƏKƏROĞULLARI (ŞƏKƏR-OĞULLARI)** – qızılbaş türkman tayfa ittifaqına daxil olan *Baharlu* tayfasının nüfuzlu nəsillərindən biri. Hətta Səfəvilər zamanında dövlətin inzibati vahidlərindən olan Həmədan bəylərbəyliyini "Qələmrovi-Əlişəkər" (Əlişəkər ölkəsi) adlandırırdılar. *Əlişəkər bəy Baharlu* Qaraqoyunlu Cahan şahın qohumu və sərkərdəsi idi. Tarixi məlumatara görə, Cahan şah və ya oğlu Məhəmməd Mirzə Əlişəkər bəyin qızı ilə evlənmişdi. Qaraqoyunlu dövlətinin süqutundan sonra Əlişəkər bəyin oğlu Pirəli bəy tayfasını da özü ilə götürərək Teymurilərin xidmətinə keçmiş, Uzun Həsənin vəfatından sonra ata-baba mülklərini geri almaq uğrunda qardaşı Bayram bəylə birlikdə Ağqoyunlu şahzadələrinə qarşı döyüşmüşdü. Onun oğlu, Xorasandakı Baharluların başçısı Canəli bəy Böyük Moğol hökmdarı *Babura* qoşulmuş, Canəli bəyin oğlu, Qəznə hakimi Seyfəli bəy də Baburun yanında xidmət etmişdi. Seyfi bəyin oğlu *Bayram xan Baharlu* Böyük Moğol hökmdarları Humayun şah və Əkbər şahın zamanında dövlətdə çox böyük nüfuz sahibi olmuş, "xanlar xanı" titulunu qazanmışdı. Bayram xandan sonra səlahiyyətləri oğlu *Əbdürrəhim xana* ötürüldü. Onların hər ikisi güclü sərkərdə, bacarıqlı siyasətçi olmaqla yanaşı, həm də şair və alim kimi tanınır, elm və sənət adamlarını himayə edirdilər.
Bu nəsildən olan Əlişəkər bəy Türkman I Şah İsmayılın zamanında döyüşlərdə fərqlənmiş, oğlu Məhəmmədi xan Hindistana mühacirət edərək Baburun silahdaşlarından birinə çevrilmişdi.
*bax:* **BAHARLU.**

**QAZAQLU** – qızılbaş türkman tayfalarından biri. Mənbələrdə Qazaqlu tayfası haqqında məlumat azdır. Bu tayfanın yetirməsi olan Vəlican bəy Qazaqlu *Çaldıran savaşında* şəhid olmuşdur. Qazaqlu tayfasının Qarabağ bəylərbəyliyində məskunlaşmış qazaqlarla eyni olması da mümkündür.

**MOSULLU** – qızılbaş türkman tayfalarından biri. Əsasən İraq ərazisində məskunlaşmışdı. Mosullu tayfası Səfəvilər dövlətinin tarixində mühüm rol oynamışdır.
I Şah İsmayılın hakimiyyətinin sonlarına yaxın *vəkil Mirzə Şah Hüseyn İsfahanini* öldürmüş *miraxurbaşı* Şahqulu bəy bu tayfadan çıxmışdır.
I Şah İsmayılın xanımı *Taclu bəyim* Mosullu tayfasından Həmzə bəy Bektaşinin oğlu Mihmad bəyin qızı idi. I Şah Təhmasib eyni tayfadan İsa bəyin qızı *Sultanım xanımla* evlənmiş, II Şah İsmayıl və Şah Məhəmməd Xudabəndə bu izdivacdan dünyaya gəlmişdilər. Bu qohumluq əlaqəsinə görə türkmanlar və onlarla müttəfiq olan qızılbaş tayfaları



II Şah İsmayılla *Heydər Mirzənin* arasındakı hakimiyyət savaşında (1576) birincini dəstəkləmişdi.

I Şah İsmayılın zamanında şahzadə *Təhmasib Mirzənin* lələsi və Herat hakimi olmuş, öz səlahiyyətlərini aşaraq sədr vəzifəsini daşıyan bir əyanı öldürməkdə ittiham edilmiş, vəzifəsindən uzaqlaşdırılıb həbsdə ölmüş *Əmir xan Mosullu*, onun qardaşları – Bağdad hakimi İbrahim xan və Əli bəy, Əli bəyin oğlu, Luristanın Kəlhor bölgəsinin hakimi Noxud (Zülfüqar) sultan, Əmir xanın oğlu Gülabı xan və b. bu tayfaya mənsub olmuşlar. Adıçəkilən İbrahim xan Mosullu böyük Azərbaycan şairi *Məhəmməd Füzulini* himayə etmiş, 1527/28-ci illərdə qardaşı oğlu tərəfindən öldürülmüşdür.

Sonralar bu nəsildən olan *Əmir xan Mosullu-Türkman* (I Şah Təhmasibin kürəkəni) Şah Məhəmməd Xudabəndənin zamanında Azərbaycan bəylərbəyi vəzifəsində xidmət etmişdir.

Səfəvilər zamanında yaşamış görkəmli Mosullu əmirləri Məhəmməd Əmin sultan və qardaşı Məhəmməd Mömin bəy, Əmir xan Mosullunun oğlu Sultan Mahmud xan və b. həm də şair idilər.

**ÖRDƏKLÜ** – mənbələrdə bu tayfa haqqında geniş məlumata rast gəlinmir. I Şah Abbasın vəfatı ərəfəsində sağ olan türkman əmirlərindən cəmi iki nəfərin adı kitablarda qeyd edilir. Bunların biri Azərbaycan bəylərbəyi *Şahbəndə xan* oğlu *Pirbudaq xan Pörnak*, digəri isə Qapanat hakimi Həsən sultan Ördəklü idi. Həsən sultanın adının türkman əmiri qismində çəkilməsi Ördəklünün türkman tayfalarından biri olduğunu düşünməyə əsas verir. *"Təzkirət əl-müluk"* əsərində də Ördəklü türkman tayfalarından biri kimi Pörnakla yanaşı qeyd edilir.

Qapanata gəlincə, bu, Naxçıvan bölgəsində, Sünik ətrafında bir məntəqənin adıdır, bu adı bəzən Qafanla eyniləşdirirlər.

Ördəklü tayfasının daha bir nümayəndəsi Qılıc bəyin adı II Şah Abbasın zamanında baş vermiş hadisələrin təsviri zamanı qarşımıza çıxır. O, *Saru Tağı* ləqəbli baş vəzirin öldürülməsində ittiham edilən qızılbaş əmirlərindən *Əmirgünə xan* oğlu Gülabı bəy Ağcaqoyunlu-Qacarı (Ağası bəy adı ilə tanınırdı) şahın əmri ilə edam etmişdi (1645).



**PÖRNAK** – qızılbaş türkman tayfalarından biri. Mənbələrdə adı "Pörnək" ("Pornək") formasında da qeyd edilmişdir. Ağqoyunlu ittifaqını təşkil edən əsas tayfalardan biri Pörnak idi. Ağqoyunlular dövlətinin süqutundan sonra Pörnak tayfası *Mosullu* tayfası ilə birləşərək türkman ittifaqını yaratdı, əvvəllər Qaraqoyunlu tayfa ittifaqına daxil olmuş *Baharlu* da bura üzv oldu. Pörnakların böyük bir hissəsi İraq torpaqlarında yerləşmişdi. Səfəvilər dövlətinin ərazisinə köçdükdən sonra onlar əsasən Təbriz civarında, qismən də Xorasanda məskunlaşdılar.

Səfəvilər dövlətinin quruluş mərhələsində Pörnak tayfası nümayəndələrinin

bir hissəsi onların tərəfində, digər hissəsi də qarşı tərəfdə mövqe tutmuşdu. Məsələn, I Şah İsmayılın İraqa yürüşü zamanı İraqi-Ərəb vilayətinin hakimi Pörnak tayfasından *Barik bəy* idi. Barik bəy Bağdadda, həmtayfası Bəşarət bəy isə Mosulda hökm sürürdülər. Barik bəy Pörnak I Şah İsmayılın təslim olmaq barədə təkliflərinə yayındırıcı cavablar vermiş, şahın hücum xəbərini eşidəndə isə mövqeyini tərk edib qaçmışdı (1508).
I Şah İsmayıl zamanında Ağqoyunlu Sultan Muradın süqutundan sonra Pörnak əmirlərindən Mənsur bəy *qızılbaşlığı* qəbul etdi. Şah hələ kiçik yaşlarında ikən qardaşları və anası ilə birlikdə o zamanlar Şiraz hakimi olmuş Mənsur bəyin tabeliyindəki İstəxr qalasında həbsdə qalmışdı. Mənsur bəy o zamanlar məhbuslarla yaxşı rəftar etdiyinə görə I Şah İsmayıl sonralar onu bağışlamış və Şiraz şəhərini Ağqoyunlulardan almağı ona tapşırmışdı.
Şah Məhəmməd Xudabəndənin dövründə Mənsur bəyin oğlu *Mürtəzaqulu xan Pörnak* Məşhəd hakimi və Xorasanın yarısının *əmir əl-ümərası* idi. Lakin o, Herat bəylərbəyi, xanlar xanı, şahzadə Abbas Mirzənin (gələcək I Şah Abbas) lələsi *Əliqulu xan Şamluya* tabe olmadığı üçün vəzifəsindən azad edildi, *Abdullah xan Ustaclunun* nəvəsi *Salman xan* onun yerinə keçdi. Bundan sonra Mürtəzaqulu xan Pörnaka Astarabad valiliyi verildi. Onun qardaşları Kazım xanla Fərrux xan Damğan və Həzarcərib (Mazandaran ətrafı) bölgələrini, oğlu Məhəmmədqulu xan isə Fars vilayətinin bir hissəsini idarə etməyə başladılar.
I Şah Abbas, I Şah Səfi və II Şah Abbas zamanlarında bir neçə türkman əmiri ardıcıl olaraq Azərbaycan hakimi təyin olunmuşdur. Qeyd edildiyi kimi, Osmanlı istilasından əvvəl Azərbaycan bəylərbəyi *Əmir xan Türkman* idi. I Şah Abbas 1603-cü ildə Təbrizi osmanlılardan azad etdikdən sonra *I Pirbudaq xan Pörnak Türkmanı* bəylərbəyi təyin etdi. 1616-cı ildə osmanlılarla döyüşdə öldürüldükdən sonra onun yerini oğlu *Şahbəndə xan* tutdu. *Qərəçəqay xanın* qısamüddətli hakimiyyətini çıxmaq şərti ilə, 1625-ci ilədək Şahbəndə xan Azərbaycan vilayətini idarə etdi. Gürcüstan hakimləri ilə döyüşdə həlak olduqdan sonra şah onun 3 yaşlı oğlu Pirbudaqa xan titulu bağışlayaraq atasının yerində əyləşdirdi.
9 il sonra I Şah Səfi Pirbudağın hələ də azyaşlı olduğunu əsas gətirərək onu vəzifədən azad etdi (1634/35-ci illər). 1643-cü ilədək *qulam* əsilli *Rüstəm xan* Azərbaycan bəylərbəyi oldu. 1643-cü ildə artıq yetkin yaşda olan *II Pirbudaq xan* yenidən vəzifəsinə qaytarıldı, amma 1650-cı ildə II Şah Abbas tərəfindən Rüstəm xanın qardaşı Əliqulu xanla əvəz edildi.



**TƏRƏKƏMƏ** – qızılbaş türkman tayfalarına sonralar verilmiş ad, “türkman” sözünün cəmi. *Otuziki* tayfa ittifaqının qalıqlarını da tərəkəmə adlandırırlar.
*bax:* **TÜRKMAN, OTUZİKİ.**



**USTACLU** – ən böyük qızılbaş tayfalarından biri. Mənbələrdə adı bəzən "Ustacalu" şəklində qeyd edilir və "usta kimi" sözündən, yaxud "Usta Hacı" adından götürüldüyü iddia edilir. Bəzi salnamələrdə I Şah İsmayılın Anadolu səfərində Qarahisar tərəfdəki kəndlərin birində Ustaca adlı bir nəfərə qonaq olduğu yazılsa da, bu məlumat mötəbər mənbələrdə öz əksini tapmayıb.

Ustaclu tayfası Sivas-Amasya-Tokat bölgəsində məskunlaşmış, bəzi oymaqları Kırşehirə kimi yayılmış Ulu Yörük tayfa ittifaqının Orta parə qoluna daxil idi. *Şeyx Cüneyd* və *Şeyx Heydərin* Anadoludakı *müridlərinin* böyük bir qismini ustaclular təşkil edirdi. Oymağın xeyli hissəsi Səfəvilər dövlətinin ərazisinə köç etdikdən sonra Anadoluda az miqdarda ustaclu qalmışdı; onlar Yağluca və Qarınca Qışla adlı iki qola bölünmüşdülər. I Şah İsmayıl zamanında ona qoşulmuş ustaclular daha rahat hərəkət edə bilmək üçün ailə üzvlərini yurdlarında (Osmanlı dövləti ərazisində) qoyub özləri Səfəvi qoşununda xidmətə başlamışdılar. Hətta I Şah İsmayılın Ustaclu ailələrini Osmanlı ərazisində buraxmaq barədə Sultan II Bayezidə məktub yazıb xəbərdarlıq etdiyi də mənbələrdə qeyd olunmuşdur.

Tarixi salnamələrdə adı çəkilən böyük Səfəvi sərkərdələrinin və dövlət xadimlərinin bir qisminin Ustaclu tayfasına və onun konkret boylarından hər hansı birinə mənsub olduğu bildirilir. Lakin mənbələrdə adı çəkilən xeyli şəxsiyyət konkret oymaq göstərilmədən ümumilikdə Ustaclu tayfasına aid edilib.

*Çaldıran savaşında* qızılbaş qoşununun sol cinahına başçılıq etmiş Mirzə bəy oğlu *Məhəmməd xan Təmişlü* (I Şah İsmayılın bacısının əri), onun yeddi qardaşı (*Qara xan*, Süleyman xan, Ulaş, Eyvaz və b.), oğlu Qılınc xan, Qazuq ləqəbli Həmzə sultan (*Çayan sultanın* qardaşı), *Qarınca sultan*, qardaşı, qorçubaşı *Saru Pirə bəy*, Kirman valisi Sofu oğlu Əhməd sultan və başqaları I Şah İsmayıl zamanında Ustaclu tayfasının öncül şəxsləri idilər. Çaldıran savaşında I Şah İsmayıl geri çəkilərkən atı bataqlığa düşəndə Ustaclu Xızır ağa öz atını şaha verib onu xilas etmişdi.

Səfəvilər dövlətinin ilk onilliklərində Ustaclu tayfasının bir neçə yetirməsi ən yüksək mənsəblərdən olan *əmir əl-üməra* (ordu komandanı) vəzifəsinə gətirilmişdi. *Məhəmməd bəy Çayan sultan* I Şah İsmayılın *süfrəçibaşısı* olmuş, daha sonra əmir əl-ümara təyin edilmiş, onun vəfatından (1522/23) sonra oğlu Bayezid sultan yerini tutmuşdu. Çayan sultanın qardaşı *Mustafa xan Köpək sultan* isə I Şah İsmayılın vəfatından sonra *Div sultanla* əmir əl-ümərалıq məqamını bölüşmüş, az sonra digər qızılbaş oymaqlarının təzyiqi qarşısında vəzifədən uzaqlaşdırılmışdı.

I Şah Təhmasibin hakimiyyət dövründə Ustaclu tayfasının 30-dan artıq yetirməsi xan və sultan titullarını qazanaraq dövlət idarəçiliyində mühüm yer tutmuşdular. Şahın həm bibisi oğlu, həm də bacısının əri olan *Abdullah xan Təmişlü Ustaclu* (Qara xanın oğlu), *Mən-*

*təşa sultan Şeyxlü*, Astarabad valiləri Sədrəddin xan və *Keçəl Şahverdi*, onun oğlu *Şahqulu sultan*, yüzbaşı Həsən bəy və qardaşı Nəzər sultan, Həsən bəyin oğlu Hüseyn bəy, Çıraq sultan, Çayan sultanın nəvəsi Ayqut sultan, *Eycəkoğlu Allahqulu sultan Kərəmpa*, Xəlil ağa Kəngərlü, *Pirə Məhəmməd xan Çavuşlu*, Baba Süleyman oğlu Yusif bəy Çavuşlu, *Məhəmmədi xan Toxmaq* və b. bu qəbildəndir.

II Şah İsmayılın zamanında *Hüseynqulu xan Rumlu xəlifət əl-xüləfa* vəzifəsindən kənarlaşdırıldıqdan sonra onun yerini Bulqar xəlifə (*Rumludan* olması ehtimal edilir), ardınca da Ustaclu tayfasından Dədə xəlifə tutmuşdur.

I Şah Abbas zamanında *Mürşidqulu xan Çavuşlu*, Simayun oğlu Mehdiqulu xan Çavuşlu, xəlifət əl-xüləfa Maqsud sultan Kəngərlü, Pir Ğeyb xan Şərəflü, Çıraq sultan Kərəmpa, *ovçubaşı (əmirşikarbaşı)* Əhməd ağa Kərəmpa, Bayramqulu bəy Qıçlu, Bektaş xan Damlu, silahdarbaşı Qənbər xan Gözüböyüklü, Abdullah xan Təmişlünün oğlu Həmzə xan və b. mühüm dövlət vəzifələrini tuturdular.

Ustaclu tayfasının siyasi karyerası enişli-yoxuşlu olmuşdur. Səfəvilər dövlətinin əvvəllərində bu tayfa kifayət qədər böyük nüfuz sahibi idi. I Şah İsmayılın vəfatından sonra I Şah Təhmasibin azyaşlı olmasından istifadə edən qızılbaş əyanlarının çəkişməsində Ustaclu əmirləri Rumlu-Təkəlü alyansına qarşı çıxsalar da, ardıcıl olaraq bir neçə dəfə məğlub oldular. Ustacluların liderləri Qarınca sultan, Köpək sultan və b. bu çəkişmələr zamanı öldürüldü. Bir neçə ildən sonra hakimiyyəti təkbaşına idarə etmək istəyən təkəlülərə qarşı qızılbaş tayfalarının müttəfiq qoşununa ustaclular da qatıldılar. Bu müharibədə müttəfiq qoşunun qalib gəlməsi nəticəsində Ustaclu tayfasının nüfuzu bərpa edildi. I Şah Təhmasib bəlkə də ustacluların bəzi nümayəndələri ilə qohumluq əlaqələrinə görə bu tayfaya çox güvənirdi (I Şah Təhmasibin bibisi Ustaclu tayfasının Təmişlü oymağından Məhəmməd xana ərə getmiş, Məhəmməd xanın ölümündən sonra isə I Şah İsmayılın əmri ilə onun qardaşı Qara xanla ailə qurmuşdu. I Şah Təhmasibin bacısı Qara xanın oğlu Abdullah xan Ustaclunın həyat yoldaşı idi. Şah öz qızı *Şəhrəbanu xanımı* Abdullah xanın oğlu Şahəli Mirzənin oğlu Salman bəy Ustacluya ərə vermişdi). Onun zamanında Ustaclu əmirlərinin sayı digər tayfalara mənsub əmirlərin sayının üçdə-ikisini təşkil edirdi. Bu dövrə aid mənbələrdə Təbriz darğası Şahqulu sultan oğlu Allahqulu bəy, ondan sonra həmin vəzifəyə keçmiş Baba Süleyman oğlu Yusif bəy, *Məntəşa sultanın* nəvəsi Murad xan *süfrəçibaşı* və digər əmirlərin adlarına rast gəlirik.

II Şah İsmayıl Ustaclu tayfasının nüfuzundan narahat olaraq onların bəzi liderlərini məhv etdi, bir müddətdən sonra qalan Ustaclu əmirləri əfv olundular. Lakin I Şah Abbasın hakmiyyətinin əvvəlində Ustaclu tayfası yenidən gözdən düşdü, Mürşidqulu xan Çavuşlu başqa olmaqla tayfanın siyasi elitası ortadan



götürüldü. Bununla da Ustaclu tayfasının nüfuzuna həlledici və ağır zərbə vuruldu. XVII əsrin birinci rübündən sonra mühüm dövlət vəzifələrində Ustaclu tayfasından az adamın adına rast gəlirik. Belə əmirlərdən biri I Şah Abbas zamanında 25 il Həmədan hakimi olmuş Həsən xandır ki, Səfəvi şahzadəsi *Heydər Mirzənin* (I Şah Təhmasibin oğlu) qızı ilə evli idi və I Şah Abbasla yaxın zamanda dünyasını dəyişmişdi. I Şah Abbasın vəfatı ərəfəsində dövlət xidmətində olmuş cəmi üç nəfər Ustaclu əmirinin adı çəkilir: Nəsa hakimi Bəktaş xan oğlu Mühibbəli sultan, Naxçıvan hakimi Maqsud sultan Kəngərli və Hillə əmiri Pur Ğeyb xan oğlu Əbülqasim sultan. I Şah Səfi zamanında Nəsa hakimi olan Kəlbəli sultan Ustaclu şəhəri özbəklərə təslim etdiyi üçün edam olundu, Səfəvi ailəsi ilə qohum olan Həsən xanın övladları da eyni aqibətə düçar oldular. Dərbənd hakimi Şahverdi bəy Ustaclu 5 il bu vəzifədə qaldıqdan sonra əvvəlcə həmtayfası keşikçibaşı Bəhram bəylə, daha sonra onun oğlu Bayezid bəylə əvəz olundu. 1645-ci ildə II Şah Abbasın baş vəziri *Saru Tağı* öldürüldü, bu sui-qəsddə əli olan qızılbaş əmirləri arasında *qorçu* Abbasqulu bəy Ustaclu da edam edildi. Göründüyü kimi, adı çəkilən Ustaclu əmirləri bəy və ya sultan titulu ilə xatırlanır, onların arasında xan titulunu daşıyanlar yox dərəcəsindədir. Bu da I Şah Abbasdan sonrakı hökmdarların Ustaclu tayfasına o qədər də müsbət yanaşmadıqlarını bir daha sübut edir.

Səfəvilər dövlətində Ustaclu tayfası əsasən Şirvan və Azərbaycan (indiki Cənubi Azərbaycan) vilayətində, qismən İraqi-Əcəmdə söz sahibi idilər, onların güc mərkəzi də bu bölgələrdə yerləşirdi. Təxminən bir əsr boyunca bu tayfanın yetirmələri Şirvan, Azərbaycan (Təbriz), Çuxursəd və digər bəylərbəyliklərdə yüksək vəzifə sahibi olmuşlar.

Ustaclu tayfasından çoxlu istedadlı qələm sahibi də çıxmışdır. Çayan sultanın nəvəsi Yaqub sultan (vəf. 1543/44) tarix elminə maraq göstərirdi. (Onun yuxarıda adı keçən Ayqut sultan olduğu, nüsxə xətası ilə adının bu şəklə düşdüyü ehtimal edilir). Yusif bəy Ustaclu, onun qohumu Pirqulu bəy, II Şah İsmayıl tərəfindən gözlərinə mil çəkilmiş Gilan valisi Murad xan Kəngərlü (təxəllüsü Fəğani), onun qardaşı Əlixan Mirzə, İmamquly bəy (təxəllüsü Füsuni) və başqaları öz dövrünün görkəmli şairlərindən sayılırdılar.

Ustaclu tayfası bir neçə oymaqdan ibarət idi: *Çavuşlu, Şeyxlü (Şeyxlər), Kəngərlü, Şərəflü, Kərəmpa, Sofular, Qoçulu, Qarahisarlu, Mahifəqihlü, Qıçlu, Qızıllu, Damlu, Gözüböyüklü, Təmişlü, Asayişlü, Sarısolaqlu*. Bu oymaqların bəziləri o birilərə nisbətən daha böyük və güclü idi.



**ASAYİŞLÜ** – qızılbaş *Ustaclu* tayfasının oymaqlarından biri. *Oruc bəy Bayat* Ustaclu oymaqlarının adlarını sadalayarkən Asayişlünün də adını qeyd etmişdir. Bu oymaq və onun nümayəndələri barədə mənbələrdə məlumat az-

dır. I Şah Təhmasibin dövründə Nəzər sultan Asayişoğlu Heratda yüksək vəzifə sahibi idi. Şah Məhəmməd Xudabəndə zamanında Rəşt ətrafında iri mülklər bağışlanmış Asayişoğlu Əhməd sultan da bu oymaqdan çıxmışdı. O, şahzadə *Həmzə Mirzənin* qətlində şübhəli bilinərək bir dəstə qızılbaş əmiri ilə birlikdə edam edilmişdir.



**ÇAVUŞLU** – qızılbaş *Ustaclu* tayfasının böyük oymaqlarından biri. Bütünlükdə Ustaclu tayfası kimi, Çavuşlu oymağı da Səfəvilər dövlətinin qurulmasında və inkişafında mühüm rol oynamışlar. Səfəvilər tarixinin ən həssas dönəmlərində Çavuşlu oymağına mənsub əmirlər siyasət səhnəsinə qatılmış, öz nüfuzlarına və hərbi güclərinə arxalanaraq həlledici söz demişlər.

Çavuşlu oymağı hələ I Şah İsmayıl hakimiyyətə gəlməzdən əvvəl ona sədaqətli olmuşdur. 1500-cü ildə I Şah İsmayıl Anadolu qızılbaşlarının vəziyyətini öyrənmək və özünə tərəfdar toplamaq üçün səfər edəndə Tercanın sənubundakı Saru Kaya yaylağında Çavuşlu oymağının başçısı, Baba Süleymanla Ayqut bəyin atası Oğlan Əmətə iki ay qonaq olmuşdu. Burada 13 yaşlı İsmayıl insanları qorxuya salan böyük bir ayını öldürərək qızılbaşları öz şücaətinə heyran etdi. (Oğlan Əmət sonralar *Zülqədəroğulları bəyliyinin* başçısı Əlaüddövlənin yanına elçi qismində göndərilmiş, onun tərəfindən həbsə atılmışdı, bundan sonra 1508-ci ildə I Şah İsmayıl Zülqədəroğulları bəyliyinin üzərinə yürüş etdi).

Çavuşlu oymağından Baba İlyasla oğulları *Çaldıran savaşında* qızılbaş ordusunun sol cinahını təşkil edən Ustaclu tayfasının döyüşçü bölmələrinə başçılıq edirdilər. Onlar həmin savaşda böyük şücaət göstərmuş və həlak olmuşdular.

Sonrakı dövrlərdə Səfəvilər dövlətində mühüm vəzifələr tutmuş və saraya yaxın olmuş görkəmli Çavuşlu əmirləri bunlardır:

I Şah Təhmasibin zamanında qorçu Həsən bəy (çox qəddar olduğuna görə Firovni-sani (yəni ikinci firon) ləqəbini qazanmışdı), onunla müasir olmuş yüzbaşı Həsən bəy və oğlu Hüseyn bəy, Baba Süleyman oğlu Yusif bəy, Herat valisi *Şahqulu sultan Yegan*;

II Şah İsmayılın qayınatası və oymağın ağsaqqalı olan *Pirə Məhəmməd xan* və oğlu Mahmud xan (vəf. 1591);

Şah Məhəmməd Xudabəndə zamanında Əliqulu sultan, Ayqut bəy oğlu Mehdiqulu sultan;

I Şah Abbasın hakimiyyətə gəlməsində mühüm rol oynamış, amma az sonra atası Şahqulu sultan Yegan II Şah İsmayıl zamanında öldürüldüyü kimi, özü də aradan götürülmüş Mürşidqulu xan (vəf. 1589), qardaşı, Sərəxs hakimi İbrahim sultan, Simayun oğlu Mehdiqulu xan (vəf. 1592), özbəklərlə müharibədə öldürülmüş Əbu Müslim xan (vəf. 1592) və qardaşı Qara Həsən xan, Məhəmməd Şərif xan (vəf. 1591) və b.

Bu şəxslərin bir hissəsi müxtəlif dövrlərdə Səfəvi şahlarının yanında sarayda xidmət etmiş, bəziləri də həssas bölgələrə rəhbər vəzifələrə göndərilmişdir.



I Şah Abbasın hakimiyyətinin əvvəlində Ustaclu tayfasının, xüsusilə Çavuşlu oymağının dövlət idarəçiliyində böyük nüfuzu vardı. Bu nüfuzdan və bundan doğa biləcək tabesizlikdən narahat olan I Şah Abbas oymağın əsas fiqurlarını ağır şəkildə cəzalandırdı, *Mürşidqulu xan* başqa olmaqla bir neçə Çavuşlu əmirini edam etdi. Bundan sonra Ustaclu tayfasının nüfuzu tamamilə sarsıldı. Səfəvi hakimiyyətinin sonuna kimi onlardan (o cümlədən Çavuşlu oymağından) digər qızılbaş tayfaları ilə rəqabət apara biləcək dərəcədə güclü və nüfuzlu dövlət adamının adına mənbələrdə rast gəlmirik.

**DAMLU** – qızılbaş *Ustaclu* tayfasının oymaqlarından biri. Bu oymağın görkəmli nümayəndələrindən biri Bektaş xan tayfanın digər oymağı *Çavuşludan* olan Mürşidqulu xanın *vəkili* (tam səlahiyyətli canişini) idi, onun adından İsfahanda darğalıq vəzifəsini yerinə yetirirdi. Sonralar Xorasanın bəzi bölgələrinə hakim təyin edilmiş Bektaş xan 8 il Mərv məntəqəsini idarə etmişdir (vəf. 1608/09). Onun oğulları Məlikişə və Mühibbəli sultan Xorasanda mühüm vəzifələrə yiyələnmişdilər. Mühibbəli sultan Damlu 1629/30-cu illərdə Xarəzm hakimi ilə mübarizədə məğlub olub öldürülmüşdür.

**GÖZÜBÖYÜKLÜ** – qızılbaş *Ustaclu* tayfasının oymaqlarından biri. Bu oymaq Anadoluda Yeni İl (El) türkmanlarına bağlı idi, sonralar Ustaclu tayfasının tərkibində Səfəvilər dövlətinə köç etmişdi. Səfəvilər tarixinə aid mənbələrdə Gözüböyüklü oymağı və onun əmirləri barədə məlumata az rast gəlirik. Mənbələrdə bu oymağa mənsubluğu bəlli olan yalnız Qənbər xandan söhbət açılır.

**HACIFƏQİHLÜ** – *bax:* **MAHİFƏQİHLÜ.**

**KƏNGƏRLÜ** – qızılbaş *Ustaclu* tayfasının böyük oymaqlarından biri. Kəngərlilərin çox qədimdən Azərbaycan torpaqlarında məskunlaşdığı bildirilir. Sonralar Ustaclu tayfa ittifaqına daxil olmuş kəngərlilər bu tayfanın ən güclü oymaqlarından birinə çevrildilər. Anadoludan Səfəvi torpaqlarına köç etdikdən sonra Kəngərli oymağı əvvəlcə Qaradağda, daha sonra Naxçıvan ərazisində yerləşmişdir. Səfəvilər dövlətinin inkişafında mühüm rol oynamış əmirlərdən bir neçəsi Kəngərli oymağına mənsub idi. Şahverdi bəy, Peykər xəlifə I Şah Təhmasibin zamanında, Cəfər sultan, Allahqulu sultan, Tanrıverdi xəlifə isə Şah Məhəmməd Xudabəndənin dövründə nüfuzlu Kəngərlü əmirlərindən sayılırdılar. I Şah Abbasın sərkərdəsi Mustafa sultan Xorasanın Təbəs məntəqəsinin hakimi idi, 1594/95-ci illərdə özbəklərlə savaşda öldürülmüş, onun yerinə Kəngərlü oymağının digər əmiri Teymur sultan təyin edilmişdi. Maqsud sultan Kəngərlü I Şah Abbasın dövründə Naxçıvan hakimi olmuş, iki dəfə şahın səfiri kimi İstanbula getmişdir. Maqsud sultanın dövlət qarşısında xidmətlərini

nəzərə alaraq I Şah Abbas onu *xəlifət əl-xüləfa* təyin etmişdi; Səfəvilər dövlətində qızılbaş sufilərin başçısı, təriqət məsələləri üzrə şahın köməkçisi sayılan xəlifət əl-xüləfa vəzifəsinə təyin edilməsi Maqsud sultanın nə qədər böyük nüfuz sahibi olduğunu göstərir.

Məlum olduğu kimi, I Şah İsmayılın zamanında Ustaclu tayfasının *Təmişlü* qolundan *Məhəmməd xan*, onun *Çaldıran savaşındakı* ölümündən sonra qardaşı *Qara xan* Diyarbəkir valisi təyin edilmişdilər. Diyarbəkirdə yerləşən Kəngərlü kəndinin adının da o zamanlardan qaldığı ehtimal olunur. Kəngərlü oymağı digər oymaqlarla ittifaqa girərək getdikcə güclənmiş, sonralar Ustaclu tayfasının siyasi varisi və təmsilçisi olmuşlar.

Kəngərlülər Səfəvilər dövlətindən sonra da bölgədə öz aparıcı mövqelərini qoruyub saxlaya bilmişlər. 1747-ci ildə Nadir şahın qətlindən sonra Kəngərlü oymağının lideri Heydərqulu xan Naxçıvan xanlığının əsasını qoydu. Onun nəslindən olan xanlar 1828-ci ildə Türkmənçay müqaviləsinin şərtlərinə görə Naxçıvan xanlığı Rusiyaya birləşdirilənədək burada hakimiyyət sürmüşlər. Kəngərlü nəslinin bəzi nümayəndələri sonralar da Azərbaycanın ictimai-siyasi həyatında yaxından iştirak etmişlər. Naxçıvanskilər nəslindən olan hərbçilər çar Rusiyası ordusunda xidmət edərək general rütbəsinə kimi yüksəlmişdilər. (İsmayıl xan, Kəlbəli xan, Hüseyn xan, Ehsan xan Naxçıvanskilər, bu nəslin son ali rütbəli hərbçisi Cəmşid Naxçıvanski).

**KƏRƏMPA** – qızılbaş *Ustaclu* tayfasının oymaqlarından biri. XVI əsrdə Sivas ətrafında Ulu Yörük ittifaqına aid 7 kənddə Kərənpa adlı bir oymağın yaşadığı və əkinçiliklə məşğul olduğu mənbələrdə qeyd olunub. Bunların Ustaclu tayfasının Kərəmpa oymağı ilə eyni olduğu ehtimal edilir.

I Şah Təhmasib zamanında Eycəkoğlu Allahqulu sultan Gilan hakimi olmuş, sonra vəzifədən götürülmüş, yerinə Pirə Məhəmməd xan Ustaclu təyin edilmişdi. O, I Şah Təhmasibin ölümündən sonra şahzadə Heydər Mirzə ilə II Şah İsmayıl tərəfdarlarının arasında yaranmış qarşıdurmada Ustaclu tayfasının rəqibi olan təkəlülər tərəfindən ailə üzvləri və yaxınları ilə birlikdə öldürüldü (1576).

Səfəvilər dövlətinə köç etmiş Kərəmpa oymağının böyüklərinin adı I Şah Abbas zamanında baş vermiş hadisələrlə bağlı çəkilir. Osmanlılardan geri alınmış Şamaxıya vali təyin edilən Çıraq sultan, onun qardaşı və İsfahan qalalarından birinin darğası Əli bəy, Çıraq sultanın oğlu və həmin qalanın hərbi qanizonunun başçısı Əhməd sultan, I Şah Abbas dövründə ovçubaşı (əmirşikarbaşı) Əhməd ağa və onun oğlu Əli bəy Kərəmpa oymağının nüfuzlu əmirlərindən sayılırdılar.



**QARAHİSARLU (QARASARLU)** – qızılbaş *Ustaclu* tayfasının oymaqlarından biri. Mənbələrdə bu oymağa mənsub olan iki əmirin adına rast gəlirik. Bunlar Məşhəd valisi Köşək oğlu Əmət xan (vəf. 1599/1600) və onun qardaşı, Nuşapur valisi Köşək oğlu Şah Nəzər



sultandır. Əmət xan 1589-cu ildə I Şah Abbasdan vəzir *Mürşidqulu xanı* öldürmək tapşırığı aldı. Bundan az əvvəl şahın Qəzvinə gəlişi zamanı onun vardövləti vəzir tərəfindən müsadirə edildiyi üçün Əmət xan Mürşidqulu xana qarşı kinli idi, bu üzdən şahın təklifini məmnuniyyətlə qəbul edib vəziri öldürdü.

**QARASARLU** – qızılbaş *Ustaclu* tayfasının oymaqlarından biri olan Qarahisarlunun adı bəzi mənbələrdə Qarasarlu şəklində qeyd edilmişdir. Qarahisar (Qarasar) Anadolu torpaqlarında Sivas bölgəsindəki bir məntəqənin adıdır (Anadoluda eyniadlı digər məntəqələr də mövcuddur). Qarahicar *Rumlu* və Ustaclu tayfalarının məskəni olmuşdur, həmin tayfalar Səfəvilər dövlətinin ərazisinə bu yerlərdən köçmüşlər. I Şah ismayılın Ərzincan səfəri zamanı (1500) Qarahisar ətrafında Ustaclu tayfasının lideri olması ehtimal edilən Ustaca adlı bir nəfərə qonaq olması bəzi mənbələrdə qeyd edilmişdir.
*bax:* **QARAHİSARLU.**

**QIÇLU** – qızılbaş *Ustaclu* tayfasının oymaqlarından biri. Bu oymaq I Şah İsmayılın yeniyetməlik zamanından bəri qızılbaş hərəkatında fəal rol oynamışdır. Həmzə bəy Qıçoğlu öz dəstəsi ilə şaha qoşulmuş və onun tapşırığı ilə ətraf məntəqələrdən tərəfdar toplamaqla məşğul olmuşdur. Qıçlu oymağının əmirlərindən olan Bayramqulu bəy Şah Məhəmməd Xudabəndənin zamanında Ələmut qalasındakı qarnizonun komandanı idi, I Şah Abbas dövründə də vəzifəsində qalmışdı. Bayramqulu bəy I Şah Abbasın əmri ilə Krım xanı Qazi Gərayın yanına gizli missiya ilə göndərilmiş və şahın məktubunu ona aparmışdı (1607/08). Əslində Qazi Gəray özü bundan əvvəl I Şah Abbasa məktub göndərərək danışıqlar üçün Bayramqulu xanı onun yanına yollamasını xahiş etmişdi. Çünki Qazi Gəray vaxtilə Ələmut qalasında həbsdə olarkən Bayramqulu bəy ona qarşı hörmətlə davranmışdı.
1584-cü ildə Azərbaycan bəylərbəyi təyin edilmiş Ustaclu tayfasından Əliqulu xan mənbələrdə “Fəthoğlu” kimi təqdim edilir, amma bu sözün hərf xətası nəticəsində “Qıçoğlu” sözündən təhrif edildiyi ehtimal olunur. Əliqulu xan Səfəvi şahzadəsi *Həmzə Mirzənin* yaxınlarından idi, onun üzərində böyük nüfuzu vardı. Şah Məhəmməd Xudabəndənin hakimiyyətinin ikinci yarısında ölkəni bürümüş hərcmərclik şəraitində və qızılbaş tayfaları arasındakı çəkişmələr fonunda Əliqulu xan əlində böyük qüvvə toplayaraq dövlət idarəçiliyini faktiki olaraq ələ keçirmişdi.

**QIZILLU** – qızılbaş *Ustaclu* tayfasının oymaqlarından biri. Bu oymaq və onun əmirləri barədə mənbələrdə geniş məlumata rast gəlmək çətindir. Qızıllu oymağının yetirməsi Əli bəy I Şah Abbasın zamanında yaşamışdır.

**QOÇULU** – qızılbaş *Ustaclu* tayfasının oymaqlarından biri. Mənbələrdə bu oy-

mağa mənsub iki əmirin adına rast gəlirik. I Şah Təhmasib tərəfindən Rey hakimi təyin edilən və onun vəfatı ərəfəsində böyük nüfuzu olan Piri bəy az sonra qızılbaş tayfaları arasında yaranmış qarşıdurma gedişində Ustaclu tayfasına qarşı mövqe tutmuş türkmanlar tərəfindən öldürüldü (1576). I Şah Abbasın zamanında Çahargav ləqəbi ilə tanınan Mürşidqulu sultan Qoçulunun ləqəbinin İsfəndabad yaxınlığındakı kəndlərdən birinin adından (Çahargav) götürüldüyü ehtimal olunur.

**MAHİFƏQİHLÜ** – qızılbaş *Ustaclu* tayfasının oymaqlarından biri. Adını bəzən *Hacıfəqihli* kimi qeyd edirlər. Sivas ətrafından Çuxursəd, İrəvan və Naxçıvan bölgələrinə köçüb buralarda məskunlaşmışdılar. I Şah Təhmasib zamanında bu oymaqdan Qarınca sultan və oğlu *Şahqulu sultan* böyük nüfuz sahibi idilər. Burada adı çəkilən Qarınca sultan I Şah İsmayıl zamanında böyük Ustaclu əmirlərindən olmuş və onun vəfatından sonra I Şah Təhmasibin hakimiyyətinin əvvəllərində *Rumlu*-Ustaclu qarşıdurmasında öldürülmüş eyniadlı əmirdən fərqli şəxsdir.

**SARUSOLAQLU (SARUZOLAQLU)** – qızılbaş *Ustaclu* tayfasının oymaqlarından biri. Onun adı *Oruc bəy Bayatın* təqdim etdiyi Ustaclu oymaqları siyahısında çəkilir. Sarusolaqlu oymağı və onun nümayəndələri haqqında mənbələrdə məlumat azdır. Şah Məhəmməd Xudabəndə zamanında Rəşt ətrafında iri mülklər bağışlanmış Sarusolaqoğlu Məhəmmədi bəy bu oymağa mənsub idi. Şah ona "sirdaş" fəxri ləqəbini vermişdi (Ustaclu tayfasından *Əliqulu xan Qıçoğlu* "qardaş", Şamludan *İmamqulu xan* "yoldaş" ləqəbinə layiq görülmüşdülər). I Şah Abbasın hakimiyyətə gəlişi ərəfəsində baş vermiş hadisələrdə onun adı tez-tez hallanır. Məhəmmədi bəy *Həmzə Mirzənin* qətlindən sonra şübhəli qismində edam edilmişdir.

**SOFULAR** – qızılbaş *Ustaclu* tayfasının oymaqlarından biri. "Sofu" sözü *sufi* deməkdir, Səfəvilər zamanında qızılbaşlar bir-birini bu adla çağırırdılar, "sofu" geniş yayılmış müraciət forması idi. Sofuluq (sufilik) qızılbaş ənənəsinə sadiqlik sayılır, bu ənənəyə və dövlətə xəyanət edənlərə "nasufi" deyirdilər. Osmanlı dövlətinin ərazisində, Sivas, Amasya, Tokat, Zonquldağ və Kastamonuda üst-üstə 16 kənd Sofular adını daşıyırdı. Ustacluların Anadolu torpaqlarından köç etdiyini nəzərə alaraq həmin kəndlərin bu tayfa ilə bağlı olduğunu ehtimal edə bilərik. Hər halda, kəndlərin adı orada qızılbaş sufilərin məskunlaşmasından xəbər verir. Sofular oymağının iki məşhur nümayəndəsi Əlixan sultan və Mahmud bəy I Şah Abbasın zamanında yaşamış və *Mürşidqulu xanın* yaxın ətrafı kimi tanınmışdılar.

**ŞEYXLƏR** – *bax:* **ŞEYXLÜ.**

**ŞEYXLÜ (ŞEYXLƏR)** – qızılbaş *Ustaclu* tayfasının oymaqlarından biri. *Çal-*



*dıran döyüşündə* həlak olmuş Səfəvi ordusunun *qorçubaşısı Saru Pirə bəy Ustaclu* bu oymaqdan idi. Onun kiçik qardaşı *Məntəşa sultan* (vəf. 1545/46) I Şah Təhmasibin zamanında böyük nüfuz sahibi idi. I Şah Abbasın hakimiyyətinin əvvəlində Turşiz əmiri olmuş, daha sonra vəzifəsindən götürülmüş Məntəşa sultanın onun nəvəsi olduğu ehtimal edilir.

**ŞƏRƏFLÜ** – qızılbaş *Ustaclu* tayfasının oymaqlarından biri. Hələ I Şah İsmayılın zamanında bu oymağın nümayəndəsi Kürd bəy bölgələrdən birinin əmiri kimi xidmət etmişdir. Sonrakı dövrlərdə Xorasan bölgəsində əmir olmuş Vəli bəy və İbrahim sultan da bu oymağa mənsub idilər. Şərəflü oymağından Bədr xan 1558-ci ildə Oxlu oymağına və Xarəzm hakiminə qarşı həyata keçirilmiş yürüşdə əsir düşmüş, amma xilas ola bilmişdi. Onun oğlu İmamqulu sultan, eləcə də Mustafa xan və Mürtəza xan bu oymağın böyük əmirlərindən sayılırdılar. Şərəflü oymağından Pirğeyb xan Ustaclu 1586-cı ildə şahzadə *Həmzə Mirzənin* tərəfində olmuş, şahzadəyə qarşı qoşun çəkən *Təkəlü* və *Türkman* tayfaları ilə döyüşdə çərxçi dəstəsinə başçılıq etmişdi. Qələbədən sonra o, Həmədan hakimliyini qazandı. Az sonra *Şamlu* tayfasından *Şahverdi xəlifə* qardaşı İsmayılqulu xanın himayəsi altında Həmədan hakimliyini ələ keçirmək üçün Pirğeyb xanla mübarizəyə başladı. Axırda Pirğeyb xan şəhəri tərk edib I Şah Abbasın hüzuruna gəldi, amma 1588-ci ildə oğlu ilə birlikdə edam olundu. Sonralar Pirğeyb xanın oğlu Əbülqasim sultan Həmədan hakimi təyin olunmuş, 1616-32-ci illər arasında Qara Həsən xan Ustaclu onu vəzifədə əvəz etmişdir. Qara Həsən xanın edamından sonra Əbülqasim xanın oğlu II Pirğeyb xan Həmədana hakim göndərildi.
Bu oymağın daha bir nümayəndəsi olan Əhməd ağa (vəf. 1605/06) Qəzvin darğası vəzifəsində xidmət edirdi və qəddarlığı ilə tanınmışdı.

**TƏMİŞLÜ** – qızılbaş *Ustaclu* tayfasının oymaqlarından biri. Bu oymağın adı əsasən onun məşhur nümayəndəsi olan Mirzə bəy oğlu Məhəmməd xanla bağlı çəkilir. Diyarbəkir hakimi *Məhəmməd xan Təmişlü* (I Şah İsmayılın bacısının əri) *Çaldıran savaşında* qızılbaş qoşununun sol cinahının sərkərdəsi idi. Onun oğlu Qılınc xan, yeddi qardaşı (*Qara xan*, Süleyman xan, Ulaş, Eyvaz və b.), Qara xanın oğlu, I Şah Təhmasibin həm bibisi oğlu, həm də bacısının əri *Abdullah xan Ustaclu*, onun oğlu Həmzə xan bu oymağın məşhur nümayəndələri idilər.

**VARSAQ** – qızılbaş tayfalarından biri. Anadolunun Tarsus bölgəsindəki türkman oymaqlarından olan Varsaq tayfası hələ *Şeyx Cüneyd* zamanında *qızılbaşlıqla* tanış olmuş və tayfanın xeyli üzvü şiəliyi qəbul etmişdi. Varsaq tayfası Səfəvilər dövlətinin quruluş mərhələsindən etibarən hadisələrdə fəal iştirak etmişdir. I Şah İsmayıl 1500-cü ildə qızılbaş oymaqları arasından özünə tərəfdar top-

lamaq üçün Anadoluya səfər etdiyi zaman ona qoşulanlar arasında Varsaq tayfasının nümayəndələri də var idi. Sultan Səlim Yavuz 1514-cü ildə Səfəvi torpaqlarını tərk edib qayıdan zaman sərhəd zolağında yerləşən və Anadolunun kilidi sayılan Kəmax qalasını çətinliklə də olsa tuta bildi. Qalanı Varsaq tayfasından olan hakim Yusif bəyin qardaşı Məhəmməd bəy tabeliyindəki 300 nəfərlik qarnizonla qoruyurdu. Bütün qarnizon həlak olduqdan sonra qala osmanlıların əlinə keçdi. Varsaqların şücaəti ilə bağlı mübaliğəyə bənzər bir rəvayət də bəzi qızılbaş mənbələrinə yol tapmışdır. Guya Kəmax qalasının mühasirəsi zamanı Varsaq tayfasının kəşfiyyatçıları Sultan Səlimin çadırına girib onun şəxsi silahlarını götürmüş və I Şah İsmayıla göndərmişdilər. Şah da sultana məktub yazıb qətl və qarətdən əl götürməyi və öz ölkəsinə qayıtmağı məsləhət görmüşdü.

Varsaqlar hələ I Şah İsmayıl zamanında elit hərbi birləşmələr olan *qorçu* birliklərində xidmət edirdilər. I Şah Təhmasibin hakimiyyət dövründə Tarsus və Adana bölgələrindən xeyli Varsaq ailəsi Səfəvilər dövlətinin ərazisinə köçmüşdü. Həmin dövrə aid mənbələrdə Varsaq tayfasından Qasim xəlifə, Mustafa bəy və onun Xorasanda mülk sahibi olan oğlu Şüca bəy, Qara Üveys, Həsən xəlifə, Musa bəy kimi şəxslərin adına rast gəlirik. Qasim xəlifə 1526-cı ildə *Rumlu-Təkəlü* ittifaqı ilə Ustaclu tayfası arasındakı döyüşün qarşısını almaq üçün tərəflər arasında barışıq yaratmağa çalışmış, amma səyləri nəticə verməmişdi.

Varsaq tayfası bütün türk oymaqları kimi, hətta onların hamısından daha artıq dərəcədə şeirə və musiqiyə bağlı idi. Qızılbaş tayfalarının dilində "varsaq" sözü el aşığı və ozan mənasında işlənirdi. Varsaqların ifa etdikləri şeir və havacata isə *varsağı* deyirdilər. Varsağı qısa müddət ərzində bütün qızılbaş tayfaları arasında geniş yayılmış və xalq aşıqlarının ən çox müraciət etdikləri şeir biçiminə çevrilmişdi.

**ZÜLQƏDƏR** – böyük qızılbaş tayfalarından biri. Adı "Zülqədr" və "Zülqədir" şəklində də qeyd edilir. Onlar əsasən Anadolu torpaqlarında iki əsrə yaxın müddət boyunca (1337-1522) mövcud olmuş *Zülqədəroğulları bəyliyinin* ərazisində məskunlaşmışdılar. Boz Ok tayfa ittifaqına daxil olan Zülqədər eli 80 mindən artıq evi əhatə edirdi, o zamanlar üçün bu, böyük rəqəm sayılırdı. Zülqədəroğulları bəyliyinin başçıları Səfəvilərlə xoş münasibətdə olmasalar da, Zülqədər tayfasının bir hissəsi Səfəvilərə rəğbət bəsləmiş, qızılbaş inancını qəbul etmiş və I Şah İsmayıla qoşularaq Səfəvi dövlətinin ərzisinə köçmüşdür.

Zülqədər tayfasının şaha sevgisi çox güclü idi. Hətta rəvayətə görə, I Şah İsmayılın Anadoluya gəlişini eşidən Zülqədər cavanlarından biri toy günü olmasına baxmayaraq, gərdəyə girmədən gəlib şaha qoşulmuşdu.

Zülqədər tayfası Səfəvi dövlətinin quruluşunun ilk mərhələsindən etibarən baş vermiş hadisələrdə aparıcı rol oynamışdır. I Şah İsmayılın ilk silahdaşlarından



biri də *Dədə bəy Abdal Zülqədər* idi. O, *Şeyx Heydər* zamanından qızılbaşlığı qəbul etmiş, balaca İsmayılı Gilanda gizlədən etibarlı dəstənin üzvü olmuşdur, daha sonralar ona qızılbaş inancının əsaslarını öyrətmişdi. I Şah İsmayıl öz silahdaşlarını məsul vəzifələrə təyin etməklə dövlətin ilk modelini yaradarkən Dədə bəy Abdal Zülqədərə ən yüksək məqamlardan biri olan *qorçubaşı* vəzifəsini vermişdi. Sonralar o, əvvəlcə Rey, ardınca da Mərv şəhərinə vali təyin edildi. Lakin Dədə bəy Abdal 1513/14-cü illərdə özbəklərin hücumu qarşısında Mərvi qoruya bilmədi və mövqeyini tərk etməyə məcbur oldu. Buna görə o, I Şah İsmayılın gözündən düşsə də, keçmiş xidmətləri nəzərə alınaraq edamdan xilas oldu.

Ağqoyunlu Əlvənd Mirzənin qoşunu ilə döyüşdə *(Şərur savaşı)* qızılbaş ordusunun sərkərdələri arasında *Keçəl İlyas bəy Zülqədər* də var idi. Şah *Almabulağı savaşında* Ağqoyunlu Sultan Murada qalib gəldikdən sonra fəth etdiyi torpaqlara öz inanılmış adamlarını hakim təyin edərkən onu da unutmamış, Fars vilayətinin ixtiyarını ona tapşırmışdı. Bir ildən sonra İlyas bəy etimadı doğrultmayıb cəzalandırıldı, onun yerinə təyin edilmiş Süleyman bəy də eyni aqibəti yaşadı. Bundan sonra Fars vilayətinin və Şiraz şəhərinin hakimliyi Əfşar tayfasından Mənsur bəyə etibar olundu. Daha sonra onun yerini yenə Zülqədər tayfasının *Sarışeyxlü* oymağından Xəlil sultan tutdu. Əsl adı Əmət bəy olan Xəlil sultan Çaldıran savaşında qızılbaş ordusunun sağ cinahındakı hərbi bölmələrə sərkərdə təyin edilmiş, amma döyüşdən yayındığına görə I Şah İsmayıl tərəfindən edam olunmuşdu. Fars bölgəsinin hakimiyyəti bu dəfə Zülqədər tayfasının *Çiçəklü* oymağından İzzəddin Əli sultana həvalə edilmişdi.

1518-19-cu illərdə Zülqədər tayfasının yaşadığı Amasya və Zilə bölgələrində Şah Vəlinin başçılığı altında qızılbaş üsyanı başladı. Ardıcıllarının sayı 20 minə yaxın olan bu üsyanın başçısı Şah Vəlini bəzi mənbələrdə Cəlal adlandırır və üsyanı *cəlali üsyanı* kimi təqdim edirlər. Sivas hakimini məğlub edərək əvvəlcə uğur qazanmış üsyançılar Osmanlı və Zülqədəroğullarının birləşmiş qüvvələri tərəfindən darmadağın edildilər, Şah Vəli ələ keçirilərək öldürüldü. Bundan bir qədər sonra bölgədə Zülqədər tayfası mənsublarının qatıldığı daha bir neçə qızılbaş üsyanı da baş verdi. Bunlardan birinə Zülqədər tayfasının *Söklən* oymağından Baba Zünnun, digərinə isə onun oğlu başçılıq edirdi. Üsyanın əsas fiqurlarından biri də Zülqədər tayfasının Söklən oymağından Söklənoğlu Musa idi. Mustafa xəlifənin oğlu Vəli xəlifənin rəhbərlik etdiyi hərəkat da Osmanlı imperiyasında böyük əks-səda doğurmuşdu. Qələndər Çələbi üsyanının əsas qüvvəsini Zülqədər tayfasının *Çiçəklü* oymağı təşkil edirdi. Bu üsyanlar Osmanlı ordusu tərəfindən amansızlıqla yatırıldı, minlərlə qızılbaş zülqədər məhv edildi.

1522-ci ildə Vələdxan bəy Zülqədəroğlu bir neçə min nəfər qızılbaşla birlikdə Osmanlı torpaqlarını tərk edib I Şah İsmayıla qoşulmuş, onunla gələnlərin bir

qismi şahın şəxsi xidmətinə qəbul edilmiş, bir hissəsi də Şirazda və Xorasanda yerləşdirilmişdi. I Şah İsmayılın zamanındakı Zülqədər tayfasının böyük əmirləri arasında Zöhrab sultanın da adı çəkilir.
I Şah Təhmasibin hakimiyyətinin əvvəlində qızılbaş tayfaları arasında baş vermiş vətəndaş müharibəsində Zülqədər tayfası rumlularla ittifaqa girərək ustaclulara, daha sonra təkəlülərə qarşı cəbhə tutmuş, Əli sultan və Məhəmməd xan Zülqədəroğlu bu savaşlarda xüsusi fərqlənmişdilər. Təkəlülərin başçısı *Çuxa sultanı* öldürən də Zülqədər tayfasının *Qoruğlu* oymağından Misir adlı şəxs olmuşdur. Zülqədərlərdən Ürkməz sultan adlı əmir *Ulamə sultan Təkəlü* ilə müttəfiqlikdə ittiham olunaraq edam edilmişdir. Bu tayfanın əmirləri Məhəmməd xan və Qaya sultan Sultan Süleyman Qanuninin İraqeyn səfərində osmanlıların tərəfinə keçdilər.
Bununla belə, I Şah Təhmasibin hakimiyyəti dövründə Zülqədər tayfası böyük etibar sahibi olmuş, Ustaclu, Rumlu və Qacar tayfaları ilə birlikdə dövlət idarəçiliyində mühüm rol ifa etmişlər. Zülqədər tayfasından Astarabad hakimi İbrahim xan, qapıçıbaşı Yolqulu bəy, 1550-ci ildə kürdlərə qarşı savaşda həlak olmuş Şadı bəy (*Şadıbəglü* oymağının adı ondan götürülüb), Məşhəd hakimi Şahvəli sultan Tatıoğlu, Fars vilayətinin hakimi Əli sultan Tatıoğlu, Urmiya hakimi Vəli sultan, Xorasan hakimi Məlkən oğlu, İstanbula elçi kimi göndərilmiş Təbət ağa, özbəklərlə döyüşdə öldürülmüş Səncər oğlu Həmzə bəy və başqalarının adlarına həmin dövrün hadisələrinin təsvirində rast gəlirik. İsgəndər bəy Münşi qeyd edirdi ki, I Şah Təhmasibin vəfatı ərəfəsində Zülqədər tayfasının əmirləri arasında aşağıdakı şəxslər fərqlənirdi: *möhürdar* vəzifəsini daşıyan və böyük hərbi dəstəsi olan Məhəmmədqulu xəlifə Qoruğlu, İbrahim xan Hacıların əmisi oğlu Məhəmməd xəlifə, Şiraz hakimi Qalxançıoğlu Vəli sultan Şadıbəglü, Xorasandakı Cam vilayətinin hakimi Təbət Ağa, möhürdar Şahqulu xəlifə və İbrahim xanın oğlu Xoy hakimi Mənsur bəy.
II Şah İsmayıl zamanında *qorçu* Qazı bəy Zülqədər tanınmış dövlət adamlarını aradan götürməklə bağlı onun gizli əmrlərini icra edirdi, Şah Məhəmməd Xudabəndə hakimiyyətə keçəndən sonra onu *eşikağasıbaşı* təyin etdi, amma az sonra Qazı bəy həbs edildi.
Şah Məhəmməd Xudabəndənin hakimiyyətə gəlişindən sonra Zülqədər əmirlərinə münasibət müsbət olaraq davam etdi. II Şah İsmayılın ölüm xəbərini gətirən İsgəndər xan Zülqədərə "Xoşxəbər xan" ləqəbi verildi. Əksinə, II Şah İsmayıldan sonra onun uşaq yaşlarında olan oğlu *Şah Şücanı* hakimiyyətə gətirməyı təklif etmiş Qalxançıoğlu Vəli sultan aradan götürüldü. Həmin dövrdə Fars vilayətinin hakimləri ənənəvi olaraq Zülqədər tayfasının əmirləri arasından seçilirdi. *Şahrux xan Tatıoğlu möhürdar*, Təbbət oğlu (Beyt oğlu) Şahqulu sultan Simnan hakimi, *Hacılar* obasından İbrahim xanın qardaşı oğlu Məhəmməd xan Astarabad valisi təyin edil-



dilər. Şirvan bəylərbəyliyinə isə Zülqədər tayfasının Hacılar oymağından Məhəmməd xəlifə təyinat aldı. O, Krım tatarlarının Şirvana yürüşü zamanı döyüşdə həlak olmuşdur.

Şah Məhəmməd Xudabəndənin hakimiyyətinin sonlarında baş vermiş qarışıqlıq zamanı zülqədərlərin bir hissəsi şahzadə *Həmzə Mirzənin*, bir hissəsi də şahzadə *Təhmasib Mirzənin* yanında mövqe tutdu. Bu mübarizədə üstünlüyü ələ alan Həmzə Mirzə sədaqətli Zülqədər əmirlərini yüksək vəzifələrə təyin etdi. *Şahqulu xəlifə Zülqədər möhürdarın* nəvəsi Əliqulu sultan Qoruğluya Qum şəhərinin hakimliyi, Əli xan Şadıbəylü Zülqədərə Fars vilayətinin *əmir əl-ümərahğı* qismət oldu. Lakin Əli xandan Zülqədər tayfası üz döndərdi, öz kürəkəni Mehdiqulu xan onu aradan götürüb yerinə keçdi. Bu mübarizədə qarşı cəbhəni seçmiş Əmət xan Zülqədər isə Yəzd şəhərinə sığınmaq istədi, amma *qorçubaşı Qulu xan Əfşarın* vəziri onu öldürdü.

I Şah Abbasın hakimiyyətinin əvvəllərində dövlətdə söz sahibi olan *Mürşidqulu xan Ustaclu* onunla rəqabətdə olan bəzi Zülqədər əmirlərini (Şiraz valisi Mehdiqulu xan, Qum hakimi möhürdar Əliqulu xan Qavurğalu) aradan götürdü.

I Şah Abbasın zamanında aşağıdakı Zülqədər əmirləri dövlətdə yüksək mövqe sahibi idilər: osmanlılara əsir düşmüş Rüstəm sultanın oğlu möhürdar və Kirman hakimi Əmir xan Söklən, Sərəxs hakimi İbrahim sultan Qoruğlu, möhürdar Şahqulu xəlifənin nəvələri Dərgahqulu sultan Qoruğlu və Məhəmməd Hüseyn sultan, möhürdar Əsləməs xan Tatıoğlu, Qarabağ əmirlərindən Kəlbəli Sultan Eymurun oğlu Xəlil Sultan, Məhəmməd xan Şəmsəddinlü, əvvəllər Qarabağ əmirlərindən olmuş, sonra Axısqaya hakim təyin edilmiş qardaşı Səlim xan Şəmsəddinlü, Astarabadın bir bölgəsinin hakimi Müstədam sultan Hacılar, şaha qarşı itaətsizliyinə görə edam olunmuş Şiraz hakimi Yaqub sultan Hacılar, Hüseyn bəy *mehmandar*, yüzbaşı Bayram bəy, Bərxurdar bəy və b.

Yazılanlardan məlum olduğu kimi, Səfəvilər zamanında dövlətin ən məsuliyyətli vəzifələrindən olmuş möhürdar mənsəbinə dəfələrlə Zülqədər tayfasının yetirmələri layiq görülmüşdülər.

I Şah Abbasın zamanında digər qızılbaş oymaqları kimi, zülqədərlər də ölkə ərazisində müxtəlif bölgələrə köçürülərək parçalandılar. Bunadək Fars vilayətində kompakt halda yaşamış Zülqədər tayfasının *Qavurğalular* oymağının bir hissəsi Sərəxsə, Söklən oymağı Kirmana, Şəmsəddinlü və Eymür oymaqları Qarabağa, Hacılar oymağı isə Astarabada köçürüldü.

Zülqədər tayfası bir neçə oymaqdan ibarət olmuşdur: *Qavurğalu (Qoruğlu), Söklən (Sarıxəlillü), Şəmsəddinlü, Eymür, Hacılar (Ağçalu), Sarışeyxlü, Çiçəklü, Camuşlu, Şadibəylü, Hisarbeglü* və s.



**AĞÇALU** – Anadoludakı Boz Ok tayfa ittifaqına daxil olmuş və əkinçiliklə dolanmış türk tayfası. Sivasla Kayseri arasında Gədük bölgəsində məskunlaşmış, daha sonralar Səfəvilər dövlətinin ərazi-

sinə köç etmişdi. Zülqədər tayfasının *Hacılar* oymağını Ağçalu tayfasının bir qolu da sayırlar. Mənbələrdə Hacılar və Ağçalu oymaqları bəzən eyniləşdirilir. Ağçalu tayfası *Qacar* tayfasının da təşəkkülündə rol oynamış, bəzi Qacar əmirləri Ağçalu ləqəbini daşımışdır. Qacar tayfasının oymaqlarından biri Ağçalu adlanırdı. Bəzən Qacar tayfasının *Ağcaqoyunlu* və Ağçalu oymaqlarını eyni qəbul edirlər. I Şah Təhmasibin zamanında yaşamış Damğan və Bistam hakimi Əli xəlifənin adı Ağçalu və Ağcaqoyunlu kimi mənbələrdə qeyd olunmuşdur.
*bax:* **HACILAR**, **AĞCAQOYUNLU.**

**AYRIMLAR** – azərbaycanlıların etnoqrafik qolu hesab edilir. Tədqiqatçıların fikrincə, ayrımlar eymürlərin qalıqlarıdır. Mahmud Kaşğarinin "Divan lüğat ət-türk" kitabında adı çəkilmiş oğuz boylarından biri də Eymürdür. Eyni zamanda Zülqədər tayfasının bir oymağı *Eymür* adlanırdı. Əmir Teymur Ankara qələbəsindən (1402) sonra Eymürlər də daxil olmaqla 50 min ailəni Gəncəbasar, Qarabağ və Zəngəzur bölgələrinə köçürmüşdü. O vaxtdan ayrımlar bu bölgələrin sakinlərinə çevrilmişlər. "Ayrım" sözünü "ayrı-ayrı yerlərdə yaşayanlar" mənasında da izah edirlər.
*bax:* **EYMÜR.**

**CAMUŞLU** – qızılbaş *Zülqədər* tayfasının oymaqlarından biri. I Şah İsmayılın vəfatından az sonra bu oymaqdan Həmzə sultan Fars vilayətinin hakimi təyin edilmişdi. 1528-ci ildə I Şah Təhmasiblə Übeyd xan Şeybani arasında baş vermiş döyüşə Həmzə sultan da qatılmışdı. 1532/33-cü illərdə I Şah Təhmasibin fərmanı ilə vəzifəsindən azad edilmiş Həmzə sultanın yerinə Zülqədər tayfasının *Çiçəklü* oymağından keçmiş Fars hakimi Xəlil sultanın qardaşı Qazı xan keçdi.
Şah Məhəmməd Xudabəndənin hakimiyyət dövrü ilə bağlı hadisələrdə Camuşlu oymağından Həmzə bəyin də adı çəkilir. Şah Məhəmməd Xudabəndə Səfəvi şahzadəsi, I Şah İsmayılın oğlu *Bəhram Mirzənin* nəvəsi Müzəffər Hüseyn Mirzəni Qəndəhar hakimi təyin etmiş, Həmzə bəyi də ləlləsi və vəkili qismində onunla birlikdə Qəndəhara göndərmişdi.
Bəzi kitablarda Camuşlu oymağının adını ərəb əlifbasındakı nöqtə fərqi ilə Xamuşlu şəklində yazmışlar.

**ÇİÇƏKLÜ** – qızılbaş *Zülqədər* tayfasının oymaqlarından biri. Anadoluda məskunlaşmış Boz Ok tayfa ittifaqına daxil olan eyniadlı oymağın bir qoludur. *Çaldıran döyüşündən* sonra Fars vilayətinin hakimi Xəlil sultan Sarışeyxlü edam edilərək onun yerinə Çiçəklü oymağından İzzəddin sultan təyin olundu. İzzəddin sultanın əsl adı Əli idi. I Şah İsmayılın vəfatından sonra baş vermiş qızılbaş qarşıdurmasında Əli bəy də *Div sultan Rumlunun* yanında durdu, amma az sonra dünyasını dəyişdi (1525). Ondan sonra qardaşı Murad xan, daha sonra Zülqədər tayfasının *Camuşlu* oymağından Həmzə sultan Fars vilayətinin hakimi oldu. 1532/33-cü illərdə I Şah



Təhmasib Həmzə sultanı vəzifəsindən götürərək Xəlil sultan Çiçəklünün qardaşı Qazı xanı onun yerinə Fars hakimi təyin etdi.

Osmanlı dövlətində Qələndər Çələbinin rəhbərliyi altında baş vermiş qızılbaş üsyanında (1526-27) Çiçəklü oymağı fəal iştirak etmiş, üsyan yatırılarkən bu oymaqdan da xeyli adam öldürülmüşdü.



**EYMÜR** – qızılbaş *Zülqədər* tayfasının oymaqlarından biri. Eymür 24 oğuz boyundan biridir. Oğuzun Üç Ok qolundan, Oğuz xaqanın oğlu Dağ xanın nəslindəndirlər. Əmir Teymur Ankara savaşında osmanlılara qalib gəldikdən sonra geri qayıdarkən 50 min ailənin Gəncəbasar, Qarabağ və Zəngəzura köçürülməsini əmr etmişdi. Azərbaycanda bunları *ayrım* adlandırmış, ayrı-ayrı yerlərdə yaşadıqları üçün onlara bu adın verildiyi deyilmişdir. Eymürlərin (ayrımların) bir hissəsi Cənubi Azərbaycan ərazisinə köçmüş, qalanları isə öz məskənlərində qalmışlar. I Şah Təhmasib zamanında Eymür obasından Şir Hüseyn *möhürdar* vəzifəsində xidmət edirdi. I Şah Abbasın vəfatı zamanı Zülqədər əmirlərindən Kəlbəli sultan oğlu Xəlil sultan da Eymür oymağından idi, Qarabağda onun iri torpaq mülkləri vardı.



**HACILAR** – qızılbaş *Zülqədər* tayfasının oymaqlarından biri. Anadoludakı Boz Ok tayfa ittifaqına daxil olan və əkinçiliklə dolanan *Ağçalu* tayfasının Hacılar oymağının bir qolu olduğu deyilir. Ağçalu tayfası *Qacar* tayfasının da təşəkkülündə rol oynamış, bəzi Qacar əmirləri Ağçalu ləqəbini daşımışdır.

Səfəvi mənbələrində Hacılar oymağının adına ilk dəfə I Şah İsmayılın sərkərdəsi “Keçəl” ləqəbli *İlyas bəy Zülqədərlə* bağlı rast gəlinir. Keçəl İlyas bəy şah tərəfindən Şiraz hakimi təyin edilmişdi (1504). Ümumiyyətlə, Səfəvilər zamanında Zülqədər əmirlərinin Şiraza hakim təyin edilməsi ənənə halını almışdı. I Şah Təhmasibin dövründə Sarışeyxlü Xəlil xanın qardaşı Qazı xan 1539/40-cı illərdə Şiraz hakimi vəzifəsində öldükdən sonra onun yerini Hacılar oymağından Keçəl İlyas bəyin oğlu İbrahim sultan tutdu. 15 ildən artıq bu vəzifədə qalan, daha sonra Astarabad hakimi təyin edilən İbrahim sultan döyüşlərin birində öldürüldü. Onun oğlu Zeynal xan Xorasanın Cəm məntəqəsinin, digər oğlu *Yaqub xan* isə I Şah Abbasın zamanında Fars bəylərbəyliyinin və Şirazın hakimi idi.

Hacılar oymağının digər üzvü, Yolaldı ağa şahzadə İsmayıl Mirzənin (gələcək II Şah İsmayılın) *dədəsi* (təriqət ustadı) idi və İstanbula elçi kimi göndərilmişdi. I Şah Abbası hakimiyyətə gətirmiş *Mürşidqulu xan Ustaclunu* devirmək məqsədilə bəzi qızılbaş əmirləri birləşmiş, amma 1588-ci ildə məsələnin üstü açılmış və əmirlər cəzalandırılmışdı. O zaman həmin dəstədən olan Mehdiqulu xan Zülqədəri Hacılar oymağından İbrahim xanın oğlu Yaqub bəy aradan götürmüş, bu xidmətinin əvəzi olaraq ona Şiraz mərkəz olmaqla Fars vilayətinin hakimliyi və xan rütbəsi verilmişdi. Lakin Yaqub xan bir müddət sonra şaha itaətsiz-

likdə müqəssir bilinərək öldürüldü (1592). Onun yerini Zülqədər tayfasından Bünyad bəy tutdu. I Şah Abbas zamanında Astarabaddakı bəzi məntəqələrin hakimi olan Müstədam sultan da Hacılar oymağına mənsub idi.

Hacılar oymağı I Şah Abbasın əmri ilə Astarabada köçürülsə də, onların bir hissəsi Qarabağda məskunlaşmışdı. Azərbaycan torpaqları Osmanlı imperiyası tərəfindən ələ keçirildikdən sonra Qarabağdakı Hacılar oymağı *Camuşgəzəklülərlə* birlikdə Osmanlı üsuli-idarəsinin tabeliyində yaşamışdır.

**HİSARBƏGLÜ** – qızılbaş *Zülqədər* tayfasının Osmanlı ərazisində məskunlaşmış oymaqlarından biri. 1526-cı ildə Osmanlı dövlətinin kifayət qədər geniş ərazisini bürümüş qızılbaş üsyanının başçısı Zünnunun adı mənbələrdə *Söklənoğlu (Süklünoğlu)* şəklində qeyd edilir. Bir ildən sonra üsyan qaldırmış Zünnunoğlunun isə *Hisarbəglü* oymağının bəylərindən olduğu məlumdur. Buradan çıxış edərək Hisarbəglünü Söklən oymağının bir qolu saya bilərik.

**XAMUŞLU** – qızılbaş *Zülqədər* tayfasının oymaqlarından biri. Klassik mənbələrdə adı *Camuşlu* şəklində də qeyd edilmişdir. Ərəb qrafikasında bu kəlmələr yalnız nöqtələr vasitəsilə fərqləndiyi üçün nüsxələrdə müxtəliflik yaranmışdır. *bax:* **CAMUŞLU.**

**QAVURĞALU** – qızılbaş *Zülqədər* tayfasının böyük oymaqlarından biri. Mənbələrdə bəzən "Qoruğlu" və ya "Qoroğlu" şəklində də qeyd edilir. Zülqədəroğulları bəyliyinin, daha sonralar Osmanlı dövlətinin ərazisində Zülqədər elinin Qavurğalu boyu məskunlaşmışdı. Onlar Mərəş, Qədirli, Yeni İl bölgələrində yaşayırdılar. Zülqədərlərin bir hissəsi Səfəvilər dövlətinə mərhələlərlə köç edərək əsasən mərkəzi əyalətlərdə – Fars vilayətində yerləşmişdir.

I Şah Təhmasib zamanında Qavurğalı oymağından Mahmud bəy *möhürdar* vəzifəsini daşıyırdı. O, 1533-cü ildə *qabaq* (digər məlumata görə *çövkən*) oyunu zamanı atdan yıxılıb ölmüşdü.

Qavurğalu oymağının daha bir məşhur yetirməsi uzun müddət sarayda möhürdar vəzifəsini icra etmiş *Şahqulu sultandır.* Görkəmli tədqiqatçı F.Sümer qeyd edir ki, Səfəvilər təriqətinin mötəbər mənbələrindən olan *"Səfvət əs-səfa"* kitabını XVI əsrin 30-40-cı illərində türkcəyə tərcümə etdirən də Şahqulu sultan Qoruğlu olmuşdur. (Məhəmməd Katib Nişatinin bu tərcümə əsəri *"Şeyx Səfi təzkirəsi"* kimi tanınır).

Oymağın mühüm simalarından biri Qum hakimi Əliqulu sultan Qavurğalu idi. I Şah Abbasın hakimiyyət uğrunda mücadiləsini dəstəkləyən Əliqulu xan Ustaclunun məsləhətlərinə baxmayaraq, Əliqulu sultan onun tərəfinə keçməmişdi. I Şah Abbas taxta çıxdıqdan sonra Əliqulu sultan Qəzvinə gəlib beyət etdi, əvəzində möhürdar vəzifəsini qazandı, lakin az sonra dövlət işlərini əlində cəmləmiş *Mürşidqulu xan Ustacluya* qarşı qurulan intriqada iştirakına görə



edam edildi. İsgəndər bəy Münşinin *"Tarixi-aləmarayi-Abbasi"* kitabında adları çəkilən, I Şah Abbasın vəfatı ərəfəsində məqam sahibi olan 6 Zülqədər əmirindən ikisi Qavurğalu oymağına mənsub idi (Sərəxs hakimi İbrahim sultan və Şahqulu xəlifənin nəvəsi Dərgahqulu sultan). I Şah Təhmasibin hakimiyyətinin əvvəllərində *Çuxa sultanı* öldürmüş Misir adlı şəxs, möhürdar Şahqulu xəlifə, möhürdar Məhəmmədqulu xəlifə, Məhəmməd Hüseyn sultan da eyni oymaqdan idilər.

I Şah Abbasın göstərişi il Qavurğalu oymağının bir hissəsi Fars vilayətindən Xorasanın Sərəxs bölgəsinə köçürülmüşdü.

**QORUĞLU** (**QOROĞLU**) – *bax:* **QAVURĞALU.**

**SARIŞEYXLÜ** – qızılbaş *Zülqədər* tayfasının oymaqlarından biri. Tarixi mənbələrdə bu oymağın adı I Şah İsmayılın zamanında yaşamış bir əmirlə bağlı çəkilir. Oymağa mənsub olan Xəlil sultan (əsl adı Əmət bəy idi) mərkəzi Şiraz şəhəri olmaqla Fars vilayətinin hakimi təyin edilmişdi. O, *Çaldıran savaşında* qızılbaş ordusunun sağ cinahındakı bölümlərin birinə başçı təyin edilmişdi. Xeyli qızılbaş döyüşçüsünün ölümü ilə nəticələnmiş bu döyüşdə Xəili bəy səhlənkarlıq göstərmişdi. Onun döyüşə girmədiyi və ya icazəsiz döyüş meydanını tərk edib Şiraza qayıtdığı deyilir. Çaldıran savaşının nəticələrinə yekun vurulan zaman I Şah İsmayıl Xəlil sultanı səhlənkar davranışına görə *qorçubaşı* Kor Süleymanın əli ilə edam etdi. Fars bölgəsinin hakimiyyətinə isə Zülqədər tayfasının *Çiçəklü* oymağından İzzəddin Əli Sultan gətirildi.

**SÖKLƏN** – qızılbaş *Zülqədər* tayfasının böyük oymaqlarından biri. Anadoluda Ağdağ ətrafında məskunlaşmış Boz Ok tayfa birliyinə mənsub idi. 1526-cı ildə Osmanlı dövlətinin Tokat, Sivas, Amasya, Maraş, Adana, Tarsus bölgələrini bürümüş qızılbaş üsyanının başçısı Zünnunoğlu Söklən oymağından idi və mənbələrdə Söklənoğlu (Süklünoğlu) kimi xatırlanır. Növbəti il onun oğlunun (Zünnunoğlu) qaldırdığı qızılbaş üsyanında Söklən oymağının başçılarından biri olan Söklən oğlu Musa da yaxından iştirak etmişdir. Ehtimala görə, Söklən oymağı Səfəvilər dövləti ərazisində məskunlaşmış Zülqədər tayfasına sonralar daxil olmuşdur. I Şah Abbasın zamanında Kirman valisi olmuş Rüstəm sultan 1603-cü ildə osmanlılara əsir düşmüşdü. Onun oğlu Əmir xan I Şah Abbas dövründə möhürdar və Kirman valisi, I Şah Səfinin zamanında isə *qorçubaşı* vəzifələrində xidmət etmişdir. Əmir xanın qardaşı Əmət sultan 1610-cu ildə Bakı hakimi vəzifəsinə gətirilmişdir. I Şah Səfinin hakimiyyət illərində Söklən oymağının yetirməsi olan Nəzərəli bəylə Xəndanqulu bəyin də adları mənbələrdə qeyd edilir. Həmçinin I Şah Səfinin zamanında *möhürdarlıq* vəzifəsini Söklən oymağından Əmir xanın oğulları Abdullah bəy və Rüstəm bəy daşıyırdılar.

Söklən oymağı I Şah Abbasın əmri ilə

Kirman ətrafına köçürülmüşdü.
Oymağın adını Süklün və ya Süglün şəklində də yazırlar.

**SÜKLÜN (SÜGLÜN)** – *bax:* **SÖKLƏN.**

**ŞADIBƏGLÜ** – qızılbaş *Zülqədər* tayfasının oymaqlarından biri. Oymağın adı 1550-ci ildə kürdlərə qarşı savaşda həlak olmuş Şadı bəyin adından götürülmüşdür, onun övladları və tabeliyində olan Zülqədərlər bu oymağı təşkil etmişlər. Artıq 1570-ci illərdən başlayaraq Səfəvilər dövlətinin tarixində bu oymağın nümayəndələrinin adlarına rast gəlirik. I Şah Təhmasib zamanında Şiraz hakimi olan Məhəmməd xan Şadıbəglünü II Şah İsmayıl vəzifəsindən götürüb eyni oymaqdan Qalxançıoğlu Vəli xanı onun yerinə təyin etdi. Vəli xan II Şah İsmayılın ölümündən sonra şah seçimində onun körpə oğlunu taxta çıxarmağı təklif etmişdi. Buna görə də Şah Məhəmməd Xudabəndə hakimiyyətə keçdikdən sonra onu aradan götürüb Şiraz hakimliyini və Fars vilayətinin *əmir əl-üməralığını* Əli xan Şadıbəglü Zülqədərə həvalə etdi. Amma Əli xan öz həmtayfaları tərəfindən dəstək görmədi və kürəkəni Mehdiqulu xan tərəfindən öldürüldü. Fars vilayətini zorla ələ keçirmiş Mehdiqulu xan Şadıbəglünün hakimiyyəti şah tərəfindən təsdiq olunmadı, özü isə *Mürşidqulu xanın* əleyhinə qurulmuş koalisiyaya üzv olduğu üçün *Yaqub bəy Hacılar Zülqədərin* əli ilə cəzalandırıldı. Əli xanın mülklərinin bir hissəsi oğlu Təhmasibqulu sultan Şadıbəglüyə verildi. Bu çəkişmələrə son qoyan I Şah Abbas Şiraz hakimliyinə Zülqədər tayfasından Yaqub bəy Hacıları təyin etdi.

**ŞƏMSƏDDİNLÜ** – qızılbaş *Zülqədər* tayfasının oymaqlarından biri. Şəmsəddinlü oymağı Qarabağda məskunlaşmışdı. I Şah Abbas zamanında bu oymağın ən tanınmış nümayəndəsi Dəli Məhəmməd idi. Əvvəllər Tiflis hakimi vəzifəsində xidmət etmiş hazırcavab, zarafatcıl xasiyyətə malik olan bu şəxsə "dəli" ləqəbini də I Şah Abbas vermişdi. Qərb səyyahlarının xatirələrində qeyd edilir ki, Dəli Məhəmməd şahın yaxınlarından sayılır və onun məclislərində tez-tez iştirak edirdi. Ömrünün sonlarına yaxın ona xan titulu verildi. Dəli Məhəmmədin ölümündən sonra onun qardaşı Səlim xan Qarabağ bəylərinin başçısı təyin edildi. Səlim xan bir müddət Axısqa valisi də olmuş, Kaxeti valisi vəzifəsində dünyasını dəyişmişdir (1635/36). I Şah Abbas dövrünün əmirlərindən olan Əlixan bəy və Hüseyn bəy də Zülqədər tayfasının Şəmsəddinlü oymağından idilər.





# Səfəvilərə qarşı irəli sürülmüş bir neçə yanlış iddiaya cavab

*1-ci iddia:*

**Səfəvilərin nəsil şəcərəsindəki Firuz şah Zərrinkülah kürd idi, buna görə də Səfəvilər sülaləsi kürd mənşəlidir.**

Bu iddiaya görə, Səfəvilər sülaləsinin tarixi barədə qədim mənbələrdən olan *"Səfvət əs-səfa"* kitabının bəzi nüsxələrində yazılıb ki, *Şeyx Səfiəddin Ərdəbilinin* yeddinci nəsildən ulu babası *Firuz şah Zərrinkülah* İslamı yaymaq üçün kürd qoşununun tərkibində Səncan ətrafından Azərbaycana gəlmişdir. İddiaya görə, Firuzun özü də kürd mənşəli idi. "Səfvət əs-səfa"nın ən qədim mövcud nüsxəsi olan 1485-ci ildə köçürülmüş Leiden nüsxəsində bu mövzuda heç nə yazılmayıb, amma 6 il sonra – 1491-ci ildə köçürülmüş Ayasofiya nüsxəsində bu barədə qeyd mövcuddur. Ehtimala görə, Səfəvilərin kürd mənşəli olması barədə qeyd Ağqoyunlu Sultan Yaqubun göstərişi ilə bu iki tarix arasında kitaba əlavə edilmişdir. Bu addımın məqsədi Səfəvilərin nəsil şəcərəsini saxtalaşdırmaq, onların türk kökünü inkar etmək, nəticədə Şeyx Heydərin övladlarının türk qızılbaş tayfalarına başçılıq etmələrinə maneçilik törətmək ola bilərdi. "Səfvət əs-səfa"nın bəzi nüsxələrində Firuz şahla bağlı işlənmiş "kürd" sözünə kitabın digər nüsxələrində "zikr" formasında rast gəlirik. Bu iki sözün ərəb əlifbası ilə yazılışı oxşardır; ola bilər ki, "zikr" sözü bəzi katiblər tərəfindən yanlış olaraq "kürd" şəklində köçürülmüşdür. Əsərin XVI əsrdə Azərbaycan dilinə tərcümə edilmiş variantında da (*"Şeyx Səfi təzkirəsi"* adı ilə tanınır) nə Azərbaycana yürüş etmiş kürd qoşunu, nə də Firuz şahın kürd mənşəyi barədə bir söz deyilir.

Bəzi müəlliflər Firuz şah Zərrinkülahın qatıldığı qoşunun Diyarbəkir ətrafındakı Səncardan gəldiyini yazmışlar (burada əsasən kürd əhali yaşayır). Amma əsərin bir neçə qədim nüsxəsində həmin məntəqənin adı Səncar yox, Səncan şəklində verilmişdir. Səncan isə qədim türk şəhəri Mərvin yaxınlığında yerləşirdi, bundan əlavə, Nişapur və Dərbənd ətrafında da Səncan məntəqələri mövcud idi.

Bu iddianın əsassız olduğunu göstərən sübutlardan biri də bundan ibarətdir: Qızılbaş Səfəvi dövlətinin yaranma mərhələsində dövlətin əsasını təşkil etmiş tayfaların arasında kürdlərin olması barədə mənbələrdə məlumata rast gəlinmir. Çigini (Çəkəni), Zəngənə, Mükri, Ruzəki, Zig, Pazuki, Siyahmənsur, Ərdəlan kimi kürd tayfalarının dövlət idarəçiliyində iştirakı daha sonrakı dövrlərə təsadüf etmişdir.

*Ətraflı məlumat üçün bax:*

**SƏFƏVİLƏRİN ETNİK MƏNSUBİYYƏTİ.**

*2-ci iddia:*

**I Şah İsmayıl özünü peyğəmbər və ya İmam Mehdi (ə) elan etmişdi, qızılbaşlar da ona Mehdi kimi baxırdılar.**

Bu iddianın əsas mənbələri I Şah İsmayılın zamanında Səfəvilər dövlətinə səfər etmiş bəzi Avropa diplomatlarının xatirələri və müharibəyə haqq qazandırmaq üçün Osmanlı ruhaniləri tərəfindən qızılbaşlara qarşı yazılmış risalələrdir. Bir neçə il (1499-1515-ci illər arasında) Səfəvilər dövlətində yaşamış italyan səyyah və diplomat Covanni Mario Ancolello (1451/52-1525) öz xatirələrini bundan əvvəl Osmanlı dövlətinə etdiyi səfərin xatirələri ilə birlikdə qələmə almışdır. Ancolellonun yazılarında həqiqətə uyğun gəlməyən, müəllifin subyektiv yanaşmasından qaynaqlanan xeyli məlumat vardır. Qərb müəllifləri adətən Şərq ruhunu, qızılbaş düşüncəsini, türk adət-ənənələrini düzgün qavraya bilmədikləri üçün şahid olduqları hadisələri özünəməxsus tərzdə təsvir və şərh edirdilər. Ancolello yazırdı: "Bu hökmdara (yəni I Şah İsmayıla) xüsusilə öz döyüşçüləri pərəstiş edirlər, onların çoxu zirehsiz döyüşür. Öz başçılarının yolunda ölməyə sevinirlər. Sinələrini açıb döyüş meydanına çıxır və fars dilində "tanrı, tanrı" mənasını verən "şeyx, şeyx" deyə nərə çəkirlər. Başqa bir dəstə onu peyğəmbər hesab edir, amma aydın olan budur ki, hamı onun ölməyəcəyinə inanır. Təbrizdə olarkən eşitdim ki, şahın özü ona pərəstiş edilməsindən və onun tanrı sayılmasından narazıdır".

Göründüyü kimi, italyan səyyahın mövzu barədə bilikləri o qədər də düzgün deyil; belə ki, o, "şeyx" sözünü "tanrı" kimi anlamışdır. Qızılbaş döyüşçülərinin döyüş meydanına zirehi soyunaraq çıxmaları və şahın uğrunda şövqlə savaşmaları normal anlaşılan haldır. Kərbəla faciəsində İmam Hüseynin (ə) silahdaşlarından Abis də zirehini və dəbilqəsini soyunaraq döyüşmüşdü.

Qızılbaşlar arasında bəzi şəxslərin və hətta müəyyən qrupun I Şah İsmayıl barədə ifrat düşüncədə olması da mümkündür. Amma Ancolello qeyd edir ki, şah özü bu cür yanaşmadan narahat idi.

Ümumiyyətlə, I Şah İsmayıla ifrat münasibətlə bağlı məlumatlar qarışıqdır və bir-biri ilə ziddiyyət təşkil edir. Bəzi müəlliflər qızılbaşların onu Allah, bəziləri peyğəmbər, bəziləri də İmam Mehdi (ə) saydıqlarını iddia etmişlər. Bu fərqlilik həmin iddiaların doğruluğunu şübhə altına salır. Səfəvi mənbələrinin heç birində nə I Şah İsmayılın belə bir iddia irəli sürməsi, nə də qızılbaşlar arasında belə bir fikrin olması barədə məlumat vardır. Əgər qızılbaş ordusunda belə bir tendensiya mövcud olsaydı, klassik Səfəvi mənbələrində buna kiçicik də olsa işarə vurulardı.

I Şah İsmayılın öz sözləri və şeirləri də bunu göstərir ki, o, ənənəvi İslam əqidəsinə bağlı olmuş, özünü heç zaman tanrı, peyğəmbər və ya imam saymamışdır. Əksinə, o, özünü Əhli-beytin nökəri sayaraq vurğulayırdı ki, bütün addımlarını imamların icazəsinə uyğun olaraq atır: "Mən vilayət şahının nökə-



riyəm, onun icazəsi olmadan su da içmərəm, bu müddət ərzində hər nə etdimsə, onun izni ilə etdim".

Şah İsmayıl Xətainin şeirlərinin mühüm hissəsini Allaha minacatlar, Mühəmməd Peyğəmbərə (s) və imamlara mədhiyyələr təşkil edir. "Ey ki yoxdan bu cahanı var edən Pərvərdigar", "Şol mübarək zatına işim sənadır, ya Nəbi" misraları ilə başlayan qəsidələr buna sübutdur. Xətai İmam Mehdiyə (ə) olan sevgi və sədaqətini bu şəkildə tərənnüm edirdi:

Yəqin bil ki, xudayidir Xətai,
Mühəmməd Mustafayidir Xətai...
Mühəmməd Mehdiyi-sahibzamanın
Eşigində gədayidir Xətai.

Səfəvilər dövründə belə bir inam mövcud idi ki, bu dövlət dünyanın sonuna yaxın zühur etməli olan *İmam Mehdinin (ə)* sülh və ədalətlə dolu ilahi hakimiyyətinə bir müqəddimədir və zühur üçün hazırlıq yaradır.

***Mənbələr:*** *S.Nəcəfinəjad. I Şah İsmayıl Səfəvinin mehdilik iddiası nəzəriyyəsinin tənqidi və təhlili ("Məşriqi-mövud" dərgisi, 1400 h.-ş., № 60), s.21-40; Venesiyalıların İran səyahətnamələri (altı səyahətnamə) (fars dilinə tərcümə: Mənuçöhr Əmiri), s.344; Мустафаев Э.К. Место веры в мехдианство в идеологической политике государства Сефевидов (Вчені записки ТНУ імені В.І.Вернадського. Серія: Історичні науки, том 31 (70), № 4, 2020), стр.198-204; Aləmarayi-Səfəvi (nəşrə hazırlayan: Y.Şükri), s.111, 291-292; Şah İsmayıl Xətai. Əsərləri (2 cilddə), I, 531.*

*3-cü iddia:*

**I Şah İsmayıl öz anasını öldürmək barədə əmr vermişdir.**

Bu iddianın da əsas mənbəyi Qərb səyyahlarının xatirələridir. XV əsrin ikinci yarısında Ağqoyunlular dövlətində diplomatik missiya daşımış italyan səyyah Katerino Zenonun xatirələrində yazılıb ki, I Şah İsmayıl 1501-ci ildə Təbrizə daxil olduqdan sonra öz analığını (ögey anasını) hüzuruna gətirdib edam etdirmişdir. Qadın öz əri *Şeyx Heydərin* qətlindən sonra bu qətldə əli olan bir nəfərə ərə getdiyi üçün ölümə məhkum edilmişdir. Lakin K.Zenonun yaşadığı və Ağqoyunlu sarayında fəaliyyət göstərdiyi illər bu hadisənin baş verməsindən xeyli əvvələ təsadüf etdiyindən belə qəbul edilib ki, bu məlumat (bəzi digər informasiyalar kimi) onun səyahətnaməsinə sonralar başqaları tərəfindən əlavə olunmuşdur. K.Zenonun xatirələri orijinaldan (italyan dilindən) başqa dillərə tərcümə edilərkən "analıq" sözü səhvən "ana" şəklində verilmiş, bu da şahın öz anasını öldürməsi barədə əfsanənin yaranmasına səbəb olmuşdur.

XVI əsrin əvvəllərində Səfəvilər dövlətində bir neçə il yaşamış daha bir italyan diplomat Covanni Mario Ancolello (1451/52-1525) da öz xatirələrində eyni məsələni qısaca qeyd etmişdir. Müəllif daha sonra I Şah İsmayılın öz anasından intiqam almasını bununla izah edir ki, guya gələcək şah körpə olarkən anası onu öldürmək istəmişdi və həm də bu qadın "düşmən nəsildən" idi.

Hər bir halda I Şah İsmayılın anası *Aləmşah bəyim* Şeyx Heydərin qətlindən sonra ailə qurmamış, övladlarını bəsləyib böyütmüş, onların təhlükəsizliyi üçün əlindən gələni etmiş, 1501-ci ildən sonra da həyatda olmuşdur. I Şah İsmayıl öz anası ilə həmişə mehriban münasibət saxlayır, bütün görüşlərində ona öz sevgi və ehtiramını bildirirdi. Aləmşah bəyimin öz oğlu tərəfindən öldürüldüyünə kiçik bir işarə belə mənbələrdə yoxdur. "Analıq" və "ana" sözləri arasındakı tərcümə fərqindən yaranmış bu çirkin iftira isə sonralar Səfəvilər sülaləsinə kin bəsləyən qüvvələr tərəfindən qəsdən tirajlanaraq I Şah İsmayılı ləkələmək üçün istifadə edilmişdir.

***Mənbələr:*** *Namiq Musalı. Şah İsmayıl Xətainin anası Aləmşah bəyim: əfsanələr və həqiqətlər (Alevilik-Bektaşilik Araştırmaları Dergisi, 2016/13), s.35-59; M.K.Yusifcəmali. I Şah İsmayılın həyatı, s.192; Mehman Süleymanov. Səfəvilər, III, 533-534; Venesiyalıların İran səyahətnamələri (altı səyahətnamə) (fars dilinə tərcümə: Mənuçöhr Əmiri), s.268, 326 və 330.*



*4-cü iddia:*

**I Şah İsmayıl 1508-ci ildə Bağdad şəhərini fəth etdikdən sonra hənəfi məzhəbinin banisi, böyük əhli-sünnə alimi Əbu Hənifənin qəbrini açdırmış, cənazəsini çıxararaq yandırmış, əvəzində qəbirdə it leşi basdırmışdır.**

Əvvəla, bunu qeyd etmək lazımdır ki, belə bir iddia mötəbər Səfəvi mənbələrində öz əksini tapmamışdır. Səfəvilər tarixindən bəhs edən "Tarixi-aləmarayi-Abbasi", "Təkmilət əl-əxbar", "Əhsən ət-təvarix", "Cəvahir əl-əxbar", "Təkmilət əl-əxbar", "Xüldi-bərin", "Fütuhati-şahi", "Həbib əs-siyər", "Lübb ət-təvarix", "Qisəs əl-xaqani", "Rövzət əs-Səfəviyyə" kimi kitablarda bu barədə heç bir məlumat verilməmişdir. Halbuki bu kitabların bir çoxunda I Şah İsmayılın İraq yürüşü (buna səbəb olan hadisələrlə birlikdə), imamların müqəddəs hərəmlərini ziyarət edib hədiyyələr verməsi, tikinti-abadlıq işləri aparması kifayət qədər ətraflı şəkildə təsvir olunmuşdur. Klassik mənbələrdən "Aləmarayi-Səfəvi"də bu barədə danışılır, amma həmin əsərin müəllifi naməlumdur, bəzi məlumatların təqdimat tərzi onun peşəkar tarixçi tərəfindən yazıldığını ciddi şübhə altına alır. Əbu Hənifənin cəsədinin təhqir edilməsi ilə bağlı məlumata isə əsasən bəzi müasir müəlliflərin əsərlərində rast gəlirik.

I Sultan Səlimin I Şah İsmayıla ünvanladığı birinci məktubda onun guya "qəbir və türbələri yandırması" ilə bağlı iddia səslənsə də, Əbu Hənifənin adı çəkilmir və ittiham konkretləşdirilmir.

Hadisə barədə bəzi kitablardakı yazılarda görünən ziddiyyət və dolaşıqlıq da bunlara şübhə ilə yanaşmağa əsas verir. Belə ki, Osmanlı salnamələrindən "Peçevi tarixi"ndə yazıldığna əsasən, hələ Bağdadın osmanlılar tərəfindən ələ keçirilməsindən əvvəl orduda xidmət edən bir çavuş baş komandan (həm də baş vəzir) İbrahim paşaya belə bir hadisə danışıbmış: Özünü türbənin xidmətçisi



kimi təqdim edən bir nəfər ona bildirib ki, Səfəvilərin Bağdada hücumundan əvvəl guya bir gecə Əbu Hənifə onun yuxusuna girmiş və cənazəsinin başqa yerə köçürülməsini xahiş etmişdi. Türbənin xidmətçisi qəbri açıb Əbu Hənifənin cənazəsini çıxarır və gizli yerdə dəfn edir, izi azdırmaq üçün isə, yuxuda ona deyildiyi kimi, bir kafirin cəsədini Əbu Hənifənin məqbərəsində basdırır. Guya 1508-ci ildə qızılbaşlar məzarı açıb həmin cənazəni yandırmışlar. 1534-cü ildə I Sultan Süleymanın başçılığı altında Osmanlı qoşunu Bağdadı tutduğu zaman İbrahim paşa bu əhvalatı xatırlayaraq Daşqın xəlifə adlı bir nəfərə Əbu Hənifənin əsl məzarını tapmağı tapşırdı. Az sonra Əbu Hənifənin gizli qəbirdə dəfn edilmiş və çürüməmiş, müşk ətri verən cənazəsini tapıb əvvəlki yerinə qaytardılar.

Hadisənin təsvirinin bəzi detalları oxucuda inanılmaz nağıl təsəvvürü yaradır. Belə ki, "əsl" məzarda qazıntı aparan şəxslərdən birinin oradan gələn müşk ətrindən huşu getmiş, o birisi isə hətta ətrin təsirindən ölmüşdü. Müəllif də etiraf edir ki, tapılan cənazənin Əbu Hənifəyə aid olmasının yeganə sübutu ondan xoş ətir gəlməsi olmuşdur; çünki yuxunu görən və cənazəni köçürən adam onun yerini dəqiq bildirməmişdi. Sadəcə olaraq, ətrafda dağılmış tikililəri yoxlayan şəxslər uçuqların altından gözəl müşk qoxusu gəldiyinə görə orada məhz Əbu Hənifənin basdırıldığını yəqin etmişdilər.

Avstriya tarixçisi Joseph Freiherr von Hammer-Purgstall (1774–1856) "Osmanlı dövlətinin tarixi" əsərində bu hadisəni mənbə göstərmədən nəql etmişdir. Müəllif əsərin növbəti bölümlərində bəzi Osmanlı mənbələrinə istinadən yazır ki, I Şah Abbas da 1623-cü ildə Bağdadı ələ keçirdiyi zaman Əbu Hənifənin və Əbdülqadir Gilaninin türbələrini dağıtmış, onların bütün gümüş qəndillərini, qapılarını və hətta mismarlarını qarət etmişdi.

I Şah İsmayılın və I Şah Abbasın Bağdadı fəth etdikdən sonra Əbu Hənifənin qəbrini təhqir etmələri, hətta buranı ayaqyoluna çevirmələri barədə şiə mənbələrindən *Qazı Nurullah Şüştərinin* "Məsalib ən-nəvasib", Şeyx Yusif Bəhraninin "Kəşkul" əsərlərində də yazılmışdır. Lakin əvvəla, bu məlumat yuxarıdakı iddia ilə uyğun gəlmir. Çünki əgər Əbu Hənifənin cəsədi qəbirdən çıxarılıb yandırılmış, yerində də it leşi basdırılmışdısa, qəbri ayaqyoluna çevirməyin mənası olmazdı. İkincisi, bu müəlliflərin hər ikisi əhli-sünnəyə qarşı barışmaz mövqedə olmuş, əsərlərində məzhəbi zəmində mübahisəli məsələlərə daha çox yer ayırmış, tarixi mövzularda qeyri-dəqiqliklərə yol vermişlər. Qazı Nurullah Şüştəri məzhəbi mövzuda fikirlərinə görə Hindistanda edam edilmişdir. (Buna görə şiə aləmində "dördüncü şəhid" kimi tanınır), Şeyx Yusif Bəhrani isə əxbari əqidəsində idi; əxbari alimlər isə üsulilərə nisbətən əhli-sünnəyə qarşı daha artıq dərəcədə dözümsüz olmuşlar. Maraqlı cəhət budur ki, I Şah Abbasın

həyatından bəhs edən mənbələrin ən mühümü olan "Tarixi-aləmarayi-Abbasi" kitabında Bağdadın fəthi ətraflı təsvir edilsə də, orada Əbu Hənifənin qəbrinə təhqirlə bağlı heç bir məlumat yoxdur.

***Mənbələr:*** *Dövləti-Osmaniyyə tarixi: Osmanlıların məbadii-zühurundan Qaynarca əhdnaməsinə qədər (müəllifi: Hammer, mütərcimi: Məhəmməd Əta, İstanbul, Səlanik mətbəəsi, 1330 h.-q.), V, 156 və IX, 24; Aləmarayi-Səfəvi (nəşrə hazırlayan: Y.Şükri), s.477-481; Qazı Nurullah Şüştəri. Məsalib ən-nəvasib, I, 366; Şeyx Yusif Bəhrani. Əl-Kəşkul (Ənis əl-müsafir və cəlis əl-hazir), I, 541; M.K.Yusifcəmali. I Şah İsmayılın həyatı, s.253-255.*



*5-ci iddia:*

**I Şah İsmayıl özbək xanı Məhəmməd xan Şeybaninin kəsik başından piyalə düzəltdirmiş və içində şərab içmişdir.**

Bu iddianı müdafiə edənlər belə bir nüansa əsaslanırlar ki, düşmənin kəllə sümüyündən qədəh kimi istifadə etmək qədim türk ənənəsinə bağlı bir hərəkətdir. Qədim türklər bu yolla düşmənin gücünü alıb öz güclərinə qatdıqlarını düşünürdülər; guya həmin qədəhdən içilən içki ilə birlikdə kəllə sahibinin gücü də onu içən adama ötürülürdü.

Amma *Məhəmməd xan Şeybani* ilə bağlı iddianı şübhə altına almağa ciddi əsaslar vardır. Əvvəla, hadisəni nəql edənlər I Şah İsmayılın həmin qədəhdə şərab içdiyini yazırlar. Dini dəyərlərə həmişə sayğı ilə davranmış şahın şərab içməsi heç bir mötəbər və qərəzsiz mənbədə öz əksini tapmamışdır. Əksinə, I Şah İsmayıl eyş-işrət məclislərindən uzaq olmuş, onun üçün göndərilən rəqqasə və çalğıçı dəstələrini qəbul etməyərək geri qaytarmışdır. Bir savaşdan əvvəl gecə vaxtı gizlicə hərbi düşərgəni gəzib dolaşarkən bir neçə döyüşçünün şərab içdiyini görüb sarsılmış və yanındakı *Hüseyn bəy Lələdən*: "Mənim qoşunumda şərabmı var?" deyə soruşmuşdu.

İkincisi, Şeybani xanın kəsilmiş başının sonrakı taleyi barədə mənbələrdə fərqli məlumatlar mövcuddur. Bəzi kitablarda qeyd edilib ki, I Şah İsmayıl Şeybani xanın kəllə sümüyünü Misirdə hökm sürən və Abbasilər xilafətinin süqutundan sonra Misirə sığınmış xəlifələri himayə edən məmlük sultanlarından Qansuh əl-Ğövriyə göndərmişdi. Səfəvi elçisinin yaraşıqlı sandıqda təqdim etdiyi kəlləni məmlük sultanı Qahirədə dəfn etdirdi. Bu yolla, orta əsrlər ənənəsinə görə, şah həm qazandığı mühüm qələbənin xəbərini qonşu dövlətin hökmdarına çatdırmış, həm də onunla düşmənçiliyin necə nəticələnəcəyi barədə onu xəbərdar etmişdi. I Şah İsmayılın əmri ilə Şeybani xanın kəllə sümüyünün üzərinə qızıl suyu ilə ərəbcə ibrətamiz bir şeir parçası da həkk edilmişdi; Misirin 200-dən artıq şairi həmin şeirə nəzirə və cavab yazmışdır. Salnaməçi Əbul-bərəkat Məhəmməd ibn Əhməd ibn İyas məmlüklərin tarixinə həsr etdiyi "Bədai əz-zühur fi vəqai əd-dühur" kitabında 1511-ci ilin yanvarında (hicri 917-ci ilin rəbi əl-əvvəl ayı) baş vermiş hadi-



sələrin içində qızılbaş elçisinin qəbul mərasimini ətraflı şəkildə təsvir etmişdir.

Görünür, kəllə sümüyünün üzərinə həkk olunmuş (və yaxud onunla birlikdə göndərilmiş kağızda yazılmış) ərəbcə şeir parçasının məzmunu onun şah tərəfindən qədəh kimi istifadə edilməsi barədə rəvayətin yaranmasına səbəb olmuşdur. Şeirin tərcüməsi belədir: "Qılınc və xəncər bizim ətirli reyhanımızdır. Vay olsun nərgiz və mərsin gülünə (ki, bunlara çata bilməzlər). Şərabımız düşmənlərimizin qanı, qədəhimiz kəllə sümüyüdür". Ehtimala görə, I Şah İsmayılın klassik şeir qaydalarına uyğun olaraq göndərdiyi rəcəz (hərbə-zorba) xarakterli şeir parçası və şeirin təsirini artırmaq üçün əyani təsvir kimi kəllədən hazırlanmış qədəh hərfi mənada qəbul edilmiş və şahın guya bu qədəhdə şərab içməsi barədə şayiəni yaratmışdır.

***Mənbələr:*** *İbn İyas. Bədai əz-zühur fi vəqai əd-dühur, IV, 218-227; Türkler Ansiklopedisi (Abdullah Gündoğdu. Şiban Han Sülalesi ve Özbek Ulusunun Teşekkülü), VIII, 606-616; Türkiye Diyanet Vakfi İslam Ansiklopedisi, XXXIX, 44.*



*6-cı iddia:*

**I Şah İsmayıl Bakını tutduqdan sonra Şirvanşahların məzarlarını dağıtmağı və cənazələrin qalıqlarını yandırmağı əmr etmişdi.**

Bəzi klassik mənbələrdə ("Həbib əs-siyər", "Xülasət ət-təvarix", "Xüldi-bərin" və s.), o cümlədən Həsən bəy Rumlunun "Əhsən ət-təvarix" kitabında yazılıb ki, 1501-ci ildə mühasirə nəticəsində Bakı qalası fəth edildikdən sonra "əzəmətli qazilər həzrət Sultan Cüneydi şəhidlik izzətinə çatdırmış Mirzə Xəlilullahın qəbrini açdılar və onun cəsədini bayıra çıxarıb yandırdılar. Onun günbəzində çoxlu qızıl tapdılar". Bəzi iddialara görə, təkcə I Xəlilullahın qəbri deyil, Şirvanşahların ümumi ailə məzarlığı (mavzoleyi) da dağıdılıb yerlə yeksan edilmişdi.

"Əhsən ət-təvarix" kitabını Azərbaycan dilinə tərcümə etmiş tarixçi alimlər O.Əfəndiyev və N.Musalı bu məsələ ilə bağlı ətək yazısında aşağıdakı qeydi vermişlər: "Lakin 1945-1947-ci illərdə Şirvanşahlar sarayındakı türbədə aparılan arxeoloji kəşfiyyat işləri zamanı türbədə açılmış qəbirlər bu məlumatın dəqiq olmadığını göstərir" (Ş.K.Məmmədova. "Xülasət ət-təvarix" Azərbaycan tarixinin mənbəyi kimi, s.65).

Görkəmli alim Oqtay Əfəndiyev "Azərbaycan Səfəvilər dövləti" kitabında bu məlumatı "Əhsən ət-təvarix" kitabından nəql etdikdən sonra şərh bölümündə Şirvanşah I Xəlilullahın məzarını tapmağın mümkün olmadığını qeyd etmişdir. Amma bunun ardınca alim 1947-ci ildə Şirvanşahlar sarayında arxeoloji qazıntılar aparmış ekspedisiyanın hesabatına istinad edərək yazır: "Sərdabanın taxta döşəməsinin altındakı zirzəmidə içərisində insan cənazələri olan beş toxunulmamış qəbir tapılmışdır və bunlar da, güman edildiyi kimi, I Xəlilullahın

ailə üzvlərinə məxsusdur. Yazıları olan başdaşılar saxlanmamışdır. Ehtimal etmək olar ki, onlar (başdaşılar) məhv edilmişdir" (Н.В.Минкевич-Мустафаева. Гробницы в усыпальнице Ширваншахов, ДАН Азерб. ССР, 1947, том 3, №1, стр.41-43).

Tədqiqatçı alim S.Aşurbəyli də "Şirvanşahlar dövləti" kitabında Həsən bəy Rumlunun verdiyi məlumatı nəql etdikdən sonra qeyd etmişdir: "Bakının İçərişəhər hissəsindəki sarayın ərazisindəki Şirvanşahlar türbəsində aparılan qazıntılar nəticəsində Xəlilullahın ailə üzvlərinin türbələrinə toxunulmadığı aşkar edilmişdir".

Görkəmli rus alimi İ.P.Petruşevski fərqli əsərlərində mövzu barədə ziddiyyətli məlumatlar vermiş, "Azərbaycan XVI-XVII əsrlərdə" kitabında isə "bütün məqbərələrin toxunulmaz olduğunu, onların yalnız bir hissəsinin dağıdıldığının mümkünlüyünü" qeyd etmişdir.

M.Süleymanov da "Səfəvilər" kitabında bu mövzuya toxunaraq yazır: "Amma sonrakı faktlar göstərir ki, ...Əmir Xəlilullahın qəbri salamat qalmışdı. Tədqiqatçıların fikrincə, ola bilsin ki, qızılbaş əmirləri yalnız qəbrin uçurulması ilə kifayətlənmiş, amma Xəlilullahın sümüklərinə toxunulmamışdı".

Göründüyü kimi, Şirvanşahların cənazələrinin təhqir olunması iddiası ilə arxeoloji qazıntıların nəticələri və tədqiqatçı alimlərin rəyləri arasında uyğunsuzluq mövcuddur.

Klassik mənbələrdə qızılbaşların Şirvanşahlara məxsus məzarlara qarşı hörmətsizlik etmələri barədə məlumatın səbəbini isə o dövrün düşüncəsində və yazı üslubunda axtarmaq daha düzgün olar. Mümkündür ki, bəzi Səfəvi müəllifləri I Şah İsmayılın hərbi uğurlarını şişirtmək, onun qətiyyətini göstərmək və düşmənlərdə qorxu yaratmaq məqsədilə öz kitablarında belə bir məlumatı yerləşdirmişlər.

***Mənbələr:*** *Oqtay Əfəndiyev. Azərbaycan Səfəvilər dövləti, s.48; Сара Ашурбейли. Государство Ширваншахов, стр.264; Həsən bəy Rumlu. Əhsənüt-təvarix (fars dilindən tərcümə və şərhlər: O.Əfəndiyev və N.Musalı), s.367; Р.Мехтиев. Шах Исмаил Сефеви: портрет правителя и воина, стр.203; M.Süleymanov. Səfəvilər (Şah İsmayıl Səfəvi), II, 258.*



*7-ci iddia:*

**Səfəvilər ilk dəfə bölgəyə şiə məzhəbini gətirmişlər, onlardan əvvəl burada şiəlik yox idi.**

Səfəvilərə qarşı irəli sürülmüş bu iddianın heç bir əsası yoxdur. *İmam Əli* ibn Əbu Talibin (ə) tərəfdarları mənasında *"şiə"* adlı qruplaşma İslamın əvvəllərindən mövcud olmuş və bu ad hələ həzrət Mühəmməd Peyğəmbər (s) tərəfindən işlənmişdir. VIII əsrdə yaşamış altıncı imam *Həzrət Cəfər Sadiq (ə)* şiə məzhəbinin hüquqi və etiqadi əsaslarını sistemləşdirdiyinə görə 12 imamçı şiələri "cəfəri" adlandırmışlar. Səfəvilər dövlətinin yaranmasına kimi keçən dövr



ərzində şiələr dini və dünyəvi elmlərdə müstəsna xidmətlər göstərmişlər. Səfəvi dövlətindən əvvəl də bölgədə irili-xırdalı şiə dövlətləri mövcud olmuşdur: xilafətin paytaxtı Bağdad şəhərini 100 ildən artıq öz nəzarəti altında saxlamış Büveyhilər (934-1062), indiki İraq və Suriya torpaqlarında hökm sürmüş Həmdanilər (890-1004) və Üqeylilər (990-1096), Deyləm (Gilan) məntəqəsində dövlət qurmuş Cüstanilər (791-XI əsrin sonları), Sultan Məhəmməd Olcaytu Xudabəndə zamanında (1304-1316) şiə məzhəbinin bərqərar olduğu qüdrətli Elxanilər dövləti, Mazandaran bölgəsinin hakimi olmuş Mərəşilər (1359-1596), Xorasana nəzarət etmiş Sərbedaranlar (1337-1381), şiə təmayülü ilə tanınan Qaraqoyunlular (1375-1468), eləcə də ifrat şiə əqidəsində olan Salarilər (941-981), İsmaililər (1090-1273), Müşəşəilər (1435-1508) və s. Səfəvilər imperiyasının tərkibində olmuş indiki Azərbaycan, İran, İraq, Əfqanıstan torpaqlarında yüzlərlə imamzadə və qədəmgah ziyarətgahı mövcuddur. Şiə müqəddəslərinin bu torpaqlara pənah gətirərək yaşaması sübut edir ki, burada hələ qədimdən *Əhli-beyti* sevən icmalar mövcud olmuş və peyğəmbər nəslinin nümayəndələrinə sığınacaq vermişlər. Məhz buna görə Səfəvilər dövlətinin quruluşu zamanı şiə məzhəbinin xalq arasında yayılması ilə bağlı ciddi problemlərə çox rast gəlinməmişdir.

*Ətraflı məlumat üçün bax:* **ŞİƏLİK.**

*8-ci iddia:*

**Səfəvilər əhli-sünnə əhalini zorla şiə etmiş, sünnilərə qarşı qırğınlar törətmişlər.**

Orta əsr mənbələrinin özünəməxsus yazılış tərzi və ifadə üslubu vardır. Adətən salnamə müəllifləri bir hökmdarın gücünü göstərmək üçün onun apardığı müharibələri bacardıqca dramatik üslubda, qanlı-qadalı formada təsvir etməyə çalışırdılar. Orta əsrlərin müharibələrində güc faktoru əsas idi, qalib tərəf, bir qayda olaraq, haqlı sayılırdı. O zamanlar belə bir düşüncə hakim idi ki, hökmdar öz düşmənlərinə qarşı nə qədər çox amansızlıq törətmişsə, bir o qədər güclüdür. Unutmaq olmaz ki, orta əsrlərin salnamələri həm də o dövrün kütləvi informasiya vasitəsi rolunu oynayırdı. Sifarişçi tərəfin qüdrətini hər tərəfə car çəkən bu əsərlər düşməndə qorxu yaratmalı idi. Səfəvi mənbələrində qızılbaş ordusunun qazandığı qələbələri daha parlaq göstərmək üçün düşmənin həm sayını, həm də itkiləri şişirdirdilər. Osmanlı mənbələrinin Səfəviləri amansız və qəddar formada təqdim etmələrinin də səbəbi aydındır; bu yolla onlar öz atdıqları addımlara legitimlik qazandırmağa və intiqam motivi yükləməyə çalışırdılar. Buna görə də Səfəvilərlə bağlı (həm Səfəvi müəllifləri, həm də əks cəbhə tərəfindən yazılan) mənbələrdəki məlumatları araşdırarkən tarixi şərait və yuxarıdakı nüanslar mütləq nəzərə alınmalıdır.

Səfəvilər dövründə şiə məzhəbi bölgə

üçün təzə bir inanc deyildi, ayrı-ayrı məntəqələrdə bundan əvvəl də tarixin müəyyən dövrlərində şiə dövlətləri mövcud olmuşdu, bəzi məntəqələrdə isə elə o zamanlar da şiə icmaları yaşayırdı. Əhli-sünnə əhali arasında şiəliyi yayarkən ayrı-ayrı hallarda bəzi qeyri-qanuni və amansız addımların atılması da mümkündür; insan hüquqları, etiqad azadlığı barədə təsəvvürlərin ozamankı səviyyəsi baxımından bu hallar normal qəbul edilirdi.

Lakin Səfəvilər dövlətinin bərqərar olduğu ərazilərdə məskunlaşmış əhalinin dini mənsubiyyət "xəritəsi" bunu söyləməyə əsas verir ki, şiəlik mütləq mənada zorla qəbul etdirilməmiş, insanlara müəyyən seçim ixtiyarı buraxılmışdır. Məsələn, I Şah İsmayıl Şirvanşahlar dövlətinin dayaq məntəqələri olan Şamaxı və Bakı şəhərlərini fəth etdikdən sonra əhali ilə kifayət qədər mərhəmətli davranmış, qızılbaşların Şamaxıdan özləri ilə qənimət aparmalarını qadağan etmişdi. Həm Səfəvilər dövlətinin yaranmasından əvvəl, həm Səfəvilər dövründə, həm də sonralar bölgədə əhli-sünnə müsəlmanlar toplum şəklində yaşamışlar. Əgər Səfəvilər şiə məzhəbini hamıya zorla qəbul etdirmişlərsə, o halda bu torpaqlarda əhli-sünnə etiqadı tamamilə məhv olmalı idi. Halbuki Səfəvilər dövlətinin iri inzibati vahidlərindən biri olan və "Ərəbistan vilayəti" adlanan Xuzistanda ənənəvi olaraq sünni məzhəbi hakim idi. Vaxtilə Səfəvilər dövlətinin tərkibində yaşamış kürdlər və talışların bir qismi də əhli-sünnə məzhəbinə etiqad bəsləyirlər. Azərbaycanın coğrafiyasına nəzər saldıqda Səfəvilərin şiə məzhəbini zorla qəbul etdirməsi barədə iddianın əsassız olduğunu aydın görmək olar. Vətənimizin mərkəzi və şimal bölgələrində (Şamaxı, Ağdaş, Quba, Qusar, Şəki, Qəbələ, Zaqatala, Balakən, Oğuz, Qax, Qazax və s. rayonlarda) əhli-sünnə məzhəbi üstünlük təşkil edir. Səfəvilər Şirvanşahlar dövlətini və Şəki hakimliyini ilhaq etsələr də, əhalinin etiqadına hörmətlə yanaşmışlar.

Səfəvi şahları əhli-sünnə məzhəbindən olan bölgə və tayfa başçıları ilə qohumluq əlaqələri qururdular. I Şah İsmayıl öz qızı *Pərixan xanımı* sünni əqidəli Şirvanşah II İbrahimin (Şeyxşahın) oğlu Sultan Xəlilə (gələcək Şirvanşah II Xəlilullah) ərə vermişdi. II Xəlilullahın ölümündən (1535) sonra Pərixan xanım əhli-sünnədən olan Şəki hakimi *Dərviş Məhəmməd xana* ərə getdi (1539). I Şah İsmayılın digər qızı *Xanış xanım* Gilanın Biyə-pəs mahalının hakimi, sünni məzhəbli Müzəffər sultanla ailə qurmuşdu. Şah özü də 1523-cü ildə Şirvanşah II İbrahimin (Şeyxşahın) qızı ilə evlənmişdi. I Şah Təhmasib çərkəz liderlərinin nəslindən olan *Şamxal sultanın* bacısı ilə ailə qurmuşdu, şahın sağlığında Şamxal sultan sarayda böyük nüfuz sahibi idi, şahın ölümündən sonra da vəliəhd *Heydər Mirzəni* öldürməklə növbəti şah seçkisinə ciddi şəkildə təsir göstərdi. I Şah İsmayılın babası *Şeyx Cüneyd* və atası *Şeyx Heydər* sünni inanclı Ağqoyunlu hökmdarı *Uzun Həsənlə* yaxşı münasibətdə idilər. Uzun



Həsən Səfəvi şeyxlərinə öz torpaqlarında hər cür şərait yaratmış, öz bacısını Şeyx Cüneydə, qızını isə Şeyx Heydərə ərə vermişdi. I Şah İsmayıl həmişə öz babası Uzun Həsəni hörmətlə yad edir, Təbrizdə Uzun Həsənin adını daşıyan saraya və məscidə qayğı ilə yanaşırdı. Səfəvilər dövlətinin sonlarına yaxın Şimali Qafqaz (dağıstanlı və çərkəz) və kürd mənşəli əmirlər yüksək vəzifələrdə xidmət edirdilər, onlar baş vəzir və qoşun sərkərdəsi mənsəblərinədək yüksəlmişdilər. Belə ki, hətta bəzi tədqiqatçılar Səfəvilər dövlətinin süqutunu və əfqanlar qarşısında məğubiyyətini qeyri-türk mənşəli sünni şəxslərin idarəçilik aparatında ən yüksək mövqelərə yiyələnmələri ilə bağlamışlar.



*9-cu iddia:*

**Səfəvilər osmanlılar kimi qeyri-müsəlman dövlətləri ilə savaşmamış və İslamı ətrafa yaymamışlar, yalnız müsəlman dövlətləri ilə müharibə etmişlər.**

Doğrudur, Səfəvilər dövləti qeyri-müsəlman ölkələri ilə Osmanlı imperiyası qədər fəal müharibə aparmamışlar. Bunun səbəbini bölgənin coğrafi şəraitində və geosiyasi quruluşunda axtarmaq lazımdır. Osmanlı dövləti Səlcuq imperiyasının xristian Bizans imperiyası ilə həmsərhəd məntəqələrində yerləşən ucbəyliklərindən biri olan Osmanoğulları bəyliyinin bünövrəsi üzərində qurulmuşdur. Osmanoğulları bu məntəqədə xristian təhlükəsinə qarşı sipər yaratmaq məqsədilə yerləşdirilmişdilər və təbii olaraq onların əsas fəaliyyəti xristian basqınının qarşısını almaq, imkan daxilində dövlətin sərhədlərini Bizans imperiyasının içlərinə doğru genişləndirmək idi. Osmanlı imperiyasının qərb və şimal sərhədləri xristian dövlətlərinə açılırdı. Buna görə də Osmanlı sultanları ilk zamanlar daha güclü olan müsəlman qonşuların deyil, zəif və parçalanmış Avropanın hesabına öz ərazilərini genişləndirməyə maraq göstərirdilər. Səfəvilər dövləti isə xristian ölkələrdən yalnız şimalda Rusiya dövləti, cənubda isə kiçik Portuqaliya müstəmləkə torpaqları ilə həmsərhəd idi. Səfəvilər dövləti bu iki xristian qüvvə ilə müharibələr aparmışdır.

İran körfəzinin girişindəki Hörmüzü ələ keçirən Portuqaliya qarnizonu ilə Səfəvilər dövlətinin ilk qarşıdurması (1507-15-ci illər) portuqalların üstünlüyü ilə başa çatmış və İran körfəzinə nəzarət yüz ilə yaxın onlara məxsus olmuşdur. I Şah Abbas 1602-ci ildə Bəhreyn ərazisini İspaniya tabeliyində olan Portuqaliyadan aldı, 1622-ci ildə isə ingilis donanmasnın yardımı ilə Hörmüzü də azad etdi.

Rusiya çarlığı ilə Səfəvilər dövlətinin sərhədyanı bölgələrdəki lokal qarşıdurmaları XVII əsrin ortalarında meydana çıxmışdı. Səfəvilər dövləti rus tacirlər üçün əlverişli ticarət şəraiti yaratsa da, Rusiyadakı Səfəvi tacirləri sıxışdırılırdı. Qafqaz torpaqlarında iki dövlətin maraqları toqquşurdu. Kaxeti çarı I Tey-

muraz Səfəvi təbəəliyini qəbul etmədiyi üçün hakimiyyətdən uzaqlaşdırıldı və Rusiyadan yardım istədi. Rusiya hökuməti bölgədə öz nüfuzu artırmaq üçün Terek qalasının yaxınlığında digər istehkam qalaları inşa etməyə hazırlaşdı. Terek, qumuq və kabardinlər arasında Rusiyanın nüfuzu getdikcə güclənməkdə idi. Şirvan bəylərbəyi Xosrov xanın təşkil etdiyi ticarət karvanları şimal torpaqlarında hücuma məruz qalır və talanırdı. Belə bir mürəkkəb şəraitdə o, Səfəvi təbəəsi olan bəzi Şimali Qafqaz liderlərinə qoşun toplamağı əmr etdi, özü də yardıma 800 nəfərlik dəstə və top göndərdi. Rusların mühüm dayaq nöqtələrindən olan Sunja qalası hədəf seçildi. Amma 1651-ci ilin payızında başlamış hərbi əməliyyatlar Səfəvi tərəfi üçün uğurlu olmadı, həmlənin qarşısı alındı.

1653-cü ilin yazında Sunja qalasının üzərinə ikinci hücum təşkil edildi. Bu dəfə də hərbi əməliyyatlara Tarku (Tərki) şamxalı Surxay xan başçılıq edirdi. Sunja ətrafındakı kəndlər qarət olundu, qala mühasirəyə alındı. Terek və Həştərxan hakimləri onlara da hücum olunacağından ehtiyat etdikləri üçün Sunjaya lazımi yardımı göstərmədilər. Sunja qalası təslim oldu, Səfəvi qoşunu qalanı ələ keçirib yandırdı. Beləliklə, 1651-53-cü illərdəki Səfəvi-Rusiya münaqişəsi birinci tərəfin qələbəsi ilə başa çatdı. Qəndəhar uğrunda Böyük Moğol imperiyası ilə yaşanan gərginlik II Şah Abbasa Şimali Qafqazdakı əməliyyatları davam etdirməyə imkan vermədi. 1654-cü ildə Fərəhabadda Rusiya elçilərinin iştirakı ilə saziş imzalandı və münaqişə başa çatdı. Lakin bundan sonra da rus silahlı dəstələrin Səfəvi torpaqlarına hərbi müdaxiləsi davam etdi. Don kazakları I Şah Süleymanın hakimiyyətinin əvvəllərində (1668-69) Stepan Razinin başçılığı altında sahilyanı bölgələrə qarətçi yürüşlər həyata keçirdilər.

Səfəvi-Rusiya münasibətlərindəki gərginlik XVIII əsrin birinci rübündə Rusiya imperatoru I Pyotrun Xəzərsahili bölgələrə dəniz yürüşü ilə ən yüksək gərginlik həddinə çatdı. 1722-23-cü illərdə Dərbənd, Bakı, Salyan və hətta Rəşt ruslar tərəfindən işğal edildi. Səfəvi şahı II Təhmasibin göndərdiyi elçinin Peterburqda bağladığı rüsvayçı müqavilə nəticəsində Xəzər dənizinin qərb və cənub sahillərinin Rusiyaya verilməsi rəsmiləşdirildi. 1724-cü ildə İstanbulda bağlanmış Rusiya-Osmanlı sazişi isə əslində Səfəvilər dövlətinin bu iki imperiya arasında bölüşdürülməsi demək idi. Sonralar Nadir xan Əfşar Şimali Qafqazda apardığı hərbi əməliyyatlar gedişində buradakı Rusiya təsirini zəiflətməyə nail oldu və 1735-ci ildə bağlanmış Gəncə müqaviləsinin şərtlərinə görə, Rusiya Dərbənddən cənuba doğru ələ keçirdiyi bütün torpaqları boşaldıb geri çəkildi.

*Əlavə məlumat üçün bax:*
**SƏFƏVİ-PORTUQAL MÜHARİBƏLƏRİ, SƏFƏVİ–RUSİYA MÜNAQİŞƏLƏRİ.**



*10-cu iddia:*

**Osmanlılar Avropada fütuhatla məşğul ikən Səfəvilər Qərb dövlətlərinin təhriki ilə onlara arxadan hücum etmişlər.**

Səfəvilərlə osmanlıların ilk qarşıdurması 1514-cü ildə, Səfəvilər dövlətinin ərazisində yerləşən Çaldıran məntəqəsində baş vermişdir. Osmanlı sultanı I Səlim Yavuz öz qoşunu ilə Səfəvi torpaqlarına daxil olmuş, bununla qonşu müsəlman dövlətin ərazi bütövlüyünə təcavüz etmişdir. Döyüşdən əvvəl I Sultan Səlimin şaha ünvanladığı məktubdakı aşağıdakı cümlələr buna sübutdur: "İdarəçiliyi altında olan məmləkətlər onların (hökmdarların) namusu kimidir... Neçə gündür ki, güclü və qalib əsgərlərim məmləkətinə daxil olub səfa sürürlər, nə səndən bir səs-soraq var, nə də gözə dəyirsən".

Səfəvilər dövlətinin ən iri şəhərlərindən biri və ilk dövrlərdə paytaxtı olmuş Təbriz şəhəri Osmanlı qoşunu tərəfindən dəfələrlə tutulmuşdur. 1514-cü ildə I Sultan Səlim, 1548-ci ildə I Sultan Süleyman Təbrizi ələ keçirmiş, şəhərdə talanlar törətmiş, xeyli qənimət və əsirlə geri qayıtmışlar. I Sultan Səlimin Təbrizdən apardığı şair və ədiblər, memar və rəssamlar ömürlərinin sonuna kimi Osmanlı dövlətində yaşayıb-yaratmağa məcbur olmuşlar. I Sultan Süleymanın Səfəvi torpaqlarına etdiyi dörd böyük yürüş "İraqeyn səfərləri" adı ilə tarixdə məşhurdur. Səfəvi-Osmanlı müharibələrinin sonrakı mərhələləri də Səfəvi torpaqlarında aparılmışdır. 1585-ci ildə Osmanlı ordusu Təbriz də daxil olmaqla indiki Cənubi və Şimali Azərbaycan torpaqlarının böyük hissəsini ələ keçirmiş və XVII əsrin əvvəllərində bu ərazilər I Şah Abbas tərəfindən azad edilənədək Osmanlı üsuli-idarəsi altında qalmışdır. XVIII əsrin birinci yarısında Səfəvilər dövlətinin siyasi-istisadi tənəzzül yaşamasından istifadə edən osmanlılar bir daha irimiqyaslı hücuma keçərək xeyli torpaqları tutmuş, yalnız bir neçə ildən sonra Nadir xan Əfşar həmin əraziləri geri almağa nail olmuşdur.

Səfəvi-Osmanlı müharibələrinin taktiki xarakteri də göstərir ki, bu müharibələr Səfəvilər dövləti tərəfindən müdafiə məqsədilə aparılmışdır. I Şah Təhmasib adətən nəhəng Osmanlı ordusu ilə qarşılaşmaqdan çəkinərək təmassız müharibə üsulunu seçirdi. Səfəvi qoşunu "yandırılmış torpaq" taktikasından istifadə edərək osmanlıların keçdiyi yollar boyunca nəqliyyat və kommunikasiya xətlərini dağıdır, məhsul zəmilərini yandırır, su quyularını qurudur, əhalini kənara köçürürdü. Belə bir şəraitdə Osmanlı qoşunu yad torpaqlarda ərzaq təminatından məhrum qalır və beləliklə, ölkənin içərilərinə doğru çox irəliləyə bilmədən geri qayıtmağa məcbur olurdu.

Osmanlı ordusunun Qərbdəki fütuhatları Səfəvi sarayında yüksək dəyərləndirilirdi. I Şah Təhmasibin "Təzkirə"sində yazılıb ki, məşvərət məclisində sərkərdələrin bir qismi I Sultan Süleyma-

nın Avropada (firəng ölkəsində) müharibə etməsindən faydalanıb Osmanlı torpaqlarına soxulmağı təklif etmişdi. Bu plana əsasən qızılbaş qoşunu köməksiz qalmış bəzi Osmanlı vilayətlərini qarət edib bol qənimət və əsirlə cəld geri qayıda bilərdi. Lakin şah bu təklifə belə cavab vermişdi: "Xondgar (yəni sultan) firəng ölkəsinə qəzavət (cihad) üçün gedib. İndi biz onun ölkəsinə hücum etsək, işimiz irəli getməz. Əgər o, mənim qardaşımı, ya oğlumu öldürsə belə, kafirlərlə cihada getdiyi üçün biz onun ölkəsinə hücum etmərik, dinimizi dünyaya satmarıq".

I Şah Təhmasib və ondan sonra hökm sürmüş Səfəvi şahları Səfəvi-Osmanlı sərhədlərini 1555-ci ildə bağlanmış *Amasya sülh müqaviləsində* təsbit edilmiş xətt boyunca saxlamağa çalışırdılar. I Şah Təhmasib I Süleymandan sonra hakimiyyətə gəlmiş növbəti iki Osmanlı sultanına (II Səlim və III Murad) elçilər göndərib Amasya sülh müqaviləsi şərtlərini təsdiq etdirməklə sülhü qorumaqda maraqlı olduğunu sübuta yetirmişdi. 1639-cu ildə bağlanmış Qəsri-Şirin müqaviləsi hər iki tərəfi təmin etdiyi üçün 85 ilə yaxın, növbəti dəfə osmanlılar tərəfindən pozulunadək qüvvədə olmuşdur. Bu müddət ərzində Avropanın dövlət başçıları öz diplomatları vasitəsilə Səfəvi şahlarını osmanlılara qarşı müharibəyə başlamağa təhrik etsələr də, məqsədlərinə çatmamışlar. Roma papasının, Fransa, Müqəddəs Roma imperiyası, İspaniya və Portuqaliya, İngiltərə və Hollandiya dövlətlərinin elçiləri Osmanlı ordusunun qərb istiqamətindəki uğurlarından narahat olduqları üçün Səfəvilərin əli ilə osmanlılara qarşı ikinci cəbhə açmağa var gücləri ilə çalışırdılar. Lakin diplomatik görüşlər zamanı Səfəvi şahları soyuqqanlılıqla davranır və Osmanlı dövləti ilə bağlanmış sülh müqaviləsini pozmayacaqlarını Avropa elçilərinə bildirirdilər. Roma papaları X İnnokenti II Şah Abbasa ünvanladığı 30 yanvar 1646-cı il və 31 avqust 1647-ci il tarixli, XI İnnokenti I Şah Süleymana yazdığı 20 iyul 1686-cı il tarixli, XII İnnokenti Şah Sultan Hüseynə yazdığı 30 aprel 1695-ci il tarixli məktublarda Səfəvilər dövlətini osmanlılara qarşı döyüşməyə təhrik etsələr də, bu çağırışlar cavabsız qalmışdı. Xristian karmelit missionerlərin göndərdikləri hesabatda deyilirdi: "Bir çox xristian dövlətlərin səfirləri şahın hüzuruna gələrək, onu türklərə qarşı müharibə etməyə ruhlandırırlar, lakin nə fayda. Bəzən o, səfirlərə qarşı öz hiddətini belə gizlətmir, xoşuna gəlmədiyini açıqca büruzə verirdi". İsveç diplomatı Lüdviq Fabritsius (1648-1729) I Şah Süleymanla görüş zamanı onu osmanlılara qarşı müharibəyə təhrik edərkən şahdan bu cavabı almışdı: "Mənim əcdadlarım sülh bağlayıblar, mən də əbədiyyətə kimi bu sülhü təsdiq etmişəm. Allah lənət etsin o şəxsə ki, yenidən qılınca əl atacaq!"

***Mənbələr:*** *Məcmueyi-münşəat əs-səlatini-Fəridun bəy, I, 379-386 və 413-414; Şah İsmayıl Səfəvi (tarixi-diplomatik sənədlər toplusu), s.74-91; Ə.Ə.Vilayəti. Şah İsmayıl Səfəvi dövründə İranın xarici əlaqələr tari-*



*xi, s.132-152 və 185-187; M.H.Raznihan və Ə.Xaləndi. Osmanlı–Avropa qarşıdurması ilə bağlı Səfəvi xarici siyasətinin mövqeyi ("Mütaliati-tarixi-İslam" dərgisi, 1394 h.-ş., № 24), s.83-116; Yaqub Mahmudov. Azərbaycan diplomatiyası, s.261; Şah Təhmasib təzkirəsi, s.21; C.Səvaqib. Hicri X əsrdə Osmanlı dövləti qarşısında Səfəvilərin sülhsevər siyasəti ("İran və İslam tarixi araşdırmaları" dərgisi, 1399 h.-ş., № 26), s.19-50; T.Nəcəfli. Azərbaycan Səfəvi dövlətinin xarici siyasəti, s.319; Selim Güngörürler. Fraternity, Perpetual Peace, and Alliance in Ottoman-Safavid Relations, 1688-1698: A Diplomatic Revolution in The Middle East (Turcica, 50, 2019), pp.145-207; Rudi Matthee. İran' s Ottoman Diplomacy During The Reign of Shah Sulayman I (1011-1105/1666-94).*



*11-ci iddia:*

**I Şah Abbas Səfəvilər dövlətində qızılbaş türklərin təmsil edilməsinə son qoymuş və onu fars dövlətinə çevirmişdir.**

I Şah Abbasın zamanına kimi, demək olar ki, tamamilə qızılbaş türk tayfalarının nümayəndələrindən ibarət olan qoşunun tərkibində İslamı qəbul etmiş qeyri-türk millətlərə mənsub qulam korpusunun yaradılmasını, I Şah Abbas dövründə və daha sonralar qulamların arasından seçilmiş bəzi şəxslərin dövlət idarəçilik aparatında yüksək vəzifələrə təyin olunmasını bu iddiaya sübut kimi gətirirlər. Lakin əldə olan tarixi faktlar söyləməyə əsas verir ki, göstərilən təşkilati addımların heç biri dövlət idarəçiliyində qızılbaşların mövqeyini ciddi şəkildə sarsıtmamışdır. Səfəvilər tarixinə aid mühüm mənbələrdən olan İsgəndər bəy Münşinin "Tarixi-aləmarayi-Abbasi" əsərində həm I Şah Təhmasibin, həm də I Şah Abbasın vəfatı ərəfəsində vəzifə başında olmuş görkəmli dövlət adamlarının sayları və siyahıları verilmişdir. Həmin siyahılardan aydın olur ki, 1576-cı ildə I Şah Təhmasibin vəfatı zamanı 114 nəfər yüksəkrütbəli əmir dövlət xidmətində olmuşdur; lakin müəllif bunlardan yalnız 72 nəfərin adını və tayfa mənsubiyyətini qeyd edir. Siyahıdakı *Ustaclu* (15 nəfər), *Əfşar* (7 nəfər), *Türkman* və *Zülqədər* (6 nəfər), *Şamlu* və *Qacar* (5 nəfər), *Rumlu* (4 nəfər), *Təkəlü*, *Şeyxavənd* və Cığatay (3 nəfər), *Çəpni* (2 nəfər), *Bayat*, *Bayburt*, *Qazaqlar*, *Alpavut* və *Xınıslu* (hərəsindən 1 nəfər) əmirlərinin ümumi sayı 64 nəfərdir. Bunların qarşısında kürd əmirlərindən 8 nəfərin adları çəkilir. Siyahıdakı 2 nəfər talış əmirini bu iki dəstənin hər hansı birinə əlavə etsək, hər halda türk əmirlərin sayı böyük üstünlük təşkil edəcək. Qeyd edək ki, həmin dövrdə vəzifə başında olmuş xeyli başqa türk qızılbaş əmirin adlarına digər mənbələrdə rast gəlmək mümkündür.

İsgəndər bəy Münşi I Şah Abbasın vəfatı ərəfəsində sağ olan görkəmli dövlət xadimlərinin də analoji siyahısını təqdim etmişdir. Buradakı 73 nəfərdən 50-dən çoxu sırf türk mənşəli tayfaların nümayəndələridir, 17 nəfər isə *kürd və lur tayfalarına* aiddir. Müəllif daha 8 nəfəri qızılbaşlara aid etməsə də, onla-

rın bəzilərinin türk mənşəli olduğu məlumdur (*Otuzikilər, Silsüpür*). Bunların ardınca 21 nəfər *qulam* təbəqəsindən olan əmirin adları çəkilir. Göründüyü kimi, bu siyahıda qulamların və qeyri-türklərin (kürd və lur) ümumi sayı yenə qızılbaş türklərin sayını üstələmir. Say nisbətindəki fərq qulamların hesabına I Şah Təhmasibin dövrünə nisbətən bir qədər artmışsa da, qızılbaş əmirlərin öz mövqelərini əldən vermələri iddiası doğru deyil. (Qeyd edək ki, hər bir halda saray və ordu dili türk dili olduğu üçün siyahılarda adları çəkilən bütün dövlət xadimləri milliyyətindən asılı olmayaraq türkdilli sayılır).

İngilis alimi David Blow I Şah Abbas dövrünə həsr etdiyi araşdırmada yazırdı: "Sarayın əsas dili türk dili idi, amma bu, İstanbulda istifadə edilən türk dili deyildi. Bu, indi də İranın şimal-qərbində, Azərbaycan vilayətində danışılan, qızılbaş türkmanların dili olan türk şivəsi idi".

Həm I Şah Abbasın zamanında, həm də sonralar Səfəvilər dövlətinə səfər etmiş Qərb səyyahları öz xatirələrində qəti şəkildə qeyd edirdilər ki, "türk dili say əyanlarının və dövlət xadimlərinin diliir" (Petra della Vallenin 18 dekabr 1617-ci il tarixli məktubundan). I Şah Səfi ilə görüşmüş alman səyyah Adam Oleari yazırdı: "İsfahandakı şah sarayında da türk dili geniş yayılıb, orada türk dilində danışığı daha çox eşidərsən, nəinki fars dilində". I Şah Səfinin 1628/29-cu illərdə Avstriya ershersoqu II Ferdinanda ünvanladığı, Şah Sultan Hüseynin 1695/96-cı illərdə Saksoniya kürfürstü və Varşava hersoqu I Fridrix Avqusta yazdığı məktublar da Azərbaycan türkcəsində qələmə alınmışdı.

*Əlavə məlumat üçün bax:*
**SƏFƏVİLƏR DÖVLƏTİNDƏ TÜRK DİLİ, QIZILBAŞ TAYFA və OYMAQLARI.**



*12-ci iddia:*

**Qızılbaşlar öz düşmənlərinin ətini yeyirdilər.**

Əvvəla, qızılbaşlıq mövzusunda qələmə alınmış mənbələrdə adam əti yeyilməsi ilə bağlı məlumatlara cəmi iki dəfə rast gəlinir: 1504-cü ildə Mazandaran bölgəsində hökm sürən *Əmir Hüseyn Kiya Çəlavi* üzərində qələbə çaldıqdan sonra qızılbaşlar guya əsir aldıqları Murad bəy Cahanşahlu adlı sərkərdəni tonqalda yandırıb ətini kabab kimi yemişlər. İkinci dəfə isə 1510-cu ildə *Mərv savaşında Məhəmməd xan Şeybaninin* qoşununa qalib gəldikdən sonra guya I Şah İsmayılın göstərişi ilə qızılbaşlar Məhəmməd xanın cəsədini parçalayıb, ətini çiy-çiy yemişlər.

Lakin bəzi nüanslar bu iddianın həqiqətə uyğun olmadığını düşünməyə əsas verir:

1. Həmin mənbələrdə qızılbaşların heç də bütün düşmənlərə deyil, yalnız iki şəxsə qarşı bu əməli törətdikləri yazılıb. Əgər qızılbaşlar arasında belə bir ənənə olsaydı, bütün düşmənlərinin cəsədi ilə



bu cür rəftar edərdilər.
2. Məhəmməd xan Şeybani öz zamanının güclü dövlət xadimlərindən biri idi. Lakin Mazandaranın fəthindən sonra müqavimət hərəkatının başçısı Əmir Hüseyn Kiya Çəlavinin deyil, sərkərdələrdən biri olan Murad bəy Cahanşahlunun ətinin yeyilməsi anlaşılan deyil.
3. Bu hadisələr o dövrün heç də bütün mənbələri tərəfindən deyil, yalnız bir neçə müəllif tərəfindən təsvir edilmişdir. Özü də mənbələrin bir qismində bu hadisələrdən yalnız biri verilmişdir.
4. Düşmənin ətinin yeyilməsi ayini fərqli şəkillərdə təsvir edilmişdir. Ən əsas fərq budur ki, iddiaya görə, Murad bəyin cəsədi odun üzərində kabab edilməklə, Şeybani xanın cəsədi isə çiy-çiy yeyilmişdir. Əgər qızılbaşlar arasında belə bir ayin var idisə, onun dəqiq və konkret keçirilmə qaydası olmalı idi.
5. I Şah İsmayıl kimi dinə, *Əhli-beyt* yoluna bağlı bir hökmdarın, incə qəlbli şairin bu cinayətə razı olması, hətta şərait yaratması qeyri-mümkündür. Çünki bu davranış İslam qanunlarının tam ziddinədir, böyük günahdır.
6. Mənbələrdə düşmənin "kabab edilməsi" və "ətinin yeyilməsi" kimi ifadələri məcazi mənada qəbul etmək daha məntiqlidir. Belə ifadələr bu gün də dilimizdə işlədilir. Çox kədərli olduğumuzu "ürəyim yanır, ürəyim bişdi, kabab oldu" ifadəsi ilə, bəd-duamızı "səni yanasan, ciyərin yansın" sözləri ilə ifadə edirik. "Özünü didib-çeynədi", "filankəsin başını yedi", "zəif olsan, səni yeyərlər", "ətini yesəm də, sümüyünü atmaram", "sənə od qoyaram", "yandırıb külünü göyə sovuraram" kimi söz birləşmələrindən tez-tez istifadə edirik. Ola bilər ki, qızılbaşların öz düşmənlərini yediklərini yazmaqla müəlliflər onlardan dəhşətli intiqam aldıqlarını və ağır şəkildə cəzalandırdıqlarını bildirmək istəmişlər.
Bu fikri Səfəvilər dövrünün klassik mənbələrindən olan "Aləmarayi-Səfəvi"dəki bir ifadə də təsdiq edir. Belə ki, qızılbaş sərkərdəsi *Həsən bəy Halvaçıoğlu* lur tayfasına qarşı apardığı döyüşü I Şah İsmayıl üçün təsvir edərkən demişdi: "Əvvəlcə onlar bizi kabab etdilər və bizdən 500 nəfərin daşla vurub beynini dağıtdılar".
"Tarixi-aləmarayi-Abbasi" əsərində "Murad bəy Cahanşahi qəzəb odunda yandırıldı, intiqam alan döyüşçülər onun ətini yedilər" cümləsinə tədqiqatçılar tərəfindən verilmiş şərhdə deyilir: "Burada "ətini yedilər" ifadəsi, çox güman ki, məcazi mənada yazılmış, qızılbaşların Murad bəydən aldıqları intiqamın şiddətini göstərmək məqsədilə işlədilmişdir".
Bəzi məlumatlara görə, haqqında danışılan Murad bəy əslində bu hadisədən sonra sağ qalmış, əvvəlcə Təbəs şəhərinə, daha sonra Quriyan qalasına sığınmış, axırda qızılbaşlar tərəfindən öldürülmüşdür.
7. Səfəvi müəlliflərindən Məhəmməd Yusif Valeh İsfahani "Xüldi-bərin" əsərində Çaldıran döyüşündən sonra Xorasan vilayətində şiddətli aclıq baş verdiyini xəbər verir. İş o yerə çatmışdı ki,

Herat şəhərinin kənar məhəllələrində bir dəstə quldur tənha adamlara hücum edib öldürür və ətlərini yeyirdi. Herat hakimi *Zeynal xan Şamlu* bundan xəbər tutanda pusqu qurub o quldurların hamısını ələ keçirdi və edam etdirdi. Bu məlumat qızılbaşların əslində kannibalizmi cinayət kimi dəyərləndirdiklərini və ağır cəzaya məruz qoyduqlarını göstərir.

Qeyd edək ki, tarixin bəzi mərhələlərində, o cümlədən Səfəvilər zamanında da çox şiddətli aclıq üzündən bəzi şəhərlərdə adam əti yeyilməsi hallarına yol verilməsi barədə xəbərlər vardır. Məsələn, tarixi məlumatlara görə, İsfahanın əfqanlar tərəfindən mühasirəsi zamanı bütün ərzaq ehtiyatı tükəndikdən sonra əhali şəhərdəki it və pişikləri yeməyə başlamış, hətta bəzi hallarda ölülərin cəsədlərinin yeyilməsi halları baş vermişdir. Lakin bu hallar böhranlı anlarda və aclıq üzündən baş verdiyi üçün onları qızılbaşların adamyemə iddiasına sübut kimi dəyərləndirmək olmaz.

***Mənbələr:*** *Şahzad Bəşir. Şah İsmayıl və qızılbaşlar: Səfəvilər dövrünün əvvəllərindəki dini tarixdə kannibalizm ("Pəyami-baharistan", 1391 h.-ş., № 16), s.198-221; Shahzad Bashir. Shah Ismail and The Qizilbash: Cannibalism in The Religious History of Early Safavid Iran (History of Religions, 2006 by The University of Chicago), s.234-256; M.K.Yusifcəmali. I Şah İsmayılın həyatı, s.165-167; Mehman Süleymanov. Səfəvilər (Şah İsmayıl Səfəvi), III, 440-445; İsgəndər bəy Münşi. Tarix-i aləmara-yi Abbasi (tərcümə və şərhlər: O.Əfəndiyev, N.Musalı), s.90; Aləmarayi-Səfəvi (nəşrə hazırlayan: Y.Şükri), s.132; Məhəmməd Yusif Valeh İsfahani. Xüldi-bərin, s.245.*









*Şeyx Səfi kompleksi. Ərdəbil*



*Şeyx Səfi kompleksində Şeyx Musa Sədrəddinin məzarı. Ərdəbil*





*Ərdəbilin Kəlxuran kəndində səfəviyyə şeyxlərinin, o cümlədən Şeyx Səfiəddin Ərdəbilinin atası Şeyx Əminəddin Cəbrailin məqbərəsi*





*Şeyx Zahid Gilani türbəsi. Lənkəranın Şıxəkəran kəndi*



*Şeyx Cüneyd türbəsi. Qusarın Həzrə kəndi*






*Uzun Həsənə həsr edilmiş Azərbaycan poçt markası*



*Dəspinə xatunun ehtimal edilən portreti (italyan rəssamı Pizanellonun freskasından)*



*Aləmşah bəyimin məzarı. Şeyx Səfi kompleksi, Ərdəbil*



*Gənc I Şah İsmayıl qızılbaş əmirləri ilə məşvərət məclisində (miniatür)*



*Şirvanşah Fərrux Yasara aid edilən dəbilqə. Metropoliten Muzey, Nyu-York*



*Məhəmməd xan Şeybani (miniatür)*



*Mərv savaşını əks etdirən freska. Çehelsütun sarayı, İsfahan*



*I Şah İsmayıl Osmanlı elçilərini qəbul edir (miniatür)*





*I Şah İsmayıl ovda (miniatürlər)*






*I Şah İsmayılın və I Şah Təhmasibin portretləri. Uffisi qalereyası, Florensiya*






*I Şah İsmayıl Qərb rəssamlarının gözü ilə*




*I Şah İsmayılın zamanındakı Səfəvilər dövlətinin xəritəsi*



*I Şah İsmayılının zamanında zərb edilmiş qızıl sikkə*





*Səfəvilər dövlətinin bayrağı:*
*yuxarıda - I Şah İsmayılın zamanında,*
*aşağıda – I Şah Təhmasibin zamanında*














*I Şah İsmayılın əl işi olan xəttatlıq nümunəsi*



*I Şah İsmayılın portreti (rəssam: K.Behzad)*



*Çaldıran savaşının baş verdiyi yerdə ucaldılmış xatirə abidəsi*



*I Şah İsmayılın məzarı. Şeyx Səfi kompleksi, Ərdəbil*



*Azərbaycan Respublikasının "Şah İsmayıl" ali hərbi ordeni*



*Əlqas Mirzə I Sultan Süleymanın hüzurunda (Osmanlı miniatürü)*





*I Şah Təhmasib miniatürlərdə*





*I Şah Təhmasibin taxta çıxması (miniatür)*



*Gənc I Şah Təhmasib saray əyanlarının əhatəsində (miniatür)*



*I Şah Təhmasiblə moğol hökmdarı Humayun şahın görüşü. Çehelsütun sarayının divar rəsmlərindən, İsfahan*







*II Şah İsmayılın həbsdə qaldığı Qəhqəhə qalası*



*Şirvanşahlar dövlətinin əsas dayaq nöqtəsi olan Gülüstan qalasının qalıqları. Şamaxı*





*Abbas Mirzənin Xorasanda vəliəhd elan edilməsi (miniatür)*



*Şah Məhəmməd Xudabəndə (miniatür)*



*Daşın üzərində həkk olunmuş Səfəvi şahlarına aid emblem (Allahın altı müqəddəs adı)*



*Üzərində Səfəvi şahlarının təsviri olan xalça*
*Yuxarıdakı sırada: I Şah İsmayıl və I Şah Təhmasib*
*Ortada: I Şah Abbas*
*Aşağıdakı sırada: Şah Sultan Hüseyn və Şah Süleyman*



*I Şah Abbasın hakimiyyəti zamanı Gəncədə zərb olunmuş sikkə*



*I Şah Abbasın və Şeyx Bəhainin əl yazısı*



*I Şah Abbasın məzarı. Kaşan*



Bərdə şəhəri. İmamzadə məscidi, XVII əsr

1599-1607-ci illərdə I Şah Abbasın yürüşləri

1605-1626-cı illərdə Osmanlı ordusunun yürüşləri

1622-1623-cü illərdə Səfəvi ordusunun İraqa yürüşləri

1629-cu ildə Ürgənc hakiminin Xorasana yürüşü

1631-ci ildə Bəlx hakiminin Xorasana yürüşü

1620-ci ildə Portuqaliyadan geri alınmış ərazi

1603-1612-ci illərdə Osmanlılardan geri alınmış ərazilər

1599-cu ildə Şeybanilərdən azad edilmiş ərazilər

*I Şah Abbas dövründə güclü nizami ordunun yaradılması Səfəvi dövlətinə itirilmiş ərazilərini geri qaytarmağa imkan yaratdı. 1599-cu ildə I Şah Abbas Şeybanilər üzərində qələbə qazanaraq Xorasanı yenidən Səfəvi imperiyasına birləşdirdi. 1603-1607-ci illər Səfəvi-Osmanlı müharibəsində qalib gələn I Şah Abbas itirilmiş Azərbaycan torpaqlarını geri qaytardı və Osmanlılarla növbəti müharibələrin gedişində imperiyanın sərhədlərini qoruyub saxladı.*

*1620-ci ildə vaxtı ilə Portuqaliyaya güzəştə gedilən Hörmüz geri qaytarıldı. 1622-1624-cü illərdə Osmanlı ordusu üzərində qələbədən sonra Ərəb İraqı da Səfəvi imperiyasına birləşdirildi. Səfəvi imperiyasının sərhədləri bərpa edildi. Lakin Şah Səfi dövründə osmanlılarla 1636-1639-cu illər müharibəsinin gedişində səfəvilər məğlub oldu və tərəflər arasında bağlanmış Qəsri-Şirin müqaviləsinə görə Ərəb İraqı Osmanlı imperiyasının tərkibində qaldı.*

*I Şah Abbas zamanında və sonralar Səfəvilər dövlətinin xəritəsi*



*Səfəvi şahzadələrinin, o cümlədən I Şah Abbasın nəvələrinin (Zibeydə bəyimin oğulları) dəfn edilmiş Sitti Fatimə ziyarətgahı. İsfahan*



*I Şah Təhmasibin qızı Pərixan xanımın ehtimal edilən portreti (miniatür)*



*I Şah Abbasın oğlu Məhəmməd (Ruzək) Mirzənin portreti (miniatür)*






*I Şah Səfinin portretləri*



*I Şah Səfiyə məxsus qılınc*





*Dilaram xanımın inşa etdirdiyi Kiçik Cəddə məscidi. İsfahan*



*I Şah Səfinin məzarı. Qum (qədim qravüra)*



*I Şah Səfinin zamanında zərb olunmuş sikkələr*







*Şah Süleyman Avropa diplomatını qəbul edir*



*Şah Süleyman Səfəvinin zamanında zərb edilmiş qızıl sikkə*




*Şah Süleyman Səfəvi Qərb rəssamının gözü ilə*





*Şah Sultan Hüseyn Novruz bayramı münasibətilə hədiyyə paylayır*



*Şah Sultan Hüseynin Qərb rəssamı tərəfindən çəkilmiş portreti*



*Şah Sultan Hüseynin zamanında İrəvanda zərb olunmuş sikkə*

*Səfəvi şahlarının məktub və fərmanlarındakı möhürlər*





*I Şah İsmayıl* *I Şah Təhmasib*





*I Şah Abbas* *I Şah Səfi*





*II Şah Abbas* *I Şah Süleyman*





*Şah Sultan Hüseynin möhürü*



*II Şah Təhmasibin portreti*



*III Şah Abbasın zamanında zərb edilmiş sikkə*



*Nadir xan Əfşar II Şah Təhmasibin hüzurunda (miniatür)*

